

ÖYRƏN - ÖYRƏT

NAZİL OLMA SIRASINA GÖRƏ
NƏCM - NƏCM

# QURANİ - KƏRİMİN AZƏRBAYCANCA MƏALI

HAQQI YILMAZ

## TƏQDİM

Quranı ərəbcə əslindən oxuyub anlamaq və anladıqlarımı türkcə anlatmaq məqsədi ilə hazırladığım bu əsərdə şeytani-rəcimdən; onun təlqinlərindən, azdırmalarından və vəsvəsələrindən Allaha sığınıram.

Lazımi kimi tərifləyə bilməsək də, idrak edə bildiyimiz və ağlımızın imkan verdiyi ölçüdə bütün təriflərin aləmlərin Rəbbinə məxsus olduğunu təsdiqləyir, xüsusən də bu aciz, fəqir və həqir qula Quranı türk dilində oxucuya ərz etmək nemətini və xidmətini bəxş etdiyi üçün Ona sonsuz təriflərimi təqdim edirəm.

Uca Rəbbimizdən, Peyğəmbəri Muhəmməd əleyhissalamı, onun yaxınlarını və dostlarını dəstəkləyib hifz etdiyi kimi, bizimlə birgə Allahın dininə xidmət edənlərin hamısını qorumasını, hifz etməsini və dəstəkləməsini niyaz edirəm.

Rəbbimizin mesajlarını saf halda təsbit edərək bəşəriyyətə təqdim etməyə çalışdığım bu əsərdə, Allahın rizasını qazanmaqdan başqa heç bir məqsəd güdməmişəm. Acizliyimiz və idrakımızın məhdudluğu səbəbindən, şübhəsiz ki, əskiklərimiz olmuşdur. Ancaq Rəbbim şahiddir ki, bilə-bilə heç bir səhvə yol verilməmişdir. Buna görə, Uca Rəbbimizin məni əfv edəcəyini ümid edirəm.

Burada təqdim edilən məal, qədim ərəb dili [lüğəti, qrammatikası, ədəbiyyatı] ilə birlikdə Quranın bütövlüyü nəzərə alınaraq, çox həssaslıqla aparılan təhlillərin nəticəsidir. Meydana çıxardığımız mənaların sübutları, mənbələri və səbəbləri “Təbyinül-Quran” adlı əsərimizdə mövcuddur. Ətraflı məlumat əldə etmək, yoxlamaq və tutuşdurmaq istəyən oxucularımız, 11 cilddə nəşr edilən “Təbyinül-Quran”dan və yaxud internet saytımızdan bunları görə bilərlər.

Məalı təqdim etməmişdən əvvəl, Quranla bağlı bir neçə məqamı bəyan etməyin faydalı olacağını düşünərək, oxucularımıza qısa və yığcam məlumatlar vermək istəyirik.

## QURAN

Allahdan, Onun elçisi Muhəmmədə (ə.s.) vəhy edilən kitabın adı olan “Quran” sözünün kök mənası “yığılıb saçılmaq”dır. Buradan hərəkətlə “hərflərin yığılaraq sözləri, sözlərin cümləni əmələ gətirməsi və bunun nəql edilməsi işi” [oxumaq] yenə eyni köklə ifadə edilmişdir. Buna görə, “Quran” sözü də “oxunan” mənasına gəlməkdədir. Biz isə buna “öyrənilib öyrədilən” mənasını verməyi tərcih edirik.

“Quran” sözü Allahdan, onun elçisi Muhəmmədə (ə.s.) vəhy edilən kitabın adı – xüsusi isimdir.

## AYƏ

“Ayə” sözü “nişan / işarə” deməkdir. “Allahın ayələri” ifadəsi ümumiyyətlə “Allahın varlığının və birliyinin nişanları / işarələri olan varlıqlar və sistemlər”, “Quran ayələri” isə “insanın haqq yolu tapması üçün nişan / işarə

olaraq Allah tərəfindən gələn cümlələr" deməkdir.

Məalda "Allahın varlığının və birliyinin nişanı / işarəsi" anlamına gələn "ayə" sözləri "nişan / işarə" kimi, "insanın haqq yolu tapması üçün nişan / işarə olaraq Allah tərəfindən gələn cümlələr" mənasına gələn "ayə" sözləri sadəcə olaraq "ayə" kimi, hər iki mənanı da özündə birləşdirən sözlər isə "ayə / nişan / işarə" kimi verilmişdir.

## SURƏ

Sözün ilk mənaları "artıq-yığıntı", "divar – şəhəri əhatə edən qala divarları", "məskən – mənzilin otaq, zal, mətbəx kimi bölmələri" deməkdir. "Quran surəsi" deyildikdə Quranın bölmələri; nazil olma sırasına görə bölmələr və yaxud mövzulara görə bölmələr nəzərdə tutulur.

Hissə-hissə, nəcm-nəcm, bölmə-bölmə nazil olan ayələr, Qurandan öyrəndiyimizə görə, ilk dövrlərdən etibarən səhifə-səhifə yazılmış və surələr halına salınmışdır. Çünki Məkkə dövrünün ilk illərində nazil olan "Rəsmi Müshəf"dəki Yunus / 38, Hud / 13, Əbəsə / 13 nömrəli ayələrdə və Mədinə dövrünün Bəqərə / 23, Tövbə / 64, 86, 124, 127, Nur / 1, Muhəmməd / 20 nömrəli ayələrində Quran surələrindən və Quran səhifələrindən bəhs edilməkdədir. Lakin burada bəhs edilən Quran səhifələri bu gün əlimizdə olan 605 səhifə deyil, bəhs edilən surələr də bugünkü 114 ədəd surə deyil. Çünki bu gün əlimizdə olan Quran səhifələri xəttatların yazdığı səhifələrdir. 114 ədəd surə isə, yuxarıdakı ayələrin nazil olduğu zamanın surə anlayışı ilə deyil, neçə illər sonra cəmiyyətin müəyyən bir hissəsinin görüş, qavrayış və anlayışı ilə əmələ gətirilmiş surələrdir. Belə ki, əlimizdə olan mənbələrə əsasən, ilk səhabələr tərəfindən tərtib edilən Müshəflərdə və surələrdəki ayə saylarında fərqlər var.

Mövcud Müshəflərdə yer alan surələr də təəssüf ki, həm nəcmləri, həm də mövzuları baxımından, Quranda bəhs edilən surə xassəsinə malik olmaqdan uzaqdır. Quranın başa düşülməsini asanlaşdırmalı olduğu halda, təəssüf ki, bir çox surə bu işi çətinləşdirmiş, hətta bəzi yerlərdə mümkünsüz etmişdir.

Qənaətimizcə, Quranda hər nəcm [vəhy qrupu] bir səhifə, hər mövzu da bir surə idi. Könlümüzdən keçən odur ki, nəcmlərin nazil olma ardıcıllığı müəyyən edilsin, surələr də Quranda ifadə edilən surə anlayışına uyğun olsun.

## SURƏ ADLARI

Surələrə, içində diqqəti cəlb edən bir sözə yaxud surənin ümumi mövzusuna görə "Bəqərə", "Nisa", "Yusuf", "Yunus" və s. kimi adlar verilmişdir. Belə adlandırmanın Allah və Rəsuluna heç bir aidiyyəti yoxdur.

## NƏCM

"Nəcm" – "bir dəfədə nazil olan ayə qrupu" deməkdir. Nəcmlər bir ayədən ibarət ola biləcəyi kimi, onlarla, hətta yüzlərlə ayədən də ibarət ola bilər.

Quran bir dəfədə bütöv olaraq deyil, mövzularına görə ayrılmış halda, 23 ilə

yaxın bir müddət içində, cəmiyyətdəki hadisələrə, dəyişikliklərə və problemlərə görə, nəcm-nəcm nazil olmuşdur. Bir mövzunu əhatə edən ayələrin hamısı bir yerdə toplanmamışdır.

Bu bəndeyi-fəqir tərəfindən, Allahın izni ilə, ayələrin mənalarına və texniki xüsusiyyətlərinə əsasən nəcmlər əmələ gətirilmiş, bundan əlavə Rəsmi Müshəfdəki səhv tərtibat və ardıcıllıq düzəldilmiş, bir çox bölümdə ayələrin tərtibatı yenilənmiş və bunlar həm qeydlərdə, həm də nəcmlərin altında göstərilmişdir. Ancaq bizim bu tərtibatımız da mütləq [son və dəyişməz] deyil. Elm sahibləri tərəfindən, bütün dünya müsəlmanlarının əl birliyi ilə son tərtibat və ardıcıllığın müəyyənləşdirilməsinə ehtiyac var. Biz bu işdə ilk addımı atdıq və bütün insaf, vicdan və iman sahiblərinin diqqətini bu məsələyə cəlb etdik.

## MƏKKƏ-MƏDİNƏ SURƏ VƏ AYƏLƏRİ

Quran, Peyğəmbərə Məkkədə nazil olmağa başlamış və hicrətdən sonra da Mədinədə –vəfatından qısa bir müddət əvvələ qədər – nazil olmağa davam etmişdir. Surə və ayələr Məkkə və Mədinə surə və ayələri olaraq iki yerə ayrılarkən, nazil olduqları məkanlar nəzərə alınmadan, sadəcə hicrət hadisəsi nəzərə alınmışdır.

Surələrin Məkkə və Mədinə surələri olaraq iki yerə ayrılmasına baxmayaraq, bəzi surələrinin bütövlükdə Məkkədə, bəzi surələrin isə bütövlükdə Mədinədə nazil olmadığı bilinməkdədir. Bəzi Məkkə surələrinin içində Mədinə ayələri, bəzi Mədinə surələrinin içində də Məkkə ayələri var. Əlinizdəki əsərdə bunlar da göstərilmişdir.

Surə və ayələrin neçəsinin Məkkədə, neçəsinin Mədinədə nazil olduğu və yaxud neçəsinin qarışıq olduğu barədə, təəssüf ki, ixtilaf var və bu ixtilafın aradan götürülməsi də çətin görünür.

## AYƏLƏRİN NÖVLƏRİ

Quranın, Rəsmi Müshəfə görə Ali-İmran surəsinin 7-ci ayəsində (477-ci nəcm) bildirildiyi kimi, Quran ayələri möhkəm və mütəşabeh ayələr olaraq ikiyə ayrılır.

## MÖHKƏM AYƏLƏR

“Möhkəm” sözünün mənası “hökm ehtiva edən” deməkdir. Deməli, “möhkəm ayələr” ifadəsi “insanları fitnə-fəsaddan və səhv əməl işləməkdən çəkindirən prinsipləri ehtiva edən ayələr” mənasına gəlir. Qurandakı təbirlə desək, belə ayələr Kitabın anasıdır. Yəni bu ayələr həyatda tətbiq edilməli olan qayda-qanunları ehtiva edir. Quranın nazil olmasındakı məqsəd, insanların bu prinsiplərə riayət etməsini təmin etməkdir.

## MÜTƏŞABEH AYƏLƏR

Bütün dillərdə sinonimlər, eyni cür yazılıb fərqli mənalar verən sözlər olduğu kimi, sözlərin həqiqi, məcazi və s. mənaları olur. Birdən çox məna ifadə edən

cümlələrə “mütəşabeh cümlə” deyilir. Belə bir cümlə Quran cümləsi olduqda, ona “mütəşabeh ayə” deyilir. Bu ayələrin bir dil və ədəbiyyat mütəxəssisi olmayan Peyğəmbərin dilindən meydana gəlməsi, bu cümlələrin Ona məxsus olmadığını göstərir, çünki Peyğəmbər bu sahənin mütəxəssisi deyildi. Digər tərəfdən, Qurandaki sözlərin birdən çox məna ehtiva etməsi, Quranın çağlar boyu təzəliyini qorumasnı, möminlərin həmişə aktiv və interaktiv olmalarını təmin etmişdir. Ali-İmran surəsinin 7-ci ayəsində (477-ci nəcm) belə ayələrin “təvil edilməsi” [ehtiva etdiyi bir neçə fərqli mənadan hansını birinci planda nəzərdə tutmaq lazım gəldiyi] işini Allahın və bu işin mütəxəssislərinin bildiyi, ancaq onların biləcəyi ifadə edilmişdir.

## TƏVİL

“Təvil” sözü “geri qayıdış” şəklindəki kök mənasından dəyişərək “tədbir” [ardlaşdırmaq], yəni “birinci, ikinci, üçüncü… kimi ard-arda düzmək / sıralamaq, üstünlük sırasına görə düzmək” mənalarında işlədilməkdədir.

Bu mənalara görə, “mütəşabeh ayələrin təvil edilməsi” dedikdə “o ayələrin bir-birindən gözəl, bir-birinə oxşar açıq-aşkar mənalarının ard-arda sıralanması, bu mənaların üstünlükləri nəzərə alınaraq bir sıraya düzülməsi” başa düşülür. Deməli, “mütəşabeh ayələrin təvil edilməsi” dedikdə, Quranda dərk edilməyən müəyyən ayələr olduğu, bunların mənasını ancaq Allahın və “rasihun” deyilən bəzi alimlərin bildiyi mənası çıxarılmamalıdır.

## QURANIN TƏRCÜMƏSİ VƏ MƏALI

“Tərcümə” sözü “bir mətni bir dildən başqa bir dilə nəql etmək” mənasına gəlir. Lakin dillər arasındakı mədəniyyət və adət-ənənə fərqləri, müstəqil təsəvvür və təxəyyüldən qaynaqlanan fərqlər üzündən əşya, hərəkət, hal, simvol və duyğuların eynən tərcüməsi mümkün olmur. Ona görə də tərcümələrdə, orijinal mətnin xüsusiyyətləri və vurğuları əks etdirilməyərək, sadəcə mənanın nəql edilməsindən [zehni və emosional mesajın çatdırılmasından] söhbət gedir. Belə olan halda, hər hansı bir dildəki normal bir mətnin eynən tərcüməsi [orijinal mətnin bütün xüsusiyyətlərinin eynən əks etdirilməsi] mümkün deyildir. Deməli, şeir, roman, hekayə kimi sənət əsərlərinin eynən tərcüməsi də ehtimal daxilində deyil.

Əsli ərəbcə olan, ən yüksək səviyyəli bir ədəbi möcüzə olan və bir çox ayəsi mütəşabeh olan Quranın ərəbcədən başqa bir dilə eynən nəql edilməsi [eynən ifadə edilməsi] qətiyyən mümkün deyil. Elə isə, Quranın bədii xüsusiyyətləri, dərin vurğuları orijinal mətndə qalmaqla, bir-birinə yaxın mənalardan biri seçilərək mətnin mesajının hədəf dilə nəql edilməsi lazım gəlir. Bu üsulla əldə edilən mənaya “məal” deyilir.

Məallar mütləq həqiqət [Allahın muradının eynən ifadəsi] olaraq qəbul edilməməlidir. Çünki hər hansı bir şəxsin hazırladığı məal, Quranın zəngin mənalarından birinin o şəxsin anlayışı ölçüsündə ön plana çıxarılması deməkdir. Bu işdə, şəxslərin zəka və qavrayış səviyyəsinə görə fərqlər

meydana gəlməkdədir.

## QURANIN TƏRCÜMƏ VƏ MƏALININ VACİBLİYİ

Uca Rəbbimiz, Qurandan əvvəl göndərdiyi kitabları, Öz mesajını çatdırmaq istədiyi qövmlərin dilində göndərdiyi kimi, peyğəmbərləri də o qövmlərin içərisindən seçmişdir. Çünki Rəbbimizin məqsədi, Öz mesajının, bu mesajın göndərildiyi kütlə tərəfindən yaxşıca başa düşülməsini təmin etməkdir:

*"Və Biz onlara, [Allahın əmrlərini] açıqca meydana qoysun deyə, hər bir peyğəmbəri yalnız öz qövmünün dilində göndərdik. Artıq, Allah dilədiyini / diləyəni azdırar, dilədiyini / diləyəni də doğru yola yönəldər. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / möhkəm edəndir."* (72 / 14, İbrahim / 4; nəcm 318).

Belə ki, Adəm, Nuh, İdris, İbrahim, Musa, İsa və digər peyğəmbərlərin gətirdikləri mesajlar da öz xalqlarının dilində idi. Quran da ərəbcə danışan bir qövmə göndərildiyi üçün ərəbcə nazil olmuşdur. Bu ilahi sünnəyə görə əgər Quran türklərə nazil olsaydı türk dilində, yunanlara nazil olsaydı yunan dilində, fransızlara nazil olsaydı fransız dilində olacaqdı. Çünki qövmlərin mesajı dərk edə bilməsi, aldıqları mesajın öz dillərində olmasından, mesajı doğru dərk etmələri isə öz dillərini yüksək səviyyədə bilmələrindən asılıdır. Quranın ərəbcə olmasına baxmayaraq, əgər hədəf kütlə ərəb dilini yüksək səviyyədə bilmirsə, mesajı yaxşıca qavraya bilməzlər.

Quran əvvəla ərəblərə nazil olsa da, Quranın hədəf kütləsi bütün bəşəriyyətdir (bax. Rəsmi Müshəf: Sad / 87 [Nəcm 67]; Nisa / 105 [Nəcm 556], 174 [Nəcm 571]; Yunus / 57 [Nəcm 178]; İbrahim / 52 [Nəcm 323]). Peyğəmbərimiz də bütün bəşəriyyətin, müxtəlif dillərdə danışan bütün xalqların peyğəmbəridir (bax. Rəsmi Müshəf: Ənbiya / 107 [Nəcm 333]; Əraf / 158 [Nəcm 79]; Səba / 28 [Nəcm 224]; Ənam / 19 [Nəcm 204]; Furqan / 1 [Nəcm 96]; Cumuə / 2-3 [Nəcm 662]).

Yer üzündə müxtəlif dillərdə danışan yüzlərlə, minlərlə xalq var. O halda, bütün insanların ərəb dilini öyrənməsi mümkün olmadığına görə, Quranın digər dillərə tərcümə edilməsi, bir məcburiyyətdir. Bu məcburiyyətin yerinə yetirilməsi və Allahın mesajının bütün insanlara çatdırılması müsəlmanların mənəvi borcudur.

Bu borcun yerinə yetirilməsi baxımından özünü yetkin görən alimlərin ən vacib vəzifəsi, Quranın dili olan ərəb dilini və tərcümə edəcəkləri dili çox yaxşı bilmək, tərcümə əsnasında mənası hədəf dilə nəql edilməmiş heç bir sözün qalmasına imkan verməməkdir. Çünki yarıtürkcə, yarıərəbcə, yarıfarsca tərcümədən nə bir türk, nə də bir başqası bir şey başa düşə bilər. Əskik və naqis bir tərcümə ilə Allahın mesajının lazımi dərəcədə çatdırılması mümkün olmaz. Sözlərin və qavramların başqa bir dilin sözləri ilə nəql edilməsi kafi deyil. Quranın sözlərinin də, nazil olduğu dövrdəki saf mənalarıyla başa düşülməsi və bugünkü dilə nəql edilməsi lazımdır. Əks təqdirdə, Quranın mesajı arzu edilən ölçüdə dərk edilməz. O günkü ifadələrin

məsləhət [fayda] və məfsədət [ziyan] ölçüləri nəzərə alınmaqla, modernləşdirilərək nəql edilməsinin isə bir qorxusu yoxdur. Çünki sözlər yox, mesaj önəmlidir.

Dilin və tərcümənin əhəmiyyəti ilə bu əhəmiyyəti nəzərə almayan davranışların nəticələri Quranda izah edilmişdir (bax. Rəsmi Müshəf: Bəqərə / 75; Nisa / 46; Maidə / 13, 41).

Nəticə etibarıyla Quran, bütün sözləri tamamən anlaşılacaq şəkildə başqa dillərə tərcümə edilməlidir. Tərcümədə örtülü, anlaşılmayan bir söz belə qalmamalıdır. Əgər əlinizdəki bu tərcümədə bir örtülü söz, bir anlaşılmazlıq varsa, bu, Quranın deyil, tərcüməçinin nöqsanıdır.

## QURAN MÖCÜZƏ KİTABDIR

- Quran, fəsahət [ifadənin açıq, düzgün və məqsədə müvafiq olması], bəlağət [bir şeydəki dərin mənanın ifadə edilməsi qabiliyyəti] və ecaz [az sözlə çox şey demək] baxımından; təşbeh, həqiqət, məcaz, istiarə, kinayə, xəbər-inşa cümləsi; əmr, nəhv, istefham, təmənna, nida, qəsr, vəsl-fəsl, ecaz, itnab, intaq, tibaq, müqabilə, ümum-xüsus, icmal-təfsil, müsavat, zikr-həzf, cinas, səci, hüsnül-ibtida, hüsnül-intaha, iltifat və başqa bir çox ədəbi sənətlər baxımından mislsiz bir kitab, bir ədəbi şah əsərdir. Halbuki Allahın Elçisi Muhəmməd əleyhissalamın nə ədəbi bir keçmişi, nə də hər hansı bir təhsili var. Deməli, belə bir kitabı özü yaza bilməz.

Quran, ərəblərin ən yüksək səviyyəyə çatdıqları ədəbiyyat sahəsində gerçəkləşən bir möcüzədir. Həqiqətən ərəb ədəbiyyatı – türk ədəbiyyatı da daxil olmaqla – bütün dünya ədəbiyyatı üçün bir qaynaq olmuşdur. Quran tam mənada bir ədəbi möcüzədir. Ədəbiyyat sahəsində yüksək səviyyəyə çatdıqları həqiqəti bütün dünya tərəfindən qəbul edilən bir cəmiyyətin içərisindən çıxan bir şəxs, o cəmiyyətdəki ədəbiyyatçılar başda olmaqla hamını heyran edən sözlər söyləməyə başlamışdır. Öz cəmiyyətində çox yaxşı tanınan bu şəxsin əvvəllər ədəbiyyatla heç maraqlanmaması, cəmiyyətdə təbliğ etdikləri ayə və surələrin, bir-birlərinə kömək etsələr belə insanlar tərəfindən yazılması mümkün olmayacaq dərəcədə mükəmməl olması, hədəf kütlənin böyük bir təəccübünə səbəb olmuşdur. Normal həyatındakı danışığıyla yenə də hamının tanıdığı məkkəli Muhəmməd olan bu şəxs, özünə vəhy edildiyini deyib oxuduğu Quranla bir möcüzə göstərmişdir.

- Quran, özündən əvvəlki kitabları və elçiləri təsdiq etməkdədir. Halbuki onu Peyğəmbər yazsa, mütləq surətdə öz ehtiraslarına tabe olar, keçmişdəki kitabları və peyğəmbərləri təsdiq etmək yerinə, özünü ön plana çıxararaq hər şeyi öz adına çıxmaq istəyərdi.
- Öz içərisində fizika, kimya, biologiya, astronomiya, kosmologiya, təhsil, psixologiya və sosiologiya barəsində neçə-neçə məlumatları ehtiva edən Quran, möhtəvası və təlimi baxmından da mislsiz bir kitabdır. Halbuki Peyğəmbərimiz Məkkədə yetişən, həyatının bütün dövrləri hamı tərəfindən bilinən, ətrafında hər hansı bir məktəb yaxud müəllim

olmayan bir şəxsdir. Ona görə də Qurandakı məlumatları bilməsi bir yana qalsın, o mövzuları ağlına gətirməsi belə mümkün deyil. Quranın bu xüsusiyyətini qiyamətə qədər qoruyub saxlayacağı, Quranın öz içində belə ifadə edilmişdir:

*"Onun haqq olduğu meydana çıxana qədər, həm xarici aləmdə, həm öz bədənlərində işarətlərimizi / nişanələrimizi onlara göstərəcəyik. Rəbbinin şübhəsiz hər şeyə şahid olması kifayət deyilmi?"* (61 / 41, Fussilət / 53 [Nəcm 249]).

- Quran, bir çox tarixi hadisəni öz içərisində ehtiva etməkdədir. Allahın Elçisi Muhəmməd əleyhissalam isə belə mövzulardan xəbərdar olamayan biridir. Bu hadisələri bilməsi, yaxud səhvə yol vermədən özündən uydurması mümkün deyildir.
- Quran, həm keçmişə, həm də gələcəyə dair məlumatlar verir. Bu məlumatların düzgünlüyü zaman içində bir-bir meydana çıxır. Bir insanın öz-özündən, eynən düz çıxan bu cür məlumatlar verməsi mümkün deyil.
- Quran, öz strukturu ilə də bir çox möcüzələri özündə ehtiva edir. Belə ki, həcminin və möhtəvasının genişliyinə baxmayaraq, içərisində heç bir ziddiyyət və uyğunsuzluq yoxdur. Bu xüsusiyyəti Nisa surəsinin 82-ci ayəsində [Nəcm 548] belə ifadə edilmişdir: *"Onlar hələ də Quranı layiqli şəkildə düşünmürlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar."* Aydındır ki, belə bir kitab, bu işi görmək üçün lazım gələn qabiliyyətlərə malik olmadığı hamılıqla bilinən bir şəxs tərəfindən yazıla bilməzdi.

Quran haqqında düşünən hər kəsin dəqiqləşdirə biləcəyi bu xüsusiyyətlər, Quranın, Peyğəmbərimizin əsəri olmadığı göstərir. Yunus surəsinin 37 nömrəli ayəsində [Nəcm 176] də buna işarə edilmiş və Quranın Allah dərgahından vəhy nəticəsində nazil edilmiş bir kitab olduğu bildirilmişdir: *"Və bu Quran, Allahın altındakılar tərəfindən uydurulan deyil. Ancaq içindəkilərin təsdiqindən və Tövratın müfəssəl olaraq izahından ibarətdir. Onda şübhə ediləcək heç bir şey yoxdur. Aləmlərin Rəbbindən gəlmişdir."*

## MÜSHƏF

"Müshəf" sözü "iki qapaq arasında bir yerə yığılan səhifələrdən meydana gələn kitab" mənasına gəlir. Əslində bütün kitablar "müshəf" olsa da, bu sözün Quran üçün istifadə edilməsi geniş yayılmışdır.

Tarixi məlumatlara görə, Peyğəmbər sağ olduğu müddətdə vəhylər davam etdiyinə görə və Quran iki qapaq arasında bir yerə yığılan tam bir kitab halına gəlmədiyinə görə, ona "Müshəf" adı verilməmişdi. Bu ad Qurana ancaq xəlifə Ömərin dövründə, kitablaşdırıldıqdan sonra verilmişdir. Bugünkü Müshəflərin surətinin xəlifə Ömərin nüsxəsindən çıxarıldığı qəbul edilməkdədir.

## MÖVCUD MÜSHƏFİN TƏRTİBATI

Quran ayələri tərtil [düzgün düzülüş; cümlə, abzas və hissələrin bir-birinə

qarışdırılmaması üsulu] əsasında və nəcm-nəcm nazil olmuşdur (bax. Furqan / 32 [Nəcm 97]). Allah, Öz Elçisinə Quranı tərtil əsasında təbliğ etməyi buyurmuşdur (bax. Müzzəmmil / 4 [Nəcm 10]). Peyğəmbər də bu əmrə müvafiq olaraq Quranı nəcm-nəcm yazdırmış və əzbərlətmişdir.

O dövrdə kağız olmadığına görə, ayələr dəri, papirus, yastı sümük parçaları, yastı daşlar, taxta, kərpic / lövhə və sair materialların üstünə yazılırdı. Əvvəlcə tərtil əsasında nəcmlər halında mövcud olan ayələr, daha sonra səhabələr tərəfindən surələrə görə tərtib edilmişdir.

Mövcud Müshəfdə təəssüf ki, xronoloji ardıcıllıq nəzərə alınmamış, tərtilə, yəni düzgün və qarışdırılmamış bir düzülüşə riayət edilməmiş, bir çox nəcmin [abzas yaxud daha böyük hissələrin] cümlələri yerli-yerinə qoyulmamış və katiblərin imla səhvləri düzəldilməmişdir. Biz yüzlərlə belə səhvi burada göstərdik. Bu səhvlərə kimin, hansı səbəbdən yol verdiyini dəqiqləşdirməyi tarixçilərin öhdəsinə buraxırıq. Ancaq bunu da yaddan çıxarmayaq ki: *“Və kafirlər [Allahın məbud və rəbb olduğunu bilə-bilə inkar edən kəslər]: ‘Qalib gəlmək üçün bu Quranı dinləməyin, onun içində mənasız şeylər edin / anlaşılmasına hər yolla mane olun’ dedilər.”*

Biz, o gündən bugünə qədər hamının bildiyi Müshəflərdəki qrammatika qaydalarına zidd olan bu imla səhvlərini (Zumər 10 və 53 nömrəli ayələrdəki kobud səhvlər istisna olmaqla) göstərmək istəmədik. Tarix və rivayət kitablarında yer alan məlumatları nəql etmək də istəmirik. Biz, indiyə qədər heç kimin səmimi və doğru bir şəkildə demədiyi yaxud deyə bilmədiyi bir şeyi – Qurandakı abzas, hissə və cümlələrin bir-birinə qarışdırıldığını, Quranın başa düşülə bilməyən yaxud səhv başa düşülən bir hala salındığını, mövcud Müshəfi analiz edərək, bir iman borcu olaraq meydana çıxarırıq.

Mövcud Müshəfin bugünkü tərtibatı, Quranın “ərəbiyyən” [ən mükəmməl ifadə və qrammatika qaydalarına tam uyğunluq] və “mübin” olmaq keyfiyyətinə, tərtil xüsusiyyətinə uyğun gəlməməkdədir. Abzasdakı iki cümlənin arasına yüzlərlə, minlərlə cümlənin gətirildiyi, bir cümlənin ayə şəklindəki üzvlərinin onlarla cümlə sonraya keçirildiyi görünür. Müshəfdəki bu qüsurlar üzündən bir çox ayə səhv başa düşülməkdə yaxud da heç başa düşülməməkdədir, bir çox ayə də əlavələr və ixtisarlar aparılmadan (mötərizə açılmadan) başa düşülməsi mümkün olmayan hala gəlməkdədir.

Beləliklə, Quran funksionallığını, cazibəsini itirmiş, “top-top göndərilib, qabağına çıxanı yıxıb keçən, cəmiyyətləri canlandıran, canlandırdıqca da haqqı batildən ayıran, üzr və ya xəbərdarlıq olaraq öyüd verən”, alimləri və müdrikləri öz qarşısında baş əydirən, cəmiyyət üçün bir ruh və nur olan, qane etmədiyi, ölümdən əvvəl özünə inandırmadığı insan qoymayan Quran, bir həyat kitabı olmaqdan çıxarılmış, bir qəbiristanlıq kitabı, məscid kitabı və əfsanələr kitabı halına salınmışdır. Ona görə də artıq Qurana baxaraq islamiyyəti qəbul edənlərə rast gəlinmir. Dinin də Quran vasitəsi ilə başa düşülməsi mümkün olmadığından, dini anlamaq və öyrətmək üçün məzhəb imamları, təriqət şeyxləri, camaat liderləri meydana çıxmışdır. Beləliklə,

İslam dininin yerinə məzhəblər-təriqətlər dini meydana çıxmışdır.

Biz bu əsərimizdə imkan daxilində yüzlərlə belə halı taparaq, lazım olduğu şəkildə düzəltdik, tərtib etməyə çalışdıq. Bu barədə bir çox maddə onsuz da əsrlərlə əvvəl qələmə alınan bir çox kitabda öz əksini tapmışdır.

Bunun məsuliyyəti də – yuxarıda dediyimiz kimi – ilk tərtibatı həyata keçirənlərin, mövcud qüsurları o gün isti-isti düzəltməyənlərin və daha sonra da bunları öyrəndikləri halda səssiz qalanların boynundadır.

Bu həqiqət qarşısında susmamaq, görməməzlikdən gəlməmək, səmimiyyət və doğruçuluqla bu işin üstünə düşərək Müshəfi yenidən tərtib etmək möminlər üçün bir iman borcudur.

Bu nöqsan indiki Müshəfdə olan bir nöqsandır və Qurana dəxli yoxdur. Quran bütövlükdə bu Müshəfin içərisindədir, yəni vəhy edildiyi halda Müshəfə daxil edilməyən heç bir ayə yoxdur. Eləcə də, vəhy edilənlərin xaricində heç bir şey Müshəfə daxil edilməmişdir.

## NAZİL OLMA ARDICILLIĞI

Surələrin nazil olma ardıcıllığına görə oxunması, Quranın daha yaxşı başa düşülməsinə kömək edir. Məsələn, o dövrün iqtidarının görüşünə görə tərtib edildiyi üçün "Rəsmi Müshəf" adıyla tanınan, xəlifə Osman tərəfindən hazırladılan Müshəf, səhabələrin ictihadı nəticəsində tərtib edilmişdir. Quran və İslamiyyət haqqında kifayət qədər məlumatı olmayan şəxslərin, Quranla ilk dəfə tanış olanların və cahiliyyət dövründəkinə oxşar bir küfr və şirk şəraitində yaşayanların bu Müshəfdən layiqli şəkildə istifadə edə bilməsi sual altındadır. Quranı Rəsmi Müshəfdəki tərtibatda başlanğıcdan etibarən oxumağa başlayan bir adam – istəyir ərəbcə orijinalını, istəyir məalını oxusun – lap əvvəllərdəki Bəqərə surəsinin 6-7-ci ayələrinə gəlib çatdıqda, zehnində sual işarələri meydana çıxacaq, qəlbində Qurana və İslamiyyətə mənfi duyğular əmələ gələcəkdir. Oxunan məalın səhv, nöqsan olması halında isə bu mənfi duyğular açıq-aşkar düşmənçiliyə çevrilə bilər. Səmimiyyətlə etiraf etməliyik ki, cəmiyyətimizdə bu ayələri başa düşənlərin sayı çox azdır. Üstəlik, bu ayələrin, Quranı ilk dəfə əlinə götürən kəslər tərəfindən oxunduğunu nəzərə alsaq, bu şəxslər İslamiyyətə yaxınlaşmaqdansa, əksinə, Quranı başa düşmədikləri, yaxud səhv başa düşdükləri üçün İslamiyyətə düşman ola bilərlər. Məsələn: *"Şübhəsiz ki, kafirlər [Allahın məbud və rəbb olduğunu bilə-bilə inkar edənlər]; onlara xəbərdarlıq etsən də, etməsən də onlar üçün fərqi yoxdur – onlar iman gətirməzlər. Allah, onların qəlblərinin və qulaqlarının üstünə möhür vurmuşdur; onların gözlərinin üstündə pərdələr var. Və böyük əzab onlar üçündür."* (Rəsmi Müshəf: Bəqərə / 6-7 [Nəcm 399]) ayələrini başa düşə bilmək üçün Qurandan ən az beş min ayəni yaxşıca oxuyub başa düşmək lazımdır. Çünki yuxarıda misal verdiyimiz ayələr, ilk nazil olan ayələrdən təxminən 10-15 il sonra nazil olmuşdur. Bəqərə surəsindəki o ayələri o dövrdə eşidənlər, yaxud oxuyanlar, onu layiqiylə başa düşmək üçün lazım gələn hazırlığa sahib idilər. Elə buna görə də, o ayələri asanlıqla başa düşmüşdülər. O ayələr günümüzdə də lazımi

hazırlığı olanlar tərəfindən başa düşülməkdədir. Bəs Quranla yeni tanış olanlar və başa düşmək üçün lazımi bazadan məhrum olanlar necə? Bu şəxslərin "Bəzi adamların qəlbləri və qulaqları Allah tərəfindən möhürlənmişdir və heç bir xəbərdarlıq da onlara kar etmirsə, deməli, İslamiyyətin nə olduğunu və Allahın nə istədiyini öyrənmək üçün boş yerə əziyyət çəkməyə dəyməz" deyə fikirləşmələri və Quranı tərk edərək bir daha əllərinə götürməmələri qüvvətli bir ehtimal deyilmi?

Təlim və təhsilin bir sistemi və üsulu olmalıdır. Günümüzdə, hazırlıq sinfində ingilis dilini öyrənməyə başlayan bir şagirdə dərhal Şekspirin əsərləri təlim edilmədiyi kimi, ibtidai sinifdə riyaziyyatla yeni tanış olan uşaqlara dərhal dərəcəyə yüksəltmə və kök altı deyil, natural ədədlər öyrədildiyi kimi, Quranı öyrənməyə yeni başlayan birinə də, Peyğəmbərimizin peyğəmbərliyinin 22-ci ilində aldığı vəhyin dərhal nəql edilməsi doğru deyil. Əks təqdirdə, o ayələrin lazımi səviyyədə başa düşüldüyü barəsində optimist olmaq mümkün deyil.

Keçmişdəki qeydləri də nəzərə alaraq oxuculara təqdim etməyə çalışdığımız bu Müshəf tərtibatı / ardıcıllığı, bu sahədə ən ciddi əsər olduğu hamılıqla qəbul edilən Xəttat Qədroğlu Müshəfidir. Ancaq bunları da bilmək lazımdır ki, Mədinə nəcmləri bir-birinə qarışdırılmış, Mədinədə nazil olan ilk surə kimi göstərdiyimiz Bəqərə surəsinin bəzi ayələri Peyğəmbərimizin vəfatına yaxın dövrdə nazil olmuşdur. Yəni bir çox Mədinə surəsindən daha sonra nazil olmuşdur. Qısaca deyə bilərik ki, Mədinə surələrində, Məkkə surələrindəki qədər xronolojik ardıcıllıq mövcud deyil. Bunun məsuliyyəti, Allahdan qorxmadan Müshəfi bu şəkildə tərtib edənlərin boynundadır. Möhtərəm oxucularımız nəcmləri nəzərə alaraq oxumalıdır. İnşallah gələcəkdə Mədinə nəcmlərinin də daha səhih xronoloji ardıcıllıqla tərtib edilməsi mümkün olar. Bu iş, möminlərin yaddan çıxarmamalı olduqları bir borcdur.

## ƏLİNİZDƏKİ BU MƏAL

Quran, insanların başa düşəcəyi ölçüdə açıq-aydın izah edilmiş bir kitabdır. Quranın ayələrini savadsızlardan ən yüksək dərəcəli alimlərə qədər hamı başa düşə bilər. Başa düşmək üçün vasitəçiyə (mollaya, şeyxə) ehtiyac olmadığı kimi, təfsirə də ehtiyac yoxdur. Çünki Quran özü ucalardan uca olan Rəbbimiz tərəfindən olan ən gözəl təfsirdir. Əlavə olaraq Quranda "ayatun bəyyinatun", "kitabun mübin", "bəyyənəhu", "mübəyyinat", "tibyan" və "bəyan" kimi eyni kökdən əmələ gələn qavramlarla Quran ayələrinin açıq-aydınlığı bildirilmiş, Quranın örtülü, müşkül, anlaşılmayan bir şey olmadığı yüzlərlə dəfə təkrar edilmişdir. Uca Allah, kitabındakı mesajların açıq-aydın başa düşülməsi üçün hər cür ifadə vasitəsindən istifadə etmiş, bir vasitə olaraq ağcaqanad kimi ən bəsit şeyləri bilə misal çəkməkdən çəkinməmişdir. Beləliklə, ilahi mesaj universitetlərdəki elm xadimlərindən dağdakı çobana qədər hər kəsin başa düşə biləcəyi bir açıqlıqla ifadə edilmişdir.

Nəticədə həm kölələr, həm də yüksək səviyyəli idarəçilərdən bəziləri Quranı

anlayaraq dərhal iman gətirmiş, Əbu Cəhl, Əbu Ləhəb kimi adamlar isə Quranı yaxşı başa düşsələr də, özlərinə sərf etmədiyi üçün həqiqətin üstünü bilə-bilə örtmüşdürlər.

Quranın əsli bu olsa da, bugünkü gündə Quranı əlimizdəki Müshəflərdən və onların tərcümələrindən istifadə etməklə, ilk dövrdəki kimi asan və rahatlıqla başa düşmək imkanı yoxdur. Çünki Quranın tərtibində və tərtilində nazil olma ardıcıllığına riayət edilməmiş, nəcmlər, abzaslar, müxtəlif hissələr bir-birinə qarışdırılmış, müəyyən köçürmə səhvlərinə yol verilmiş, ərəb dili bir tərəfdən inkişaf edərkən, digər tərəfdən də korlanmış, bütün bunlardan əlavə din adına minlərlə kitab yazılaraq Quranla insanlar arasında maneə yaradılmışdır.

Bütün bu maneələri dəf etmək məqsədi ilə illərlə ayələr və ayələrin içərisindəki sözlər üstündə dayandıq. Bu zəhmətin nəticəsində meydana çıxan işi "Təbyinül-Quran" adıyla bütün bəşəriyyətə təqdim etdik. Burada oxuduğunuz məalın meydana necə çıxdığı, buradakı mənaların hansı səbəblərdən seçildiyi "Təbyinül-Quran"da ətraflı izah edilmişdir. Xüsusilə daha əvvəllər yazılan və insanların əllərində olan müxtəlif təfsir və məallarla aradakı fərqlər, səbəbləriylə birgə göstərilmiş, bütün bunlar möhkəm dəlillərlə sübut edilmişdir. Qısaca söyləmək gərəkirsə, bu qısa mali əldə edə bilmək üçün on bir cilddən, on minlərlə səhifədən ibarət olan bir iş görülmüşdür.

## MÜSHƏFDƏKİ BİSMİLLAHLAR

Mövcud Müshəflərdə hər surənin əvvəlindəki bismillahlar Quranda olmayıb, surələrin arasını müəyyən etmək məqsədi ilə sonrada əlavə edilmişdir. Quranda 2 yerdə bismillah var. Bunlardan biri "Fatihə surəsi" adı verilən ayələrin (bax. 14-cü nəcm) əvvəlindəki bismillahdır. Digəri isə Nəml surəsində Süleyman peyğəmbərin Səba mələkəsinə yazdığı məktubun (bax. 144-cü nəcm) əvvəlindəki bismillahdır. Biz, nəcmlərə nömrələr verərək onları bir-birindən ayırdıq.

## AYƏ NÖMRƏLƏRİ

İlk nüsxələrdə ayə nömrələri yox idi. Halbuki mövcud Müshəflərdə bəzən bir cümlə 10 ayrı ayə kimi nömrələnmiş, bəzən də on cümlə, bir abzas, bir hissə, bir ayə kimi göstərilmişdir.

Biz, oxucular başqa məallarla müqayisə apara bilsinlər deyə, ayələrin əvvəlində nömrələri saxladıq. Hər nəcmin altında, surənin klassik olaraq qəbul edilmiş Rəsmi Müshəfdəki nömrəsini, nazil olma ardıcıllığına görə düzülüşdəki nömrəsini, surənin adını və ayə nömrələrini göstərdik. Məsələn, nazil olma ardıcıllığına görə düzülüşdə 1-ci yerdə, Rəsmi Müshəfdə isə 96-cı yerdə olan Ələq surəsinin 1-5-ci ayələrindən ibarət olan nəcm (1/96, Ələq/1-5) kimi, Rəsmi Müshəfdə 2-ci yerdə, nazil olma ardıcıllığına görə düzülüşdə isə 87-ci yerdə olan Bəqərə surəsinin 114-115-ci ayələrindən ibarət olan nəcm (87/2, Bəqərə / 114-115) şəklində göstərilmişdir. Yəni bölmə

işarəsindən əvvəlki rəqəm surəsinin nazil olma sırasına görə düzülüşdəki yerini, sonrakı rəqəm isə Rəsmi Müshəfdəki yerini göstərir.

## QURANIN BAŞA DÜŞÜLÜB-DÜŞÜLMƏMƏSİ

Bütün bunlardan sonra, bir şəxsin Quranı başa düşməsi və ondan istifadə edə bilməsi üçün Quranın özündən öyrəndiyimiz şərtlər belədir:

- Quran oxuyan bir kəs əvvəla mütəhhər [zehnən təmizlənmiş] olmalıdır, yəni beynindəki viruslardan, məzhəb, məşrəb, təriqət çöküntülərindən uzaq olmalıdır.
- Öz şeytanından da uzaq olmalı, oxuduğu mövzulara obyektiv yaxınlaşmalı, Allah adına oxumalı və Allahdan anlama, qavrama diləməlidir (biz buna şüurlu olaraq "əuzu bismillah" çəkmək deyirik).
- Quran ayələrinin tərtilinə (düzgün ardıcıllıqda olmasına) riayət edilməli, Quran nəcm-nəcm oxunmalı, nəcmlər bir-birinə qarışdırılmamalı, arxa-arxaya gələn iki nəcmin nazil olmasının arasından həftələrlə, aylarla, hətta illərlə vaxt keçdiyi, onların bir-biri ilə əlaqədar olmadığı bilinməlidir.
- Hər hansı bir mövzu bir ayədən deyil, o mövzudakı ayələrin hamısından – imkan daxilində nazil olma ardıcıllığıyla – Quranın bütövlüyü nəzərə alınmaqla öyrənilməlidir. Bu üsul düzgün öyrənməyə zəmanət verdiyi kimi, hər hansı bir mövzunun ətraflı öyrənilməsini də təmin edəcəkdir. Misal üçün, İslamiyyətdə iddə [əri ölən, yaxud ərindən boşanan bir qadının təzədən evlənməmişdən qabaq gözləməli olduğu müddət] barədə məlumat almaq istəyən şəxs, Quranda bu mövzuda olan bütün ayələri (450, 453, 514 və 601 nömrəli nəcmlər) birgə oxusa, daha ətraflı məlumat sahibi olar.
- Bir də, Qurandakı mövzuların və hadisələrin arxa planı, termin və hökmlərin lokallığı nəzərə alınmalıdır. Məsələn, Quranda cənnət və cəhənnəmin timsalları ərəb coğrafiyasına görə verilmiş, cəhənnəm o coğrafiyada ən böyük problem olan istilik və atəş ilə, cənnət isə ərəb coğrafiyasında ən çox həsrət qalınan şəraitlə [yaşıllıq, sulu bağlar, kölgəliklər və s.] təsvir edilmişdir. Paltar, dünyanın bir çox yerində insanları soyuqdan qoruyan əşya olduğu halda, Quranda *"Sizi istidən qoruyacaq libaslar və sizi özünüzün qəzəbindən qoruyan geyimlər əmələ gətirdi"* (Nəhl/81, nəcm 306) deyilərək, istidən qorunmaq üçün istifadə edilən bir əşya kimi xatırlanmışdır. Deməli, Quran soyuq iqlimli, bol yağışlı bir coğrafiyada yaşayan bir qövmə nazil edilsə, cənnət və cəhənnəmin təsviri fərqli olacaq, libaslar barədə də "sizi soyuqdan qoruyacaq" ifadəsi işlədiləcəkdi.

Quranda ağaclar və heyvanlar barədə misallar da Ərəbistan coğrafiyasına uyğun çəkilmişdir. Quranda Ərəbistan xalqını hədəf alan "Dəvənin necə yaradıldığını görmürlərmi?" sözü, bir hindli üçün "Filin necə yaradıldığını görmürlərmi?" mənasını ifadə etməkdədir.

Quranın bir çox ayəsində Məkkə və Mədinənin siyasi, hərbi və ticari

vəziyyətinə işarət edilmiş, bununla əlaqədar olan xüsusi isimlər, riba, zihar, ila, talaq, nikah kimi terminlər, Əbu Ləhəb, Zeyd kimi adlar, Bədr, Ühüd, Xəndək, Hüneyn, Təbük müharibələri, Hudeybiyyə müqaviləsi kimi hadisələr Quranda yer almışdır. Bunları ensiklopedik səviyyədə bilmək, Quranın yaxşı başa düşülməsinə kömək edər.

Bu şəkildə oxunan Quran, insanların inanmasını təmin edəcək, insanları rüşdə [ən düzgün yola, düz yolu tapmağa, ağılla hərəkət etməyə, əqli və ruhi cəhətdən kamilləşməyə, yaxşı şeyləri əldə etməyə layiq kamilliyə çatmağa] yönləndirəcəkdir. İnsanlara furqan [yaxşını-pisi, gözəli-çirkini bir-birindən ayırmaq] şuuru bəxş edəcək, zehni xəstəliklərə şəfa, sıxıntı və böhranlardan xilas yolu, zülmətlərə qarşı nur, hətta fərdlərin və cəmiyyətin ruhu / canı olacaq. Beləliklər fərdlər və cəmiyyətlər hər sahədə özünü göstərən çürümüşlükdən xilas olacaqlar.

Bütün Quran əhlini, bəşəriyyəti Quranla tanış etməyə səsləyirəm. Bu, bir iman və vicdan borcudur. İnanıram ki, Quran yalın bir şəkildə bəşəriyyətə təqdim edilsə, bütün düşünən insanlar axın-axın, dəstə-dəstə Allahın dininə daxil olacaqlar və İslam dini həqiqətdə olduğu kimi hər kəsin can atdığı bir din olaraq yenə də özünü göstərəcəkdir.

Quranı tanımaq və tanıtmaq diləklərimlə və ümidlərimlə…

**Haqqı YILMAZ**

# ƏLƏQ [EMBRİON] (NAZİL OLMA SIRASINA GÖRƏ 1 – MÜSHƏF SIRASINA GÖRƏ 96) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 1[1]

**1-2** Yaradan; insanı embriondan yaradan Rəbbinin[2] adına öyrən-öyrət![3]

**3-5** Öyrən-öyrət!

Sənin Rəbbin isə özlərini üstün sayanlardan daha üstündür. Sənin Rəbbin ki, qələmlə öyrətdi.[4] O, insana bilmədiyini öyrətdi.

(1 / 96, Ələq / 1-5)

### Nəcm: 2[5]

**6-8** Qətiyyən sənin düşündüyün kimi deyil! Dönüşü Rəbbinə olsa da, insan, öz-özünü kafi görəndə, mütləq yoldan çıxır. **9,10** Səlat[6] etdiyi [maddi və yaxud zehni baxımdan dəstək olduğu; cəmiyyəti maarifləndirməyə çalışdığı] zaman bir qulu əngəlləyən şəxsi gördünmü? **11,12** Heç düşündünmü, əgər o səlat edən qul doğru yol üzərindədisə ya da təqvanı [Allahın mühafizəsi altına daxil olmağı][7] əmr etdi isə?... **13** Heç düşündünmü, əgər səlat edəni əngəlləyən o şəxs, təkzib etmiş və üz çevirmiş isə?... **14** Səlata əngəl olan o şəxs, Allahın mütləq gördüyünü bilmədimi? (1 / 96, Ələq / 6-14)

### Nəcm: 3

**15,16** Qətiyyən sənin düşündüyün kimi deyil! Əgər səlat edənə [maddi və yaxud zehni baxımdan dəstək olana; cəmiyyəti maarifləndirməyə çalışan kimsəyə] əngəl olan o şəxs, səlatı [maddi və yaxud zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyə çalışmağı] əngəlləməsinə son qoymayarsa, and olsun ki, kəkildən; yalançı, günahkar kəkildən; saçından tutub sürükləyəcəyik. **17** O zaman o, məclisini / təşkilatını çağırsın. **18** Biz zəbaniləri, dəf edənləri, əngəlləyənləri çağıracağıq.

**19** Qətiyyən sənin düşündüyün kimi deyil! Sən səlat edən [maddi və yaxud zehni baxımdan dəstək olanı; cəmiyyəti maarifləndirməyə çalışanı] əngəlləyən o şəxsə itaət etmə. Sən Rəbbinə boyun əyib təslim ol və yaxınlaşdırıl / Rəbbin səni Özünə yaxınlaşdırsın.

(1 / 96, Ələq / 15-19)

# QƏLƏM (2 – 68) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 4

**1** Nun / 50.[8] Qələmi və onları sətir-sətir yazıb söylədiklərini / əfsanələşdirdiklərini dəlil gətirirəm[9] ki, **2** Sən Rəbbinin neməti sayəsində, məcnun [gizli güclər tərəfindən dəstəklənən / dəli bir şəxs] deyilsən. **3,4** Və həqiqətən sənin üçün minnətə bulaşmamış çox mal var. Və həqiqətən sən, çox böyük bir əxlaq üzərindəsən.[10]

(2 / 68, Qələm 1-4)

## Nəcm: 5

**5-8** Artıq, yaxında haqq dindən çıxaraq özünü atəşə atan hansınızmış görəcəksən, onlar da görəcəklər. Şübhəsiz Rəbbindir, yolundan azanı ən yaxşı bilən. Göstərilən doğru yola yetişənləri də ən yaxşı bilən Odur. Elə isə axirət gününü yalanlayan o şəxslərə itaət etmə!

**9-16** Onlar arzu etdilər ki, sən onlara yaltaqlanasan, onlar da dərhal sənə yaltaqlansınlar. Çox and içən, alçaq, lağ eləyən, söz gəzdirən; qeybət edən, ara vuran, dedi-qodu məqsədilə gəzən, malı və oğulları var deyə xeyrə mane olan, təcavüzkar, günaha batan, kobud / qarınqulu, sonra da pisliklə damğalanmış bu tüfeylilərin heç birinə itaət etmə. Axirəti təkzib edən o adam, ayələrimiz ona oxunduğu zaman: “Keçmişdəkilərin əfsanələridir” dedi. Yaxında biz onun burnunu ovacağıq.[11] (2 / 68, Qələm / 5-16)

## Nəcm: 6[12]

**17-24** Şübhəsiz Biz, o bağ sahiblərinə bəla verdiyimiz kimi, onlara da bəla verəcəyik: Bir vaxt, onlar and içmişdilər ki, səhər açılanda bağın məhsulunu mütləq dərəcəklər. Heç bir istisna yeri də qoymamışdılar. Amma onlar yuxuda olanda Rəbbin tərəfindən bir qasırğa bağın üstündə gəzdi. Səhərə qədər o bağ, biçilmiş / məhsulu dərilmiş kimi oldu. Səhər açılanda bir-birlərinə səsləndilər: “Haydı, dərəcəksinizsə, səhər tezdən gedin!” Dərhal yola düşdülər, öz aralarında belə pıçıldaşırdılar: “Məbada bu gün aranıza bir yoxsul soxulmasın!”

**25-29** Sadəcə əngəlləmə gücünə sahib / şiddətə gücləri çatan bir halda erkəndən getdilər. Amma bağı gördükdə: *“Biz şübhəsiz ki, yolumuzu azmışıq / yanlış yerə gəlmişik; xeyr, xeyr, biz məhrum buraxılmışıq; Allah bizi cəzalandırmış.”* dedilər. Ən xeyirli olanları dedi: *“Mən sizə ‘Allah’ı nöqsanlıqlardan pak tutmursunuzmu?*[13] – deməmişdim?” Onlar dedilər: “Rəbbimiz, Səni bütün nöqsanlardan pak bilirik,

həqiqətən biz səhv edən, özümüzə zərər verən, haqsız davranan kimsələr olmuşuq!”

**30-32** Sonra qayıdıb bir-birlərini qınamağa başladılar: *“Vay bizim halımıza! Həqiqətən də biz, özümüzü firon kimi görən azğınlarmışıq, ümid edirik ki, Rəbbimiz bizə onun yerinə daha xeyirlisini verər; gerçəkdən də biz bütün ümidimizi Rəbbimizə yönəldirik.”*

**33** Dünyadakı əzab bax belədir! Əlbəttə, axirət əzabı daha böyükdür, kaş ki bilənlərdən olsaydılar! (2 / 68, Qələm / 17-33)

## Nəcm: 7

**34** Həqiqətən, Allahın mühafizəsi altına daxil olan kimsələr üçün Rəbbi yanında bol neməti olan cənnətlər var. **35** Elədirsə, müsəlmanları günahkarlar kimi eləyərikmi? (2 / 68, Qələm / 34-35)

## Nəcm: 8

**36** Sizə nə olub, necə hökm verirsiniz? **37,38** Yoxsa içində, dərs aldığınız şeylər: “Siz bu aləmdə nəyi seçərsəniz / bəyənərsəniz o (şey) mütləq sizin olacaq” (deyə) təminatı verən sizə aid bir yazılı sənədmi var? **39** Ya da “Siz necə hökm verərsəniz mütləq elə olacaq” deyə bizimlə qiyamət gününə qədər davam edəcək bir əhd / and, öhdəlikmi var?

**40** Axirəti yalanlayan o kəslərdən soruş görək, hansı buna zamin duracaq? **41** Yoxsa onların ortaqlarımı var? Əgər doğrulardandırlarsa, qoy onda ortaqlarını gətirsinlər.

**42** Gerçək bütün açıqlığı ilə ortaya qoyulub işin böyüməyə başladığı, işin ciddiləşdiyi və boyun əyib təslim olmağa dəvət edildikləri gün artıq gücləri çatmayacaq. **43** Gözləri yerə dikilmiş, özlərini bir zillət və düşkünlük bürümüş olacaq. Halbuki onlar, sağ-salamat olduqları vaxt da boyun əyib təslim olmağa dəvət edilirdilər. (2 / 68, Qələm / 36-43)

## Nəcm: 9

**44** Elədirsə, bu sözü / Quranı yalan sayanları Mənim öhdəmə burax! Biz onları bilmədikləri yerdən yaxalayacağıq. **45** Və Mən onlara möhlət verirəm; vaxt verirəm, çünki Mənim planım çətindir / sağlamdır.

**46** Yoxsa sən onlardan bir muzd istəyirsən, onlar da bu səbədən ağır bir borcun altında əzilirlər? **47** Yoxsa görmədikləri, bilmədikləri şeylər, gələcəkdə olacaq hadisələr onların yanındadır və onu onlarmı yazır?

**48** Elədirsə, Rəbbinin hökmü üçün səbr et və darlığa düşən kəs[14] kimi olma. O, bir dəfə həddindən artıq darlığa düşəndə, Rəbbini səsləmişdi. **49** Əgər Rəbbindən ona bir yaxşılıq yetişməsəydi, məzəmmət olunaraq boş bir yerə atılacaqdı. **50** Ancaq Rəbbi onu seçdi və salehlərdən biri etdi.

**51** Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] o öyüdü / Quranı eşitdikləri zaman az qalsın səni baxışlarıyla yıxmaq istəyəcək; az qalsın səni gözləriylə yeyəcəklər və "Şübhə yoxdur ki o bir divanədir / gizli güclərin dəstəklədiyi biridir" deyəcəklər.

**52** Halbuki Quran bütün aləmlərə bir öyüddən başqa bir şey deyil.

(2 / 68, Qələm / 44-52)

## MUZZƏMMİL (3 – 73) SURƏSİ MƏKKƏ DÖVRÜ

### Nəcm: 10

**1-4** Ey evinə qapanan şəxs![15] Gecə vaxtı *–az bir müddət istisna olmaqla; bəzən gecənin yarısı müddətində, bəzən bundan bir az əskilt, bəzən də buna bir az əlavə et–* ayağa qalx vəzifəni yerinə yetir. Sənə nazil edilməkdə olan Quranı təbliğ edərkən də yaxşıca nizama sal!
**5** Həqiqətən biz sənin üstünə çox ağır bir söz / Quranı qoyacağıq.

**6** Gecənin zehni asudəliyi, işlərini rahatca görmək baxımından daha əlverişli, söz baxımından daha təsirlidir. **7** Şübhəsiz ki, gündüz sənin üçün uzun-uzadı işlər var.[16] **8** Rəbbinin adını zikr et və bütün varlığınla Ona yönəl. **9** O, məşriqin və məğribin; bütün səmtlərin Rəbbidir. Ondan başqa heç bir tanrı yoxdur. Elə isə Onu vəkil[17] tut; "bütün varlıqları müəyyən bir proqrama görə tərtibləyən və bu proqramı mühafizə edərək, dəstəkləyərək yerinə yetirən" olaraq tanı!
**10** Onların dediklərinə / deyəcəklərinə də səbr göstər. Və onlardan gözəl bir şəkildə ayrıl, **11** Məni, nemət sahibi olan o yalan sayanlarla tək burax! Onlara bir az möhlət ver. (3 / 73, Muzzəmmil / 1-11)

### Nəcm: 11

**12** Həqiqətən Bizim yanımızda qandallar; ayaqlarına vurmaq üçün dəmir həlqələr və cəhənnəm var. **13** Boğazdan çətinliklə keçən bir yemək, ağrılı-acılı bir əzab var. **14** O gündə ki, yer və dağlar titrəyəcək və dağlar əriyib axan bir qum yığınına çevriləcək.

(3 / 73, Muzzəmmil / 12-14)

## Nəcm: 12

**15** Həqiqətən Biz, Firona elçi göndərdiyimiz kimi, sizə də üstünüzdə şahidlik edəcək bir elçi göndərdik. **16** Amma Firon, elçiyə asi oldu və Biz də onu qorxunc bir şəkildə yaxaladıq. **17** Belə olduğu halda küfr etsəniz; Allahın ilah və rəbb olduğunu bilərək rədd etsəniz, uşaqları ağ saçlı qocalara çeviren o gündən özünüzü necə qoruyacaqsınız? **18** O günün şiddətindən göy belə parçalanacaq. Onun verdiyi vəd yerinə yetəcəkdir. **19** Şübhəsiz ki, yuxarıda anladılanlar, Quran bir öyüd verici / düşündürücüdür. Ona görə, kim istəsə, Rəbbinə tərəf bir yol tutar. (3 / 73, Muzzəmmil / 15-19)

## Nəcm: 13

**20** Heç şühbən olmasın, Rəbbin bilir ki, sən gecənin üçdə ikisindən daha azını, yarısını, üçdə birini ayaq üstündə olursan. Səninlə olanlardan bir qrup da belədir. Allah gecəni də, gündüzü də ölçüyə bağlamışdır. Sizin bu işi asanlıqla edə bilməyəcəyinizi bildi və sizin üçün bu görəvi yüngülləşdirdi. O halda, Qurandan asan gələni öyrənin-öyrədin. Sizdən xəstələr olacağını bildi. Bildi ki, bir qisminiz Allahın fəzlindən nəsə axtarmaq üçün yer üzünü gəzib-dolaşacaq, başqa bir qisminiz isə Allah yolunda çarpışacaq. O halda, ondan asan gələni öyrənin-öyrədin! Səlatı [maddi və yaxud zehni baxımdan dəstəyi; cəmiyyəti maarifləndirmə qurumlarını] təşkil edin / ayaqda tutun,[18] zəkatı[19] verin! Gözəl bir ödünclə Allaha ödünc verin. Öz mənlikləriniz üçün öncədən göndərdiyiniz yaxşılığın Allah qatında xeyrinin daha çox, mükafatının daha böyük olduğunu görəcəksiniz. Allahdan əfv diləyin! Şübhəsiz ki, Allah çox əfv edən, çox mərhəmət edəndir.[20] (3 / 73, Muzəmmil / 20)

## MUDDƏSSİR (4-74) VƏ FATİHƏ [AÇIŞ] (5 – 1) SURƏLƏRİ MƏKKƏ DÖVRÜ

## Nəcm: 14

**Muddəssir 1-2** Ey vəzifəsini yerinə yetirməyə hazır olan şəxs![21] Qalx! Dərhal, **Fatihə 1-7** Yaratdığı bütün canlılara nemət verən, yaratdıqlarına çox mərhəmətli Allah adına: "Bütün təriflər, aləmlərin[22] Rəbbi,[23] yaratdığı bütün canlılara nemət verən, yaratdıqlarına çox mərhəmətli olan, hər kəsin yaxşı ya da pis bütün fellərin və işlərin qarşılığını görəcəyi axirət gününün sahibi, hökmdarı Allaha məxsusdur; Allahdan başqa kimsə tərifə layiq deyildir. Yalnız Sənə qulluq[24] edərik və yalnız Səndən kömək istəyərik. Bizə, üstünə qəzəb

yağdırılanların və azıb qalanların yolundan başqa olan yolu, özlərinə nemət verdiyin kəslərin yolu olan ən doğru yolu göstər, bildir!" deyərək xəbərdarlıq et![25] **Müddəssir 3** Və dərhal, Rəbbinin ən böyük olduğunu bildir, **4-7** Şəxsiyyətini ləkələmə; təmiz saxla, pisliklərdən dərhal uzaqlaş, pisliyi dərhal özündən uzaqlaşdır, etdiyin yaxşılığı çox bilib başa qaxma! Və ancaq Rəbbin üçün səbr et![26]

**8-10** Çünkü sur üfürülərkən,[27] bax o, o gün çox çətin, çox ağır bir gün olacaq. Çünki o, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün heç də asan olmayacaq.

(4 / 74, Muddəssir / 1-2 + Fatihə / 1-7 + Muddəssir / 3-10)

## Nəcm: 15

**11-14** Tək başıma yaratdığım, saysız-hesabsız mal-dövlət verdiyim, şahid olaraq oğullar verdiyim, hər cür imkanla təmin etdiyim kimsəni Mənimlə baş-başa burax!

**15** Bütün bunlardan sonra yenə də tamah salaraq Mənim daha da artırmağımı istəyir. **16** Qətiyyən onun düşündüyü kimi deyil! Şübhəsiz ki, o, Bizim ayələrimizə / əlamətlərimizə / işarətlərimizə qarşı inadkar oldu. **17** Mən onu dik bir yoxuşu çıxmağa məcbur edəcəyəm. **18-25** Şübhəsiz ki, o, düşündü və ölçü qoydu. *–O, artıq məhv oldu. Necə bir ölçü qoydu! Yenə də o məhv oldu. Necə ölçü qoydu!–* Sonra baxdı. Sonra üzünü turşutdu, qaşqabağını tökdü. Sonra arxasını çevirdi və təkəbbür göstərərək: "Bu, rəvayət halında gəlib çatan sehrdən başqa bir şey deyildir. Bu, bəşər sözündən başqa bir şey deyildir." dedi.

**26-30** Mən, "Quran bəşər sözüdür" deyən kəsi tezliklə Səqərə söykəyəcəm. Bilirsənmi ki, Səqər nədir? O, nə meydanda saxlayar, nə də yox eləyər. O, insan/dəri üçün görünməmiş lövhələr hazırlayandır / susayandır / uzaqdan görünəndir / bir işarə olan şeydir. Səqərin üzərinədir "on doqquz".

**31** Biz, cəhənnəm dostlarını da yalnız mələklər etdik. Sayını da elə etdik ki, özlərinə kitab verilən kəslər yaxşıca və açıq-aşkar bilsinlər, iman edənlərin imanı artsın, özlərinə kitab verilənlər və iman edənlər qərarsızlığa düşməsinlər, həm də qəlblərində xəstəlik olan [düşüncəsi xarab olan] kəslər və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] "Allah bununla nə demək istədi?" desinlər, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün bu, bir imtahan olsun. Bax belə. Allah istədiyini/istəyəni azdırır, istədiyinə/istəyənə də yol göstərər. Rəbbinin ordularını da Özündən başqası bilməz. Bu, bəşər üçün bir öyüd verici və düşündürücüdən başqa bir şey deyildir.[28]

**32-37** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Elçinin vəziyyətini, getməkdə olan cəhaləti, cəmiyyətdə başlayan maariflənməyi sübut gətirirəm ki,[29] Səqər, bəşər üçün; sizdən, irəli keçmək / irəliləmək yaxud geriyə qalmaq / geridə qalmaq istəyən kəslər üçün bir uyarıcı/ xəbərdarlıq olaraq, ən böyük şeylərdən biridir. (4 / 74, Muddəssir / 11-37)

## Nəcm: 16

**38,39** Hər mənliyini olan kimsə *–sağın dostları istisna olmaqla–* qazancının girovudur.

**40,41** Sağın dostları bağlardadırlar. Günahkarlardan soruşacaqlar: **42** “Sizi Səqərə sürükləyən nədir?” **43** Günahkarlar: “Biz səlat edənlərdən [maddi və yaxud zehni baxımdan dəstək olanlardan; cəmiyyəti maarifləndirməyə çalışanlardan] deyildik, **44** Miskini də yedirtməzdik; işsiz-gücsüzlərə ruzisini qazanmaq üçün fürsət və imkan verməzdik. **45** Və boş yerə səy göstərənlərlə birlikdə biz də boş yerə səy göstərirdik. **46,47** Və həm də biz, mübahisəsiz, əleyhinə çıxmaq mümkün olmayan ölüm, qiyamət bizə gələnə qədər Din Gününü yalanlayırdıq.” dedilər. **48** Artıq onlara yardımçıların, himayəçilərin yardımı, himayəsi fayda verməz!

**49** Yaxşı, onlara nə olub ki, onlara öyüd verib düşündürən şeydən üz çevirirlər? **50,51** Onlar, sanki sağa-sola qaçışan; aslandan hürkmüş vəhşi eşşəklər kimidir. **52** Əslində onlardan hər biri, özünə açılmış səhifələr verilməsini istəyir. **53** Qətiyyən onların düşündüyü kimi deyil! Əslində onlar, axirətdən qorxmurlar. **54** Qətiyyən onların düşündüyü kimi deyil! O, bir öyüd verici / düşündürücüdür. **55,56** Elədirsə, istəyən onu düşünər, öyüd alar. Və onlar, Allahın istəməsi xaricində öyüd ala bilməzlər. O, qorumağa və çəkindirməyə qadirdir və bağışlamağa da qadirdir. (4 / 74, Muddəssir / 38-56)

# TƏBBƏT VE YA MƏSƏD [QURUDU] (6 – 111) SURƏSİ MƏKKƏ DÖVRÜ

## Nəcm: 17

**1** Əbu Ləhəbin[30] iki gücü yox oldu.[31] **2** Özü də yox oldu. Malı və qazandıqları ona fayda vermədi. **3-5** Tezliklə o və boynunda lifdən bir ip odun daşıyan olaraq arvadı, alovlu atəşə atılacaqlar.

(6 / 111, Təbbət / 1-5)

# TƏKVİR [DÜRMƏK] (7 – 81) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 18

**1** Günəş qatlanıb büküləndə, **2** Ulduzlar bulananda, **3** Dağlar hərəkətə gətiriləndə, **4** Mənfəətlər və ən yaxşı gəlir mənbələri[32] işə yaramayanda, **5** Canlılar öz xilqətlərini itirəndə,[33] **6** Dənizlər qaynadılanda, **7** İnsanlar etiqadına və əməllərinə görə qruplara ayrıldığında,[34] **8,9** Zar-zar zarıldadılanlardan,[35] hansı günahlarına görə öldürüldükləri / həyatlarının məhv edildiyi soruşulanda, **10** Əməl dəftərləri açılıb yayılanda, **11** Göy siyrilərək açılanda, **12** Cəhənnəm alovlandırılanda, **13,14** Və cənət yaxınlaşdırılanda hər kəs nə tədarük etdiyini biləcək.

(7 / 81, Təkvir / 1-14)

## Nəcm: 19 (Qeyd: 15-25-ci ayələr Nəcm surəsinin 18-ci ayəsinin davamıdır. Orada oxunmalıdır)

**15-21** Quranı dinləməmək üçün gizlənənlərin, qaçanların halını, həqiqəti ört-basdır etmənin – cəhalətin gedişini, aydınlığın – yetkinliyin gəlişini[36] dəlil göstərirəm ki, şübhəsiz bu, güclü, Ərşin / ən uca taxtın[37] sahibinin yanında çox dəyər verilən, itaət edilən, güvənilən, dəyərli bir elçi sözüdür.[38] **22** Dostunuz gizli güclər tərəfindən dəstəklənən / dəli olan bir insan deyil. **23** And olsun ki O, gördüklərini özü açıq-aşkar üfüqdə ikən; qəlbi tərəddüd etmədən, gözü yanılmadan və həddi aşmadan gördü. **24** O, heç kəsin görmədiyi, eşitmədiyi, duymadığı, ona verilən vəhylər barəsində xəsis də deyildir. **25** Bu, onun öz düşüncə qabiliyyətinin məhsulu olan bir söz də[39] deyil.

**26** Belə isə, hara gedirsiniz? **27-28** Bu, aləmlər üçün, sizlərdən doğru yolda olmaq istəyənlər üçün öyüddən başqa bir şey deyildir. **29** Aləmlərin Rəbbi olan Allah, sizin düşünməyinizi, öyüd almağınızı istəməyincə, siz istəyə bilməzsiniz. (7 / 81, Təkvir / 15-29)

# ƏLA [ƏN UCA] (8 - 87) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 20

**1-5** Yaradıb nizama salan, ölçü qoyub sonra yol göstərən, otlağı çıxardıb sonra onu qapqara bir sel tullantısına çevirən Rəbbinin uca adını pak tut.[40]

**6-8** Bundan sonra səni bilikləndirib (məlumatlandırıb) onu (bilikləri və məlumatları) başqalarına çatdıracağıq, sonra da sən unutmayacaqsan / tərk etməyəcəksən. Ancaq Allah istəyərsə başqadır. Şübhəsiz ki, O, aşkarı da bilir, gizlini də. Və sənə ən asan olanı / səni ən çox

sevindirəcək şeyləri asanlaşdıracağıq.

**9,10** Bu səbəbdən sən dərhal öyüd ver, əgər öyüd fayda edərsə / edəcəksə; ehtiram göstərənlər öyüdü qəbul edəcəklər. **11** Ən bədbəxt adam isə ondan qaçacaqdır. **12** O kəs ən böyük alova söykənəcək. **13** Sonra onun içində nə öləcək, nə də yaşayacaqdır.

**14-17** Təmizlənən, Rəbbinin adını zikr edərək səlat edən [maddi və zehni baxımdan dəstək olan; cəmiyyəti maarifləndirməyə çalışan] kəs şübhəsiz ki, nicat tapacaqdır. Lakin siz bu bəsit dünya həyatını üstün tutursunuz. Halbuki axirət daha xeyirli və əbədi qalıcıdır.

**18,19** Həqiqətən bu qurtuluş çarələri, ilk səhifələrdə; İbrahimin və Musanın səhifələrində var idi. (8 / 87, Əla / 1-19)

## LƏYL (9 – 92) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 21**

**1-4** Qara cahilliyii, vəhyin aydınlığını; biliyi və genetik xüsusiyyətləri dəlil göstərirəm ki, sizin əmək və səyləriniz həqiqətən müxtəlif və hissə-hissədir.[41]

**5-7** Buna görə də kim malını / qazancını versə, Allahın mühafizəsi altına girsə və ən gözəl olanı təsdiqləsə, Biz ona, "o ən asan olan"ı asanlaşdıracağıq.

**8-11** Kim də xəsislik edərsə və özünü bütün ehtiyacların fövqündə görərsə və ən gözəl olanı təkzib edərsə, Biz ona "o ən çətin olan"ı müyəssər edəcəyik. Aşağı yuvarlanıb dəyişikliyə, məhvə məruz qaldığında / öldüyündə mal-dövləti onu xilas etməyəcəkdir.

**12** Doğruya və gözələ yönəltmək ancaq Bizə aiddir. **13** Sonrası da, öncəsi də sadəcə Bizimdir.

**14-16** Bax bu səbəblə yalanlayan, üz çevirən, ən çox bədbəxt olan kəsdən başqasının girmədiyi, alovlandıqca alovlanan bir atəşə qarşı Mən sizi xəbərdar etdim.

**17-21** Kimsədən qarşılıq gözləmədən, sadəcə Uca Rəbbinin rizasını qazanmaq, təmizlənmək üçün malını verən, ən çox Allahın mühafizəsi altına daxil olan şəxs ondan uzaq tutulacaqdır. Və yaxında o şəxs, həqiqətən razı olacaqdır. (9 / 92, Ləyl / 1-21)

# FƏCR [DAN YERİ] (10 - 89) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

**Nəcm: 22**

**1-4** Gerçəyin ört-basdır edilməsinin, Allaha ortaq qəbul edilməsinin, cahilliyin parçalanmasını; on gecə Peyğəmbərin bilikləndirilməsini; Allah-qul əlaqəsini və gerçəyin ört-basdır edilməsinin, Allaha ortaq qəbul edilməsinin, cahilliyin getməyə yönəlməsini (aradan qalxmasını) dəlil gətirirəm ki, həqiqətən **14** Rəbbin nəzarət edir.[42] **5** Bunlarda, ağıl sahibi üçün qüvvətli, qane edici, inandırıcı bir izah vardır.[43]

(10 / 89, Fəcr / 1-4, 14, 5)

**Nəcm: 23**

**6-13** Ad qövmünə, sütunlar sahibi İrəmə *–ki, məmləkətlər arasında bir bənzəri yaradılmamışdı–* vadilərdə qayaları kəsən Səmud qövmünə, o pazların sahibi; möhtəşəm orduları olan / görülməmiş işgəncələr verən[44] Firona Rəbbinin nə etdiyini görmədinmi / düşünmədinmi? Onlar ki, o ölkələrdə azğınlıq edirdilər. Oralarda fitnə-fəsadı çoxaltmışdılar. Ona görə də Rəbbin onların üzərinə əzab qamçısı yağdırdı.

(10 / 89, Fəcr / 6-13)

**Nəcm: 24**

**15-16** İnsana gəldikdə, Rəbbi onu nə zaman imtahana çəkib ehtiram göstərsə və ona nemətlər versə, "Rəbbim mənə ehtiram göstərdi" deyər. Amma nə zaman imtahana çəkib ruzisini azaltsa, "Rəbbim məni alçaltdı" deyər.

**17-20** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Əslində siz yetimi, üstün-hörmətli bir şəkildə yetişdirmirsiniz. Bir-birinizi yoxsulları yedirtməyə rəğbətləndirmirsiniz. Halbuki mirası talan edərcəsinə elə hərisliklə yeyirsiniz ki! Mal-dövləti isə ancaq yığıb saxlamaq üçün elə bir məhəbbətlə sevirsiniz ki!

**21-23** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Yer üst-üstə sarsıntılarla dümdüz olanda, Rəbbinin haqq-hesab apardığı, göndərdiyi vəhylər şahid qismində səf-səf düzüldüyü zaman, o gün cəhənnəm də gətirilmişdir; o gün, o insanın ağlı başına gələcək, ağlının başına gəlməsinin artıq ona nə faydası var?

**24** Deyəcək ki: "Kaş ki, bu axirət həyatım üçün hazırlıq görəydim!"

**25,26** Artıq o gün Allahın verdiyi əzabı heç kim verə bilməz və Onun vurduğu bağı heç kim vura bilməz. (10 / 89, Fəcr / 15-26)

**Nəcm: 25**

**27-30** Ey ağlındakı bütün sualların cavabını taparaq arxayınlığa qovuşan kəs! Dön Rəbbinə, sən Rəbbindən, O da səndən razı qalaraq! Dərhal bəndələrimin arasına daxil ol. Və cənnətimə daxil ol.

(10 / 89, Fəcr / 27-30)

## DUHA [QUŞLUQ VAXTI] (11 - 93) VƏ İNŞİRAH (12-94) SURƏLƏRİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 26**

**Zuha 1-3** Maariflənmənin başlaması və Allahın ilah və rəbb olduğunun bilərək rədd edilməsi, Allaha ortaq qəbul edilməsi, cəhalətin cəmiyyəti bürüməsi[45] dəlildir ki, Rəbbin səni tərk etməyəcək və sənə acığı tutmayacaq.

**4,5** Şübhəsiz ki, sonrası sənin üçün əvvəlindən daha xeyirli olacaq. Və Rəbbin sənə əta edəcək, sən də razı qalacaqsan.

**6-8** O, səni yetim ikən tapıb sığınacağa qovuşdurmadımı? Səni doğru yoldan kənarda biri kimi tapıb doğru yola yönəltmədimi? Səni, ailəni dolandırmağa çətinlik çəkən biri kimi tapıb zəngin etmədimi? **9,10** Elə isə yetimə əziyyət etmə / vəziyyətini daha da pisləşdirmə! İstəyənə / soruşana acıqla cavab vermə.

**11** Rəbbinin nemətini sözünlə və əməlinlə göstər!

**İnşirah 1-4** Biz, sənin üçün, sənin köksünü açmadıqmı? Ağır yükünü səndən götürmədikmi? *–O yük sənin belini bükmüşdü.–* Sənin ad-sanını da sənin üçün ucaltmadıqmı?

**5,6** Deməli, çətinliyin yanında mütləq bir asanlıq var. Çətinliyin yanında bir asanlıq mütləq var.

**7** Elə isə boş qalan kimi dərhal yeni bir şeyə başla. **8** Və arzularını yalnızca Rəbbinə yönəlt. (11 / 93, Zuha / 1-11 + 12 / 94, İnşirah / 1-8)

## ƏSR (13 - 103) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 27**

**1-3** Yaşadığınız zamanda insanlığın vəziyyəti dəlildir ki, iman edən, sahmana salmaq məqsədi ilə işlər görən, haqqı bir-birinə tövsiyə edən; bir-birinə şərt qoşan / öyüd verən və səbri bir-birinə tövsiyə edənlərin; bir-birinə şərt qoşanların / öyüd verən kəslər xaricində hamı həqiqətən tamamilə ziyan, zərər, böhran və ağrı-acı içərisindədir. (13 / 103, Əsr / 1-3)

## ADİYAT [TÖVŞÜYƏ-TÖVŞÜYƏ QAÇANLAR] (14 - 100) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 28**

**1-5** Tövşüyə-tövşüyə qaçanlar, sonra alov saçanlar, sonra sübh çağı basqın edənlər, sonra orada toz-duman qoparanlar, sonra bir topluluğun ən dəyərli qaynaqlarına, varlıqlarına soxulanlar dəlildir ki,
**6** Həqiqətən insan Rəbbinə qarşı çox nankordur, **7** Və özü də buna qəti
surətdə şahiddir. **8** Şübhəsiz o, mal-dövlətə məhəbbəti ucbatından çox sərtdir.
**9-11** Bəs o möhtəkir şəxslər, qəbirlərdə olanların dirildilərək çölə atıldığı, sinələrdə olanların yığılıb cəm edildiyi zaman, heç şübhəsiz o gün Rəblərinin onları gerçəkdən xəbərdar edəcəyini bilmirlərmi?

(14 / 100, Adiyat / 1-11)

## KƏVSƏR [BOL NEMƏT] (15 - 108) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 29**

**1** Həqiqətən, Biz sənə bol nemət verdik. **2** Elə isə, Rəbbin üçün səlat et [maddi və yaxud zehni baxımdan dəstək ol; cəmiyyəti maarifləndirməyə çalış] və qarşına çıxan çətinliklərə sinə gər!
**3** Şübhəsiz ki, səni xor görən, sonu olmayanın; səyləri fayda verməyənin məhz özüdür! (15 / 108, Kəvsər / 1-3)

## TƏKASUR [ÇOXALTMA YARIŞI] (16 - 102) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 30**

**1,2** Çoxaltma yarışı, qəbirlərə girənə qədər sizi əyləndirib başınızı qatdı.

**3,4** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Yaxında biləcəksiniz. Yenə də, qətiyyən sizin düşündüyünüz kimi deyil! Yaxında biləcəksiniz.

**5,6** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Əgər qəti biliklə bilsəniz, çılğınca yanan atəşi mütləq görərsiniz. **7** Bir müddətdən sonra onu,
gözünüzlə gördüyünüz kimi, gerçək olaraq mütləq görəcəksiniz.

**8** Sonra, o gün siz, nemətdən mütləq sorğu-sual olunacaqsınız.

(16 / 102, Təkasur / 1-8)

## MAUN [BƏSİT EV ƏŞYALARI] (17 - 107) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 31**

**1** Axirətdə hər kəsin yaxşı və ya pis, etdiyi işlərin qarşılığını görməsini / Allahın ictimai sistemi nizamlayan prinsiplərini yalanlayan bu kimsəni gördünmü / heç düşündünmü? **2,3** Yetimi itələyib qovan və yoxsulu yedirtməyə sövq etməyən kimsə bax odur.

**4-7** Artıq, səlatlarında qafil, etinasız, özünü göstərmək məqsədi ilə səlat edən [özünü maddi və yaxud zehni baxımdan dəstək olan; cəmiyyəti maarifləndirməyə çalışan biri kimi göstərən] və bəsit bir şeylərin belə bir ehtiyaclıya çatdırılmasına əngəl olan kəslərin vay halına! (17 / 107, Maun / 1-7)

## KAFİRUN [KAFİRLƏR] (18 – 109) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 32**

**1** De ki: "Ey kafirlər [Allahın ilah və rəbb olduğunu qəbul etməyənlər]! **2** Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm / mən sizin etdiyiniz qulluğu etmərəm. **3** Siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz / siz də mənim etdiyim qulluğu[46] edən deyilsiniz. **4** Və mən qətiyyən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm / mən qətiyyən sizin etdiyiniz qulluğu edən deyiləm. **5** Siz də mənim ibadət etdiyimə ibadət edəsi deyilsiniz / sizə də mənim etdiyim qulluğu edəsi deyilsiniz. **6** Sizin dininiz / etiqadınız və həyat prinsipləriniz yalnız sizin üçün, mənim dinim / etiqadım və həyat prinsiplərim də yalnız mənim üçündür." (18 / 109, Kafirun / 1-6)

## FİL (19 - 105) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 33**

**1,2** Rəbbin, filli orduya [axmaqlar, ağılsızlar dəstəsini] necə elədi, görmədinmi / heç düşünmədinmi?[47] Onların bəd planlarını boşa çıxartmadımı?

**3-5** Və onlarım üzərlərinə, onlara bişmiş daşlar ilə birlikdə iri dənəli yağmur yağdıran topa topa buludlar / boran göndərdi və onları yeyilmiş bitki yarpağı kimi etdi.

[Rəbbin, axmaqlar, ağılsızlar dəstəsinə necə etdi görmədinmi? Onların üzərinə nəcm-nəcm ayələr / üst-üstə bəlalar göndərdi və onları həm

vicdan baxımından rahatsız etdi, həm də köklərini qaşıyıb yox etdi.
(19 / 105, Fil / 1-5)

## FƏLƏQ [YARILMA, ÇATLAMA] (20 - 113) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 34**

**1-5** "Yaratdığı şeylərin pisliyindən, çökdüyü zaman qaranlığın pisliyindəm və düyünlərə tüpürüb üfürənlərin / sazişlərə riayət etməyənlərin pisliyindən və qısqandığı zaman qısqananın pisliyindən yarılıb açılmaların[48] Rəbbinə; [bütün] sıxıntıları [müəyyən bir proqram çərçivəsində] ortadan qaldıran Allaha sığınıram" de!
(20 / 113, Fələq / 1-5)

## NAS (21 - 114) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 35**

**1-6** Cinn və İnsdən, "Görünməyən varlıqlardan, bilinən varlıqlardan;[49] hamısından, insanların ağıllarında yamanlıq pıçıldayan hənnasın [riyakar düşmənin] pis pıçıltılarının şərindən insanların ilahına,[50] insanların hökmdarına və insanların Rəbbinə sığınıram" de! (21 / 114, Nas / 1-6)

## İXLAS [SƏMİMİYYƏT] (22 - 112) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 36**

**1** De ki: "O Rəbb, bir tək olan Allahdır, **2** Səməd[51] olan Allahdır,
**3** Doğmamışdır və doğulmamışdır. **4** Və heç bir şey Onun; yalnız
Onun tayı-bərabəri olmamışdır." (22 / 112, İxlas / 1-4)

## NƏCM (23 - 53) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 37**

**1** Qrup-qrup nazil olan ayələrin hər bir enişini dəlil göstərirəm ki,
**2** yoldaşınız yoldan çıxmamışdır, azmamışdır. **3** O, boş, gəlib keçən
arzusundan da danışmır. **4** Onun sizə söylədikləri; nazil olan o ayə
qrupları, ona vəhy edilən vəhydən başqa bir şey deyildir. **5** O
dediklərini yoldaşınıza fövqəladə qüvvələri olan, üstün ağıl sahibi olan, hökmranlığını qurmuş olan öyrətdi.

**6,7** Və fövqəladə qüvvələri olan, üstün ağıl sahibi olan, hökmranlığını qurmuş olan, ən uca üfüqün sahibidir.[52] **8,9** Sonra da O; fövqəladə qüvvələri olan, üstün ağıl sahibi olan və hökmranlığını qurmuş olan keyfiyyət olaraq yaxınlaşdı və dərhal ard-arda qova sallanmış / yığın-yığın ayələr endi. Birində iki yay uzunluğu[53] qədər, digərində də keyfiyyət olaraq daha yaxın olmuşdu. **10** Dərhal O; fövqəladə qüvvələri olan, üstün ağıl sahibi olan və hökmranlığını qurmuş olan, ən uca üfüqün sahibi olan, quluna, **14** axırıncı gilas ağacının yanında **15** *–ki burada oturmağa layiq bir dincəlmə yeri var–* vəhy etdiyini vəhy etdi.[54] **16** O zaman gilas ağacını bürüyən bürümüşdü. **11** Qulun qəlbi, gördüyünü yalan saymadı. **12** Onun gördüyü şey barəsində şübhənizmi var / Onun gördüyü şey barəsində onunla mübahisəmi edirsiniz?

**13** And olsun ki, onu başqa bir enişdə yenə gördü. **17** Göz yanılmadı və azmadı. **18** And olsun ki, Rəbbinin nişanələrinin / işarətlərinin ən böyüyünü gördü.

....

●[**15-21** Quranı eşitməmək üçün gizlənənlərin, qaçanların halını, həqiqəti ört-basdır etməyin – cəhalətin gedişini, aydınlığın – yetkinliyin gəlişini[36] sübut gətirirəm ki, həqiqətən bu, qüvvətli, ərşin / ən uca taxtın[37] sahibinin yanında böyük qiyməti olan, itaət edilən, etibarlı, dəyərli bir elçinin sözüdür.[38] **22** Dostunuz gizli güclər tərəfindən dəstəklənən / dəli olan bir insan deyil. **23** And olsun ki O, gördüklərini özü açıq-aşkar üfüqdə ikən; qəlbi tərəddüd etmədən, gözü yanılmadan və həddi aşmadan gördü. **24** O, heç kəsin görmədiyi, eşitmədiyi, duymadığı, ona verilən vəhylər barəsində xəsis də deyildir. **25** Bu, onun öz düşüncə qabiliyyətinin məhsulu olan bir söz də[39] deyil.]●

(23 / 53, Nəcm: / 1-10, 14-16, 11-13, 17-18, Tekvir/ 15-25)

## Nəcm: 38

**19,20** Buna rəğmən, heç düşündünüzmü Lat və Uzzanı, digər üçüncü Mənatı?[55]

**21** Erkək sizin üçün, dişi Allah üçünmü? **22** Əgər bu, bu şəkildə olsa, əskik / haqsız bir bölüşdürmədir. **23** Bunlar, Allah, haqlarında bir dəlil nazil etmədiyi halda, sizin və atalarınızın qoyduğu adlardan başqa şeylər deyildir. And olsun ki, Rəblərindən onlara doğru yolu göstərən gəldiyi halda, onlar sadəcə zənnə, bir də nəfslərinin xoşladığı şeylərə qapılırlar.

**24** Yoxsa insan üçün, hər arzulayıb xəyal etdiyimi var? **25** Axirət də,

dünya da Allahındır.

**26** Və göylərdə elə mələklər[56] var ki, Allahın istədiyi və razı qaldığı kimsəyə icazə verməsindən sonrakı halı istisna olmaqla, yardımları, himayələri[57] heç bir işə yaramaz. **27** O axirətə inanmayanlar, mələkləri həqiqətən dişilərin isimləndirilməsiylə isimləndirirlər. **28** Halbuki onların bu barədə heç bir biliyi yoxdur. Onlar yalnız zənnə qapılırlar. Zənn isə “haqq”dan heç bir şey qazandırmaz.

(23 / 53, Nəcm: / 19-28)

## Nəcm: 39

**29** Bizim öyüdümüzdən / Qurandan uzaq duran və müvəqqəti dünya həyatından başqa bir şey istəməyən kəsdən dərhal uzaqlaş. **30** Onların bilikdən əldə edəcəkləri şey elə budur. Şübhəsiz ki, sənin Rəbbin, yolundan azanı başqalarından daha yaxşı biləndir, doğru yola yönələni də başqalarından daha yaxşı biləndir. (23 / 53, Nəcm: / 29-30)

## Nəcm: 40

**31,32** Göylərdə nə varsa, yerdə nə varsa; əməlləriylə pislik göstərənləri cəzalandırmaq, yaxşılaşdıran-gözəlləşdirən kəsləri, -bəzi kiçik xətalar xaricində- böyük günahlardan və iyrənc əməllərdən çəkinib uzaq duran kəsləri də “ən gözəl” ilə mükafatlandırmaq Allaha məxsusdur. Həqiqətən sənin Rəbbinin məğfirəti genişdir. Sizi, torpaqdan əmələ gətirəndə də, analarınızın bətnində cəninlər/rüşeymlər halında olduğunuz zamanda da ən yaxşı bilən Odur. Elə isə, nəfslərinizi təmizə çıxarmayın. Allahın mühafizəsi altına daxil olan kəsi O daha yaxşı bilir.

**33** Yaxşı, o üz döndərən kimsəni gördünmü / heç düşündünmü? **34** O, bir azca verdi və inadla möhkəm saxladı. **35** Keçmiş və gələcək haqqında məlumatlar onun yanındadırmı ki, o da onları görsün? **36** Yaxud məlumatlanmadımı Musanın səhifəsindəkilərdən? **37** Və o çox vəfalı İbrahimin səhifəsindəkilərdən? **38** *“Həqiqət budur ki, heç bir günahkar başqa bir günahkarın günahını daşımaz.* **39** *Həqiqət budur ki, insan üçün zəhmət çəkib səy göstərdiyindən başqa şey yoxdur.* **40** *Və onun zəhmət çəkib səy göstərməsi tezliklə məlum olacaq.* **41** *Sonra əvəzi ona əskiksiz olaraq veriləcək.* **42** *Heç şübhəsiz, axır dönüş yalnız Rəbbinədir.* **43** *Heç şübhəsiz, güldürən də, ağladan da Odur.* **44** *Heç şübhəsiz, öldürən də, dirildən də Odur.* **45,46** *Heç şübhəsiz, yaratmağı planladığı zaman iki cütü; erkəyi və dişini bir toxumdan / spermadan əmələ gətirən də Odur.* **47** *Heç şübhəsiz,*

*digər yaradılış da yalnız Onun işidir.* **48** *Heç şübhəsiz, varlandıran da, nemət içində üzdürən də Odur.* **49** *Heç şübhəsiz, Şiranın / biliyi, şüurun Rəbbi də Odur."* (23 / 53, Nəcm: / 31-49)

**Nəcm: 41**

**50** Şübhəsiz ki, sənin Rəbbin, daha önc gələn Ad qövmünü dəyişdirdi, məhv etdi. **51** Səmudu da. Beləliklə, geriyə bir şey buraxmadı. **52** Daha öncə də Nuhun qövmünü. Həqiqətən onlar, bəli onlar, Allahın ortaqlarının olduğunu qəbul edərək başqalarından daha çox xəta eləyən, daha azğın kimsələrlər idi. **53** Alt-üst olmuş şəhərləri də O, yerə batırdı. **54** Oranı bürüyən bürüdü. **55** Yaxşı, Rəbbinin gücü çatanların; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansından şübhə edirsən?

**56** Quranda deyilənlər, əvvəlki xəbərdarlıqlar kimi bir xəbərdarlıqdır.

**57** Yaxınlaşan; qiyamət, ölüm yaxınlaşdı. **58** Allahın altındakılardan heç kəs, onu dəf edə bilməz / ona əngəl ola bilməz.

**59** Yaxşı, indi siz bu sözə təəccübmü edirsiniz? **60** Və gülürsünüz, ağlamırsınız. **61** Və siz, ağlınızı layiqincə işlətməyən kimsələrsiniz.

**62** Haydı, Allaha boyun əyib təslimiyyət göstərin və qulluq[58] edin!

(23 / 53, Nəcm: / 50-62)

## ƏBƏSƏ [QAŞQABAĞINI SALLADI] (24 – 80) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 42**

**1,2** O kor adam yanına gəldiyi üçün elçi qaşqabağını salladı və arxa çevirdi.

**3,4** *–Nə bilirsən, bəlkə o da təmizlənəcək, bəlkə öyüd dinləyəcək və bu öyüd ona fayda verəcək.*

**5-7** *Özünü bütün ehtiyacların fövqündə görən o şəxsə gəlincə isə, onun təmizlənməməsində sənin bir məsuliyyətin olmadığı halda, sən üzünü ona çevirirsən.* **8-10** *Ancaq! Biliklə, sevgiylə və hörmətlə ürpərərək qaça-qaça sənə gələn var ha; sən isə ondan asanlıqla uzaqlaşırsan, elə bilirsən ki yaxşı eləmisən.–* (24 / 80, Əbəsə / 1-10)

**Nəcm: 43**

**11-16** Qətiyyən onların düşündüyü kimi deyil! Quran, qiymətli səhifələr içində, ucaldılmış, tərtəmiz təmizlənmiş, möhtərəm, yaxşı yazıçıların əllərində bir düşündürücüdür. İstəyən, onu düşünərək öyüd

alar. (24 / 80, Əbəsə / 11-16)

**Nəcm: 44**

**17** Düzəlməz bir vəziyyətə düşdü o insan! Necə də kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri oldu o insan!

**18** Allah, onu hansı şeydən yaratdı? **19** Bir spermadan! Allah yaratdı,
müəyyən ölçüdə formalaşdırdı, **20** Sonra, yaşadığı müddətdə elçi göndərərək, kitab nazil edərək haqq yolu onun üçün asanlaşdırdı,
**21** Sonra onu öldürdü, qəbrə qoydurdu, **22** Sonra istədiyi zaman dirildib ortaya çıxardı.

**23** Qətiyyən onun düşündüyü kimi deyil! O insan, Allahın ona əmr elədiyini indiyə qədər heç yerinə yetirmədi.

**24** Qoy insan öz yediyinə diqqət yetirsin!

**25** Biz suyu tökdükcə tökdük. **26** Sonra torpağı yardıqca yardıq.

**27-32** Beləliklə yer üzündə, sizin və heyvanlarınızın dolanışığı üçün dənlər / taxıl, üzümlər, yoncalar, zeytunlar, xurmalar, gur otlu, sıx ağaclı bağlar, meyvə və otlaq yetişdirdik.

**33-36** Sonra, şiddətli toqquşmadan çıxan dəhşətli səs eşidiləndə; o elə bir gündür ki, adamlar qardaşından, anasından, atasından, zövcəsindən, oğullarından qaçacaq.

**37** O gün onlardan hər biri üçün yetərincə iş olacaq.

**38,39** O gün parlayan; gülən, müjdə verən üzlər olacaq.

**40,41** Və o gün üzlər də olacaq ki, üstündə toz-torpaq olacaq; toz-torpağı da his basacaq. **42** Bax bunlar, bəli bunlar küfr işləyən;
Allahın ilah və rəbb olduğunu bilərək rədd edən, din-iman bilmədən pisliyə batanlardır. (24 / 80, Əbəsə / 17-42)

## QƏDR [ÖLÇMƏ - QİYMƏT] (25 - 97) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 45**

**1** Həqiqətən Biz, qiymətli səhifələr içindəki Quranı Qədr gecəsində nazil etdik.

**2** Qədr gecəsi nədir; sənə nə bildirdi / öyrətdi?

**3** Qədr gecəsi min aydan daha xeyirlidir.

**4,5** Xəbərçi ayələr,[59] içlərindəki ruh; can verən, canlı saxlayan gücləriylə[60] Rəblərinin izni ilə / məlumatı daxilində, dan yeri sökülənə kimi / aydınlığa qovuşana kimi elə hey enərlər; hər bir iş

barəsində.

*–Salam olsun*[61]*! –* (25 / 97, Qədr, 1-5)

## ŞƏMS [GÜNƏŞ] (26 - 91) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 46**

**1-10** Quranı və onun cəmiyyətə yaydığı aydınlığı, Quranın izindən gedən Elçi və möminləri, Quranın işığı ilə aydınlanan cəmiyyətləri, Quranın işığından məhrum qalan cəmiyyətləri, alimləri və alimləri ucaldan bilikləri, qara cahilləri və qara cahilləri bu hala salan prinsipləri və məfhumları, öz mənliyini tapan kimsələri və mənliklərin tapılmasının amillərini,[62] *–Allah, insana azğınlıq etmək və özünü qorumaq instinktlərini / günah işləmək və Allahın mühafizəsi altına daxil olmaq bacarığını təlqin etmişdir; genlərinə kodladı–* sübut gətirirəm ki, nəfsini təmizləyən həqiqətən qurtulmuşdur. Onu bilərək rədd eləyən isə mütləq ziyana uğramışdır.

**11** Səmud azğınlıq ucbatından yalanladı; **12** Bu qövmün Axirətdə ən bədbəxt olanları / liderləri görəvi qəbul edib getdiyi zaman, **13** Allahın elçisi onlara demişdi: **14** "Allahın dəvəsinə diqqət yetirin!" və "Ona su içmək, yaşamaq üçün imkan verin!"[63]

**15,16** Fəqət onlar, onu yalanladılar, bunun nəticəsindən qorxmayaraq da baldırından kəsərək Allahın dəvəsini öldürdülər.

Rəbləri də günahları ucbatından onları dəyişikliyə, məhvə məruz qoydu, sonra yerlə yeksan etdi. (26 / 91, Şəms / 1-16)

## BURUC [BÜRCLƏR] (27-85) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 47**

**1-3** Quran ayələrini öyrənmiş yaxşı hesab bilənləri, ölüm anını, dəyişikliyə, məhvə məruz qoyulan qövmlərin qalıntılarını və bunları izləyənləri[64] dəlil gətirərəm ki, **12** Rəbbinin qıs-qıvraq şəkildə yaxalaması həqiqətən də çox şiddətlidir. **13** Həqiqətən ilk yaradan, sonra öldürüb təkrarən yaradan yalnız Odur. **14** Və O, çox bağışlayan, çox sevəndir, **15** Ən böyük taxtın[65] sahibidir, şanı şərəfi uca / ehsanı çox olandır, **16** istədiyini ən yüksək dərəcədə edəndir.[66]

(27 / 85, Buruc / 1-3, 12-16)

**Nəcm: 48**

**17,18** O orduların; Firon və Səmudun xəbəri sənə gəldimi? Əlbəttə ki, gəldi!

**4,5** Uxdudun / şiddətlə yanan alovun sahibləri öldürüldü: **6** Hansılar ki, onun üzərində oturmuşdular **7** və möminlərə elədiklərinə şahid idilər. **8,9** Möminlərə cəza verməl追ərinin səbəbi isə onların yalnız çox qüdrətli, tərifə layiq, göylərin və yerin hökmranlığı Özünə məxsus olan və hər şeyə şahid olan Allaha iman etmələrindən başqa bir şey deyildi. (27 / 85, Buruc / 17-18, 4-9)

**Nəcm: 49**

**10** İman edən kişi və qadınlara alovlarda işgəncə edib, sonra da tövbə eləməyənlər üçün şübhəsiz ki, cəhənnəm əzabı var, yanğın əzabı da onlar üçündür. **11** Həqiqətən iman edən və sahmana salmaq məqsədi ilə işlər görənlər üçün altından çaylar axan cənnətlər var. Budur böyük qurtuluş.

**19** Fəqət o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr] hələ də təkzib etməkdədirlər. **20** Halbuki Allah onları arxalarından əhatə edəndir. **21,22** Əksinə, o, qorunmuş lövhədə şərəfli bir Qurandır. (27 / 85, Buruc / 10-11, 19-22)

## TİN [ƏNCİR] (28 - 95) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 50**

**1-3** Egey bölgəsi əhalisini, Aralıq dənizi bölgəsi əhalisini, Yaxın Şərqin əhalisini və Ərəbistanın əhalisini; dünyanın hər yerindəki insanları[67] dəlil gətirirəm ki, **4-6** Həqiqətən Biz, insanı ən gözəl şəkildə yaratdıq, sonra iman edənlər və sahmana salmaq məqsədi ilə işlər görənlər xaricində *–çünki beləleri üçün tükənməz mükafat var–* onu alçaqların ən alçağına çevirdik.

**7** Elə isə, bundan sonra dini / qiyamət gününü yalanlamağa səni məcbur edən nədir?

**8** Allah hakimlərin ən hakimi deyilmi? (28 / 95, Tin / 1-8)

## QURƏYŞ (29-106) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 51**

**1,2** Qureyşin təhlükəsizliyi, salamatlığı; qış və yay; hər zamankı

səfərlərində təhlükəsizlikləri, salamatlıqları üçün… **3,4** Elə isə onları aclıqdan xilas edərək yedirən və hər cür qorxudan əmin-amanlığa çıxaran, bu Evin Rəbbinə[68] qulluq[69] etsinlər. (29 / 106, Qurəyş / 1-4)

## QARİƏ [FƏLAKƏT QAPISINI ŞİDDƏTLƏ DÖYƏN] (30 - 101) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 52**

**1** Qariə![70]

**2** Nədir o qariə?

**3** Qariənin nə olduğunu sənə nə bildirdi?

**4** O gün, insanlar, darmadağın kəpənəklər kimi olarlar. **5** Dağlar da didilmiş rəngli yun kimi olar.

**6** Və dərhal kimin tərəzisi ağır gəlsə, **7** bax o, xoşbəxtlik verən bir yaşayış içindədir. **8** Tərəzisi yüngül gələn isə, **9** bax onun anası uçurumdur / dərin bir çuxurdur. **10** Onun nə olduğunu sənə nə bildirdi?

**11** Qızmar bir atəş! (30 / 101, Qariə / 1-11)

## QİYAMƏ [ÖLÜM VƏ QALXMA] (31 - 75) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 53**

**1** Xeyr, qiyamət gününə dəlil göstərirəm! **2** Xeyr, çox məzəmmət edən o nəfsə də dəlil göstərirəm!

**3** O insan elə güman edir ki, onun sümüklərini qətiyyən bir yerə yığmayacağıq? **4** Bəli, biz onun barmaq uclarını / bütün orqanlarını düzəltməyə qadirik.

**5** Əslində o insan, önünü; qalan ömrünü din-iman tanımayıb pisliyə batmaqla keçirmək istəyir. **6** Soruşur: “Qiyamət günü nə vaxt olacaqmış?”

**7-10** Gözün şimşək kimi çaxdığı, ayın tutulduğu, günəşlə ayın qovuşdurulduğu zaman, bax o gün, insan, “Qaçış harayadır / qaçmalı yer haradadır?” deyər

**11** Qətiyyən onun düşündüyü kimi deyil! Sığınacaq deyə bir şey yoxdur. **12** O gün yalnız Rəbbinə gedib durmaq var / o gün gedib durmalı yer yalnız Rəbbinin hüzurudur.

**13** O gün, o insana, qabaqcadan göndərdiyi şeylər və geriyə buraxdığı şeylər ilə xəbərdar edilər.

**14,15** Əslində insan, bütün üzrxahlıqlarını / bütün pərdələrini ortaya qoysa da, özü əleyhində yaxşı bir nəzarətçidir: **16** *"Onu sürətləndirmək üçün dilini ona tərpətmə!* **17** *Şübhə yoxdur ki, elədiklərini-eləmədiklərini birləşdirmək və toplamaq ancaq Bizə aiddir.*
**18** *Elədirsə, Biz elədiklərini-eləmədiklərini topladığımız zaman, sən onun toplanmasına tamaşa et!* **19** *Sonra, elədiklərini-eləmədiklərini bəyan etmək; dəlilləriylə ortaya qoymaq da ancaq Bizə aiddir."*[71]

**20,21** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Əslində siz, dünyanı sevirsiniz və axirəti buraxırsınız.

**22** Üzlər var ki, o gün; o an nurlu olacaq; **23** Rəblərinə baxarlar; Rəblərindən nemət gözləməkdədirlər.

**24** Və üzlər də var ki, o gün qaşqabaqlıdır; **25** bellərini qıran bir əməliyyata məruz qaldıqlarını zənn edəcəklər.

**26-30** Qətiyyən onların düşündüyü kimi deyil! Körpücük sümüklərinə dirəndiyi, "Çarə edən kimdir?" deyildiyi və can verən kəs bunun o ayrılıq anı olduğunu anladğı və ayaqlar bir-birinə dolaşdığı zaman; bax o gün sürülüb aparılacaq yer ancaq Rəbbinin hüzurudur.

**31** Fəqət o, nə təsdiq etdi, nə də dəstəklədi. **32** Fəqət o, yalan saydı və geri çəkildi. **33** Sonra da özünü darta-darta yaxınlarının yanına getdi.

**34,35** Məhv olmağın çox yaxındır, lap çox yaxındır! Yenə də məhv olmağın çox yaxındır, lap çox yaxındır!

**36** Yoxsa o insan başıboş buraxılacağınımı sanır? **37** O, hazırlanmış mənidən / toxumdan bir nütfə deyildimi? **38** Sonra bir embrion idi və sonra onu yaratmış, sonra da nizama salmışdır; **39** ondan da iki tayı; erkək və dişini var elədi.

**40** Yaxşı, bütün bunları eləyən, ölüləri diriltməyə qadir deyilmi?

(31 / 75, Qiyamə / 1-40)

## HUMƏZƏ (32 - 104) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 54**

**1** Arxadan qeybət edənlərin, qaş-göz işarətləriylə məsxərə edənlərin hamısının vay halına!

**2,3** O ki, mal-dövləti toplayıb, və mal-dövlətinin gerçəkdən onu əbədiyyətə qovuşduracağını sanaraq onu çoxaldan / təkrar-təkrar sayandır.

**4** Qətiyyən onun düşündüyü kimi deyil! Həqiqətən o, Hütəməyə fırlatılıb atılacaqdır.

5 Hütəmənin nə olduğunu sənə nə bildirdi?

6,7 O, Allahın, könüllərin üzərinə dırmaşaraq çıxan, yandırılmış bir atəşdir

8,9 O, uzadılmış dirəklər içində, onların üzərinə qıfıllanmışdır / bağlanmışdır. (32 / 104, Huməzə / 1-9)

## MURSƏLAT (33 - 77) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 55**

1-7 Topa-topa / nəcm-nəcm göndərilib və önünə çıxanları devirdikcə devirən, cəmiyyətləri canlandırdıqca canlandıran, canlandırdıqca da haqqı batildən ayıran, üzr və ya xəbərdarlıq olaraq öyüd verən Quran ayələri dəlildir ki, həqiqətən təhdid olunduğunuz, qorxudulduğunuz şey mütləq meydana gələcəkdir.[72]

8 Ulduzlar silindiyi / məhv edildiyi / uzaqlaşdırıldığı zaman, 9 göy
aralandığı zaman, 10 dağlar səpələndiyi zaman, 11-13 şahidlik edəcək
elçilər şahidlik üçün gözlədiləndə / "ayırd etmə günü" şahidlik vaxtı
müəyyən olunduğu zaman, 14 –*"ayırd etmə günü"nün nə olduğunu
sənə nə bildirdi?*– 15 o gün, yalan sayanların vay halına.

16 Biz, əvvəlkiləri dəyişikliyə / məhvə məruz qoymadıqmı?

17 Sonra, geridəkiləri də onların arxasına qatacağıq. 18 Biz,
günahkarlara bax belə edərik. 19 O gün yalan sayanların vay halına!

20 Biz sizi dəyərsiz bir sudan əmələ gətirmədikmi?

21,22 Sonra onu müəyyən bir ölçüyə / vaxta qədər sağlam bir yerin
içində saxladıq. 23 Deməli, Biz buna qadir olduq. Nə gözəl qadir
olanlarıq Biz. 24 O gün, yalan sayanların vay halına!

25,26 Yer üzünü dirilər və ölülər üçün bir yığışma-saxlanma yeri etmədikmi?

27 Orada çox möhkəm uca dağlar əmələ gətirdik və sizə şirin sular
içirtdik. 28 O gün, yalan sayanların vay halına!

29 Yalan saymaqda olduğunuz o şeyə doğru gedin! 30-31 O üç
qolu-çəngəli olan, kölgə salmayan və alovdan qorumayan bir kölgəyə
doğru gedin!

32 Həqiqətən o, saray kimi qığılcımlar atar / yağdırar; 33 qığılcımlar
sanki sarı erkək dəvələr kimidir. 34 O gün, yalan sayanların vay
halına!

35 Bu, onların danışmayacaqları gündür. 36 Üzr istəmək üçün onlara
icazə də verilməz. 37 O gün, yalan sayanların vay halına!

**38** Bu, sizi və öncəkiləri topladığımız Ayırma Günüdür. **39** Əgər bir hiyləniz varsa, haydı, o hiyləni mənə qarşı tətbiq edin! **40** O gün, yalan sayanların vay halına!

**41,42** Şübhəsiz, Allahın mühafizəsi altına daxil olan kimsələr kölgəliklər, çeşmələr və ürəkləri istəyən meyvələr içindədir. **43** –*"Əməllərinizin müqabilində nuşcanlıqla yeyin, için."*– **44** Biz gözəl davrananları bax belə mükafatlandırarıq. **45** O gün, yalan sayanların vay halına!

**46** Yeyin, faydalanın bir az, şübhəsiz ki, siz günahkarlarsınız. **47** O gün, yalan sayanların vay halına! **48** Onlara, "Allaha ortaq qoşmaqdan uzaq durun" deyildiyi zaman, ortaq qoşmaqdan uzaq durmazlar. **49** O gün, yalan sayanların vay halına!

**50** Qurandan sonra, artıq hansı sözə inanacaqlar. (33 / 77, Mursəlat / 1-50)

## QAF (34 - 50) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 56**

**1** Qaf / 100.[73] Çox şərəfli / şanlı Quran dəlildir ki, **22** həqiqətən sən bundan qafil, xəbərsiz idin. İndi səndən pərdəni götürdük. Bugün artıq gözün kəskindir; Quran sayəsində düzgün qərarlar ala bilən biri oldun.[74]

**2,3** Ancaq onlar, öz içlərindən xəbərdarlıq edən birinin gəlməsinə təəccüb etdilər və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər], "Bu təəccüblü bir şeydir! Öldüyümüz və bir (də) torpaq olduğumuz zamanmı? Bu, uzaq bir qayıdışdır" dedilər.

**4** Biz, yerin onlardan nəyi əskiltdiyini əlbəttə bilirik. Yanımızda da çox yaxşı qeyd edib qoruyan bir kitab var.

**5** Əksinə, haqq onlara gəldiyi zaman onu təkzib etdilər, buna görə də onlar dolaşıq bir işin içindədirlər.

**6** Yaxşı, onlar üstlərindəki göyə baxmadılarmı ki, Biz onu heç yarığı olmadan necə bina etmişik və bəzəmişik? **7,8** Və Biz, Allaha yönələn hər qula qəlb gözünü açmaq və ona öyüd olaraq yeri yayıb döşədik və ona möhkəm dağlar yerləşdirdik. Orada görünüşü iç açıcı, göz alıcı bitkilərin hər cütündən bitirdik, **9-11** Biz, göydən bərəkətli bir su endirdik. Onunla bağlar və biçilən dənlər, qullara ruzi olsun deyə tumurcuqları bir-birinin üstünə düzülmüş böyük və yüksək xurma ağacları bitirdik. Və Biz, onunla ölü bir məmləkəti canlandırdıq. Dirilmə bax belədir.

**12** Onlardan əvvəl Nuhun qövmü, Rəss əhli və Səmud yalanlamışdı.
**13,14** Ad, Firon və Lutun qardaşları, Əykə əhli[75] və Tubbə qövmü də. Bunların hamısı peyğəmbərləri yalanladılar və mənim əzabım gerçəkləşdi.

**15** Məgər Biz, ilk yaradılışda acizlikmi göstərdik? Xeyr, ancaq onlar yeni bir yaradılışdan şübhə içindədirlər.

**16** Və and olsun ki, insanı Biz yaratdıq. Nəfsinin ona nələr pıçıldadığını da bilirik. Və Biz, ona şah damarından daha yaxınıq.
**17, 18** Onun sağında və solunda [hər yanında] yerləşən iki təsbitçi onun hər işini təsbit edərkən, insan elə bir söz söyləməz ki, yanında hazır nəzarət edəni olmasın.

**19** Ölümün sərxoşluğu həqiqətən, haqq olaraq gəlmişdir; *–Ey insan, bax bu, sənin həmişə qaçdığın şeydir.–*

**20** Və sur da üfürülmüşdür.[76] *–Bax bu, vəd olunan təhdid günüdür.–*
**21** Və hər kəs, özüylə bərabər bir sürücü (sürüb gətirən) və bir şahid olaraq gəldi.

**23** Və onun yaşıdı olan yoldaşı / İblis dedi ki: "Budur, yanımdakı hazırdır."

**24,25** *"–Haydı, İblis və şahid; ikiniz, bütün inadcıl, kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən], hər bir xeyrə əngəl olan, özünə zülm edən və şəkk edən o kəsləri atın cəhənnəmə!* **26** *O ki, Allahla yanaşı özünə başqa bir ilah qəbul etmişdi. Haydı, ikiniz birlikdə, onu şiddətli əzabın içinə atın!–"*

**27** Onun yaşıdı olan yoldaşı / İblis dedi ki: "Rəbbimiz, mən onu azdırmadım. Fəqət özü uzaq bir azğınlıq içindəydi."

**28** Allah dedi ki: "Mənim hüzurumda mübahisə etməyin! Mən sizə əvvəlcədən təhdit / xəbərdarlıq göndərmişdim. **29** Mənim hüzurumda
Söz[77] dəyişdirilməz. Və Mən, qətiyyən qullara qarşı yanlış iş görən; etdikləri yaxşı əməlləri nöqsanlaşdıran, haqsızlıq edən biri deyiləm."

**30** Biz, o gün cəhənnəmə, "Doldunmu?" deyərik. O isə, "Yenə varmı?" deyər.

**31** Cənnət də Allahın mühafizəsi altına daxil olan kəslərə uzaq olmayıb, yaxınlaşdırılmışdır.

**32-35** Bax bu, ən çox yönələn və ən çox qoruyan Rəhmandan; yaratdığı bütün canlılara dünyada ən çox mərhəmət edən Allahdan görülmədiyi, duyulmadığı, sezilmədiyi yerlərdə belə, hörmətlə, sevgiylə və biliklə ürpərən və könüldən bağlı olan hər kəs üçün verilən sözdür. *–"Salam ilə oraya daxil olun. Bax bu, sonsuzluq günüdür."–* Orada onlar üçün istədikləri hər şey var. Qatımızda daha artığı da var.

**36** Biz, onlardan öncə, onlardan daha böyük gücə sahib olan neçə nəsilləri dəyişdirdik, məhv etdik. Belə ki, onlar məmləkətləri dəlik-deşik eləyirdilər. Heç qaçıb qurtulacaq yer varmı?

**37** Həqiqətən bunda, ağlı, idrakı, vicdanı olan və ya özü şahid olaraq qulaq verən kimsə üçün əlbəttə öyüd vardır.

**38** Və həqiqətən Biz, göyləri, yeri və ikisinin arasında olanları altı mərhələdə yaratdıq. Və Bizə heç bir yorğunluq toxunmadı.

**39,40** Elə isə, sən onların dediklərinə qarşı səbrli ol. Və günəşin doğmasından öncə və batmasından öncə və gecədən bir bölümdə; hər fürsətdə Rəbbini mədh edərək pak tut. Və boyun əyib təslim olmaların / razı olmaların ardınca; inkar edənə iman etdirdikdən sonra da Onu pak tut.

**41** Və sən, bir carçının yaxın bir yerdən car çəkəcəyi günə qulaq ver;
**42** O gün, o harayı gerçək olaraq eşidərlər. Bax bu, çıxış, dirilmə günüdür.

**43** Həqiqətən Biz, bəli biz, həyat bəxş edirik və öldürürük. Dönüş də yanlız Bizədir.

**44** O gün yer onlardan tez yarılar. Bax bu, ancaq Bizim üçün asan olan bir toplamadır.

**45** Biz, onların dediklərini daha yaxşı bilirik. Və sən, onların üzərində zor tətbiq edən deyilsən. Elə isə sən, Mənim təhdidimdən qorxan kimsələrə Quran ilə öyüd ver. (34 / 50, Qaf / 1,22,2-45)

## BƏLƏD (35-90) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 57

**1-4** Düşündüyünüz kimi deyil; bu şəhərdə yaşayan bütün insanları, ilk insandan bu yana törəyib gəlmiş bütün insanları sübut gətiririəm ki, Biz insanı həqiqətən bir sıxıntı içində yaratdıq. Sən də bu insanlardan birisən; sən də sıxıntı içində olacaqsan.[78] (35 / 90, Bələd / 1-4)

### Nəcm: 58

**5** O, elə güman edir ki, heç kəsin ona gücü çatmayacaq;
**6** "Mən çoxlu mal-dövlət tələf etdim" deyir! **7** O, elə güman edir ki, heç kəs onu görmür?
**8,9** Biz ona iki göz, bir dil və iki dodaq vermədikmi?
**10** Və Biz ona açıq iki yolu göstərdik.
**11** Fəqət o, o çətin / dik yoxuşa can atmadı.
**12** Və o çətin / dik yoxuşun nə olduğunu sənə nə bildirdi?
**13** Bir kölə azad etməkdir **14,15** və ya hər yeri qıtlıq bürüyən bir

gündə yaxınında olan bir yetimə **16** və ya torpaqlığa sərilmiş; sürünən yoxsula, işsizə yemək yedirməkdir. **17** Sonra da iman edib səbri tövsiyə edənlərdən və mərhəməti tövsiyə edənlərdən olmaqdır.
**18** Bax bunlar, səadətə və uca mərtəbəyə çatanlardır.
**19** Ayələrimizi ört-basdır edənlər uğursuzların-talehsizlərin özüdür ki var. **20** Onların üzərində, qapıları möhkəm bağlanmış bir od var.
(35 / 90, Bələd / 5-20)

## TARİQ (36 – 86) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 59**

**1-4** Alimlər və Tariq; dəlib keçən Quran ayələri qrupu şahiddir ki, həqiqətən mənliyini tamamlamış hər varlığın üzərində müəyyən qoruyucular var.[79]

**5** Onun üçün, insan nədən yaradıldığına bir baxsın; **6,7** onurğa ilə köks sümükləri arasından çıxan, atıcı / püskürdücü bir sudan; "estrogen" və "testosteron"dan başlanaraq yaradıldı.

**8,9** Şübhəsiz ki, o Yaradan, bütün sirlərin aşkar olacağı gündə, onu geri qaytarmağa qadirdir. **10** Artıq onun üçün nə hər hansı bir qüvvə, nə də hər hansı bir yardımçı var.

**11-14** Öldükdən sonra diriləcəyinə iman edən alimlərin, cahil, etiqadsız kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] halı dəlildir ki, o, həqiqətən ayırıcı bir qərardır. Və o bir zarafat deyildir.[80]

**15** Şübhəsiz onlar, olduqca hiylə qururlar. **16** Mən də onları cəzalandırıram.[81]

**17** Elə isə sən kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] möhlət ver, onlara bir azca vaxt tanı. (36 / 86, Tariq / 1-17)

## QƏMƏR (37 - 54) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 60**

**1** O saat / qiyamətin qopma anı yaxınlaşdırıldı. Və hər şey aşkara çıxardıldı.[82]

**2** Onlar isə bir əlamət / işarət görsələr, dərhal üz döndərirlər və "Davam edib gedən bir sehrdir" deyirlər.

**3-5** Quranda onlara verilən hər əmr "qərarlaşdırılmış, ən üstün səviyyədə yetərli, haqsızlıq və hərc-mərcliyi əngəlləmək üçün qoyulan bir qanun, qayda və prinsip" olduğu halda, onlar yalanladılar və öz

ehtiraslarına tabe oldular. Şübhəsiz ki, onlara, çəkindirən xəbərlər də gəlmişdi. Buna baxmayaraq, xəbərdarlıqlar fayda etmir.

**6-8** Elə isə onlardan geri çəkil. O gündə, Carçının bilinməyən / yadırğanan bir şeyə çağırdığı o gündə gözləri aşağı dikmiş olaraq o dəvətçiyə sürətlə qaçaraq qəbirlərindən çıxarlar. Sanki onlar darmadağın çəyirtkələr kimidirlər. O kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] "Bu, çətin bir gündür" deyərlər.

**9** Onlardan öncə Nuhun qövmü də yalanlamışdı. Elə ki, qulumuzu yalanladılar və "O, gizli güclər tərəfindən dəstəklənən / dəli biridir" dedilər. Və onun qarşısını almışdılar; bütün fəaliyyətinə əngəl olunmuşdu.

**10** Belə olduqda, Nuh, Rəbbinə yalvardı: "Mən həqiqətən məğlubiyyətə uğradıldım, mənə yardım et!"

**11** Biz də dərhal sel kimi axan bir su ilə göyün qapılarını açdıq.

**12** Yerdən də qaynaqlar fışqırtdıq; beləliklə sular müəyyən edilmiş bir iş üçün bir-birinə qovuşdu.

**13,14** Nuhu da, nankorluq edilən kəsə bir mükafat olsun deye, qorumamız / nəzarətimiz altında axıb gedən lövhələri; taxtaları və mismarları / ipləri olan xilasetmə qayığı / kiçik bir gəmi üzərində daşıdıq.

**15** And olsun ki, Biz, Bunu bir ayə olaraq saxladıq. Elə isə, ibrət alıb düşünən varmı?

**16** Bəs Mənim əzabım və xəbərdarlıqlarım necə imiş?

**17** And olsun ki, Biz, Quranı düşünmək / öyüd üçün asanlaşdırdıq / hazırladıq. Elə isə, ibrət alıb düşünən varmı?

**18** Ad da təkzib etdi. Bəs Mənim əzabım və xəbərdarlıqlarım necə imiş?

**19,20** Şübhəsiz Biz, onların üstünə uğursuz, uzun bir gündə dondurucu / uğultulu, insanları qopardıb atan bir külək göndərdik; sanki onlar kökündən çıxarılmış xurma kötükləri kimi idilər.

**21** Bəs Mənim əzabım və xəbərdarlıqlarım necə imiş?

**22** And olsun ki, Biz, Quranı düşünmək / öyüd üçün asanlaşdırdıq / hazırladıq. Elə isə, ibrət alıb düşünən varmı?

**23** Səmud da o xəbərdarlıqları yalan saydı: **24,25** *"Aramızdan bir nəfərə, ona tabe olacağıqmı? Elə etsək, şübhəsiz bir azğınlıq və qudurğanlıq etmiş olarıq, Öyüd; Kitab aramızdan onamı verildi? Xeyr, əksinə, o, çox yalançı, təkəbbürlüdür."* dedilər.

**26** Sabah onlar, çox yalançının, təkəbbürlünün kim olduğunu
biləcəklər. **27,28** Şübhəsiz biz onlara, özlərinə görəv olsun deyə, sosial

dəstək qurumları qurmalarını[83] və onları ayaqda tutmalarını əmr edəcəyik.

Onun üçün sən onları müşahidə et və səbr göstər. Və onlara, bu qurumları ayaqda tutacaq zəkat; vergi və xərclərin öz aralarında bölüşdürüldüyünü xəbər ver; hər kəsin ictimai dəstək qurumuna nə qədər töhfə verəcəyi də müəyyənləşdirilmişdir.

**29** Bunun üzərinə, yoldaşlarına / idarəçilərinə səsləndilər. O da alacağını alıb sosial qurumları ayaqda tutan gəlir qaynaqlarını qurudaraq sistemi çökdürdü.

**30** Bəs, əzabım və xəbərdarlıqlar necə imiş?

**31** Şübhəsiz Biz, onların üzərinə bircə qorxunc səs göndərdik; (heyvanlar üçün) ağıl düzəldən kəsin yığdığı kol-kos kimi oldular.

**32** And olsun ki, Biz, Quranı düşünmək / öyüd üçün asanlaşdırdıq / hazırladıq. Elə isə, ibrət alıb düşünən varmı?

**33** Lutun qövmü, xəbərdarlıqları yalan saydı. **34,35** Biz onların üstünə kiçik daş yağdıran bir fırtına göndərdik. Lutun ailəsi bundan ayrı saxlanıldı. Onları, dərgahımızdan bir nemət olaraq, səhər vaxtı xilas etdik; Biz, özünə verilən nemətlərin qarşılığını ödəyən kimsəni beləcə mükafatlandırarıq.

**36** And olsun ki, Lut, onlara xəbərdarlıq etmişdi Bizim yaxalamağımız (cəzalandırmağımız) barədə. Fəqət onlar xəbərdarlıqları şübhə ilə qarşıladılar
**37** və and olsun ki, onun qonaqlarından cinsi yöndən faydalanmağa çalışdılar. Biz də onların gözlərini kor etdik / qəbilələrini, nəsillərini silib-süpürdük:

**38** “Haydı, əzabımı və xəbərdarlıqlarımı dadın!”
**39** Və and olsun ki, səhər tezdən, qərarlı bir əzab onların başının üstünü kəsdirdi: “Haydı, əzabımı və xəbərdarlıqlarımı dadın!”

**40** And olsun ki, Biz, Quranı düşünmək / öyüd üçün asanlaşdırdıq / hazırladıq. Elə isə, ibrət alıb düşünən varmı?

**41** Şübhəsiz Fironun ailəsinə də xəbərdarlıq edənlər gəlmişdi.
**42** Onlar bütün ayələrimizi yalanladılarr. Biz də onları çox qüvvətli və qüdrətli birinin yaxalamasıyla yaxaladıq.

**43** Sizin kafirləriniz [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələriniz] onlardan xeyrlidirmi? Yoxsa kitabələrdə sizin üçün onların qurtulacaqlarına dair Allah tərəfindən verilmiş bir sənəd və ya fərmanmı var?
**44** Yoxsa onlar, “Biz bir-birinə yardım edən / intiqam ala bilən bir topluluğuq” deyirlər?

**45** Yaxında o topluluq darmadağın olacaq və arxalarını çevirib qaçacaqlar.

46 Əslində onlara vəd edilən, o saatdır. O saat inanın ki, daha fəlakətli və daha ağrılıdır.

47 Günahkarlar şübhəsiz ki, azğınlıq və qudurğanlıq içindədirlər.

48 O gün, üzləri üstə atəşdə sürüklənərlər: "Cəhənnəmin beyinləri qaynadan istisinin təmasını dadın!" (37 / 54, Qəmər / 1-48)

## Nəcm: 61

49 Həqiqətən Biz, hər şeyi; bəli, hər şeyi bir ölçü və tənzimləmə ilə yaratdıq.

50 Və əmrimiz, bir dəfə göz qırpmaq kimidir; bir anlıq şeydir.

51 Və and olsun ki, Biz, sizin kimiləri dəyişikliyə, məhvə məruz qoyduq. Elə isə, bir düşünən varmı?

52 Onların etdiyi hər şey yazılı sənədlərdə qeyd edilmişdir. 53 Kiçiyi
də, böyüyü də, hamısı sətir-sətir yazılmışdır.

54 Şübhəsiz ki, Allahın mühafizəsi altına daxil olan kimsələr
cənnətlərdədir, çaylardadır / aydınlıqlardadır. 55 Çox güclü sahibin,
idarəçinin hüzurunda "doğruluğun oturma məqamında"; doğru
kimsələrə məxsus olan, yalan söylənməsi mümkün olmayan, yox olma
ehtimalı olmayan sabit məqamlardadırlar. (37 / 54, Qəmər / 49-55)

## SAD (38 - 38) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

## Nəcm: 62

1 Sad / 90.[84] Öyüd / şərəf sahibi Quran dəlildir ki, 3 onlardan öncə
neçə-neçə nəsilləri dəyişikliyə, məhvə məhkum etdik Biz. Onlar da
haray salmışdılar. Amma artıq qurtuluş vaxtı deyildi. 2 Əksinə, o
kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr]
bir qürur və bölünmə (parçalanma) içindədirlər.[85]

4,5 Və öz içlərindən onlara xəbərdarlıq edən birinin gəlməsinə təəccüb etdilər o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr], "Bu bir sehrbazdır, həddən artıq yalan danışan birisidir. O bu qədər ilahı, bir ilahmı etmiş? Həqiqətən bu, çox təəccüb ediləsi bir şeydir!" dedilər.

6-8 Və içlərindən adlı-sanlı adamlar irəli gələrək: "İlahlarınız üzərində möhkəm dayanın və sözünüzdən, qərarınızdan dönməyin. Həqiqətən bu, sizdən gözlənilən bir şeydir! Biz bunu sonuncu / başqa bir dində eşitmədik, bu ancaq bir uydurmadır. Öyüd / Kitab aramızdan onun üzərinəmi nazil oldu?" *–Əksinə, onlar Mənim öyüdüm / Quran*

*barəsində yetərsiz məlumata sahibdirlər, əksinə, onlar hələ əzabımı dadmadılar.–*

**9-11** Yoxsa çox güclü və çox əta edən Rəbbinin rəhmət xəzinələri onların yanındadır? Və ya bütün o göylərin, yerin və aralarında olanların mülkü onlarındırmı? Elə isə, burada müxtəlif firqələrdən meydana gələn, məğlubiyyətə uğrayacaq bir ordu olan onlar, hər yolu təcrübədən keçirdərək yüksəlsinlər, əllərindən gələn hər şeyi təcrübədən keçirsinlər!

**12,13** Onlardan öncə Nuhun qövmü, Ad, dirəklər sahibi; möhtəşəm orduları olan / görülməmiş işgəncələr edən[86] Firon, Səmud, Lutun qövmü və Əykə əhli[87] də yalanladılar. Bax Onlar, ayrı-ayrı baş çəkən qruplardır.

**14** Onların hamısı, sadəcə elçiləri yalanladılar. Bu səbəblə əzabım haqq oldu. **15** Və bunlar, göz qırpacaq qədər belə gecikməsi olmayan bir çığlıqdan başqasını gözləmirlər.

**16** Və dedilər ki: "Rəbbimiz! Bizim əzab payımızı tezliklə, Haqq-hesab günündən öncə ver bizə!" (38 / 38, Sad / 1, 3, 2, 4-16)

## Nəcm: 63

**17** Sən onların dediklərinə səbr et və güclərin sahibi qulumuz Davudu yadına sal. Həqiqətən o, daha çox Rəbbinə üz tutardı.

**18** Həqiqətən Biz, dağlara boyun əydirdik / insanların faydalanmasına uyğun bir formada yaratdıq. Həmişə onunla birgə Allahı nöqsanlıqlardan pak tutardılar. **19** Quşların da hamısını ona boyun əydirmişdik / Davudun və insanların faydalanmasına uyğun bir formada yaratmışdıq. Hamısı ona tərəf yönəlməkdə idi. **20** Biz, onun mülkünü də möhkəmləndirdik. Və ona qanunu və haqqı batildən ayıran sözü söyləmək imkanını verdik.

**21** Və sənə bu iddiaçıların xəbəri gəldimi? Onlar mehraba / Davudun xüsusi evinə çıxmışdılar.

**22,23** Davudun yanına daxil olduqları vaxt, o, onlardan qorxmuşdu. Ona, "Qorxma! Biz iki iddiaçıyıq. Hansımızsa hansımıza haqsızlıq etdik. İndi sən aramızda haqq ilə hökm ver, haqsızlıq etmə və bizi doğru yolun ortasına yönəlt." dedilər. Biri də dedi ki: "Bax, bu, mənim qardaşımdır. Onun doxsan doqquz qoyunu var, mənim isə bircə qoyunum var. Belə olduğu halda, 'onu da mənə ver', dedi və danışıqda mənə üstün gəldi / mübahisədə məni məğlub etdi."

**24** Davud dedi ki: "Həqiqətən, sənin bir qoyununu öz qoyunlarına qatmaq istəməklə o, sənə haqsızlıq etmişdir. Həqiqətən ortaqların, eyni

cəmiyyətdə yaşayanların çoxu mütləq bir-birinə haqsızlıq edir. Ancaq iman gətirənlər və sahmana salmaq məqsədi ilə işlər görən kimsələr haqsızlıq etməz. Amma onlar da nə qədər azdır!" Və Davud, Bizim onu müəyyən sıxıntılarla imtahan edərək, tərtəmiz vəziyyətə gətirdiyimizə / kamilləşdirdiyimizə qəti qənaət gətirdi və başa düşdü. Dərhal Rəbbindən bağışlanmaq dilədi, ortaq qoşmaqdan uzaq olaraq yerə qapandı və döndü.

**25** Biz də onun üçün bunu bağışladıq / Biz də onu bağışladıq. Bax belə! Şübhəsiz ki, yanımızda onun üçün bir yaxınlıq və gözəl bir dönüş yeri vardır.

**26** Ey Davud! Həqiqətən Biz / biz səni bu yerdə keçmiş yönəticinin yerinə yönətiçi təyin etdik. Elə isə insanlar arasında haqq vasitəsi ilə haqsızlığa və hərc-mərcliyə əngəl olub ədaləti təmin et. Kefə, arzuya qapılma. O təqdirdə səni Allahın yolundan azdırar. Həqiqətən Allahın yolundan azanlar haqq-hesab gününə əhəmiyyət vermədiklərindən, onlar üçün çox şiddətli bir əzab vardır.

**30** Davuda Süleymanı da bəxş etdik. O, nə gözəl quldu! Şübhəsiz, o, Rəbbinə daha çox dönən (yönələn) idi.

**31** Axşamüstü ona yaxşı cins və yorğa atlar təqdim edilmişdir;

**32** "Mən, mal-dövlət, mənfəət sevgisini, Rəbbimin zikr edilməsi səbəbindən sevdim." *–Sonunda, onlar pərdənin arxasına girdilər.–*

**33** "Onları mənim yanıma geri qaytarın!" dedi. Dərhal onların ayaqlarını, boyunlarını sığallamağa başladı.

**34,35** And olsun ki, Biz Süleymanı da müxtəlif təhlükələrdən, çətinliklərdən keçirərək saflaşdırmışdıq / kamilləşdirmişdik. Və taxtının üstünə bir cəsəd qoymuşduq. Sonra o, qayıtdı;

"Ey Rəbbim! Məni qoru / mənə maddi və mənəvi pislik bulaşdırma və mənə, məndən sonra heç kimsəyə yaraşmayan bir mülk hibə et / bağışla! Həqiqətən Sən, bol-bol hibə edənsən / bağışlayansan." dedi.

**36-38** Bunun üzərinə Biz də, onun əmri ilə istədiyi yerə sakitcə axıb gedən küləyi, şeytanları; bütün dalğıcları, bina ustalarını və zəncirlərə bağlanmış olan digərlərini onun əmrinə verdik.

**39** *–Bax bu, bizim saysız-hesabsız ehsanımızdır. Artıq sən istəsən başqalarına ver və ya verməyib saxla.–*

**40** Şübhəsiz ki, onun üçün yanımızda bir yaxınlıq və gözəl bir donüş yeri vardır.

**41** Qulumuz Əyyubu da yada sal! Bir zaman o, Rəbbinə səslənmişdi: "Şeytan mənə üzüntü, dərd və gələcək qorxusu toxundurdu."

**42** *–Oradan dərhal, sürətlə, piyada uzaqlaş! Bax, yuyunmalı bir yer və içməyə soyuq bir şey!”–*

**43** Və Biz ona, ailəsini və onlarla birlikdə olanların bir qatını da bəxş etdik ki, dərgahımızdan bir mərhəmət və dərk etmə qabiliyyəti olanlar üçün bir ibrət olsun.

**44** “Və əlinə bir tutam (bir avuc içi və ya bir çimdik) ot hökmündəki sərmayəni / ədviyyatçılıq üçün nanə, reyhan dəstəsi al, ruzi axtarmaq məqsədi ilə onunla dərhal səfərə çıx və qərarsız olma, haqq yoldan azma, günah işləmə.” Həqiqətən Biz, onu səbrli biri olaraq gördük. O, nə gözəl quldu! Şübhəsiz, o, Rəbbinə daha çox dönəndir (yönələndir).

**45** Qüvvət və bəsirət sahibi olan qullarımız İbrahimi, İshaqı və Yəqubu da xatırla!

**46** Həqiqətən, Biz onları “yurd düşüncəsi / azad vətən həsrəti” saflığıyla saflaşdırdıq, tərtəmiz bir hala gətirdik.

**47** Və şübhəsiz ki, onlar, Bizim yanımızda seçilmiş ən xeyrli kimsələrdəndir.

**48** İsmaili, Əl-Yəsəni, Zülkifli də yada sal. Hamısı da xeyrli kimsələrdəndir. (38 / 38, Sad / 17-26, 30-48)

## Nəcm: 64

**27** Və Biz göyü, yeri və onların arasında olanları boş-boşuna yaratmadıq. Bu, kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] zənnidir. Cəhənnəm alovuna görə bu kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] vay halına!

**28** Yoxsa, iman edən və salihatı (saleh əməlləri) işləyənləri Biz, yer üzündəki o fəsadçılarla eyni tutarıqmı? Yoxsa Allahın mühafizəsi altına daxil olan o kimsələri, din-iman tanımayıb pisliyə batanlarla eyni tutarıqmı?

**29** Bu, təmiz ağıl sahibləri onun ayələrini (arxa-arxaya düzərək) düşünsünlər və öyüd alsınlar deyə, sənə nazil etdiyimiz bərəkətli bir kitabdır.[88]

**49-52** Bax bu, bir öyüddür / şərəfdir / xatırlatmadır. Şübhəsiz ki, Allahın mühafizəsi altına daxil olan kimsələrlər üçün gözəl bir dönüş yeri; içində söykənərək bir çox meyvə və içkilər istədikləri və həm də yanlarında hamısı eyni yaşda, gözləri qarşılarındakından başqasını görməyən xidmətçilərin olduğu, qapıları onlara açılmış Ədn cənnətləri vardır.

**53** Bax bu, haqq-hesab günü üçün sizə vəd ediləndir. **54** *–Heç şübhəsiz ki, bu Bizim ruzimizdir; o, bitməz-tükənməzdir.–*

**55,56** Bax belə! Şübhəsiz, azğınlar üçün də ən pis dönüş yeri; özünə söykəndikləri cəhənnəm vardır. *–O nə pis yataqdır.–* **57** Bax o, qaynar su və irindir. Artıq onu dadıb dursunlar!

**58** Və onun şəklindən cüt-cüt digərləri vardır. **59** Bax bunlar da sizinlə birlikdə, atılarcasına girən bir qrupdur. Onlara bir rahatlıq yoxdur. Şübhəsiz, onlar, cəhənnəmə sallandılar.

**60** Deyərlər ki: "Xeyr, əsil sizə mərhəba; salam, sabah yoxdur. Cəhənnəmi önümüzə siz gətirdiniz. O nə pis bir dayanacaqdır!"

**61** Deyərlər ki: "Rəbbimiz! Bizim önümüzə bunu kim gətirdisə, onun oddakı əzabını qatbaqat artır!"

**62** Və yenə deyərlər ki: "Özlərini pislərdən saydığımız bəzi adamları niyə görə bilmirik? **63** Biz onları məsxərəyə qoymuşduq / təhqir etmişdik. Yoxsa onlar gözlərimizdən qaçdımı?"

**64** Şübhəsiz ki, bu, atəş əhlinin bir-biri ilə çəkişməsi / davalaşması gerçəkdir. (38 / 38, Sad / 27-29, 49-64)

## Nəcm: 65

**65,66** De ki: "Mən ancaq xəbərdarlıq edənəm. Və O, tək olan və qəhr edən, göylərin, yerin və bu ikisinin arasında olan şeylərin Rəbbi, çox güclü, çox bağışlayıcı olan Allahdan başqa tanrı yoxdur."

**67** De ki: "O; Quran, çox böyük, önəmli bir xəbərdir. **68** Siz ondan üz çevirirsiniz. **69** Onlar bir-birləriylə mübahisə edərkən, mənim, "ən üstün şeylərin doldurulduğu; Qurana[89] dair bir biliyim yox idi. **70** Ancaq mən, bəli mən açıq-aşkar bir xəbərdaredən olduğum üçün, mənə vəhy edilir." (38 / 38, Sad / 65-70)

## Nəcm: 66

**71,72** Bir vaxt Rəbbin, kainatdakı güclərə,[90] "Şübhəsiz Mən palçıqdan bir bəşər yaradacağam. Onu düzgünləşdirib bilikli hala gətirdiyimdə,[91] dərhal ona boyun əyib təslim olun [təslim olanlar olaraq yerlə bir olun; heçləşin]." demişdi.

**73,74** Belə olduqda İblis / düşüncə qabiliyyəti[92] xaric, kainatdakı güclərin hamısı birlikdə boyun əyib təslimiyyət göstərdilər, İblis təkəbbür göstərdi və o, görməzdən gələnlərdən idi.

**75** Allah: "Ey İblis! O Mənim iki əlimlə / qüdrətimlə yaratdığıma boyun əyib təslim olmana nə əngəl oldu? Təkəbbür göstərdinmi? Yoxsa yüksək dərəcələrdə olanlardanmı oldun?" dedi.

**76** İblis dedi ki: "Mən ondan xeyirliyəm. Məni enerjidən yaratdın, onu

isə maddədən[93] yaratdın.”

**77,78** Allah: “Dərhal çıx oradan, artıq sən qəti surətdə qovulmusan, / qatilin, yalan söz və düşüncə uyduranın, qaranlığa daş atanın birisən, “əlbəttə qarşılıq gününə qədər səni xeyirdən uzaq qalmağa məhkum etdim”” dedi.

**79** İblis: “Rəbbim! Elə isə, təkrar dirildiləcəkləri günə qədər mənə möhlət ver” dedi.

**80,81** Allah: “Haydı, sən, müəyyən vaxta qədər möhlət verilənlərdənsən” dedi.

**82,83** İblis: “Elə isə, ən üstünlüyünə, ən qüdrətliliyinə, ən şərəfliliyinə, ən məğlubedilməzliyinə and içirəm ki, mən onların hamısını *–içlərində təmizlənmiş qulların xaric–* mütləq azdıracağam” dedi.

**84** Allah dedi ki: “Gerçək budur. Mən də bu gerçəyi söyləyirəm:
**85** And olsun ki, cəhənnəmi mütləq səninlə və onların içindən sənə tabe olanlarla; hamınızla dolduracağam.” (38 / 38, Sad / 71-85)

**Nəcm: 67**

**86** De ki: “Mən Qurana qarşı sizdən bir əcr istəmirəm. Mən
məsuliyyət qoyanlardan / özlərindən bir şey uyduranlardan, yük
artıranlardan, iş artıranlardan da deyiləm. **87** Quran, bütün aləmlər
üçün bir öyüddür ancaq. **88** Və onun müdhiş xəbərini bir müddət sonra
mütləq biləcəksiniz.” (38 / 38, Sad / 86-88)

## ƏRAF (39 - 7) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 68**

**1** Əlif / 1, Lam / 30, Mim / 40, Sad / 90.[94]

**2** O, onunla xəbərdar etməyin və inananlara öyüd / xatırlatma üçün
sənə nazil edilən; içinə işlədilən Kitabdır. Onun üçün, ondan köksündə
heç bir sıxıntı olmasın. **3** Rəbbinizdən sizə nazil edilənə tabe olun və
Onun altındakılardan, yol göstərən, yardım edən və qoruyan (himayə edən) sözdə yaxınlara tabe olmayın. Nə qədər az öyüd alırsınız / xatırlayırsınız!

**4** Və Biz, neçə şəhərləri dəyişikliyə, məhvə məruz qoyduq. Əzabımız
bəzilərinə gecə yatarkən, bəzilərinə də gündüz dincələrkən gəlmişdi.
**5** Əzabımız onlara gəldiyində də, “Biz gerçəkdən şirk qoşaraq özlərinə zülm edən kimsələr imişik!” deməkdən başqa bir yalvarışları olmamışdı.

6 And olsun ki, özlərinə elçi göndərilənləri da sorğu-suala çəkəcəyik, and olsun ki, göndərilən elçiləri də sorğu-suala çəkəcəyik.

7 Və and olsun ki, onlara, bir bilik ilə anladacağıq; çünkü Biz, uzaqda olanlar deyildik.

8 Və çəki, o gün haqdır. Kimin tərəziləri / çəkiləri ağır gələrsə, bax onlar qurtulanlardır.

9 Və kimin tərəziləri / çəkiləri yüngül gələrsə, bax onlar, ayələrimizə qarşı zalımlıq etdikləri üçün özlərini ziyana uğradan kimsələrdir.

10 Və heç şübhəsiz, Biz, sizi yer üzündə yerləşdirdik və orada sizə dolanışıqlarla təmin etdik; sizə verilən nemətlərin qarşılığını nə qədər də az ödəyirsiniz! (39 / 7, Əraf / 1-10)

## Nəcm: 69

11 Və heç şübhəsiz, Biz, sizi yaratdıq, sonra sizə surət verdik, sonra da kainatdakı güclərə,[95] "Adəmə / biliklənmiş, vəhy almış insana[96] boyun əyib təslim olun" dedik; İblis / düşüncə qabiliyyəti[97] xaric olmaqla, onlar dərhal boyun əyərək təslim oldular; o, boyun əyib təslim olanlardan olmadı.

12 Allah, "Sənə əmr etdiyim zaman, boyun əyib təslimiyyət göstərməkdən nə saxladı?" dedi. İblis, "Mən ondan xeyirliyəm; məni oddan / enerjidən yaratdın, onu da palçıqdan / maddədən yaratdın" dedi.

13 Allah, "Elə isə oradan dərhal alçal, sənin üçün orada böyüklük göstərmək olmaz, dərhal çıx, sən qəti surətdə alçaqlardansan." dedi.

14 İblis, "Yenidən dirildiləcəkləri günə qədər mənə möhlət ver" dedi.

15 Allah, "Sən möhlət verilmişlərdənsən" dedi.

16,17 İblis, "Elə isə, məni azdırmağına qarşılıq, and olsun ki, mən də, onlar üçün Sənin doğru yolunun üstündə oturacağam, sonra yenə and olsun ki, onların önlərindən, arxalarından, sağlarından, sollarından onlara soxulacağam və Sən, onların çoxunu, onlara verilən nemətlərin qarşılığını ödəyən görməyəcəksən" dedi.

18 Allah, "Haydı, sən məzəmmət olunmuş və qovulmuş olaraq oradan çıx. Onlardan kim sənə tabe olarsa, and olsun ki, sizin hamınızla
cəhənnəmi dolduracağam" 19 və "Ey Adəm / məlumatlanmış, vəhy
almış insan! Sən və zövcən cənnətdə sakin olun, istədiyiniz yerdən yeyin və girift (bir-birinin içinə girərək həll olunmaz dərəcədə qarışıq olan, çaşqın, dolaşıq), mübahisənin qaynağı olan bu şeyə yaxınlaşmayın; malın-mülkün, paranın-pulun[98] düşkünü olmayın, yoxsa yanlış; özünə zərərli iş görənlərdən olarsınız" dedi.

**20** Bundan sonra İblis, onların özlərindən gizli qalan çirkinliklərini onlara göstərmək üçün onlara vəsvəsə verdi. Və “Rəbbiniz, başqa bir səbəbə görə deyil, sırf ikinizin də mələk / iradəsiz güc olmanız ya da sonsuz olaraq qalanlardan / inkişaf etməyən, dəyişməyən bir varlıq olmanız üçün sizi girift (bir-birinin içinə girərək həll olunmaz dərəcədə qarışıq olan, çaşqın, dolaşıq), mübahisənin qaynağı olan bu şeydən; maldan-mülkdən, paradan-puldan çəkindirdi / bunları sizə yasaq etdi” dedi.
**21** Və “Şübhəsiz, mən sizə öyüd verənlərdənəm” deyərək onlara and içdi / dəlillər gətirdi.
**22** Beləcə onları aldadaraq alçaltdı. Onlar girift (bir-birinin içinə girərək həll olunmaz dərəcədə qarışıq olan, çaşqın, dolaşıq), mübahisənin qaynağı olan şeyin; malın-mülkün, paranın-pulun dadına baxınca, hərislikləri (ehtirasları), acgözlülükləri araya girdi və mal-mülk, para-pul istifçiliyinə (gələcəkdə tapılmayacağı və ya bahalı olacağı düşüncəsiylə çox mal yığaraq tükətmək sıxıntısına yol açmağa) başladılar. Rəbləri onlara səsləndi: “Mən sizə mal-mülk, para-pul düşkünü olmağı qadağan etmədimmi və sizə, ‘Bu şeytan şübhəsiz ki, sizin açıq-aşkar düşməninizdir’, demədimmi?”

**23** Onlar / ikisi də, “Ey Rəbbimiz! Biz özümüzə haqsızlıq etdik və əgər bizi bağışlamasan və bizimlə rəhmətinlə rəftar etməsən şübhəsiz ki, ziyana uğrayanlardan olacağıq!” dedilər.

**24** Allah, “Bir-birinizə düşmən olaraq alçalın, sizin üçün yer üzündə bir müddətə qədər qalmaq və faydalanmaq vardır” dedi.

**25** Allah, “Orada yaşayacaqsınız, orada öləcəksiniz və oradan çıxarılacaqsınız” dedi.[99] (39 / 7, Əraf / 11-25)

## Nəcm: 70

**26** Ey Adəm oğulları! Sizə çirkinliklərinizi örtəcək geyim, bəzənmək üçün libas nazil etdik. Və “Allahın mühafizəsi altına daxil olmaq” libası; o, daha xeyrlidir. Bax bu, düşünüb öyüd alarlar deyə Allahın ayələrindəndir.

**27** Ey Adəm oğulları! Şeytan, sizin ata-ananızı, öz çirkinliklərini özlərinə göstərmək üçün libaslarını soyunduraraq cənnətdən çıxartdığı kimi, sizi də fitnəyə salmasın; sizi haqq dindən döndərməsin, aman! Çünkü o və onun qəbiləsi, sizin onları görə bilməyəcəyiniz yerdən sizi görürlər. Biz, şeytanları, iman etməyənlər üçün vəlilər / yol göstərən, yardım edən kimsələr etdik.

**28** Və onlar bir iyrənclik etdikləri zaman, “Atalarımızı bu yolda gördük, bunu bizə Allah əmr etdi” deyərlər. De ki: “Allah iyrəncliyi

əmr etməz. Allaha qarşı bilmədiyiniz şeylərimi deyirsiniz?”

**29** De ki: “Rəbbim həqqaniyyəti (haqqa uyğunluğu) əmr etdi. Hər məscidin yanında;[100] camaat arasında üzünüzü; bütün mənliyinizi Ona doğru çevirin və dini ancaq Ona məxsus edərək Rəbbinizə yalvarın. Sizi ilk dəfə yaratdığı kimi, Ona dönəcəksiniz.”

**30** Bir qrupu doğru yola yönəltdi, bir qrupa da azğınlıq haqq oldu; onlar, Allahın altındakılardan, şeytanları, yol göstərən, yardım edən və qoruyan (himayə edən) yaxınlar bildilər və özlərinin də qəti surətdə göstərilən doğru yolda olduqlarını sanırlar.

**31** Ey Adən oğulları! Hər məscidin yanında; camaat arasında süslərinizi alın, yeyin-için, lakin israfçılıq etməyin; Şübhəsiz Allah israfçıları sevməz.

**32** De ki: “Allahın, qulları üçün üzə çıxartdığı zinətləri və təmiz ruziləri kim haram etmişdir?” De ki: “Bunlar, müvəqqəti dünya həyatında iman efənlər üçündür *–qiyamət günündə yalnız onlara məxsus olacaq.–”* Bax beləcə Biz, ayələri bilən bir topluluğa ətraflı olaraq açıqlayırıq.

**33** De ki: “Rəbbim sadəcə iyrənclikləri; onun açıq və gizli olanını, günahları, haqsız yerə baş qaldırmağı, barəsində heç bir dəlil nazil etmədiyi şeyləri Allaha ortaq qoşmağınızı və Allah haqqında bilmədiyiniz şeyləri söyləməyinizi haram etmişdir.”

**34** Və hər öndərli camaat üçün (müəyyən) bir müddətin sonu vardır. Ona görə müddətləri sona çatdığında, nə bir an təxirə sala bilərlər, nə də önə çəkə bilərlər.

**35** Ey Adəm oğulları! Sizə, öz aranızdan, ayələrimi anladan elçilər gəldiyində, kim Allahın mühafizəsi altına daxil olar və yaxşılaşdırarsa, bax onlara qorxu yoxdur və onlar üzülməyəcəklər.

**36** Ayələrimizi inkar edənlər və onlara qarşı təkəbbür göstərənlər isə,
bax onlar atəşin dostlarıdır. Onlar orada daimi qalacaqlar. **37** Elə isə,
Allaha qarşı yalan uyduran və ya ayələrini yalanlayandan daha yanlış; öz ziyanına iş görən kim ola bilər? Bax onlara Kitabdan payları çatacaqdır; sonunda elçilərimiz, canlarını almaq üzrə onların yanına gəlincə, “Allahın altındakılardan yalvardıqlarınız haradadır?” deyərlər. Onlar, “Yalvardıqlarımız bizdən ayrılıb uzaqlaşdılar” deyərlər və kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] olduqlarına şəxsən özləri şahidlik edərlər.

**38** Allah, “Sizdən öncə gəlib-keçmiş, tanıdığınız və tanımadığınız, atəş içinə girmiş, öndərli topluluqların içinə girin!” deyər. Hər topluluq girdikcə qardaşını özgələşdirərək özündən uzaqlaşdırar. Nəhayət

hamısı oraya toplandıqda, sonrakılar öncəkilər haqqında, "Rəbbimiz, bizi bax bunlar azdırdı. Onlara atəşdən qatbəqat əzab ver" deyərlər. Allah, "Hər kəsə qatbəqatdır, lakin siz bilməyirsiniz" deyər.

**39** Öncəkilər də sonrakılara, "Sizin bizə qarşı üstünlüyünüz yoxdur. O halda, etdiklərinizdən dolayı əzabı dadın" deyərlər. (39 / 7, Əraf / 26-39)

## Nəcm: 71

**40** Ayələrimizi yalanlayan və onlara qarşı təkəbbür göstərən kimsələrə, bax onlara, göyün qapıları açılmayacaq və dəvə / kəndir iynənin gözündən keçmədikcə, onlar cənnətə girməyəcəklər. Biz günahkarları bax belə cəzalandırırıq. **41** Onlar üçün cəhənnəmdən yataqlar, üstlərindən də örtükləri olacaq. Və Biz, zalımları bax belə cəzalandırırıq.

**42,43** İman edənlər və sahmana salmaq məqsədi ilə işlər görənlər; *–Biz, heç kimsəyə gücü yetdiyindən artığını yükləmərik–* bax onlar cənnət dostlarıdır və onlar, orada sonsuz olaraq qalanlardır. Və onların köksündə kindən, küdurətdən, qısqanclıqdan, hiylədən, xainlikdən, qərəzdən nə varsa, çıxarıb atarıq. Onların altlarından çaylar axar. Onlar, "Bütün təriflər, bizə bunun üçün yol göstərən Allaha məxsusdur. Əgər Allah bizə yol göstərməsəydi, biz yönləndirildiyimiz doğru yola çıxa bilməzdik. Şübhəsiz, Rəbbimizin peyğəmbərləri bizə haqqı gətirmişdilər." deyərlər. Və onlara səslənilər: "Budur, sizə cənnət! Etdikləriniz sayəsində buna varis; son sahib oldunuz."

**44,45** Və cənnət əhli atəş əhlinə, "Biz, Rəbbimizin bizə vəd etdiyini doğru gördük. Bəs siz, Rəbbinizin sizə vəd etdiyini doğru gördünüzmü?" deyə səsləndilər. Onlar: "Bəli" dedilər. Aralarında bir carçı, şübhəsiz ki Allahın uzaqlaşdırmasının / rəhmətindən məhrum etməsinin, Allahın yolundan geri çevirib yolun əyri-üyrüsünü istəyən və axirəti bilərək rədd edən zalımların; yanlış, öz ziyanlarına iş görənlərin üstünə olacağını bildirdi.

**50,51** Və atəş əhli, cənnət əhlinə, "Bir az su və ya Allahın sizə ruzi olaraq verdiyi şeylərdən bizə də ötürün" deyə səsləndilər. Onlar da, "Allah, dinlərini alay mövzusuna və əyləncəyə çevirən, bəsit, keçici dünya həyatına aldanan kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] ikisini də gerçəkdən qadağan etmişdir!" dedilər. *–Bu günlə qarşılaşacaqlarına əhəmiyyət vermədikləri, ayələrimizi / əlamətlərimizi / işarətlərimizi bilə-bilə inkar etdikləri kimi, Biz də bu gün onlara əhəmiyyət verməyəcəyik / onları cəzalandıracağıq.–*
**46** Aralarında da bir pərdə var. Və Quranın bölmələri üzərində biliyi

olan kimsələr,[101] onların hamısını əlamətlərindən tanıyırlar. Və Quran biliyinə sahib kimsələr, cənnəti istəyib və hələ girməmiş olan cənnət əhlinə səslənərlər: “Salam olsun sizə!”
47 Gözləri atəş əhlinə çevrilincə, “Rəbbimiz! Bizi bu xainlərlə bir yerə qoyma” deyərlər.
48,49 Quran bölmələrinin biliyinə sahib kimsələr, əlamətlərindən tanıdıqları kimsələrə səslənib, “Topluluğunuz və böyükləndiyiniz şeylər sizə fayda vermədi, Allahın, rəhmətinə *–ki bu rəhmət, Allahın, ‘Girin cənnətə, sizə narahatçılıq yoxdur, üzülməyəcəksiniz də’ deyərək verdiyi sözdür–* nail etməyəcəyinə and içdikləriniz, bunlarmı?” deyərlər.[102] (39 / 7, Əraf / 40-45,50,51,46-49)

## Nəcm: 72

52 Heç şübhəsiz onlara, iman edənlər üçün bir yol göstərən və rəhmət olaraq, tam bir məlumatla müfəssəl izah etdiyimiz bir Kitab gətirmişdik.
53 Onun ön plana çıxmasından (ortalığa qoyulmasından) başqa nə gözləyirlər? Onun ön plana çıxdığı (ortalığa qoyulduğu) gün gəldiyində, əvvəllər ona əhəmiyyət verməyənlər, “Rəbbimizin elçiləri həqiqətən bizə haqqı gətirmişdi. Görəsən bizim üçün vasitəçilik edəcək vasitəçilər varmı? Və ya geri qaytarılıb etdiyimiz əməllərdən başqasını edə bilərikmi?” deyəcəklər. Şübhəsiz, özlərini ziyana uğratmışlar. Uydurduqları şeylər də onlardan ayrılmışdır.
54 Şübhəsiz ki, sizin Rəbbiniz, göyləri və yeri altı mərhələdə yaradan, sonra ən böyük taxt üzərində hökmranlığını quran,[103] gündüzü, dayanmadan sürətlə təqib edən gecə ilə bürüyən və günəşi, ayı, ulduzları əmrinə boyun əymiş olaraq yaradan Allahdır. Yaxşı bilin ki, yaratmaq və sistemlər quraraq onları işlətmək sadəcə Ona məxsusdur. Aləmlərin [104] Rəbbi olan Allah, nə qədər də xeyirxahdır! (39 / 7, Əraf / 52-54)

## Nəcm: 73

55 Rəbbinizə alçala alçala (önə əyilərək) və gizlicə / açıq-aşkar göstərərək dua edin; namaz qılın. Həqiqətən O, həddi aşanları sevməz.
56 Və sahmana salındıqdan sonra yer üzündə fəsad törətməyin. Ona, ürpənərək və rəhmət ümidi ilə dua edin. Həqiqətən Allahın rəhməti yaxşılaşdıranlara-gözəlləşdirənlərə çox yaxındır.[105] (39 / 7, Əraf / 55-56)

## Nəcm: 74

57 Və O, xatırlayarsınız / öyüd alarsınız deyə, rəhmətinin önündə

küləkləri müjdəçilər / paylayıcılar / yayıcılar olmaq üzrə göndərir. O küləklər, yağmur yüklü buludları yüklənincə, onu quraqlıq olan bir məmləkətə göndərir, sonra onunla suyu endiririk. Beləcə, onunla məhsulun hamısından çıxardırıq. Bax Biz, ölüləri də belə çıxaracağıq.
**58** Və gözəl məmləkətin bitkisi, Rəbbinin izni ilə / biliyi ilə çıxar; pis olandan isə faydasız bitkidən başqa bir şey çıxmaz. Biz, özünə verilən nemətlərin qarşılığını ödəyən bir topluluq üçün ayələri beləcə cürbəcür, təkrar-təkrar açıqlayırıq. (39 / 7, Əraf / 57-58)

## Nəcm: 75

**59** And olsun ki, Biz, Nuhu öz qövmünə elçi göndərdik və o, "Ey qövmüm! Allaha qulluq edin, sizin üçün Ondan başqa bir ilah yoxdur. İnanın ki, mən, ziyanınıza olan, üstünüzə gələcək böyük bir günün əzabından qorxuram" dedi.

**60** Qövmünün başçıları, "Biz səni açıq-aşkar bir azğınlıq içində görürük" dedilər.

**61-63** Nuh dedi ki: "Ey qövmüm! Məndə hər hansısa bir azğınlıq yoxdur. Lakin mən, aləmlərin Rəbbi tərəfindən göndərilmiş bir elçiyəm. Sizə Rəbbimin göndərdiyi gerçəkləri təbliğ edirəm, sizə öyüd verirəm və Allah tərəfindən sizin bilmədiyiniz şeyləri bilirəm Allahın mühafizəsi altına daxil olmağınız və rəhmətə vasil olmağınız üçün, içinizdən sizi xəbərdar edəcək bir nəfərə, Rəbbinizdən bir öyüd / kitab gəlməsinə təəccübləndinizmi?"

**64** Belə olan halda onu yalanladılar, Biz də Nuhu və onunla birlikdə gəmidə olanları xilas etdik, ayələrimizi yalanlayanları da boğduq! Həqiqətən onlar kor bir qövm idilər.

**65** And olsun ki, Ad (qövmünə) də qardaşları Hudu elçi göndərdik. O, "Ey qövmüm! Allaha qulluq edin, sizin üçün Ondan başqa bir ilah yoxdur. Hələ də Allahın mühafizəsi altına daxil olmayacaqsınız?" dedi.

**66** Qövmünün başçıları olan kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr], "Biz səni ağıl sarıdan yüngüllük / cahillik içində görürük və həqiqətən səni yalançılardan sanırıq" dedilər.

**67-69** Hud, "Ey qövmüm! Məndə ağıl sarıdan yüngüllük / cahillik yoxdur, lakin mən aləmlərin Rəbbi tərəfindən göndərilmiş bir elçiyəm. Sizə Rəbbimin göndərdiklərini təbliğ edirəm və mən sizin üçün etibarlı bir öyüdçüyəm. Sizi xəbərdar etməsi üçün içinizdən bir adam üzərinə Rəbbinizdən, sizə bir öyüd / kitab gəlməsinə təəccübləndinizmi? Düşünün ki, O, sizi Nuh qövmündən sonra, xəlifələr, sonradan gələn

nəsillər etdi və yaradılışda boy-buxun baxımından sizi artırdı. Qurtulmanız üçün Allahın nemətlərini xatırlayın.” dedi.

**70** Onlar dedilər ki: “Deməк, sən, Allaha; başqalarını qarışdırmadan qulluq edək və atalarımızın qulluq etdiklərini tərk edək deyəmi bizə gəldin? Əgər doğrulardansansa, bizi təhdid etdiyin şeyi bizə gətir!”

**71** Hud dedi ki: “Artıq sizə Rəbbinizdən bir əzab və qəzəb enmişdir. Allahın onlar haqqında heç bir dəlil endirmədiyi, sadəcə sizin və atalarınızın qoyduğu adlar barəsində mənimlə mübahisəmi edirsiniz? Elə isə gözləyin, şübhəsiz, mən də sizinlə birlikdə gözləyənlərdənəm.”

**72** Beləliklə, Hudu və onunla bərabər olan kimsələri Öz mərhəmətimizlə xilas etdik və ayələrimizi yalanlayan və iman etməyən kimsələrin kökünü kəsdik.

**73** And olsun ki, Biz, Səmuda da qardaşları Salehi elçi olaraq
göndərdik. O dedi ki: “Ey qövmüm! Allaha qulluq edin, sizin üçün
Ondan başqa bir ilah yoxdur. Sizə Rəbbinizdən açıq-aşkar bir dəlil
gəldi. Bax bu, Allahın dəvəsi / sosial yardım və dəstək prinsipi, sizin
üçün bir ayədir; qoyun o, Allaha məxsus yer üzündə yesin, aman, ona
pislik etməyin, yoxsa sizi üzücü bir əzab yaxalayacaqdır. **74** Və
düşünün ki, Ad (qövmündən) sonra sizi xəlifələr etdi. Və sizi yer
üzündə yerləşdirdi: Onun düzənliklərində saraylar tikirsiniz, dağlarını
yonub evlər düzəldirsiniz. Elə isə Allahın nemətlərini xatırlayın və yer
üzündə iğtişaşçılar olaraq həddi aşmayın.”

**75** Qövmündən təkəbbürlü başçılar, aralarından zəif görünən iman edən kimsələrə dedilər ki: “Siz Salehin həqiqətən Rəbbi tərəfindən göndərilən bir elçi olduğunu bilirsinizmi?” Onlar, “Həqiqətən biz, onunla göndərilənə iman edirik!” dedilər.

**76** O təkəbbürlü kimsələr, “Biz sizin iman etdiyinizi həqiqətən bilərək
rədd edən kimsələrik!” dedilər. **77** Və həmin anda da o sosial yardım
və dəstək qurumlarını ayaqda tutan gəlir qaynaqlarını qurutdular[106] və
təkəbbür göstərərək Rəblərinin buyruğundan kənara çıxdılar və “Ey
Saleh! Əgər həqiqətən göndərilən elçilərdənsənsə, bizi təhdit etdiyini
gətir bizə!” dedilər.

**78** Bunun üzərinə onları dərhal şiddətli bir sarsıntı yaxaladı və öz yurdlarında dizləri üstündə çökərək qaldılar.

**79** O vaxt Saleh onlardan üz çevirdi və “Ey qövmüm! And olsun ki, mən sizə Rəbbimin göndərdiklərini təbliğ etdim və sizə öyüd verdim, fəqət siz öyüd verənləri sevməyirsiniz” dedi.

***

**80,81** And olsun ki, Biz, Lutu da elçi olaraq göndərdik. Bir zaman o, öz qövmünə demişdi ki: "Siz, sizdən öncə aləmlərdən heç birinin etmədiyi iyrəncliyimi edirsiniz? Həqiqətən və şübhəsiz siz, cinsi meyil olaraq qadınlardan aşağı olan kişilərin üstünə şəhvətlə gedirsiniz. Əslində siz, həddi aşan bir qövmsünüz."

**82** Və qövmünün cavabı yalnız, "Onları şəhərinizdən çıxarın, çünkü onlar, həddən ziyadə təmizlənən insanlar imiş!" demək oldu.

**83** Belə olduqda, Biz də onu və ailəsini xilas etdik, ancaq zövcəsini xilas etmədik; o, geridə qalanlardan; düşüncə baxımından günahkar qövmlə birgə olanlardan idi. **84** Və onların üzərlərinə bir yağmur yağdırdıq. Bax gör günahkarların sonu necə oldu!

***

**85-87** And olsun ki, Biz Mədyənə də qardaşları Şüeybi elçi göndərdik. Dedi ki: "Ey qövmüm! Allaha qulluq edin, sizin üçün Ondan başqa bir ilah yoxdur. Sizə Rəbbinizdən açıq-aşkar bir dəlil gəldi: Artıq ölçüdə və çəkidə düz olun, insanların əşyasını əskik verməyin, sahmana salındıqdan sonra yer üzündə fəsad törətməyin; əgər iman edən kimsələrsinizsə, bu sizin üçün daha xeyirlidir! Təhdid edərək, iman edənləri Allahın yolundan uzaqlaşdıraraq və o yolun əyriliyini axtararaq hər yolun başında oturmayın. Düşünün ki, siz az idiniz, O, sizi çoxaltdı. Və fəsadçıların aqibətinin necə olduğuna baxın bir! Və əgər içinizdən bir qrup mənimlə göndərilənə iman etmiş, bir qrup da iman etməmişsə, o təqdirdə Allah aramızda hökm edincəyə qədər səbr edin. Və O, hökm verənlərin ən xeyirlisidir."

**88,89** Qövmündən, təkəbbürlü başçılar dedilər ki: "Ey Şüeyb! Ya səni və səninlə bərabər iman edənləri şəhərimizdən həqiqətən çıxaracağıq, ya da bizim dinimizə / həyat tərzimizə qayıdacaqsınız!" Şüeyb dedi ki: "İstəməsək də, eləmi? Allah bizi ondan qurtardıqdan sonra təkrar sizin dininizə / həyat tərzinizə qayıtsaq, həqiqətən Allaha qarşı yalan uydurmuş olarıq. Rəbbimiz olan Allahın istəyi xaricində, ona geri qayıtmağımız bizim üçün olacaq şey deyil. Rəbbimiz biliyi ilə hər şeyi əhatə etmişdir. Biz sadəcə Allaha güvənib dayandıq." *–Ey Rəbbimiz! Bizimlə qövmümüz arasında haqq ilə hökm et. Çünkü Sən, hökm edənlərin ən xeyirlisisən!–*

**90** Və onun qövmündən kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] başçılar dedilər ki: "Əgər Şüeybə tabe olsanız, o təqdirdə siz həqiqətən ziyana uğrayanlardan olarsınız."

**91,92** Belə olduqda, o dəhşətli sarsıntı onları yaxaladı, yurdlarında dizləri üstündə çöküb qaldılar. Şüeybi yalanlayanlar sanki heç orada

olmamış / zənginlik sürməmiş kimi oldular. Şüeybi yalanlayanlar var ha, bax, ziyana uğrayanlar özləri oldu.

**93** Belə olduqda Şüeyb, onlardan üz çevirdi və: "Ey qövmüm! Mən sizə Rəbbimin göndərdiklərini təbliğ etdim və sizə öyüd verdim, vəziyyət belə olduğu halda kafirlər topluluğundan [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən camaatdan] ötrü necə qayğılanım?" dedi. (39 / 7, Əraf / 59-93)

## Nəcm: 76

**94,95** Biz hansı şəhərə bir peyğəmbər göndərdiksə, onun xalqını mütləq yalvarıb-yaxarsınlar deyə yoxsulluq və çətinliyə saldıq. Sonra pisliyin yerini yaxşılığa dəyişdirdik; nəhayət çoxaldılar və "Atalarımıza da belə çətinlik və sevinc üz vermişdi" dedilər. Belə olduqda onları dərhal, onlar fərqində deyillərkən qəflətən yaxaladıq.

**96** Və əgər o şəhərlərin əhalisi iman etsəydilər və Allahın mühafizəsi altına daxil olsaydılar, əlbəttə ki, üzərlərinə göydən və yerdən olan bolluqları açardıq. Lakin onlar yalanladılar. Biz də onları ele hey işlədikləri şeyin müqabilində yaxaladıq.

**97-99** Görəsən o şəhərlərin əhalisi, gecə yatarkən, əzabımızın onlara gəlməyəcəyindən arxayın idilərmi? Yoxsa o şəhərlərin əhalisi gündüz vaxtı mənasız işlərlə məşğul olarkən, onlara əzabımızın gəlməyəcəyindən arxayın idilərmi? Elə isə, Allahın incə planından arxayın idilərmi? Ziyana uğramış topluluqdan başqası Allahın incə planından özünü arxayın görməz.

**100** Və öncəki sahiblərindən sonra yer üzünün varisi; son sahibi olanlara bəyan olmadımı, onlara təsir etmədimi: "Əgər Biz istəsək, onları da günahlarına görə cəzalandırardıq. Biz onların qəlblərinin üzərinə damğa vurarıq / qəlblərini möhürləyərik və onlar da eşitməzlər."

**101,102** Bax, o şəhərlər ki, sənə onların önəmli xəbərlərindən bir qismini söyləyirik. And olsun ki, peyğəmbərləri onlara açıq-aşkar dəlillərlə gəlmişdi. Fəqət öncədən yalanladıqları şeylərə iman etməmişdilər. Bax kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrin] qəlblərinin üzərinə Allah belə damğa basar / onları möhürləyər. Onların çoxunda, sözdə durma prinsipini görmədik. Həqiqət budur ki, onların çoxunu yoldan çıxmış kimsələr olaraq gördük. (39 / 7, Əraf / 94-102)

## Nəcm: 77

**103** Sonra o elçilərin / o qövmlərin ardından Musanı əlamətlərimizlə / işarətlərimizlə Firona və əyanlarına göndərdik, onlar isə əlamətlərə / işarətlərə haqsızlıq etdilər. Hələ bir bax, o fəsadçıların aqibətləri necə oldu!

**104,105** Və Musa "Ey Firon! Mən həqiqətən aləmlərin Rəbbi tərəfindən göndərilən bir elçiyəm. Allah haqqında haqdan başqasını söyləməməklə mükəlləfəm. Həqiqətən mən sizə, Rəbbinizdən açıq-aşkar bir dəlil ilə gəldim. Buna görə İsrail oğullarını mənimlə göndər." dedi.

**106** Firon, "Əgər bir əlamət / işarət ilə gəldinsə, dərhal onu gətir, əlbəttə, əgər doğru kimsələrdənsənsə." dedi.

**107,108** Belə olduqda Musa, biliyini və təcrübələrini[107] ortaya atdı, o da birdənbirə açıq-aşkar bir "silib süpürən"[108] oldu. Gücünü də sıyırıb ortaya qoydu; artıq onun gücü, baxanlar üçün mükəmməl, tam qüsursuz idi.[109]

**109-112** Fironun qövmünün əyanları, "Həqiqətən bu, çox bilikli, büyüləyici, təsirli bir alimdir.[110] O, sizi yurdunuzdan çıxarmaq istəyir." dedilər. Firon, "Elə isə siz nə əmr edirsiniz?" dedi. Onlar: "Onu və qardaşını saxla, şəhərlərə də toplayıcılar göndər. Bütün çox bilikli, büyüləyici, təsirli alimləri sənə gətirsinlər" dedilər.

**113,114** Və o çox bilikli, büyüləyici, təsirli alimlər Firona gəldilər: "Əgər qalib gələn biz olsaq, bizim üçün həqiqətən böyük bir mükafat olacaq / olacaqmı?" dedilər. Firon "Bəli" dedi, "siz şübhəsiz yaxınlaşdırılmışlardan da olacaqsınız."

**115** Çox bilikli, büyüləyici, təsirli alimlər: "Ey Musa! Sən öz tezisini ortaya qoyacaqsan, yoxsa tezis ortaya atanlar biz olaq?" dedilər.

**116** Musa: "Siz tezisinizi ortaya atın" dedi. Onlar atınca da, insanların gözlərini büyülədilər və onları qorxutdular (öz ağıllarına görə xəttə gətirmək / adam etmək istədilər). Və böyük, təsirli bir hünər göstərdilər.

**117** Biz də Musaya: "Sən də öz biliklərini ortaya at" deyə vəhy etdik. Bir də nə görsələr yaxşıdır, onların uydurub ortaya qoyduqları şeyləri sürətlə yaxalayıb udur.

**118** Beləliklə, haqq yerini tapdı, Firon və əyanların bütün etdikləri boşa getdi, işə yaramadı.

**119** Firon və əyanlar artıq orada məğlub oldular və kiçik düşürülmüş bir dəstə olaraq geri döndülər.

**120-122** Çox bilikli, büyüləyici, təsirli alimlər isə boyun əyib təslim olmuş kimsələr olaraq qaldılar. "Aləmlərin Rəbbinə; Musanın və Harunun Rəbbinə iman etdik" dedilər.

**123-126** Firon dedi ki: "Mən sizə icazə vermədən öncə, ona imanmı etdiniz? Şübhəsiz ki, bu, şəhərdə qurduğunuz gizli bir hiylədir ki, əhalisini şəhərdən çıxarasınız. Tezliklə biləcəksiniz. Mütləq müqavilələrdən; öhdəliklərdən əlaqənizi kəsəcəyə, sonra da hamınızı qətiliklə rahat mühitdən; şəhərdəki işinizdən, vəzifənizdən çıxarıb xurma tarlalarında kənd təsərrüfatı işlərində işlədəcəyəm; daş ocaqlarında işlədəcəyəm; çətin işlərdə işlədərək yağınızı çıxardacağam; iliyinizi sovuracağam!" Çox bilikli, büyüləyici, təsirli alimlər isə dedilər ki: "Heç şübhəsiz, biz sadəcə Rəbbimizə dönənlərik. Sənin bizi tutub cəzalandırmağın da ancaq Rəbbimizin ayələri gəlincə onlara iman etməmizə görədir." –*"Ey Rəbbimiz! Bizə daha çox səbr ver ki yumuşalmayaq, zəiflik göstərməyək, boyun əyməyək. Canımızı da müsəlman olaraq al!"*–

**127** Firon qövmünün əyanları isə, "Səni və sənin ilahlarını / səni ilah olaraq görməyi tərk etsinlər və yer üzündə fəsad çıxarsınlar deyəmi Musanı və onun qövmünü azad buraxacaqsan?" dedilər. Firon dedi ki: "Onların oğullarını öldürəcəyik; təhsilsiz, təlimsiz saxlayıb savadsız bir kütləyə çevirməklə onları zəiflədəcəyik, qızlarını sağ buraxacağıq (utanca boğacağıq) və biz, onların üzərində əzici bir gücə sahib kimsələrik."

**128** Musa, qövmünə dedi ki: "Allahın yardımını istəyin və səbr edin. Şübhəsiz ki, yer üzü Allahındır. Qullarından istədiyini ona mirasçı edər. Gözəl aqibət də Allahın mühafizəsi altına daxil olan kimsələr üçündür."

**129** Musanın qövmü dedilər ki: "Sən bizə gəlməmişdən öncə də əziyyət gördük, sən gəldikdən sonra da." Musa dedi ki: "Ümid var ki, Rəbbiniz düşmənlərinizi dəyişikliyə, məhvə məruz qoyacaq və sizi yer üzündə onların yerinə keçirdəcəkdir. Beləcə də, sizin necə davranacağınıza baxacaqdır."

**130** Və and olsun ki, Biz, Firon nəslini, düşünüb öyüd alsınlar deyə illərlə quraqlıqlarla / illərlə qıtlıq və məhsul çatışmazlığı ilə yaxaladıq.
**131** Sonra onlara yaxşılıq üz verdiyi zaman, "Bax bu, bizə aiddir" dedilər. Əgər onlara bir pislik gələrsə, Musa və onun yanındakılarının uğursuzluğu kimi qəbul edərlər. Yaxşı bilin ki, onların uğursuzluğu Allah qatındadır. Fəqət onların çoxu bilməzlər.

**132** Və Fironun qövmü, "Sən bizi büyüləmək üçün bizə nə qədər

əlamət / işarət gətirsən də biz sənə iman edənlər deyilik." dedilər.

133 Biz də müəyyən fasilələrlə, ayələr olmaq üzrə onların üzərlərinə tufanı, çəyirtkələri, həşəratları, qurbağaları və qanı göndərdik. Yenə də təkəbbür göstərdilər və günahkar bir qövm oldular.

134 Və nə zaman ki, bu əzab üzərlərinə çökdü, "Ey Musa! Sənə olan əhdi / verdiyi söz səbəbiylə bizim üçün Rəbbinə dua et, əgər sən bizdən bu cəzanı götürsən, sənə mütləq iman edəcəyik. Və həqiqətən İsrail oğullarını səninlə birlikdə göndərəcəyik." dedilər.

135 Nə vaxt ki, yetişəcəkləri bəlli bir vaxta qədər onlardan cəzanı qaldırdıq, dərhal sözlərindən qaçdılar.

136 Biz də, şübhəsiz ki, ayələrimizi yalanladıqları və onlardan qəflətdə olduqları üçün onları cəzalandırıb ədaləti təmin etdik. Və onları bol suda / çayda[111] boğduq.
137 Zəifliyə düçar edilən / gücdən salınan qövmü də bərəkətləndirdiyimiz yerin hər yanına varis təyin etdik. Və beləcə, Rəbbinin, İsrail oğullarına olan o çox gözəl sözü,[112] səbr etdikləri üçün yerinə yetdi. Biz də Firon ilə qövmünün keçmişdən bəri düzəltdikləri sənaye əsərlərini və ucaltmaqda olduqları şeyləri yerləbir etdik. (39 / 7, Əraf / 103-137)

## Nəcm: 78

138,139 Və İsrail oğullarını bol sudan / çaydan[113] keçirtdik. Sonra öz bütlərinə ibadət edən bir camaata rast gəldilər. Dedilər ki: "Ey Musa! Onların tanrıları olduğu kimi, sən də bizim üçün bir tanrı təyin et!" Musa dedi ki: "Siz həqiqətən cahillik edən bir camaatsınız. Bu gördüyünüz camaatın etiqad etdikləri din, yox olmağa məhkumdur və bütün etməkdə olduqları da batildir."

140 Musa dedi ki: "O, sizi aləmlərə üstün etmişkən, mən sizə Allahdan başqa ilahmı axtarım?!"

141 Bir vaxt Biz, sizə əzabın pisini edən; oğullarınızı öldürən; oğullarınızın boğazını kəsən; təhsilsiz, təlimsiz saxlayıb savadsız bir kütləyə çevirməklə onları zəiflədən, qızlarınızı sağ buraxan (utanca boğan) Firon ailəsinin əlindən də sizi qurtarmışdıq. Bunda da sizin üçün Rəbbiniz tərəfindən böyük bir imtahan var.

142 Və Musa ilə otuz gecəyə vədələşdik və müddəti bir on gecə ilə tamamladıq. Beləliklə, Rəbbinin təyin etdiyi vaxt tam qırx gecə oldu. Və Musa, qardaşı Haruna, "Qövmümün içində mənim yerimə keç, islah et və fəsadçıların yoluna uyma!" dedi.

143 Musa, təyin etdiyimiz vaxtda gəldikdə, Rəbbi ona söz söylədi. Musa, "Ey Rəbbim! Göstər mənə Özünü, baxım Sənə; Səni araşdırım,

Səninlə əlaqəli geniş və dərin məlumat sahibi olum!" dedi. Rəbbi ona dedi ki: "Məni sən əsla görə bilməzsən, lakin bu dağa bax [dağı araşdır, teori ortaya qoy], əgər o yerində qala bilərsə [əgər nəzəriyyən [teorin / geniş və dərin biliyin], incələmələrin dağın məkanına tam oturmuş olarsa; dağın olduğu yerin önünü-arxasını, altını-üstünü, sağını-solunu, içini-çölünü tam ifadə edərsə], sən də Məni görəcəksən [bax o zaman sən məni görərsən]." Daha sonra Rəbbi dağa təcəlli edincə onu parça-parça etdi [Beləliklə Rəbbi, Musanın dağ kimi problemləri üçün aydınlıq gətirdiyi zaman; Musanın dağ kimi problemlərini aradan qaldırdı], Musa da huşunu itirərək yerə sərildi [Musa da həyəcanla yerə qapandı; Rəbbinə təslimiyyət göstərdi]. Ayılıb özünə gəlincə də [həyəcanı keçincə də], "Səni tənzih edirəm, Sənə döndüm; tövbə etdim və mən, iman edənlərin birincisiyəm." dedi.

**144** Allah dedi ki: "Ey Musa! Vəhylərimlə və kəlamımla səni insanların üzərinə seçdim. İndi sənə verdiyimi götür və özünə verilən nemətlərin qarşılığını ödəyənlərdən ol!"

**145** Və Biz, onun üçün o lövhələrdə hər şeydən bir nəsihət və hər şey üçün bir təfsilat yazdıq. "Haydı, bunları möhkəm tut,[114] qövmünə də ən gözəl şəkildə tutmalarını əmr et. Yaxında sizə, o haqq yoldan
çıxanların yurdunu göstərəcəyəm. **146** Yer üzündə, bütün ayələri
görsələr də onlara iman etməyən, doğrunun yolunu görsələr də o yolu tutub getməyən, əgər azğınlığın yolunu görərlərsə onu özünə yol seçən, haqsız yerə təkəbbürlük göstərən bu kimsələri, ayələrimizdən uzaq tutacağam." *–Bu, onların ayələrimizi yalanlamaları və onlardan qafil; onlara diqqət yetirməyən, məhəl qoymayan kimsələr
olmalarındandır.–* **147** Ayələrimizi və axirətdəki qarşılaşmağı
yalanlayanların əməlləri boşa getmişdir. Onlar, öz etdikləri əməllərdən başqa bir şeyləmi cəzalandırılacaqlar?

**148** Musanın qövmü, Musadan sonra, özlərinin zinət əşyalarını bir yerə yığaraq aldadıcı, cazibəli səsi olan,[115] əslində heç bir işə yaramayan bir ilah düzəltdilər; böyük bir sərmayə əmələ gətirərək ona sitayiş etdilər. *–Onun onlara bir söz söyləyə bilməzliyini və bir yol göstərə bilməzliyini görmədilərmi?–* Onu düzəltdilər və zalımlardan oldular.

**149** Nə zaman ki, gözlərinin önünə gəldi və haqq yoldan azdıqlarını gördülər, "Əgər Rəbbimiz bizə mərhəmət etməz və bizi bağışlamazsa, həqiqətən biz böyük ziyana uğrayanlardan olacağıq" dedilər.

**150** Və Musa, qəzəbli və kədərli halda qövmünün yanına döndüyündə, "Məndən sonra mənim üçün nə pis bir xələf / nəsil oldunuz! Rəbbinizin əmrini tezləşdirdinizmi?" dedi. Və lövhələri buraxdı və qardaşı Harunu özünə çəkərək başından yapışdı. Harun: "Ey anamın

oğlu! İnan ki, bu camaat məni aciz qoydu, az qalsın məni öldürəcəkdilər. Onun üçün mənə, düşmənləri sevindirəcək bir şey etmə. Və məni bu zalımlar dəstəsi ilə bir tutma" dedi.

**151** Musa dedi ki: "Rəbbim! Məni və qardaşımı bağışla! Bizi rəhmətinə daxil et. Və Sən, mərhəmət edənlərin ən mərhəmətlisisən."

**152** Şübhəsiz, o qızıla sitayiş edənlərə Rəblərindən bir qəzəb, dünya həyatında bir "zillət" üz verəcək. Və Biz, uydurmaçıları (saxtakarları) belə cəzalandırarıq.

**153** *–Pis əməllər işlədikdən sonra dönən o kimsələr və iman edənlər üçün də, heç şübhəsiz, Rəbbin bundan sonra yenə də əfv edən və mərhəmət edəndir.–*

**154** Qəzəbi Musadan əl çəkdikdə lövhələri götürdü. Onlardakı yazıda da ancaq Rəblərindən qorxan kimsələr üçün bir hidayət və rəhmət var idi.

**155** Və Musa, təyin etdiyimiz vaxt üçün qövmünə yetmiş adam seçdi. O sarsıntı bunları yaxaladığı vaxt, bax o vaxt Musa "Rəbbim!" dedi, "İstəsəydin bunları da, məni də daha əvvəl dəyişikliyə / məhvə məruz qoyardın. İndi bizi, aramızdakı o səfehlərin etdikləri üzündən dəyişikliyə / məhvə məruzmu qoyacaqsan? O, Sənin, saflaşmamız üçün atəşlərə atmağından başqa bir şey deyildir. Sən bu saflaşdırma işlərinlə istədiyini azğınlıqda buraxar, istədiyinə də yol göstərərsən. Sən bizim yardımçımız, yol göstərən yaxınımızsan. Artıq bizi bağışla, bizə mərhəmət et, Sən bağışlayanların ən xeyirlisisən. Və bizə həm bu dünyada bir yaxşılıq yaz, həm də axirətdə. Biz həqiqətən də Sənə döndük." (39 / 7, Əraf / 138-155)

## Nəcm: 79

**156,157** Allah deyir ki: "Mənim əzabım var; onu istədiyimə toxundururam, rəhmətim də var, o isə hər şeyi əhatə etmişdir. Onu da xüsusən Allahın mühafizəsi altına daxil olanlara, zəkatını;[116] vergisini verənlərə və ayələrimizə iman edənlərə; onlara yaxşı işlər görməyi əmr edən və pis əməlləri qadağan edən, təmiz və xoş şeylərə icazə verən, napak, murdar və çirkli şeylərə icazə verməyən, bellərindən ağır yükləri, üzərlərindəki bağları və zəncirləri götürən, yanlarındakı Tövrat və İncildə yazılmış olduğunu görəcəkləri Anaşəhərli / Məkkəli Peyğəmbərə, o elçiyə tabe olan kimsələrə yazacağam. Elə isə, Ona iman edən, Ona möhkəm ehtiram göstərən, Ona yardımçı olan və Onunla birgə nazil olan nurun ardınca gedənlər ki var, bax onlar, qurtuluşa qovuşanların məhz özüdür."

**158** De ki: "Ey insanlar! Şübhəsiz mən, göylərin və yerin mülkü Özünə məxsus olan, Özündən başqa heç bir ilah olmayan, həm dirildən, həm öldürən Allahın, sizə, hamınıza göndərdiyi elçiyəm. Elə isə, yönləndirildiyiniz doğru yolu tapmanız üçün Allaha və Onun sözlərinə iman edən, Ümmi; Şəhərli; Məkkəli Peyğəmbər olan Elçisinə iman edin və ona tabe olun."

**159** Musanın qövmündən də, haqqı göstərən və haqq ilə ədaləti tətbiq edən bir liderləri (başçıları) olan bir topluluq vardır. (39 / 7, Əraf / 156-159)

## Nəcm: 80

**160** Və Biz onları, öz nəsillərindən olan on iki nəvənin liderlik etdiyi kiçik qəbilələrə ayırdıq. Və qövmü ondan su istədiyi zaman Musaya, "Biliklərini o daş qəlbli qövmünə[117] tətbiq et"[118] deyə vəhy etdik. Dərhal o daş qəlbli qövmdən on iki qövm / ölkə xalqı[119] əmələ gəldi. Xalqın hər biri su götürəcəyi yeri yaxşıca öyrəndi / işarəlıədi. Və buludu da üzərlərinə kölgə etdik. Onlara qüdrət halvası və bal / bildirçin endirdik; sizə ruzi olaraq verdiyimiz nemətlərin təmizindən yeyin! Onlar Bizə haqsızlıq etmədilər, öz-özlərinə haqsızlıq edirdilər.

**161** Və bir zaman onlara, "Bu şəhərdə sakin olun və oradan istədiyiniz şeyləri yeyin və 'hittə!' [günahlarımızı bağışla!] deyin və təslim olmuş bir halda qapıdan girin. Biz günahlarınızı bağışlayacağıq, yaxşılar üçün artıracağıq" deyilmişdi.

**162** Sonra onların arasından bir qisim yanlış; öz zərərlərinə iş görənlər, onlara deyilən sözü, başqa bir sözlə dəyişdirdilər. Biz də yanlış; öz zərərlərinə iş gördüklərinə görə üzərlərinə göydən bir cəza göndərdik. (39 / 7, Əraf / 160-162)

## Nəcm: 81

**163** Və onlardan, dəniz kənarındakı o şəhəri də soruş. O əsnada onlar, qulluğa, yaxşı-yaxşı düşünməyə məxsus edilən gündə həddi aşırdılar. Qulluğa, yaxşı-yaxşı düşünməyə məxsus edilən gündə həddən artıq sıxılırdılar, digər günlərdə isə çox sevincliydilər.[120] Haqq yoldan çıxdıqları üçün Biz onlara bax belə bəla veririk. (39 / 7, Əraf / 163)

## Nəcm: 82

**164** Və onların arasında bir ümmət də var; başçısı olan bir camaat, "Allahın dəyişikliyə / məhvə məruz qoyacağı və ya şiddətli bir əzabla əzab verəcəyi bir camaata nə üçün öyüd verirsiniz?" dedikdə, o xəbərdarlıq edənlər də dedilər ki: "Rəbbiniz qarşısında bir üzrümüz

olsun, bunlar da Allahın mühafizəsi altına daxil olsunlar deyə."

**165,166** Nə vaxt ki onlar, onunla xatırlatma edilən şeylərə əhəmiyyət vermədilər, Biz də pis əməllərdən çəkindirənləri qurtardıq, o zalımları da haqq yoldan çıxdıqları üçün şiddətli / fəqir edən bir əzabla yaxaladıq. Nə zaman ki onlar, onunla qadağan edilən şeylər barəsində təkəbbür göstərdilər, Biz də onlara, "Alçalmış (qovulan kəslər halında) meymunlar olun!" dedik.

**167** Və o vaxt Rəbbin, qiyamət gününə qədər üzərlərinə, mütləq onları ən pis əzaba məruz qoyacaq kimsələr göndərəcəyini elan etdi. Şübhəsiz ki, Rəbbin, tez cəza verəndir. Və həqiqətən O, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olan, geniş mərhəmət sahibidir.

**168** Və onları yer üzündə başçıları olan bir çox topluluqlara ayırdıq. Onların bəziləri doğru kəslər idi, bəziləri isə onlardan aşağı idi. Və Biz, dönsünlər deyə, onları yaxşılıqlarla və pisliklərlə sınadıq.

**169** Beləliklə, onlardan sonra bir nəsil gəlib onların yerlərinə keçdi. Kitabın varisi oldular. Onlar bu dünyanın dəyərsiz qazanclarını alarlar, "Gələcəkdə bizə məğfirət olunar / günahlarımız bağışlanar" deyirdilər. Onlara ona bənzər dəyərsiz bir mal gələrsə, onu da alardılar. *–Allaha qarşı haqdan başqasını söyləməyəcəklərinə dair onlardan o kitabın təminatı alınmadımı? Halbuki onda olanı oxuyub öyrənmişdilər. Axirət yurdu, Allahın mühafizəsi altına daxil olan kimsələr üçün daha xeyirlidir. Hələ də dərk etməyəcəksiniz?–*

**170** Və Kitabdan möhkəm yapışanlara və səlatı iqamə edənlərə[121] [maddi və yaxud zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumunu təsis edənlərə-ayaqda tutanlara] gəlincə, Biz, o sahmana salanların / yaxşılaşdıranların mükafatını itirmərik.

**171** Bir zamanlar o dağ [dağ kimi problemlər], kölgəlik / çətir kimi [üzərlərinə çökmüş] ikən, onlar da dağ üzərlərinə yıxılacaq deyə [o dağ kimi problemlərlə yaşayacaqlarına] inanmışlarkən Biz, onların Üstününü / ən seçkinlərini o dağa çəkmişdik / yüksəltmişdik[122] [o dağ kimi problemləri üzərlərindən götürdük]: "Allahın mühafizəsi altında olmaq üçün sizə verdiyimizi möhkəm tutun və içindəkini yadınızdan çıxarmayın." (39 / 7, Əraf / 164-171)

## Nəcm: 83

**172,173** Halbuki sənin Rəbbin, qiyamət günündə, "Biz bunlardan xəbərsizdik" deməyəsiniz yaxud "Bizdən öncə atalarımız ortaq qoşmuşdu, biz onlardan sonra gələn nəsillərik, batil əməl işləyənlərin

əməlləri üzündən bizi dəyişikliyə / məhvə məruz qoyacaqsanmı?" deməyəsiniz deyə, Adəm oğullarının bellərindən onların nəsillərini çıxarar və onları öz əleyhinə şahid tutar; "Mən sizin Rəbbiniz deyiləmmi?" Deyərlər ki: "Əlbəttə Rəbbimizsən, şahidlik edirik."

**174** Biz, düşünsünlər deyə ayələri bax belə ətaflı olaraq açıqlayırıq.

(39 / 7, Əraf / 172-174)

## Nəcm: 84

**175** Bizim özünə ayələr verdiyimiz, sonra onlardan sıyrılıb çıxan, sonra, şeytanın öz arxasınca apardığı, beləliklə də azğınlardan olan o adamın ciddi xəbərini onlara anlat.

**176** Və əgər Biz istəsəydik, onu o ayələrlə ucaldardıq, amma o, alçaqlığa batıb qaldı və öz istəyinə uydu. Artıq onun vəziyyəti, üstünə cumsan da dilini salladıb ləhləyən, öz halına buraxsan da dilini salladıb ləhləyən köpəyin vəziyyətinə bənzəyir. Bax bu, ayələrimizi yalanlayan topluluğun vəziyyətidir. Ona görə də sən, yaxşıca düşünsünlər deyə bu məsəli yaxşıca anlat.

**177** Ayələrimizi yalanlayıb, sırf özlərinə haqsızlıq edən o topluluğun halı necə də pisdir!

**178** Allah kimə yol göstərərsə, bax o, yönəldildiyi doğru yolu tapandır. Kimi də azdırarsa, bax onlar, ziyana uğrayanların məhz özləridir.

(39 / 7, Əraf / 175-178)

## Nəcm: 85

**179** Və and olsun ki, tanıdıqlarınızdan-tanımadıqlarınızdan bir çoxunu cəhənnəm üçün törədib yaratdıq; onların qəlbləri var, onlarla anlamazlar. Gözləri var, onlarla görməzlər. Qulaqları var, onlarla eşitməzlər. Bax onlar, dörd ayaqlı heyvanlar kimidirlər. Hətta daha da azğındırlar. Bax onlar, qafillərin məhz özləridir.

**180** Və ən gözəl isimlər Allahındır. Elə isə, Onu onlarla çağırın. Onun isimləri barəsində əyriliyə azanları da tərk edin. Onlar, etdiklərinin qarşılığını yaxında görəcəklər.

**181** Yenə bizim yaratdıqlarımızdan, haqqa yönəldən və onunla ədaləti tətbiq edən bir ümmət var.

**182** Və ayələrimizi yalanlayanları, bilməyəcəkləri yöndən, tədricən, yavaş-yavaş dəyişikliyə / məhvə yaxınlaşdıracağıq.

**183** Mən onlara möhlət də verirəm. Həqiqətən, Mənim planım çox çətindir.

**184** Və onlar yoldaşlarında heç bir dəliliyin / cinlənmişliyin olmadığını düşünmədilərmi? O, ancaq açıq-aşkar bir xəbərdarlıq edəndir.

**185** Və onlar göylərin və yerin mülkünə və idarəsinə, Allahın yaratdığı hər hansı bir şeyə və əcəllərinin gerçəkdən yaxınlaşması ehtimalına heç baxmadılarmı? Artıq bundan sonra başqa hansı sözə inanacaqlar?

**186** Allah, kimi azdırarsa, artıq ona yol göstərəcək bir kimsə də yoxdur. Və O, bunları həddi aşmaları içində çaşqın bir vəziyyətdə buraxar.

(39 / 7, Əraf / 179-186)

## Nəcm: 86

**187** Sənə, Saatdan; qiyamətin qopacağı an barəsində sual verirlər: "Nə zaman gəlib çatacaq?" De ki: "Onun biliyi ancaq Rəbbimin qatındadır. Onun vaxtını Özündən başqası açıqlaya bilməz. Onun vaxtını bilmək, göylərdə və yerdə ağır gəlmişdir / bilinməsi mümkün olmayan olmuşdur. O, sizə qəflətən gələcək."

Sanki sən onu çox yaxşı bilirsənmiş kimi onu səndən soruşurlar. De ki: "Onun biliyi Allahın qatındadır. Fəqət insanların çoxu bilməzlər."

**188** De ki: "Mən özüm üçün Allahın istədiyindən başqa nə bir fayda əldə etməyə, nə də bir zərərin qarşısını almağa səlahiyyətli deyiləm. Əgər mən görülməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi bilsəydim, əlbəttə xeyiri çoxaltmaq istəyərdim. Və mənə heç bir pislik toxunmamışdır. Mən ancaq bir xəbərdarlıq edən və iman edən bir topluluğa müjdə verənəm." (39 / 7, Əraf / 187-188)

## Nəcm: 87

**189** O, sizi bir candan yaradan və ondan da, özünə isinmək (ünsiyyət) üçün zövcəsini yaradandır. Nə vaxt ki, o, onu örtüb bürüdü, o zaman o həfif bir yüklə yükləndi. Və bununla gedib-gəldi. Nə vaxt ki, xanım ağırlaşdı, dərhal o ikisi Rəblərinə dua etdilər: "Əgər bizə sağlam bir uşaq versən, and olsun ki, mütləq qarşılığını ödəyənlərdən olarıq."

**190** Nə vaxt ki, O ikisinə sağlam bir uşaq verdi, o ikisinə verdiyi şey haqqında Onun (Allah) üçün ortaqlar qoşdular. Allah, onların ortaq qoşduğu şeylərdən pakdır, ucadır.

**191** Heç bir şey yaratmayan və özləri də yaradılmış olan şeylərimi tay tuturlar?

**192** Halbuki bunların, sitayiş edənlər üçün yardım etməyə gücü
çatmaz. Öz nəfslərinə də yardım edə bilməzlər. **193** Əgər siz onları
doğru yola səsləsəniz, sizə tabe olmazlar. Onları çağırsanız da, çağırmayıb susmuş olsanız da sizə qarşı heç fərq etməz.

194 Allahın altındakılardan yalvardığınız kimsələr, eyni sizin kimi qullardır. Əgər doğrusunuzsa, haydı, onları çağırın da sizə qarşılıq versinlər. 195 Məgər onların özləriylə yeriyəcək ayaqları, tutacaq əlləri, görəcək gözləri və ya eşidəcək qulaqlarımı var?

De ki: "Çağırın ortaqlarınızı, sonra mənə hiylə qurun və mənə möhlət də verməyin.

196 Şübhəsiz ki, mənim vəlim [yol göstərənim, yardım edənim, qoruyanım], o kitabı nazil edən Allahdır. Və O, düzgün kimsələrə vəli [yol göstərən, yardım edən, qoruyan] olar. 197 Onun altındakılardan, sizin yalvardığınız kimsələr isə sizə yardım etməyə qadir deyillər, öz nəfslərinə də yardım edə bilməzlər. 198 Siz onları doğru yola çağırsanız da eşitməzlər. Və onları sənə baxan görürsən, halbuki onlar görməzlər." (39 / 7, Əraf / 189-198)

## Nəcm: 88

199 Sən əfvi / malın artığını götür, "urf" [haqqa uyğun adət, Quran ayələri qrupu] ilə əmr et və cahillərdən də məsafəli dur.

200 Əgər sənə şeytandan bir vəsvəsə gəlsə, dərhal Allaha sığın. Həqiqətən O, ən yaxşı eşidən, ən yaxşı biləndir.

201,202 Öz qardaşları onları azğınlığa çəkdiyi və buraxmadığı halda, şübhəsiz Allahın mühafizəsi altına daxil olan bu kimsələr, onlara şeytandan bir vəsvəsə, qaranlıq bir şübhə, əl çəkməyən (sıxıntı verən) bir tufan toxunduğu zaman, xatırlayarlar / düşünərlər. Sonra bir də görərsən ki, onlar görüb-bilmişlərdir!

203 Onlara bir ayə gətirmədiyin zaman, "Nə olardı, onu özündən uydursaydın" deyərlər. De ki: "Mən ancaq Rəbbimdən mənə nə vəhy olunursa, ona tabe oluram." Bax bu Quran, Rəbbinizdən gələn, qəlb gözünü açacaq bəyanlardır, iman edən bir camaat üçün bir yol göstərən və bir rəhmətdir.

204 Və sizə rəhm olunması üçün, Quran öyrənilib-öyrədildiyi zaman, dərhal ona qulaq asın və susun.

205 Və hər zaman öz içindən, qorxaraq və alçala-alçala (önə əyilərək), yüksək olmayan bir səslə Rəbbini yad et və qafillərdən olma!

206 Şübhəsiz ki, Rəbbini yaxşı tanıyan kəslər, Allaha qulluq etməkdən böyüklənməzlər, Onu hər cürə nöqsanlıqlardan pak tutarlar və yalnızca Ona boyun əyib təslim olarlar. (39 / 7, Əraf / 199-206)

# CİNN (40 - 72) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

**Nəcm: 89[123]**

**1-2** De ki: Mənə vəhy edildi ki, şübhəsiz xaricilərdən bir qrup Quranı
dinləyib: *"Şübhəsiz ki, biz, rüşdə yönəldən (yetkinliyə çatmağ üçün yol
göstərən) heyrət verici bir Quran dinlədik. Buna görə, biz ona iman
etdik və Rəbbimizə heç bir şeyi qətiyyən ortaq qoşmayacağıq.*
**3** *Həqiqət budur ki, Rəbbimizin Şanı çox ucadır. O, bir dişi yoldaş və
bir də övlad götürməmişdir.*

**4** *Və heç şübhəsiz "bizim ağlı kəsməyənimiz", Allah barəsində boş-boş
şeylər söyləyirmiş.* **5** *Doğrusu, biz, bildik-bilmədik hər kəsin Allaha
qarşı qətiyyən yalan söyləməyəcəyinə inanırdıq.*

**6** *Həqiqətən də insdən; çox yaxşı tanıdığımız kimsələrdən bəzi kimsələr, cindən; tanımadığımız xarici kimsələrdən bəzilərinə sığınırdılar. Beləcə də, o xarici kimsələr, onların azğınlıqlarını, axmaqlıqlarını artırırdılar.*

**7** *Gerçəkdən də onlar sizin iman etdiyiniz kimi kimi, Allahın əsla kimsəni peyğəmbər göndərməyəcəyinə / diriltməyəcəyinə iman etmişdilər.*

**8** *Və həqiqətən biz göyə toxunduq, onu güclü gözətçilər və parlaq
alovlarla doldurulmuş gördük.* **9** *Və heç şübhəsiz ki biz göydən xəbər
eşitmək üçün oturulan yerlərdə otururduq. Amma, indi hər kim xəbər
eşitmək üçün çalışsa, qarşısına, keşik çəkən parlaq bir alov çıxar.*
**10** *Biz də, yer üzündəkilərə pislikmi istəndi, yoxsa Rəbləri onlara bir
doğruluqmu istədi bilməyirik.[124]*

**11** *Şübhəsiz biz; bizlərdən bir qismi salehlərdəndir, bizdən bəziləri də bunun aşağısındandır. Biz, müxtəlif yollarda idik.*

**12** *Və həqiqətən, Allahı yer üzündə əsla aciz qoya bilməyəcəyimizi,
qaçmaqla da Onu əsla aciz qoya bilməyəcəyimizi yaxşıca anladıq.*
**13** *Və biz o yol göstərəni / Quranı dinlədiyimizdə ona iman etdik.
Onun üçün kim Rəbbinə iman edərsə, o haqqının əskik verilməsindən
və haqsızlığa uğramaqdan / axmaq yerinə qoyulmaqdan, özünə
həddindən artıq yük yüklənilməsindən qorxmaz.*

**14** *Və həqiqətən bizim vəziyyətimiz isə, bizdən müsəlmanlar da var,
səhv; öz zərərinə olan əməli işləyənlər də var. Amma kimlər müsəlman
oldusa, bax onlar doğruya, gözələ, yaxşıya, gerçəyə çatmağı
axtaranlardır.* **15** *Amma inanc barəsində səhv; öz zərərinə olan əməli
işləyənlərə gəldikdə, onlar da cəhənnəm üçün odun olmuşlardır."
demişdirlər.*

(40 / 72, Cinn / 1-15)

**Nəcm: 90**

**16,17** Və əgər onlar həqiqətən o yolda dümdüz getsəydilər, əlbəttə onlara, özlərini saflaşdırmaq üçün bol su verərdik. Kim Rəbbinin zikrindən / Rəbbinin öyüdündən; Qurandan üz çevirərsə, O da onu getdikcə yüksələn bir əzaba salar.

**18** Və şübhəsiz ki, məscidlər[125] həqiqətən Allah üçündür. Ona görə də Allah ilə birlikdə hər hansı bir kimsəyə yalvarmayın.

**19** Və bu bir həqiqətdir ki, Allahın qulu / Peyğəmbər Ona dəvət edərək ayağa qalxdığı / hərəkətə keçdiyi zaman o xaricilərdən bir qrup onun ətrafında az qalsın birləşəcəkdilər.

**20** De ki: "Mən mütləq Rəbbimə dua edirəm və heç bir şeyi də Ona ortaq qoşmaram!"

**21** De ki: "Şübhəsiz ki, mən sizi bir zərərə və yaxşılığa, pisliyə, gözələ, doğruya götürməyə qadir deyiləm."

**22,23** De ki: "Həqiqət budur ki, Allahdan məni, Allahdan [gələn şeylərin] təbliğ edilmələri və Onun elçiliyi vəzifələri xaricində heç bir kimsə heç bir zaman qurtara bilməz. Mən Onun altındakılardan bir sığınacaq da heç bir zaman tapa bilmərəm. Artıq kim Allaha və Onun Elçisinə qarşı çıxarsa, onun üçün cəhənnəm atəşi vardır. Onlar orada sonsuzadək qalıcıdırlar.

**24** Nəhayət təhdid edildikləri şeyi gördükləri zaman, kimin yardımcı baxımından ən zəif və sayca da daha az olduğunu dərhal biləcəklər.

**25-28** De ki: "O təhdid olunduğunuz şeyin yaxın olduğunu, yaxud Rəbbimin onun üçün uzun bir müddət təyin etdiyini mən bilmirəm. Rəbbim, bütün görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi və gələcəyi biləndir. Və elçilərdən seçib razı olduğu kəs istisna olmaqla, göstərmədiyinə, eşitdirmədiyinə, hiss etdirmədiyinə, keçmişə və gələcəyə dair heç bir kəsi məlumat sahibi etməz. Çünki O, Rəblərinin göndərdiklərini layiqincə təbliğ etdiklərini bilsin deyə onun hər tərəfindən gözətçilər qoyar. O, onların yanında olan hər şeyi əhatə etmişdir, hər şeyi də sayına görə (bir-bir) saymışdır." (40 / 72, Cinn / 16-28)

## YƏ SİN (41 - 36) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 91**

**1** Ya / 10, Sin / 60.[126]

**2-6** Ataları xəbərdar edilməyən, buna görə də qafil (olan) bir topluluğa bununla (Quranla) xəbərdarlıq edəsən deyə, ən üstün, ən güclü, ən şərəfli, məğlub olması mümkün olmayan / mütləq qalib olanın, geniş

mərhəmət sahibinin nazil etdiyi qanunları ehtiva edən / pozulması əngəllənmiş Quran dəlildir ki, sən, o elçilərdənsən, heç şübhəsiz ki, sən ən doğru bir yol üzərindəsən.

7 And olsun ki, ataları xəbərdar edilməmiş bu camaatın əksəriyyəti barəsində Söz[127] haqq olmuşdur. Artıq onlar iman etməzlər.
8 Şübhəsiz ki, Biz, onların boyunlarının içində dəmir halqələr keçirtmişik. Belə ki, onlar çənələrinə qədərdir. Beləcə, onlar burunları yuxarı qaldırılanlardır. 9 Və Biz onların önlərindən bir sədd, arxalarından bir sədd yaratdıq. Beləcə Biz, onları əhatəyə almışıq. Artıq onlar görməzlər. 10 Və onları xəbərdar etmisən, yaxud xəbərdar etməmisən, onlara görə birdir, onlar iman etməzlər.

11 Şübhəsiz ki, sən o öyüd, xatırlatma olan Qurana tabe olan və görülməyən, eşidilməyən, hiss edilməyən yerlərdə belə Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] hörmətlə, məhəbbətlə, elmlə ürpərən kimsəyə xəbərdarlıq edə bilərsən. Sən dərhal onu bir bağışlanma və çox şərəfli bir mükafat ilə müjdələ.

12 Şübhəsiz ki, ölüləri ancaq Biz dirildirik Biz. Onların öncədən edib göndərdiklərini və əsərlərini (qoyub getdikləri izləri) də yazarıq. Onsuz da Biz hər şeyi bir "açıq-aşkar öndərdə / Quranda" sayıb təsbit etmişik.

13 Sən qafil camaata o şəhərin əhalisini örnək ver. Bir vaxt oraya elçilər gəlmişdi.

14 Bir vaxt Biz onlara iki elçi göndərmişdik, onlar ikisini də yalanlamışdılar. Biz də üçüncü ilə gücləndirmişdik və onlar: "Şübhəsiz ki, biz sizə (göndərilən) elçilərik" dedilər.

15 Onlar isə: "Siz ancaq bizim kimi bir bəşərsiniz. Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah], heç bir şey də nazil etməmişdir. Siz sadəcə olaraq yalan danışırsınız." dedilər.

16,17 Elçiler dedilər ki: "Rəbbimiz bilir ki, biz, həqiqətən, sizə göndərilmiş elçilərik. Bizə düşən də sadəcə açıq-aşkar təbliğdir."

18 O şəhərin əhalisi dedi ki: "Şübhəsiz ki, bizə sizin ucbatınızdan uğursuzluq üz verdi. Əgər əl çəkməsəniz, and olsun ki, sizi daşqalaq edərək öldürərik və həqiqətən bizdən sizə çox acınacaqlı bir əzab toxunar."

19 Elçilər: "Sizin uğursuzluğunuz sizinlə bərabərdir. Sizə öyüd verildi deyəmi? Əslində siz həddinizi bilməyən bir camaatsınız" dedilər.

20-25 Bu vaxt o şəhərin ən uzaq yerindən bir adam qaçaraq gəldi. Dedi ki: "Ey xalqım! Tabe olun elçilərə! Tabe olun sizdən heç bir muzd istəməyən o kəslərə ki, onlar "göstərilən doğru yol göstəricisi"ni

tapmışlardır. Mənə nə olur ki, qulluq etməyəcəyəmmiş O məni yoxdan yaradana? Siz də sadəcə Ona döndəriləcəksiniz. Mən, heç Onun altındakılardan ilahlar qəbul edərəmmi? Əgər Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən] Özündən mənə bir zərər verməj istəsə, ilahların köməyi, arxa çıxması mənə heç bir fayda verməz və o ilahlar məni qurtara bilməzlər. Şübhəsiz ki, mən, ilahlar qəbul etdiyim təqdirdə, açıq-aşkar bir azğınlıq içindəyəm. Şübhəsiz ki, mən Rəbbinizə iman etdim. Haydı, qulaq asın mənə!”

**26,27** Deyildi ki: “Haydı, gir cənnətə!” O da dedi ki: “Nə olardı! Qövmüm, Rəbbimin məni bağışladığını və məni şərəfləndirilmişlərdən etdiyi bir bilsəydilər.”

**28,29** Və Biz sonra onun qövmünün üzərinə heç bir ordu göndərmədik, göndərəsi də deyildik. Sadəcə bir çığlıq! Bir də baxmısan ki, onlar dərhal sönüb (getmişlər).

**30** Vay o qulların halına ki, onlara gələn hər bir elçini mütləq şəkildə məsxərəyə qoyardılar.

**31,32** Özlərindən öncə neçə-neçə nəsilləri dəyişikliyə, məhvə məruz qoyduğumuzu və bunların onlara dönməyəcəklərini görmədilərmi? Onların hamısı yığılaraq ancaq Bizim hüzurumuzda hazır olacaqlar.

**33** Və ölü torpaq, qafil camaat üçün bir dəlildir. Biz ona həyat verdik və ondan dənələr çıxardıq, onlar da ondan yeyirlər.

**34,35** Və Biz onun məhsulundan və öz əlləri ilə etdiklərindən yesinlər deyə orada xurmalıqlardan, üzüm bağlarından bağçalar yaratdıq. İçindəki bulaqlardan sular fışqırtdıq. Hələ də onlara verilən nemətlərin qarşılığını ödəməyəcəklər?

**36** Yerin bitkilərindən, öz nəfslərindən və bilmədikləri neçə-neçə şeylərdən cütləri, onun hamısını yaradan (Allah) hər cürə nöqsanlıqdan pakdır.

**37** Gecə də qafil camaat üçün bir dəlildir. Biz gecədən gündüzü sıyırırıq (çıxarırıq) və onlar dərhal qaranlığa qərq olurlar.

**38** Öz yolunda onun üçün qərarlaşdırılmış olana görə axıb gedən günəş də qafil camaat üçün bir dəlildir. Bax bu, çox güclü və hər şeyi bilən Allahın nizamlamasıdır.

**39** Bizim özü üçün, köhnə quru bir xurma budağına dönüncəyədək mənzillər; çox otaqlar müəyyən etdiyimiz Ay da, o qafilləşmiş camaat üçün bir dəlildir.

**40** Günəşin aya yetişib çatması uyğun olmaz. Gecə də gündüzün önünə keçən deyildir. Hamısı da bir orbitdə üzərlər.

**41,42** Bizim, şübhəsiz ki, onların soyunu yüklü bir gəmidə

daşımağımız və şübhəsiz onlar üçün onun kimi minik vasitələri yaratmağımız da qafil camaat üçün bir dəlildir.

**43,44** Və Biz istəsək –*Bizim tərəfimizdən bir rəhmət və müəyyən bir zamana qədər faydalanma; möhlət verilməsi istisna olmaqla*– onları suda boğarıq və o zaman onların çığlığına heç çatan da olmaz. Onlar qurtarıla bilməzlər də.

**45,46** Və onlara: "Sizə rəhmət olunması üçün, keçmişdə etdiyiniz və gələcəkdə edəcəyiniz işlərdə / keçmiş və gələcək qüsurlarınızdan / keçmiş qövmlərin başına gələnlərin sizin başınıza gəlməməsi üçün, axirətdə başınıza gələcək fəlakətlərə qarşı, "Allahın mühafizəsi altına daxil olun" deyildiyi zaman və onlara Rəblərinin ayələrindən hər hansısa bir ayə gəldiyində, onlar ancaq ondan üz çevirdilər.

**47** Onlara: "Allahın sizə ruzi olaraq verdiyi şeylərdən xərcləyin; başqalarının da nəfəqələrini (ehtiyacını) təmin edin" deyildiyi zaman da kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş o kəslər], bu iman etmiş kəslər üçün: "Allahın istədiyi zaman yedirə biləcəyi kimsəni bizmi yedirəcəyik? Siz, ancaq açıq-aşkar bir azğınlıq içindəsiniz" dedilər.

**48** Bir də qafil camaat: "Əgər doğrulardansınızsa, bu söz verilən təhdid nə zaman (gəlib çatacaq)?" deyirlər.

**49,50** Onlar ancaq bir-biriylə mübahisə edərlərkən, onları yaxalayacaq tək bir çığlıqla qarşı-qarşıya qalacaqlar. Bax, o zaman bir vəsiyyət belə edə bilməzlər. Ailələrinə, yaxınlarına da dönə bilməzlər.

**51** Və Sur üfürülmüşdür.[128] Bir də görmüsən ki, onlar qəbirlərindən öz Rəblərinə doğru axın edirlər.

**52** Onlar: "Vay halımıza! Yatdığımız yerdən bizi kim qaldırdı / oyandırdı? Bu, Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] vəd etdiyi şeydir. Göndərilən elçilər də doğru söylədilər." deyirlər.

**53** Ancaq tək bir çığlıq olmuşdur. Bir də görmüsən ki, hamısı
hüzurumuzda "hazır ol" (fərəqət) vəziyyətdə dayanmışdır. **54** Artıq bu
gün kimsə hər hansısa bir şəkildə haqsızlığa düçar olmaz. Və sadəcə etdiklərinizin qarşılığını alırsınız. (41/36, Yə Sin / 1-54)

## Nəcm: 92

**55** Həqiqətən cənnət əhli bu gün könlünü şənləndirməklə məşğuldurlar.

**56** Onlar və onları müşayiət etmək üçün təqdim edilən zövcələr, kölgələr içində taxtlar üzərindədirlər.

**57** Ancaq onlar üçün orada meyvələr vardır. İstəyəcəkləri hər şey də onlarındır.

**58** Söz olaraq onlara geniş mərhəmət sahibi Rəbbdən "salam" vardır.

**59** Və ey günahkarlar! Bu gün siz haydı ayrılın!

**60-62** Mən: "Ey Adəmoğulları! Şeytana qulluq etməyin, həqiqətən o sizə açıq-aşkar bir düşməndir və Mənə qulluq edin, bax bu doğru yoldur və and olsun ki, şeytan sizdən bir çox nəsilləri azdırdı" deyə sizə əhd vermədimmi? Hələ də ağlını istifadə etməyənlərdənsiniz?
**63** Bax bu, sizin vəd olunduğunuz cəhənnəmdir.

**64** Bilərək rədd etdiyiniz / iman etmədiyiniz şeylər səbəbiylə haydı, bu gün ona yaslanın! **65** Bu gün Biz, onların ağızlarının üzərinə möhür vurarıq; Bizə əlləri danışar, ayaqları da qazandıqları şeylərə şahidlik edər. (41/36, Yə Sin / 55-65)

## Nəcm: 93

**66** Əgər Biz istəsəydik, gözlərini üzərindən silmə kor edərdik / soylarını qurudardıq onlar da yola tökülərdilər. Artıq haradan görəcəklər ki?

**67** Və əgər Biz istəsəydik, olduqları yerdə görünüşlərini elə dəyişdirərdik ki, nə irəli getməyə və nə geri dönüb gəlməyə gücləri çatardı.

**68** Və Biz kimə uzun ömür vermiş olsaq, xilqətcə onu tərsinə çevirərik / təpəsi üstə dikəldərik. Buna rəğmən hələ də ağıllanmayacaqlarmı? (41/36, Yə Sin / 66-68)

## Nəcm: 94

**69,70** Və Biz ona şeir öyrətmədik. Bu onun üçün yaraşmaz da. O, sadəcə diri olanları xəbərdar etmək və kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] üzərinə Sözün[129] haqq olması üçün bir öyüd və açıq-aşkar bir Qurandır. (41/36, Yə Sin / 69-70)

## Nəcm: 95

**71** Və onlar görmədilərmi ki, Biz, şübhəsiz ki, onlar üçün qüdrətimizin meydana gətirdiklərindən bəzi heyvanlar yaratdıq, onlar da onlara sahib oldular.

**72** Və onları, özləri üçün alçaq qəbul edilən varlıqlar etdik. Bu üzdən minikləri onlardandır. Onlardan yeyirlər də.

**73** Və onlarda daha bir çox mənfəətlər və içkilər var. Hələ də özlərinə

verilən nemətlərin qarşılığını ödəməyib nankorluqmu edəcəklər?

74 Bir də onlar, özlərinə yardım olunsun deyə Allahın altındakılardan ilahlar / tanrılar qəbul etdilər.

75 Onlar, onlara yardım etmək iqtidarında deyillər. Halbuki ilah qəbul edənlər, uydurma ilahlar üçün hazır əsgərlərdir.

76 O halda, onların sözü səni üzməsin. Şübhəsiz ki, Biz onların gizlədiklərini və aşkara çıxardıqlarını da bilirik.

77 Və o adam, özünü bir nütfədən / bir damcı sudan yaratdığımızı görmədimi, indi o, açıq-aydın bir düşmən olmuşdur.

78 Və öz yaradılışını diqqətə almayaraq, Bizə bir nümunə çəkdi: Dedi ki: "Kim dirildəcəkmiş o sümükləri? Onlar çürümüş olduğu halda!"

79,80 De ki: "Onları ilk dəfə yaradan, onları dirildəcəkdir. Və O, hər yaratmağı çox yaxşı biləndir. O, sizə o yamyaşıl ağacdan bir atəş / oksigen yaradandır. İndi də siz oksigendən yandırırsınız.

81 Göyləri və yeri yaradan, onlar kimilərini yaratmağa qadir deyilmi? Bəli, əlbəttə qadirdir! Və O, çox-çox mükəmməl yaradandır, çox yaxşı biləndir.

82 Şübhəsiz ki, O, bir şeyi istədiyi zaman, Onun əmri / işi o şeyə "Ol!" deməkdir; o da dərhal olur.

83 O halda, hər şeyin mülkiyyət və idarəsi Öz əlində olan Allah, hər cürə nöqsanlıqlardan pakdır. Siz də yalnız Ona döndəriləcəksiniz."

(41/36, Yə Sin / 71-83)

## FURQAN (42 - 25) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 96**

1 Aləmlərə xəbərdarlıq etsin deyə quluna / qullarına Furqanı[130] nazil
edən necə də comərddir / necə də çox nemət verəndir! 2 Furqanı nazil
edən, göylərin və yerin hökmranlığı Özünə məxsus olan, heç bir övlad götürməyən, hökmranlıqda ortağı olmayan və hər şeyi yaradıb sonra da bir ölçüyə görə nizamlayandır.

3 Kafirlər isə Onun altındakılardan, heç bir şey yarada bilməyən, özləri yaradılmış olan, özləri üçün zərər və fayda verməyə gücü olmayan, ölümə, həyata və ölümdən sonra yenidən diriltməyə gücləri çatmayan ilahlar qəbul etdilər.

4 Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr], "Bu Quran, onun / Muhəmmədin uydurduğu yalandan başqa bir şey deyildir. Ona başqa bir topluluq da bunun üçün yardım

etmişdir" dedilər. Beləliklə onlar həqiqətən haqsızlıq etdilər və əsassız bir iddia gətirdilər.

5 Və "O Quran, keçmişdəkilərin əfsanələrinin yazılı halıdır; indi də o, səhər-axşam / həmişə onun üçün oxunmaqdadır" dedilər.

6 De ki: "Onu göylərdəki və yerdəki sirri bilən nazil etmişdir. Şübhəsiz ki, O, bağışlayandır, mərhəmət edəndir."

7,8 Və inkar edənlər: "Bu necə elçidir ki, yemək yeyir, küçələrdə gəzir? Ona bir mələk nazil olsaydı, beləliklə, onunla birgə xəbərdarlıq edərdi! Yaxud da ona bir xəzinə verilsəydi və ya bir bağı olsaydı ki, oradan yesəydi!" dedilər. Bu şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləyənlər: "Siz yalnızca büyülənmiş bir adama tabe olursunuz!" dedilər.

9 Sənin üçün necə örnəklər gətirdiklərinə bir bax! Artıq onlar azmışlardır, heç bir yol tapmaq iqtidarında da deyillər.

50 Və and olsun ki Biz, öyüd almaları üçün Furqanı, aralarında müxtəlif şəkillərdə anlatdıq, amma insanların çoxu nankorluqda inad etdilər.

51 Əgər istəsəydik Biz əlbəttə hər şəhərə xəbərdarlıq edən birini göndərərdik.

52 Elə isə kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] itaət etmə və Furqan ilə onlara qarşı bütün gücünlə böyük bir cihad et, səy göstər!

10 O elə comərddir ki, istəsə, sənə xəzinədən, onların dediyi bağçadan daha xeyirlisini; altından çaylar axan cənnətləri verər, sənin üçün saraylar da yaradar.

11 Əslində onlar qiyaməti yalanladılar. Biz isə qiyaməti yalan sayanlara şiddətli bir atəş hazırladıq.

12 O şiddətli atəş onları uzaq bir yerdən görən kimi, onun qəzəblənməsini və uğultusunu eşitdilər.

13 Və bağlanmış kimsələr olaraq cəhənnəmdən dar bir yerə atıldıqları zaman, elə oradaca ölümü istəyərlər.

14 *–Bu gün bir ölüm deyil, bir çox ölüm istəyin!–*

15 De ki: "Qarşılıq və gediləcək bir yer olaraq bu daha yaxşıdır, yoxsa Allahın mühafizəsi altına daxil olan şəxslərə söz verilən sonsuzluq
cənnəti?" 16 Onlar üçün orada, istədikləri hər şey daimi olaraq var.
*–Bu, Rəbbinin yerinə yetirməyi Öz üzərinə götürdüyü bir vəddir.–*

17 Və o gün Rəbbin, onları və Allahın altındakılardan onların ibadət etdikləri şeyləri bir yerə yığar, "Bu qullarımı sizmi azdırdınız, yoxsa

özlərimi o yolu itirdilər?” deyər.

**18** O saxta ilahlar dedilər ki: “Səni bütün nöqsanlıqlardan pak tuturuq. Sənin altındakılardan, yardım edən, yol göstərən və qoruyan (himayə edən) yaxınlar qəbul etmək bizə yaraşmaz. Amma Sən onlara və atalarına o qədər nemət verdin ki, Öyüdü / Kitabı tərk etdilər və dəyişikliyə / məhv olmağa gedən bir camaat oldular.”

**19** Bax ibadət etdikləriniz sizi söylədiklərinizdə yalanladılar. Artıq geri çevirməyə və yardım etməyə gücünüz yetməz. Və sizdən kim şirk qoşaraq səhv; *öz zərərinə* olan əməl işləyərsə, Biz ona böyük bir əzabı daddıracağıq.

**20** Biz, səndən əvvəl də şübhəsiz yemək yeyən, bazarlarda gəzib dolaşan elçilərdən göndərdik. Və Biz sizin bir qisminizi bir qisminizə görə saflaşdırmaq üçün sıxıntı vasitəsi etdik. –*Səbr edirsinizmi?*– Və sənin Rəbbin çox yaxşı görəndir. (42/25, Furqan, 1-9,50-52,10-20)

## Nəcm: 97

**21** Bizə qovuşmağı ümid etməyənlər də, “Bizim üzərimizə mələklər / təbii güclər nazil edilməliydi” və ya “Rəbbimizi görməli deyildikmi?” dedilər. And olsun ki, onlar öz aralarında böyüklüklərinə inandılar və böyük bir azğınlıq etmək surətiylə azğınlaşdıqca azğınlaşdılar.

**22** Mələkləri görəcəkləri gün; bax o gün günahkarlara heç bir müjdə; sevindirici xəbər olmayacaq. Və qovuşmağı ümid etməyənlər “Qadağan edilmişdir, qadağan!” deyərlər.

**23** Və Biz, Bizə qovuşmağı ümid etməyənlərin işlədikləri hər əməlin qarşısını aldıq və onu səpələnmiş toz zərrələrinə çevirdik.

**24** O gün, cənnət əhlinin qalacağı yer çox yaxşı, istirahət yeri də daha gözəldir.

**25** Ve o gün səma buludlarla yarılar və mələklər [şüa, radiasiya və meteorlar] bir-birinin ardınca endirilər.

**26** Bax o gün, həqiqi hökmranlıq Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] məxsusdur. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün isə o, çox çətin bir gün olmuşdur.

**27-29** Və o gün, şirk qoşmaq surətiylə səhv; *öz zərərinə* olan əməli işləyənlər əllərini dişləyərək; “Vay halıma, kaş elçi ilə bərabər bir yol tutsaydım! Vay halıma, kaş filankəsi özümə iz qoyan bir öndər seçməsəydim. Heç şübhəsiz mənə gəldikdən sonra, məni Öyüddən / Kitabdan o azdırdı. Və şeytan, insanı rüsvay edən imiş!” deyər.

**30** Elçi də: “Ey Rəbbim! Heç şübhəsiz ki, mənim camaatım bu Quranı

məhcur / tərk edilmiş bir şey qəbul etdilər" dedi.

**31** Və bax beləcə, Biz hər peyğəmbər üçün günahkarlardan bir düşmən hazırlamışıq. Və yol göstərən və yardımçı olaraq Rəbbin yetər.

**32** Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] də: "Quran ona bir dəfədə cəm halında nazil edilməli deyildimi?" dedilər. Biz, onu sənin qəlbinə yaxşıca yeritmək üçün bu cür parça-parça nazil etdik. Və Biz, onu dənə-dənə / bir-birinə qarışdırmadan vəhy etdik.

**33** Onların sənə gətirdikləri hər bir çətin məsələdə Biz şübhəsiz sənə haqqı və ən gözəl açıqlamanı gətirmişik.

**34** O, üzüstü cəhənnəmə yığılacaq olanlar; bax onlar, yerləri ən pis, yolları da ən azğın olanlardır. (42/25, Furqan / 21-34)

## Nəcm: 98

**35** Və and olsun ki, Musaya Kitabı verdik və qardaşı Harunu da onunla birlikdə yardımçı, dəstəkçi verdik.

**36** Sonra da, "Haydı, ayələrimizi yalanlayan o qövmə gedin!" dedik. Sonunda da onları (ayələrimizi yalanlayan o qövmü) parçalayıb yox etdik.

**37** Biz, Nuh qövmünü də, elçiləri yalanladıqları vaxt suda boğduq və onları insanlar üçün bir əlamət / işarət etdik. Və Biz şirk qoşaraq səhv; *öz zərərlərinə* olan əməli işləyənlər üçün çox ağrılı bir əzab hazırladıq.

**38** Adı, Səmudu, Rəss əhlini və bunların arasında olan daha bir çox nəsilləri də həmçinin.

**39** Və Biz onların hamısına örnəklər verdik və hamısını qırıb məhv etdik.

**40** Və and olsun ki, bunlar bəla və pislik (səfalət) yağmuruna tutulan bir diyara getdilər. Bəs onu da görmürdülərmi? Əksinə, bunlar öldükdən sonra dirilməyi ümid etməyirdilər. (42/25, Furqan / 35-40)

## Nəcm: 99

**41,42** Səni görəndə də: "Budurmu Allahın elçi kimi göndərdiyi? Əgər tanrılarımıza inanmaqda inad etməsəydik, həqiqətən də az qala bizi onlardan döndərəcəkdi" deyə səni məsxərəyə qoymaqdan başqa bir şey etmirlər. Və onlar, yaxında əzabı gördükləri zaman kimin haqq yoldan daha çox azdığını biləcəklər!

**43** Mənfi duyğularını, ehtiraslarını özünə tanrı seçən adamı gördünmü / heç düşündünmü? Yaxşı, sən ona vəkil olursanmı?

**44** Yoxsa sən elə bilirsən ki, onların çoxu həqiqətən vəhyə qulaq asacaq yaxud ağıllarını işlədəcəklər? Onlar ancaq heyvanlar kimidir. Əslində tutduqları yola baxılsa, daha çox azğındırlar / çaşqındırlar / alçaqdırlar. (42/25, Furqan / 41-44)

## Nəcm: 100

**45,46** Rabbinin o kölgəni necə uzatmış olduğuna baxmadınmı? İstəsəydi, əlbəttə onu hərəkətsiz də edərdi. Sonra Biz günəşi ona dəlil etdik. Sonra da onu asan bir çəkimlə Özümüzə doğru çəkdik.

**47** Və O, sizin üçün gecəni örtük, yuxunu da rahatlıq edəndir. Və O, gündüzü yayılma (vaxtı) edəndir.

**48,49** Və O, küləkləri rəhmətinin önündə müjdəçi olaraq göndərəndir. Və Biz ölü bir diyarı diriltmək, yaratdığımız neçə-neçə heyvanlara və insanlara su vermək məqsədi ilə göydən tərtəmiz bir su endirdik.

(42/25, Furqan / 45-49)

## Nəcm: 101

**53** Və iki dənizi buraxan da Odur; bu su şirin və susuzluğu yatızdıran, bu su isə duzlu və acıdır. Və O, aralarında bir əngəl və qadağa qoyandır.

**54** Və O, sudan, bir bəşər yaradıb sonra ona bir soy və evlilik səbəbi ilə qohumluq yaradandır. Və sənin Rəbbin hər şeyə qadirdir.

**55** Onlar da Allahın altındakılardan, özünə faydası və zərəri olmayan şeylərə ibadət edirlər. Və o kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəs] Rəbbinin əleyhinə səy göstərəndir / qullarını azdırmaq üçün çalışandır.

**56** Və Biz səni ancaq müjdələyici və xəbərdar edən biri olaraq göndərdik.

**57** De ki: "Mən, buna görə sizdən heç bir muzd istəmirəm. Sadəcə və sadəcə Rəbbinə doğru bir yol tutmağı istəyən kimsələr istəyirəm."

**58** Və sən, ölməyən daima diri olana güvənib dayan və Onun tərifi ilə birlikdə bütün nöqsanlıqlardan pak tut. Qullarının günahlarından xəbərdar olaraq O ölməyən, daim diri olan yetər.

**59** O, daima diri olan, göyləri, yeri və onların arasındakıları altı mərhələdə yaradan, sonra ən böyük taxt üzərində hökmranlıq qurandır,[131] yaratdığı bütün canlılara dünyada çox mərhəmət edəndir. Haydı, sən bunu çox yaxşı biləndən soruş.

**60** Və onlara deyiləndə ki: "Rəhmana [yaratdığı bütün canlılara

dünyada çox mərhəmət edən Allaha] boyun əyib təslimiyyət göstərin!" dedilər ki: "Yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah da nə imiş? Sənin bizə əmr etdiyin şeyə görə boyun əyib təslimiyyət göstərməliyik?" Və boyun əyib təslimiyyət göstərmə əmri, onların nifrətlərini artırdı. (42/25, Furqan / 53-60)

## Nəcm: 102

**61** Göydə bürclər yaradan, onların içində bir qəndil və işıq saçan bir ay yaradan Zat necə də comərddir!

**62** Və öyüd almaq və ya verilən nemətlərin qarşılığını ödəmək istəyən kimsələr üçün gecə ilə gündüzü bir-birinin ardınca gətirən də Odur.

**63** Və Rəhmanın; yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın qulları elə kimsələrdir ki, onlar yer üzündə təvazökarlıqla gəzərlər, cahil kimsələr onlara söz atdığı zaman "Salam!" deyərlər.

**64** Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] qulları, gecələri Rəbbinə təslimiyyət göstərərək və öz qulluq vəzifələrini yerinə yetirərək keçirərlər.

**65,66** Və Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] qulları, "Rəbbimiz! Cəhənnəm əzabını bizdən sovuşdur! Şübhəsiz ki, onun əzabı daimi bir dəyişikliyə və məhvə məruz qalmaqdır. Ora həqiqətən necə də pis bir qərargah, necə də pis bir iqamətgahdır!" deyərlər.

**67** Və Rəhmanın qulları xərclədiklərində bədxərclik etməz, simiclik də etməzlər və bu ikisinin arasında bir tarazlıq olmuşdur.

**68-71** Və bax gör ki, Rəhmanın qulları, Allah ilə birlikdə başqa bir ilaha yalvarmaz. Allahın haram etdiyi canı öldürməzlər. *–Ancaq haqq ilə öldürərlər.–* Zina da etməzlər. *–Və kim bunları edərsə, günahla qarşılaşar. Qiyamət günündə onun əzabı qat-qat olar və orada, alçaldılarak həmişəlik olaraq qalar. Ancaq tövbə edən, iman edən və yaxşı əməl işləyənlər bunun xaricindədir. Allah, bax onların pis əməllərini yaxşı əməllərə çevirər. Və Allah, çox bağışlayandır, çox mərhəmətlidir. Və hər kim tövbə edər və saleh əməli işləyərsə, o həqiqətən də tövbəsi qəbul edilmiş olaraq Allaha dönər.–*

**72** Və Rəhmanın qulları, yalan yerə şahidlik etməzlər, boş bir şeyə rast gəldikləri zaman da alicənablıqla keçib gedərlər.

**73** Və Rəhmanın qulları, Rəbbinin əlamətləri / işarələri xatırladılanda özlərini onlara qarşı kar və kor kimi aparmazlar.

**74** Və Rəhmanın qulları, "Rəbbimiz! Bizə zövcələrimizdən və bizdən sonrakı nəsillərimizdən bizə göz aydınlığı olacaq kimsələr

hibə et / bağışla. Və bizi Allahın mühafizəsi altına girmiş kəslərə öndər et!" deyərlər.

**75,76** Bax, Rəhmanın qulları, səbr etmələrinə qarşılıq cənnətin ən yüksək məqamlarında, orada sonsuz olaraq qalan kimsələr olaraq mükafatlandırılacaqlar, orada hörmət və salamla qarşılanacaqlar. *–Ora necə də gözəl bir qərargah və necə də gözəl bir iqamətgahdır!–*

**77** De ki: "Dualarınız olmasa, Rəbbim sizə dəyər verərmi ki, siz də qətiyyən dua etmədiniz, yalanladınız? Artıq dua etməmək, yalanlamaq sizin yaxanızı buraxmayacaq; özünüzü bu vəziyyətdən qurtara bilməyəcəksiniz." (42/25, Furqan / 61-77)

## FATİR (43 - 35) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 103

**1** Bütün təriflər, göyləri və yeri yoxdan yaradan, xəbərçi ayələri iki-iki,
üç-üç, dörd-dörd… anlamlı / təbiət qüvvələrini ikiqat, üçqat,
dördqat… şiddət vahidində[132] elçilər edən Allaha məxsusdur;
başqasını tərifləmək olmaz. O, yaratmada istədiyi şeyləri artırar.
Şübhəsiz ki, Allah hər şeyə qadirdir. **2** Allah, insanlara rəhmətdən nəyi
açarsa, artıq onu heç kim tuta bilməz. Hər nəyi də tutarsa, artıq onu heç kim açıb sərbəst buraxa bilməz. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, fəsadı yaxşı əngəlləyən / elədiyini sağlam edəndir.
(43 / 35, Fatir / 1-2)

### Nəcm: 104

**3** Ey insanlar! Sizə göydən və yerdən ruzi verən Allahın sizin üzərinizdəki nemətini xatırlayın. Allahdan başqa bir yaradıcımı var? Ondan başqa ilah deyə bir şey yoxdur. Belə olduğu halda, necə döndərilirsiniz?!

**4** Və əgər onlar səni yalanlayırlarsa, həqiqətən səndən öncə də elçilər yalanlanmışdı. Və işlər yalnızca Allaha döndərilər.

**5** Ey insanlar! Heç şübhəsiz, Allahın yerinə yetirməsi üçün verdiyi söz
gerçəkdir. Onun üçün bu bəsit dünya həyatı sizi aldatmasın. Və o
aldadan da, sizi qətiyyən Allah ilə aldatmasın. **6** Şübhəsiz o şeytan,
sizin düşməninizdir. Buna görə, siz də onu düşmən bilin. Şübhəsiz ki, şeytan öz tərəfdarlarını alovlu atəşin əhlindən olmağa çağırır.

**7** Kafirlər, Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr; onlar üçün şiddətli bir əzab vardır. İman etmiş və sahmana

salmaq məqsədi ilə işlər görmüş kəslər; onlar üçün bağışlanma və böyük bir mükafat vardır. **8** Onun üçün, pis əməli özünə süslü göstərilən sonra da onu gözəl görən adammı? Şübhə yox ki, Allah istədiyini / istəyəni çaşdırar, istədiyini / istəyəni də doğru yola yönəldər. Belə isə, onlara qarşı canını həsrətlə / kədərlə sıxma. Şübhəsiz ki, Allah onların nə etdiklərini çox yaxşı bilir.

**9** Və Allah, külələri göndərəndir. Sonra da onlar bir buludu hərəkətə keçirib yuxarılara qaldırar. Ardınca, Biz, o buludu ölmüş bir diyara sürüb göndərərik. Beləliklə, yer üzünə ölümüdən sonra onunla həyat verərik. Ölüb çürümüş insanlara həyat vermək də bax belədir.

**10** Hər kim üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan; mütləq qalib olmaq istəyirsə, bilsin ki ən üstün, ən güclü, ən şərəfli, məğlub olması mümkün olmayan; mütləq qalib olmaq tamamilə ancaq Allaha məxsusdur. Xoş sözlər ancaq Ona yüksələr. Və düzgün iş onu yüksəldər. Pisliklərin planlarını quran bu kəslər; onlar, şiddətli əzab onlar üçündür. Onların planları isə; o, darmadağın olar.

**11** Və Allah sizi bir torpaqdan, sonra nütfədən yaratdı Sonra sizi cütlər halına saldı. Dişi ancaq Onun biliyi olə hamilə olar və buraxar [doğar, yükünü yerə qoyar]. Ömür biçilənlərin də bu ömründən yaşadığı və ömründən azalanlar mütləq bir kitabda yazılıdır. Şübhə yox ki, bu, Allah üçün çox asandır.

**12** İki dəniz də eyni deyil; bu şirindir, hərarəti kəsər və içərkən boğazdan rahatlıqla keçər; digəri isə şordur, yandırıb qovurar. Hər birindən də təzə bir ət yeyərsiniz və geymək üçün bir bəzək çıxararsınız. Allahın lütfündən haqqınız olanı axtarmağınız üçün və sizə verilən nemətlərin qarşılığını ödəyərsiniz deyə, orada suyu yara - yara gedən gəmiləri də görərsən.

**13,14** Allah, gecəni gündüzə qatar, gündüzü də gecəyə qatar. Günəşi və ayı insanlığın faydalanacağı quruluş və funksiyada yaratmışdır. Hamısı qabaqcadan müəyyən edilmiş bir müddət üçün axıb gedir. Bu, sizin Rəbbiniz olan Allahdır, mülk də Onundur. Onun altındakılardan, yalvardığınız kimsələr bir xurma çəyirdəyinin zərinə belə sahib ola bilməzlər. Onları çağırsanız, onlar sizin çağırışınızı eşitməzlər; eşitsələr belə sizə cavab verə bilməzlər, Qiyamət günü də ortaq qoşduğunuzu qəbul etməzlər. Hər şeydən xəbərdar olan Allah kimi, sənə kimsə xəbər verə bilməz.

**15** Ey insanlar! Allaha möhtac olanlar sizlərsiniz. Allah isə; O, zəngin və tərifə layiq olandır.

**16,17** Əgər O istəsə, sizi məhv edər və yeni bir məxluqu / xalqı gətirər. Bu, Allah üçün qətiyyən çətin deyil. (43 / 35, Fatir / 3-17)

**Nəcm: 105**

**18** Və günahkar kimsə, başqasının günahını daşımaz. Əgər çox günahı olan / çox zəngin olan bir kimsə, günahını daşımaq üçün birini çağırsa da ondan heç bir günah alınıb başqasına daşıtdırılmayacaq. –*Qohumu olsa belə.*– Şübhəsiz sən ancaq öz Rəbbi qarşısında kimsəsiz yerlərdə hörmətlə, məhəbbətlə, elmlə ürpərən və səlatı iqamə edənləri [maddi və zehni baxımdan dəstək olanları; cəmiyyəti maarifləndirmə qurumlarını quranları -ayaqda tutanları] xəbərdar edirsən. Hər kim təmizlənərsə sadəcə özü üçün təmizlənər. Dönüş də yalnızca Allahadır.

**19-21** Kor ilə görən, qaranlıqlar ilə aydınlıq və kölgə ilə istilik eyni olmaz.

**22** Ölülər və dirilər də eyni olmaz. Şübhəsiz ki, Allah hər istədiyinə / istəyənə eşitdirər. Sən isə qəbirlərdəki adamlara eşitdirən biri deyilsən.
**23** Sən sadəcə bir xəbərdar edənsən.

**24** Şübhəsiz Biz, səni haqq ilə müjdələyən, xəbərdar edən biri kimi göndərdik / elçi etdik. Hər ümmətin içindən də xəbərdar edən biri
mütləq gəlib keçmişdir. **25** Və onlar səni yalanlayırlarsa, heç şübhəsiz
ki, onlardan öncəki kəslər də yalanlamışdılar; elçilər onlara açıq-aşkar dəlillərlə, səhifələrlə və aydınlıq bəxş edən kitablarla gəlmişdilər.
**26** Sonra Mən, kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəsləri] tutub yaxaladım. İndi gör, Məni tanımamaq / tanıtdırmamağa çalışmaq necə oldu?

**27** Görmədinmi / heç düşünmədinmi, həqiqətən Allah göydən bir su endirdi? Biz onunla rəngləri müxtəlif cür meyvələr / məhsullar bitirdik. Dağlardan da yollar var; ağlı, qırmızılı müxtəlif rənglərdə / rənglərin dəyişik tonlarında. Və qapqara torpaqlar / yollar da var.

**28** İnsanlardan, digər canlı varlıqlardan və mal-qaralardan da belə müxtəlif rəngdə olanlar vardır. Qulları arasında Allah qarşısında hörmətlə, məhəbbətlə, elmlə ürpərənlər ancaq alimlərdir. Heç şübhəsiz ki, Allah çox güclüdür, çox bağışlayandır.

**29,30** Heç şübhəsiz, Allahın kitabını oxuyan, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olan; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirən və ayaqda tutan] və onları ruziləndirdiyimiz şeylərdən gizli və açıq şəkildə Allah yolunda xərcləyən / yaxınlarının nəfəqələrini (ehtiyaclarını) təmin edən bu kimsələr, Allah, mükafatlarını onlara əskiksiz olaraq versin və ərməğanlarından onlara artırsın deyə, qətiyyən batmaq ehtimalı / imkanı olmayan bir ticarəti ümid edərlər. Heç şübhəsiz O, çox bağışlayan və qarşılıq verəndir.

**31** Və Bizim, Kitabdan sənə, sadəcə içində olanları təsdiqləyici olaraq vəhy etdiyimiz şey, haqqın elə özüdür. Şübhə yox ki, Allah öz qullarını haqqıyla bilən və haqqıyla görəndir. (43/35, Fatir / 18-31)

## Nəcm: 106

**32,33** Sonra Biz Kitabı qullarımızdann seçib ayırdıqlarımıza miras qoyduq. İndi də onlardan bəziləri özlərinə haqsızlıq edən, bəziləri orta yolu tutan / ikibaşlı rəftar edən, bəziləri də Allahın izni ilə / biliyi daxilində xeyir əməllərdə öndə gedənlərdir. Bax bu, böyük lütfün; Ədn cənnətlərinin özüdür ki var. Onlar oraya daxil olacaqlar. Orada qızıl bilərziklərlə və incilərlə bəzənəcəklər. Libasları da ipəkdən olacaqdır.
**34,35** Onlar orada deyərlər: "Bütün təriflər, bizdən qəm-qüssəni uzaqlaşdıran və bizə ərmağanlar verən, içində bizim üçün yorğunluq və bezginlik olmayan bu yurda bizi daxil edən Allaha məxsusdur; başqasını tərifləmək olmaz. Həqiqətən, Rəbbimiz çox bağışlayandır və çox qarşılıq verəndir."

**36** Və o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kəslər] ki var, cəhənnəm atəşi onlar üçündür. Onlar haqqında hökm verilməz ki, ölsünlər. Onlardan, cəhənnəm atəşinin bir azı da yüngülləşdirilməz. Biz, kafiri [Allahın ilah və rəbb olduğunu bilərək
rədd edəni]; hər həddini aşanı bax belə cəzalandırarıq. **37** Və onlar,
orada fəryad edərlər: "Ey Rəbbimiz! Bizləri çıxar, işlədiyimiz əməllərdən başqa düzgün əməl işləyək." *–Sizə, düşünəcək olanın düşünəcəyi qədər ömür vermədikmi? Sizi xəbərdar edən də gəlmişdi. O halda dadın! Artıq şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün bir yardımçı da yoxdur.–*

**38** Həqiqətən, Allah göylərdə və yerdə görünməyən, eşidilməyən, hiss edilməyən şeyləri biləndir. Heç şübhəsiz ki, O, kökslərin içindəkini çox yaxşı biləndir.

**39** O, sizi yer üzünündə xəlifələr edəndir. Artıq kim küfr edərsə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsə], küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməsi] öz zərərinədir. Və kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməsi] Rəblərinin qatında onlara olan buğzu (nifrəti) ancaq artırar. Və kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməsi] özlərinə verdikləri zərəri ancaq artırar.
(43/35, Fatir / 32-39)

**Nəcm: 107**

**40** De ki: "Allahın altındakılardan o yalvardığınız, ortaq qoşduğunuz kəsləri heç düşündünüzmü? Göstərin görüm, yer üzündə nəyi yaratmışlar? Ya da onlar üçün göylərdə bir ortaqlıqmı var? Yaxud da Biz onlara bir kitab vermişik, onlar oradakı bir dəlilə istinad edirlər?" Əksinə, şirk qoşaraq səhv; *öz zərərlərinə* olan əməli işləyən o kəslər, bir-birlərinə yalandan başqa bir vəd vermirlər.

**41** Heç şübhəsiz, göyləri və yer üzünü yox olmaqdan Allah qoruyur. And olsun ki, əgər göylər və yer üzü yox olsalar, onları Ondan başqa heç kim saxlaya bilməz. Həqiqətən O, çox yumşaq rəftar edən, çox bağışlayandır.

**42,43** Və onlar, var gücləriylə Allaha and içmişdilər ki, onları xəbərdar edən bir peyğəmbər gələrsə, mütləq öndərli camaatların hamısından daha doğru yolda olacaqlar. Buna baxmayaraq, nə zaman ki, onları xəbərdar edən biri gəldi, bu, yer üzündə təkəbbür və pis əməlləri ucbatından onların ancaq nifrətlərini artırdı. Halbuki pis əməl ancaq öz sahibinin ətrafını bürüyər. O halda, öncəkilərin qanunundan / onlara tətbiq ediləndən başqa nə gözləyirlər? Onun üçün sən, Allahın tətbiqlərində qətiyyən bir dəyişiklik tapa bilməzsən. Sən, Allahın tətbiqlərində qətiyyən bir fərq də tapa bilməzsən.

**44** Və yer üzündə gəzib-dolaşarkən, özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmədilərmi? Halbuki onlar, bunlardan daha qüvvətli idilər. Göylərdə və yer üzündə Allahı aciz qoyan heç bir şey yoxdur. Həqiqətən O, ən yaxşı bilən, ən güclü olandır.

**45** Və əgər Allah, qazandıqları şeylər səbəbindən insanları sorğu-sual edib cəzalandırsaydı, yer üzündə kiçik-böyük heç bir canlını sağ buraxmazdı. Lakin onlara müəyyən bir müddətə qədər möhlət vermişdir. Nəhayət bu müddət başa çatdıqda, artıq şübhəsiz ki, Allah, Öz qullarını ən yaxşı görəndir. (43/35, Fatir / 40-45)

## MƏRYƏM (44 - 19) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 108**

**1** Kaf / 20, Ha / 5, Ya / 10, Əyn / 70, Sad / 90.[133]

**2** Rəbbinin, qulu Zəkəriyyaya olan mərhəmətinin xatırlanması!

**3** Bir vaxtlar o, Rəbbinə gizli olaraq səslənmişdi. **4-6** Demişdi ki: "Ey Rəbbim! Şübhəsiz ki, mənim sümüyüm zəifləyib kövrəkləşdi və başım ağaran saçıyla alov kimi yandı. Sənə dua etməklə də, kədərlənmədim. Və həqiqətən mən, arxamdan, yaxınlarımdan / əmioğullarımdan

narahatam. Arvadım da sonsuzdur. Onun üçün dərgahından mənə bir vəli [köməkçi, himayəçi yaxın kimsə] əta et ki həm mənə varis olsun, həm də Yəqub ailəsinə varis olsun. Rəbbim, elə et ki, o, Sənin razılığını qazanan / hər kəsin razı qaldığı biri olsun!”

**7** “Ey Zəkəriyya! Şübhəsiz ki, Biz sənə bir cavan oğlanı *–Onun adı Yəhyadır–* müjdə veririk. Bundan öncə ona heç bir adaş yaratmadıq.”

**8** Zəkəriyya: “Ey Rəbbim! Arvadım sonsuz, mən də son dərəcə qoca olduğum halda, mənim cavan oğlum necə ola bilər?” dedi.

**9** Allah dedi ki: “Elədir! Rəbbin buyurdu ki, “Bu, Mənim üçün asandır. Bundan öncə də sən heç bir şey olmadığın halda, Mən səni yaratmışdım.”

**10** Zəkəriyya: “Ey Rəbbim! Mənə bir əlamət ver” dedi. Allah, “Sənin əlamətin, sağlam olduğun halda üç gecə insanlarla danışmamağındır” buyurdu.

**11** Belə olan halda, Zəkəriyya mehrabdan; öz məqamından camaatın qarşısına çıxıb onlara işarə etdi ki, həmişə / hər vaxt Allahı bütün nöqsanlıqlardan pak bilsinlər.

**12-15** “Ey Yəhya! Kitabı möhkəm tut!” O, xarab dini tərk edən biri ikən Biz ona qanun, şəfqət və saflıq verdik və o, Allahın mühafizəsi altına xeyli daxil olan biri idi. Və ana-atası ilə çox yaxşı rəftar edərdi. Və o, dikbaş və itaətsiz biri deyildi. Və doğulduğu gündə və öləcəyi gündə və yenidən diri olaraq qaldırılacağı gündə ona salam olsun!

(44/19, Məryəm / 1-15)

## Nəcm: 109

**16** Kitabda Məryəmi də yad et! O ki, ailəsindən / yaxınlarından ayrılaraq məşriq tərəfdə bir yerə qaçıb getmişdi.

**17** Sonra ailəsiylə / yaxınlarıyla özü arasına bir pərdə çəkmişdi və Biz də ona ruhumuzu / ilahi xəbərimizi[134] göndərdik, sonra ruhumuzu / xəbərlərimizi gətirən elçi, Məryəmə kamil bir bəşəri nümunə göstərdi.

**18** Məryəm: “Mən səndən Rəhmana [yaratdığı bütün canlılara dünya-da çox mərhəmət edən Allaha] sığınıram. Əgər sən Allahın mühafizəsi altına daxil olan biri / müttəqi birisənsə…” dedi.

**19** Elçi / Zəkəriyya: “Mən ancaq sənə pak bir oğlan bağışlayım deyə / bağışlamaq üçün Rəbbinin elçisiyəm” dedi.

**20** Məryəm: “Mənim necə oğlum ola bilər? Mənə heç bir bəşər toxunmamışdır. Mən qanun tanımayan / iffətsiz biri də deyiləm” dedi.

**21** Elçi: “Elədir! Rəbbin buyurdu ki: Atasız uşaq vermək, Mənim üçün çox asandır. Həm də Biz, onu Öz tərəfimizdən insanlara bir əlamət /

işarət və rəhmət edəcəyik." Və o, gerçəkləşdirilmiş bir iş oldu.

**22** Nəhayət Məryəm / oğlana hamilə qaldı. Sonra da onunla birgə uzaq bir yerə qaçıb getdi.

**23** Sonra doğuş sancısı onu məcbur etdi ki, bir xurma kötüyündən tutaraq dayansın. "Kaş ki, bundan əvvəl ölmüş və tamamən yaddan çıxıb getmiş biri olsaydım!" dedi.

**24-26** Sonra ona; Məryəmə aşağısındaki kəs; Zəkəriyya səsləndi: "Əsla üzülmə, Rəbbin alt tərəfində bir su arxı yaratdı. Xurma kötüyünü özünə doğru silkələ, üstünə yetişmiş, təzə xurmalar düşsün. Sonra ye-iç, gözün aydın olsun. Sonra əgər bəşərdən birini görsən, 'Mən Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] bir oruc nəzir eləmişəm, buna görə də bu gün heç kimlə danışmayacağam' de."

**27-28** Sonra Məryəm, uşağını alıb qövmünə gətirdi. Qövmü dedi ki: "Ey Məryəm! Həqiqətən sən görülməmiş bir şey etdin. Ey Harunun bacısı! Atan pis bir adam deyildi, anan da qanun tanımayan / iffətsiz bir qadın deyildi."

**29** Belə olduqda, Məryəm ona; doğuş anında aşağı tərəfində olan adama; Zəkəriyyaya işarə etdi, hadisələri onun açıqlamasını istədi. Zəkəriyya Məryəmin zina etmədən uşaq doğduğuna zamin olub uşağın məbəddə yetişdirilməsini istədi. Onlar: "Biz, yüksək mövqeyə sahib olan kəslər, Sabii; bizim dinimizi tərk etmiş birinə necə söz söylərik / yüksək mövqeyə sahib olan insanlar, Sabii; bizim dinimizi tərk etmiş birinə necə söz söylər?" dedilər.

**34** Bax, bu, haqq sözə görə, haqqında ixtilaf edib durduqları,
**30** *"Şübhəsiz mən Allahın quluyam. O mənə kitabı verdi və məni bir peyğəmbər etdi.* **31** *Məni, harada oluramsa olum mübarək etdi. Həyatda olduğum müddətdə mənə səlatı [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyi] və zəkatı / vergini öhdəlik olaraq mənim üzərimə qoydu.* **32** *Və məni, anamla yaxşı rəftar edən biri etdi. Və məni dikbaş, bədbəxt biri etmədi.* **33** *Və doğulduğum gündə, öləcəyim gündə və diri olaraq yenidən qaldırılacağım gündə salam mənim üzərimədir.* **36** *Və şübhəsiz, Allah mənim Rəbbimdir, sizin də Rəbbinizdir. O halda, Ona qulluq edin, bax bu, ən doğru yoldur."* **34** deyən Məryəm oğlu İsadır.[135] (44/19, Məryəm / 16-34, 36)

## Nəcm: 110

**35** Allah üçün uşaq götürmək deyə bir şey yoxdur. O, bundan pakdır. O, bir şeyə hökm edərsə, ona yalnızca "Ol!" deyər, o da olar.

**37** Sonra da öz aralarından çıxan bir-birinə zidd qruplar ixtilafa düşdülər. Bax, o böyük günün şahidliyində, məhkəməsində o kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] vay halına!

**38** Bizə gələcəkləri gün, nələr eşidəcəklər, nələr görəcəklər! Lakin şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələr bu gün açıq-aşkar bir azğınlıq içindədirlər.

**39** Və sən onları, özləri cahillik, laqeydlik içində olduqları və inanmadıqları halda əmrin yerinə yetiriləcəyi o böyük peşmanlıq günüylə xəbərdar et!

**40** Şübhəsiz Biz, yer üzünə və onun üzərindəki kimsələrə varis olacağıq / onlar gedəcək, Biz qalacağıq. Və onlar yalnızca Bizə döndəriləcəklər. (44/19, Məryəm / 35, 37-40)

## Nəcm: 111

**41** Kitabda İbrahimi də yad et / xatırlat. Şübhəsiz ki, o, özü-sözü doğru biri idi, peyğəmbər idi.

**42-45** Bir zaman o, atasına: "Atacan! Nə üçün eşitməyən, görməyən və sənə heç bir faydası olmayan şeylərə qulluq edirsən? Atacan! Şübhəsiz ki, sənə verilməyən bir bilik mənə verildi. O halda mənim ardımca gəl ki, sənə doğru bir yol göstərim. Atacan! Şeytana qulluq etmə. Şübhəsiz ki, şeytan Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] asi oldu. Atacan! Mən həqiqətən qorxuram ki, sənə Rəhmandan [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahdan] bir əzab gələr və sən də şeytan üçün bir yol göstərən, qoruyan, kömək edən yaxın biri olarsan."-demişdi.

**46** Atası: "Ey İbrahim! Sən mənim ilahlarımdan üz çevirirsən? Əgər buna son qoymasan, and olsun səni daşqalaq edərək öldürərəm. Haydı, uzun bir müddət məndən uzaq ol / rədd ol!" dedi.

**47,48** İbrahim: "Salam olsun sənə, sənin üçün Rəbbimdən bağışlanma diləyəcəyəm. Şübhəsiz ki, O, mənə çox ətalar edəndir. Və mən, sizdən də, Allahın altındakılardan qulluq etdiyiniz şeylərdən də çəkilib uzaqlaşıram. Və Rəbbimə dua edəcəyəm. Ümid edirəm ki, Rəbbimə etdiyim duada məyus olmayacağam" dedi.

**49** Sonra İbrahim, qövmündən, Allahın altındakılardan qulluq etdikləri şeylərdən uzaqlaşınca, Biz ona İshaqı və Yə'qubu bəxş etdik. Hamısını da peyğəmbər etdik.

**50** Və Biz onlara öz rəhmətimizdən ehsanlar etdik. Və onlar üçün ali bir doğruluq dili hazırladıq. (44/19, Məryəm / 41-50)

## Nəcm: 112

**51** Və Kitabda Musanı da yad et / xatırlat. Şübhəsiz ki, o safalaşdırılaraq təmizlənmişdi. Və bir elçi, bir peyğəmbər idi.

**52** Biz onu ən mübarək Turun yan tərəfindən çağırdıq və məxsusi danışmaq üçün onu yaxınlaşdırdıq. **53** Və rəhmətimizdən ona qardaşı Harunu da bir peyğəmbər olaraq bəxş elədik.

**54** Və Kitabda İsmaili yad et / xatırlat. Şübhəsiz ki, o, vədinə sadiq idi, bir elçi, bir peyğəmbər idi. **55** Və o, ailəsinə / çevrəsinə səlatı [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyi] və zəkatı / vergini əmr edərdi. Və o Rəbbinin dərgahında bəyənilmişdi.

**56** Və Kitabda İdrisi yad et / xatırlat. Şübhəsiz ki, o, özü-sözü doğru bir kəs idi, bir peyğəmbər idi. **57** Və Biz onu ali bir məkana yüksəltdik.

**58** Bax bunlar, Adəmin nəslindən, Nuh ilə bərabər daşıdıqlarımızdan, İbrahim və İsrailin nəslindən, bələdçilik etdiyimiz və seçdiyimiz peyğəmbərlərdən Allahın nemətlər verdiyi kimsələrdir. Onlar Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] ayələri oxunduğu zaman ağlayaraq və boyun əyib təslimiyyət göstərərək üzü üstə yerə qapanırdılar. (44/19, Məryəm / 51-58)

## Nəcm: 113

**59-61** Sonra onların ardından pis bir nəsil gəldi ki, səlatı [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirmək işini] itirdilər / həyatlarından çıxarıb atdılar. Və şəhvətlərinə tabe oldular. Buna görə, tövbə edən və iman edən və saleh əməl işləyənlər istisna olmaqla, onlar azğınlıqlarının cəzasıyla qarşılaşacaqlar. Beləliklə, tövbə edən, iman edən və saleh əməl işləyənlər cənnətə; Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] qullarına *–görmədikləri halda–* vəd etdiyi və Ədn cənnətlərinə daxil olacaqlar və qətiyyən haqsızlığa məruz qalmayacaqlar. Şübhəsiz ki, Onun vədi mütləq yerinə yetəcəkdir.

**62** Onlar orada boş bir söz eşitməzlər. Ancaq "Salam [sağlıq, salamatlıq, xoşbəxtlik]!" eşidərlər. Orada onlar üçün hər zaman ruziləri də var.

**63** Bax bu, qullarımızdan Allahın mühafizəsi altına daxil olan kəslərə miras olaraq / zəhmətsiz və son sahibləri olmaq üzrə verəcəyimiz cənnətdir. (44/19, Məryəm / 59-63)

## Nəcm: 114

**64** Biz Quran ayələri,[136] yalnızca Rəbbinin əmri ilə nazil olarıq. Bütün keçmiş və gələcək şeylər və bunların arasındakılar yalnızca Onundur. Və sənin Rəbbin unutmamışdır.
**65** O, göylərin, yerin və onların arasında olanların Rəbbidir. Elə isə, Ona qulluq et və Ona qulluq etməkdə səbr et. Sən heç Onun ismiylə isimlənən birini tanıyırsanmı? (44/19, Məryəm / 64-65)

## Nəcm: 115

**66** Və o insan: "Mən öldüyüm zaman, gələcəkdə həqiqətən diri olaraq çıxarılacağammı?" deyir.

**67** Və o insan, daha öncə o heç bir şey deyilkən, həqiqətən Bizim onu yaratdığımızı düşünməzmi?

**68** Bunun üçün, Rəbbinə and olsun ki, Biz onları və şeytanları mütləq toplayacağıq. Sonra onları dizləri üzərinə çökmüş halda cəhənnəmin xarici kənarında / toplanma sahəsində mütləq cəm edəcəyik.

**69** Sonra hər qrupdan, Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] qarşı itaətsizlikdə ən şiddətli rəftar edən hər kəsi mütləq ayıracağıq.

**70** Sonra əlbəttə Biz, oraya atılmağa kimlərin daha çox layiq olduğunu çox yaxşı bilirik.

**71** Və Rəbbinin Öz üzərinə götürdüyü qəti bir hökm olaraq, sizin içinizdə elə bir kəs yoxdur ki, cəhənnəmin xarici kənarına / toplanma sahəsinə gəlməsin.

**72** Sonra Biz, Allahın mühafizəsi altına daxil olan kəsləri qurtararıq. Şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənləri cəhənnəmin xarici kənarında / toplanma sahəsində dizləri üstə çökmüş halda buraxarıq.
(44/19, Məryəm / 66-72)

## Nəcm: 116

**73** Və ayələrimiz onlara açıq-aşkar oxunduğu zaman, o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəslər] iman edən kəslərə: "Bu iki dəstədən [möminlərlə Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərdən] hansının məqamı, mövqeyi daha yaxşı, oturub-durduğu kimsələr / təşkilatları daha gözəldir?" dedilər.

**74** Halbuki Biz onlardan öncə, mal və təmtəraq baxımından daha gözəl neçə-neçə nəsilləri / neçə-neçə əsrlərin xalqını dəyişikliyə / məhvə məruz qoymuşduq.

**75** De ki: "Kim azğınlıq içində olarsa, Rəhman [yaratdığı bütün

canlılara dünyada çox mərhəmət edən Allah], onun üçün elə hey uzadar / ona möhlət verər. Axırda onlara vəd ediləni [əzabı və ya qiyamətin qopmasını] gördükləri vaxt, artıq onlar kimin məqam və mövqe baxımından daha şərli (pis), əsgər [dəstək, qüvvə] baxımından daha zəif olduğunu biləcəkdir.

**76** Və Allah, özünə göstərilən doğru yola girənlərin hidayətini artırar. Və qalıcı olan saleh işlər, Rəbbinin qatında savab baxımından daha xeyirlidir, nəticə baxımından da daha yaxşıdır.” (44/19, Məryəm / 73-76)

## Nəcm: 117

**77** Yaxşı, bəs əlamətlərimizi / işarətlərimizi, Allahın ilah və rəbb olduğunu qəbul etməyən və “Əlbəttə mal və uşaq veriləcək” deyən kimsəni gördünmü / heç düşündünmü?

**78-80** O inkarçı şəxs, bilməsi, dərk etməsi mümkün olmayan şeylər barədə məlumat sahibi oldu; ya da Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] qatından bir sözmü aldı? Qətiyyən onun düşündüyü kimi deyil! Biz onun söylədiyi şeyləri yazarıq və onun üçün, əzabdan elə hey uzadarıq. Və o söylədiyi şeylərə Biz mirasçı olacağıq / son söz və əməl Bizimdir və o, Bizə tək başına gələcəkdir.

**81** Və onlar, özləri üçün bir güc, şan, şərəf olsun deyə Allahın altındakılardan ilahlar qəbul etdilər.

**82** Qətiyyən onların düşündüyü kimi deyil! İlah qəbul etdikləri o şeylər onların qulluqlarını qəbul etməyəcəklər və onların əleyhlərinə çevrilərək qarşı olacaqlar.

**83** Görmədinmi / heç düşünmədinmi? Şübhəsiz ki, Biz, şeytanları kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəslərin] üzərinə göndərdik. Onları qışqırtdıqca qışqırdırlar (elə hey qızışdırırlar). (44/19, Məryəm / 77-83)

## Nəcm: 118

**84** Elə isə, onların zərəri üçün tələsmə. Şübhəsiz ki, Biz, onlar üçün saydıqca sayırıq.

**85** O gün Allahın mühafizəsi altına daxil olan kəsləri Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] minikli heyətlər halında; krala gedən elçi ehtişamıyla toplayacağıq.

**86** Günahkarları da susamış olaraq cəhənnəmə sürəcəyik.

**87** Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] qatından bir zəmanət sözü alan kimsədən başqa *–heç kimə*

*belə bir söz verilməyib*– onlar yardıma-dəstəyə sahib olmayacaqlar.

**88** Və onlar, "Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah] Özünə övlad götürdü!" dedilər.

**89** And olsun ki, siz çox çirkin bir şey söylədiniz.

**90,91** Bundan ötrü; Rəhmana övlad isnad etdilər deyə az qalsın ki, göylər çatlayacaq, yer yarılacaq və dağlar parçalanıb dağılacaqdı.

**92** Halbuki Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət
edən Allah] üçün övlad götürmək yaraşmaz. **93** Göylərdə və yerdə
olan bütün hər kəs Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha], yalnızca qul olaraq gələcəkdir.

**94** And olsun ki, Rəhman, onların hamısını əhatə etmişdir və onları bir
-bir saymışdır. **95** Hamısı da qiyamət günü Rəhmana tək başlarına
gələrlər.

**98** Və Biz onlardan öncə neçə-neçə nəsilləri dəyişikliyə / məhvə məruz qoyduq. Onlardan hansısa bir kimsəni hiss edə bilirsənmi? Yaxud onlara aid xəfif bir səs eşidə bilirsənmi?[137]

**96** Şübhəsiz, bu iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyənlər (ki var); Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah], onlar üçün sevgi yaradacaqır.

**97** Bax şübhəsiz Biz bu Quranı, bununla Allahın mühafizəsi altına daxil olan kəsləri müjdələyəsən, inad edən camaatı da xəbərdar edəsən deyə sənin dilində asanlaşdırdıq. (44/19, Məryəm / 84-95, 98, 96-97)

## TA HA (45 – 20) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 119**

**1** Ta / 9, Ha / 5.[138]

**2-4** Biz, Quranı sənə sıxıntıya düşəsən / qüssələnəsən deyə yox, ancaq hörmət, məhəbbət və elmlə ürpərən kimsə üçün bir öyüd olsun deyə, yer üzünü və uca göyləri yaradan tərəfindən nazil etdik.

**5** Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən
Allah], ən böyük taxt üzərində hökmranlıq qurmuşdur.[139] **6** Göylərdə
olan şeylər, yer üzündə olan şeylər, bu ikisinin arasında olan şeylər və nəmli torpağın altında olan şeylər ancaq Rəhmanındır.

**7** Sən səsini qaldırsan, Rəhman şübhəsiz ki, gizlini və gizlinin də
gizlisini bilir. **8** Allah, Özündən başqa heç bir ilah olmayandır. Ən
gözəl isimlər yalnız Ona məxsusdur. (45/20, Ta Ha / 1-8)

## Nəcm: 120[140]

9 Musa ilə əlaqəli məlumatlar həqiqətən sənə yetişdi.

10 Bir vaxt o, bir atəş görmüşdü və əhlinə [ailəsinə, yaxınlarına]: "Həqiqətən mən bir atəş gördüm. Ondan sizə bir köz parçası gətirməm, yaxud atəş üzərində bir yol göstərən tapa bilməyim üçün siz gözləyin." demişdi.

11 Sonra onun yanına gəldiyində səsləndi: *"Ey Musa!* 12 *Mən, sənin*
*Rəbbin olan Mənəm. Dərhal yaxınlarını və mallarını burada qoy,*[141]
*şübhəsiz sən təmizlənmiş Tuva vadisindəsən / iki dəfə təmizlənmiş bir*
*vadidəsən.* 13 *Və Mən səni seçdim; O halda, vəhy ediləcək olan şeyə;*
14 *"Heç şübhəsiz ki, Mən, Allahın elə Özüyəm. Məndən başqa İlah*
*deyə bir şey yoxdur. O halda Mənə qulluq et və Məni xatırlamaq üçün*
*səlatı iqamə et [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti*
*maarifləndirmə qurumlarını yarat-ayaqda tut].* 15 *Şübhəsiz ki, o*
*saat / qiyamət gələcəkdir. Onu Mən hər kəs əməyinin qarşılığını alsın*
*deyə, az qala, gizlədirəm.* 16 *O səbəbdən, qiyamətə iman etməyən və*
*öz boş, müvəqqəti arzusuna uyan kimsə səni, qiyamətə iman etməkdən*
*yayındırmasın; sonra dəyişikliyə / məhvə məruz qalarsan"*
13 xəbərdarlığına qulaq ver.[142]

17 Və sağ əlindəki nədir, ey Musa?"

18 Musa: "O mənim əsamdır, ona söykənir, onunla qoyunlarıma yarpaq silkələyirəm və onda mənim üçün başqa faydalar da var" dedi.

19 Allah: "Ey Musa! Onu burax / çobanlığı buraxıb oturaq həyata keç!
24 Fironun yanına get, şübhəsiz o, həddini aşmışdır" dedi.[143]

***

20 O da onu dərhal buraxdı / oturaq həyata keçdi, bir də nə görsən! Artıq sağ əlindəki; ona vəhy edilən Kitab, hərəkət edən bir candır; sosial həyatın mənbəyidir.[144]

25 Musa: "Ey Rəbbim! 33 Seni bütün nöqsanlıqlardan çox pak tutaq
deyə 34 Və Səni çoxlu-çoxlu yad edək deyə 25 Köksümü aç, 26 İşimi
mənə asanlaşdır. 27 Dilimdəki düyünü də aç 28 ki sözümü yaxşı başa
düşsünlər. 29 Və ailəmdən 30 Qardaşım Harunu 29 Mənə vəzir et,
31 Onunla arxamı möhkəmləndir. 32 Onu işimdə mənə ortaq et.
35 Şübhəsiz, Sən bizi görüb, eşidirsən!" 25 dedi.

36 Allah: "Ey Musa! İstədiyin sənə verildi." dedi.

21 Allah: 23 "Sənə ən böyük əlamətlərimizdən / işarətlərimizdən
göstərməyimiz üçün 21 Sarıl ona, qorxma![145] Biz onu ilk gediş (tabe
olunan prinsiplər yoluna geri çevirəcəyik; o işləri yoluna qoyacağıq,
sənə sıxıntı verdirməyəcəyik. 22 Digər bir əlamət; işarə olaraq da

gücünü / qanadına əlavə et, çirkinlik olmadan heç qüsursuz, kamil bir
halda çıxacaqsan” dedi.[146]

***

**37** “Və and olsun, Biz sənə başqa bir dəfə də yaxşılıq etmişdik: **38** Bir
vaxt vəhy ediləsi şeyləri anana vəhy etmişdik, **39** ‘Musanı sandıq içinə
qoy və bol suya / çaya burax, sonra da bol su / çay[147] onu sahilə atsın.
Onu Mənə düşmən olan və ona düşmən olan birisi alsın.’ Və Mən Öz
tərəfimdən sənin üstünə bir sevgi yaratdım və Mənim nəzarətim
altında boya-başa çatdırılmağın üçün, **40** Bir vaxt sənin bacın gəlib
‘Sizi onun qayğısına qalacaq birinin yanına aparımmı?’ demişdi.
Beləcə, gözü aydın olsun və qəm yeməsin deyə, səni anana qaytardıq.
Və sən, bir can öldürmüşdün və səni qəmdən qurtarmışdıq. Və Biz
səni potada əridib xeyli saflaşdırdıqca saflaşdırdıq / səni
kamilləşdirdik. Bir də ki, illərlə Mədyən xalqının içində qaldın. Sonra
bir ölçü; plan üzərinə gəldin, ey Musa!

**41** Və Mən səni Özüm üçün yetişdirdim.

***

**42** Sən və qardaşın əlamətlərimlə / işarələrimlə gedin və Məni
xatırlamaqda zəiflik göstərməyin.

**43** Hər ikiniz gedin Firona. Şübhəsiz ki, o, həddini aşmışdır. **44** Sonra
öyüd alsın və hörmətlə, sevgiylə, biliklə ürpərməsi üçün ona yumşaq
söz söyləyin.”

**45** Musa ilə Harun: “Ey Rəbbimiz! Onun bizə qarşı həddini
aşmasından və ya azğınlığından qorxuruq” dedilər.

**46** Allah: “Qorxmayın, şübhəsiz Mən ikinizlə bərabərəm, eşidirəm və
görürəm. **47** Dərhal ona gedin və ona; ‘Şübhəsiz ki, biz Rəbbinin iki
elçisiyik. Artıq İsrail oğullarını bizimlə göndər və onlara əzab etmə;
həqiqətən biz sənə Rəbbindən bir əlamət / işarə ilə gəldik. Salam yol
göstərənə uyanlaradır. **48** Şübhəsiz biz; həqiqətən bizə, mütləq əzabın
yalanlayana və arxa çevirənə olduğu vəhy edildi’ deyin.” **46** dedi.

***

**49** Firon: “Elə isə sizin Rəbbiniz kimdir, ey Musa?” dedi.

**50** Musa: “Bizim Rəbbimiz hər şeyə varlığını və xüsusiyyətlərini
verən, sonra yol göstərəndir” dedi.

**51** Firon: “Elə isə ilk əsrlərin halı necədir?” dedi. **52** Musa: “Onların
biliyi Rəbbimin qatında bir kitabdadır. Rəbbim səhv etməz və
unutmaz / tərk etməz. **53** O, yer üzünü sizin üçün bir beşik edən,
oradan sizin üçün yollar açan və göydən bir su endirəndir.”
**52** dedi. *–Bax Biz, o su ilə növbənöv bitkilərdən cütlər çıxartdıq.*

**54** *Yeyin və heyvanlarınızı otarın. Şübhəsiz ki, ağıl sahibləri üçün bunda neçə-neçə əlamətlər / işarələr vardır!* **55** *Biz sizi yer üzündən yaratdıq, sizi ona döndərəcəyik və sizi bir dəfə yenə ondan çıxaracağıq.–* **56** Və and olsun ki, Biz Firona əlamətlərimizi / işarələrimizi; hamısını göstərdik, o yalanladı və inadkarlıq göstərdi.

**57,58** Firon: "Ey Musa! Sən biliyinlə bizə təsir edərək bizi torpaqlarımızdan çıxarmaq üçün gəlmisən? O halda biz də sənin təsirli biliyin kimi bir təsirli biliklə sənə gələcəyik.[148] İndi bizimlə sənin aranda bir görüşmə zamanı / yeri seç; bizim və sənin etiraz etmədiyimiz düz və geniş bir yer olsun" dedi.

**59** Musa: "Sizinlə görüş zamanı, mərasim, şənlik günü və insanların yığışdığı səhərortası (səhərlə günorta arası) vaxtıdır" dedi.

***

**60** Belə olduqda Firon arxasını çevirdi, hiylələrini-planlarını yığdı, sonra gəldi.

**61** Musa onlara dedi ki: "Təəssüflər olsun sizə! Allaha yalan uydurmayın. Sonra bir əzab ilə kökünüzü kəsər. Həqiqətən, uyduran zərər etmişdir."

**62** Beləliklə, nüfuzlu (təsirli) alimlər öz aralarında işlərini müzakirə etdilər və **63,64** "Bunların ikisi həqiqətən nüfuzlu (təsirli) alimlərdir; təsirli bilikləriylə sizi yurdunuzdan qovub çıxartmaq və ən yaxşı nümunə olan yolumuzu məhv etmək istəyirlər. Onun üçün bütün hiylələrinizi bir yerə yığın, sonra növbəylə gəlin. Bu gün üstün gələn həqiqətən zəfər qazanmışdır" deyə fısıldaşmalarını gizli saxladılar.

**65** Nüfuzlu (təsirli) alimlər: "Ey Musa! Sənmi ortaya qoyacaqsan və yaxud ilk ortaya qoyan kəslər biz olaq" dedilər.

**66** Musa: "Əksinə, siz ortaya qoyun" dedi. Bir də nə görsən! Onların təcrübələri, köhnə inancları və tezisləri / çör-çöpləri / xırım-xırda bilikləri,[149] etdikləri sehrdən / hünərli nümayiş səbəbindən gözündə böyüdü. **67** Buna görə Musa, içində bir qorxu hiss etdi.

**68,69** Biz: "Qorxma, şübhəsiz sən; ən üstün olan sənsən. Sən sahib olduğun təcrübəni ortaya qoy; o, onların ortaya qoyduqlarını udsun dursun. Şübhəsiz ki, onların etdikləri ancaq bir göz boyayanın hiyləsidir. Göz boyayıb təsirə salan adam isə, haraya gedərsə getsin zəfər qazana bilməz, müvəffəq ola bilməz" dedik.

***

**70** Axırda bütün nüfuzlu (təsirli) alimlər, "Musa ilə Harunun Rəbbinə iman etdik" demək surətiylə boyunlarını əyib təslim olmuş vəziyyətdə qaldılar.

**71** Firon: "Mən sizə izin vermədən öncəmi ona iman etdiniz? Şübhəsiz ki, o, sizə təsirli biliyi öyrədən böyüyünüzdür. And olsun ki, müqavilələri; öhdəlikləri ləğv etdirip, sonra da hamınızı qətiliklə rahat mühitdən; şəhərdəki işinizdən, vəzifənizdən çıxarıb xurma tarlalarında kənd təsərrüfatı işlərində işlədəcəyəm; daş ocaqlarında işlədəcəyəm; çətin işlərdə işlədərək yağınızı çıxaracağam; iliyinizi qurudacağam. Və hansımızın əzabının daha şiddətli və daha qalıcı olduğunu həqiqətən biləcəksiniz" dedi.

**72,73** Nüfuzlu (təsirli) alimlər: "Bizə gələn bu açıq dəlillər və bizi yoxdan yaradana qarşı qətiyyən səni üstün tutmarıq. İndi nə hökm edəcəksənsə et! Sən, ancaq bu fani dünya həyatına hökm edərsən. Şübhəsiz biz, xətalarımıza və bizi təsirli bilikdən məcbur etdiyin şeyə qarşı, bizi bağışlaması üçün, Rəbbimizə iman etdik. Və Allah daha xeyirli və daha qalıcıdır" dedilər.

***

**77** Və and olsun, Biz Musaya "Arxanızdan çatacaqlarından qorxmadan və hörmətlə, sevgiylə ürpərməyərək / Firon qarşısında minnətli olmadan qullarımı gecə vaxtı çıxart və onlar üçün bol suda / çayda quru bir yol aç!" deyə vəhy etdik.

**78** Firon ordularıyla dərhal onları təqib etdi və bol sudan / çaydan onları bürüyən şey bürüdü.

**79** Və Firon camaatını azdırdı və doğru yolu göstərmədi.[150]

***

**83** Səni camaatından (ayırıb) daha tələsdirən şey nədir, ey Musa?

**84** Musa: "Onlar mənim izim-təlimim üzərində olanlardır. Mən də Sən razı olasan deyə Sənə gəlmək üçün tələsdim, Rəbbim" dedi.

**85** Allah: "Şübhəsiz ki, bax, Biz səndən sonra camaatını imtahan etdik. Samiri də onları azdırdı" dedi.

**86** Belə olduqda, Musa qəzəbli və kədərli halda dərhal camaatının yanına qayıtdı: "Ey qövmüm! Rəbbiniz sizə gözəl bir vəd ilə söz vermədimi? İndi sizə bu [müddət] uzunmu gəldi, yoxsa Rəbbinizdən sizə bir qəzəb gəlməsinimi arzu etdiniz ki, mənə olan vədinizə xilaf çıxdınız?" dedi.

**87** Onlar dedilər ki: "Biz sənə verdiyimiz sözə öz ixtiyarımızla xilaf çıxmadıq. Fəqət biz o qövmün zinətlərindən bəzi yüklər götürmüşdük. Sonra onları fırladıb atdıq. Sonra da bax beləcə, Samiri başımıza (ağlımıza) saldı."

**88** Samiri aldadan, tələyə salan bir cəsədi / qızılı[151] çıxardı və İsrail oğulları: "Bax bu, sizin ilahınız və Musanın da ilahıdır. Amma Musa

onu tərk etdi” dedilər. **89** –*Yaxşı, bəs onlar görmürlər ki, qızıl onlara heç bir sözlə cavab verə bilmir; onlara bir zərər və ya bir fayda verməyə gücü çatmır!*–

**90** Və and olsun ki Harun daha öncə onlara: “Ey qövmüm! Şübhəsiz ki, siz bununla imtahana çəkildiniz / dindən çıxıb özünüzü atəşə atdınız. Və şübhəsiz ki, sizin Rəbbiniz Rəhmandır [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahdır]. Mənə tabe olub əmrimə itaət edin!” demişdi. **91** Harunun qövmü: “Musa qayıdıb bizə gələnə qədər, biz ona ibadət etməkdən əsla əl çəkməyəcəyik” dedilər.

**92,93** Musa: “Ey Harun! Bunların azğınlığa düşdüyünü gördüyün vaxt, mənim yolumu təqib etməyinə nə mane oldu? Yoxsa mənim əmrimə qarşımı gəldin?” dedi.

**94** Harun: “Ey anamın oğlu! Saqqalımı və başımı tutma. Şübhəsiz, mən qorxdum ki, sən deyəcəksən: İsrail oğulları arasına ayrılıq saldın və mənim sözümə baxmadın” dedi.

**95** Sonra da Musa: “Ey Samiri! Sənin bu etdiyin nədir?” dedi.

**96** Samiri: “Mən onların anlamadıqları bir şeyi anladım, elçinin əsərindən bir ovuc almışdım, sonra da onu fırladıb atdım. Və bunu, mənə nəfsim beləcə xoş göstərdi” dedi.

**97,98** Musa: “Haydı, get. Artıq sən ömür boyu ‘Mənimlə əlaqə yoxdur’ deməlisən. Həm də, sənin üçün qətiyyən qarşı çıxa bilməyəcəyin bir görüş günü var. Bir də qulluq etdiyin bu ilahına bax” dedi. –*Əlbəttə Biz onu yandıracaq, sonra da onu həqiqətən bol suda kökündən yıxacağıq. Sizin ilahınız ancaq Özündən başqa heç bir ilah olmayan Allahdır. Şübhəsiz ki, Onun bolii hər şeyi əhatə etmişdir.*–

***

**99** Biz, sənə keçmişdə olan şeylərin önəmli xəbərlərindən bir qismini beləcə anladırıq. Şübhə yox ki, sənə Öz dərgahımızdan bir Öyüd / xatırlatma [Quran] verdik. **100-102** Kim Bizim verdiyimiz Öyüddən [Kitabdan / Qurandan] üz çevirərsə, şübhəsiz ki, o, qiyamət günü; Sura üfləndiyi gün, daimi içində qalacaqları bir yüklə yülənəcəkdir. Və qiyamət günündə, onlar üçün bu necə də pis bir yükdür! Biz günahkarları o gün, gözləri göyərmiş bir halda toplayacağıq. **103** Aralarında pıçıldaşacaqlar: “Siz dünyada yalnız ‘on gün’ qaldınız.” **104** –*Biz, aralarında nə danışacaqlarını daha yaxşı bilirik.*– Ən üstün yolda olan: “Siz ancaq bir gün qaldınız” deyəcək.

(45/20, Ta Ha / 9-104)

**Nəcm: 121**

**74** Həqiqət budur ki, hər kim Rəbbinin hüzuruna günahkar kimi gələrsə, şübhəsiz ki, ona cəhənnəm vardır. Orada ölməz və dirilməz.

**75,76** Və kim Rəbbinə bir mömin olaraq, yaxşılaşdırmaq məqsədi ilə əməl işləyərək gələrsə, bax onlar; ən yüksək dərəcələr, ağaclarının altından çaylar axan Ədn cənnətləri onlar üçündür. Onlar orada sonsuz olaraq qalacaqlar. Və bax bu, təmizlənən kimsələrin qarşılığıdır.

**80** Ey İsrail oğulları! Sizləri düşməninizdən qurtardıq və dağın sağ tərəfində sizə söz verdik / dağın sağ tərəfini sizə görüşmə yeri olaraq təyin etdik. Üstünüzə də qüdrət halvası və bildirçin / bal endirdik. **81** *–Sizə ruzi olaraq verdiyimiz şeylərin təmizindən yeyin və bunda həddi aşmayın, yoxsa qəzəbim üstünüzə enər. Kimin üstünə qəzəbim ensə, həqiqətən o enər [yıxılar, məhv olar].* **82** *Və şübhə yox ki, Mən, tövbə edən, iman edib saleh əməl işləyən, sonra da yönləndirildiyi doğru yolu tapan kəslər üçün çox bağışlayanam.*[152]

(45/20, Ta Ha / 74-76, 80-82)

**Nəcm: 122**

**105-107** Səndən dağlar haqqında soruşurlar, de ki: "Rəbbim onları havaya sovuracaq. Beləliklə, onları dümdüz boş bir hala gətirəcək. Orada bir çuxur və bir təpə görməyəcəksən."

**108** O gün, heç bir əyriliyi olmayan o dəvətçiyə tabe olacaqlar və Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah] üçün səslər kəsilmişdir. Artıq sadəcə zəif bir səs eşidəcəksiniz.

**109** O gün Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] icazə verdiyi və söz baxımından razı olduğu kimsələr istisna olmaqla, yardım-dəstək fayda verməz.

**110** Allah, yardım görməyənlərin önlərindəki və onların arxasındakı şeyləri bilir. Onlar isə Onu bilikləri ilə əhatə edə bilməzlər.

**111** Və hər kəs, diri və bütün yaratdıqlarına daim göz qoyan Allah üçün baş əymişdir. Bir şirkə bulanaraq səhv; öz zərərinə olan əməli işləyən kəslər həqiqətən zərərə uğramışdır.

**112** Və hər kim iman edən biri olaraq sahmana salmaq məqsədi ilə əməl işləyənlərdən olarsa, artıq o, bir haqsızlıqdan və haqqının itiriləcəyindən qorxmaz. (45/20, Ta Ha / 105-112)

**Nəcm: 123**

**113** Və bax beləcə, Biz, Allahın mühafizəsi altına daxil olsunlar, yaxud onlara yeni bir öyüd olsun deyə onu ərəbcə bir Quran olaraq

nazil etdik. Onda təhdidləri təkrar-təkrar şərh etdik.

**114** Bax gör, haqq olan, yeganə hökmdar olan Allah nə qədər ucadır! Onun vəhyi sənə tamamlanmadan əvvəl, oxumaq / öyrətmək üçün tələsmə və: "Ey Rəbbim, mənim biliyimi artır!" de. (45/20, Ta Ha / 113-114)

## Nəcm: 124

**115** Və and olsun Biz, bundan öncə Adəmdən söz aldıq, o ağlından çıxardı, sözünü tutmadı və Biz, onda bir qərarlılıq (əzm) görmədik.

**116** Və Biz bir zaman təbiət qüvvələrinə,[153] "Adəmə boyun əyib təslimiyyət göstərin!" dedik, İblis / düşüncə qabiliyyəti[154] xaric olmaqla, hamısı boyun əyib təslimiyyət göstərdilər, o inad etdi.

**117-119** Sonra da Biz, "Ey Adəm! Şübhəsiz ki, İblis sənə və zövcənə düşməndir. Ehtiyatlı olun ki, o sizi Cənnətdən çıxartmasın, sonra bədbəxt olarsan, sənin acmamağın və çılpaq qalmamağın həqiqətən cənnətdədir. Və sən orada susamaz və günəşin istisində qalmazsan" dedik.

**120** Axırda şeytan ona vəsvəsə verdi. Dedi ki: "Ey Adəm! Sənə sonsuzluğun ağacı və köhnəlməyən / çökməyən mülk / səltənət üçün yol göstərimmi?"

**121** Belə olduqda, ikisi də mal-mülk, qızıl düşkünü oldular.[155] Dərhal çirkinlikləri açılıb özlərinə göründü. Və öz zərərlərinə, cənnət ağaclarının yarpaqlarından örtərək istifçiliyə (gələcəkdə tapılmayacağı və ya bahalı olacağı düşüncəsiylə çox mal yığaraq cəmiyyətdə sıxıntıya yol açmağa) başladılar. Adəm Rəbbinə asi oldu və çaşbaş qaldı / azdı.

**122** Sonra Rəbbi, onu seçdi və tövbəsini qəbul etdi və ona doğru yolu göstərdi.

**123** Allah, o ikisinə: "Bir-birinizə düşmən olaraq hamınız oradan alçalın. Artıq Məndən sizə bir yol göstərən gəldiyi zaman, kim Mənim yol göstərənimə tabe olarsa, bax o, azğınlığa düşməz və bədbəxt olmaz" dedi. (45/20, Ta Ha / 115-123)

## Nəcm: 125

**124-126** Kim Mənim xatırlanmağımdan / Mənim öyüdümdən məsafə saxlayarsa, heç şübhəsiz ki, onun üçün çətin, sıxıcı bir dolanışıq / həyat vardır. Qiyamət günü onu kor olaraq qiyamət gününün toplantı səhnəsinə gətirərik. O deyər ki: "Ey Rəbbim, mən görən biri olduğum halda məni niyə kor olaraq bu yerə çıxartdın?" Allah deyər ki: "Bəli, elədir, ayələrimiz sənə gəldikdə sən onları tərk etmişdin; bu gün də

eyni şəkildə sən tərk edilirsən / cəzalandırılırsan.”

**127** Və bax Biz, həddini aşanları və Rəbbinin ayələrinə iman etməyənləri belə cəzalandırırıq. Və axirət əzabı şübhYsiz ki, daha şiddətli, daha sürəklidir.

**128** (İndi) yurdlarında gəzib dolaşdıqları, onlardan öncə məhv etdiyimiz bu qədər nəsillər, onlara yol göstərmədimi? Şübhəsiz ki, bunda ağıl sahibi olanlar üçün bir çox dəlillər vardır.

**129** Və əgər Rəbbindən bir Söz[156] və müəyyən bir müddət olmasaydı, həqiqətən qaçınılmaz olardı. (45/20, Ta Ha / 124-129)

## Nəcm: 126

**130** Artıq onların söylədiklərinə səbr et, razılığa nail ola bilmək üçün günəşin doğuşundan öncə də, batışından öncə də Rəbbinin tərifi ilə birlikdə Allahı tanıt / nöqsanlıqlardan uzaq olduğunu öyrət!

Gecənin bəzi saatlarıyla, gündüzün iki ucunda da Allahı tanıt / nöqsanlıqlardan uzaq olduğunu öyrət!

**131** Və onları imtahan etmək üçün, bəsit dünya həyatının süsü olaraq, onlardan bəzi cütlükləri faydalandırdığımız mal, mülk, övlad və səltənətə qətiyyən gözlərini dikmə / rəğbətlə baxma. Və Rəbbinin ruzisi daha yaxşı və daha sürəklidir.

**132** Və əhlinə səlatı [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyi] əmr et, özün də ona səbrlə davam et. Biz səndən bir ruzi istəmirik. Səni Biz ruziləndiririk. Aqibət, “Allahın mühafizəsi altında olmaq” üçündür. (45/20, Ta Ha / 130-132)

## Nəcm: 127

**133,134** Və inkar edənlər: “Elçiliyini iddia edən bu adam, Rəbbindən bizə bir əlamət / işarət gətirəydi də!”-dedilər. Onlara ilk səhifələrdə olan açıq-aşkar dəlillər gəlmədimi? Və əgər Biz, onları bundan öncə bir əzab ilə dəyişikliyə / məhvə məruz qoysaydıq, həqiqətən “Ey Rəbbimiz! Bizə bir peyğəmbər göndərəydin ki, alçaq və rəzil olmadan öncə Sənin ayələrinə tabe olsaydıq!” deyəcəkdilər.

**135** De ki: “Hər kəs gözləməkdədir. Siz də gözləyin. Şübhəsiz ki, düz yolun sahiblərinin kimlər olduğunu və kimlərin yönləndirildiyi doğru yolu tapdığını yaxında; **Vaqiə 1-7** olacak o vaqiə (hadisə, iş) olduğu zaman –*ki o vaqiənin olması üçün yalan söyləyən yoxdur. O vaqiə, alçaldıcıdır, yüksəldicidir*– yer üzü şiddətlə sarsıldıqca sarsıldığı və dağlar ovxalandıqca ovxalanıb və toza-dumana döndüyü zaman və sizlər üç tay sinif (üç ayrı qrup) olduğunuz zaman **135** biləcəksiniz.
(45/20, Ta Ha /133-135+46/56, Vaqiə/1-7)

# VAQİƏ (46 – 56) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

**Nəcm: 128**

**8** Budur sağın əhli, sağın əhli nədir?

**9** Və solun əhli, solun əhli nədir?

**10** Önə keçənlər də, önə keçənlərdir.

**11** Bax, önə keçənlər, yaxınlaşdırılanlardır.

**12** Bax, önə keçənlər, Nəim cənnətlərindədir.

**13,14** Bir çoxu əvvəlkilərdəndir, çox azı da sonrakılardandır. **24** Onlar,
etdiklərinə qarşılıq olaraq, **15** zinət əşyaları ilə işlənmiş taxtların
üzərindədirlər. **16** Qarşı-qarşıya onların üzərində yaslanarlar.
**17-23** Ətraflarında, qaynağından doldurulmuş piyalələr, kuzələr,
qədəhlər *–ondan başları ağrımaz, ağılları da başlarından getməz–*
bəyəndikləri meyvələr, istədikləri quş əti ilə heç böyüməyən uşaqlar,
gizli incilər kimi iri gözlülər gəzərlər. **25** Orada boş söz, cəfəngiyat və
günaha bais olan şeyləri eşitməzlər. **26** Sadəcə söz olaraq: "Salam
[sağlıq, salamatlıq, xoşbəxtlik], salam [sağlıq, salamatlıq,
xoşbəxtlik]!"

**27-34** Və sağın dostları, nədir o sağın dostları! Onlar tikansız gilas ağacları, meyvələri salxım-salxım düzülmüş bananlar / akasiyalar, uzanmış kölgəliklər, fışqıran su, kəsilməyən; tükənməyən və qadağan edilməyən bir çox meyvələr və yüksəldilmiş döşəklər içindədirlər.

**35** Şübhəsiz Biz, gilası, bananı, kölgələri, fışqıran suyu elə bir
yaradılışla yaratdıq. **36-38** Ki onları, sağın əhli üçün cazibədar və
hamısı bir nizamda, heç toxunulmamışlardan etdik.

**39,40** Bir camaat, çoxu öncəkilərdəndir. Bir camaat da sonrakılardandır.

**41** Və solun əhli, nədir o solun əhli?

**42-48** Onlar içlərinə işləyən bir atəş və qaynar su içindədirlər, sərin olmayan, xoş olmayan qapqara dumandan ibarət bir kölgə içindədirlər. Şübhəsiz ki, solun əhli bundan öncə bolluq içində zövq və əyləncəyə qurşananlar idilər. Və böyük günahda; Allaha ortaq qoşmaqda israr edirdilər. Və "Biz ölüb torpaq və sür-sümük olduqdan sonra, biz həqiqətən qaldırılacağıqmı? Öncəki atalarımızda, eləmi?" deyirdilər.

(46/56, Vaqiə / 8-48)

**Nəcm: 129**

**49,50** De ki: "Şübhəsiz ki, öncəkilər və sonrakılar məlum bir günün

bəlli vaxtında / görüş yerinə mütləq toplanacaqlar. **51** Sonra şübhəsiz ki, siz, ey azğınlar, yalan hesab edənlər! **52** Mütləq zəqqumdan bir ağacdan yeyəcəksiniz **53** Qarınlarınızı onunla dolduracaqsınız. **54** Sonra da onun üstündən qaynar su içəcəksiniz. **55** Həm də susuzluq xəstəliyinə tutulmuş dəvələrin içdiyi kimi içəcəksiniz.” **56** –*Bax bu, din günündə onların ziyafətləridir.*–

**57** Biz, sizi yaratdıq; təsdiqləməniz lazım deyil? **58** Bəs tökdüyünüz şeyi [mənini, nütfəni, yumurtanı] heç düşündünüzmü? **59** Sizmi yaradırsınız onu, yoxsa yaradıcısı Bizik?

**60,61** Ölümü aranızda Biz nizamladıq, Biz. Və Biz, sizi bənzərlərinizlə dəyişdirməmizdə və sizi bilmədiyiniz bir şeydə inşa etməmizdə, qarşımızı ala / əngəl ola bilməzlər.

**62** Və and olsun, ilk yaradılışı bildiniz, öyrəndiniz. Bəs, düşünüb öyüd almağınız lazım deyilmi?

**63** Bəs, əkdiyiniz şeyi heç düşündünüzmü?

**64** Sizmi bitirirsiniz onu, yoxsa bitirən Bizik?

**65-67** Biz istəsəydik, əlbəttə, onu quru bir çöp edərdik və siz: “Şübhəsiz ki, biz borc altına girmiş kimsələrik! Daha doğrusu, biz hər şeyi əlindən alınmış, məhrum qalmış kimsələr imişik!” deyərək çaşıb qalardınız. **68** Bəs, içdiyiniz suyu heç düşündünüzmü?

**69** Sizmi buluddan endirdiniz onu, yoxsa endirən Bizik?

**70** İstəsəydik onu duzlu edərdik. O halda, qarşılığını ödəməyiniz lazım deyilmi?

**71** Yaxşı, yandırdığınız o atəşi / oksigeni heç düşündünüzmü?

**72** Sizmi atəşin / oksigenin ağacını inşa etdiniz, yoxsa inşa edənlər Bizik?

**73** Biz atəşi / oksigeni bir ibrət / xatırlatma və çöl yolçularına (səyyahlara) bir fayda etdik.

**74** Elə isə, böyük Rəbbinin adını pak tut / nöqsanlıqlardan uzaq tut / Onun nöqsanlıqlardan uzaq olduğunu öyrət! (46/56, Vaqiə / 49-74)

## Nəcm: 130

**75** Artıq xeyr. Nəcmləri / hər səfərdə nazil edilən ayələrin yerlərini / zamanlarını; nazil edilməsini dəlil göstərirəm ki **76** –*Və əgər bilsəniz, bu göstərilən böyük bir dəlildir*– **77** Heç şübhəsiz, o, şərəfli Qurandır. **78** Saxlanmış / qorunmuş bir kitabdadır. **79** Onunla zehni baxımdan təmizlənənlərdən başqası təmas edə bilməz. **80** O, aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir.

**81** Bəs, indi siz bu Sözəmi / Quranamı məhəl qoymursunuz?

**82** Və dolanışığınızı (ruzinizi) yalanlayaraqmı təmin edirsiniz / verilən ruzilərə yalanlayaraqmı qarşılıq verirsiniz? (46/56, Vaqiə / 75-82)

**Nəcm: 131**

**83-85** Ancaq can boğaza gəlib yetişəndə, siz də o zaman, onun qarşısında gözləyirsiniz, Biz isə ona sizdən daha yaxınıq. Lakin siz görməzsiniz.

**86,87** Bəs, madam ki, cəzalandırılmayacaqmışsınız, əgər doğrulardansınızsa boğaza gəlmiş, çıxmaqda olan canı geri çevirmək lazım deyilmi?

**88,89** Amma əgər o, yaxınlaşdırılanlardandırsa, artıq rahatlıq, gözəl qoxulu ruzi və bol nemətlərin cənnəti vardır.

**90,91** Və əgər o, sağın əhlindəndirsə; artıq sənə sağın əhlindən salam!

**92-94** Və amma o, haqq yoldan azmış yalanlayıcılardandırsa, budur qaynar sudan bir ziyafət! Və cəhənnəmə atılmaq!

**95** Şübhəsiz, bax Bizim bu nəql etdiklərimiz qəti biliyin, həqiqətin məhz özüdür.

**96** Elə isə böyük Rəbbinin adını pak tut / Onun nöqsanlıqlardan uzaq olduğunu öyrət! (46/56, Vaqiə / 83-96)

## ŞUƏRA (47 – 26) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 132**

**1** Ta / 9, Sin / 60, Mim / 40.[157]

**2** Bunlar, açıq-aşkar / açıqlayan kitabın ayələridir.

**3** Onlar; **Hicr 91** Quranı sehr, şeir, əsatir (mifoloji rəvayətlər), uydurulmuş söz-söhbət parçaları, pis sözlər kimi qəbul edən kimsələr,
**3** iman etmirlər deyə sən özünü həlakmı edəcəksən!

**4** Əgər Biz istəsəydik,

**Hicri 90** o and içənlərə[158] nazil etdiyimiz şey kimi

**4** onlara göydən bir əlamət [işarə; şüa, radiasiya və meteorlar, fırtına, sel] endirərik də onların boyunları, ona qarşı əyilər. **5** Və onlara
Rəhmandan [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahdan] yeni bir öyüd gəldikdə, həqiqətən ondan üz çevirdilər.
**6** Sonra da, həqiqətən yalanladılar. Bax, istehza etdikləri şeyin xəbəri onlara yaxında gələcəkdir. **Hicr 92,93** Bax, and olsun Rəbbinə ki, Biz, həqiqətən onların hamısını etdikləri şeylərdən hesaba çəkəcəyik.

**7** Və onlar yer üzünə baxmadılarmı? Biz orada hər gözəl cütdən neçəsini bitirdik. **8** Şübhəsiz ki, bunda həqiqətən əlamət / işarət var; amma onların çoxu iman etmədilər. **9** Və şübhə yoxdur ki, Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, geniş mərhəmət sahibinin məhz Özüdür.

(47/26, Şuəra / 1-6 + 54/15, Hicr / 90-93 + Şuəra / 7-9)

## Nəcm: 133

**10** Bir vaxt da Rəbbin, Musaya: “Get o səhv; öz zərərinə olan əməli işləyən qövmə; **11** Fironun qövmünə, hələ də Allahın mühafizəsi altına daxil olmayacaqlarmı?” deyə nida etmişdi.

**12** Musa: “Ey Rəbbim! Şübhəsiz mən, məni yalanlamalarından qorxuram. **13** Köksüm daralar, dilim danışmaz, onun üçün Haruna da elçilik ver. **14** Həm də mənim boynumda onlara aid bir günah (cinayət) var. Buna görə də məni öldürmələrindən qorxuram”-dedi.

**15** Allah: “Qətiyyən sənin düşündüyün kimi deyil! Haydı, ikiniz əlamətlərimizlə / işarətlərimizlə gedin. Şübhəsiz ki, Biz sizinlə bərabərik, eşidənlərik. **16,17** Haydı, ikiniz Firona gedin və: ‘Həqiqətən biz, İsrail oğullarını bizimlə göndərəsən deyə’ aləmlərin Rəbbinin elçisiyik deyin” dedi.

**18** Firon: “Biz səni uşaqkən öz aramızda tərbiyə etmədikmi? Ömrünün bir çox illərini bizim aramızda qalmadınmı? **19** Axırda elədiyini də elədin. Sən nankorun birisən…” dedi.

**20-22** Musa: “Mən, o işi görəndə çaşmışlardan (cahillərdən) idim. Sizdən qorxunca da dərhal sizdən qaçdım. Sonra Rəbbim mənə qanunlar-prinsiplər bəxş etdi və məni elçilərdən biri etdi. O boynuma minnət qoyduğun nemət də İsrail oğullarını özünə kölə etməyindəndir” dedi.

**23** Firon: “Aləmlərin Rəbbi dediyin də nədir ki?” dedi.

**24** Musa: “Əgər yəqinliklə bilmiş olsanız, O, göylərin, yerin və ikisinin arasında olan şeylərin Rəbbidir.”

**25** Firon, yanındakılara: “Eşitmirsinizmi?” dedi.

**26** Musa: “O, sizin Rəbbiniz və daha öncəki atalarınızın da Rəbbidir” dedi.

**27** Firon: “Sizə göndərilən bu elçiniz, şübhəsiz gizli güclər tərəfindən dəstəklənən / dəlinin biridir” dedi.

**28** Musa: “Əgər ağlınızı işlətsəniz, O, məşriqin, məğribin və ikisinin arasında olanların Rəbbidir” dedi.

**29** Firon: “Məndən başqa ilah qəbul etsən, and olsun ki, səni zindana

(həbsə) salınmışlardan edərəm" dedi.
30 Musa: "Sənə açıq-aşkar bir şey gətirmiş olsam da, eləmi?" dedi.
31 Firon: "Haydı, dərhal gətir onu, əgər doğrulardansansa" dedi.
32 Belə olduqda Musa, öz biliklərini[159] ortaya qoydu; bir də gördülər ki, Musanın bilikləri, açıq-aşkar bir "silib süpürən"[160] olub.
33 Gücünü də çəkib (meydana) çıxardı; bir də gördülər ki, o güc, izləyənlər üçün çox mükəmməl, heç bir qüsur yoxdur.[161]
34,35 Firon, yanındakılardan başbilənlərə: "Şübhəsiz ki, bu, həqiqətən çox bilikli, təsirli bir alimdir! Sizi təsirli bilikləriylə yurdunuzdan çıxarmaq istəyir. İndi nə buyurursunuz?" dedi.
36,37 Başbilənlər dedilər ki: "Onu və qardaşını tutub saxla, şəhərlərə də toplayıcılar göndər. Bütün böyük və çox təsirli alimləri sənə gətirsinlər."
38 Beləliklə, təsirli alimlər müəyyən bir günün müəyyən bir vaxtında bir yerə gətirildi.
39 İnsanlara da, "Siz toplanırsınızmı?" deyildi.
40 *–"Bizim təsirli alimlərə tabe olmağımız üçün, onların qalib gəlməyi lazımdır!"–*
41 Təsirli alimlər gələn kimi Firona: "Əgər biz üstün gəlsək, bizim üçün həqiqətən bir muzd olacaqmı?" dedilər.
42 Firon: "Bəli, o halda siz, heç şübhə yox ki, yaxınlardan olacaqsınız" dedi.
43 Musa onlara: "Ortaya qoyun, nə qoyacaqsınızsa!" dedi.
44 Belə olduqda onlar, öz biliklərini, qədim inanc və tezislərini / çör-çöplərini; əsassız (dəyərsiz) biliklərini[162] ortaya qoydular və "Fironun gücü haqqı, şübhəsiz ki, biz qalib olanlarıq" dedilər.
45 Sonra Musa biliklərini ortaya qoydu; bir də nə görsünlər, onların uydurduqları şeyləri bir ucdan udur!
46-48 Sonra təsirli alimlər boyun əyib təslimiyyət göstərənlər kimi qaldılar:
"Biz, aləmlərin Rəbbinə; Musa və Harunun Rəbbinə iman etdik" dedilər.
49 Firon dedi ki: "Mən sizə izn vermədən Ona iman etdiniz, eləmi? Şübhəsiz ki o, əlbəttə sizə sehri öyrədən böyüyünüzdür! Yaxşı, tezliklə biləcəksiniz! And olsun ki, əllərinizi və ayaqlarınızı çapraz / ardıcıl (sırayla) kəstirəcəyəm və mütləq hamınızı astıracağam.
50,51 Təsirli alimlər: "Zərəri yoxdur, şübhəsiz biz Rəbbimizə dönənlərik. Biz möminlərin birincisi olduğumuza görə, Rəbbimizin

bizim xətalarımızı bağışlayacağını ümid edirik" dedilər.

63 Sonra Musaya: "Vur biliklərini o bol suya / çaya!" deyə vəhy etdik. Sonra o bol su / çay yarıldı / bəndlər (su anbarları) düzəldildi və bəndin hər biri, ulular ulusu bir dağ kimi oldu.[163]

52 Və Biz Musaya: "Qullarımı gecə yola çıxar, şübhəsiz ki, siz təqib edilənlərsiniz" deyə vəhy etdik.

53-56 Bu əsnada Firon da şəhərlərə toplayıcılar göndərdi: "Şübhəsiz ki, bunlar, sayları az olan, bölünüb parçalanmış bir topluluqdur. Və onlar bizim üçün əlbəttə qəzəblidirlər. Biz isə, əlbəttə hazırlıqlı, tədbirli gözləyən bir camaatıq." 60 Sonra Firon və adamları günəş doğarkən onların arxasınca düşdülər.

61 İki topluluq bir-birini görüncə Musanın camaatı: "Şübhəsiz ki, bizim həqiqətən çıxış yolumuz qalmadı (tələyə düşdük)" dedilər.

62 Musa: "Qətiyyən sizin düşündüyünüz kimi deyil! Şübhəsiz ki, Rəbbim mənimlədir, mənə yol göstərəcəkdir" dedi.

64 Digərlərini də ora yaxınlaşdırdıq.

65,66 Və Musanı və onunla birlikdə olanların hamısını qurtardıq, sonra da digərlərini suda boğduq.

57-59 Axırda Biz, Firon və camaatını bağçalardan, bulaqlardan, xəzinələrdən və şərəfli məqamdan çıxardıq. Bax, belə! Və sonra onlara İsrail oğullarını mirasçı / son sahib etdik. 67 Şübhəsiz bunda həqiqətən bir əlamət / işarət vardır. Amma çoxları iman etmiş deyildi.
68 Və şübhəsiz ki Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayanın / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür.[164]

(47/26, Şuəra / 10-51, 63, 52-56, 60-66, 57-59, 67-68)

## Nəcm: 134

69 Və onlara İbrahimin xəbərini oxu!

70 Necə ki, o, atasına və qövmünə "Siz nəyə qulluq[165] edirsiniz?" demişdi.

71 Onlar: "Bəzi bütlərə qulluq edirik. Onlara qulluq etməyə davam edəcəyik" dedilər.

72-74 İbrahim: "Yalvarıb dua etdiyinizdə onlar sizi eşidirlərmi və ya sizə fayda verirlərmi, yaxud zərər verirlərmi?" dedi. Onlar, "Əksinə, biz atalarımızı belə edərkən gördük" dedilər.

75,76 İbrahim: "Yaxşı, siz və ən qədim atalarınızın nələrə ibadət etmiş olduğunuzu heç düşündünüzmü? 77 Bax, onlar mənim düşmənimdir; ancaq aləmlərin Rəbbi ayrıdır. 78-82 O, məni yaradandır. Və mənə

doğru yolu O göstərir. Və məni yedirdən də, içirdən də Onun Özüdür.
Xəstələndiyim zaman O, mənə şəfa verir. Və O, məni öldürəcək, sonra
məni dirildəcəkdir. Və ümid edirəm ki, O, din günündə mənim
qüsurumu bağışlayacaq. **83** Rəbbim! Mənə 'hökm' ver və məni
yaxşılara qat! **84** Və məni, sonradan gələnlər üçün doğruluqla
xatırlananlardan et! **85** Və məni neməti bol cənnətin mirasçılarından
et! **86** Və atamı da bağışla, şübhəsiz o, azğınlardan oldu. **87-91** Və
yenidən dirildilən gün; mal və oğulların sağlam bir qəlblə / gerçək
imanla Allaha gələnlərdən başqasına fayda vermədiyi və cənnətin
Allahın mühafizəsi altına daxil olanlara yaxınlaşdırıldığı, azğınlar
üçün də cəhənnəmin açılıb göstərildiyi gün məni rəzil etmə!" dedi.

(47/26, Şuəra / 69-91)

## Nəcm: 135

**92,93** Və onlara: "Allahın altındakılardan ibadət etdiyiniz şeylər haradadı? Sizə yardım edirlərmi və ya özlərinə yardımları dəyirmi?" deyilmişdir.

**94,95** Sonra da bütlər və azğınlar və İblisin / düşüncə qabiliyyətinin əsgərləri; yaxşı-yaxşı düşünmədən hərəkət edənlər hamısı birlikdə cəhənnəmin içinə fırladılmışlardır.

**96-102** Onlar, onun içində bir-birləriylə mübahisə edərək dedilər ki: "Vallahi biz, həqiqətən açıq-aşkar bir azğınlıq içində idik. Çünki biz sizi aləmlərin Rəbbi ilə eyni səviyyədə tuturduq. Və bizi yalnızca o günahkarlar azdırdı. Artıq bizim üçün yardımçılardan, torpedalardan heç bir kimsə və candan bir yardımçı, yol göstərici, qoruyucu yaxın yoxdur. Kaş bizim üçün bir geri dönüş imkanı olsaydı, biz də möminlərdən olsaydıq!"

**103** Şübhəsiz bunda bir əlamət / işarət vardır. Amma onların çoxu iman edən deyildi.

**104** Və şübhə yox ki Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür. (47/26, Şuəra / 92-104)

## Nəcm: 136

**105** Nuhun qövmü göndərilənləri [elçiləri, mesajları] yalanladı.

**106-110** Bir zamanlar qardaşları Nuh onlara demişdi: "Siz Allahın mühafizəsi altına daxil olmayacaqsınız? Şübhəsiz ki, mən sizin üçün güvənilir bir elçiyəm. Artıq, Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin. Və buna qarşılıq mən sizdən heç bir muzd istəmirəm.

Mənim muzdum ancaq aləmlərin Rəbbinə aiddir. Artıq, Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin!”

**111** Onlar: “Sənə çox səfil kimsələr tabe olduğu halda, biz sənə inanarıqmı?” dedilər.

**112-115** Nuh dedi ki: “Onların nə etdiklərinə dair bir məlumatım yoxdur. Onların hesabı yalnız Rəbbimə aiddir. Əgər düşünürsünüzsə! Və mən iman edənləri qovan deyiləm. Mən ancaq açıq-aşkar xəbərdar edən biriyəm.”

**116** Onlar dedilər ki: “Ey Nuh! Əgər imtina etməsən, yaxşı bil ki, həqiqətən sən daşqalaq edilərək öldürülənlərdən olacaqsan!”

**117,118** Nuh: “Ey Rəbbim! Qövmüm məni yalanladı. Artıq mənimlə onların arasında sən hökm et. Və məni və möminlərdən mənimlə birlikdə olan kimsələri qurtar!” dedi.

**119,120** Belə olan halda Biz də onu və onunla birlikdə olanları o dolu gəminin içində qurtardıq. Sonra da arxalarından geridə qalanları suda boğduq.

**121** Şübhəsiz ki, bunda həqiqətən bir əlamət / işarət vardır. Amma
onların çoxu iman edən deyildi. **122** Və şübhəsiz ki Rəbbin, həqiqətən
ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayanın / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür.

(47/26, Şuəra / 105-122)

## Nəcm: 137

**123** Ad (qövmü) göndərilənləri [elçiləri, mesajları] yalanladı.

**124-135** Bir vaxt qardaşları Hud onlara demişdi ki: “Siz Allahın mühafizəsi altına daxil olmayacasınız? Şübhəsiz ki, mən sizin üçün güvənilir bir elçiyəm. Artıq Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin. Və buna qarşılıq mən sizdən heç bir muzd istəmirəm. Mənim muzdum ancaq aləmlərin Rəbbinə aiddir. Hər yüksək təpənin üstündə əlamət (olaraq) bir bina quraraqmı əylənirsiniz? Əbədiləşmək üçün / sanki əbədi qalacaqsınız kimi sənaye istehsal edən yerlərə [fabriklərə / qalalara] sahib olursunuz? Ələ keçirdiyiniz vaxt da (zor gücündən istifadə edən) zalımlar kimi ələ keçirirsiniz? Artıq Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin. Sizə o bildiyiniz şeyləri verənin [mal-qara, oğullar, bağlar, bağçalar, çeşmələr verənin] mühafizəsi altına daxil olun. Şübhəsiz ki, mən sizin haqqınızda böyük bir günün əzabından qorxuram.”

**136-138** Onlar dedilər ki: “Sən, öyüd-nəsihət versən də, yaxud öyüd verənlərdən olmasan da bizim üçün fərqi yoxdur. Bu, sadəcə

keçmişdəkilərin həyat tərzləridir. Və biz əzaba məhkum olmayacağıq."

**139** Bu halda onu yalançı saydılar və Biz də onları dəyişikliyə / məhvə məruz qoyduq. Şübhəsiz ki, bunda həqiqətən mütləq bir əlamət / işarət var, amma onların çoxu iman edən deyil.

**140** Və şübhəsiz ki Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayanın / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür. (47/26, Şuəra / 123-140)

## Nəcm: 138

**141** Səmud (qövmü) göndərilənləri [elçiləri, mesajları] yalanladı.

**142-152** Bir vaxt qardaşları Saleh onlara demişdi ki: "Allahın mühafizəsi altına daxil olmayacaqsınız? Şübhəsiz ki, mən sizin üçün güvənilir bir elçiyəm. Artıq Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin. Mən sizdən heç bir muzd istəmirəm də. Mənim muzdum ancaq aləmlərin Rəbbinə aiddir. Siz burada; bağçalarda, çeşmələr başında və əkinlərin və salxım-salxım xurmaların arasında arxayınlıqla qalacaqsınız? Və siz, dağlardan ustalıqla evlər yonursunuz. Artıq Allahın mühafizəsi altına daxil olun və mənim dediklərimi edin. Və yer üzündə fəsad törədib, islah etməyən, həddini aşan o kimsələrin əmrinə tabe olmayın."

**153,154** Onlar dedilər ki: "Sən həqiqətən ovsunlanmışlardansan! Sən də ancaq bizim kimi bir bəşərsən. Əgər doğru danışanlardansansa, bizə bir əlamət / işarət göstər."

**155,156** Saleh "Bax bu Dəstək Qurumudur, onun yaşaması üçün dəstəklənməsi lazımdır; qazancınızın bir hissəsi onun üçün ayrılmalıdır. Onu ayaqda tutun. Yoxsa böyük bir günün əzabı sizi yaxalayar!" dedi.

**157** Buna baxmayaraq onlar Dəstək Qurumunun gəlir mənbələrini qurudaraq onu məhv etdilər və peşman bir halda səhəri açdılar.[166]

**158** Belə olduqda onları əzab yaxaladı. Doğrusu bunda, böyük bir dərs vardır, amma onların çoxu iman etmədilər.

**159** Və şübhəsiz ki Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayanın / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür. (47/26, Şuəra / 141-159)

## Nəcm: 139

**160** Lutun qövmü göndərilənləri [elçiləri, mesajları] yalanladı.

**161-166** Bir vaxt qardaşları Lut onlara demişdi ki: "Siz Allahın mühafizəsi altına daxil olmayacaqsınız? Şübhəsiz ki, mən sizin üçün

güvənilir bir elçiyəm. Gəlin artıq, Allahın mühafizəsi altına daxil olun və mənim dediklərimi edin. Və buna qarşılıq mən sizdən heç bir muzd da istəmirəm. Mənim muzdum ancaq aləmlərin Rəbbinə aiddir. Və Rəbbinizin sizin üçün yaratdığı zövcələrinizi tərk edərək aləmlər içindən kişilərəmi gedirsiniz? İşin əsli budur ki, siz həddi aşan bir camaatsınız."

**167** Onlar: "Ey Lut! Əl çəkməsən, mütləq çıxarılanlardan olacaqsan" dedilər.

**168** Lut: "Həqiqətən, mən sizə (əməlinizə) buğz (nifrət) edənlərdənəm" dedi.

**169** *–Rəbbim! Məni və ailəmi onların işlədikləri əməldən qurtar!–*

**170-172** Belə olduqda, Biz də onu və ailəsinin hamısını *–geridə qalanların içindəki zavallı arvad xaric–* qurtardıq, sonra da geridə qalanların hamısını dəyişikliyə / məhvə məruz qoyduq. **173** Və üzərlərinə elə bir yağmur yağdırdıq ki! Bax, xəbərdar edilmişlərin yağmuru necə də pisdir!

**174** Şübhəsiz ki, bunda bir əlamət / işarət var. Amma onların çoxu iman edən deyildi.

**175** Və şübhəsiz ki Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayanın / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür. (47/26, Şuəra / 160-175)

## Nəcm: 140

**176** Əykə əhli[167] göndərilənləri [elçiləri, mesajları] yalanladı.

**177-184** Bir vaxt Şüeyb onlara demişdi ki: "Siz Allahın mühafizəsi altına daxil olmayacaqsınız? Şübhəsiz ki, mən sizin üçün güvənilir bir elçiyəm. Bu səbəblə Allahın mühafizəsi altına daxil olun və mənim dediklərimi edin. Buna qarşılıq mən sizdən heç bir muzd istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir. Ölçünü tam ölçün və haqq yeyənlərdən olmayın. Və düzgün tərəzi ilə çəkin. Xalqın əşyalarını dəyərindən salmayın və yer üzündə fəsad törədərək qarışıqlıq çıxartmayın. Və sizi və sizdən öncəki nəsilləri yaradan O Zatın mühafizəsi altına daxil olun."

**185-187** Onlar: "Sən həqiqətən ovsunlanmışlardan birisən. Sən də bizim kimi bir bəşərdən başqa bir şey deyilsən. Biz həqiqətən sənin yalançılardan biri olduğuna əminik. Əgər doğrulardansansa, göyün bir parçasını üstümüzə sal!" dedilər.

**188** Şüeyb: "Rəbbim, etdiklərinizi ən yaxşı biləndir!" dedi.

**189** Belə olduqda onu yalanladılar və onları o kölgə gününün əzabı

yaxaladı. Şübhəsiz ki, o böyük bir günün əzabı idi.

**190** Şübhəsiz, bunda bir əlamət/ işarət var. Amma onların çoxu iman edən deyildi.

**191** Və şübhəsiz Rəbbin, həqiqətən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayanın / mütləq qalib olanın, geniş mərhəmət sahibinin məhz Özüdür. (47/26, Şuəra / 176-191)

## Nəcm: 141

**192** Və şübhəsiz ki, bu açıq-aşkar kitab, həqiqətən aləmlərin Rəbbinin
endirməsidir. **193-195** O açıq-aşkar kitabla, xəbərdar edənlərdən olasan deyə açıq-aşkar bir ərəb dili ilə sənin qəlbinə Güvənilir Can [ilahi mesajlar, güvənilir məlumat] nazil oldu.
**196** Və şübhəsiz, Güvənilir Can [güvənilir məlumat] həqiqətən öncəkilərin kitablarında da vardı.

**197** Və İsrail oğullarından olan alimlərin öz kitablarında güvənilir məlumatın varlığını bilməsi, onlar üçün bir əlamət / işarət olmadımı?

**198,199** Və Biz açıq-aşkar kitabı əcnəbilərdən / ərəbcə bilməyənlərdən birinə nazil etsəydik və o da bunu onlara oxusaydı, onlar, buna iman etməyəcəkdilər.

**200,201** Beləcə onu günahkarların qəlblərinə saldıq. Onlar ağrılı əzabı görməyənədək ona iman etməzlər. (47/26, Şuəra / 192-201)

## Nəcm: 142

**202** Bax bu, onlara, özləri fərqində olmadan, qəflətən gələcəkdir.

**203** Sonra da onlar: "Bizə möhlət verilənlərdənikmi?" deyəcəklər.

**204** Onlar, Bizim əzabımızı olduqca tezləşdirməkmi istəyirlər?

**205-207** Gördünmü / heç düşündünmü, onları illərlə qazancla təmin etsək, sonra onlara vəd edilən (gün) gəlib çatsa, o qazandıqları şeylərin onlara heç bir faydası olmayacaqdır.

**208** Və Biz, sadəcə xəbərdarlıq edənlərin gəldiyi şəhərlərin əhalisini dəyişikliyə / məhvə məruz qoyduq.

**209** Öyüd! Və Biz, haqsızlıq edənlər deyilik.

**210** Və açıq-aşkar, açıqlayan kitabı şeytanlar sənin qəlbinə salmadı.

**211** Bu onlara yaraşmaz, onların gücləri də çatmaz.

**212** Şübhəsiz, onlar eşitməkdən / vəhydən tamamilə uzaqlaşdırılmışlar.

**213** O halda qətiyyən Allah ila bərabər başqa ilaha yalvarma, sonra
əzablandırılmışlardan olarsan. **214** Və ən yaxın qəbiləni xəbərdar et.

**215** Və möminlərdən sənə tabe olan kimsələrə qanadını endir (qanadın altına al). **216** Əgər sənə üsyan edərlərsə, “Şübhəsiz ki, mən sizin etdiklərinizdən tamamilə uzağam!” de. **217-219** Və sən qalxdığın / elçilik vəzifəni yerinə yetirmək üçün ortaya çıxdığın və boyun əyib təslimiyyət göstərənlərin arasında gəzdiyin zaman (işin) əncamını səni görən ən üstün, ən güclü, ən şərəfli, məğlub olması mümkün olmayan / mütləq qalib olan, geniş mərhəmət sahibinə həvalə et. **220** Şübhəsiz ki O, ən yaxşı eşidən, ən yaxşı biləndir.

**221** Şeytanların kimə endiyini / kimlərin başına bir şeylər soxduğunu sizə xəbər verimmi? **222** Şeytanlar, bütün iftiraçı günahkarlara enərlər / onların başına bir şeylər soxarlar. **223** Onlar, şayiə (sensasiya) buraxarlar, halbuki onların çoxu yalançıdır. **Nəml 6** *–Şübhəsiz, bu Quran isə sənə, qanunlar qoyan və ən yaxşı bilən Allah tərəfindən sənin içinə işlədilməkdədir (yerləşdirilməkdədir).–*[168]

**224** Və o şairlər, şübhəsiz onlara yoldan çıxmış azğınlar uyar.

**225,226** Onların hər vadidə sərgərdan dolaşdıqlarını və həqiqətən etmədikləri şeyləri söylədiklərini görmədinmi / heç düşünmədinmi? **227** Ancaq iman edənlər və düzəltməyə yönəlik işlər görənlər, Allahı daha çox yad edənlər və haqsızlığa uğradıldıqlarında özlərini müdafiə edənlər müstəsnadır. Haqsızlıq edənlər hansı dönüşə dödürüləcəklərini tezliklə biləcəklər. (47/26, Şuəra / 202-223 + 48/27, Nəml / 6 + Şuəra / 224-227)

## NƏML (48 – 27) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 143

**1-3** Ta / 9, Sin / 60. Bunlar səlatı iqamə edən [maddi və yaxud zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumunu təsis edən -ayaqda tutan], zəkatı / vergini verən və axirətə də qəti surətdə iman edən kəslərin məhz özləri olan möminlər üçün doğru yol göstərən və müjdəçi olmaq üzrə Quranın və açıq-aşkar / açıqlayan bir kitabın ayələridir. (48/27, Nəml/1-3)

### Nəcm: 144

**4** Şübhəsiz Biz, axirətə iman etməyən o kimsələrin işlərini özlərinə süslü göstərdik, onlar da şaşqın bir vəziyyətdə qalmışdılar.

**5** Bax bunlar, əzabın pisi özləri üçün olan kimsələrdir və bunlar, axirətdə də ən çox ziyana uğrayanların elə özüdür.[169]

**7** Biz zaman Musa, yaxınlarına: “Şübhəsiz mən bir od gördüm, ondan sizə bir xəbər gətirəcəyəm və yaxud qızınmanız üçün bir köz

gətirəcəyəm" demişdi.

**8-12** Sonra oraya gəldiyi zaman (ona) səslənilmişdi: "Odun içindəki və ətrafındakı adam bərəkətləndirilmişdir! Və aləmlərin Rəbbi olan Allah qüsurlardan pakdır! Ey Musa! Şübhəsiz, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanunlar qoyan, fitnənin qarşısını yaxşı alan / sahmana salan Allaham! Və biliklərini ortaya qoy!" *–Onu sanki görünməyən bir varlıq kimi, hərəkət etdirdiyini görüncə, dərhal dönüb arxasına baxmadan qaçdı. -"Ey Musa, qorxma! Şübhəsiz ki, Mən; Mənim hüzurumda elçilər qorxmaz. Ancaq kim yanlış; öz ziyanlarına iş görər, sonra pisliyin arxasını yaxşılığa çevirərsə, şübhəsiz ki, Mən çox bağışlayanam, çox mərhəmət sahibiyəm.—*

Və qoynundakı gücünü də işə sal, doqquz[170] ayə [əlamət / işarət] içində Firona və onun camaatına qüsursuz və mükəmməl bir şəkildə çıxacaqsan. Şübhəsiz onlar yoldan çıxmış bir camaat olmuşdur."

**13** Sonra da ayələrimiz / əlamətlərimiz / işarətlərimiz onlara parlaq bir şəkildə gəlincə, "Bu, açıq-aşkar bir göz boyama və adam aldatmaqdır" dedilər.

**14** Və onların özləri bunlara tamamən inandıqları halda, şirk qoşaraq yanlış; öz ziyanlarına olan əməli işlədikləri və təkəbbürlərinə görə onları bilə-bilə inkar etdilər. *–İndi fəsadçıların sonunun necə olduğuna bir bax!–*

***

**15** Və and olsun ki, Biz Davuda və Süleymana bilik verdik. O ikisi də: "Bütün təriflər, bizi mömin qullarının bir çoxundan üstün edən Allaha məxsusdur!" dedilər.

**16** Və Süleyman, Davuda varis oldu. Və Süleyman: "Ey insanlar! Bizə quşların məntiqi [səslərindən, hərəkətlərindən məna çıxarmaq] öyrədildi və bizə hər şeydən verildi" dedi. *–Doğrusu bu, açıq-aşkar bir ərməğandır.–*

**17** Və yerlilərdən və əcnəbilərdən və quşlardan ibarət orduları Süleyman üçün bir araya gətirildi. *–Sonra onlar müntəzəm şəkildə göndərilirlər. –*

**18** Nəhayət, Qarışqa vadisinə gəldikləri zaman, bir qarışqa: "Ey qarışqalar! Evlərinizə girin, Süleyman və orduları bilmədən sizi qırıb məhv etməsin!" dedi.

**19** Sonra da Süleyman, dişi qarışqanın sözünə / qərarına görə gülərək təbəssüm etdi. Və "Rəbbim! Mənə, ana-atama lütf etdiyin nemətin qarşılığını ödəməmi, razı qalacağın saleh əməli işləməmi könlümə

gətir və rəhmətinlə məni saleh qullarının arasına qat" dedi.

**20,21** Və Süleyman quşları nəzərdən keçirdi və sonra, "Hüdhüdü nə üçün görmürəm? Yoxsa qeyb oldumu? Həqiqətən onu çətin bir əzab ilə əzablandıracağam yaxud onun boğazını üzəcək / onu pərişan edəcəyəm yaxud da o, mənə açıq-aşkar bir dəlil / güc gətirəcək" dedi.[171]

**22-26** O əsnada çox gözləmədən Hüdhüd gəldi və "Mən sənin bilmədiyin bir şey öyrəndim. Səbadan[172] sənə çox doğru və önəmli bir xəbər gətirdim. Şübhəsiz ki, Səbalılara hökmdarlıq edən, özünə də hər şeydən verilmiş olan və çox böyük bir taxta sahib olan bir qadın gördüm. Onu və qövmünü, Allahın altındakılardan günəşə boyun əyib təslimiyyət göstərirlər / ibadət edən halda gördüm. Şeytan da, göylərdə və yerdə gizli olanı aşkara çıxaran, gizli saxladıqlarınızı da, aşkar etdiklərinizi də bilən Allaha boyun əyib təslimiyyət göstərməsinlər / qulluq etməsinlər deyə, özlərinə etdiklərini süslü göstərmiş və onları doğru yoldan uzaqlaşdırmış. Bunun üçün də onlar, rəhbər tutulan doğru yolu tapa bilmirlər. *–Allah, Özündən başqa ilah deyə bir şey olmayandır, böyük ərşin sahibidir –*" dedi.

**27,28** Süleyman dedi ki: "Doğrumu söylədin, yoxsa yalançılardansanmı, görəcəyik. Bu məktubumu götür, onu onlara burax, sonra onlardan bir az geri çəkil və bax, gör nəyə dönəcəklər."

**29-31** Süleymanın məktubunu alan Səba məlikəsi: "Ey möhtərəmlər! Şübhəsiz ki, mənə həqiqətən çox hörmətli / şərəfli bir məktub verildi. Şübhəsiz ki, o məktub Süleymandandır və 'Mənə qarşı böyüklük göstərməyin, təslimiyyət göstərərək / müsəlman olaraq mənə gəlin!' deyə yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən, geniş mərhəmət sahibi Allahın adı ilədir" dedi.

**32** Məlikə dedi ki: "Ey möhtərəmlər! Bu işdə mənə fətva verin. Siz mənə şahidlik etmədən, heç bir iş barədə qəti qərar verməm."

**33** Möhtərəmlər dedilər ki: "Biz, qüvvət sahibiyik və savaşmağı çox yaxşı bilən kimsələrik, hökm isə sənindir; artıq nə əmr edəcəyini düşün!"

**34,35** Məlikə: "Heç şübhəsiz ki, krallar bir məmləkətə girdikləri zaman dərhal oranı viran qoyarlar və xalqın hörmətli adamlarını alçaldarlar. Onlar da belə edəcəklər. Mən onlara bir hədiyyə göndərim, görək elçilər nə ilə qayıdacaqlar!" dedi.

**36,37** Elçi Süleymana gəldikdə, Süleyman, "Siz mənə mal ilə yardım etməkmi istəyirsiniz? Baxın, Allahın mənə verdiyi, sizə verdiyindən daha yaxşıdır. Əksinə, siz hədiyyələrinizlə təkəbbür göstərirsiniz.

Onlara geri dön; yaxşı bilsinlər ki, onlara qarşısında əsla dura bilməyəcəkləri ordularla gələrik, onları həqiqətən hörmətsiz və alçaldılmış kəslər olaraq çıxararıq!" dedi.

38 Süleyman dedi ki: "Ey möhtərəmlər! Onlar təslim olub mənə gəlməmişdən öncə, hansınız onun taxtını mənə gətirər?"

39 Cinlərdən bir ifrit, "Sən məqamından[173] qalxmadan öncə mən onu sənə gətirərəm. Və heç şübhə yoxdur ki, mən bunun üçün güclü və güvənilirəm" dedi.

40 Kitabdan məlumatı olan kimsə: "Mən onu sənə, baxışın özünə dönmədən öncə gətirərəm"[174] dedi.

Sonra Süleyman, məlikənin taxtını öz yanında görüncə: "Bu, mənə verilən nemətlərin qarşılığını verəcəyəmmi, yoxsa nankorluq edəcəyəmmi deyə məni sınağa çəkmək üçün Rəbbimin fəzlindəndir. Və kim özünə verilən nemətlərin qarşılığını ödəyərsə, heç şübhəsiz, özü üçün qarşılığını ödəyər. Kim də nankorluq edərsə, heç şübhəsiz ki, Rəbbim çox zəngin və kərimdir (səxavətlidir)."

41 Süleyman dedi ki: "Onun üçün taxtını tanınmaz edin [onunla adi bir adam kimi rəftar edin], görək o, yönəldildiyi yolu tapanlardanmı olacaq, yoxsa yönəldildiyi doğru yolu tapmayanlardanmı olacaq [Görək müsəlmanlığında səmimidir, yoxsa yox?]!"

42 Məlikə gəldikdə, "Sənin taxtın belədirmi?" deyidi. Məlikə: "Elə bil, bu odur. Və bizə ondan öncə məlumat verilmiş və biz Müsəlmanlar olmuşduq."

43 Və onu, Allahın altındakılardan ibadət etdiyi şeylər yayındırmışdı. Şübhəsiz ki, o kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] bir tayfadan idi.

44 Məlikəyə, "Gizli qapaqlı heç bir şeyin olmadığı, hər şeyin açıq-açığına göstərildiyi köşkə / xalis dinə gir!" deyildi. Sonra Məlikə, xalis dini görüncə təkrar təkrar, incədən incəyə hesab etdi, araşdırdı və keçmiş həyatındakı bütün sirlərini açıqladı. Süleyman; "Bu, Allahın vəhylərindən diqqətlə əldə edilmiş xalis dindir" dedi. Məlikə, "Rəbbim! Mən, həqiqətən, özümə haqsızlıq etmişdim. Süleyman ilə bərabər, aləmlərin Rəbbi olan Allaha təslim oldum "dedi.

(48/27, Nəml/4, 5,7-44)

## Nəcm: 145

45 And olsun ki, "Allaha qulluq edin" deyə Səmuda da qardaşları Salehi elçi göndərdik. Dərhal bir-biriləriylə çəkişən iki qrup oldular.

46 Saleh dedi ki: "Ey qövmüm! Yaxşılıqdan öncə nə üçün pisliyi

tezləşdirmək istəyirsiniz? Sizə mərhəmət olunması üçün Allahdan bağışlanma diləsəniz nə olar?”

**47** Onlar, “Sənin ucbatından və səninlə bərabər olan kəslər ucbatından başımıza uğursuzluq gəldi / səni və səninlə bərabər olanları uğursuzluq əlaməti sayırıq” dedilər. Saleh, “Uğursuzluğunuz Allah qatındadır. Daha doğrusu siz, özünü oda atan / imtahana çəkilən bir camaatsınız” dedi.

**48** Və o şəhərdə, yer üzündə fəsad törədən, saleh işlər görməyən,
doqquz nəfərlik bir qrup vardı. **49** Allaha birlikdə and içərək, “Gecə
ona və ailəsinə basqın edəcəyik, sonra da vəlisinə / haqlarını qoruyacaq yaxınlarına, ‘Biz o ailənin məhv edilməsinə şahid olmadıq / hadisə baş verərkən orada deyildik və biz həqiqətən doğru olanlarıq’
deyəcəyik” dedilər. **50** Və onlar belə bir hiylə qurdular, şübhəsiz Biz
də onları, fərqində olmadıqları bir cəza ilə cəzalandırdıq.

**51** Budur bax! Onların hiylələrinin aqibəti necə oldu, şübhəsiz Biz
onları və topluluqlarını, hamısını birlikdə yerlə bir etdik. **52** Bax,
onların, şirk qoşmaqla işlədikləri xətalar ucbatından damları çöküb evləri kimsəsiz qalmışdı. Heç şübhəsiz ki, bunda, bilən bir camaat üçün bir əlamət / işarət vardır.

**53** İman edən və Allahın mühafizəsi altına daxil olan kəsləri də qurtardıq.

***

**54,55** Lutu da elçi olaraq qövmünə göndərdik. Bir zaman o, qövmünə, “Göz görə-görə hələ də o azğınlığı / həyasızlığı edəcəksinizmi? Şəhvət baxımından qadınlardan aşağı olan kişilərə yaxınlaşacaqsınızmı? Əslində siz cahillikdə davam edən bir qövmsünüz!” demişdi.

**56** Sonra qövmünün cavabı sadəcə, “Lut ailəsini məmləkətinizdən çıxarın; görmürsünüzmü ki, onlar təmiz qalmaq istəyən insanlar imiş!” deməkdən ibarət oldu.

**57** Belə olduqda onu və geridə qalmasını təqdir etdiyimiz zövcəsindən
başqa yaxınlarını qurtardıq. **58** Və onların üstünə elə bir yağmur
yağdırdıq ki! Xəbərdarlıq edilənlərin yağmuru necə də pis idi!

(48/27, Nəml/45-58)

## Nəcm: 146

**59** De ki: “Bütün təriflər Allaha məxsusdur; başqasını tərifləmək olmaz. Salamatlıq, təhlükəsizlik də seçib təmiz və pak hala gətirdiyi qullarına məxsusdur. Allahmı xeyirlidir, yoxsa onların ortaq qoşduğu şeylərmi?”

**60** Onların ortaq qoşduğu şeylərmi xeyirlidir, yoxsa göyləri və yer üzünü yaradan, göydən sizin üçün su endirənmi? Sonra da Biz onunla, sizin bir ağacını belə bitirə bilməyəcəyiniz gözəl-gözəl bağçalar bitirmişik. Allahla bərabər başqa bir ilahmı var? Əksinə, onlar şərik qoşmaq surətiylə yanlış; öz ziyanlarına olan əməli işləməyə davam edən bir camaatdır.

**61** Onların ortaq qoşduğu şeylərmi xeyirlidir, yoxsa yer üzünü sığınacaq edən, aralarında çaylar yaradan, onun üçün möhkəm dağlar qoyan və iki dənizin arasına əngəl qoyanmı? Allah ilə bərabər bir ilahmı var? Tamamilə əksinə, onların çoxu bilmir.

**62** Onların ortaq qoşduqları şeylərmi xeyirlidir yoxsa Ona yalvardığında, darda qalana cavab verən və şəri sovuşduran, sizi yer üzünün xəlifələri edənmi? Allahın yanında başqa bir ilahmı var? Çox az düşünürsünüz!

**63** Onların ortaq qoşduğu şeylərmi xeyirlidir, yoxsa qurunun və dənizin qaranlıqları içində sizə yol göstərən, rəhmətinin önündə küləkləri müjdəçi olaraq göndərənmi? Allah ilə bərabər bir ilahmı var? Allah, onların qoşduqları ortaqlardan çox ucadır.

**64** Onların ortaq qoşduğu şeylərmi xeyirlidir, yoxsa öncə yaratmağı başladan, sonra onu geri qaytaracaq olan və sizi həm göydən, həm də yerdən ruziləndirənmi? Allah ilə bərabər başqa bir ilahmı var? De ki: "Əgər doğru kimsələrsinizsə, qəti dəlilinizi gətirin!"

**65** De ki: "Qeybi; göylərdə və yerdə görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi Allahdan başqa kimsə bilməz. Və onlar, nə zaman dirildiləcəklərini də dərk edə bilməzlər."

**66** Əslində onların axirət haqqında bildikləri ardıcıl olaraq gəlməkdədir. Fəqət onlar, bundan bir şübhə [qəti olmayan, əskik məlumat] içindədirlər. Daha doğrusu, onlar bundan kordurlar.

**67,68** O kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr] də: "Biz və atalarımız torpaq olduqdan sonramı, həqiqətən də biz dirildilərək çıxardılacağıq? And olsun ki, bu əzab və dirilmə təhdidi, bizə və daha öncə atalarımıza təhdid olaraq söz verilmişdi. Bu, ancaq keçmişlərin uydurma nağıllarından başqa bir şey deyildir" dedilər.

**69** De ki: "Yer üzündə gəzib dolaşın və günahkarların sonunun necə olduğuna bir baxın!"

**70** *–Sən onlardan ötrü kədərlənmə və onların qurmaqda olduqları hiylələrdən ötrü də sıxıntı içində olma!–*

**73** Və heç şübhəsiz, sənin Rəbbin, insanlara qarşı böyük səxavət

(kərəm) sahibidir, lakin onların çoxu sahib olduqlarının qarşılığını
ödəmirlər. **74** Və şübhəsiz ki, sənin Rəbbin, onların sinələrinin gizli
saxladıqlarını və aşkar etdiklərini qəti surətdə bilməkdədir
**75** Və göydə və yerdə gizli olan heç bir şey yoxdur ki, açıq-aydın bir
kitabda olmasın. (48/27, Nəml/59-70,73-75)

## Nəcm: 147

**76** Heç şübhəsiz, bu Quran İsrail oğullarına, haqqında ixtilafa düşdükləri şeylərin bir çoxunu xəbər verib anlatmaqdadır.

**77** Və heç şübhəsiz ki, həqiqətən Quran, möminlər üçün bir yol göstərən və bir rəhmətdir.

**78** Şübhəsiz ki, sənin Rəbbin, onların arasında Öz hökmünü gerçəkləşdirir. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, çox yaxşı biləndir.

**79** Elə isə sən, işin nəticəsini Allaha həvalə et, şübhəsiz ki, sən, açıq-aşkar olan haqq üzərindəsən.

**80** Şübhəsiz ki, sən, ölülərə eşitdirə bilməzsən və arxasını dönüb qaçdıqları zaman karlara da dəvəti eşitdirə bilməzsən.

**81** Sən korları düşdükləri azğınlıqdan çəkib doğru yolu göstərən də deyilsən; sən ancaq ayələrimizə iman edənlərə *–ki onlar təslim olanlardır–* eşitdirə bilərsən. (48/27, Nəml/76-81)

## Nəcm: 148

**82** Və Söz,[175] üzərlərinə vaqe olduğu / gerçəkləşdiyi zaman, onlar üçün, insanların ayələrimizə lazımi şəkildə iman etmədiklərini onlara söyləyən / izah edən, torpaqdan / maddədən düzəlmiş, hərəkət edən, danışan bir varlıq[176] çıxardıq.

**83** Və başçısı olan hər camaatdan, ayələrimizi / əlamətlərimizi / işarətlərimizi yalan sayanlardan bir qrup topladığımız gün, onlar həbs olunub dağıdılarlar.

**84** Və gəldikləri zaman, Allah deyər ki: "Siz Mənim ayələrimi / əlamətlərimi / işarətlərimi, bilik baxımından onu qavramadığınız halda, yalanladınızmı? Və ya nə edirdiniz?"

**85** Və şirk qoşaraq, inanmayaraq yanlış etmələrinə qarşılıq, Söz[177] öz əleyhlərinə gerçəkləşməkdədir, artıq onlar danışmazlar.

(48/27, Nəml/82-85)

Nəcm: 149

86 Onlar görmədilərmi ki, istirahət etsinlər deyə gecəni yaratdıq, gündüzü də gördürücü [düşüncə inkişaf etdirici olaraq], aydınlıq yaratdıq. Şübhəsiz ki, bunda iman edən bir camaat üçün həqiqətən əlamətlər / işarətlər vardır.

87 Və Sura üfürüldüyü[178] gün, artıq Allahın istədiklərindən başqa, göylərdə və yerdə kimlər varsa hamısı dəhşətə qapılarlar. Və hamısı dəyərlərini itirmiş olaraq Ona gələrlər.

88 Və sən dağları görərsən; sən onları donuq, durğun (hərəkətsiz) sanarsan. Halbuki onlar, hər şeyi mükəmməl yaradan Allahın yaratması olaraq, buludun keçib getməsi kimi keçib getməkdədirlər. Şübhəsiz ki O, etdiklərinizdən tamamilə xəbərdardır.

89 Kim bir yaxşılıq – gözəllik gətirərsə, onun üçün gətirdiyindən daha xeyirlisi / gətirdiyinə görə bir xeyir vardır. Və onlar o gün qorxudan güvəndə olanlardır.

90 Və kim pisliklə gələrsə, artıq üzləri atəşdə sürtülər. *–Siz etdiyiniz əməllərdən başqasıylamı qarşılıq görəcəksiniz?–*

71 Və onlar: "Əgər doğru kimsələrsinizsə, bu təhdid olaraq söylənən söz / əzab nə zamandır?" deyirlər.

72 De ki: "Bəlkə də, tezləşdirməkdə olduğunuzun bir qismi artıq sizə yetişmişdir."

91-93 Sən, "Mənə ancaq hər şeyin sahibi olan və buranı toxunulmaz edən Məkkənin Rəbbinə[179] qulluq etməklə əmr olundum. "Və Mən müsəlman olmağımla və Quranı oxu-yub izləməyimlə əmr olundum. Artıq kim göstərilən doğru yola yönələrsə, yalnız özü üçün göstərilən doğru yola yönəlmiş olar; kim də azarsa, dərhal, 'Mən sadəcə xəbərdar edənlərdənəm.' Və bütün təriflər Allaha məxsusdur; başqasını tərifləmək olmaz. O, ayələrini / əlamətlərini / işarətlərini sizə göstərəcək və siz də onları tanıyacaqsınız" de.

*–Və Rəbbin, etdiklərinizdən xəbərsiz deyildir.–*

(48/27, Nəml/86-90,71,72,91-93)

## QƏSƏS (49 – 28) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

Nəcm: 150

1 Ta / 9, Sin / 60, Mim / 40.[180]

2 Bunlar, açıq-aşkar / açıqlayan kitabın ayələridir.

3 Biz, iman edəcək bir camaat üçün Musa və Fironun önəmli

xəbərlərindən bir qismini sənə haqq ilə oxuyuruq / sənin nəzərinə çatdırırıq.

4 Şübhəsiz ki, Firon yer üzündə ucaldı və idarəsi altındakı insanları qruplara böldü; onlardan bir qrupu zəiflətmək istəyir; bunların oğullarını işgəncə edərək öldürür; təhsilsiz, təlimsiz saxlayıb savadsız bir kütlə meydana gətirərək zəiflədir, qızlarını da sağ buraxırdı [qadınlarını utanca boğurdu]. Şübhəsiz ki, o, fəsad törədənlərdən idi.

5 Biz isə istəyirik ki, yer üzündə zəiflədilənlərə bir ərməğan verək,
onları öndərlər edək və onları mirasçılar edək. 6 Və onları yer üzündə
möhkəm yerləşdirək, Firon, Haman və bu ikisinin əsgərlərinə, onlardan çəkinməkdə olduqları şeyləri göstərək.

7 Və Biz Musanın anasına vəhy etdik: "Onu əmizdir. Əgər onun üçün qorxsan, onu çaya burax, qorxma və kədərlənmə. Şübhəsiz ki, Biz onu sənə qaytaracaq və onu elçilərdən biri edəcəyik."

8 Sonra da Firon ailəsi, özləri üçün bir düşmən və məyusluq səbəbi olmaq üzrə, onu bir "tapıntı" kimi aldı. Həqiqətən, Firon, Haman və bu ikisinin əsgərləri xəta edənlər idi.

9 Və Fironun arvadı: "Mənim və sənin üçün göz aydınlığı olsun! Onu öldürməyin; [Musanı İsrail oğullarının digər uşaqları kimi savadsız; təhsilsiz, peşəsiz saxlamayın"], bəlkə bizə bir faydası toxunar, ya da onu övladlığa götürərik" dedi. Və onlar, işin fərqində olmurlar.

10 Musanın anasının ürəyi səhərə bomboş çıxdı. *-Əgər Biz, inananlardan olması üçün onun qəlbinə qüvvət verməmiş olsaydıq, az
qalmışdı onu (sirri) açığa vuracaqdır.–* 11 Və Musanın anası Musanın
bacısına, "Onun dalınca get!" dedi. O da dərhal, onlar fərqinə varmadan uzaqdan onu güdürdü.

12 Və Biz daha öncə, ona süd analarını haram etdik. Belə olduqda, Musanın bacısı, "Sizə, sizin yerinizə ona baxacaq və öyüd və təhsil verəcək bir ailə göstərimmi?" dedi.

13 Beləliklə, Biz onu, gözü aydın olsun, qəm çəkməsin və Allahın verdiyi sözün gerçək olduğunu bilsin deyə anasına geri verdik. *–Lakin onların bir çoxu bilmir.–*

14 Və Musa igidlik yaşına qədəm qoyduqda, Biz ona qanun və bilik verdik. Və Biz gözəl davrananlara bax belə qarşılıq veririk.

15 Və Musa, şəhər əhalisinin xəbərsiz olduğu bir anda şəhərə girdi. Sonra orada, biri öz tərəfindən, digəri düşmən tərəfindən, bir-birini öldürməyə çalışan iki adam gördü. Sonra öz tərəfindən olan, düşmənə qarşı Musadan kömək istədi. Musa da o birinə dərhal bir yumruq vurdu, o da dərhal öldü. Musa, "Bu, şeytanın işindəndir, şübhəsiz o,

azdırıcı (yoldan çıxardan), açıq-aşkar bir düşməndir” dedi.
**16** Musa: “Ey Rəbbim! Şübhəsiz ki, özümə haqsızlıq etdim. Artıq məni bağışla!” dedi və Allah onu bağışladı. Şübhəsiz O, çox bağışlayanın, çox mərhəmət edənin məh Özüdür.
**17** Musa: “Ey Rəbbim! Mənə nemət olaraq verdiyin şeylərə and olsun ki, artıq heç vaxt günahkarlara arxa olmayacağam” dedi.
**18** Sonra da Musa, şəhərdə qorxu içində, ətrafını yoxlaya-yoxlaya səhərə çıxdı. Bir də nə görsün, dünən ondan kömək istəyən kimsə, fəryad edərək ondan kömək istəyir. Musa ona: “Şübhəsiz ki, sən, açıq-aşkar bir azğınsan!” dedi.
**19** Musa, ikisinin də düşməni olan adamı tutmaq istəyərkən, o adam: “Ey Musa! Dünən bir adamı vurub öldürdüyün kimi məni də öldürmək istəyirsən? Sən yalnız yer üzündə bir dikbaş olmaq istəyirsən və sən islah edicilərdən olmaq istəmirsən” dedi.
**20** Və şəhərin o biri başından bir adam qaçaraq gəldi. Dedi ki: “Ey Musa! Əyan-əşrəf səni öldürmək üçün sənin haqqında müzakirə edirlər. Dərhal çıx! Şübhəsiz ki, mən öyüd verənlərdənəm.”
**21** Sonra da Musa qorxa-qorxa, (ətrafını) yoxlaya-yoxlaya oradan çıxdı. “Ey Rəbbim! Məni şirk qoşaraq səhv, öz zərərinə olan əməli işləyənlər tayfasından qurtar!” dedi.
**22** Və Musa Mədyənə doğru yönəldiyində: “Ümid edirəm ki, Rəbbim mənə yolun doğrusunu göstərəcək” dedi.
**23** Və Musa Mədyən suyuna çatanda orada heyvanlarını sulayan bir öndərli insan topluluğu gördü. Və Musa, heyvanlarını sulayanlar qədər güclü olmayan, heyvanlarını geri çəkən iki qadın gördü. Dedi ki: “Halınız nədir?” Dedilər ki: “Çobanlar sulayıb çəkilmədən biz sulamarıq; atamız da çox yaşlı bir qocadır.”
**24** Belə olduqda, Musa, ikisi üçün heyvanları suladı. Sonra kölgəyə çəkildi və: “Ey Rəbbim! Şübhəsiz ki mən, yaxşılıqdan mənə endirdiyin şeyə möhtacam” dedi.
**25** Bu zaman o iki qadından biri utana-utana Musanın yanına gəldi. Dedi ki: “Şübhəsiz ki, atam, bizim yerimizə sulamağının muzdunu qarşılamaq üçün səni çağırır.” Musa, qızın atasının yanına gəldi və hadisələri ona anlatdı. Qızın atası; “Qorxma, o şirk qoşaraq səhv; öz zərərinə olan əməlləri işləyən camaatdan qurtuldun” dedi.
**26** Onun iki qızından biri: “Atacan! Onu muzdla tut. Şübhəsiz, muzdla tutulan kimsələrin ən yaxşısı, güclü və güvənilir olanıdır” dedi.
**27** Qızların atası dedi ki: “Həcc edilən səkkiz il mənə işləməyinə qarşılıq bu iki kızımdan birini sənə nigahlamaq istəyirəm. Əgər ona

(on ilə) tamamlasan, artıq o özündən; sənə ağırlıq vermək də istəmirəm. İnşaAllah məni salehlərdən görəcəksən."

**28** Musa: "Bu, səninlə mənim aramdadır; bu iki müddətdən hansını başa vursam, demək ki, mənə qarşı düşmənçilik / məsuliyyət olmayacaq. Və söylədiklərimizə Allah vəkildir [qoruyaraq, dəstəkləyərək həyata keçirəndir]" dedi.

**29** Artıq Musa müddəti başa vurub ailəsiylə / yaxınlarıyla yola çıxınca, dağ tərəfindən bir ataş hiss etdi. Ailəsinə, "Mən sizə bir xəbər gətirənə kimi siz gözləyin; mən bir ataş hiss etdim. Yaxud isinməyiniz üçün o ataşdan bir parça gətirərəm" dedi.

**30-32** Sonra oraya çatanda, o bərəkətli torpaq parçasındakı vadinin sağ tərəfindən, bir ağacdan səsləndi: "Ey Musa! Heç şübhəsiz ki Mən aləmlərin Rəbbi Allahın Özüyəm! Və öz biliklərini ortaya at! *–Öz biliklərinin sanki görünməyən bir varlıq kimi, hərəkət etdiyini görüncə, dönüb arxasına baxmadan qaçdı.–* Ey Musa! Bəri gəl, qorxma. Həqiqətən sən əmin-amanlıq içində olanlardansan. Qoynundaki gücünü işlət, qüsursuz, mükəmməl çıxacaqsan.[181] Qorxudan qanadını özünə çək. Bax bu ikisi Firona və onun adamlarına qarşı sənin Rəbbin tərəfindən iki qəti dəlildir. Şübhəsiz ki, onlar, yoldan çıxan bir camaat olmuşdur."

**33,34** Musa dedi ki: "Ey Rəbbim! Şübhəsiz ki, mən onlardan bir adam öldürdüm, indi onların məni öldürmələrindən qorxuram. Qardaşım Harunu da mənimlə göndər; o, dil baxımından məndən daha yaxşı, gözəl və təsirlidir. O səbəblə, onu da məni təsdiqləyən bir yardımçı olaraq mənimlə birlikdə göndər. Şübhəsiz ki, mən, məni yalanlamalarından qorxuram."

**35** Allah dedi ki: "Səni qardaşınla dəstəkləyəcəyik və ikiniz üçün bir güc, iqtidar yaradacağıq. Sonra da onlar əlamətlərimiz / işarətlərimiz səbəbiylə sizə çata bilməyəcəklər. Siz ikiniz və ikinizin arxasınca gedənlər üstün olanlarsınız."

***

**36** Musa açıq-aşkar əlamətlərimiz / işarətlərimiz ilə onların yanına gəlincə, "Bu, sadəcə uydurulmuş təsirli bir məlumatlardır. Və biz öncəki atalarımızdan bunu eşitməmişdik" dedilər.

**37** Musa isə dedi ki: "Mənim Rəbbim Öz dərgahından kimin doğru yol göstərici ilə gəldiyini və yurdun sonunun kim üçün daha yaxşı olacağını daha yaxşı biləndir. Şübhəsiz ki, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər nicat tapmazlar."

**38** Firon isə: "Ey möhtərəmlər! Sizin üçün məndən başqa bir ilah

tanımadım. Ey Haman! Mənim üçün palçıq üzərində dərhal atəş yandır; kərpic düzəlt və Musanın ilahı haqqında məlumat ala bilməyim üçün mənə bir qüllə düzəlt. Və şübhə yox ki, onun yalançılardan biri olduğuna qəti surətdə inanıram" dedi.

39 Firon özü və əsgərləri yer üzündə haqsız yerə təkəbbür göstərdilər və gerçəkdən Bizə döndərilməyəcəklərinə inandılar.

40 Biz də onu və əsgərlərini tutub o bol suda / çayda fırladıb atdıq. İndi, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin sonunun necə olduğuna bir bax!

41 Və onları, atəşə çağıran öndərlər etdik. Qiyamət günü onlar yardım da görməyəcəklər.

42 Və elə etdik ki, bu dünyada qovulmaq, Allahın rəhmətindən məhrum olmaq onların yaxasını buraxmasın. Onlar, qiyamət günündə də pislənmiş / uzaqlaşdırılmış kimsələrdəndir.

43 Və and olsun ki, Biz ilk nəsilləri dəyişikliyə / məhvə məruz qoyduqdan sonra, Musaya, öyüd alarlar deyə insanlar üçün açıq-aşkar dəlillər, rəhbər və rəhmət olaraq Kitabı / Tövratı verdik.

44 Və Musaya o əmri verdiyimiz vaxt, sən məğrib tərəfində deyildin. Orada olanlardan, şahid olanlardan da deyildin.

45 Amma Biz neçə-neçə nəsillər yaratdıq, onların ömürləri uzandıqca uzandı. Sən onlara ayələrimizi oxuyaraq, Mədyən xalqı arasında olanlardan da deyildin. Lakin Biz elçi göndərənlərik.

46,47 Və Biz xitab edərkən, Tur dağının yanında da deyildin. Əksinə, səndən öncə özlərinə xəbərdar edən / peyğəmbər gəlməyən bir camaatı xəbərdar etməyin üçün və öz əllərinin etdiklərinə görə başlarına bir fəlakət gəldiyində dərhal, "Rəbbimiz! Nə olardı, bizə bir peyğəmbər göndərsəydin, ayələrinə uyardıq və möminlərdən olardıq" deyə bilməsinlər, onlar öyüd alsınlar deyə, Rəbbindən bir rəhmət olaraq… orada olanları sənə bildirdik, səni elçi olaraq göndərdik.

48 Beləliklə, onlara tərəfimizdən o haqq gəldikdə, "Musaya verilən şeylər; əlamətlər; işarətlər kimi şeylər ona da verilməli deyildimi?" dedilər. Daha əvvəl Musaya veriləni ört-basdır edib rədd etməmişdilərmi? "Bir-birinə arxa çıxan; bir-birini dəstəkləyən iki sehr; təsirli məlumat" dedilər. Və "Şübhəsiz ki, biz hamısını qəbul etməyəcəyik" dedilər.

49 De ki: "Əgər doğru kimsələrsinizsə, dərhal Allah qatından mənə və Musaya nazil olan kitablardan daha çox doğruluğa bələdçi olan bir kitab gətirin, mən də ona tabe olum!"

50 Buna baxmayaraq əgər sənə cavab verməsələr, bil ki, onlar yalnız

öz nəfslərinə uymaqdadırlar. Allah tərəfindən doğru yol göstərən biri olmadan öz nəfsinə tabe olanlardan daha çox azmış [çaşmış, rəzil] kim ola bilər? Həqiqətən Allah şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən camaata yol göstərməz.

**51** Və and olsun Biz, Sözü [vəhyi / Quranı] öyüd alarlar deyə bir-birinin ardınca yolladıq.

**52** Sözdən [vəhydən / Qurandan] öncə özlərinə Kitab verdiyimiz kimsələr; onlar, Sözə [vəhyə / Qurana] da inanırlar.

**53** Və onlara o Söz [vəhy / Quran] oxunduğu zaman onlar, "Biz ona inandıq. Şübhəsiz ki, o, Rəbbimizdən gələn həqiqətdir. Həqiqətən biz, ondan öncə də müsəlman olanlar idik" dedilər.

**54** Bax onlar; səbr etdikləri üçün onların mükafatları iki dəfə veriləcəkdir. Və onlar pisliyi yaxşılıqla dəf edərlər və onları ruziləndirdiyimiz şeylərdən Allah yolunda xərcləyərlər / başda öz yaxınları olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edərlər.

**55** Və onlar, boş söz eşitdikləri zaman, ondan üz çevirərlər və: "Bizim işlərimiz yalnız bizim üçün, sizin işləriniz də yalnızca sizin üçündür. Sizə salam olsun! Biz cahilləri axtarmırıq" deyərlər.

**56** Şübhəsiz ki, sən sevdiyini doğru yola yönəldə bilməzsən; amma Allah istədiyinə doğru yolu göstərir və O, göstərilən doğru yolu qəbul edəcək olanları daha yaxşı bilir.

**57** Və onlar: "Biz səninlə bərabər, doğru yol göstəricisinə tabe olarsaq, yurdumuzdan qovularıq" dedilər. Biz onları, Öz qatımızdan bir ruzi olaraq, hər şeyin səmərələrinin toplanıb gətirildiyi, güvənli, toxunulmaz bir yerə / Məkkəyə[182] yerləşdirmədikmi? Lakin onların çoxu bilməzlər.

**58** Və Biz, öz güzaranıyla qürrələnən neçə-neçə şəhəri dəyişikliyə / məhvə məruz qoyduq. Bax, budur onların yurdları! Onlardan sonra çox az yaşayış olan məskənləri. Və Biz, varislərin məhz Özüyük.

**59** Rəbbin, onlara ayələrimizi oxuyan bir peyğəmbəri şəhərin mərkəzinə göndərmədikcə, heç bir məmləkəti dəyişikliyə / məhvə məruz qoyan deyildir. Eləcə də, Biz, əhalisi şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələr olmayan məmləkətləri dəyişikliyə / məhvə məruz qoyan deyilik. (49/28, Qəsəs/1-59)

## Nəcm: 151

**60** Və sizə verilən şeylər, bəsit dünya həyatının qazancı və onun bərbəzəyidir. Allah qatında olanlar isə daha xeyirli və daha qalıcıdır.

Hələ də ağlınızı işlətməyəcəksiniz?

**61** Belə olduğu halda, Bizim gözəl bir söz verdiyimiz və o sözə qovuşan kimsə, bəsit dünya həyatının qazancını qazandırdığımız və sonra qiyamət günündə hüzurumuza gətirilən / hüzurumuzda ‘farağat’da saxlanan kimsə ilə eyni ola bilərmi?

**62** Və o gün Allah onlara səslənər və deyər ki: “Yanlış olaraq inandığınız Mənim ortaqlarım hanı, haradadır?”

**63** Haqlarında Söz gerçəkləşən kimsələr: “Ey Rəbbimiz! Bax bunlar bizim azdırdığımız kimsələrdir. Biz necə azmışıqsa, bunları da eləcə biz yoldan çıxardıq. Biz, Sənə qarşı uzaq olduq. Onlar sadəcə bizlərə ibadət etmirdilər” deyərlər.

**64** Və “Ortaqlarınızı çağırın!” deyilər, onlar da çağırarlar. Sonra da onlar (ortaq qoşduqları) onlara cavab verməzlər və əzabı görərlər. *–Nə olardı onlar, yönləndirildikləri doğru yolu qəbul etmiş olsaydılar!–*

**65** Və o gün Allah onlara səslənərək: “Göndərilən elçilərə nə cavab verdiniz?” deyər.

**66** Bax, o gün, bütün önəmli xəbərlər onlar üçün qapqaranlıq olmuşdur; artıq onlar bir-birlərindən də soruşa bilməzlər.

**67** Ancaq tövbə edən, iman edən və sahmana salmaq məqsədi ilə işlər görən kimsəyə gəlincə, o, qurtuluşa yetişənlərdən olmağı ümid edə bilər. (49/28, Qəsəs/60-67)

## Nəcm: 152

**68** Və sənin Rəbbin istədiyi şeyi yaradır və onlar üçün xeyirli olan şeyləri seçər, onlar üçün isə seçmək haqqı yoxdur. Allah onların ortaq qoşduqlarından pakdır və ucalar ucasıdır.

**69** Və sənin Rəbbin, onların köksləri̇ndə gizlədikləri şeyləri və aşkar etdikləri şeyləri bilir.

**70** Və O, Özündən başqa ilah[183] deyə bir şey olmayan Allahdır. İlkdə də və sonda da bütün təriflər Ona məxsusdur, hökm ancaq Ona məxsusdur. Və ancaq Ona qaytarılacaqsınız. (49/28, Qəsəs/68-70)

## Nəcm: 153

**71** De ki: “Heç düşündünüzmü, əgər Allah üzərinizdəki gecəni qiyamət gününə qədər ara vermədən davam etdirsə, Allahdan başqa sizə işıq gətirə bilən ilah kimdir? Hələ də qulaq asmayacaqsınız?”

**72** De ki: “Heç düşündünüzmü, əgər Allah üzərinizdəki gündüzü qiyamət gününə qədər ara vermədən davam etdirsə, Allahdan başqa,

istirahət edəcəyiniz gecəni sizə gətirə bilən ilah kimdir? Hələ də görməyəcəksiniz?”

**73** Və Allahın mərhəmətindəndir ki, O, gecəni və gündüzü; gecələr dincələsiniz və gündüzlər Onun lütfündən bolluca verdiyi nemətlərdən axtarasınız və özünüzə verilən nemətlərin əvəzini ödəyəsiniz deyə yaratdı.

**74** Və o gün Allah onlara səslənib deyər ki: “Yanlış olaraq inandığınız Mənim ortaqlarım hanı, haradadır?”

**75** Və Biz, başçısı olan hər camaatdan bir şahid çəkib çıxardıq və: “Haydı, qəti dəlilinizi gətirin!” dedik. Artıq bildilər ki, həqiqət Allaha aiddir və uydurub düzəltdikləri şeylər onlardan ayrılıb yox olmuşdur.

(49/28, Qəsəs/71-75)

## Nəcm: 154

**76,77** Şübhəsiz, Qarun Musanın qövmündən idi, ancaq onlara qarşı azğınlıq etmişdi. Biz ona elə xəzinələr vermişdik ki, şübhəsiz, onun açarları güclü-qüvvətli bir topluluğa ağır gəlirdi. Bir zaman qövmü ona demişdi ki: “Qürrələnmə! Şübhəsiz ki, Allah qürrələnənləri sevməz. Və Allahın sənə (bir nemət) verdiyində, axirət yurdunu istə. Dünyadakı nəsibini də unutma! Allahın sənə ehsan etdiyi kimi, sən də ehsan et. Və yer üzündə fəsad törətməyi istəmə. Şübhəsiz ki, Allah fəsad törədənləri sevməz.”

**78** Qarun, “Bu sərvət, mənə ancaq məndəki bilik (savad) sayəsində verildi” dedi. Bilmirdimi ki, Allah, ondan öncəki nəsillərdən, ondan daha güclü, ondan daha çox tərəfdarı, biliyi (təcrübəsi) olan kimsələri həqiqətən dəyişikliyə / məhvə məruz qoymuşdu? *–Və bu günahkarlar, digərlərinin günahlarının məsuliyyətini daşımaz.–*

**79** Bir vaxt Qarun, zinət və ehtişam içində qövmünün qarşısına çıxdı. Dünya həyatını istəyən kimsələr: “Kaş ki, Qaruna verilən şeylər bizim də olsaydı! Şübhəsiz ki o Qarun, çox böyük bir nəsib sahibidir” dedilər.

**80** Və özlərinə bilik (savad) verilmiş olan kimsələr isə: “Vay olsun sizə! İman edən və yaxşı əməl işləyən kimsələr üçün Allahın verəcəyi mükafat daha xeyirlidir. Ona da ancaq səbr edənlər qovuşa bilər” dedilər.

**81** Axırda Biz onu və evini yerə batırdıq. Artıq Allahın altındakılardan ona yardım edəcək bir tərəfdar da olmadı və o, özünü müdafiə edib qurtara bilənlərdən də deyildi.

**82** Və elə dünən onun yerində olmaq istəyənlər: “Demək ki, Allah

qullarından istədiyinin ruzisini artırır və azaldır. Əgər Allah bizə lütf etmiş olmasaydı, bizi də yerin dibinə batırardı. Və demək ki kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] özlərini qurtara bilmirlər" deyərək səhərə çıxdılar. (49/28, Qəsəs/76-82)

## Nəcm: 155

**83** Bax, axirət yurdu! Biz onu yer üzündə təkəbbürlənməyi və fəsad törətməyi arzulamayan kimsələr üçün hazırlayarıq. Və aqibət, Allahın mühafizəsi altına daxil olan kəslər üçündür.

**84** Kim bir yaxşılıq gətirərsə, ona ondan daha xeyirlisi / ona ondan ötrü bir xeyir vardır. Və kim bir pislik gətirərsə; bax, o pislikləri işləyənlər, ancaq etdikləri şeylər ilə qarşılıq görəcəklər.

(49/28, Qəsəs/83-84)

## Nəcm: 156

**85** Şübhəsiz ki, Quranı sənə fərz edən Allah, əlbəttə səni dönüləcək yerə döndərəcəkdir. De ki: "Mənim Rəbbim, kimin doğru yol göstəricisi ilə gəldiyini və kimin açıq-aşkar bir azğınlıq içində olduğunu daha yaxşı biləndir."

**86** Və sən Kitabın sənə vəhy ediləcəyini / nazil olacağını ümid etmirdin. O, ancaq Rəbbindən bir rəhmət olaraq verildi. Elə isə heç vaxt kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] arxa çıxma / yardımçı olma.

**87** Və ortaq qoşanlar, sənə nazil edildikdən sonra, əsla səni Allahın ayələrindən döndərməsinlər. Və Rəbbinə dəvət et. Və əsla ortaq qoşanlardan olma!

**88** Və Allah ilə bərabər başqa bir tanrıya yalvarma. Ondan başqa heç bir ilah yoxdur. Onun Zatından başqa hər şey yox olacaqdır. Qanun-qayda, yalnızca Onundur. Siz də ancaq Ona döndəriləcəksiniz.

**İsra 1** Bəndəsini bir gecə, ayələrimizdən / əlamətlərimizdən / işarətlərimizdən göstərmək üçün Məscidülhəramdan bir kənarını mübarək etdiyimiz Məscidüləqsaya[184] aparan Zat, bütün nöqsan sifətlərdən pakdır. Şübhəsiz O, ən yaxşı eşidənin, ən yaxşı görənin məhz Özüdür. (49/28, Qəsəs/85-88+50/17, İsra/1)

# İSRA (50 – 17) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 157

2,3 Musaya da Kitab verdik və Mənim altımdakılardan vəkil [bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən bir nəfər / təşkilat] tanımayasınız deyə Kitabı, İsrail oğulları *–Nuhla bərabər gəmiyə mindirərək xilas etdiyimiz kimsələrin soyundan olanlar–* üçün bir yol göstərən etdik. Şübhəsiz ki, Nuh, şükr edən; özünə verilən nemətlərin qarşılığını çoxlu ödəyən bir quldu.

4 Və Biz İsrail oğullarına Kitabda / Yazıda (qədərdə) bunu gerçəkləşdirdik: "Həqiqətən siz, yer üzündə iki dəfə qarışıqlıq çıxaracaqsınız / darmadağın ediləcəksiniz və həqiqətən böyük bir yüksəlişlə yüksələcəksiniz."
5 Bax, o ikisindən birincisinin vaxtı gələndə üzərinizə çox güclü qullarımızı göndərdik və onlar, evlərin arasına girib axtarırdılar. Və o, yerinə yetirilməsi lazım olan bir vəd idi.
6 Sonra sizi yenə güclü qulların üzərinə qalib etdik və sizə mallarla və oğullarla yardım etdik. Və sizə işə yarayan şeylərdən daha çox şey verdik.

7 *–Əgər yaxşılıq etdinizsə, özünüzə yaxşılıq etmisiniz və əgər pislik etdinizsə o da onun (edənin) özü üçündür.–* Artıq digər darmadağın olmaq zamanı gəlincə də sizə pislik etmələri, ilk dəfə girdikləri kimi yenə məscidə / Beytül-Məqdisə girmələri, ələ keçirtdikləri yerləri yıxıb-dağıdmaları üçün üzərinizə güclü qullarımızı təkrar göndərəcəyik.
8 Ola bilsin ki, Rəbbiniz sizə mərhəmət edər. Və əgər siz döndünüzsə, Biz də döndük. Və Biz Cəhənnəmi kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün onları əhatə edən bir zindan etdik. (50/17, İsra / 2-8)

## Nəcm: 158

9,10 Şübhəsiz ki, bu Quran insanları ən doğru və ən sağlam şeyə; yetkinliyə yönləndirər (kamala çatdırar) və sahmana salmaq məqsədi ilə işlər görən möminlər üçün həqiqətən də mütləq böyük bir əcr olduğunu və axirətə inanmayan kəslər üçün də Bizim ağrılı bir əzab hazırladığımızı müjdələyər. (50/17, İsra / 9-10)

## Nəcm: 159

11 Və insan, xeyri təbliğ edirmiş kimi pisliyi təbliğ edər. Və insan çox tələsəndir.

**12** Və Biz, gecəni və gündüzü iki əlamət / işarət etdik. Sonra Rəbbinizin lütf etdiyi şeyləri axtarasınız deyə, illərin sayını və hesabı biləsiniz deyə gecənin əlamətini / işarətini silib, bir gördürücü aydınlıq (düşüncə inkişaf etdirici) olaraq gündüzün əlamətini / işarətini gətirdik. Və Biz, hər şeyi ətraflı izah etdikcə, izah etdik.

**13,14** Və hər insanın öz etdiklərinin qarşılıqlarını, ayrılmayacaq şəkildə boynuna doladıq. Və Biz, qiyamət günü açılmış gördüyü kitabı onun üçün çıxardarıq: "Oxu öz kitabını! Bu gün sən özün, özünü hesaba çəkmək üçün o sənə yetər!"

**15** Kim, göstərilən doğru yolu taparsa, sırf öz yaxşılığı üçün göstərilən doğru yolu tapmışdır. Kim də azarsa, ancaq öz zərərinə azmış olar. Və heç bir yük daşıyan başqasının yükünü daşımaz. Və Biz, bir peyğəmbər göndərmədikcə, əzab edən olmadıq.

**16** Və Biz, bir ölkəni dəyişikliyə / məhvə məruz qoymaq istədiyimiz zaman, oranın zəngin və güclü adamlarına, başbilənlərinə haqq yolda olmağı, haqq yolda öndərlik etmələrini əmr edərik, ancaq onlar, bunun əksinə, orada haqq yoldan çıxarlar. Artıq oranın üzərinə Söz[185] (vəd) haqq olar və Biz oranı kökündən darmadağın edərik.

**17** Və Biz Nuhdan sonrakı neçə-neçə nəsilləri dəyişikliyə / məhvə məruz qoyduq. Və qullarının günahlarını layiqincə bilən və ən yaxşı görən olaraq Rəbbin kifayətdir.

**18** Hər kim tez keçib gedən dünyanı istəsə, istədiyimiz kimsəyə istədiyimiz şeyi tezləşdirərik. Sonra onun üçün cəhənnəmi hazırlayarıq, qınanmış və qovulmuş olaraq oraya daxil olar. **19** Kim də axirəti istəyərsə və mömin olaraq axirətə yaraşar bir səy ilə axirət üçün çalışarsa, bax elələrinin çalışmalarının qarşılığı verilər. **20** Hamısına; dünyanı istəyənlərə və axirəti istəyənlərə Rəbbinin ehsanından verərik. Rəbbinin ehsanı məhdudlaşdırılmış deyil.

**21** Onların bir qisimini bir qismindən necə üstün etdiyimizə bir bax! Əlbəttə axirət, dərəcələr baxımından daha böyükdür, çoxluq baxımından da daha böyükdür.

**22** Allah ilə birlikdə başqa bir ilah qəbul etmə / tanıma! Yoxsa qınanmış və yalnız başına buraxılmış olaraq oturub qalarsan.

(50/17, İsra / 11-22)

## Nəcm: 160

**23,24** Və sənin Rəbbin qəti olaraq, Özündən başqasına qul olmamağınızı, ana və atanı yaxşılaşdırmağı - gözəlləşdirməyi buyurdu. Onlardan biri və ya hər ikisi sənin yanında qocalığa çatarsa, əsla

onlara "Uf" demə, onları danlama; onlarla çox həssas rəftar et. Və ikisinə də şərəfli, şirin və gözəl söz söylə. Və mərhəmət göstərərək onlar üçün təvazökarlıq qanadlarını endir. Və de ki: "Ey Rəbbim! Onların məni kiçik yaşımda tərbiyə edib ləyaqətli biri olaraq böyütdükləri kimi, onlara rəhmət et."

**25** Sizin Rəbbiniz sizin daxilinizdə olanları çox yaxşı bilir. Əgər salehlərdən olsanız, əlbəttə, O həqiqətən dönənləri bağışlayandır.

**26,27** Yaxınlara; yurdlarından çıxarılan fəqirlərə, yoxsula və yolda qalmışa da haqqını ver. Və yersiz / pis işlər üçün xərcləmə. *–Şübhəsiz, yersiz / pis işlər üçün xərcləyənlər, şeytanların qardaşlarıdır. Şeytan isə Rəbbinə qarşı çox nankordur.–*

**28** Və əgər Rəbbindən ümid etdiyin bir rəhməti axtararaq, əqrəba, yoxsul və yolda qalmışa yardım etməyəcəksənsə, o zaman da onlara yumşaq və şirin / onları incitməyəcək bir söz söylə.

**29** Və əlini boynuna bağlama / xəsis olma, onu büsbütün də açıb-saçma / bədxərclik etmə. Əks halda qınanmış və etdiyinə peşman olub qalarsan.

**30** Həqiqətən sənin Rəbbin, qullarından istədiyinin ruzisini artırar və azaldar. Şübhəsiz ki, O, qullarından həqiqətən xəbərdardır, haqqıyla görəndir.

**31** Və yoxsulluq ucbatından uşaqlarınızı öldürməyin. Onları və sizi Biz ruzilənditirik / onları və sizi Biz bəsləyirik. Onları öldürmək, həqiqətən, böyük bir günahdır.

**32** Zinaya da yaxınlaşmayın / zinaya yol açacaq yollardan uzaq olun. Şübhəsiz ki o, iyrənclikdir və pis bir yoldur.

**33** Və haqq ilə olmadıqca, Allahın haram qıldığı bir kimsəni öldürməyin. Və kim haqsızlıq edilərək öldürülərsə, Biz onun yaxınlarına bir səlahiyyət vermişik. O da öldürməkdə həddi aşmasın. *–Şübhəsiz, öldürülənə / onun hüquqlarını qoruyan yaxınlarına yardım olunmuşdur.–*

**34** Həddi-büluğa (yetkinliyə) çatana qədər yetimin malına da *–ən gözəl bir şəkildə (niyyətlə) olması istisna–* yaxınlaşmayın. Əhdi / verilmiş sözünüzü də yerinə yetirin. Şübhəsiz ki, verilən sözdə məsuliyyət vardır.

**35** Ölçərkən düz ölçün və düz tərəzi ilə çəkin. Bu, həm daha xeyirlidir və nəticə / əməl baxımından da daha gözəldir.

**36** Və heç bilmədiyin bir şeyin arxasınca düşmə! Şübhəsiz ki, qulaq, göz, ürək – bunların hər biri ondan məsuliyyət daşıyırlar.

**37** Və yer üzündə təkəbbür və əzəmətlə gəzmə! Şübhəsiz ki, sən əsla

yeri yara bilməzsən və boyda da dağlara çata bilməzsən.

38 Pis olan bütün bunlar, Rəbbinin qatında xoşlanılmayan şeylərdir.

39 Bax, yuxarıda müəyyən edilən bu prinsiplər / əmrlər, Rəbbinin sənə vəhy etdiyi, səhv işləri və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qanun, düstur və prinsiplərdən bəziləridir. Allahla bərabər başqa bir ilah[186] qəbul etmə. Əks halda qınanmış və qovulmuş olaraq cəhənnəmə buraxılarsan. (50/17, İsra/23-39)

## Nəcm: 161

41 Biz, bu Quranda, onlar ağıllarını başlarına yığsınlar deyə, (sözü) müxtəlif şəkillərdə dolandırıb çevirdik / fərqli-fərqli şəkillərdə açıqladıq. Və bu açıqlamalar, onların ancaq nifrətini artırmışdır.

45 Quranı öyrənib-öyrətdiyin zaman, səninlə axirətə inanmayanlar arasında görünməz / gizli bir pərdə çəkdik.

46 Və onların qəlbləri üzərinə, onu qavrayıb anlamalarını əngəlləyən qabıqlar, qulaqlarına da bir ağırlıq (tıxac) qoyduq. Və sən Quranda sadəcə Rəbbini ‘bir və tək’ olaraq andığın zaman, ‘nifrətlə qaçaraq’ geriyə çəkilərlər.

47 Biz, onların səni dinlədikləri vaxt nə üçün dinlədiklərini, gizli danışıqlarında da şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələrin, “Siz ovsunlanmış bir adamdan başqasına tabe
olmayırsınız” dediklərini çox yaxşı bilirik. 48 Sənin üçün necə
örnəklər verdiklərinə bir bax! Beləcə azğınlığa düşdülər! Artıq bir yola da gücləri çatmaz.[187] (50/17, İsra/41, 45-48)

## Nəcm: 162

42 De ki: “Əgər dedikləri kimi, Allah ilə birlikdə bəzi ilahlar olsaydı, o zaman o ilahlar ən böyük taxtın[188] sahibinə; Allaha bir yol axtarardılar”.

40 Rəbbiniz, oğulları xüsusi olaraq sizə verdi və Özünə isə mələklərdən dişilərimi götürdü? Şübhəsiz ki, siz çox böyük bir söz söyləyirsiniz.

43 Allah, onların dediklərindən böyük bir ucalıqla pak və çox ucadır.

44 Bütün göylər / kosmos, yer üzü və bunların içində olanlar, Allahı nöqsan sifətlərdən pak tuturlar. Onun tərifi ilə birlikdə (Allahı) nöqsan sifətlərdən pak tutmayan heç bir şey yoxdur. Lakin siz, onların Allahı nöqsan sifətlərdən pak tutmalarını yaxşı anlamırsınız. Şübhəsiz ki, O, həlimdir, çox bağışlayandır. (50/17, İsra/42, 40, 43-44)

## Nəcm: 163

**49** Və onlar dedilər ki: “Biz, bir sümük yığını olduğumuz və ovxalanıb toz olduğumuz vaxt, həqiqətən biz, yeni bir yaradılışla dirildiləcəyikmi?”

**50-52** De ki: “İstər daş olun, istər dəmir. Və yaxud ürəyinizdə böyütdüyünüz başqa bir məxluq olun.” Sonra onlar: “Bizi kim geri döndərəcək?” deyəcəklər. De ki: “Sizi ilk dəfə yoxdan yaratmış olan.” Belə olduqda, sənə başlarını sallayacaqlar (yelləyəcəklər) və: “Nə zamandır bu?” deyəcəklər. De ki: “Ümid edilir ki, çox yaxında! Sizi çağıracağı / dirildiləcəyiniz gün, Onu tərifləyərək Onun çağırışına tabe olacaqsınız və sadəcə çox az qaldığınızı zənn edəcəksiniz.”

(50/17, İsra/49-52)

## Nəcm: 164

**53** Qullarıma söylə, ən gözəl olanı söyləsinlər. Şübhəsiz ki, şeytan aralarına qarışıqlıq salar. Şübhəsiz ki, şeytan, insan üçün açıq-aşkar bir düşməndir.

**54** Sizin Rəbbiniz sizi daha yaxşı biləndir. İstəsə, tövbəniz səbəbiylə sizə mərhəmət edər və yaxud istəsə əzab edər. Səni də onların üzərinə, vəkil [bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən biri] olaraq göndərmədik.

**55** Və Rəbbin göylərdə və yerdə olan kimsələri ən yaxşı biləndir. Və and olsun ki, Biz peyğəmbərlərin bəzisini bəzisindən üstün etdik. Biz, Davuda da Zəburu verdik.

**56** De ki: “Allahın altındakılardan, ilah olduğunu iddia etdiyiniz şeyləri çağırın. Görəcəksiniz ki, onlar sizdən sıxıntını uzaqlaşdırmağa və dəyişdirməyə qadir deyillər.

**57** Bax, ilah olduğunu iddia etdiyiniz şeylər, Rəblərinə daha yaxın olmaq üçün vəsilə axtararaq yalvaran və onun mərhəmətini ümid edən və Onun əzabından qorxan kimsələrdir. Həqiqətən sənin Rəbbinin əzabı qorxuncdur.

**58** Və heç bir şəhər yoxdur ki, qiyamət günündən öncə Biz onu dəyişikliyə / məhvə məruz qoymayaq, yaxud şiddətli bir əzab ilə cəzalandırmayaq. Bu, kitabda sətir-sətir yazılmışdır.

**59** Və Bizi, əlamətləri / işarətləri göndərməkdən ancaq öncəki nəsillərin onları yalanlamış olmaları saxladı. Və Səmuda, açıq, görünən bir şəkildə sosial dəstək qurumları qurmaları[189] görəvini vermişdik, ancaq onun səbəb olmasıyla haqsız davranmışdılar. Və Biz, o əlamətləri / işarətləri ancaq qorxutmaq üçün göndəririk.

**60** Və bir vaxt Biz sənə, "Şübhəsiz ki, Rəbbin insanları əhatə etmişdir" demişdik. Və sənə açıqca göstərdiyimiz o görüntünü və Quranda uzaq durulmasını istədiyimiz qızıl, mal-mülk hərisliyini[190] də yalnız insanlara bir imtahan üçün etmişik. Və Biz onları qorxuduruq, lakin bu, onların ancaq böyük bir azğınlığını artırır. (50/17, İsra / 53-60)

## Nəcm: 165

**61** Və bir vaxt Biz təbiətdəki güclərə:[191] "Adəmə; biliklәndirilmiş insana boyun əyib təslimiyyət göstərin" demişdik, İblisdən; düşüncə bacarığından[192] başqa hamısı boyun əyib təslimiyyət göstərmişdilər. O: "Mən bir palçıq olaraq; maddə olaraq yaratdığın kimsəyə boyun əyib təslimiyyətmi göstərəcəyəm?" demişdi.

**62** İblis dedi ki: "Məndən üstün tutduğun bu adamı gördünmü? And içirəm ki, əgər mənə qiyamət gününə qədər möhlət versən, az bir qismi istisna olmaqla, onun soyunu öz buyruğum altına alacağam."

**63-65** Allah dedi ki: "Get! Sonra onlardan kim sənə uyarsa, bilin ki, şübhəsiz ki, cəzanız yetərli bir cəza olaraq cəhənnəmdir. Onlardan gücünün çatdığı kimsələri səsinlə silkələ (yerindən oynat). Və atlılarınla və piyadalarınla onların üzərinə fəryad qopar! Mallarına və övladlarına ortaq ol![193] Və onlara vədlər ver. *–Və şeytan, onlara aldatmaqdan başqa bir şey vəd etməz.–* Şübhəsiz ki, Mənim qullarım (ki var), sənin onlar əleyhində heç bir gücün yoxdur." *–Bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən olaraq da Rəbbin yetər.–*

**66** Sizin Rəbbiniz, Öz nemətlərindən haqqınız olanları axtarasınız deyə, sizin üçün dənizdə gəmiləri üzdürən Zatdır. Şübhəsiz ki, O, sizə çox mərhəmətlidir.

**67** Və dənizdə sizə bir zərər toxunduğunda, o yalvardığınız kəslər yox olub gedərlər, O, yox olmaz. Sonra O, sizi quruya çıxardaraq xilas edincə, üz çevirərsiniz. Və insan, çox yaxşılıq bilməyən biridir (nankordur)!

**68** Onun sizi quruda yerin dibinə batırmasından, yaxud üzərinizə bir qasırğa göndərməsindən güvəndəsinizmi? Sonra özünüzə varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən birini də tapa bilməzsiniz.

**69** Ya da sizi təkrar dənizə döndərib və üzərinizə qasırğalar göndərməsindən və beləcə etdiyiniz nankorluq səbəbiylə sizi boğmasından güvəndəsinizmi? Sonra bu etdiyimizə qarşı, Bizim əleyhimizə sizə yardım edəcək bir qoruyucu da tapa bilməzsiniz.

**70** Və and olsun ki, Biz insan övladını şan və şərəf sahibi etdik və quruda, dənizdə nəqliyyat vasitələrinə mindirdik və təmiz-xoş yeməklərdən onları ruziləndirdik. Və onları, yaratdıqlarımızın bir çoxundan olduqca üstün etdik.

**71** O gün Biz, bütün insanları öndərləriylə çağıracağıq. O gün, kimin kitabı sağ əlinə verilərsə, onlar öz kitablarını oxuyacaqlar və onlar qəndil fitili / çəyirdəyin teli qədər belə haqsızlığa məruz qalmayacaqlar.

**72** Hər kim bu dünyada kor isə, bax o, axirətdə də kordur. Və yolunu daha çox azmışdır. (50/17, İsra / 61-72)

## Nəcm: 166

**73** Az qalsın onlar səni, sənə vəhy etdiyimizdən uzaqlaşdıraraq, ondan başqasını Bizə isnad edərək söyləyəsən deyə sənə səhv elətdirib səni atəşdə yandıracaqdılar. Bax, o təqdirdə səni özlərinə xəlil (dost) / iz qoyan bir öndər qəbul edərdilər.

**74** Və əgər Biz, səni sağlamlaşdırmamış olsaydıq, həqiqətən onlara bir azca meyl edəcəkdin.

**75** Elə olsa, sənə həyatın iki qatını və ölümün iki qatını daddırardıq. Sonra Bizə qarşı özünə heç bir yardımçı da tapa bilməzdin.

**76,77** Və tezliklə səni bu yerdən / yurdundan çıxartmaq üçün mütləq narahat edəcəklər. O təqdirdə, səndən öncə elçilərimizdən göndərdiyimiz kəslər haqqındakı qanunumuza / prinsipimizə görə, səndən sonra onlar da çox az qalacaqlar. *–Bizim qayda-qanunumuzda hər hansısa bir dəyişiklik görə bilməzsən.–*

**78** Günəşin batmasından / itməsindən gecənin qaranlığının düşməsinə qədər səlatı iqamə et [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətir və ayaqda tut] və səhər də öyrənmə-öyrətmə işini həyata keçir.[194] Çünki səhərlər öyrənmə-öyrətmə işi görülməli işdir.

**79** Və gecələr də. Bundan başqa, sənə xas bir əlavə olaraq sən, gecələr oyanıb səlatı tətbiq et! Ümid edilir ki, Rəbbin, səni gözəl bir məqama çatdırsın.

**80** Və de ki: “Ey Rəbbim! Məni, doğruluq girişiylə daxil et və doğruluq çıxışıyla çıxart. Və mənə qatından yardımçı bir qüvvə ver.”

**81** Və de ki: “Haqq gəldi, batil yox oldu. Şübhəsiz ki, batil yox olub gedər.” (50/17, İsra / 73-81)

## Nəcm: 167

82 Və Biz Qurandan, möminlər üçün şəfa və rəhmət olan şeyləri nazil edirik. Və bu, sadəcə şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin ziyanını artırır.

83 Və Biz insana nemət verdiyimiz zaman üz çevirib uzaqlaşar. Ona sıxıntı üz verdikdə isə ümidsizliyə düşər.

84 De ki: "Hər kəs olduğu hal üzrə iş görər. Belə olduqda, Rəbbin kimin ən doğru yolda olduğunu daha yaxşı biləndir."

85 Və sənə vəhy[195] haqqında sual verirlər. De ki: "Vəhy, Rəbbimin işindəndir. Sizə isə az məlumatdan başqa bir şey verilməmişdir."

86 Və and olsun ki, istəsək, sənə vəhy etdiyimizi ortadan qaldırarıq; sonra Bizə qarşı, özünə varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən birini tapa bilməzsən.

87 Rəbbindən bir rəhmət olaraq Biz bunu etmədik. Həqiqətən, Onun sənin üzərindəki nemətləri çox böyükdür.

88 De ki: "And olsun ki, bu günün, sabahın bütün insanları, bu Quranın bir bənzərini gətirmək üçün bir yerə yığışsalar, bir-birlərinə yardımçı da olsalar, onun bənzərini qətiyyən gətirə bilməzlər."

89 Və and olsun ki, Biz bu Quranda insanlar üçün hər örnəkdən təfsilatlı olaraq vermişik. Yenə də insanların çoxu həqiqəti basdırmaqdan başqa bir iş görmədilər / inkarda israr etdilər.

90-93 Və belə dedilər: "Bizim üçün yerdən bir bulaq fışqırtmadıqca sənə qətiyyən inanmayacağıq. Yaxud sənin xurmalardan, üzümlərdən ibarət bir bağçan olmalıdır. Onların aralarından şırıl-şırıl çaylar axıtmalısan. Yaxud, iddia etdiyin kimi, göyü parça-parça üzərimizə salmalısan, yaxud Allahı və mələkləri qarşımıza gətirməlisən. Yaxud sənin qızılla bəzənmiş bir evin olmalıdır, yaxud göyə yüksəlməlisən. Ancaq, sənin [göyə] yüksəlişinə, öyrənib və öyrədəcəyimiz bir kitabı bizə endirməsən, qətiyyən inanmarıq." Sən de ki: "Rəbbim nöqsanlıqlardan pakdır. Mən, bəşər bir elçidən başqa bir şeyəm ki?!"

94 Və insanlara yol göstərən / Quran gəldikdə, onların iman etmələrinə, sadəcə "Allah bir bəşərimi elçi göndərdi?" demələri əngəl olur.

95 De ki: "Əgər yer üzündə arxayın gəzib dolaşan mələklər olsaydı, əlbəttə Biz onlara göydən elçi olaraq bir mələk endirərdik."

96 De ki: "Mənimlə sizin aranızda şahid olaraq Allah yetər. Şübhəsiz ki, O, qullarına qarşı hər şeyin iç üzünü, gizli tərəflərini yaxşı biləndir, ən yaxşı görəndir.

**97,98** Və Allah kimə yol göstərərsə, bax o, doğru yolu tapmışdır. Kimi də azdırarsa, artıq bunlar üçün Allahın altındakılardan heç bir yardımçı, himayəçi, yol göstərən yaxın kimsə tapa bilməzsən. Və Biz, onları qiyamət günü, kor, lal və kar olduqları halda üzləri üstə toplayacağıq. Onların gedəcəkləri yer Cəhənnəmdir. Cəhənnəm səngiyəndə, onların atəşini artırarıq. Bax bu, onların ayələrimizi / əlamətlərimizi / işarətlərimizi ört-basdır etmələri və "Bizlər, bir yığın sümük və ovxalanmış toz olduğumuz zamanmı, yeni bir yaradılışla həqiqətən dirildilmiş olacağıq?" demələri səbəbiylə onların cəzasıdır.

**99** Onlar, göyləri və yeri yaradan Allahın, onların eynisi olan insanları yaratmağa da qadir olduğunu və onlar üçün şübhə edilməyən bir vaxt sonu müəyyən etdiyini də görmədilərmi? Bax, bu şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər, həqiqəti gizlətməkdən başqa bir şeydən çəkindilər / ancaq həqiqətləri örtməyə yönəldilər.

**100** De ki: "Əgər siz Rəbbimin rəhmət xəzinələrinə sahib olsaydınız, xərclənib tükənməsindən qorxaraq həqiqətən əlinizdə saxlayar; kimsəyə bir şey verməzdiniz. Və insan çox xəsisdir." (50/17, İsra / 82-100)

## Nəcm: 168

**101** Və and olsun, Biz Musaya açıq-aşkar doqquz; bir çox ayə [əlamət / işarət][196] verdik. *–Buyur, İsrail oğullarından soruş.–* Bir zaman Musa, onlara gəldi və Firon ona: "Ey Musa! Mən sənin ovsunlanmış olduğunu həqiqətən bilirəm" demişdi.

**102** Musa dedi ki: "Sən həqiqətən bildin ki, ayələri, bir ibrət olmaq üzrə, ancaq göylərin və yerin Rəbbi nazil etdi. Və mən də sənin məhvə məruz qalacağına həqiqətən inanıram."

**103** Belə olduqda, Firon Musanı və İsrail oğullarını Misirdən sürgün etmək istədi, Biz onu və bərabərindəkilərin hamısını suda boğduq.

**104** Və ondan sonra Biz İsrail oğullarına: "Bu torpaqlarda siz sakin olun! Sonra axirətə dair verilən söz gəldiyi vaxt, sizi toplayıb bir yerə gətirəcəyik" dedik. (50/17, İsra / 101-104)

## Nəcm: 169

**105** Və Biz Quranı yalnız haqq ilə nazil etdik, o da yalnız haqq ilə nazil oldu. Və Biz səni yalnız müjdə verən və xəbərdarlıq edən elçi etdik.

**106** Və Quranı, Biz onu insanlara gözləntilərə görə öyrənib öyrədəsən deyə, parça-parça ayırdıq və Biz onu endirdikcə endirdik!

**107,108** De ki: "Siz Qurana istər inanın, istər inanmayın; daha öncə

özlərinə bilik verilənlər, Quran onlara oxunduğunda onlar, boyun əyib təslimiyyət göstərərək çənələri üstə (yerə) qapanarlar. Və 'Rəbbimiz hər cür qüsurdan pakdır. Rəbbimizin vədi mütləq gerçəkləşəcəkdir' deyərlər."

109 Və onlar, ağlayaraq çənələri üstə (yerə) qapanarlar. Və Quran, onların ehtiramını, təvazökarlığını artırar.

110 De ki: "Allah deyə çağırın və yaxud Rəhman deyə çağırın. Necə çağırırsınızsa çağırın, ən gözəl isimlər Onundur. Səlatı [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmək işini] açıq şəkildə etmə, gizli də etmə. Və bu ikisinin arasında bir yol axtar."

111 Və de ki: "Bütün təriflər, heç bir övlad götürməyən, sahiblik və yönətimdə (rəhbərlikdə) Özünün hər hansısa bir ortağı olmayan, zəiflik səbəbindən yardımçısı (köməkçiyə ehtiyacı) olmayan Allaha məxsusdur; başqası təriflənməz." Və Allahı ucaltdıqca ucalt!

(50/17, İsra / 105-111)

## YUNUS (51 – 10) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 170

1 Əlif / 1, Lam / 30, Ra / 200.[197] Bax bunlar, o qanunlar ehtiva edən kitabın ayələridir.

2 İnsanları xəbərdar et və iman edənlərə Rəbləri nəzdində (yanında) həqiqətən "qədəmə sidq [xoş gəlişlər, xoşbəxt həyatlar]"[198] olduğunu müjdələyəsən deyə, onların öz aralarından yetkin bir adama vəhy etməyimiz onlara qəribəmi gəldi? Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr], "Heç şübhəsiz bu elçi / bu kitab, şübhəsiz, açıq-aşkar büyüləyici (təsirli) sözlər söyləyən bir alimdir / göz boyayan təsirli məlumatlardır" dedilər. (51/10, Yunus / 1-2)

### Nəcm: 171

3 Şübhəsiz, sizin Rəbbiniz göyləri və yeri altı mərhələdə yaradan, sonra ən böyük taxt üzərində hökmranlıq quran,[199] hər işi idarə edən Allahdır. Dünyada yardım edəcək, dəstək olacaq adam, ancaq Onun izni̇ndən / biliyindən sonra yardım edə bilər. Bax bu, Rəbbiniz olan Allahdır. O halda, Ona qulluq edin! Hələ də düşünüb ibrət almayacaqsınız?

4 Hamınızın dönüşü sadəcə Onadır. Allah, bunu haqq olaraq vəd etmişdir. Şübhəsiz O, insanları ilk öncə yaradır, sonra iman edən və sahmana salmaq qayəsi ilə əməl işləyən kimsələri nəsibləri / haqları olan payları ilə qarşılıq vermək üçün geri döndərir. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr], küfrləri [Allahın

ilah və rəbb olduğunu bilərək rədd etmələri] səbəbiylə, qaynar sudan bir içki və ağrılı-acılı əzab onlar üçündür.
5 O, günəşi bir aydınlıq, ayı bir işıq edən və illərin sayını və hesabını biləsiniz deyə, aya mənzillər müəyyən edəndir. Allah bunu ancaq haqq ilə yaratmışdır. O, bilən bir camaat üçün ayələri müfəssəl olaraq açıqlayar.
6 Şübhəsiz, gecə ilə gündüzün bir-birinin ardınca gəlməsində, Allahın göylərdə və yerdə yaratdığı şeylərdə, Allahın mühafizəsi altına daxil olan bir camaat üçün neçə əlamətlər / işarətlər vardır. (51/10, Yunus / 3-6)

## Nəcm: 172
7,8 Bizə qovuşmağı ümid etməyən, dünya həyatına razı olan, onunla rahatlıq tapan bu kimsələr və özləri Bizim ayələrimizə / əlamətlərimizə / işarətlərimizə qarşı laqeyd olan, qafil olan kimsələr; bax bunlar, öz əlləri ilə etdikləri əməllərə görə gedəcəkləri yer atəşdir.
9 Heç şübhəsiz, iman edən və sahmana salmaq qayəsi ilə əməl işləyən bu kimsələr; imanlarına görə Rəbləri onlara yol göstərən olar. Bol nemətli cənnətlərində onların altlarından çaylar axar.
10 Onların oradakı duaları belədir: "Allahım! Sən hər cür əskiklikdən (nöqsanlıqdan) paksan!" Və onların oradakı salamlaşmaları belədir: "Salam" [sağlıq, rifah, xoşbəxtlik]! Dualarının axırı da belədir: "Bütün təriflər, aləmlərin Rəbbi Allaha məxsusdur!" (51/10, Yunus / 7-10)

## Nəcm: 173
11 Və əgər Allah insanlara, onların xeyri tələm-tələsik istədikləri kimi, pisliyi tələsik versəydi, onlara, həqiqətən öz möhlətlərinin sonunu gerçəkləşdirərdi. Fəqət Biz, Bizə qovuşmağı ümid etməyənləri azğınlıqları içində çaşbaş vəziyyətdə tərk edərik.
12 Və insana sıxıntı üz verdikdə uzananda da, oturanda da, ayaq üstündə olanda da Bizə həqiqətən yalvarır. Elə ki, ondan sıxıntısını götürdük, (sonra o,) sanki ona toxunan o sıxıntı üçün Bizə heç yalvarmayıbmış kimi saymazyana keçib gedər. Həddi aşanlara etdikləri şeylər, bax bu cür süslənmişdir.
13 Və and olsun ki, sizdən öncəki nəsilləri, şirk qoşaraq, küfr edərək yanlış etdikləri zaman dəyişikliyə / məhvə məruz qoyduq. Və onların elçiləri açıq sübutlarla gəlmişdilər. Onsuz da onlar inanmayacaqlar. Bax, günahkar qövmləri Biz bu cür cəzalandırırıq.
14 Sonra necə əməl edəcəyinizə baxmaq üçün, onlardan sonra sizi yer üzündə onların yerinə gətirdik.
15 Və ayələrimiz onlara açıq-aşkar oxunduğu zaman, Bizə qovuşmağı ümid etməyənlər: "Bundan başqa bir Quran gətir və ya bunu dəyişdir!"

dedilər. De ki: "Onu öz düşüncəmlə dəyişdirmək mənim üçün mümkün ola bilməz. Mən, sadəcə mənə vəhy olunana tabe oluram. Rəbbimə asi olsam, həqiqətən böyük bir günün əzabından qorxuram."
**16** De ki: "Allah istəsəydi, mən Quranı sizə oxumazdım və Allah, Quranı sizə bildirməmiş olardı. Mən də Qurandan öncə həqiqətən içinizdə bir ömür yaşamışdım. Hələ də ağlınızı işlətməyəcəksiniz?"
**17** Elə isə, Allahın əleyhinə bir yalanı uyduran və ya Onun ayələrini / əlamətlərini / işarətlərini yalanlayan kəsdən daha səhv; öz zərərinə olan əməli işləyən kim ola bilər? Heç şübhəsiz ki, bu günahkarlar qurtuluşa yetişməzlər.
**18** Onlar, Allahın altındakılardan, özlərinə zərər verməyən və özlərinə faydası olmayan şeylərə ibadət edirlər və: "Bunlar Allah qatında bizim yardımçılarımız / dəstəkçilərimizdir" deyirlər. De ki: "Siz Allaha göylərdə və yerdə Özünün bilmədiyi bir şeyimi xəbər verirsiniz?" Allah onların ortaq qoşduqları şeylərin hamısından pakdır və çox ucadır.
**19** Və insanlar, vahid bir ümmət idilər, sonra ixtilafa düşdülər və əgər Rəbbindən bir Söz[200] verilməmiş olsaydı, ixtilaf edib durduqları şeylər haqqında aralarında hökm mütləq verilmişdi.
**20** Və onlar: "Ona Rəbbindən bir əlamət / işarət endiriləydi də!" deyirlər. "Görülməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi bilmək həqiqətən Allaha aiddir. Haydı, gözləyin. Şübhəsiz ki, mən də sizinlə birlikdə gözləyənlərdənəm" de!
**21** Və insanlara toxunan bir sıxıntıdan sonra onlara bir rəhmət daddırdığımız zaman, ayələrimiz / əlamətlərimiz / işarətlərimiz haqqında onların bir planı vardır. De ki: "Plan baxımından Allah daha çevikdir." Şübhəsiz ki, elçilərimiz planladığınız şeyləri yazırlar.
(51/10, Yunus / 11-21)

## Nəcm: 174

**22** Allah, sizi quruda və dənizdə gəzdirəndir. Gəmilərə mindiyiniz vaxt, gəmilər öz içindəkiləri xoş bir külək vasitəsilə aparar. Sərnişinlər sevindikləri vaxt, şiddətli bir fırtına gəlib çatar, dalğalar hər tərəfdən gələr. Və onlar, hər tərəfdən mühasirəyə alındıqlarını anlayınca, dini Allah üçün pak tutanlar olaraq Ona yalvararlar: "Bizi bundan xilas etsən, heç şübhəsiz, qarşılığını ödəyənlərdən olarıq."
**23** Sonra elə ki, Biz onları oradan xilas etdik, xilas olan kimi yer üzündə haqsız yerə azğınlıqlar edərlər. *–Ey insanlar, azğınlığınız, bu bəsit dünya həyatının bir qazancı olaraq sırf sizin öz zərərinizədir. Sonra isə dönüşünüz sadəcə Bizədir. Sonra Biz, etmiş olduqlarınızı sizə xəbər verəcəyik.–* (51/10, Yunus / 22-23)

**Nəcm: 175**

24 Dünya həyatının örnəyi, Bizim göydən endirdiyimiz su kimidir. Göydən endirdiyimiz su ilə insanların və heyvanların yediyi bitkilər bir-birinə qarışmışdır. Sonunda, yer üzü süslərini taxıb süsləndiyi, sahibləri də özlərinin buna müqtədir olduqlarına inandıqları bir vaxtda, bəzən gecə bəzən də gündüz vaxtı, ona əmrimiz gəlib çatmışdır və qəflətən, sanki dünən orada heç bir şənlik yox imiş kimi, onu, kökündən biçmişdir. Biz, ayələrimizi, düşünən bir camaat üçün bax belə ətraflı olaraq izah edirik.
25 Və Allah salamatlıq [əmin-amanlıq, təhlükəsizlik, xoşbəxtlik] yurduna çağırır və O, dilədiyi / diləyən kimsəyə doğru yolu göstərər.
26 Gözəl işlər görən kəslər üçün daha gözəli və artığı vardır. Üzlərinə qara bulaşmaz, alçaqlığa, alçaldılmağa da (məruz qalmazlar). Bax bunlar, cənnət əhlidirlər. Onlar orada sonsuz olaraq qalacaqlar.
27 Pislik qazanan kimsələr də, pisliyin cəzası, bir bənzəri ilədir. Və onları bir zillət bürüyəcək. Onlar üçün Allahdan, heç bir himayəçi yoxdur. Sanki onların üzləri qaranlıq gecələrdən bir parçaya bürünmüş kimidir. Bax onlar atəş əhlidir. Onlar orada sonsuzadək qalacaqlar.
28,29 Və hamısını bir yerə toplayacağımız, sonra da o ortaq qoşanlar üçün: “Yerlərinizə (keçin)! Siz və ortaqlarınız!” deyəcəyimiz gün, artıq həqiqətən aralarını yaxşıca açacağıq və onların ortaqları: “Siz yalnız bizə ibadət etmirdiniz ki! İndi bizim aramızda və sizin aranızda şahid olaraq Allah yetər. Biz sizin qulluğunuzdan həqiqətən xəbərsizdik / hiss etmirdik” deyəcəklər.
30 Onlar, bax burada / o zaman hər kəs nə göndərdisə, onun imtahanını verəcək. Və həqiqətən gerçək mövlaları olan Allaha döndəriləcəklər. İftira edib uydurduqları şeylər də həqiqətən onlardan uzaqlaşıb qeyb olacaqlar.
31,32 De ki: “Sizi göydən və yer üzündən kim ruziləndirir? Ya da qulaqlara və gözlərə kim sahib olur, bunların sahibi kimdir? Və ölüdən dirini, diridən ölünü çıxardan kimdir? Və işləri kim düzüb qoşur? Dərhal “Allah” deyəcəklər. O zaman de ki: “O halda, hələ də Allahın mühafizəsi altına daxil olmayacaqsınızmı? Elə isə, bax O, sizin həqiqi Rəbbiniz olan Allahdır. Artıq, həqiqətdən sonra azğınlıqdan başqa nə ola bilər! O halda, necə döndərilirsiniz?”
33 Haqq yoldan çıxan kəslər üçün Rəbbinin sözü[201] gerçəkləşmişdir: Şübhəsiz ki, onlar imana gəlməzlər.
34 De ki: “Ortaqlarınızdan, öncə yaradıb, sonra da onu çevirib yenidən geri gətirəcək / dirildəcək kimdir?” De ki: “Allah öncə yaradar, sonra da onu geri qaytarar. O halda, necə döndərilirsiniz?”
35 De ki: “Ortaqlarınızdan doğru yolu göstərəcək olan kimdir?” De ki:

“Allah, haqq olan doğru yolu göstərir. O halda, kim doğru yolu göstərir? O halda doğru yolu göstərənmi tabe olunmağa daha çox layiqdir, yoxsa özünə yol göstərilməyincə onu tapa bilməyən kəs? O halda, sizə nə olur? Necə hökm edirsiniz?”
36 Və onların çoxu ancaq bir zənnə uyarlar. Şübhəsiz ki, zənn “haqq”dan heç bir şey qazandırmaz. Şübhəsiz ki, Allah onların etdiklərini çox yaxşı bilir. (51/10, Yunus / 24-36)

## Nəcm: 176
37 Və bu Quran, Allahın altındakılar tərəfindən uydurulan deyil. Ancaq içindəkilərin təsdiqlənməsi və Tövratın müfəssəl olaraq açıqlanmasıdır. Onda şübhə ediləcək heç bir şey yoxdur. Aləmlərin Rəbbindəndir.
38 Yaxud: “Onu özü uydurdu!” deyirlər. De ki: “Elə isə siz (buna) bənzər bir surə meydana gətirin, Allahın altındakılardan çağıra bildiklərinizi də çağırın. Əgər doğru kimsələrsinizsə.”
39 Əksinə, onlar biliyini qavraya bilmədikləri və ilk olaraq ortaya çıxması onlara hələ gəlməmiş olan bir şeyi yalanladılar. Bunlardan öncəkilər də bu cür yalanlamışdılar. Bax gör, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin aqibəti necə olmuşdur.
40 Onlardan Qurana iman edənlər də var, iman etməyənlər də var. Və sənin Rəbbin fəsad törədənləri ən yaxşı biləndir.
41 Və əgər səni yalanladılarsa, dərhal de ki: “Mənim əməlim mənə, sizin əməliniz də sizə aiddir. Mənim etdiklərimdən siz uzaqsınız, mən də sizin etdiklərinizdən uzağam.”
42 Və onlardan sənə qulaq asan kimsələr var. Onlar ağlını işlətmirlərsə, karlara sənmi eşitdirəcəksən?
43 Onlardan sənə baxanlar da var. Fəqət korlara, onlar görməyəndən sonra, sənmi yol göstərəcəksən?
44 Şübhəsiz ki, Allah, insanlara heç bir surətdə və heç bir yolla haqsızlıq etməz. Lakin insanlar öz-özlərinə səhvlər; öz zərərlərinə olan əməli işləyərək özlərinə haqsızlıq edirlər.
45 Və insanlar, Allahın, onları toplayacağı gündə, sanki onlar sadəcə gündüzün bir saatı qədər qalmış kimi, bir-birlərini tanıyacaqlar. Allaha qovuşmağı yalanlayan kəslər, göstərilən doğru yoldan getmədikləri üçün həqiqətən ziyana uğramışlar.
46 Və Biz onlara vəd etdiyimizin bir qismini sənə göstərsək, yaxud səni vəfat etdirsək; keçmişdə etdiklərini, etməli olduğun halda etmədiklərini bir-bir xatırlatsaq da, axırda onların dönüşü yalnızca Bizə olacaq. Sonra Allah onların nə edəcəklərinə şahiddir.
47 Və başçısı olan hər camaat üçün elçi olacaqdır. O elçiləri

gəldiyində də, aralarında ədalət bərqərar edilmişdir. Və onlara haqsızlıq edilməz.

**48** Və onlar: "Əgər doğru kəslərsinizsə, bu vəd nə zamandır?" deyirlər.

**49** De ki: "Mən, Allahın istəyinin xaricində özüm üçün bir zərər və bir fayda verməyə gücüm çatmaz." Başçısı olan hər camaat üçün bir möhlət vardır. Onların möhlətlərinin axırı gəldikdə, artıq nə bir an təxirə sala bilərlər, nə də tezləşdirə bilərlər.

**50** De ki: "Heç düşündünüzmü? Onun əzabı sizə gecə vaxtı yuxuda və ya gündüz vaxtı gələcək olsa!" Günahkarlar bundan nəyi tələsik istəyirlər?

**51** Bu əzab gəldikdən sonramı ona iman edəcəksiniz, yoxsa indimi? Halbuki siz onun tez olmasını istəyirdiniz.

**52** Sonra o şirk qoşaraq, inkar edərək səhv; öz zərərinə olan əməli işləyənlərə: "Dadın bu sonsuzluğun əzabını!" deyiləcəkdir. *–Məgər qazandığınız şeylərdən başqasıylamı cəzalandırılacaqsınız?–*

**53** Və "O əzab gerçəkdirmi?" deyə səndən xəbər almaq istəyirlər. De ki: "Bəli. Rəbbimə and olsun ki, o, şübhəsiz ki, bir həqiqətdir. Və siz, aciz qoya bilməyəcəksiniz."

**54** Və əgər şirk qoşmaq surətiylə səhv; öz zərərlərinə olan əməli işləyən hər kəs, yer üzündə olan hər şeyə sahib olsaydı, onu fəda edərdi / qurtulmaq üçün verərdi. Və onlar, əzabı gördükdə peşmançılıq hiss edərdi. Və aralarında ədalət həqiqətən bərqərar olacaqdır. Və onlar, haqsızlığa uğramayacaqlar. (51/10, Yunus / 37-54)

## Nəcm: 177

**55** Xəbəriniz olsun! Həqiqətən, göylərdə və yerdə olan şeylər Allah üçündür. Xəbəriniz olsun! Şübhəsiz ki, Allahın vədi gerçəkdir. Lakin onların çoxu bilmirlər.

**56** Allah, həyat verir və öldürür. Və siz, yalnızca Ona döndəriləcəksiniz. (51/10, Yunus / 55-56)

## Nəcm: 178

**57** Ey insanlar! Sizə Rəbbinizdən bir öyüd, kökslərdəkinə şəfa, iman edənlərə bir yol göstərən və bir rəhmət gəlmişdir.

**58** De ki: "Bunlar, Allahın ehsanı və rəhmətiylədir. Bax, yalnızca bunlarla sevinsinlər. Bu, onların yığdıqlarından daha xeyirlidir."

**59** De ki: "Gördünüzmü / heç düşündünüzmü? Allah sizin üçün nə qədər ruzi endirdi, siz onlardan bir qismini haram və halal etdiniz." De ki: "Allahmı izin verdi sizə, yoxsa siz Allah adına yalan uydurursunuz?"

**60** Və Allaha, yalanı iftira atanların, qiyamət gününə dair fikirləri, inancları nədir? Şübhəsiz, Allah insanlara lütf edəndir, lakin onların çoxu qarşılığını ödəmirlər.
**61** Və sən, nə iş görürsən gör, Qurandan onun haqqında nə oxuyursan oxu və siz hansı işlə məşğul olursunuzsa olun, unutmayın ki, siz ona daldığınız vaxt, Biz, sizin üzərinizdə şahidik. Yerdə və göydə zərrə ağırlığında heç bir şey Rəbbinizdən uzaq qalmaz. Və bundan kiçiyi və daha böyüyü də ancaq açıq-aşkar bir kitabdadır. (51/10, Yunus / 57-61)

## Nəcm: 179

**62,63** Açın gözünüzü! Allahın yaxınlarına, yardımçılarına *–ki, onlar inanan və Allahın mühafizəsi altına daxil olan kəslərdir–* qətiyyən qorxu yoxdur. Onlar üzülməyəcəklər də.
**64** Onlara dünya həyatında və axirət həyatında müjdə var. Allahın sözləri üçün dəyişiklik deyə bir şey yoxdur. Bax bu, ən böyük qurtuluşun elə özüdür.
**65** Və onların sözü səni üzməsin. Həqiqətən hakimiyyət, şan və şərəf tamamilə Allaha məxsusdur. O, ən yaxşı eşidən, ən yaxşı biləndir.
**66** Gözünüzü açın! Göylərdə olan kimsələr və yer üzündə olan kimsələr həqiqətən Allahındır. Və Allahın altındakılardan bir şey istəyən kimsələr, (Allaha) tay tutduqlarına tabe olmurlar. Onlar sadəcə zənnə uyurlar və onlar sadəcə yalan söyləyirlər.
**67** Allah, dincələsiniz deyə gecəni, görəsiniz [araşdırıb məna əldə edəsiniz] deyə də gündüzü var edəndir. Şübhəsiz ki, bunda qulaq asan bir camaat üçün əlamətlər / işarətlər vardır. (51/10, Yunus / 62-67)

## Nəcm: 180

**68** Dediler ki: “Allah, övlad götürdü.” O, bundan pakdır. O, zəngindir / heç bir şeyə möhtac deyildir. Göylərdə və yerdə olan şeylər Onundur. Buna dair yanınızda heç bir dəlil yoxdur. Allaha qarşı bilməyəcəyiniz bir şeyimi söyləyirsiniz?
**69** De ki: “Allaha yalan uyduran bu kimsələr qətiyyən qurtula bilməzlər.”
**70** O şeylər, dünyada bir mənfəətdir. Sonra dönüşləri yalnızca Bizədir. Daha sonra da küfr etdikləri; bilərək rədd edib qəbul etmədikləri şeylər səbəbiylə onlara o çətin əzabı daddıracağıq. (51/10, Yunus / 68-70)

## Nəcm: 181

**71,72** Bir də onlara Nuhun önəmli xəbərlərini oxu: Bir vaxt o, öz qövmünə demişdi: *“Ey qövmüm! Əgər mənim mövqeyim; mənə tapşırılan vəzifə, sizə qarşı çıxmağım və Allahın ayələri ilə öyüd*

*verməyim sizə ağır gəlirsə, bunu bilin ki, mən, işin nəticəsini yalnızca
Allaha buraxmışam. Artıq siz və ortaqlarınız hər nə edəcəksinizsə,
toplanıb bütün gücünüzlə qərar verin. Sonra bu işiniz sizə dərd
olmasın. Sonra mənə istədiyinizi edin, mənə möhlət də verməyin.
Sonra da əgər üz çevirərsəniz; onsuz da mən sizdən heç bir muzd
istəmədim! Mənim muzdum sadəcə Allahın üzərinədir. Və mən
müsəlmanlardan olmaqla əmr olundum."*
**73** Buna rağmən, yenə də onu yalanladılar. Biz də onu və gəmidə
onunla bərabər olanları xilas etdik. Və onları gedənlərin yerinə
gətirdik. Ayələrimizi [əlamətlərimizi / işarətlərimizi] yalanlayanları da
suda boğduq. Xəbərdarlıq edilən o kəslərin aqibətinin necə olduğuna
bir bax.
**74** Sonra onun ardından, öz qövmlərinə elçilər göndərdik və onlar
(elçilər), onlara (öz qövmlərinə) açıq-aydın dəlillər gətirdilər. Amma
daha öncə onu [dəlilləri] yalanlamaları səbəbiylə inanmadılar. Biz,
həddi aşanların qəlblərini bax belə damğalayırıq / möhürləyirik.

***

**75** Sonra bunların ardınca Musa və Harunu ayələrimizlə /
əlamətlərimizlə / işarətlərimizlə Firona və əyanlarına göndərdik. Lakin
onlar təkəbbür göstərdilər və günahkar bir camaat oldular.
**76** Onlara tərəfimizdən həqiqət gəlincə: "Heç şübhəsiz ki, bu,
həqiqətən açıq-aşkar bir sehrdir!" dedilər.
**77** Musa dedi ki: "Haqq sizə gəldikdə, siz onun haqqında "Bu, bir
sehrli (büyülü) sözdürmü?" deyirsiniz? Halbuki sehirli (büyülü) söz
söyləyənlər, umduqlarını əldə edə bilməzlər."
**78** Onlar dedilər: "Sən atalarımızı üzərində gördüyümüz şeydən bizi
döndərəsən və yer üzündə səltənət ikinizin olsun deyəmi bizə gəldin?
Biz ikinizə də inanmayacağıq."
**79** Və Firon: "Ən bilikli, təsirli söz söyləyən alimlərin hamısını
yanıma gətirin!" dedi.
**80** Nəhayət təsirli söz söyləyən alimlər gəlincə, Musa onlara: "Nə
atacaqsınızsa, atın!" dedi.
**81,82** Onlar ortaya atınca da, Musa dedi: "Sizin gətirdiyiniz şey bir
göz boyama / aldatmaqdır. Şübhəsiz ki, Allah onun boş və əsassız
olduğunu ortaya çıxaracaqdır. Şübhə yoxdur ki, Allah fəsadçıların işini
düzəltməz. Və Allah, günahkarların xoşuna gəlməsə də, haqqı, Öz
kəlmələri ilə ortaya qoyub gerçəkləşdirər" dedi.
**83** Sonra Firon və adamları tərəfindən atəşə atılmaq qorxusundan,
Musaya qövmünün içindən, bir soydan (nəsildən) başqa heç kimsə
iman etmədi. Və şübhəsiz ki, Firon yer üzündə çox üstün idi və o,
həqiqətən həddi aşanlardan idi.

**84** Və Musa: “Ey qövmüm! Siz Allaha iman etdinizsə, yalnız Ona təslim olan müsəlmanlardan oldunuzsa, artıq nəticəni yalnız Ona buraxın!” dedi.
**85,86** Onlar da: “Biz işin nəticəsini Allaha buraxdıq. Ey Rəbbimiz! Bizi o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən tayfa üçün atəşə sürümə və bizi rəhmətinlə kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] topluluğundan qurtar!” dedilər.
**87** Və Biz Musa ilə qardaşına: “Camaatınız üçün Misirdə bəzi məktəblər hazırlayın və məktəblərinizi qiblə / hədəf edin və səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maariflәndirmə qurumları yaradın, onları ayaqda tutun] və möminlərə müjdə verin!” deyə vəhy etdik.
**88** Və Musa: “Ey Rəbbimiz! Şübhəsiz ki, Sən Firona və əyanlarına bəsit dünya həyatında zinət və mal-dövlət verdin. *–Rəbbimiz! Sənin yolundan azdırsınlar deyə!–* Rəbbimiz! Onların mallarını məhv et və qəlblərinə sıxıntı sal. Çünki onlar o ağrılı əzabı görmədikcə iman etməyəcəklər” dedi.
**89** Allah: “Hər ikinizin duası həqiqətən qəbul olundu. Elə isə ikiniz doğru yolda olmağa davam edin. Və bilməyən kəslərin yolunu əsla getməyin!” dedi.
**90-92** Və İsrail oğullarını bol sudan / çaydan keçirdik. Amma Firon və əsgərləri azğıncasına və düşməncəsinə onları dərhal təqib etdi. Sonunda boğulmaq (anı) ona gəlib çatdıqda: “Həqiqətən, İsrail oğullarının inandığı tanrıdan başqa tanrı olmadığına mən də inandım, mən də təslim olanlardanam” dedi. *–İndimi? Halbuki daha öncə üsyan etmişdin və fəsad törədənlərdən olmuşdun. Artıq Biz, səndən sonra gələcəklərə ibrət olasan deyə, bu gün səni zirehinlə birlikdə qurtaracağıq.–* Və şübhəsiz, insanlardan bir çoxu həqiqətən Bizim ayələrimizə / əlamətlərimizə / işarətlərimizə qarşı laqeyd / qafildirlər.
**93** Və and olsun, İsrail oğullarını çox gözəl bir yurdda sakin etdik və onlara xoş nemətlərdən ruzi verdik, onlara bilik (məlumat) gələnə qədər ixtilafa düşmədilər. Şübhəsiz ki, Rəbbin, o anlaşılmazlığa düşdükləri məsələlər barəsində qiyamət günü onların arasında hökm verəcəkdir. (51/10, Yunus / 71-93)

## Nəcm: 182

**94,95** Artıq, sənə nazil etdiyimiz şeylərin bir qisiminə dair qəti, yetərli məlumatın yox idisə, dərhal səndən öncə kitab öyrənib-öyrədən kimsələrdən soruş! And olsun ki, sənə Rəbbindən haqq gəlmişdir. O halda, əsla şübhə edənlərdən olma! Əsla Allahın ayələrini

yalanlayanlardan da olma, sonra ziyana / itkiyə uğrayıb əzab çəkənlərdən olarsan. (51/10, Yunus / 94-95)

## Nəcm: 183

**96,97** Şübhəsiz, əleyhlərində sənin Rəbbinin Sözü[202] haqq olan bu kimsələr, bütün əlamətlər / işarətlər hamısı birdən gəlsə, yenə də o ağrılı əzabı görənə qədər iman etməzlər.
**98** Nə olardı, iman edib və imanları özlərinə fayda vermiş bir şəhər olsaydı? Ancaq Yunusun qövmü ayrıdır. Onlar iman etdikləri vaxt, bəsit dünya həyatında o rəzillik əzabını onların üzərlərindən qaldırdıq və onları müəyyən bir vaxta qədər faydalandırdıq.
**99** Halbuki, Rəbbin istəsəydi, əlbəttə yer üzündə olanların hamısı toplu halda inanardı. Artıq, insanları inanan kimsələr olmaları üçün sənmi məcbur edəcəksən?
**100** Allahın izni / məlumatı olmadan heç kimsə iman edə bilməz. Və Allah, murdarlığı / əzabı ağlını işlətməyənlərin üzərinə buraxar.
**101** De ki: "Göylərdə və yerdə nə var, bir baxın!" *–Və iman etməyəcək bir topluluğa açıq-aşkar ayələr / əlamətlər / işarətlər və xəbərdarlıqlar bir şey etməz / xəbərdarlıqlar nə edər?–*
**102** Artıq onlar, sadəcə özlərindən öncə gəlib-getmiş olanların məruz qaldıqları günlərin eynisinimi gözləyirlər? De ki: "Gözləyin, mən də sizinlə bərabər gözləyənlərdənəm."
**103** Sonra Biz, elçilərimizi və iman edənləri qurtararıq. Bax belə! Möminləri qurtarmaq üzərimizə düşən bir vəzifədir.
**104-106** De ki: "Ey insanlar! Əgər mənim dinimin nə olduğunu qəti və tam olaraq bilmirdinizsə, yaxşı bilin ki, Allahın altındakılardan sizin ibadət etdiklərinizə mən ibadət etmərəm. Ancaq sizin canınızı alacaq Olana / Allaha ibadət edərəm. Və mən möminlərdən olmamla bərabər: "Bütün mənliyini, ortaq qoşmaqdan [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməkdən] Haqqa dönən biri olaraq Dinə tərəf döndər və əsla ortaq qoşanlardan (müşriklərdən) olma! Və Allahın altındakılardan sənə fayda verməyən, zərər də verə bilməyən şeylərə yalvarma! Buna baxmayaraq, əgər belə etsən, o zaman heç şübhəsiz, sən şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələrdən olarsan." deyə əmr olundum.
**107** Və əgər Allah sənə bir zərər vermək istəsə, onu Ondan başqa heç kəs aradan qaldıra bilməz. Və əgər sənin üçün bir xeyir diləsə, o zaman da Onun verdiklərini geri qaytara bilən biri yoxdur. O, nemətlərini öz qullarından istədiyinə bəxş edər. Və Allah, çox bağışlayandır, çox mərhəmətlidir.
**108** De ki: "Ey insanlar! Rəbbinizdən, əlbəttə, sizə haqq gəlmişdir.

Artıq göstərilən doğru yola girən, ancaq özü üçün girmişdir və gerçəkdən, (doğru yoldan) çıxan da, öz zərərinə yoldan çıxmışdır. Və mən, sizin üzərinizə sizi ayaqda tutan (dəstəkləyən); sizə cavabdeh biri deyiləm (sizin üçün məsuliyyət daşıyan biri deyiləm)."

**109** Və sən, sənə vəhy olunan şeyə tabe ol! Və Allah Öz hökmünü verənə qədər səbr et. Və Allah, hökm verənlərin ən xeyirlisidir.

(51/10, Yunus / 96-109)

## HUD (52 – 11) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 184

**1-4** Əlif / 1, Lam / 30, Ra / 200.[203] Bu Quran, Allahdan başqasına qulluq etməyin; yalnız Allaha qulluq edin deyə ayələri, şirk qoşaraq edilən səhvi; öz zərərinə olan əməl işləməyin və fəsadı əngəlləmək üçün qoyulmuş qanun, düstur və prinsiplər ehtiva edən / pozulması əngəllənmiş, bir də ən yaxşı qanun qoyan, pozulmanı yaxşı əngəlləyən / sağlam edən, hər şeyin iç üzünü / gizli tərəflərini də yaxşı bilən (Allah) tərəfindən müfəssəl olaraq açıqlanmış bir kitabdır: *"Şübhəsiz ki, mən sizin üçün Onun tərəfindən, bir xəbərdarlıq edən və bir müjdəçiyəm. Və Rəbbinizdən bağışlanma istəyin, sonra Ona tövbə edin ki, sizi müəyyən bir müddətin sonuna qədər yaxşıca faydalandırsın. Və hər fəzilət sahibinə nemətlərini versin. Və əgər üz çevirsəniz, mən sizin əleyhinizə olan böyük bir günün əzabından qorxuram. Dönüşünüz sadəcə Allahadır. Və O hər şeyə qadirdir."*[204]

(52/11, Hud / 1-4)

### Nəcm: 185

**5** Xəbəriniz olsun! Şübhəsiz ki, onlar, Elçidən / vəhydən gizlənmək üçün sinələrini bürmələyib bükərlər. Xəbəriniz olsun! Onlar örtüklərinə bürünərkən, gizlədikləri şeyləri, aşkar etdikləri şeyləri Allah bilir. Şübhəsiz ki, Allah, kökslərdə olanı ən yaxşı biləndir.

**6** Və yer üzündə heç bir kiçik-böyük canlı yoxdur ki, onun ruzisi Allaha aid olmasın. Allah, onun yaşayış yerini də, müvəqqəti olduğu yeri[205] də bilir. Hamısı açıq-aşkar bir kitabdadır.

**7** Və Allah, hansınızın daha gözəl əməl işləyəcəyini imtahan etmək üçün göyləri və yeri altı mərhələdə yaradandır. *–Kainat, əvvəlcə su halında idi; Onun taxtı*[206] *su üzərində idi; Allah o mərhələdə də hökmran, planlayıb idarə edən idi.*[207] Və əgər onlara, "Həqiqətən siz öldükdən sonra dirildiləcəksiniz" desən, o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş olan o kəslər] də həqiqətən sənə,

"Bu, açıq-aşkar bir sehrdən / sehrbazdan başqa bir şey deyil" deyəcəklər.

**8** Və əgər Biz bunlardan əzabı, başçısı olan müəyyən bir tayfa yaranana qədər təxirə salsaq, o zaman da, "Onu əngəlləyən nədir ki?" deyəcəklər. Xəbəriniz olsun! O əzab onlara gəldiyi gün, onlardan dəf olunası deyildir. Və istehza etdikləri o şey onları əhatə etmişdir.

**9-11** Və əgər, səbr edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kəslərdən *–Bax bunlar, bağışlanma və böyük mükafat onlar üçündür–* başqa insanlara, tərəfimizdən bir rəhmət daddırıb, sonra da onu ondan geri alsaq, şübhəsiz o, ümidsizdir, çox nankordur. Və əgər, bədbəxtlikdən sonra ona xoşbəxtliyi daddırsaq, əlbəttə, "Artıq pisliklər məndən getdi" deyər. Və şübhəsiz, o, öyünəndir, lovğalanan biridir.

(52/11, Hud / 5-11)

## Nəcm: 186

**12** İndi sən, "Ona bir xəzinə endirilsəydi, və ya onunla birlikdə bir mələk gəlsəydi!" deyirlər deyə, sənə vəhy olunan vəhyin bir qismini tərk edəcək olarsansa, bundan dolayı sinən daralar. Sən yalnızca xəbərdarlıq edən birisən. Allah isə hər şeyi müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək həyata keçirəndir.

**13** Əslində onlar, "Onu özündən uydurdu!" deyirlər. De ki: "Elə isə, əgər doğrulardansınızsa, uydurma olaraq da olsa, buna bənzər on surə gətirin, Allahın altındakılardan gücünüz çatan kəsləri də çağırın."

**14** Yox, əgər bunun üzərinə onlar, sizə cavab vermədilərsə, artıq bilin ki, Quran ancaq Allahın biliyi ilə nazil edilmişdir. Və Ondan başqa ilah deyə bir şey yoxdur. Artıq siz müsəlman olursunuzmu?

**35** Yaxud da "Onu uydurdu" deyirlər. De ki: "Əgər onu mən uydurdumsa, vəbalı (günahı) mənim üzərimədir. Mən isə sizin işlədiyiniz günahlardan uzağam."[208] (52/11, Hud / 12-14, 35)

## Nəcm: 187

**15** Hər kim bəsit dünya həyatını və süsünü istəyərsə, etdiklərinin qarşılığını, heç bir şeyi əskiltmədən, burada tam olaraq ona verərik. Onlar orada heç bir zərərə uğradılmazlar.

**16** Bax onlar üçün axirətdə atəşdən başqa bir şey yoxdur. Etdikləri işlər də orada boşa getmişdir. Etdikləri şeylər də yox olub getməyə məhkumdur.

**17** Artıq dünyanı istəyənlər, heç Rəbbindən açıq-aydın bir dəlil üzrə

olan və Rəbbindən bir şahidin onu təqib etdiyi və önündə də bir öndər və rəhmət olaraq Musanın kitabı olan kimsə kimidirmi? Bax belə olanlar, Qurana inanarlar. Hansı əleyhdar (qarşı) qrupdan olursa olsun, kim Quranı ört-basdır edərsə, ona vəd edilən yer atəşdir. Bax bütün bunlara görə sən də Qurandan şübhə içində olma. Həqiqətən o, Rəbbindən bir haqdır / gerçəkdir. Lakin insanların çoxu iman etmirlər.

**18,19** Və bir yalanı Allaha iftira edəndən daha səhv; öz zərərlərinə olan əməli işləyən kim ola bilər? Bunlar Rəbbinə ərz olunacaq, şahidlər də "Bax bunlar Rəbbinə qarşı yalan söyləyənlərdir" deyəcəklər. Xəbəriniz olsun! Allahın uzaqlaşdırması / rəhmətindən məhrum etməsi, Allah yolundan döndərməyə çalışan və o yolu əyri-üyrü etmək istəyən və axirətə də inanmayanların məhz özləri olan bu səhv; öz zərərinə olan əməli işləyən kimsələrin üzərinədir.

**20** Bax onlar yer üzündə aciz qoya bilənlər deyillər. Allahın altındakılardan onları qoruyan, yol göstərən, yardım edən yaxınları yoxdur. Onlar üçün əzab qat-qat artırılar. Onlar vəhyi eşitməyə təhəmmül edə bilmirdilər və həm də görmürdülər. **21** Bax onlar, özlərinə zərər vermiş olan kimsələrdir. O uydurduqları şeylər də onlardan uzaqlaşıb qeyb olmuşdular. **22** Şübhə yoxdur ki, həqiqətən axirətdə də ən çox zərərə / itkiyə məruz qalıb acı çəkənlər məhz bunlardır.

**23** Şübhəsiz iman edənlər, yaxşılaşdırmaq qayəsi ilə əməl işləyənlər və Rəbbinə dərin hörmət və təvazökarlıq ilə bağlananlar, bax bunlar da cənnət əhlidirlər. Onlar orada sonsuz olaraq qalarlar.

**24** Bu iki qrupun örnəyi, kor və kar ilə görən və eşidən kimidir. Bunlar örnək olaraq heç eyni olarmı? Hələ də düşünməyəcəksiniz / öyüd qəbul etməyəcəksiniz? (52/11, Hud / 15-24)

## Nəcm: 188

**25,26** Və and olsun ki, Nuhu da öz qövmünə elçi olaraq göndərdik: "Həqiqətən, mən sizin üçün açıq-aşkar xəbərdarlıq edənəm. Allahdan başqasına qulluq etməyin! Mən, sizin haqqınızda acı bir günün əzabından qorxuram."

**27** Buna qarşılıq, o qövmün kafirlərinin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərinin] başbilənləri belə dedilər: "Biz səni sadəcə bizim kimi adi bir insan olaraq görürük. Sənə dayaz fikirli aşağı təbəqələrimizdən / səfillərdən başqa heç kimin tabe olduğunu görmürük. Sizin bizdən bir üstünlüyünüzü də görmürük. Əksinə, biz sizi yalançı hesab edirik!"

**28-31** Nuh: “Ey qövmüm! Heç düşündünüzmü, mən Rəbbimdən açıq-aşkar bir dəlil üzərindəyəmsə və O, mənə Öz tərəfindən bir rəhmət bəxş etmişdirsə və bu sizə gizli tutulmuşsa?! *–Siz ondan xoşlanmadığınız halda, Biz sizi ona zorlayarıqmı?–”* **29** Və: “Ey qövmüm! Mən sizdən hər hansı bir mal istəmirəm. Mənim muzdum ancaq Allaha aiddir.. Və mən iman edənləri qovan deyiləm. Onlar əlbəttə Rəblərinə qovuşacaqlar. Lakin mən sizi cahillik edən bir camaat olaraq görürəm.” **30** Və: “Ey qövmüm! Mən onları qovarsam, Allaha qarşı mənə kim yardım edəcək? Yaxşı, siz heç düşünməzmisiniz? **31** Və mən sizə, ‘Allahın xəzinələri mənim yanımdadır’ demirəm. Və mən görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi bilmirəm. Mən sizə ‘Mən bir mələyəm’ də demirəm. O sizin özünüzə görə, xor gördükləriniz haqqında, ‘Allah onlara heç bir xeyir verməz’ də demirəm. Allah, onların daxilindəkini ən yaxşı billəndir. Bax, əsil o zaman mən həqiqətən səhv; öz zərərinə olan əməli işləyənlərdən olaram.” **28** dedi.

**32** Onlar dedilər ki: “Ey Nuh! Bizimlə didişib-durdun, mücadiləmizi çoxaltdın. Haydı, artıq doğrulardansansa, bizi təhdid etdiyin o əzabı gətir bizə!”

**33,34** Nuh dedi: “Onu sizə ancaq istəsə Allah gətirər. Və siz Onu aciz qoya bilməzsiniz. Mən sizə öyüd vermək istəsəm də, əgər Allah sizi azdırmağı murad edirsə (məqsədə uyğun bilirsə), mənim öyüdüm sizə bir fayda verməz. O sizin Rəbbinizdir və yalnızca Ona döndəriləcəksiniz.”

**36,37** Və Nuha belə vəhy olundu: “Həqiqətən sənin qövmündən iman edənlərdən başqa artıq kimsə iman etməyəcəkdir. Onun üçün, onların etdikləri şeylərə üzülmə. Və Bizim nəzarətimiz altında və vəhyimizə görə gəmini düzəlt. Şirk qoşmaq surətiylə səhv; öz zərərinə olan əməli işləyən kəslər haqqında da Mənə müraciət etmə. Həqiqətən onlar suda mütləq boğulacaqlar.”

**38,39** Və o, gəmini düzəldirdi, qövmündən bəzi başbilənlər, hər dəfə onun yanından keçdikdə onunla istehza edirdilər. Nuh dedi ki: “Bizimlə istehza edirsiniz, biz də sizinlə eyni bizimlə istehza etdiyiniz kimi istehza edəcəyik.” *–Artıq o alçaldıcı əzabın kimə gələcəyini və o daimi əzabın kimin üstünə enəcəyini gələcəkdə biləcəksiniz.–*

**40** Nəhayət əmrimiz gəldiyi və iş qızışdığı zaman[209] Biz dedik ki: “Hər cinsdən bir cütü və əleyhlərində hökm verilmiş olanların xaricində ailəni və iman etmiş olanları onun içinə yüklə.” *–Onsuz da, Onunla birlikdə çox az adamdan başqası iman etməmişdi.–*

**41** Və Nuh dedi ki: “İçərisinə minin, onun axması da, dayanması da

Allahın adı ilədir. Şübhəsiz, Rəbbim həqiqətən çox bağışlayandır, çox mərhəmətlidir.”

**42** Və gəmilər dağlar kimi; sapsağlam, yıxılmadan, yıpranmadan onlarla, dalğalar içində axıb gedirdi. Və Nuh ayrı bir yerə çəkilən oğluna səsləndi: “Mənim balam (oğlum)! Bizimlə birgə min, kafirlərlə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərlə] birlikdə olma!”

**43** Nuhun oğlu dedi ki: “Mən, özümü sudan qoruyacaq bir dağa sığınacağam.” Nuh dedi: “Bu gün Allahın mərhəmət etdiyindən başqasını, Allahın bu əmrindən qoruyacaq kimsə yoxdur.” Və dalğa aralarına girdi. O da suda boğulanlardan oldu.

**44** Və: “Ey yer üzü, suyunu ud! Ey göy üzü sən də tut!” deyildi. Sular da çəkildi. Əmr də yerinə gəlmiş oldu. Gəmi də Cudi üzərinə oturdu. Və o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən tayfaya: “Uzaq olun [məhv olun, tarixdən silinin]!” deyildi.

**45** Və Nuh Rəbbinə səslənib dedi ki: “Ey Rəbbim! Oğlum mənim əhlimdəndi (ailəmdəndi). Sənin vədin də əlbəttə haqdır. Və Sən, hakimlərin ən hakimisən.”

**46** Allah: “Ey Nuh! Şübhəsiz ki, o sənin əhlindən (ailəndən) deyildir. Şübhəsiz ki, o, saleh olmayan bir işdir / o, saleh olmayan bir iş işləmişdir. Haqqında məlumatın olmayan bir şeyi Məndən istəmə! Şübhəsiz ki, Mən, səni, cahillərdən olmaqdan çəkindirirəm” dedi.

**47** Nuh, “Ey Rəbbim! Mən, haqqında biliyim olmayan bir şeyi istəmiş olmaqdan dolayı Sənə sığınıram. Və əgər Sən məni bağışlamasan, mənə mərhəmət etməsən, mən zərərə / itkiyə məruz qalaraq əzab çəkənlərdən olaram” dedi.

**48** Deyildi ki: “Ey Nuh! Bizdən bir salam və səninlə birlikdə olanlardan gələcək ümmətlərə bir salam və bolluq bəxş edilməklə gəmidən en.” *–Və gələcəkdə özlərini bir çox nemətdən faydalandıracağımız, sonra da buna görə özlərinə tərəfimizdən ağrılı bir əzab toxunacaq neçə-neçə ümmətlər vardır.–*

**49** Bax Nuh ilə əlaqəli anlatılanlar, sənə vəhy etdiyimiz görünməyənin, eşidilməyənin, hiss edilməyənin xəbərlərindəndir. Bunları sən və qövmün bundan öncə bilmirdiniz. O halda səbr et. Şübhəsiz ki, aqibət, Allahın mühafizəsi altına daxil olan kəslərindir.

(52/11, Hud / 25-34, 36-49)

## Nəcm: 189

**50-52** Ad qövmünə də qardaşları Hudu elçi göndərdik. O, dedi ki: “Ey qövmüm! Allaha qulluq edin. Sizin üçün Ondan başqa ilah yoxdur. Siz

uydurmaçılardan başqa bir şey deyilsiniz. Ey qövmüm! Buna qarşılıq mən sizdən heç bir muzd istəmirəm. Mənim muzdum ancaq məni yoxdan yaradana aiddir. Hələ də ağıllanmayacaqsınızmı? Ey qövmüm! Rəbbinizdən bağışlanma istəyin, sonra Ona tövbə edin ki, üzərinizə göydən bol-bol göndərsin və gücünüzə güc qataraq sizi artırsın. Və günahkarlar olaraq arxanızı çevirməyin."

**53-57** Onlar dedilər ki: "Ey Hud! Bizə açıq-aşkar bir dəlil ilə gəlmədin. Və biz, sənin sözünlə ilahlarımızı tərk edəcək deyilik. Biz, sənə inananlar da deyilik. Ancaq 'Tanrılarımızdan bəzisi sənə çox pis xətər toxundurmuşdur' deyə bilərik." Hud dedi ki: "Şübhəsiz ki, mən Allahı şahid tuturam və siz də şahid olun ki, mən, Allahın altındakılardan Ona ortaq qoşduğunuz şeylərdən uzağam. Haydı, elə isə hamınız mənə qarşı hiylə qurun, sonra məni heç gözlətməyin. Şübhəsiz ki, mən, həqiqətən, mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha işin nəticəsini həvalə etdim. Onun, kəkilindən tutub sorğulamadığı heç bir irili-xırdalı hərəkət edən canlı yoxdur. Şübhəsiz ki, mənim Rəbbim doğru bir yol üzərindədir. Buna baxmayaraq, yenə də arxanızı çevirərsəniz, mən sizə nə ilə göndərilmişəmsə, bax onu təbliğ etdim. Və mənim Rəbbim, başqa bir qövmü sizin yerinizə gətirər. Və siz Ona heç bir şəkildə və heç bir yolla zərər verə bilməzsiniz. Heç şübhəsiz ki, Rəbbim, hər şeyi qoruyub hifz edəndir."

**58** Və nə zaman ki, əmrimiz gəldi, Hudu və onunla birlikdə iman edən kəsləri Öz tərəfimizdən bir rəhmət ilə qurtardıq, Biz onları çox ağır bir əzabdan da qurtardıq.

**59,60** Və bax bu, Rəblərinin ayələrinə baş qaldıran, Onun elçilərinə asi olan və hər bir inadkar zalımın əmrinə tabe olan Ad qövmüdür. Bu dünyada və qiyamət günü arxalarında kənarlaşma qaldı. Xəbəriniz olsun! Ad qövmü, Rəblərinə inanmadılar. Xəbəriniz olsun! Hudun qövmü olan Ad qövmünə məhv olmaq / tarixdən silinmək (payı) verildi. (52/11, Hud / 50-60)

## Nəcm: 190

**61,62** Səmuda da qardaşları Salehi elçi göndərdik. O, dedi ki: "Ey xalqım! Allaha qulluq edin. Sizin üçün Ondan başqa ilah yoxdur. O, sizi yer üzündən yaradan və sizə orada ömür sürdürəndir. Artıq Ondan bağışlanma istəyin. Sonra Ona tövbə edin. Şübhəsiz ki, Rəbbim çox yaxındır, yalvarışlara cavab verəndir." Dedilər ki: "Ey Saleh! Sən, bundan öncə aramızda, axtarılan / ümid bəslənən bir adam idin. İndi qalxıb, atalarımızın qulluq etdiklərinə qulluq etməyimizi qadağanmı edirsən? Və heç şübhəsiz biz, bizi dəvət etdiyin şey haqqında başları

qarışdıran bir şübhə [qəti olmayan, əskik məlumat] içindəyik."

**63,64** Saleh dedi ki: "Ey qövmüm! Əgər mən Rəbbimdən açıq-aşkar bir dəlil üzərindəyəmsə və O mənə Özündən bir rəhmət vermişsə… Belə olduğu halda Ona asi olsam, məni Allahdan kim qoruya bilər? O zaman siz də mənə zərərdən başqa bir şey artırmazsınız. Və ey qövmüm! Budur, sizə əlamət / işarət olaraq səlat [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmək] vəzifəsi. Artıq onu buraxın, Allahın yer üzündə tətbiq edilsin. Və ona pislik toxundurmayın; sonra sizi yaxın bir əzab yaxalayar.

**65** Beləliklə, onlar həyat qaynaqlarını qurudaraq öldürdülər. Bunun üzərinə Saleh dedi ki: "Yurdunuzda üç gün daha faydalanın. Bax bu, yalanlanmayacaq bir vəddir."

**66** Artıq nə zaman ki, əmrimiz gəldi, Salehi və onunla birlikdə iman edən kəsləri Öz tərəfimizdən bir rəhmətlə qurtardıq. O günün pərişanlığından da qurtardıq. Heç şübhəsiz ki, sənin Rəbbin, güclü, mütləq üstün olandır.

**67** Və şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kəsləri qorxunc bir gurultu yaxaladı və öz yurdlarında diz üstə çöküb qaldılar.

**68** Sanki orada heç zəngincə yaşamamışdılar. Xəbəriniz olsun! Heç şübhəsiz ki, Səmud qövmü həqiqətən Rəbblərinə inanmadılar. Xəbəriniz olsun! Səmud üçün uzaqlıq (payı) verildi. (52/11, Hud / 61-68)

## Nəcm: 191

**69** Və and olsun ki, İbrahimə də elçilərimiz müjdə ilə gəldilər, "Salam!" dedilər. O, "Salam!" dedi, sonra da qızıl verməyə[210] gecikmədi.

**70** Sonra da onların ona uzanmadığını (əl uzatmadığını) görüncə, onları qəribə gördü və daxilində onlara qarşı bir qorxu oyandı. Onlar: "Qorxma, şübhəsiz, biz Lutun qövmünə göndərildik" dedilər.

**71** Və İbrahimin zövcəsi ayaq üstündəydi, güldü.

Sonra ona İshaqı, İshaqın ardınca da Yəqubu müjdələdik.

**72** İbrahimin zövcəsi dedi ki: "Vay (Heyrət)! Mənmi doğacağam?! Mən, əri işə yaramaz bir zavallıyam, bəxtsiz, bədbəxt bir qadınam. Bu ərim də yaşlı bir adamdır! Şübhəsiz ki, bu, çox qəribə bir şeydir!"

**73** Elçilər: "Sən Allahın işinə görəmi təəccüblənirsən? Allahın rəhməti və bolluqları sizin üzərinizdədir. Ey ev xalqı! Şübhəsiz ki, O, təriflənməyə layiq olan, səxavəti bol olandır" dedilər.

**74** Sonra İbrahimdən qorxu yaxşıca keçib gedincə və özünə müjdə gəlincə, Bizimlə Lut qövmü haqqında mücadiləyə başladı.

**75** Şübhəsiz ki, İbrahim, çox yumşaq təbiətli, çox ah çəkən / yumşaq qəlbli / yönələn biri idi.

**76** –*"Ey İbrahim! Bundan əl çək. Həqiqətən, sənin Rəbbinin əmri qəti olaraq gəldi və heç şübhəsiz onlar; onlara dəf edilməsi mümkün olmayan bir əzab gələcəkdir."*–

**77** Və nə zaman ki, elçilərimiz Lutun yanına gəldilər, bunlardan ötrü o üzüldü, bunlar haqqında əli-qolu bağlanıb qaldı və "Bu, müthiş bir gündür!" dedi.

**78** Və onun qövmü tələsik onun yanına gəldilər. Onlar daha öncə də çirkinliklər edərdilər. Lut dedi: "Ey qövmüm! Bax, bunlar qızlarımdır. [211] Onlar sizin üçün daha təmizdirlər. Gəlin Allahın mühafizəsi altına daxil olun, məni qonaqlarım ilə əlaqəli olaraq rəzil-rüsvay etməyin. Sizin aranızda ağlı başında olan bir adam heç yoxdur?"

**79** Onlar: "Heç şübhəsiz sən, sənin qızlarında bizim üçün hər hansısa bir haqq olmadığını bildin. Və şübhəsiz ki, sən bizim nə istədiyimizi çox yaxşı bilirsən." dedilər.

**80** Lut: "Kaş ki, sizə qarşı bir gücüm olsaydı, ya da əlçatmaz bir bölgəyə / güclü bir tayfaya sığına bilsəydim!" dedi.

**81** Qonaq elçilər dedilər: "Ey Lut! Şübhəsiz ki, biz sənin Rəbbinin elçiləriyik. Onlar sənə əsla toxuna bilməyəcəklər. Sən, gecənin bir vaxtında ailənlə birlikdə dərhal yola çıx. Və içinizdən heç kimsə geri baxmasın [burada olanları, keçmişdəkiləri düşünməsin], zövcəndən başqa. Şübhəsiz ki, onlara toxunan (əzab) ona da toxunacaqdır. Şübhəsiz vəd edilənin zamanı səhər vaxtıdır. Səhər vaxtı yaxın deyilmi?"

**82,83** Nəhayət əmrimiz gəldikdə, oranın üstünü altına gətirdik (çevirdik). Və bişmiş palçıqdan, Rəbbinin dərgahında üstünə işarə qoyulmuş, yığılmış daşları onların üzərlərinə yağdırdıq. Və bunlar, şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyənlərdən uzaq deyildir. (52/11, Hud / 69-83)

## Nəcm: 192

**84-86** Mədyən (xalqına) da qardaşları Şüeybi elçi göndərdik. Şüeyb dedi: "Ey qövmüm! Allaha qulluq edin. Sizin üçün Ondan başqa ilah yoxdur. Ölçünü və tərəzini əskik tutmayın. Şübhəsiz ki, mən sizi xeyir ilə görürəm. Və mən, əhatə edəcək bir günün əzabından sizin üçün qorxuram. Və ey qövmüm! Ölçərkən və çəkərkən ədaləti yerinə gətirin. İnsanların əşyalarını əskiltməyin və yer üzündə üsyançılar kimi pislik etməyin. Əgər möminsinizsə, Allahın izin verdiyi / halalından

sizə ehsan etdiyi mənfəət, sizin üçün daha xeyirlidir. Və mən sizin üzərinizə bir qoruyucu deyiləm."

**87** Onlar dedilər ki: "Ey Şüeyb! Atalarımızın ibadət etdiklərini və ya mallarımızda istədiyimizi etməyi tərk etməyi sənə sənin səlatınmı [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyi ehtiva edən dininmi] əmr edir? Şübhəsiz ki, sən yumşaq təbiətlisən və ağlı başında bir adamsan."

**88-90** Şüeyb dedi: "Ey qövmüm! Heç düşündünüzmü? Əgər mən Rəbbimdən bir dəlil üzərindəyəmsə və əgər O, mənə Öz dərgahından gözəl bir ruzi ehsan etmişsə!? Və Mən, sizə qarşı çıxmaqla sizi çəkindirdiyim (qadağan etdiyim) şeylərə özüm düşmək istəmirəm. Mən, sadəcə gücüm çatdığı qədər islah etməyi istəyirəm. Müvəffəq olmağım da ancaq Allah ilədir. Mən, işin nəticəsini yalnızca Ona həvalə etdim və ancaq Ona yönəlirəm. Və ey qövmüm! Mənə qarşı gəlməyiniz əsla sizi Nuh qövmünün və ya Hud qövmünün və ya Saleh qövmünün başlarına gələn müsibətlər kimi bir müsibətə düçar etməsin. Və Lut qövmü sizdən çox uzaq deyildir; [onlarla sizin inanış və davranışınız eynidir / Lut qövmü, haqqında yetərli məlumata sahib olduğunuz bir qövmdür.] Və Rəbbinizdən bağışlanma diləyin, sonra Ona tövbə edin. Şübhəsiz ki, mənim Rəbbim çox mərhəmətlidir, çox sevəndir."

**91** Şüeybin qövmü dedilər ki: "Ey Şüeyb! Biz sənin söylədiklərinin çoxunu yaxşı anlamırıq. Səni aramızda çox zəif olaraq görürük. Əgər sənin əqrəbaların (yaxınların) / tərəfdarların olmasaydı, həqiqətən səni daşqalaq edərək öldürərdik. Və sənin bizə qarşı heç bir üstün gücün / qalib gəlmək imkanın yoxdur."

**92,93** Şüeyb dedi: "Ey qövmüm! Mənim əqrəbalarım (yaxınlarım) / tərəfdarlarım sizə qarşı Allahdan daha güclüdürmü / dəyərlidirmi? Və Allahı arxanıza atılmış bir şey olaraq qəbul etdiniz. Şübhəsiz ki, Rəbbim bütün etdiklərinizi hər tərəfdən əhatə edəndir. Və ey qövmüm! Var gücünüzlə edəcəyiniz nə varsa edin! Şübhəsiz mən edənəm (edirəm). Pərişan edəcək əzabın kimə gələcəyini və kimin yalançı olduğunu yaxında biləcəksiniz. Gözləyin, şübhəsiz, mən də sizinlə bərabər gözləyəcəyəm."

**94** Və nə zaman ki, əmrimiz gəldi, Şüeybi və onunla birlikdə inanmış olan kəsləri, tərəfimizdən bir rəhmət ilə qurtardıq. Və şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kəsləri qorxunc bir gurultu yaxaladı və onlar öz yurdlarında çöküb qaldılar.
**95** Sanki onlar orada heç yaşamadılar. Xəbəriniz olsun! Səmud qövmü necə uzaqlaşdısa Mədyənə də elə məhv olmaq / tarixdən silinmək vardır.(52/11, Hud / 84-95)

## Nəcm: 193

**96,97** And olsun ki, Biz Musanı da ayələrimizlə və açıq-aşkar bir dəlil ilə Firon və onun əyanlarına elçi etdik. Amma onlar Fironun əmrinə tabe oldular. Halbuki Fironun əmri ağıl işlədən / doğruya çatdıran deyildir.

**98** Firon qiyamət günü qövmünün önünə düşər. *–Artıq Firon, öz qövmünü atəşə aparmışdır. O gedilən yer də nə pis bir yerdir!–*

**99** Və bu dünyada və qiyamət günündə kənar tutularaq izləndilər (təqib edildilər). *–Verilən bu vergi nə pis vergidir!–* (52/11, Hud / 96-99)

## Nəcm: 194

**100** Bax, Keçmişə dair bu anlatma, şəhərlərin ciddi xəbərlərindən, önəmli məlumatlarındandır. Biz, onu sənə anladırıq; onlardan ayaq üstə qalan və biçilmiş əkin (kimi) olan da vardır.

**101** Və onlara Biz haqsızlıq etmədik; lakin onlar özlərinə haqsızlıq etdilər, səhv; öz zərərlərinə olan əməli işlədilər. Onun üçün Rəbbinin əmri gəldiyində, Allahın altındakılardan ibadət etdikləri tanrıları onlara heç bir şey vermədi və onlara ziyandan başqa bir şey artırmadılar.

**102** Və Rəbbin, xalqı şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kəslər olan şəhərləri yaxaladıqda, Onun yaxalamağı bax belədir. Şübhəsiz ki, Onun yaxalaması çox ağrılıdır, çox çətindir!

**103** Şübhəsiz, axirət əzabından qorxan kimsələr üçün bunda həqiqətən bir əlamət / işarət vardır. O, insanların özləri üçün toplandığı bir gündür və həqiqətən görüləcək bir gündür.

**104** Və Biz onu sadəcə müəyyən bir müddətə qədər təxirə salırıq.

**105** O gün gəldiyində, Allahın izni olmadan heç kimsə danışmaz. Bax o gün insanlardan bir qismi bədbəxt və bir qisimi də xoşbəxtdir.

**106,107** Bax o bədbəxt olanlar cəhənnəm atəşi içindədirlər. Onlar üçün orada iç çəkmə və hıçqırma vardır. Göylər və yer durduqca[212] onlar da o atəşdə sürəkli qalacaqlar. *–Ancaq Rəbbinin dilədiyi istisna olmaqla.–* Şübhəsiz ki, Rəbbin istədiyini ən yüksək səviyyədə edəndir.

**108** Və o xoşbəxt olanlara gəlincə, onlar da göylər və yer durduqca, ardı arxası kəsilməyən bir ikram (nemət) olaraq cənnətin içində sürəkli olmaq üzrə qalacaqlar. *–Ancaq Rəbbinin dilədiyi istisna olmaqla.–*

**109** O halda, əsla bunların qulluq etdikləri şeylərdən şübhə içində olma! Onların ataları daha öncə necə qulluq edirdisə, bunlar da elə qulluq edirlər. Şübhəsiz ki, Biz də onlara nəsiblərini həqiqətən əskiksiz

ödəyərik.
**111** Və şübhəsiz, hamısı elə kimsələrdir ki, onların etdiklərinin qarşılığını Rəbbin onlara tam ödəyəcəkdir. Şübhəsiz ki, O, onların etdikləri şeylər haqqında layiqincə məlumat sahibidir.
**110** Və and olsun ki, Biz Musaya Kitabı verdik və onda ixtilafa düşüldü. Əgər Rəbbindən daha öncə verilmiş bir Söz[213] olmasaydı, əlbəttə bu dünyada dərhal cəzalandırılardılar. Və onlar şübhəsiz, Quran barəsində tərəddüd doğuran bir şübhə [qəti olmayan, əskik məlumat] içindədirlər.
**112** Bax buna görə, sənə əmr olunduğu kimi doğru ol! Bərabərindəki tövbə edənlər də doğru olsunlar. Və həddi aşmayın! Həqiqətən Allah, sizin etdiklərinizin hamısını layiqincə görəndir.
**113** Və Allahın ortağı olduğunu qəbul edərək səhv, öz zərərlərinə olan əməli işləyən kəslərə meyl etməyin, sonra sizə atəş toxunar. Və sizin üçün Allahın altındakılardan yardım edən, yol göstərən, qoruyan yaxınlar yoxdur. Sonra yardım görə bilməzsiniz.
**114** Və gündüzün iki tərəfində və gecənin yaxın saatlarında səlatı [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə işini] yerinə yetir, çünki yaxşılıqlar pislikləri aradan qaldırar. Bu, ibrət alanlara bir öyüddür.
**115** Və səbr et! Çünki şübhəsiz, Allah yaxşılıq-gözəllik eləyənlərin mükafatlarını itirməz.
**116** Bax, sizdən öncəki dövrlərdən “Bəqiyyə (qalan şeylərin)” [söz, əsər, fəzilət] sahibləri; ağıllı insanlar, Kitab Əhli, yer üzündə fəsad törətməyi qadağan etməyə çalışsaydılar! Lakin onların içindən qurtardığımız çox az adam bunu etdi. Allahın ortağı olduğunu qəbul edərək, Allahın ilah və rəbb olduğunu bilərək rədd etməklə səhv; öz zərərinə olan əməli işləyən o kəslər isə, onları qudurdan rifahın arxasınca düşdülər və günahkarlar oldular.
**117** Və sənin Rəbbin, xalqları islah edərkən, o məmləkətləri haqsız yerə dəyişikliyə / məhvə məruz qoymaz.
**118,119** Əgər Rəbbin istəsəydi, insanları əlbəttə başçısı olan vahid bir topluluq edərdi. Halbuki Rəbbinin rəhmət etdiyi kəslər istisna olmaqla, onlar hələ də ixtilafdadırlar. Onları bax bunun üçün yaratmışdır. Və Rəbbinin, “And olsun ki, cəhənnəmi bildiyiniz-bilmədiyiniz, tanıdığınız-tanımadığınız insanlarla; onların hamısıyla dolduracağam” Sözü tamamlanmışdır.
**120** Və elçilərin xəbərlərindən qəlbinə qüvvət verəcək olanların hamısını sənə qissələr şəklində anladırıq. Və bunda sənə bir həqiqət,

möminlərə də bir öyüd və xatırlatma gəlmişdir.

**121,122** Və inanmayan o kəslərə de ki: "Əlinizdən gələni edin! Şübhəsiz biz (də) edənlərik. Gözləyin! Şübhəsiz ki, biz [də] gözləyənlərik."

**123** Və göylərin və yerin görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi sadəcə Allaha aiddir. Və bütün iş / yaradılış yalnızca Ona döndərilər. O halda, Ona qulluq et, nəticəni Ona həvalə et. Və Rəbbin, sizin nə etdiklərinizdən xəbərsiz, bunlara qarşı laqeyd deyildir. (52/11, Hud / 100-123)

## YUSUF (53 – 12) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 195**

**1** Əlif / 1, Lam / 30, Ra / 200.[214] Bax bu, o, açıq-aydın / açıqlayan kitabın ayələridir.

**2** Şübhəsiz ki, Biz onu düşünəsiniz deyə, ərəbcə bir Quran olaraq nazil etdik.

**3** Sənə bu Quranı vəhy etməklə Biz, sənə qissələrin ən gözəlini[215] anladırıq. Halbuki sən, bundan öncə, həqiqətən bu mövzu haqqında xəbərsiz / məlumatı olmayanlardan idin.

**4** Bir zaman Yusuf atasına: "Atacan! Şübhəsiz ki, mən on bir ulduz, günəş və ayı gördüm; onların mənə boyun əyib təslimiyyət göstərdiklərini gördüm"[216] demişdi.

**5,6** Atası dedi: "Mənim balam (Oğlum)! Gördüyünü qardaşlarına anlatma. Sonra sənə bir hiylə qurarlar. Şübhəsiz ki, şeytan insan üçün açıq-aşkar bir düşməndir. Və beləcə, Rəbbin səni seçəcək və sənə hadisələrin / sözlərin ilk anlamlarının nə olduğuna dair məlumatlar öyrədəcək. Bundan öncəki iki atana; İbrahimə və İshaqa (nemətini) tamamladığı kimi, sənə və Yəqub soyuna da nemətini tamamlayacaqdır. Şübhəsiz ki, Rəbbin çox yaxşı biləndir, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir."

**7** *–And olsun ki, Yusuf və qardaşlarında soruşanlar / istəyənlər üçün neçə əlamətlər / işarətlər vardır.–*

**8,9** Bir zaman Yusufun qardaşları: "Yusuf və qardaşı atamıza bizdən daha əziz, biz isə güclü və bir-birimizə bağlı bir qrupuq. Şübhəsiz ki, atamız həqiqətən çox açıq çıxılmaz bir yoldadır. Yusufu öldürün və ya bir yerə atın ki, atanız tamamilə sizə qalsın, sonra da siz saleh bir camaat olarsınız" demişdilər.

**10** Onlardan bir sözçü: "Yusufu öldürməyin, onu o quyunun dibinə buraxın (atın) ki, oradan keçən karvanın biri onu tapıb götürsün. Əgər

edəcəksinizsə belə edin.” dedi.
11,12 Onlar dedilər ki: “Ey atamız! Sən nə üçün Yusufu bizə etibar etmirsən? Halbuki biz həqiqətən Onun yaxşılığını istəyirik. Sabah Onu bizimlə birlikdə göndər, bol-bol yesin, oynasın. Və şübhəsiz ki, biz onu həqiqətən qoruyanlarıq.”
13 Ataları dedi ki: “Onu aparmağınız məni üzüntüyə salar və siz ona qarşı laqeyd / maraqsız olduğunuz halda, onu qurd yeməsindən qorxaram.”
14 Yusufun qardaşları dedilər ki: “And olsun ki, biz belə güclü-qüvvətli bir topluluq ikən onu qurd yeyərsə, o zaman şübhəsiz biz həqiqətən zərərə / itkiyə məruz qalıb əzab çəkənlərdən olarıq.”
15 Nəhayət, Yusufun qardaşları, Yusufu apardılar və hamısı birlikdə o quyunun dibinə buraxmağa (atmağa) qərar verdilər. Biz də Yusufa vəhy etdik: “And olsun ki, sən onlara gələcəkdə, onlar heç fərqində deyilkən bu işlərini xəbər verəcəksən.”
16 Və axşam vaxtı, ağlayaraq atalarının yanına gəldilər.
17 Onlar dedilər ki: “Ey atamız! Şübhəsiz ki, biz yarış etməyə getdik. Yusufu da əşyalarımızın yanına qoymuşduq. Bir də baxdıq ki, onu qurd yeyib. Və biz doğru kimsələr olsaq da, sən bizə inanmazsan.”
18 Bir də köynəyinin üzərində yalandan bir qan gətirdilər. Ataları dedi ki: “Əksinə, nəfsləriniz aldadıb sizə bir iş gördürmüş. *–Artıq gözəl bir səbr!–* Bu anlatdıqlarınıza qarşılıq yardımına sığınılacaq olan ancaq Allahdır.”

***

19 Və bir yolçu karvan gəldi, öz suçularını göndərdilər. O da vedrəsini quyuya saldı, “Müjdə hey, müjdə! Bax, bir oğlan!” dedi. Və onu bir ticarət malı olaraq gizləyib qorudular. Allah isə onların nə edəcəklərini bilirdi.
20 Və onu aşağı bir qiymətə; bir neçə gümüş pula satdılar. Onlar Yusufun satılmasında az şeylə kifayətlənənlərdən idilər.
21 Və onu alan misirli kişi, arvadına: “Bunun yerini şərəfli tut. Bizə faydalı ola bilər ya da onu övladlığa götürərik” dedi. Və Biz, Yusufu beləcə yer üzündə yerləşdirdik… Və ona hadisələrin / sözlərin ilk anlamlarının nə olduğuna dair məlumatları öyrədək deyə… Və Allah, Öz əmrində qalibdir. Lakin insanların çoxu bilməzlər.
22 Və Yusuf, tam yetkinlik çağına gəlincə, ona bilik və hökm verdik. Və Biz, gözəlləşdirənlərə bax belə qarşılıq verərik.

***

23 Və evində olduğu xanım, onun nəfsindən kam alıb faydalanmaq istədi, qapıları bağladı və “Haydı, bəri gəl!” dedi. Yusuf: “Allaha sığınıram! Həqiqətən ərin, mənim ağam / Rəbbim; Allah, mənim

mövqeyimi gözəl etdi. Şübhəsiz ki, səhv; öz zərərinə olan əməli işləyənlər nicat tapmazlar.” dedi.
**24** Və and olsun o xanım, ona (onunla bağlı) niyyəti qurmuşdu. Əgər Yusuf Rəbbinin açıq dəlilini görməsəydi, (o da) o qadına niyyəti qurmuşdu. Ondan fuhuşu (zinanı) və pisliyi uzaqlaşdırmağımız üçün belədir. Şübhəsiz ki, o, Bizim paklaşdırılmış qullarımızdandı.
**25** Və ikisi də qapıya (doğru) qaçdılar. Xanım, onun köynəyini arxadan cırdı. Və qapının yanında o xanımın ağasıyla qarşı-qarşıya gəldilər. O xanım: “Sənin əhlinə pislik etmək istəyən adamın cəzası, zindana atılmaqdan və ya ağrılı bir əzabdan başqa nə ola bilər?” dedi.
**26,27** Yusuf: “O, məndən, özümdən faydalanmaq istədi” dedi. Və o xanımın yaxınlarından bir şahid şahidlik etdi: “Əgər Yusufun köynəyi öndən cırılmışsa, xanım doğru söyləmişdir, Yusuf da yalançılardandır. Və əgər Yusufun köynəyi arxadan cırılmışsa, xanım yalan söyləmişdir, Yusuf da doğrulardandır.”
**28,29** Artıq nə zaman ki, Yusufun ağası, Yusufun köynəyinin arxadan cırılmış olduğunu gördü: “Şübhəsiz ki, bu, siz qadınların fəndinizdəndir (hiylənizdəndir). Həqiqətən də sizin fəndiniz (hiyləniz) çox böyükdür. Yusuf! Sən bu (hadisəni) yaddan çıxar. Qadın! Sən də günahın üçün bağışlanma dilə. Şübhəsiz ki, sən xəta edənlərdən oldun.” dedi.

***

**30** Şəhərdə qadınlar da: “Əzizin arvadı, gənc oğlanın nəfsindən kam almaq istəyirmiş. Həqiqətən, sevgi onun ürəyinə işləmiş. Şübhəsiz ki, biz, onu həqiqətən açıq-aşkar bir azğınlıq içində görürük.” dedilər.
**31** Sonra Əzizin arvadı, onların gizlidən-gizliyə dedi-qodu yaydıqlarını eşidincə, onların arxasınca elçi göndərdi və onlara yastıq / meyvə; gözəl bir süfrə hazırladı. Və onlardan hər birinə bir bıçaq verdi. Və: “Onların qarşısına çıx!” dedi. Və indi onlar Yusufu görür-görməz onu öz gözlərində çox böyütdülər və əllərini kəsdilər. Və: “(Heyrət) doğrusu! Allah üçün, bu bir bəşər deyil, ancaq çox şərəfli bir mələkdir.” / “(Heyrət) doğrusu! Bu satın alınmış bir kölə deyil, ancaq çox şərəfli bir şahzadədir” dedilər.
**32** Əzizin zövcəsi: “Bax, bu gördüyünüz, məni haqqında qınadığınızdır. And olsun ki, mən bunun nəfsindən faydalanmaq istədim, ancaq o namuslu davrandı. Yenə and olsun ki, ona əmr etdiyimi etməzsə, mütləq zindana atılacaq və həqiqətən etibarsızlığa uğrayanlardan olacaqdır.” dedi.
**33** Yusuf: “Ey Rəbbim! Zindan mənə, bunların məni dəvət etdikləri şeydən daha sevimlidir. Əgər Sən, bunların hiyləsini məndən dəf etməsən, mən onların tələsinə düşərəm və cahil kimsələrdən olaram”

dedi.
34 Belə olduqda Rəbbi, ona cavab verdi və ondan onların hiyləsini dəf etdi. Şübhəsiz ki, O, bəli O, layiqincə eşidənin, layiqincə bilənin Özüdür.
35 Sonra bu qədər dəlili gördükdən sonra bir müddət onu zindana atmaları ortaya çıxdı.

***

36 Və zindana onunla birlikdə iki cavan oğlan da girdi. Onlardan biri: "Şübhəsiz mən, özümü şərab sıxarkən gördüm." dedi. O biri də: "Şübhəsiz, mən başımın üstündə çörək daşıdığımı, quşların da ondan yediyini gördüm. Bizə bunun təvilini (yozumunu) xəbər ver. Şübhəsiz ki, biz səni yaxşılıq / gözəllik edənlərdən görürük." dedi.
37-41 Yusuf: "Sizə veriləsi yemək gəlməmişdən öncə mən onun təvilini (yozumunu) sizə bildirərəm. Bu, Rəbbimin mənə öyrətdiyi şeylərdəndir. Şübhəsiz ki, mən, Allaha inanmayan bir camaatın *–ki, onlar axirəti bilərək rədd edənlərin; inanmayanların özləridir–* dinini, həyat tərzini tərk etdim. Və atalarım İbrahim, İshaq və Yəqubun dininə, həyat prinsipinə tabe oldum. Bizim, Allaha heç bir şeyi ortaq tutmağımız olmaz. Bu, Allahın bizə və insanlara bir nemətidir. Lakin insanların çoxu onlara verilən nemətlərin qarşılığını ödəmirlər. Ey mənim zindan yoldaşlarım! Ayrı-ayrı bir çox rəbblərmi daha xeyirlidir, yoxsa hər şeyə hakim və qalib olan bir tək Allahmı? Sizin, Onun altındakılardan ibadət etdikləriniz, sizin və atalarınızın uydurduğu bir neçə adlardan başqa bir şey deyildir. Bunlara ibadət etmək mövzusunda Allah heç bir dəlil nazil etməmişdir. Hökm ancaq Allaha aiddir: O, sizə, Özündən başqasına ibadət etməməyinizi əmr etdi. Bax bu, doğru / qoruyan dindir. Lakin insanların çoxu bilmirlər. Ey mənim zindan yoldaşlarım! Sizdən biriniz yenə ağasına şərab verəcək. Digəri də asılacaq [şəhər həyatından uzaqlaşdırılıb kənd təsərrüfatı işlərində işlədiləcək, daş karxanalarında işlədiləcək də] quşlar onu başından yeyəcəklər. Bax, haqqında fətva istədiyiniz iş gerçəkləşdi." dedi.
42 Və Yusuf o iki nəfərdən, qurtulacağını qəti olaraq bildiyi adama: "Ağa / hökmdar bildiyin adamın yanında məni yad et!" dedi. Sonra mənliyi ona xatırlatmağı tərk etdirdi. Beləcə, Yusuf, beş-on il zindanda qaldı.

***

43 Və hökmdar dedi ki: "Şübhəsiz ki, mən yeddi cılız inəyin yeddi kök inəyi yediyini və yeddi yaşıl sünbüllə yeddi quru sünbül görürəm. Ey əyanlar! Siz görüntü / görmə yoza bilirsinizsə, məni bu görüntü haqqında inandırıb aydınladın."

44 Əyanlar dedilər ki: "Qarmaqarışıq görüntülərdir. Biz isə belə qarmaqarışıq görüntülərin təvilini (yozumunu) bilmirik."
45 Və o ikidən (iki nəfərdən) qurtulmuş olan adam, iş işdən keçdikdən sonra yada salaraq dedi ki: "Mən sizə o görüntünün qəti olaraq nəyi ifadə etdiyini xəbər verərəm, dərhal məni göndərin."

***

46 "Yusuf! Ey doğru sözlü! İnsanların yanına məlumatlanaraq dönməyim və onların öyrənməsi üçün, 'Yeddi kök inəyi, yeddi cılız inək yeyir və yeddi yaşıl sünbüllə digər yeddi quru sünbül' haqqında bizə inandırıcı məlumat ver."
47-49 Yusuf dedi ki: "Yeddi il adət üzrə əkinçilik edəcəksiniz; hər cür qida məhsulunu yetişdirəcəksiniz, sonra da yetişdirdiyiniz məhsulları yeyəcəyiniz miqdar istisna olmaqla, qalanını sünbüldə saxlayın; ehtiyata yığın. Sonra da onun arxasından yeddi quraq il gələcək. Bu quraq illərdə, öncəki tədarüklərinizdən yeyəcəksiniz, az bir miqdar saxlayacaqsınız. Sonra da onun arxasından bir il gələcək ki, insanlar onda yağmura qovuşacaq və onda (o ildə) sıxıb sağacaqlar; zeytun yağı, üzüm suyu, bəkməz kimi qidaya da qovuşacaqlar; həyat normala dönəcək."

***

50 Və o hökmdar, "Onu mənə gətirin!" dedi. Sonra nə zaman ki, elçi Yusufun yanına gəldi, Yusuf ona dedi ki: "Ağanın yanına geri qayıt və ondan soruş görək, o əllərini kəsən qadınların zoru (problemi) nə imiş? Heç şübhə yox ki, Rəbbim, onların oyunlarını çox yaxşı bilir."
51 Hökmdar: "Yusufun nəfsindən kam almağa çalışdığınız zaman durum nə idi?" dedi. Qadınlar: "(Heyrət) doğrusu, Allah üçün, biz onun əleyhində (olacaq) heç bir pislik bilmədik" dedilər. Əzizin arvadı da: "İndi haqq və həqiqət olduğu kimi ortaya çıxdı. Onun nəfsindən mən kam almaq istədim. O isə şəksiz-şübhəsiz doğrulardandır.
52 *–Bax bu, Yusufun, kimsəsiz bir yerdə mənim ona xainlik (xəyanət) etmədiyimi və həqiqətən Allahın xainlərin hiyləsinə yol göstərən olmadığını bilməsi üçündür.–* 53 Və mən nəfsimi təmizə çıxartmıram. Şübhəsiz ki, nəfs, şiddətlə pisliyi əmr edəndir. Ancaq Rəbbimin rəhm etdiyi kimsə istisnadır. Şübhəsiz ki, Rəbbim çox bağışlayandır və çox mərhəmətlidir!" dedi.
54 Və hökmdar: "Onu mənə gətirin, onu özüm üçün (bir işə) təyin edim" dedi. Sonra onunla söhbətləşincə də: "Şübhəsiz ki, sən bu gün yanımızda gerçəkdən önəmli bir mövqe sahibisən, etibarlı bir şəxssən!" dedi.
55 Yusuf dedi ki: "Məni yer üzünün xəzinələri üzərinə görəvləndir. Şübhəsiz ki, mən, yaxşı qoruyan, çox yaxşı bilənəm."

56 *–Və Biz bax beləcə Yusuf üçün o yerdə iqtidar; ölkə yönətimi (ölkənin idarə edilməsi vəzifəsini) verdik. Harada istəsə orada qalırdı. Biz rəhmətimizi istədiyimizə nəsib edərik. Və yaxşılıq edənlərin mükafatını itirmərik.* 57 *Və iman edən və Allahın mühafizəsi altına daxil olan insanlar üçün əlbəttə axirət mükafatı daha xeyirlidir.–*

***

58 Yusufun qardaşları gəldilər, onun yanına daxil oldular. O, onları dərhal tanıdı, onlar isə onu tanımayan kimsələrdi.
59,60 Nə zaman ki, onların təchizatlarını hazırladı, "Atanızdan olan qardaşınızı mənə gətirin. Görürsünüz ki, mən ölçünü tam ölçürəm və mən qonaq qəbul edənlərin ən yaxşısıyam. Siz əgər onu mənə gətirməsəniz, bir daha sizə heç taxıl yoxdur, yanıma da yaxınlaşmayın!" dedi.
61 Onlar: "Onu atasından istəməyə çalışacağıq və şübhəsiz ki, biz (bunu) edənlərik" dedilər.
62 Və Yusuf məmurlarına: "Ailələrinin yanına dönüncə fərqinə varmaları və yenə gəlmələri üçün, sərmayələrini yüklərinin içinə qoyun!" dedi.

***

63 Beləcə, atalarının yanına döndükləri vaxt: "Ey atamız! Bizə taxıl qadağan edildi; bizə taxıl verilməyəcək. Onun üçün bu dəfə qardaşımızı bizimlə göndər ki, taxıl ala bilək. Və biz onu həqiqətən qoruyacağıq" dedilər.
64 Ataları dedi ki: "Mən onu sizə əmanət edərəmmi? Bundan öncə qardaşını; Yusufu əmanət etdiyim zaman (vəziyyət) başqa (idi)! Bax, Allah ən xeyirli qoruyandır. Və O, mərhəmət edənlərin ən mərhəmətlisidir."
65 Və yüklərini açdıqları zaman sərmayələrinin özlərinə qaytarıldığını gördülər. Dedilər ki: "Ey atamız! Daha nə istəyirik? Bax, sərmayələrimiz bizə qaytarılmış. Bununla ailəmizə taxıl alıb gətirərik, qardaşımızı da qoruyarıq, üstəlik bir dəvə yükü daha artıq taxıl alarıq. Bu aldığımız, çox asan / çox az bir taxıldır."
66 Ataları dedi ki: "Ətrafınız mühasirə edilmədiyi / hamınız çarəsiz qalmadığı təqdirdə, onu mənə həqiqətən gətirəcəyinizə dair Allaha and içib söz verməsəniz, onu qətiyyən sizinlə birlikdə göndərmərəm." Onlar atalarına təminat verincə, ataları: "Bu söylədiklərimizi Allah, müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək həyata keçirəndir" dedi.
67 Və dedi ki: "Ey balalarım! Bir qapıdan girməyin, ayrı-ayrı qapılardan girin. Mən, Allahdan (gələn) heç bir şeyi sizdən dəf edə bilmərəm. Hökm yalnızca Allahındır. Mən, nəticəni sadəcə Ona

tapşırdım. Artıq nəticəni buraxanlar da, nəticəni ancaq Ona buraxmalıdırlar."

***

68 Və nə zaman ki, şəhərə gəldilər, o zaman atalarının onlara əmr etdiyi şəkildə girdilər. Bu, onlar haqqında Allahdan (gələn) heç bir şeyin qarşısını ala bilməzdi, bu sadəcə Yəqubun öz içindən keçirdiyi bir istəyin gerçəkləşməsi oldu. Və şübhəsiz ki, o, ona öyrətdiyimiz üçün məlumat sahibi idi. Lakin insanların çoxu bilməzlər.
69 Və Yusufun yanına girdikləri vaxt, Yusuf, qardaşını yanına aldı: "Şübhəsiz, mən sənin qardaşının məhz özüyəm! Bax, buna görə onların etdiklərinə üzülmə!"
70 Sonra Yusuf onların önəmli əşyalarını, materiallarını (mallarını) hazırlayanda, su qabını qardaşının yükünün içinə qoydu. Sonra bir müəzzin; carçı səsləndi: "Ey karvan! Şübhəsiz ki, siz həqiqətən oğrusunuz!"
71 Karvandakılar onlara dönərək, "Nə itirmisiniz?" dedilər.
72 Görəvlilər dedilər ki: "Hökmdarın su qabını itirmişik və onu gətirənə bir yük taxıl var. Mən də buna zaminəm."
73 Karvandakılar: "Allaha and olsun ki, qəti surətdə, siz də bildiniz ki, biz, yer üzündə / burada fəsad törətmək üçün gəlmədik. Biz oğrular da deyilik." dedilər.
74 Görəvlilər: "Əgər yalançılarsınızsa, oğurluq edənin cəzası nədir?" dedilər.
75 Karvandakılar dedilər ki: "Onun cəzası, kimin yükündən çıxarsa, məhz özü, onun (bu işin) cəzasıdır / onu tutub saxlayarsınız, (bu işin) cəzasını özü ödəyər. Biz səhv; öz zərərinə olan əməli işləyənlərə bax belə cəza veririk."
76 Belə olduqda, Yusuf, qardaşının qabından öncə onların qablarını axtarmağa başladı. Sonra su qabını qardaşının qabının içindən çıxartdı. Bax Yusufa Biz belə bir oyun öyrətdik.[217] Məlikin dinində / ölkənin qanunlarında, qardaşını tutub saxlamasına imkan yoxdu. *–Ancaq Allah (bunu) diləsə, o başqa. Biz istədiyimiz kəsləri dərəcələrlə yüksəldərik. Və hər bilik (məlumat) sahibinin üstündə, bir daha yaxşı bilən vardır.–*
77 Karvandakılar dedi ki: "Əgər o, yükündə su qabı tapılmasıyla oğru olursa, o zaman onun qardaşlarından hər hansı biri də; yəni bizdən birimiz də, daha əvvəl buğda əvəzi olaraq ödədiyimiz pullarımızın məmləkətimizə çatdığımızda yükümüzdə çıxmasıyla qətiliklə oğru olmuş olur. Halbuki bunun belə olmadığı qəbul edilmişdir, kimsə bizdən birimizi oğurluqla təqsirləndirməmişdir, bizə yenə buğda verilmişdir. Bu vəziyyətdə qardaşımız oğurluqla təqsirləndirilə bilməz."

O vaxt Yusuf olub bitəni gizlədirdi və onlara bu mövzuda açıqlama etmədi, “Siz çox pis bir mövqedəsiniz, səciyyələndirdiyiniz şeyi Allah ən yaxşı biləndir.” dedi.

**78** Onlar dedilər ki: “Ey Əziz! Şübhəsiz ki, bunun çox yaşlı bir atası var. Onun üçün, onun yerinə bizim birimizi al. Şübhəsiz, Biz səni yaxşılıq edənlərdən görürük.”

**79** Yusuf dedi ki: “Əşyamızı kimin yanında tapmışıqsa, ondan başqasını tutmaqdan / saxlamaqdan Allaha sığınırıq. Şübhəsiz ki, biz elə etsək həqiqətən səhv; öz zərərinə olan əməli işləyənlərdən olarıq.”

**80-82** Artıq nə zaman ki, ondan ümidi kəsdilər, o zaman pıçıldaşaraq bir yana çəkildilər. Onların böyüyü dedi: “Atanızın sizdən Allah adına əhd aldığını və daha öncə Yusuf mövzusunda həddi aşdığınızı bilmirsinizmi? Atam mənə izn verənə və ya Allah mənim barəmdə bir hökm verənə qədər mən artıq buradan ayrılmaram. Və Allah, hökm verənlərin ən xeyirlisidir. Siz qayıdıb atanıza deyin ki: Ey atamız! Şübhəsiz oğlun oğurluq etdi / oğurluqla təqsirləndirildi. Biz də ancaq bildiyimizə şahidlik etdik. Və biz görülməyənin, eşidilməyənin, hiss edilməyənin mühafizəçisi deyilik. Həm içində olduğumuz şəhər (əhalisindən) və içlərində (birlikdə) gəldiyimiz karvandan soruş. Və şübhəsiz ki, biz həqiqətən doğru kimsələrik.”

***

**83** Ataları dedi ki: “Əksinə, nəfsləriniz sizi aldadıb bir işə sürükləmişdir. Artıq gözəl bir səbr! Ümid edirəm ki, Allah üçünü [Yusufu, kiçik qardaşını və böyük qardaşını] birdən mənə gətirər. Şübhəsiz ki, O, ən yaxşı bilənin, haqsızlıq və fəsadı əngəlləmək üçün qoyulmuş qanun, düstur və prinsipləri qoyanın Özüdür.”

**84** Və Yəqub onlardan üz çevirdi. Və “Vay Yusufa olan həsrətim, vay!” dedi. Və üzüntüdən iki gözü dümağ oldu [saralıb soldu, dərbədər oldu]. Artıq Yəqub, elə hey udqunan; dərdini içində tutan biri idi.

**85** Dedilər ki: “Allaha and olsun ki, sən elə hey Yusufu xatırlayırsan. Axırda əriyib gedəcəksən yaxud dəyişikliyə / məhvə məruz qalanlardan olacaqsan.”

**86,87** Yəqub dedi ki: “Mən, içimi doldurub daşan həsrətimi, kədərimi Allaha şikayət edirəm. Və mən Allah tərəfindən sizin bilmədiyiniz şeyləri bilirəm. Ey oğullarım! Gedin Yusufu və qardaşını araşdırın (bir xəbər bilin). Allahın verəcəyi fərahlıqdan (qurtuluşdan) ümid kəsməyin, həqiqətən kafirlər; [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] topluluğundan başqası Allahın verəcəyi fərahlıqdan (qurtuluşdan) ümid kəsməz.”

***

**88** Sonra Yusufun hüzuruna girincə, dedilər ki: “Ey Əziz! Bizə və

əhlimizə (ailəmizə) sıxıntı toxundu. Və biz az bir sərmayə ilə gəldik. Sən bizə yenə (bütöv) ölçü ver. Və bizə sədəqə də ver. Şübhəsiz ki, Allah sədəqə verənlərə qarşılıqlar verər."

**89** Yusuf dedi ki: "Siz cahil olarkən Yusufa və qardaşına nələr etdiyinizi bilirsinizmi?"

**90** Yusufun qardaşları: "Yoxsa sən, həqiqətən də Yusufsan?" dedilər. Yusuf: "Mən Yusufam, bu da qardaşımdır. Həqiqətən, Allah bizi nemətləndirdi. Şübhəsiz ki, kim Allahın mühafizəsi altına daxil olar və səbr edərsə, artıq heç şübhəsiz ki, Allah yaxşı-gözəl işlər görənlərin mükafatını itirməz." dedi.

**91** Onlar dedilər ki: "Allaha and olsun, Allah səni həqiqətən bizdən üstün etdi. Və biz həqiqətən xətalı idik."

**92,93** Yusuf dedi ki: "Bu gün sizə bir məzəmmət və danlaq yoxdur. Allah sizi bağışlasın. O, mərhəmət edənlərin ən mərhəmətlisidir. Bu köynəyimi götürün, atamın üzünə qoyun, o, qəbahətli / məsxərə edilən xəstəlikdən qurtulmuş hala gələr / dərbədərlikdən qurtular. Və bütün ailənizi mənə gətirin."

***

**94** Və nə zaman ki, karvan ayrıldı, ataları dedi ki: "Əgər mənə ağlını itirmiş qoca deməsəniz, şübhəsiz mən Yusufun qoxusunu alıram."

**95** Dedilər ki: "Vallahi, şübhəsiz sən hələ də o köhnə şaşqınlığındasan."

**96** Fəqət nə zaman ki, gerçəkdən muştuluqçu gəldi, köynəyi Yəqubun üzünə qoydu, dərhal qəbahətli / məsxərə edilən xəstəlikdən qurtulmuş hala gəldi: "Mən sizə demədimmi ki, mən Allahdan sizin bilmədiklərinizi bilirəm!" dedi.

**97** Dedilər ki: "Ey atamız! Bizim üçün günahlarımıza bağışlanma dilə. Şübhəsiz ki, biz xətalı idik."

**98** Yəqub dedi ki: "Sizin üçün Rəbbimdən irəlidə bağışlanma diləyəcəyəm. Şübhəsiz ki, O çox bağışlayanın, çox mərhəmət edənin Özüdür!"

***

**99** Nə zaman ki, onlar Yusufun yanına girdilər, bax o zaman Yusuf anasını və atasını qucaqladı, bağrına basdı, yanına aldı və "Allahın diləməsiylə güvən içində Misirə girin!" dedi.

**100** Və anasıyla atasını yüksək bir taxt üzərinə yüksəltdi. Və hamısı boyun əyib təslimiyyət göstərərək onun üçün yerə qapandılar. Və Yusuf: "Atacan! Bax bu hal, o gördüyümün təvilidir (yozumudur). Gerçəkdən, Rəbbim onu həqiqətə çevirdi. Şeytan mənimlə qardaşlarımın arasını pozduqdan sonra, məni zindandan çıxarmaqla və sizi çöldən (səhradan) gətirməklə Rəbbim mənə həqiqətən ehsan

(yaxşılıq) etdi. Şübhəsiz ki, Rəbbim dilədiyi şeyə mükafat verəndir. Şübhəsiz ki, O, ən yaxşı bilən, hökm qoyanın Özüdür."
**101** –*"Rəbbim! Sən mənə hökmdarlıq verdin və mənə olacaqların / sözlərin ilk anlamlarının nə olacağına dair bilik (məlumat) öyrətdin. Göyləri və yeri yoxdan var edən! Sən mənim dünya və axirətdə yardım edənim, qoruyanımsan, mənim canımı müsəlman olaraq al və məni salehlər arasına qat!"*–
**102** Bax bu, sənə vəhy etdiyimiz görmədiyinin, eşitmədiyinin, bilmədiyinin xəbərlərindəndir. Yoxsa, onlar edəcəklərinə qərar verib pis (işlər üçün) plan qurarkən, sən onların yanında deyildin.
**103** Sən şiddətlə arzulasan da, insanların çoxu iman edən deyildir.
**104** Və sən buna qarşılıq onlardan hər hansı bir muzd istəmirsən. Quran, aləmlərə sadəcə bir öyüddür.
**105** Və göylərdə və yerdə neçə əlamətlər / işarətlər var, onlar ondan üz
çevirən kimsələr olaraq üzərlərindən keçib gedərlər. **106** Onların çoxu,
ortaq qoşmadan Allaha iman etməzlər.
**107** Yoxsa bunlar, Allahın əzablarından hamısını bürüyəcək bir fəlakətin gəlməsindən və ya fərqində olmadıqları halda, qəflətən onlara saatın / qiyamətin qopma anının gəlməsindən güvəndədirlərmi?
**108** De ki: "Bax bu, mənim yolumdur; ağlın, biliyin, sağlam düşüncənin tələbi olaraq Allaha dəvət edirəm. Mən və mənə tabe olanlar… Və Allah pakdır. Və mən ortaq qoşanlardan deyiləm. "
**109** Və Biz səndən öncə də yalnızca şəhərlərin öz əhalisindən (olan), özlərinə vəhy etdiyimiz bir neçə yetkin adamları elçi olaraq göndərdik. İndi o yerlərdə bir gəzib dolaşmadılarmı? Özlərindən öncə gəlib-keçənlərin aqibətinin necə olduğuna bir baxsalar! Əlbəttə axirət yurdu Allahın mühafizəsi altına daxil olan kəslər üçün daha xeyirlidir. Hələ də ağlınızı işlətməyəcəksiniz?
**110** Nəhayət elçilər ümid kəsəcək hala düşüncə və özlərinin yalanlandıqları qənaətinə gəlincə, onlara yardımımız gəldi. Sonra da dilədiklərimiz qurtarıldı. Və günahkarlar topluluğundan Bizim əzabımız geri çevrilə bilməz.
**111** And olsun ki, Yusufun, atasının, qardaşlarının qissəsində anlayış qabiliyyəti olanlar üçün bir ibrət vardır.
Quran, uydurulan bir söz deyildir. Ancaq sadəcə içindəkilərin təsdiqi, inananlar üçün hər şeyin müfəssəl açıqlaması, bir yol göstərən və rəhmətdir." (53/12, Yusuf / 1-111)

# HİCR (54 – 15) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 196

1 Əlif / 1, Lam / 20, Ra / 200.[218] Bunlar Kitabın və açıq-aşkar / açıqlayan bir Quranın ayələridir.

2 Zaman-zaman kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] "Kaş ki, müsəlman olsaydıq!" istəyində olacaqlar.

12 Beləliklə, Biz Quranı, günahkarların qəlblərinə soxarıq.[219]

3 Qoy onlar yesinlər, faydalansınlar və boş ümid onların başını qatsın. Amma onlar tezliklə biləcəklər.

4 Və Biz heç bir məmləkəti bilinən bir kitabı olmadan dəyişikliyə / məhvə məruz qoymadıq.

5 Heç bir ümmət, vaxtın sonunu (möhləti) tezləşdirə və gecikdirə bilməz.

6,7 Və onlar: "Ey özünə Öyüd / Quran nazil edilən adam! Şübhəsiz ki, sən gizli güclərlə dəstəklənən / dəli birisən. Əgər doğrulardansansa, bizə mələklər ilə gəlməliydin" dedilər.

8 Biz o təbii gücləri, ancaq haqq ilə endiririk. O vaxt da onlar möhlət verilənlərdən olmazlar.

9 Heç şübhəsiz Biz, o Öyüdü / Quranı Biz nazil etdik, Biz. Və həqiqətən Biz, onun üçün qoruyucularıq.[220]

10 Və and olsun ki, Biz səndən öncə keçmiş topluluqlara da elçilər göndərdik.

11 Və onlara hər hansı bir elçi gəlsə, mütləq onunla istehza edərdilər.

13 Onlar endirilən kitaba / göndərilən elçiyə inanmazlar, halbuki, əvvəlkilər ilə əlaqəli qanunumuz / tətbiqimiz olub-keçmişdir, sizə bildirilmişdir.

14,15 Və Biz, onların üzərlərinə göy üzündən bir qapı açsaq və onlar oradan yuxarı yüksəlsələr belə, həqiqətən "Gözlərimiz döndərildi / bulandırıldı. Əslində biz ovsunlanmış bir topluluğuq" deyəcəklər.

(54/15, Hicr / 1-15)

## Nəcm: 197

16 And olsun, Biz, göydə bir neçə bürclər yaratdıq və baxanlar üçün onu süslədik (bəzədik).

17,18 Və kosmosu, az da olsa vəhyə qulaq asan, onları alov sütunu təqib edənlər / raketlərlə kosmosa gedənlər xaric, bütün düşüncə qabiliyyətlərindən qoruduq.[221]

**19** Yer üzünü də yaydıq və oraya möhkəm dayaqlar / dağlar yerləşdirdik. Və yer üzündə ölçülmüş hər şeydən bitkilər bitirdik.

**20** Və yer üzündə sizin üçün və sizin ruziləndirmədiyiniz kimsələr üçün dolanışıq yollarını yaratdıq / Və yer üzündə sizin üçün bir neçə dolanışıq yolları və sizin ruziləndirmədiyiniz kimsələr yaratdıq.

**21** Və hər şeyin xəzinələri yalnız Bizim yanımızdadır. Və Biz, onu ancaq müəyyən bir ölçü ilə endiririk.

**22** Və Biz küləkləri aşılayıcı (tozlandıran) olaraq göndərdik və göydən bir su endirib sizi onunla suladıq. Suyu xəzinələrdə tutanlar / yığıb saxlayanlar da siz deyilsiniz.

**23** Və yalnızca Biz, əlbəttə, dirildirik və Biz öldürürük! Və sonuncu sahib olan da Bizik.

**24** Və and olsun ki, Biz sizlərdən önə keçmək istəyənləri bilmişik və and olsun ki, Biz, geri qalmaq istəyənləri də bilmişik.

**25** Və şübhəsiz, sənin Rəbbin onları toplayanın Özüdür. Şübhəsiz ki, O, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, ən yaxşı biləndir. (54/15, Hicr / 16-25)

## Nəcm: 198

**26,27** Və and olsun ki, Biz insanı; görünən, bilinən varlıqları cingildəyən gildən, işlənə bilən (forma verilə bilən) palçıqdan / haldan hala düşən bir maddədən yaratdıq. Və cannı; görünməz varlıqları[222] da daha öncə, ən incə dəlikdən belə keçə bilən, yandıran bir əsintinin atəşindən / əngəl tanımayan enerjidən yaratmışdıq. (54/15, Hicr / 26-27)

## Nəcm: 199

**28,29** Və bir zamanlar Rəbbin kainatdakı güclərə, "Mən, quru palçıqdan, şəkil verilmiş / işlənə bilən (forma verilə bilən) bir palçıqdan bir bəşər yaradacağam. Mən, ona şəkil (surət) verdiyimdə və onu bilikləndirdiyimdə,[223] siz dərhal ona təslimiyyət göstərənlər olaraq yerlə bir olun; heçləşin (heç olun)" demişdi.

**30,31** Belə olduqda, İblis / düşüncə qabiliyyəti xaric, mələklərin / kainatdakı güclərin hamısı birlikdə boyun əyib təslimiyyət göstərdilər. O, boyun əyib təslimiyyət göstərənlər ilə bərabər olmağa qarşı çıxıb, (itaət) etmədi.

**32** Allah dedi ki: "Ey İblis! Sənə nə olur ki, boyun əyib təslimiyyət göstərənlərlə olmursan?"

**33** İblis cavab olaraq: "Quru palçıqdan, şəkil verilmiş / işlənə bilən (forma verilə bilən) bir palçıqdan yaratdığın bir bəşərə boyun əyib

təslimiyyət göstərmək üçün yaradılmadım” dedi.

**34,35** Allah: “Elə isə oradan çıx! Sən, artıq həqiqətən qovulmuş, məhv olmuş birisən və həqiqətən Din gününə qədər qovulma (uzaq tutulma) sadəcə sənin üzərindədir” dedi.

**36** İblis, “Ey Rəbbim! Elə isə onların yenidən diriləcəkləri günə qədər məni qarşında tut / mənə möhlət ver!” dedi.

**37,38** Allah: “Elə isə sən həqiqətən məlum vaxtın gününə qədər qarşıda tutulanlardansan / möhlət verilənlərdənsən” dedi.

**39,40** İblis dedi ki: “Ey Rəbbim! Sən məni, insanları azdırmaq üçün yaratdığın səbəblə həqiqətən mən də yer üzündə, hər şeyi onlara süsləyəcəyəm (gözəl göstərəcəyəm) və təmizlənmiş qulların xaric, onların hamısını mütləq azdıracağam!”

**41-44** Allah dedi ki: “Bax bu, Mənim üzərimə götürdüyüm doğru bir yoldur. Sənə uyan azğınlardan başqa, qullarımın üzərində heç bir məcburedici gücün yoxdur. Şübhəsiz ki, onların hamısına vəd edilən yer də cəhənnəmdir. Onun üçün yeddi qapı vardır. O qapıların hər biri üçün onlardan bir bölük (dəstə) ayrılmışdır.”[224] (54/15, Hicr / 28-44)

## Nəcm: 200

**45,46** Şübhəsiz ki, Allahın mühafizəsi altına daxil olan kəslər cənnətlərdə və çeşmə (başında) olacaqlar: “Salamatlıqla, güvən içində oraya girin!”

**47** Və Biz Allahın mühafizəsi altına daxil olan kəslərin sinələrindəki kinləri çıxarıb atdıq. Onlar qardaşlar halında, üz-üzə divanlara (taxtlara) otururlar.

**48** Cənnətdə onlara heç bir yorğunluq toxunmaz. Onlar oradan çıxarılacaq da deyillər. (54/15, Hicr / 45-48)

## Nəcm: 201

**49,50** Qullarıma heç şübhəsiz Mənim çox bağışlayan və çox mərhəmət edənin Özü olduğumu, Mənim əzabımın da, çox ağrılı bir əzabın özü olduğunu vacib olaraq xəbər ver.

**51** Və qullarıma, İbrahimin qonaqlarından xəbər ver.[225]

**52** Bir vaxt İbrahimin qonaqları, İbrahimin yanına girdilər və “Salam!” demişdilər. İbrahim: “Şübhəsiz ki, biz sizdən qorxuruq” demişdi.

**53** İbrahimin qonaqları: “Qorxma! Şübhəsiz ki, biz sənə çox bilikli bir oğul müjdələyirik!” dedilər.

**54** İbrahim dedi ki: “Mənə qocalıq gəlmişkənmi, məni

müjdələyirsiniz? Yaxşı, nəyə əsaslanaraq məni müjdələyirsiniz?”

**55** İbrahimin qonaqları: “Səni gerçəklə müjdələyirik. Ümidini kəsənlərdən olma!” dedilər.

**56** İbrahim dedi ki: “Rəbbimin rəhmətindən, azğınlardan başqa kim ümid kəsər?”

**57** İbrahim: “Ey göndərilmiş elçilər! Sizin işiniz nədir?” dedi.

**58-60** Elçilər: “Şübhəsiz ki, biz günahkar bir camaata göndərildik. Ancaq Lutun ailəsi istisnadır.” *–Şübhəsiz Biz, Lutun zövcəsindən başqa onların hamısını mütləq qurtaracağıq. Biz ayarladıq (nizamladıq). Şübhəsiz ki, o, həqiqətən geridə qalanlardan / gözü arxada olanlardandır.–*

**61,62** Sonra elçilər Lutun ailəsinin yanına gəldikdə, Lut: “Həqiqətən, siz qeyri-adi, kimliyi bəlli olmayan bir dəstəsiniz” dedi.

**63-65** Elçiler dedilər ki: “Tam əksinə, biz sənə onların şübhə duyduqları şeyi gətirdik. Və sənə gerçəyi gətirdik və biz əlbəttə doğru olanlarıq. Dərhal gecənin bir vaxtı ailəni yola çıxar, sən də onların arxasınca get. Və sizdən heç kimsə vaxt itirməsin / geridə qalanları fikirləşməsin, sizə əmr olunan yerə doğru gedin.”

**66** -Və Biz, Luta əmri gerçəkləşdirdik: “Şübhəsiz ki, səhərə çıxarkən bunların arxaları (kökü) kəsilmiş olacaqdır.”-

**67** Və şəhər əhalisi sevinərək gəldilər.

**68,69** Lut: “Şübhəsiz ki, bunlar mənim qonaqlarımdır, o səbəblə məni rüsvay etməyin və Allahın mühafizəsi altına daxil olun və məni alçaltmayın!” dedi.

**70** Onlar: “Biz səni aləmlərdən; ətrafla əlaqələrdən uzaqlaşdırmamışdıqmı?” dedilər.

**71** Lut: “Bax bunlar mənim qızlarımdır![226] Əgər edəcəksinizsə…” dedi.

**72** *–Sən ömründə bunlar kimi şəhvət çılğınlığı içində çaşıb qalmış rəzil adamları heç görmədin. –*

**73** Günəş doğarkən, o qorxunc çığlıq onları yaxaladı.

**74** Beləliklə, Biz, onların üstünü altına çevirdik və üzərlərinə palçıqdan bişirilmiş daşlar yağdırdıq.

**75** Şübhəsiz, bunda, izdən, imzadan anlayanlar; düşünən kəskin (dərin) anlayışlılar üçün həqiqətən əlamətlər / işarətlər vardır.

**76** Və şübhəsiz, Lut qövmünün olduğu şəhərin xarabalıqları, həqiqətən bir yol üzərində qalmaqdadır.

**77** Şübhəsiz ki, bunda iman edənlər üçün həqiqətən bir əlamət / işarət

vardır.

**78,79** Əykə əhli[227] də həqiqətən şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kəslər idi və Biz onlardan intiqam aldıq / tutub cəzalandırmaq surətiylə ədaləti yerinə yetirdik. İkisi də; Əykə və Lut qövmü açıq bir yol üzərindədir.

**80** And olsun ki, Hicr əhli da elçiləri yalanladılar.

**81** Və Biz, onlara ayələrimizi / əlamətlərimizi / işarətlərimizi
vermişdik və onlar isə onlardan üz çevirirdilər. **82** Və onlar dağlardan
möhkəm və təhlükəsiz evlər yonturdular.

**83,84** Beləliklə, onları da səhər çağı qorxunc bir çığlıq yaxaladı. Beləcə, qazanmaqda olduqları şeylər, onlardan heç bir şeyi dəf etmədi.

(54/15, Hicr / 49-84)

## Nəcm: 202

**85** Və Biz göyləri, yeri və onların arasındakı şeyləri ancaq haqq / gerçək ilə yaratdıq və əlbəttə ki, o qiyamət, həqiqətən qopacaqdır. İndi sən fikir vermə və gözəl rəftar et.

**86** Şübhəsiz, Rəbbin layiqincə yaradandır və ən yaxşı biləndir.

**87** And olsun ki, Biz sənə qatbaqat neçə nemətləri və böyük Quranı verdik.

**88,89** Əsla onlardan bəzi kimsələrə verdiyimiz və onları onunla faydalandırdığımız şeylərə; mal və sərvətə həvəslənib gözlərini dikmə. Onlar haqqında üzülmə də… Sən qanadlarını möminlərin (üstünə) sər. Və: "Şübhəsiz, mən açıq-aşkar bir xəbərdarlıq edənin özüyəm" de.[228]

**94-96** İndi sən əmr olunduğun şeyləri açıq-aşkar bildir (təbliğ et) və ortaq qoşanlardan məsafə saxla. Şübhəsiz ki, Biz, Allah ilə birlikdə başqasını ilah qəbul edən bu istehzaçı kimsələrə (məsxərəçilərə) qarşı sənə yetərik (kifayət edərik). Artıq onlar yaxında biləcəklər.

**97** And olsun, Biz bilirik ki, həqiqətən onların söylədiklərinə sənin ürəyin qısılır.

**98,99** O halda sənə "yəqin / qəti məlumat" gəlməsi üçün Rəbbinin tərifi ilə birlikdə Onu nöqsan sifətlərdən pak tut, boyun əyib təslimiyyət göstərənlərdən ol və Rəbbinə qulluq et![229] (54/15, Hicr / 85-89, 94-99)

# ƏNAM (55 – 6) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 203

1 Bütün təriflər, göyləri və yeri yaradan, zülmətləri və nuru var edən Allaha məxsusdur; başqasını tərifləmək olmaz. Sonra da Allahın ilah və rəbb olduğunu qəbul etməyən o insanlar, bəzi şeyləri Rəblərinə bərabər / tay tuturlar.
2 O, sizi bir palçıqdan yaratmış olandır. Sonra "vaxtın sonunu" gerçəkləşdirmişdir. Və müəyyən edilmiş vaxtın sonu, Onun qatındadır. Sonra siz yenə də şübhə edirsiniz.
3 Və O, göylərdəki və yerdəki Allahdır. O, gizlininizi və aşkarınızı bilir. Qazandığınız şeyləri də bilir. (55/6, Ənam / 1-3)

## Nəcm: 204[230]

4 Onlar isə, Rəblərinin ayələrindən bir ayə gələn kimi mütləq ondan məsafə saxlayıb uzaq durmuşdular.
5 Sonra da onlar, özlərinə haqq gəldikdə onu həqiqətən yalanladılar. Artıq istehza etdikləri şeylərin vacib xəbərləri yaxında onlara gələcəkdir.
6 Görmədilərmi ki, Biz, onlardan öncə yer üzündə sizə vermədiyimiz bütün imkanları verdiyimiz, göy üzünü üzərlərinə bərəkətlərlə göndərib altlarından çaylar axıtdığımız neçə-neçə nəsilləri dəyişikliyə / məhvə məruz qoyduq?! Biz onları günahlarına görə dəyişikliyə / məhvə məruz qoyduq və onların ardınca başqa bir nəsil yaratdıq.
7 Və Biz, əgər ki, sənə papirusa / kağıza yazılı bir kitab nazil etmiş olsaq, onlar da əlləri ilə ona toxunsaydılar, həqiqətən o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş olan o kəslər]: "Bu, açıq-aşkar sehrdən başqa bir şey deyildir" deyərdilər.
8 Və onlar, "Bu Peyğəmbərə bir mələk endiriləydi də!" dedilər. Əgər Biz, bir mələk endirmiş olsaydıq, iş, həqiqətən bitirilmiş olardı. Sonra da onlara göz açmağa belə imkan verilməzdi.
9 Əgər Biz, Peyğəmbəri bir mələk etsəydik, yenə də onu bir adam şəklində edərdik və onlar yenə də düşdükləri şübhəyə düşərdilər.
10 Və heç şübhəsiz, səndən öncə də elçilər ilə istehza edildi. Sonra da onlardan istehza edən kəsləri istehza etdikləri şey bürüdü.
11 De ki: "Yer üzündə gəzin-dolaşın, sonra da yalanlayanların aqibətinin necə olduğuna bir baxın!"
12 De ki: "Göylərdə və yerdə olanlar kimin üçündür?" De ki: "Allah üçündür." Allah, rəhməti Öz Zatı üzərinə yazmışdır. Sizi mütləq, gerçəkləşməsində əsla şübhə olmayan qiyamət günündə toplayacaqdır. Öz özlərini zərərə salan kimsələr, bax onlar iman etməzlər.

13 Və gecədə, gündüzdə mövcud olan hər şey Onundur. O, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
14 De ki: "Göyləri və yeri yoxdan var edən, bəsləyən, lakin Özü bəslənməyən Allahdan başqa yardım edən, qoruyan, yol göstərən bir yaxınmı qəbul edim?" De ki: "Mənə İslam əhlinin (müsəlmanların) ilki olmaq əmr edildi." Və sən əsla Allaha ortaq qoşanlardan olma!
15 De ki: "Həqiqətən mən, əgər Rəbbimə asi olsam, böyük bir günün əzabından qorxaram."
16 Kim ki, ortaq qoşmaqdan / üsyan etməkdən döndərilərsə, şübhəsiz, Allah o gün, ona rəhmət etmişdir. Və bax bu, açıq-aşkar qurtuluşdur.
17 Və əgər Allah sənə bir zərər toxundurarsa, onu Özündən başqa açacaq (bir kəs) yoxdur. Və əgər O, sənə bir xeyir toxundursa, şübhəsiz, O, hər şeyə qadirdir.
18 Və O, qullarının üstündə / daha üstün olaraq, üsyan edən kimsələri qəhr edəndir. Və O, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, hər şeyin iç üzünü / gizli tərəflərini də yaxşı biləndir.
19 De ki: "Şahidlik baxımından hansı şey daha böyükdür?" De ki: "Mənimlə sizin aranızda Allah şahiddir. Və sizi və (ona) çatan hər kəsi onunla xəbərdar edim deyə, mənə bu Quran vəhy olundu. Allahla bərabər başqa ilahlar olduğuna siz gerçəkdən şahidlik edə bilərsinizmi?" De ki: "Mən etmərəm." De ki: "O, ancaq və ancaq bir tək ilahdır və həqiqətən mən, sizin ortaq tutduğunuz şeylərdən uzağam."
20 Özlərinə Kitab verdiyimiz bu kimsələr, Peyğəmbəri, öz oğullarını bildikləri kimi bilirlər. Öz nəfislərini ziyana uğradan bu kimsələr, bax onlar iman etməzlər.
21 Və Allaha qarşı yalan uydurandan və ya ayələrini yalanlayandan daha yanlış davranan; öz zərərinə əməl edən kim ola bilər? Heç şübhə yox ki, şirk qoşaraq yanlış davranan; öz zərərlərinə olan əməli işləyən bu kimsələr qurtuluşa yetişməzlər.
22 Və o gün hamısını toplayacağıq. Sonra Biz, ortaq qoşan kimsələrə: "Hanı, haradadır o həqiqətə zidd olaraq inandığınız ortaqlarınız?"
deyəcəyik. 23 Sonra, onların atəşlərə atılmaları, "Rəbbimiz Allaha and olsun ki, 'Biz ortaq qoşanlardan deyildik'." deməkdən başqa bir şey deyildi.
24 Bax, özlərinin əleyhində necə yalan söylədilər! O uydurduqları şeylər də onlardan ayrılıb qeyb oldu.
25 Onlardan səni dinləyənlər də var; halbuki Biz, onu qavrayıb anlamalarına (mane olmaq üçün), qəlbləri üzərinə qat-qat örtüklər və qulaqlarında bir ağırlıq yaratdıq. Onlar, bütün əlamətləri / işarətləri

görsələr də, ona inanmazlar. Belə ki, o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr], sənin yanına gəldiklərində səninlə mübahisəyə girərək: “Bu, öncəkilərin uydurma nağıllarından başqa bir şey deyildir” deyərlər.
**26** Və onlar, ondan (Qurandan) uzaqlaşdırarlar və özləri də ondan (Qurandan) uzaq durarlar. Və onlar şüursuzca, yalnızca özlərini dəyişikliyə / məhvə məruz qalmağa doğru sürükləyirlər.
**27** Və onların, atəşin üzərində saxlanıldıqları zaman: “Ah, nə olardı, biz dünyaya qaytarılsaydıq, Rəbbimizin ayələrini yalanlamasaydıq və möminlərdən olsaydıq!” dediklərini bir görsən!
**28** Əksinə, işin əsli, daha öncə gizləyib durduqları açığa çıxdı. Geri qaytarılsaydılar, (daha əvvəl onlara) qadağan edilən şeyə həqiqətən yenidən qayıdardılar. Bəli, onlar həqiqətən, yalançıdırlar.
**29** Və onlar, “Bizim bu fani dünya həyatımızdan başqa bir həyat yoxdur, biz dirildiləsi də deyilik” demişdilər.
**30** Və Rəblərinin hüzurunda saxlanıldıqları zaman onları bir görsən! Rəbləri: “Bu, bir həqiqət deyil, eləmi?” deyər. Onlar: “Rəbbimizə and olsun ki, həqiqətdir” deyərlər. Rəbləri: “Elə isə küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş] olduğunuz üçün dadın əzabı!” deyər.
**31** Allaha qovuşmağı yalanlayanlar, həqiqətən itkiyə / zərərə məruz qalıb iztirab çəkmişlər. Qiyamət anı qəflətən gəldikdə, onlar günahları bellərinə yüklənmiş olaraq deyəcəklər ki: “Dünyada etdiyimiz təqsirlərə görə vay olsun bizə!” *–Diqqət edin, yüklənib durduqları (şey) / günahları necə də pisdir!–*
**32** Və bəsit dünya həyatı, sadəcə əyləncə və oyundur. Son yurd / Axirət yurdu isə, Allahın mühafizəsi altına daxil olanlar üçün həqiqətən daha xeyirlidir. Hələ də ağlınızı işlətməyəcəksinizmi?
**33** Biz onların söylədiklərinin səni həqiqətən üzdüyünü əlbəttə bilirik. Amma onlar əslində səni yalanlamırlar; amma şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələr Allahın ayələrini bilə-bilə rədd edirlər.
**34** Və əlbəttə ki, səndən öncə də elçilər yalanlanmışdı və özlərinə yardımımız gələnə qədər (onlar) yalanlanmağa və əziyyət olunmağa səbr etmişdilər. Və Allahın sözlərini dəyişdirəcək heç bir kimsə yoxdur. Heç şübhəsiz ki, sənə, elçilərin xəbərlərindən bir qismi gəlib çatmışdır.
**35** Və əgər onların üz çevirməsi sənə ağır gəldisə, haydı, gücün çatırsa yerin içində bir dəlik, ya da göydə bir nərdivan axtar və onlara bir əlamət / işarət gətir! Allah istəsəydi, həqiqətən onları doğru yol göstərən (kitabın) üzərində toplayardı. O halda, qətiyyən cahillərdən

olma!
**36** Ancaq eşidənlər qarşılıq verər. Ölüləri; onları da Allah diriltdir. Sonra yalnızca Ona döndərilərlər.
**37** Və onlar dedilər ki: "(Məgər) ona Rəbbindən bir əlamət / işarət endirilməli deyildimi?" De ki: "Şübhəsiz ki, Allah bir əlamət / işarət endirməyə qadirdir, lakin onların çoxu bilməzlər."
**38** Və yer üzündə heç bir irili-xırdalı hərəkət edən canlı və iki qanadıyla uçan heç bir quş yoxdur ki, sizin kimi öndərli topluluqlar olmasın. Biz Kitabda heç bir şeyi nöqsan / yetərsiz buraxmadıq. Sonra onlar Rəblərinin hüzuruna toplanacaqlar.
**39** Ayələrimizi yalanlayan bu kimsələr də qaranlıqlar içindəki kar və dilsizlərdir (lallardır). Hər kim istəyərsə Allah onu çaşdırar (çaşqın vəziyyətə salar), kim də istəyərsə, onu doğru yol üzərinə buraxar.
**40** De ki: "Özünüzü heç düşündünüzmü, Allahın əzabı sizə gəlsə və ya qiyamət vaxtı gəlsə, Allahdan başqasınamı yalvararsınız? *–Əgər doğru kimsələrsinizsə.–*
**41** Əslində yalnızca Allaha yalvararsınız və O, istəyərsə, yalvardığınız şeyi (aradan) qaldırar və siz ortaq qoşduğunuz şeyləri ağzınıza almazsınız."
**42** Və and olsun ki, səndən öncəki başçısı olan cəmiyyətlərə elçilər göndərdik və onları yalvarsınlar deyə dözülməz çətinlik; yoxsulluq və sıxıntılarla əhatə etdik.
**43** Onlara çətin əzabımız gəldiyi zaman yalvarmalı deyildilərmi? Amma onların qəlbləri sərtləşdi və şeytan onlara etməkdə olduqları şeyləri cazibədar göstərdi.
**44** Beləliklə, onlara xatırladılanı tərk etdiklərində, onların üzərlərinə hər şeyin qapılarını açdıq. Belə ki, özlərinə verilən şeylərlə 'sevincə qapılıb həddi aşınca', onları heç gözləmədikləri bir vaxtda qəflətən yaxaladıq. Artıq onlar, ümidləri suya düşənlərdilər.
**45** Beləliklə şirk qoşaraq, küfr edərək səhv; öz zərərinə olan əməli işləyən topluluğun kökü kəsildi. *–Və bütün təriflər aləmlərin Rəbbi Allahadır; başqasını tərifləmək olmaz.–*
**46** De ki: "Heç düşündünüzmü, əgər Allah sizin eşitmə və görmə qabiliyyətinizi alsa və qəlblərinizi möhürləyərsə, onları sizə Allahdan başqa gərtirə biləcək ilah kimdir?" Bax gör, Biz ayələri necə açıqlayırıq. Sonra da onlar arxa çevirib əngəlləyirlər (qadağan edirlər)?
**47** De ki: "Özünüzü heç düşündünüzmü, Allahın əzabı sizə qəflətən və ya aşkar gələrsə, şirk qoşaraq yanlış davranan; öz zərərlərinə olan əməli işləyən camaatdan başqasımı dəyişikliyə / məhvə məruz qalacaq?"
**48** Və Biz göndərilən elçiləri, ancaq müjdəçilər və xəbərdar edicilər

olaraq göndərərik. Artıq kim iman edər və düzəldərsə, artıq onlara heç
bir qorxu yoxdur. Onlar qəm-qüssə də görməyəcəklər.
**49** Ayələrimizi yalanlayanlara da, haqq yoldan çıxdıqları üçün əzab
toxunacaqdır.
**50** De ki: "Mən sizə 'Allahın xəzinələri mənim yanımdadır' demirəm.
Görünməyəni, eşidilməyəni, keçmişi, gələcəyi də bilmirəm mən. Sizə,
'Mən bir mələyəm' də demirəm. Mən yalnızca mənə vəhy edilənə tabe
oluram." De ki: "Kor ilə görən eyni ola bilərmi? Hələ də
düşünmürsünüzmü?"
**51** Və Rəblərinin hüzuruna toplanacaqlarından qorxanları, Allahın
mühafizəsi altına daxil olmaları üçün, sənə vəhy edilənlə xəbərdarlıq
et. Onların, Onun altındakılardan yardım edən, yol göstərən, qoruyan
yaxın bir kimsələri və dəstəkçiləri, himayə edənləri yoxdur.
**52** Və Allahın razılığını diləyərək səhər-axşam; həmişə Rəblərinə dua
edən kimsələri qovma! Onların haqq-hesabında sənin heç bir
məsuliyyətin yoxdur, sənin haqq-hesabından da onlara heç bir şey
yoxdur. Əgər onları qovsan səhv; öz zərərinə olan əməli işləyənlərdən
olarsan!
**53** Və Biz, "Allah, aramızdan bunlaramı yaxşılıq etdi?!" desinlər deyə,
onlardan bəzisini bəzisi ilə beləcə ataşlərə sürüklədik, imtahan etdik.
Allah, özlərinə verilən nemətlərin qarşılığını ödəyənləri daha yaxşı
bilən deyilmi?
**54** Və ayələrimizə inanan kimsələr sənə gəldikləri zaman dərhal:
"Salam olsun sizə! Rəbbiniz rəhməti Öz üzərinə yazdı. Şübhəsiz ki,
sizdən hər kim bilməyərək bir pislik etdikdən sonra tövbə edər və
düzəldərsə; şübhəsiz ki, Allah qullarının günahlarını çox örtən, onları
cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir!"
de!
**55** Və Biz ayələri bax belə, müfəssəl olaraq açıqlayırıq. Və
günahkarların yolu ortaya çıxsın / sənə bəlli olsun deyə.
**56** De ki: "Şübhəsiz ki, sizin, Allahın altındakılardan yalvardıqlarınıza
qulluq etmək mənə qadağan edildi." De ki: "Mən, sizin boş, müvəqqəti
arzularınıza uymaram. Əgər uysam, azaram və mən, yönləndirildiyim
doğru yola çatanlardan olmaram."
**57** De ki: "Mən, Rəbbimdən açıq-aşkar bir dəlil üzərindəyəm. Siz isə o
dəlili yalanladınız. O tez gəlməsini istədiyiniz şey mənim yanımda
deyil, hökm ancaq Allaha aiddir, gerçəyi O anladır / gerçəkləşdirər və
O, ayırd edənlərin ən xeyirlisidir."
**58** De ki: "Sizin tez gəlməsini istədiyiniz şey mənim yanımda olsaydı,
mənimlə sizin aranızdakı iş həqiqətən gerçəkləşib getmişdi. Və Allah,
səhv; öz zərərinə olan əməli işləyənləri ən yaxşı biləndir.

59 Görünməzin, eşidilməzin, keçmişin, gələcəyin açarları da yalnızca Onun qatındadır. Ondan başqa heç kimsə onları bilməz. Quruda və dənizdə olanları da O bilir. O bilmədən bir yarpaq belə düşməz. Yerin qaranlıqlarındaki bir toxum, yaş və quru heç bir şey yoxdur ki, açıq-aşkar bir kitabda olmasın.
60 Və O, sizi gecələr vəfat[231] etdirən (yuxuya verən); keçmişdə etdiklərinizi, etməniz lazım olduğu halda etmədiklərinizi bir-bir yadınıza salan, gündüz əldə etdiyiniz şeyləri bilən, sonra adı qoyulmuş vaxt sonunun gerçəkləşməsi üçün sizi (yuxudan) qaldırandır. Sonra dönüşünüz yalnızca Onadır. Sonra O, etdiklərinizi sizə xəbər verəcəkdir.
61 Və Allah, qulları üzərində hökmranlığını sürdürər və O, sizin üzərinizə qoruyucular göndərər. Sonra da sizdən birinizə ölüm gəldiyi vaxt, elçilərimiz heç bir artıq-əskikliyə yol vermədən onu vəfat etdirərlər; onlara keçmişdə etdiklərini, etməsi lazım olduğu halda
etmədiklərini bir-bir xatırladarlar. 62 Sonra öz gerçək Mövlaları
Allaha döndərilərlər. Diqqətli olun, hökm ancaq Onundur və O, haqq-hesab çəkənlərin ən sürətlisidir."
63 De ki: "Siz, 'bizi bundan qurtararsa, həqiqətən qarşılığını ödəyənlərdən olacağıq' deyə gizli və yalvararaq Ona dua edib durarkən, qurunun və dənizin qaranlıqlarından sizi kim qurtarar?"
64 De ki: "Sizi ondan və hər sıxıntıdan Allah qurtarar. Sonra da siz
ortaq qoşarsınız. 114 Və O, sizə Quranı müfəssəl / haqq-batil ayrılmış
olaraq nazil etdiyi halda, Allahdan başqa bir hakimmi axtarım?" Və özlərinə Kitab verdiyimiz bu şəxslər, Quranın şübhəsiz Rəbbindən haqq ilə nazil edilmiş olduğunu bilirlər. O halda, sən onların, bu kitabın Allah tərəfindən nazil edildiyini bildikləri xüsusda əsla şübhə edənlərdən olma..
65 De ki: "O, üstünüzdən və ayaqlarınızın altından əzab göndərməyə, yaxud da sizi müxalif qruplara ayırıb birinizə digərinizin qisasını aldırmağa qadirdir." Bax, onlar yaxşıca anlasınlar deyə ayələrimizi necə də hər tərəfli / incəliyə-incəliyə açıqlayırıq.
66 Sənin qövmün isə əzab / Quran / ayələrin yaxşıca açıqlanması, haqq olmasına rağmən, onu yalanladı. De ki: "Mən sizin üzərinizə, işləri müəyyən bir proqrama görə nizamlayan və bu proqramı
qoruyaraq, dəstəkləyərək tətbiq edən" biri deyiləm. 67 Hər vacib
xəbərin qərarlaşdırılmış bir zamanı vardır, siz də yaxında biləcəksiniz.
104 Həqiqətən sizə Rəbbinizdən gözünüzü açacaq, doğru yolu tapa biləcəyiniz məlumatlar gəldi. Artıq kim haqqı görərsə, faydası özünə, kim də korluq edərsə zərəri özünədir. Mən sizin üzərinizdə bir gözətçi deyiləm!"[232]

68 Və ayələrimiz / əlamətlərimiz / işarətlərimiz / haqqında boşboğazlıq edənləri gördüyün zaman, onlar ondan başqa sözə keçənə qədər onlardan dərhal uzaq dur. Və əgər şeytan bunu sənə unutdursa da, xatırladıqdan sonra o şirk qoşaraq səhv davrananlar; öz zərərlərinə olan əməli işləyənlər topluluğu ilə bərabər oturma.
69 Allahın mühafizəsi altına daxil olan kəslərə də, o şirk qoşaraq səhv davrananların; öz zərərlərinə olan əməli işləyənlərin haqq-hesabından bir şey yoxdur. Lakin (bu) Allahın mühafizəsi altına daxil olmaqları üçün bir xatırlatmadır!
70 Və dinlərini oyun və əyləncə edənlər / oyun və əylənceni özlərinə din edənlər, dünya həyatı özlərini aldatmış olan kimsələri burax və Quran ilə xatırlat / öyüd ver: Bir adam, öz əlinin işləyib qazandığıyla dəyişikliyə və məhvə məruz qalarsa, onun üçün Allahın altındakılardan yardım edəcək, yol göstərəcək, qoruyan yaxın bir kimsədən, dəstək olacaq və himayə edə biləcək birindən söhbət gedə bilməz. Günahına qarşı hər cürə bədəli ödəməyi istəsə də, ondan alınmaz. Bax bunlar, qazandıqları ilə dəyişikliyə / məhvə məruz qalan kimsələrdir. Nankorluq etdiklərindən ötrü onlar üçün qaynar sudan bir içki və can ağrıdan bir əzab vardır.
71,72 De ki: “Allahın altındakılardan bizə fayda verməyən və zərər də ver bilməyən şeylərəmi yalvaraq? Və Allah bizi doğru yola yönəltdikdən sonra, özünün ‘Bizə gəl!’ deyə doğruya və gözələ çağıran yoldaşları varkən şeytanlar tərəfindən aldadılıb yoldan çıxarılan və yer üzündə çaşqın bir halda dolaşan kimsələr kimi gerimi döndərilək?” De ki: “Şübhəsiz ki, Allahın doğru yolu, gerçək doğru yolun özüdür. Və biz aləmlərin Rəbbinə təslim olmaqla [müsəlman olmamızla] və səlatı [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmə qurumlarını təşkil etmək və yaşatmaq] və Onun mühafizəsi altına daxil olun deyə əmr olunduq. Və Allah, sadəcə Özünə toplanacağımız Kimsədir”
73 Və O, göyləri və yeri haqq ilə yaradandır. Və O, “Ol!” dediyi gün, dərhal olar. Onun sözü haqdır. Sur üfləndiyi gün də mülk ancaq Onundur. O, gizlini və aşkarı biləndir. O, ən yaxşı qanun qoyandır, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, hər şeyin iç üzünü / gizli tərəflərini də yaxşı biləndir.

***

74 Və bir zaman İbrahim, atası Azərə, “Sən bütləri tanrılar olaraqmı qəbul edirsən? Şübhəsiz ki, mən səni və qövmünü açıq-aşkar bir azğınlıq içində görürəm!” demişdi.
75 Və Biz, dəlil əldə etməsi və qəti surətdə inananlardan olması üçün İbrahimə göylərin və yerin mülkiyyəti və yönətimini beləcə

göstərirdik.
76 Bu səbəblə, İbrahim, gecənin qaranlığı üzərinə çöküncə, bir ulduz gördü: “Bu mənim Rəbbimdir” dedi. Sonra ulduz batınca, “Mən batanları sevmirəm” dedi.
77 Sonra ayı doğarkən, görüncə də: “Bu, mənim Rəbbimdir” dedi. O da batınca, “And olsun ki, Rəbbim mənə doğru yolu göstərməsəydi, həqiqətən mən azğınlardan olaram” dedi.
78,79 Sonra günəşi doğarkən görüncə də: “Bu mənim Rəbbimdir, bu daha böyükdür!” dedi. Sonra o da batınca: “Ey qövmüm! Şübhəsiz ki, mən sizin ortaq qoşduğunuz şeylərdən uzağam. Həqiqətən mən hənif; batil inanclardan dönmüş biri olaraq üzümü göyləri və yeri yoxdan var edənə / yox edəcək olana çevirdim və mən ortaq qoşanlardan deyiləm” dedi.
80-81 Və qövmü, onunla mübahisə etdi. İbrahim dedi: “Mənə doğru yolu göstərmişkən, Allah haqqında mənimlə mübahisəmi edirsiniz? Ona ortaq qoşduqlarınızdan heç qorxmuram. *–Ancaq Rəbbimin istədiyi şey xaric olmaqla.–* Rəbbim biliyi ilə hər şeyi əhatə etmişdir. Hələ də düşünmürsünüz? Və Allah, onlar barəsində heç bir güc-qüvvət nazil etmədiyi halda, siz Ona ortaq qoşmaqdan qorxmadığınız halda, mən sizin ortaq qoşduğunuz şeylərdən necə qorxaram? Bu halda, əgər bilirsinizsə (deyin görək), bu iki topluluqdan hansı güvəndə olmağa daha layiqdir?”
82 Bu iman edənlər və imanlarına səhv; öz zərərlərinə olan iş qarışdırmayanlar / ortaq qoşma inancı qarışdırmayanlar, bax onlar, güvəndə olanlardır. Yönləndirildikləri doğru yolu tapanlar da onlardır.
83 Və bax bunlar, öz qövmünə qarşı İbrahimə verdiyimiz dəlilimizdir. Biz istədiyimizi dərəcələrlə yüksəldərik. Şübhəsiz ki, sənin Rəbbin ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, çox yaxşı biləndir.
84 Və Biz ona İshaqı və Yəqubu da bəxş etdik. Hamısına doğru yolu göstərdik. Daha öncə də Nuha və onun soyundan Davuda, Süleymana, Əyyuba, Yusufa, Musaya və Haruna da doğru yolu göstərmişdik. Və Biz gözəl-yaxşı işlər görənlərə belə qarşılıq veririk.
85 Zəkəriyya, Yəhya, İsa və İlyasa da doğru yolu göstərdik. Hamısı salehlərdəndir.
86 İsmail, Əlyəsə, Yunus və Luta da doğru yolu göstərdik. Hamısını da Biz aləmlərə üstün etdik.
87 Və bunların atalarından, soylarından və qardaşlarından da (bəzilərini) üstün etdik. Və onları seçdik, doğru yola yönəltdik.
88 Bax bu, Allahın yönəltməsidir. O, onunla qullarından istədiyinə doğru yolu göstərər. Və əgər onlar ortaq qoşsaydılar, həqiqətən etmiş

olduqları şeylər boşa getmiş olardı.
89 Bax onlar, özlərinə kitab, hökm və peyğəmbərlik verdiyimiz kimsələrdir. İndi bunlar, ona inanmayacaq olarlarsa, Biz həqiqətən bunu örtməyəcək / buna inanacaq bir toplumu "bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edənlər" olaraq (təyin) etmişik.
90 Bax bunlar, Allahın yol göstərdiyi kimsələrdir. Artıq sən də onların yol göstəricisinə / vəhyə tabe ol. De ki: "Mən onun müqabilində sizdən heç bir muzd istəmirəm. O, sadəcə aləmlərə bir öyüddür."
91 Və onlar, "Allah, heç bir bəşərə bir şey göndərməmişdir" deməklə, Allahı layiqincə təqdir edə bilmədilər / layiqincə tanıya bilmədilər. De ki: "Musanın insanlara işıq və yol göstərən olmaq üzrə gətirdiyi, sizin parça-parça yazı materialları hazırladığınız, bir qismini bəlli etdiyiniz, bir çoxunu gizlətdiyiniz; sizin və atalarınızın, bilmədiyi bir çox şeyləri sayəsində öyrəndiyiniz Kitabı kim nazil etdi?" Sən, de ki: "Allah!" Sonra qoy onlar boş işləriylə oynaya-oynaya qalsınlar.
92 Bax bu, Bizim mərkəzi şəhəri və ətrafındakı kəsləri xəbərdar etməyin üçün nazil etdiyimiz, sadəcə içində bəhs edilənləri təsdiqləyən zəngin (mübarək) bir Kitabdır. Axirətə inananlar ona da inanırlar və onlar səlatlarını [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını] da qoruyub saxlayandırlar.
93 Və Allaha qarşı yalan uydurandan yaxud da özünə heç bir şey vəhy olunmadığı halda "Mənə vəhy olundu" deyəndən və "Allahın nazil etdiyi kimi mən də nazil edəcəyəm" deyəndən daha səhv; öz zərərinə olan əməli işləyən kim ola bilər? Şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kəsləri ölümün şiddətləri içindəykən, (bu iş üçün tapşırıq alan) görəvli qüvvələr də onlara əllərini uzadıb: "Canlarınızı çıxarın. Bu gün, Allaha qarşı nahaq şeylər söylədiyinizə və Onun ayələrinə qarşı təkəbbürlənməyinizə görə alçaldıcı bir əzabla cəzalandırılacaqsınız!" dedikləri vaxt bir görsən!
94 Və and olsun ki, siz, sizi ilk dəfə yaratdığımız zamanki kimi yalnız başına / tək-tək Bizə gəldiniz və sizə verdiyimiz şeyləri arxanızda qoydunuz. Və aranızda özlərinin ortaqlar olduğuna inandığınız sözdə dəstəkçilərinizi sizinlə bərabər görmürük. And olsun ki, aranızda kəsinti / qırılma olmuş və səhv inandığınız şeylər qeyb olmuşdur.
95 Şübhəsiz ki, Allah, toxumu və çəyirdəyi yarıb çıxarandır: Ölüdən dirini çıxarar, diridən də ölünü çıxarar. Budur Allah! Necə də döndərilirsiniz?
96 Dan yerini yarıb çıxarandır. Gecəni bir istirahət vaxtı, günəş və ayı hesab ilə yaratmışdır. Bu, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, çox yaxşı bilənin müəyyən etməsidir, nizamlamasıdır.

**97** Və Allah, qurunun və dənizin qaranlıqlarında, yönəldiyiniz doğru yolu tapa biləsiniz deyə ulduzları sizin üçün tanıdandır. Şübhəsiz ki, Biz, bilən bir toplum üçün ayələri ətraflı olaraq açıqladıq.
**98** Və O, sizi bir tək nəfsdən inşa edəndir. Sonra da bir qərar yeri və əmanət yeri…[233] *–Biz həqiqətən ayələri, yaxşı anlayan bir toplum üçün ətraflı olaraq açıqladıq.–*
**99** Və Allah göydən suyu endirəndir. Beləcə Biz onunla hər şeyin bitkilərini bitirdik. Ondan da bir-birinə bənzəyən və bir-birinə bənzəməyən, bir-biri üzərinə minmiş toxumlar; xurmanın tumurcuğundan sallanan salxımları, üzümdən bağları, zeytunu və narı, çıxardığımız filizi (cücərtiləri) çıxardıq. Bunlar meyvələndikləri zaman meyvələrinə və yetişməsinə baxın! Bax bunlarda, həqiqətən inanan bir toplum üçün əlamətlər / işarətlər vardır.
**100** Və onlar görünməz güc və varlıqları Allaha ortaqlar etdilər. Halbuki onları O yaratmışdır. Məlumatları olmadan da oğullar, qızlar uydurdular. *–Onun şanı onların vəsf etdikləri şeylərdən pak və ucadır.–*
**101** O, göyləri və yeri yoxdan var edəndir. Onun sahibəsi / zövcəsi olmadığı halda, necə ola bilər ki, Onun övladı olsun? Və O, hər şeyi yaratmışdır. Və O, hər şeyi ən yaxşı biləndir.
**102** Budur Rəbbiniz Allah! Ondan başqa ilah yoxdur. Hər şeyin yaradıcısıdır. Elə isə, Ona qulluq edin. O, hər şey üzərinə müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edəndir.
**103** Gözlər Ona çata bilməz, O isə gözlərə çatar; O, çox mükafat (ehsan) sahibidir, hər şeydən xəbərdardır.
**105** Bax beləcə, Biz sənə: “Sən dərs almısan / bunları bir yerdən oxuyub öyrənmisən” desinlər və aydın şəkildə ortalığa qoyaq deyə ayələri hər tərəfli / geniş şəkildə açıqlayırıq.
**106,107** Sən, Özündən başqa ilah deyə bir şey olmayan Rəbbindən sənə vəhy edilənə tabe ol. Ortaq qoşanlardan da üz çevir. Və əgər Allah istəsəydi, onlar ortaq qoşmazdılar. Biz, səni onların üzərinə bir gözətçi etmədik və sən onların üzərində işləri müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən biri də deyilsən!
**108** Və onların, Allahın altındakılardan yalvardıqları kimsələrə söyməyin ki, onlar da məlumatsızca, hədlərini aşaraq Allaha söyməsinlər. Biz, başçısı olan hər topluma, etdikləri işi bax beləcə süslədik. Sonra da onların dönüşü Rəblərinədir. Sonra O, onlara nə etdiklərini xəbər verər.
**109** Və ortaq qoşanlar, onlara bir əlamət / işarət gələrsə, ona həqiqətən iman edəcəklərinə dair ən ağır andlarıyla Allaha and içdilər. De ki:

"Əlamətlər / işarətlər ancaq Allah qatındadır." Onlara əlamətlər / işarətlər gəldiyində də iman etməyəcəklərini anlamırsınız?
**110** Və Biz onların qəlblərini və gözlərini, əvvəlcə iman etmədikləri vəziyyətdəki kimi tərsinə çevirərik. Və Biz də onları həddi aşmaları içərisində kor və çaşbaş qoyarıq.
**111** Və əgər Biz, şübhəsiz ki, onlara bəzi güclər endirsəydik, onlara ölülər söz söyləsəydi və hər şeyi qarşılarına toplasaydıq, *–Allahın diləməsi xaricində–* yenə də inanmayacaqdılar. Lakin onların çoxu cahillik edirlər.
**112,113** Beləcə Biz, hər peyğəmbər üçün gizli-açıq şeytanlarını düşmən etdik: Ki dünya malına aldandıqlarına görə axirətə inanmayan kimsələrin qəlbləri ona aldansın, ondan razı olsun və etməkdə olduqlarını etsinlər deyə bunlardan bəziləri digərlərinə sözün süslüsünü gizlicə təlqin edər / pıçıldayar. *–Və əgər Rəbbin istəsəydi, bunu etməzdilər. Elə isə onları və uydurduqları şeyləri burax!–*
**115** Və Rəbbinin sözü həm doğruluq, həm də ədalət baxımından tamamlanmışdır. Onun sözlərini dəyişdirə biləcək biri yoxdur. O, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**116** Və əgər yer üzündə olanların əksəriyyətinə tabe olsan, səni Allahın yolundan azdırarlar. Çünki onlar sadəcə "zənn"ə qapılırlar və sadəcə cəfəngiyyat (boş şeylər) danışırlar.
**117** Şübhəsiz ki, sənin Rəbbin, Öz yolundan kimlərin azdığını (çıxdığını) ən yaxşı biləndir. Və O, yönəldikləri doğru yolda olanları da daha yaxşı biləndir.
**124** Və onlara bir ayə gəldiyi zaman: "Allahın elçilərinə verildiyi kimi bizə verilməyənə qədər, qətiyyən inanmayacağıq" dedilər. Allah (bir elçi olaraq Öz) elçilik missiyasını harada yerləşdirəcəyini daha yaxşı bilir. Günahkarlara, işlətdikləri hiylələrinə görə Allah qatında alçaqlıq və çətin bir əzab toxunacaqdır.
**125** Və sonra, Allah kimi doğru yola yönəltmək istəyərsə, İslam üçün onun sinəsini açar. Kimi də azdırmaq istəyərsə sinəsini elə sıxar ki, o, göyə yüksəlirmiş kimi olar. Bax belə, Allah, pisliyi [zərər, əzab verən şeyləri] iman etməyənlərin üzərinə qoyar / atar.

***

**119** Və sizə nə olub ki, Özü sizə, məcbur qalmadıqca haram olan şeyləri geniş şəkildə açıqlamış olduğu halda, Allahın adı çəkilənlərdən yemirsiniz? Və şübhəsiz ki, bir çoxları bilmədən həvəslərinə (istəklərinə) uyaraq yoldan azdırırlar (çıxarırlar). Şübhəsiz ki, sənin Rəbbin, həddi aşanları ən yaxşı bilənin Özüdür.
**120** Günahın açığını və gizlisini tərk edin! Şübhəsiz ki, günah qazanan kimsələr, qazanmış olduqları şeylər səbəbiylə cəzalandırılacaqlar.

121 Və üzərində Allahın adı çəkilməyən şeylərdən yeməyin. Və şübhəsiz ki, o, tam bir yoldan çıxışdır. Və şübhəsiz ki, şeytanlar öz yaxın kimsələrinə sizinlə mücadilə etmələri üçün gizlicə təlqin edirlər. Və əgər onlara boyun əyərsəniz, şübhəsiz ki, siz ortaq qoşan kimsələr oldunuz deməkdir.
122 Ölü ikən diriltdiyimiz və insanların arasında gəzməsi üçün bir nur verdiyimiz kimsənin halı, qaranlıqlar içində qalıb oradan bir çıxış tapa bilməyənin halı kimidirmi? Bax, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] etməkdə olduqları bu cür 'süslü və cazibədar' göstərilmişdir.
123 Və Biz beləcə, hər şəhərdə əyanları, orada hiylələr işlətsinlər deyə oranın günahkarları etdik. Halbuki bunlar, pisliyi yalnızca özlərinə edirlər və bunu dərk etmirlər.
126 Və bax bu, Rəbbinin doğru yoludur. Həqiqətən Biz, xatırlayıb öyüd alan bir topluluq üçün ayələri geniş bir şəkildə açıqladıq.
127 İşləmiş olduqları şeylər səbəbiylə Rəbləri qatındakı hüzur, güvənlik və xoşbəxtlik yurdu yalnızca onlarındır. Və Rəbləri, onların yardımçısı, yol göstərəni və qoruyucusudur.
128 Və Allah onların hamısını topladığı gün: "Ey gizli düşmən topluluğu! Həqiqətən belə insanlardan çoxaltdınız!…"
İnsanlardan onların yaxınları da: "Rəbbimiz! Biz bir-birimizdən qazanc əldə etdik. Nəhayət biz, bizim üçün müəyyənləşdirdiyin vaxtımızın sonuna çatdıq" deyərlər. Allah: "Atəş, sizin dayanacağınızdır. Orada, Allahın diləməsi xaric, sonsuz olaraq qalacaqsınız" deyər. Şübhəsiz ki, Rəbbin ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən, ən yaxşı biləndir.
129 Və bax Biz beləcə, qazandıqları günahlara görə səhv; öz zərərinə olan əməli işləyənlərin bir qismini, digər bir qisminə yaxınlaşdırarıq
130 Ey gizli, aşkar, gələcəyin, bu günün insan topluluğu! Sizə ayələrimi anladan və bu gününüzə qovuşacağınız barədə sizə xəbərdarlıq edən, özünüzdən (öz içinizdən) elçilər gəlmədimi? Onlar: "Öz əleyhimizə şahidik" dedilər. Bəsit dünya həyatı onları aldatdı və onlar özlərinin həqiqətən kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] elə özü olduqlarına şahidlik etdilər.
131 Bax bu; Rəbbinin, xalqı laqeyd, məlumatsız ikən, ölkələri haqsız yerə dəyişikliyə / məhvə məruz qoyan biri olmamasıdır.
132 Və hamısı üçün, etdiklərinə görə dərəcələr vardır. Və sənin Rəbbin onların etdiklərindən qafil / xəbərsiz deyildir.
133 Və sənin Rəbbin çox zəngindir / heç bir şeyə möhtac deyildir, mərhəmət sahibidir. Sizi, başqa tayfaların soyundan gətirdiyi kimi, istəsə, sizi də yox edər və sizdən sonra yerinizə istədiyini gətirər.

134 Şübhəsiz, sizin vəd olunduğunuz şeylər həqiqətən gələcəkdir. Və siz, bunu əngəlləyə biləcək biriləri deyilsiniz.
135 De ki: "Ey qövmüm! Gücünüz çatdığı qədər edəcəyinizi edin! Şübhəsiz ki, mən də edirəm. Yaxında Yurdun sonunun kim üçün olduğunu biləcəksiniz. Şübhəsiz ki, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər qurtuluşa yetişməzlər."

***

136 Və onlar, Allahın yaratdığı əkinlərdən və heyvanlardan Allaha bir pay ayırdılar və öz azğın inanclarına görə, "Bu, Allah üçün; bu da ortaqlarımız üçündür" dedilər. Budur, ortaqları üçün olan pay Allaha çatmaz, Allah üçün olan şey ortaqlarına çatar. Verdikləri hökm nə pisdir!
138 Və onlar, yanlış inancları səbəbiylə: "Bunlar, toxunulmaz heyvanlar və əkinlərdir. Bunları bizim istədiklərimizdən başqası yeyə bilməz. Bunlar beli qadağan edilmiş heyvanlardır" dedilər. Və bir qisim heyvanları Allaha yalan uyduraraq üzərlərində Onun adını çəkməzlər. Allah, onları iftira etdikləri şeylər səbəbiylə cəzalandıracaqdır.
139 Və onlar, "Bu heyvanların qarnındakılar sadəcə kişilərimizə aid olub qadınlarımıza isə haramdır. Əgər ölü olarsa, o zaman onlar onda ortaqdırlar" dedilər. Allah, onların vəsflərini onlara cəza olaraq verəcəkdir. Şübhəsiz ki, O, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, çox yaxşı biləndir.
137 Və onların ortaqları, özlərini məhv etsinlər və dinlərini qarışdırıb pozsunlar deyə ortaq qoşanların çoxuna, yük, utanc səbəbi və ilahlara qurban edilməsi səbəbləriylə, övladlarını öldürməyi gözəl göstərdi. Və Allah istəsəydi, bunu etməzdilər. O halda, onları və onların uydurduqları şeyləri burax!
140 Savadsızlıq (cəhalət) üzündən beyinsizcə uşaqlarını öldürənlər və Allahın onlara verdiyi ruzini, Allaha iftira edərək haram edənlər, şübhəsiz ki, zərərə düçar oldular. Onlar, həqiqətən azmışlardır və onlar yönləndirildikləri doğru yola yetişmiş kimsələr deyillərdir.
141 Və Allah asmalı və asmasız bağçaları, xurmaları, müxtəlif məhsullar verən əkinləri, zeytunları və narları, bir-birinə bənzəyən və bənzəməyən şəkildə yaradandır. Meyvə verdikdə meyvəsindən yeyin, məhsul yığımı günü də onun haqqını verin və israf etməyin. Şübhəsiz ki, Allah, israf edənləri sevməz.
142 Və O, heyvanlardan yük daşıyanları, döşək düzəldilənləri yaradandır. Allahın sizə ruzi olaraq verdiyi şeylərdən yeyin. Şeytanın addımlarını izləməyin. Şübhəsiz ki, o, sizin üçün açıq-aşkar bir düşməndir.

**143** Səkkiz cüt: qoyundan iki, keçidən də iki. De ki: “Allah, iki erkəyimi haram etdi, yoxsa iki dişinimi, ya da iki dişinin qarınlarının sarıb-bürüdüyünü; balalarımı? Əgər doğru danışanlarsınızsa, mənə elmə əsaslanaraq xəbər verin.”
**144** Və dəvədən iki, inəkdən də iki… De ki: “Allah, iki erkəyimi haram etdi, yoxsa iki dişinimi, ya da iki dişinin balalarınımı? Yoxsa Allahın sizə belə bir öhdəlik qoyduğunda Onun yanında idinizmi?” Bu cür, heç bir biliyə əsaslanmadan, insanları azdırmaq üçün Allaha qarşı yalan uyduran kimsədən daha səhv; öz zərərinə olan əməli işləyən kim ola bilər? Şübhəsiz ki, Allah, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələr topluluğuna yol göstərməz.
**145** De ki: “Mənə vəhy olunanda, leş və ya axıdılmış qan, yaxud donuzun əti *–şübhəsiz ki, donuzun əti çirklidir, narahatlıq verəndir–* yaxud Allahdan başqası adına kəsilmiş bir haqq yol xaricinə çıxış nümayişi istisna olmaqla, onları yeyən üçün haram edilmiş bir şey görmürəm. Artıq kim çarəsiz qalarsa, həddi aşmamaq və zərurət həddini keçməmək üzrə bunlardan yeyə bilər.” Bax, şübhəsiz, sənin Rəbbin çox bağışlayandır, çox mərhəmət edəndir.
**118** Artıq, əgər Allahın ayələrinə iman edənlərsinizsə, üzərində Allahın adı çəkilənlərdən yeyin.[234]
**146** Və Biz yəhudilərə bütün dırnaqlı heyvanları haram etdik. Bellərində ya da bağırsaqlarında daşınan, ya da sümüyə qarışan yağlar xaricində, inək və qoyunun yağlarını da (piylərini də) onlara haram etdik. Bu, təcavüzkarlıqları üzündən Bizim onları cəzalandırmağımızdır. Və Biz, əlbəttə doğru olanlarıq.
**147** Artıq, əgər səni yalanladılarsa, dərhal de ki: “Rəbbiniz geniş rəhmət sahibidir. Və Onun əzabı günahkar camaatdan geri çevrilməz.”
**148** Allaha ortaq qoşan kimsələr deyəcəklər ki: “Allah istəsəydi, biz ortaq qoşmazdıq, atalarımız da ortaq qoşmazdılar, heç bir şeyi də haram etməzdik.” Onlardan öncə yalanlayanlar da əzabımızı dadana qədər bax belə idilər. De ki: “Yanınızda bizim üçün çıxara biləcəyiniz bir məlumat (bilik) varmı? Siz, ancaq zənnə uyursunuz və siz sadəcə cəfəngiyyat (boş şeylər) danışırsınız.”

***

**149** De ki: “Budur (bilin), ən qəti və üstün dəlil, Allahındır. O səbəblə, əgər Allah istəsəydi, əlbəttə hamınıza yol göstərərdi.”
**150** De ki: “Haydı, Allah bunu həqiqətən haram etdi deyə şahidlik edəcək şahidlərinizi gətirin.” Buna rəğmən, əgər onlar şahidlik edərlərsə də sən onlarla bərabər şahidlik etmə. Ayələrimi yalanlayan və axirətə inanmayan kimsələrin boş müvəqqəti arzularına da uyma. Və onlar, öz Rəblərinə tay tutmaqdadırlar.

**151** De ki: "Gəlin, Rəbbinizin sizə nələri qadağan etdiyini; toxunulmaz etdiyini oxuyum:
'Özünə heç bir şeyi ortaq qoşmamağınızı,
ana-ataya yaxşılıq etməyinizi, (onlarla) gözəl davranmağınızı,
fəqirlik qorxusuyla / fəqirləşdirilərik qorxusuyla uşaqlarınızı öldürməməyinizi, *–Sizi və onları Biz ruziləndiririk–*
pisliklərin açığına və gizlisinə yaxınlaşmamağınızı,
haqsız yerə, Allahın haram etdiyi nəfsi öldürməməyinizi, *–Bax bunlar, ağlınızı işlədəsiniz deyə, Onun sizə öhdəliklər olaraq çatdırdıqlarıdır.–*
**152** Yetimin malına da yaxınlaşmamağınızı, *–Yalnız həddi-büluğa çatana qədər ən gözəl şəkildə yaxınlaşa bilər və uyğun şəkildə xərcləyə bilərsiniz.–*
ölçünü, çəkini haqqı qədər əskiksiz etməyinizi, *–Biz kimsəni gücünün çatdığından başqası ilə; imkanı xaricindəki bir şeylə məsuliyyətli tutmarıq.–*
söylədiyiniz zaman da, yaxınınız da olsa ədalətli olmağınızı
və Allaha verdiyiniz sözü əskiksiz tutmağınızı.' *–Bax bunlar, öyüd alıb düşünəsiniz deyə Allahın sizə öhdəlik (vacib) olaraq çatdırdıqlarıdır.–"*
**153** Və şübhəsiz ki, bu, ən doğru olaraq Mənim yolumdur. Dərhal ona uyun. Və başqa yollara uymayın ki, sizi Onun yolundan ayırmasın. Bax bunlar, Allahın mühafizəsi altına daxil olasınız deyə, Allahın sizə öhdəlik (vacib) olaraq çatdırdıqlarıdır.
**154** Sonra Biz, öz Rəblərinə qovuşacaqlarına inansınlar deyə, yaxşı-gözəl işlər görənlərə tam olaraq hər şeyi geniş şəkildə açıqlamaq və yol göstərici və rəhmət olmaq üzrə Musaya Kitabı verdik.
**155-157** Və Quran, bəziniz: "Kitab, sadəcə bizdən öncəki iki topluluğa; yəhudi və xristianlara endirildi; biz isə, o kitabları oxuya bilmir və dillərini anlaya bilmirdik", bəziniz də: "Əgər bizə kitab nazil edilsəydi, biz onlardan daha çox doğru yolda olardıq" deməyəsiniz deyə Bizim nazil etdiyimiz bərəkətli bir kitabdır. O səbəblə, sizə rəhmət olunması üçün ona tabe olun və Allahın mühafizəsi altına daxil olun. Artıq sizə də Rəbbinizdən açıq-aşkar dəlil, yol göstərici və rəhmət gəlmişdir. Elə isə Allahın ayələrini yalanlayıb onlardan üz çevirəndən daha səhv, öz zərərlərinə olan əməli işləyən kim ola bilər? Ayələrimizdən üz çevirənləri üz çevirmələri səbəbiylə əzabın pisi ilə cəzalandıracağıq.
**158** Mələklərin gəlməsindən, yaxud da Rəbbinin gəlməsindən, ya da Rəbbinin bəzi əlamətlərinin / işarətlərinin gəlməsindən başqa bir şeymi gözləyirlər? Rəbbinin əlamətlərindən / işarətlərindən bəzisi gəldiyi gün, daha öncə iman etməmiş yaxud imanından bir xeyir

qazanmamış kimsəyə, artıq iman etməsi bir fayda verməz. De ki: “Gözləyin; doğrusu, biz də gözləyənlərik.”
**159** Şübhəsiz, dinlərini parça-parça edib qrup-qrup olan bu kimsələr (ki var); sən heç bir şəkil və davranışca onlardan deyilsən. Şübhəsiz ki, onların işi Allahadır. Sonra Allah, onlara etməkdə olduqları şeyləri xəbər verəcəkdir.
**160** Kim yaxşılıq (yaxşı əməl) gətirərsə, artıq ona gətirdiyinin on misli vardır. Kim də pislik (pis əməl) gətirərsə, artıq o, sadəcə onun misliylə cəzalandırılar və onlar haqsızlığa uğradılmazlar.
**161** De ki: “Şübhəsiz ki, Rəbbim məni doğru yola yönəltdi; dim-dik ayaqda duran bir dinə, şirkdən, Allahın ilah və rəbb olduğunu bilərək rədd etməkdən dönmüş olan İbrahimin dininə, həyat tərzinə. İbrahim, ortaq qoşanlardan olmamışdı.”
**162,163** De ki: “Mənim səlatım [maddi və zehni baxımdan dəstək olmağım; cəmiyyəti maarifləndirmək üçün çalışmağım], qulluğum, hər cür ibadətim, həyatım və ölümüm sadəcə Özünün ortağı olmayan aləmlərin Rəbbi Allah üçündür. Və mənə belə əmr olundu, mən Müsəlmanların da ilkiyəm.”
**164,165** De ki: “Allah hər şeyin Rəbbi ikən, mən Allahdan başqa Rəbb axtarım?” Hər kəsin qazandığı yalnız özünə aiddir. Yükünü daşıyan kimsə, bir başqasının yükünü daşımaz. Sonra dönüşünüz sadəcə Rəbbinizədir. Beləcə, Allah ayrılığa düşdüyünüz şeyi sizə xəbər verəcəkdir. Və O, sizi yer üzündə gedənlərin yerinə gətirən, verdikləri ilə sizi sınamaq üçün bəzinizi digərinizin üzərinə dərəcələrlə yüksəldəndir. Şübhəsiz Rəbbin, tez qovuşdurandır və şübhəsiz O, çox bağışlayandır, çox mərhəmət edəndir. (55/6, Ənam / 4-165)

## SAFFAT (56 - 37) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 205

**1-5** O səflər halında düzülən / düzən, sonra da hayqırıb sürükləyən, hayqırıb sürüklədikdən sonra da öyüd oxuyan Quran ayələri dəlildir ki, sizin ilahınız həqiqətən Təkdir. O, göylərin, yerin və aralarındakıların Rəbbidir. Məşriqlərin də Rəbbidir. (56/37, Saffat / 1-5)

### Nəcm: 206

**6** Gerçəkdən Biz ən alt səmanı bir süslə; ulduzlarla [ulduzların zinətiylə] süslədik. **7-10** Qurandan az da olsa faydalanan və *–raketlə kosmosa çıxanlar xaric–* davamlı səy içində olan, hər kəs tərəfindən uzaqlaşdırılan (qovulan) və Qurana qulaq verməyən bütün zehni

qabiliyyətlərdən qoruduq; bunlar kosmosda işə yaramaz, fəaliyyət göstərə bilməz.[235] (56/37, Saffat / 6-10)

## Nəcm: 207

**11** İndi onlardan soruş: "Yaradılışca onlarmı daha çətindir, yoxsa Bizim yaratdığımız kimsələrmi?" Şübhəsiz ki, Biz onları çox sulu yapışqan bir palçıqdan yaratdıq.

**12** Əslində sən heyrət etdin, onlar isə əylənirlər (istehza edirlər).
**13** Onlara öyüd verildiyi zaman öyüd qəbul etmirlər. **14** Və bir ayə
gördükləri zaman əylənmək üçün götürərlər (istehza edərlər).

**15-17** Və onlar: "Bu, açıq-aşkar ovsundan başqa bir şey deyildir. Öldüyümüz və torpaq, sümük olduğumuz zaman, Gerçəkdən biz təkrar dirildiləcəyikmi? Öncəki atalarımız da, eləmi?" deyirlər.

**18** De ki: "Bəli, siz də çox alçaldılmış olaraq dirildiləcəksiniz…"

(56/37, Saffat / 11-18)

## Nəcm: 208

**19,20** Artıq o, çətin bir hayqırışdan ibarətdir. Bir də baxmısan ki, onlar qarşıda durublar. Və "Vay halımıza! Bax bu, Din günüdür!" deyərlər.

**21** *–"Bax bu, sizin yalanladığınız Ayırma günüdür!"–*

**22,23** Toplayın o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənləri, tay tutduqlarını və Allahın altındakılardan ibadət etdikləri şeyləri. Sonra da onları cəhənnəmin yoluna yönləndirin.

**24,25** Və durdurun onları, şübhəsiz ki, onlar sorğu-suala çəkiləcəklər: "Sizə nə oldu ki, yardımlaşmırsınız?"

**26** Əksinə, bu gün onlar təslim olmuşlar.

**27** Və onların bəzisi bəzisinə dönmüş / üz-üzə gəlmiş, soruşurlar / məsuliyyəti bir-birlərinə atırlar.

**28** Onlar: "Şübhəsiz ki, siz bizə sağ əldən / haqq yoldan / yaxşı mövqedən / gücdən-qüvvətdən gəlirdiniz" deyərlər.

**29-32** Digərləri deyərlər ki: "Tam tərsinə, siz möminlər olmamışdınız. Bizim sizə qarşı bir gücümüz də yox idi. Tam tərsinə, siz azmış bir camaat idiniz. Onun üçün üzərimizə Rəbbimizin Sözü[236] haqq oldu. Şübhəsiz ki, biz dadanlarıq. Sonra Biz sizi təhrik etdik (yoldan çıxartdıq). Çünki biz təhrik edənlərik (yoldan çıxaranlarıq)."

**33** Bu halda şübhəsiz ki, onlar, o gün əzabda ortaqdırlar.

**34** Şübhəsiz, Biz günahkarlara belə edərik.

**35,36** Şübhəsiz, onlar, özlərinə: "Allahdan başqa ilah deyə bir şey

yoxdur" deyildiyi zaman böyüklük göstərirlər və: "Şübhəsiz ki, biz, gizli güclərlə dəstəklənən / dəli bir şair üçün ilahlarımızı buraxarıqmı?" deyirlər.

**37** Tam tərsinə o, haqq ilə gəldi və bütün peyğəmbərləri təsdiqlədi.

***

**38,39** Şübhəsiz siz, o ağrılı-acılı əzabı dadacaqsınız və sadəcə etdiyiniz əməllərinizlə cəzalandırılacaqsınız.

**40** Allahın pak qulları bunun xaricindədir.

**41-49** Məhz Allahın pak qulları, onlar üçün müəyyən bir ruzi / meyvələr vardır. Bol nemətli cənnətlərdə qarşılıqlı olaraq taxtlar üzərində qonaqlıq görənlərdir. İçənlərə ləzzət verən, çeşmədən doldurulmuş, zərərli bir tərəfi olmayan, sərxoşluq da verməyən dümağ bir qədəhlə onların ətrafında gəzib dolaşılar. Yanlarında da gözlərini onlara dikmiş iri gözlülər vardır. Qorunmuş yumurta kimidir onlar.

**50** Sonra da bəzisi bəzisinə dönüb bir-birlərindən soruşarlar.

**51-53** Onlardan bir sözçü deyər ki: "Şübhəsiz ki, mənim 'Sən gerçəkdən, qəti surətdə doğrulayanlardansanmı? Öldüyümüz və torpaq, sümük olduğumuz bir vaxtda gerçəkdən biz (etdiklərimizin) qarşılığını görəcəyikmi?' deyən bir yaşıdım / yaxın dostum var idi."

**54** Dedi ki: "Siz onu tanıyan, bilən birisinizmi?"

**55** Elə o vaxt, özü onu tanıdı və onu cəhənnəmin düz ortasında gördü.

**56-59** Dedi ki: "Allaha and olsun ki, sən az qala məni dəyişikliyə / məhvə məruz qoyacaqdın. (Əgər) Rəbbimin neməti olmasaydı, şübhəsiz ki, mən də orada olanlardan biri olacaqdım. Yaxşı, necə imiş, gör! Biz ilk ölümümüzdən başqa bir daha ölməyəcəkmişik, eləmi; bir daha dirildilməyəcəkmişik, eləmi? Biz, əzab da görməyəcəkmişik, eləmi?"

**60** Şübhəsizki, məhz bu, böyük qurtuluşun elə özüdür.

**61** Artıq çalışanlar, sadəcə böyük qurtuluş kimisi üçün çalışsınlar.

(56/37, Saffat / 19- 61)

## Nəcm: 209

**62** Qonaqlıq olaraq bu daha xeyirlidir, yaxud zəqqum ağacı?

**63** Şübhəsiz, Biz onu şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün bir imtahan vasitəsi etdik. **64,65** Şübhəsiz, o zəqqum ağacı, cəhənnəmin dibində çıxan bir ağacdır. Tumurcuqları buynuzlu ilanların başı kimidir.

**66** Bax, həqiqətən onlar, ondan yeyəcəklər və qarınlarını bununla

dolduracaqlar. 67 Sonra şübhəsiz onlar üçün, bundan əlavə qaynar
suyla qarışıq bir içki var. 68 Sonra da şübhəsiz dönəcəkləri yer,
həqiqətən cəhənnəmdir. (56/37, Saffat / 62-68)

## Nəcm: 210

69 Şübhəsiz, onlar atalarını azmış kimsələr olaraq gördülər.

70 İndi də özləri onların izləri üzərində gedirlər.

71 Və and olsun ki, onlardan öncəkilərin çoxu azğındı.

72 And olsun ki, Biz onların arasında xəbərdarlıq edənlər də göndərdik.

73,74 İndi bir bax, Allahın pak qulları xaricindəki o xəbərdarlıq edilənlərin sonu necə oldu?

75 Və and olsun ki, Nuh, Bizə səslənib dua etmişdi. *–Bax gör Biz nə
gözəl cavab verənlərik!–* 76 Biz də Onu və ailəsini, yaxınlarını, iman
edənlərini o böyük sıxıntıdan qurtardıq. 77 Və Onun nəslini baqi
qalanların (yaşamağa davam edənlərin) elə özü etdik.

78 Və Biz sonradan gələnlər arasında onun haqqında həmişə qalacaq [xeyirlə xatırlanacaq, örnək alınacaq] bir söz buraxdıq.

79 *–Aləmlər içində Nuha salam olsun!–*

80 Şübhəsiz, Biz, yaxşılıq edənlərə bax bu cür qarşılıq verərik.

81 Şübhəsiz, Nuh, Bizim mömin qullarımızdandır.

82 Sonra digərlərini suda boğduq.

***

83 Heç şübhəsiz İbrahim də Nuhun qrupundan (firqəsindən) idi.

84 Bir vaxt o, Rəbbinə səlim (təmiz) bir qəlblə gəlmişdi.

88-89 Çünki İbrahim, ulduzlara elə bir nəzərlə baxdı ki! Sonra da ‘Şübhəsiz ki, mən sancılıyam / fikir sancısı çəkirəm’ dedi.

85-87 Bir vaxt o, atasına və qövmünə: “Siz nəyə qulluq edirsiniz? Allahın altındakılardan bir neçə uydurma ilahlarımı istəyirsiniz? Bəs, aləmlərin Rəbbi haqqında qənaətiniz nədir?” demişdi.[237]

90 Buna görə atası və qövmü, İbrahimə arxalarını çevirərək (ondan) geri çəkildilər / onunla əlaqəni kəsdilər.

91,92 Sonra da o, onların ilahlarının yanına gedib: “Yemirsiniz /
nəsiblənmirsiniz? Sizə nə olub ki, danışmırsınız?” dedi. 93 Dərhal sağ
əliylə / andı səbəbiylə bir vuruşla yaxınlaşdı.

94 Bir müddət sonra, İbrahimin xalqı qaçaraq İbrahimlə üz-üzə gəldilər.

**95,96** İbrahim: "Əlinizlə yonub düzəltdiyiniz şeylərəmi ibadət edirsiniz? Halbuki sizi və düzəltdiyiniz şeyləri Allah yaratmışdır" dedi.

**97** Onlar: "Bunun üçün bir divar düzəldin / embarqo tətbiq edin və bunu şiddətlə yanan atəşin / həddindən artıq çətinliyin içinə atın!" dedilər.

**98** Onlar, İbrahimə tələ qurmaq istədilər, ancaq Biz onları alçaltdıq.

**99,100** Və İbrahim: "Şübhəsiz, mən Rəbbimə gedəcəyəm, O, mənə yol göstərəcək: Rəbbim! Mənə salehlərdən birini bəxş et!" demişdi.

**101** Buna görə Biz, İbrahimə yumşaq xasiyyətli (mülayim) bir gənc oğlanı müjdə verdik.

**102** Sonra nə vaxt ki, o müjdələnən uşaq özüylə birlikdə qaçacaq duruma / onunla birlikdə iş tutacaq çağa gəldi, o zaman İbrahim: "Oğlum! Şübhəsiz ki, mən, bu, yatılan; sakit, laqeyd, əlaqəsiz; yerdə, şübhəsiz özümü, səni pərişan və haqsızlığa uğramış hala (çətin vəziyyətə) saldığımı görürəm. Bax gör sən nə düşünürsən?" dedi. Oğlu: "Atacan! Sən əmr olunacağın şeyləri et! İnşaAllah sən mənim (yanımda) olmadığın bir vaxtda, başıma gələcək bütün sıxıntılara və haqsızlıqlara səbr edənlərdən (olduğumu) görəcəksən." dedi.

**103-105** Sonra nə zaman ki, ikisi də islamlaşdılar və İbrahim, onu alnı üzərində yerə yatırdı [üz üstə buraxdı, çətin vəziyyətdə buraxdı] və Biz ona: "Ey İbrahim! Sən o fikirini həqiqətən təsdiqlədin" deyə səsləndik…[238] *–Şübhəsiz Biz, yaxşı-gözəl əməl işləyənlərə bax onun kimi qarşılıq / mükafat verərik.–*

**106** Şübhəsiz ki, (öz) oğlunu üz üstə buraxmaq işi, həqiqətən açıq-aşkar cəfalı bir sınamadır.

**107** Və Biz İbrahimə, pərişan edəcəyi və çətin vəziyyətə salacağı çox böyük bu şey qarşılığında / səbəbiylə, bədəl / bəxşiş verdik.

**108** Və sonradan gələnlər arasında onun haqqında həmişə qalacaq [xeyirlə xatırlanacaq, örnək alınacaq] bir söz buraxdıq.

**109** Salam olsun İbrahimə!

**110** Bax, Biz yaxşı-gözəl əməl işləyənləri onun kimi mükafatlandırarıq.

**111** Şübhəsiz, o, Bizim inanan qullarımızdandır.

**112** Və Biz ona, salehlərdən bir peyğəmbər olaraq İshaqı müjdə verdik.

**113** İbrahimə və İshaqa bərəkətlər verdik. Hər ikisinin nəslindən də yaxşı-gözəl əməl işləyən ilə, açıq-aşkar öz nəfsinə haqsızlıq edən (də) vardır.

***

**114,115** Və and olsun ki, Biz Musa ilə Haruna da nemətlər verdik. Və o ikisini və qövmlərini o böyük sıxıntıdan qurtardıq.

**116** Və Biz, onlara yardım etdik, onlar da qalib gələnlərdən oldular.

**117** Və Biz, onlara o açıq-aşkar göstərən Kitabı verdik.

**118** Və onları doğru yola yönəltdik.

**119** Və sonrakılar arasında o ikisinə (yaxşı ad) buraxdıq.

**120** Salam olsun, Musa və Haruna!

**121** Şübhəsiz, Biz, yaxşı-gözəl əməl işləyənləri bu cür mükafatlandırarıq.

**122** Şübhəsiz, o ikisi Bizim mömin qullarımızdandır.

***

**123** Şübhəsiz, İlyas da həqiqətən göndərilən elçilərdəndir.

**124-127** Bir vaxt o, qövmünə: "Siz Allahın mühafizəsi altına daxil olmayacaqsınız? Yaradıcıların ən gözəli, sizin Rəbbiniz və daha öncəki atalarınızın Rəbbi Allahı buraxıb, Bəəl (adlı bütəmi) yalvarırsınız?" demişdi və onlar onu yalanlamışdılar. Buna görə onlar mütləq (hüzurda) hazır saxlanılacaqlar.

**128** Ancaq Allahın pak qulları müstəsna.

**129** Və sonradan gələnlər arasında onun haqqında həmişə qalacaq [xeyirlə xatırlanacaq, örnək alınacaq] bir söz buraxdıq.

**130** *–Salam olsun bütün İlyas kimi olanlara!–*

**131** Şübhəsiz, Biz, yaxşı-gözəl əməl işləyənləri bu cür mükafatlandırarıq.

**132** Şübhəsiz, o, Bizim mömin qullarımızdandır.

***

**133** Şübhəsiz, Lut da göndərilən elçilərdəndir.

**134-136** Bir vaxt Biz, onu və geridə qalıb batanlar arasında qalan bədbəxt qadın xaric olmaqla əhlinin (ailəsinin) hamısını qurtarmışdıq. Sonra digərlərini dəyişikliyə / məhvə məruz qoymuşduq.

**137,138** Və siz əlbəttə səhərlər və gecələr onların üzərində dayanıb durursunuz. Hələ də fikir vermirsiniz?

***

**139** Əlbəttə Yunus da göndərilən elçilərdəndir.

**140** Bir vaxt o, dolu (yüklü) bir gəmiyə doğru qaçaq bir kölə kimi qaçmışdı.

**141** Sonra o, ox ilə püşk atdı, sonra da dəlili ləğv edilənlərdən / iddiası

çürüdülənlərdən oldu.

**142** Sonra onu "acgözlük-böhran" udmuşdu. O isə peşman olmuşdu.

**143,144** Sonra əgər, şübhəsiz, o, Allahı nöqsan sifətlərdən pak tutanlardan olmasaydı, həqiqətən dirildiləcəkləri günə qədər böhranın içində qalacaqdı.

**145.146** Sonra Biz, o fikir ağrısı keçirdiyi vaxt onu sahilə atdıq və
böhrandan (depressiyadan) qurtardıq: Onun ağlına bəsit, müvəqqəti və
qısa müddətə həll ediləcək bir neçə problemlər soxmuşduq. **147** Və
Onu, öncə yüz min, sonra da daha çox adama elçi olaraq göndərdik.

**148** Nəhayət iman etdilər, buna görə, Biz də onları bir müddətə qədər faydalandırdıq. (56/37, Saffat / 69-148)

## Nəcm: 211

**149** İndi soruş onlardan: Qız uşaqları Rəbbinin, oğlan uşaqları onlarındırmı?

**150** Yoxsa Biz mələkləri dişi yaratmışıq, onlar da şahidlər imiş?

**151,152** Gözünüzü açın! Onlar, şübhəsiz ki, uydurduqları iftiralarına görə: "Həqiqətən Allah doğdu" deyirlər. Və heç şübhəsiz ki, onlar həqiqətən yalançıdırlar.

**153** Allah, qızları oğullardan üstünmü tutmuşdur?

**154** Sizə nə olub? Necə hökm verirsiniz?

**155** Hələ də düşünmürsünüz?

**156** Yoxsa sizin üçün açıq-aşkar bir güc / dəlil varmı?

**157** O halda, əgər doğru kimsələrsinizsə, gətirin kitabınızı.

**158** Və onlar, Allah ilə gizli güclər arasında bir qohumluq bağı (əlaqəsi) qurdular. Halbuki, and olsun ki, gizli güclər özlərinin (də) həqiqətən (hüzurda) hazır olanlar / məhşərdə toplananlar olduqlarını bilirlər.

**159** Allah, onların vəsf etdikləri şeylərdən pakdır.

**160** *–Ancaq Allahın pak qulları Allahı belə ortaq qəbul etmək şəklində vəsf etməzlər.–*

**161-163** Artıq siz və ibadət etdikləriniz, özü istəyərək cəhənnəmə can atan kimsədən başqasını, Allaha qarşı atəşə ata bilməzsiniz; ortaq qoşmağa cəlb edə bilməzsiniz. (56/37, Saffat / 149-163)

## Nəcm: 212

**164-166** Və "Bizdən hər birimizin həqiqətən bəlli bir məqamı vardır. Və biz həqiqətən səf-səf düzülənlərin / düzənlərin məhz özüyük. Biz,

Allahı nöqsanlıqlardan pak tutanların da məhz özüyük.”[239]

(56/37, Saffat / 164-166)

**Nəcm: 213**

**167-169** Və onlar həqiqətən, deyirdilər ki: “Şübhəsiz əgər yanımızda öncəkilərdən bir öyüd / kitab olsaydı, əlbəttə biz də Allahın pak qulları olardıq.”

**170** İndi də o öyüdü / kitabı ört-basdır etdilər. Artıq yaxında biləcəklər.

**171-173** Və and olsun ki, göndərilən qullarımız / elçilərimiz haqqında bizim sözümüz (belə) keçmişdir: “Şübhəsiz ki, onlar, mütləq qalib olanların özüdür. Şübhəsiz ki, Bizim ordularımız mütləq qalib gələnlərin özüdür.”

**174,175** Artıq sən, müəyyən bir vaxta qədər onlardan üz çevir. Və onları izlə. Onlar da yaxında görəcəklər.

**176** Yoxsa indi onlar, Bizim əzabımızın tez gəlməsinimi istəyirlər?
**177** Fəqət əzabımız onların sahəsinə endiyi zaman, xəbərdarlıq edilmişlərin səhəri necə də pisdir!

**178,179** Yenə sən, müəyyən bir müddət onlardan üz çevir və onları izlə! Onlar da yaxında görəcəklər.

**180** Güç, qüvvət, yenilməzlik, şan və şərəfin Rəbbi olan sənin Rəbbin onların vəsf etdiyi şeylərdən pakdır.

**181** Və salam, göndərilən elçilərədir!

**182** Bütün təriflər də aləmlərin Rəbbi Allahadır; başqasını tərifləmək olmaz. (56/37, Saffat / 167-182)

## LUQMAN (57 - 31) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 214**

**1** Əlif / 1, Lam / 30, Mim / 40.[240]

**2-5** Bax bunlar, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirən-ayaqda tutan], zəkatı / vergini verən, axirətə də qəti surətdə inananların özü olan gözəl-yaxşı əməl işləyənlər *–ki, bax bunlar, Rəbləri tərəfindən bir doğru yol üzərindədirlər. Və onlar, qurtuluşa yetişənlərin özüdür–* üçün bir doğru yol gösrtərən və rəhmət olmaq üzrə qanunlar ehtiva edən o kitabın ayələridir. (57/31, Luqman / 1-5)

### Nəcm: 215
**6** İnsanlardan eləsi də vardır ki, biliksizcə Allah yolundan azdırmaq və
onu əyləncəyə çevirmək üçün əyləncəli boş sözləri satın alar. Bax
onlar üçün alçaldıcı bir əzab vardır.
**7** Və ona ayələrimiz oxunduğu zaman, sanki qulaqlarında bir ağırlıq
varmış və onları eşitməmiş kimi böyüklük göstərərək arxa çevirər. Bax
ona, çox ağrı-acı verəcək bir əzabı müjdələ.
**8,9** Şübhəsiz, bu iman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən
kəslər, içində sonsuzadək qalmalarına rəğmən, onlar üçün nemət
(olaraq verilən) cənnətlərə (sahib) olanlardır. Bu, Allahın gerçək bir
vədidir. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün
olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın
qarşısını yaxşı alan / sağlam edəndir. (57/31, Luqman / 6-9)

### Nəcm: 216
**10** Allah, göyləri dayaq olmadan yaratmışdır, bunu görürsünüz. Yer
üzündə də, sizə süfrə hazırlasın deyə sarsılmaz (möhkəm duran) dağlar
qoymuşdur və oralarda irili-xırdalı hər canlıdan törədib yaymışdır. Və
Biz göydən su endirdik, beləliklə orada hər dəyərli cütdən bitkilər
bitirdik.
**11** Bax bu, Allahın yaratmasıdır. Haydı, göstərin mənə! Onun
altındakılardan olan kimsələr nə yaratmışdır? Əslində o şirk qoşaraq
səhv; öz zərərinə olan əməli işləyənlər, açıq-aşkar bir azğınlıq
içindədirlər. (57/31, Luqman / 10-11)

### Nəcm: 217
**12** And olsun ki, Biz, Luqmana: “Sənə verilən nemətlərin qarşılığını
Allaha ödə!” deyə, haqsızlıq və fəsadı əngəlləmək üçün qoyulmuş
qanun, düstur və qaydalar verdik. *–Kim özünə verilən nemətlərin
qarşılığını ödəyərsə, özü üçün ödəyər. Kim də nankorluq edərsə,
şübhəsiz ki, Allah heç bir şeyə möhtac deyildir, daim tərifə ən layiq
olandır.–*
**13** Və Əslində bir zaman Luqman oğluna öyüd verərək: *“Balam!
Allaha ortaq qoşma, heç şübhəsiz ki, Allaha ortaq qoşmaq, həqiqətən
böyük bir yanlış davranışdır; öz zərərinə olan əməli işləməkdir.* **16** *Ey
oğlum! Şübhəsiz ki, (Allaha) ortaq qoşmaq; işlənən pis bir əməl bir
xardal dənəsi ağırlığında olsa da bir qayanın içində, yaxud göylərdə
ya da yerin içində olsa, Allah onu gətirəcəkdir. Şübhəsiz ki, Allah, ən
lətif, layiqincə (yaxşıca) xəbərdar olandır.* **17** *Balam! Səlatı yerinə
yetir [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti
maarifləndirmə qurumlarını yarat-yaşat], yaxşılığı əmr et, pislikdən*

*çəkindir. Sənə üz verənə də səbr et. Şübhəsiz ki, bunlar, işlərin qəti olanlarındandır.* **18** *Və insanlara ovurdunu şişirmə (təkəbbürlə onlardan üz döndərmə), qaşqabağını tökmə və yer üzündə lovğalanaraq gəzib dolaşma. Şübhəsiz ki, Allah öyünən və övhama (xəyallarına) qapılanları sevməz.* **19** *Və yerişində orta həddi gözlə, səsini qaldırma. Şübhəsiz ki, səslərin ən anlaşılmazı həqiqətən eşşəklərin səsidir."* **13** demişdi.

**14** Və Biz insana, anası və atasını öhdəlik olaraq yüklədik. –*Anası onu zəiflik üstünə zəifliklə daşıdı. Onun süddən ayrılması da iki il içindədir.*– "Mənə, anana və atana qarşılıq ödə!" Dönüş, ancaq Mənədir.

**15** Və əgər ki, ana-atan bilmədiyin bir şeyi Mənə ortaq qoşmağın üzərində səni zorlayarlarsa, onlara itaət etmə. Və dünyada onlarla yaxşı dolan və Mənə yönələn kimsələrin yolunu tut. Sonra dönüşünüz ancaq Mənədir. Sonra da Mən, sizə etməkdə olduğunuz şeyləri sizə xəbər verəcəyəm.[241] (57/31, Luqman / 12-13, 16-19, 14-15)

## Nəcm: 218

**20** Allahın, göylərdə və yer üzündə nə varsa, hamısını sizin üçün boyun əydirdiyini (tabe etdirdiyini) / sizin faydalanacağınız quruluş və sistemdə yaratdığını görmədinizmi? Və Allah, daxildə və açıqda olmaq üzrə nemətlərini üzərinizə yaymışdır. İnsanlardan eləsi də var ki, biliksiz, yol göstərəni olmadan (rəhbərsiz) və aydınlıq gətirən bir kitabı olmadan Allah haqqında mübahisə edir.

**21** Və onlara: "Allahın nazil etdiyinə tabe olun!" deyildiyi zaman: "Əksinə, biz atalarımızı üzərində gördüyümüz şeyə tabe olarıq!" dedilər. Bəlkə şeytan onları cəhənnəmin əzabına çağırırdısa!

(57/31, Luqman / 20-21)

## Nəcm: 219

**22** Və hər kim gözəl-yaxşı əməl işləyərək özünü Allaha təslim edərsə, bax o, gerçəkdən ən sağlam dəstəkdən yapışmışdır. Bütün işlərin aqibəti yalnızca Allaha aiddir.

**23** Kim də küfr işləyərsə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsə], artıq onun küfrü [bilərək rədd etməsi] səni üzməsin. Onların dönüşü yalnızca Bizədir. O zaman Biz onlara etdikləri şeyləri xəbər verəcəyik. Gerçəkdən, Allah qəlblərin özünü çox yaxşı biləndir.

**24** Biz onları bir az bəhrələndirərik. Sonra da onları şiddətli bir əzaba doğru zorlayarıq.

**25** Yenə and olsun ki, onlara: "Göyləri və yeri kim yaratdı?" deyə soruşsan, mütləq "Allah" deyəcəklər. De ki: "Bütün təriflər Allaha

məxsusdur; başqasını tərifləmək olmaz!” Əslində onların çoxu bilməzlər.

26 Göylərdə və yerdə olan şeylər sadəcə Allahındır. Şübhəsiz ki, Allah zəngindir / heç bir şeyə möhtac deyildir, daima təriflənməyə layiqdir.

27 Və əgər, şübhəsiz, yer üzündə ağacdan nə varsa qələm olsa, dəniz də arxasından yeddi dəniz qatılaraq onun mürəkkəbi olsa, Allahın sözləri tükənməzdi. Şübhə yox ki, Allah ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

28 Sizin yaradılmağınız və ölümdən sonra dirildilməyiniz ancaq bir tək nəfərinki kimidir. Şübhəsiz ki, Allah ən yaxşı eşidən, ən yaxşı görəndir.

29 Görmədinmi / heç düşünmədinmi ki, Allah gecəni gündüzə daxil edir, gündüzü də gecəyə daxil edir. Günəş və ayı əmrinə boyun əydirmişdir / insanların faydasına uyğun quruluş və sistemdə yaratmışdır. Hamısı müəyyən edilmiş bir müddətin sonuna (doğru) axıb gedir. Və şübhəsiz ki, Allah etdiklərinizdən layiqincə xəbərdardır.

30 Bu da o səbəbdəndir ki, şübhəsiz, Allah haqqın elə özüdür. Və onların, Allahın altındakılardan yalvardıqları (şeylər) həqiqətən qeyb olub getmişdir. Və şübhəsiz ki, Allah, ən Ucanın, ən Böyüyün elə Özüdür.

31 Əlamətlərini / işarətlərini sizə göstərmək üçün, şübhəsiz, Allahın neməti ilə gəmilərin dənizdə üzüb getdiyini görmədinmi / heç düşünmədinmi? Şübhəsiz ki, bunda, bütün çox səbr edən və özünə verilən nemətlərin qarşılığını çoxlu ödəyən üçün əlamətlər / işarətlər vardır.

32 Və kölgələr kimi bir dalğa onları bürüdüyündə, Onun üçün dini pak tutaraq Allaha yalvarırlar. Amma nə zaman ki quruya çıxararaq qurtardı, onlardan bir qismi orta yolu tutar [iman ilə Allahın ilah və rəbb olduğunu bilərək rədd etmək arasında bir yol tutar, ikibaşlı oynayar]. Və bizim ayələrimizi ancaq, tam xain və tam nankor olan kimsələr bilə-bilə inkar edər.

33 Ey insanlar! Rəbbinizin mühafizəsi altına daxil olun. Və atanın övladına heç bir faydasının olmadığı, övladın da atasına heç bir şeylə faydasının olmadığı günü (yadınıza salaraq) ürpərin. Şübhəsiz ki, Allahın vədi gerçəkdir. O halda, bəsit dünya həyatı sizi aldatmasın. Və əsla o çox aldadıcı, sizi Allah ilə aldatmasın.

34 Şübhəsiz ki, qiyamətin qopma zamanının biliyi (məlumatı) Allah yanındadır. Və yağmuru O yağdırır, bətnlərdə olan şeyləri O bilir. Və kimsə sabah nə qazanacağını bilməz. Kimsə hansı yerdə öləcəyini də

bilməz. Şübhəsiz ki, Allah, ən yaxşı biləndir, ən yaxşı xəbəri olandır.
(57/31, Luqman / 22-34)

## SƏBA (58 – 34) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 220**

**1** Bütün təriflər, göylərdə olan şeylər və yerdə olan şeylər Özünə aid olan Allah üçündür; başqasını tərifləmək olmaz. Axirətdə də bütün təriflər yalnızca Onun üçündür; başqasını tərifləmək olmaz. Və O, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, hər şeyin iç üzünü, gizli tərəflərini də yaxşı biləndir.
**2** Allah, yerə gireni və oradan çıxanı da, göydən düşəni və onda yüksələni bilir. Və O, geniş mərhəmət sahibidir, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bağışlaması bol olandır.
(58/34, Səba / 1-2)

**Nəcm: 221**

**3,4** Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr]: “Bizə o qiyamətin qopma anı gəlməyəcəkdir” dedilər. De ki: “Bəli, gələcəkdir. Görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi bilən Rəbbimə and olsun ki, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən o kimsələrə *–ki, bax onların özləri üçün bir bağışlanma və önəmli bir ruzi vardır– (etdiklərinin)* qarşılıqlarını vermək üçün sizə mütləq gələcəkdir. Ondan göylərdə və yerdə zərrə qədər ağırlığı olan heç bir şey qaça bilməz. Bundan daha kiçik və daha böyük nə varsa, hamısı həqiqətən açıq-aşkar bir kitabdadır.”
**5** Və bu, əlamətlərimi / işarətlərimi gizlətməyə çalışanlar; bax onlar, üzüntü verən pis əzabdan onlar üçün bir əzab vardır.
**6** Özlərinə bilik verilmiş olan kimsələr də görürlər ki, Rəbbindən sənə nazil edilən şey, haqqın elə özüdür. Və o nazil edilən şey / Quran, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, təriflənən, tərifə layiq olanın yoluna yönləndirir.
**7,8** Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] belə dedilər: “Siz çürüyüb, didik-didik parçalandığınız vaxt, mütləq yeni bir yaradılışda olacaqsınız deyə sizə xəbər verən bir adamı göstərəkmi? O, bir yalanı Allah barəsində uydurdumu, yoxsa onda bir dəlilikmi var?” Tam tərsi, axirətə inanmayan kimsələr, əzab və uzaq bir azğınlıq içindədirlər.
**9** Yaxşı, onlar göydən və yerdən önlərində və arxalarında olan şeylərə bir baxmırlarmı? Biz istəsək onları yerə batırarıq. Yaxud göydən

üzərlərinə parçalar (parçalanmış bir şey) salarıq. Şübhəsiz ki, bunda yönələn / haqqa könül verən hər qul üçün bir əlamət / işarət vardır.
(58/34, Səba / 3-9)

## Nəcm: 222

10,11 Və and olsun ki, Biz Davuda Öz tərəfimizdən bir üstünlük və quşları verdik; "Ey dağlar! Onunla bərabər dönün!" Və onun üçün dəmiri yumşaltdıq: Çoxlu-çoxlu zirehlər düzəlt və formasını (fiqurunu) hazırlayarkən ölçüyə riayət et. *–Siz də saleh əməli işləyin. Həqiqətən Mən etdiklərinizi ən yaxşı görənəm.–*
12 Süleyman üçün də, səhər gedişi bir ay, axşam qayıdışı bir ay olan küləyi boyun əydirdik; və Biz ərimiş mis mədənini ona sel kimi axıtdıq. Və (onun) əli altında Rəbbinin izni ilə / məlumatı daxilində iş görən yadları (bilinməyən kəsləri) boyun əydirdik. Və onlardan kim Bizim əmrimizdən çıxıb-azarsa, ona şiddətli atəşin əzabından daddırdıq.
13 Onlar, Süleymana xüsusi qərargahlar, heykəllər / şəkillər və hovuzlar kimi çanaqlar və sabit qazanlardan hər nə istəyərsə düzəldirlər. *–Ey Davud ailəsi! Nemətlərin qarşılığını ödəmək üçün çalışın! Amma qullarım arasında, verilən nemətlərin qarşılığını ödəyən də çox azdır!–*
14 Nə zaman ki, Biz onun ölümünü gerçəkləşdirdik; onun ölümünə, onlara əl sopasını (dəyənəyini) yeyən yer üzü canlısından başqa heç bir şey dəlalət etmədi. Onun öldüyünü anlamalarına, onlara sadəcə əl sopasını (dəyənəyini) yeyən yer canlısı / qurd səbəb oldu. Nə zaman ki üz üstü yerə düşdü, ortaya çıxdı ki: "O yadlar (bilinməyən kəslər) bilmədikləri Süleymanın ölümünü bilmiş olsaydılar, o alçaldıcı əzab; həsrət, qürbət, əsarət (içində), ağır işlər (altında), zəncirə vurulmuş halda qalmazdılar."[242]
(58/34, Səba / 10-14)

## Nəcm: 223

15 And olsun ki, Səba qövmü üçün yurd tutduqları yerdə bir əlamət / işarət var idi: Sağdan və soldan iki bağça! – *"Rəbbinizin ruzisindən yeyin və Onun üçün nemətlərin qarşılığını ödəyin! Nə gözəl bir diyar və çox bağışlayan bir Rəbb!"–*
16 Fəqət onlar üz çevirdilər; nemətlərin qarşılığını ödəmədilər. Biz də üzərlərinə (su) anbarların selini buraxdıq və iki bağçalarını onlar üçün acı meyvəli, yulğun və içində bir az da "sidr ağacı" olan iki bağçaya çevirdik.
17 Bu, onların küfr etdikləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd etdikləri] səbəbiylə Bizim onları cəzalandırmağımızdır. Və Biz

sadəcə çox nankor olanları cəzalandırarıq.
**18** Və Biz onlarla o bərəkət verdiyimiz məmləkətlər arasında, arxa-arxaya (bir-birinə bitişik) şəhərlər meydana gətirmişdik. Və onlara da müntəzəm gediş-gəliş təşkil etdik: *–Buralarda gecə-gündüz təhlükəsiz şəkildə gedin-gəlin! –*
**19** Sonra da onlar: "Rəbbimiz! Səfərlərimizin arasını uzaqlaşdır!" dedilər və nəfslərinə yanlış; öz zərərlərinə olan əməli işləyərək haqsızlıq etdilər. İndi də Biz onları əfsanələr etdik və tamamən didik-didik dağıtdıq. Şübhəsiz ki, bunda, özünə verilən bütün nemətlərin qarşılığını çoxlu ödəyən səbr edən üçün əlbəttə əlamətlər / işarətlər vardır.
**20** Və and olsun ki İblis / zehin qabiliyyəti[243] onlar haqqındakı zənnini təsdiq etdi və möminlərdən ibarət bəlli bir bölümdən başqaları İblisə tabe oldu.
**21** Halbuki İblisin onların üzərində heç bir qüdrəti (gücü) yoxdur. Fəqət Biz axirətə imanı olanı, onun haqqında yetərli biliyi (məlumatı) olmayandan ayırd edəcəkdik; onları işarələyib bildirəcəkdik. Və sənin Rəbbin hər şeyi yaxşıca qoruyandır. (58/34, Səba / 15-21)

## Nəcm: 224
**22** De ki: "Allahın altındakılardan yanlış inandığınız kimsələrə yalvarın. Onlar göylərdə və yer üzündə zərrə ağırlığına malik olmazlar. Onlar üçün bu ikisində [göylər və yer üzündə] hər hansı bir ortaqlıq yoxdur. Onun üçün [Allah üçün] onlardan bir yardımcı da yoxdur."
**23** Onun yanında (yaxınında) yardım, dəstək, şəfaət[244] sadəcə Onun icazə verdiyi kimsəyə faydası olar. Nəhayət qəlblərindən dəhşət qaldırıldığı zaman: "Rəbbiniz nə dedi?" deyərlər. Onlar: "Haqqı" deyərlər. Və O, çox ucadır, çox böyükdür.
**24** De ki: "Sizi göylərdən və yerdən kim ruziləndirir?" De ki: "Allah! Və şübhəsiz ki, ya biz, ya da siz həqiqətən göstərilən doğru yol üzərindəyik və ya açıq-aşkar bir azğınlıq içindəyik."
**25** De ki: "Siz bizim etdiyimiz günahlardan məsul olmazsınız. Biz də sizin etdiklərinizdən məsul olmarıq."
**26** De ki: "Rəbbimiz aramızı birləşdirəcək, sonra da haqq (olan) hökmü ilə aramızı ayıracaqdır. Və O, xeyir qapılarını açandır, hökm verəndir, çox yaxşı biləndir.
**27** De ki: "Ona ortaqlar deyə düzüb-qoşduqlarınızı mənə göstərin görüm! Qətiyyən sizin düşündüyünüz kimi deyil… Xeyr! Tam tərsinə, O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən Allahdır."

28 Və Biz, səni ancaq bütün insanlara müjdə verən və xəbərdarlıq edən olaraq göndərdik, lakin insanların çoxu bilmir.
29 Və onlar, "Əgər siz doğrulardansınızsa, bu vəd etdiyiniz nə zamandır?" deyərlər.
30 De ki: "Sizin üçün günün müəyyən edilmiş bir zamanı vardır ki, ondan nə bir saat geri qala bilərsiniz, nə də irəli keçə bilərsiniz."
31 Və o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr]: "Biz qəti olaraq, bu Qurana inanmarıq, ondan öncəkinə də…" dedilər. Sən şirk qoşaraq, küfr edərək yanlış; öz zərərinə olan əməli işləyən o kimsələri Rəbləri hüzurunda tutuqlanmış, sözü bəzisinin bəzisinə geri çevirdiyini bir görsən! Zəifliyə məruz qalan kimsələr, təkəbbürlü kimsələrə: "Əgər sizlər olmasaydınız, həqiqətən bizlər mömin kimsələr olardıq" deyəcəklər.
32 Təkəbbürlü kimsələr, zəif salınan (olan) kimsələrə: "Sizə yol göstərən gəldikdən sonra, sizi ondan bizmi döndərdik? Tam tərsinə, siz özünüz günahkar oldunuz" deyərlər.
33 O zəif salınan (olan) kimsələr də o təkəbbürlü kimsələrə: "Tam tərsinə, gecənin və gündüzün tələsi! Siz bizə Allaha inanmamağımızı və Ona bir neçə tay tutaq deyə əmr edirdiniz." deyərlər. Bunlar əzabı gördükləri zaman peşmanlıqlarını gizləyəcəklər. Biz də o kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrin] boyunlarına dəmir həlqələr keçirmişik. Onlar sadəcə etdiklərinin qarşılığını görürlər.
34 Və Biz hər hansı bir məmləkətə xəbərdarlıq edən (birini) göndərdiksə, həqiqətən oranın varlı və güclü, qudurğan başbilənləri: "Biz sizinlə göndərilən şeyləri / mesajları bilərək rədd edənlərik / inanmayanlarıq" dedilər.
35 Və yenə dedilər ki: "Biz mal-dövlət və övlad baxımından daha çoxuq və biz əzaba uğrayanlardan deyilik."
36 De ki: "Şübhəsiz ki, mənim Rəbbim istədiyi kimsənin ruzisini artırar və məhdudlaşdırar. Lakin insanların çoxu bilməz."
37 Və sizi hüzurumuza yaxınlaşdıran, mal-dövlətiniz və övladlarınız deyil. Ancaq kim iman edər və yaxşılaşdırmaq məqsədi ilə əməl işləyərsə, bax onlar; özləri üçün etdiklərinə qarşı qat-qat qarşılıq vardır. Və onlar, yüksək qəsrlərində güvən içindədirlər.
38 Və ayələrimiz / əlamətlərimiz / işarətlərimiz haqqında aciz qoymaq üçün (bir-biri ilə) yarışan bu kimsələr, əzab içində hazır edilənlərdir.
39 De ki: "Şübhəsiz ki, mənim Rəbbim qullarından istədiyi kimsənin ruzisini artırar və onun üçün məhdudlaşdırar. Və siz hansı şeydən Allah yolunda xərcləsəniz / nəfəqə edərsəniz (başqalarının məişətini təmin etsəniz), O, dərhal arxasını gətirər. Və O, ruzi verənlərin ən

xeyirlisidir.”
40 Və o gün Allah, onların hamısını bir yerə toplayacaq, sonra da mələklərə: “Bunlarmı sizə ibadət edirdilər?” deyəcəkdir.
41 Onlar: “Səni tənzih edərik (nöqsanlardan uzaq tutarıq). Onlara qarşı bizim qoruyucu, yol göstərən yaxınımız Sənsən. Əksinə, onlar gizli güclərə ibadət edirdilər. Çoxu onlara inananlar idi” dedilər.
42 Artıq bu gün bəziniz-bəzinizə fayda və zərərə malik olmaz. Və Biz, ortaq qoşma inancına batmış o kəslərə: “Yalanladığınız o atəşin əzabını dadın görək!” deyərik. (58/34, Səba / 22-42)

## Nəcm: 225

43 Və onlara açıq dəlillər halında ayələrimiz oxunduğu zaman onlar: “Bu, sadəcə sizi atalarınızın ibadət etdiyi tanrılardan uzaqlaşdırmaq istəyən bir adamdan başqası deyil.” dedilər. Və: “Quran, uydurulmuş bir iftiradan başqa bir şey deyildir” dedilər. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr], özlərinə haqq gəldiyi zaman: “Şübhəsiz ki, bu, açıq-aşkar bir sehrdən başqa bir şey deyildir” dedilər.
44 Və Biz onlara belə dərs alacaqları kitablardan vermədik. Onlara səndən öncə xəbərdarlıq edən birini də göndərmədik.
45 Onlardan öncəki kimsələr də yalanlamışdılar. Həm də bunlar, onlara verdiklərimizin onda birinə / mində birinə belə yetişəməmişdilər. Buna rəğmən elçilərimi yalanladılar. Bax, Məni tanımamaq / tanıtmamağa çalışmaq necə oldu?
46 De ki: “Mən sizə sadəcə bir tək; Allah üçün iki-iki, üç-üç və tək-tək qalxmağınızı, sonra da yoldaşınız Muhəmməddə dəlilikdən bir şey olmadığını, onun, sadəcə şiddətli bir əzabın önündə sizi çəkindirəcək bir xəbərdarlıq edən olduğunu düşünməyinizi tövsiyə edirəm.”
47 De ki: “Mənim sizdən istədiyim muzd, bax o, sizin üçündür; sizin Allaha yaxınlaşmağınızdır. Mənim muzdum ancaq Allaha aiddir. Və O, hər şeyə şahiddir.”
48 De ki: “Şübhəsiz ki, mənim Rəbbim, haqqı öz yerinə qoyar. O, görünməyəni, eşidilməyəni, hiss edilməyəni, gələcəyi, keçmişi ən yaxşı biləndir.”
49 De ki: “Quran / Quranın ehtiva etdiyi gerçəklər gəldi. Və batil (bir şeyə) başlaya bilməz və (bir şeyi) geri gətirə bilməz; artıq heç bir şey edə bilməz.”
50 De ki: “Əgər mən yoldan azmışamsa, artıq yalnızca öz zərərimə azaram. Və əgər yönləndirildiyim doğru yolu tapmışamsa, bilinməlidir ki, (bu) Rəbbimin mənə vəhy verməsiylədir. Şübhəsiz ki, O, ən yaxşı eşidəndir, çox yaxındır.” (58/34, Səba / 43-50)

**Nəcm: 226**
51 Və sən onları qorxuya qapıldıqları zaman görəsən; artıq qaçmaq yoxdur. Və yaxın bir yerdən yaxalanmışlar.
52 Və onlar: "Ona iman etdik" dedilər. Lakin onlar üçün uzaq bir yerdən əl uzatmaq / yetişə bilmək haradadır?
53 Halbuki daha öncə dünyada Onu qəti surətdə bilərək rədd etmişdilər / Ona inanmamışdılar. Uzaq bir yerdən boş-boş danışırdılar.
54 Artıq eynilə bundan öncə bənzərlərinə edildiyi kimi, onlarla arzularının arasına sədd (maneə) çəkilmişdir. Şübhəsiz ki, onlar narahatlıq verən bir şübhə [qəti olmayan, əskik məlumat] içindədirlər.
(58/34, Səba / 51-54)

## ZUMƏR [QRUPLAR] (59 – 39) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 227**
1 Bu kitabın nazil edilməsi ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan; mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən Allah tərəfindəndir.
2 Şübhəsiz ki, Biz bu kitabı sənə həqiqətlə nazil etdik. Elə isə, Dini yalnız Onun üçün pak tutaraq Allaha qulluq et.
3 Diqqətli olun, xalis din sadəcə Allaha aiddir. Onun altındakılardan bir neçə yardımçı, yol göstərici, qoruyucu yaxınlar qəbul edənlər: "Allahın altındakılardan qəbul etdiyimiz yardımçı, yol göstərici, qoruyucu yaxınlar, bizi Allaha daha çox yaxınlaşdırsın deyə biz onlara ibadət edirik." (deyirlər). Şübhəsiz ki, onların ayrılığa / anlaşılmazlığa düşdükləri şeylər barədə, onların arasında Allah hökm verəcəkdir. Şübhəsiz ki, Allah yalançı və çox nankor olan şəxsləri doğru yola yönəltməz.
4 Əgər Allah özünə övlad götürmək istəsəydi, həqiqətən yaratdıqlarından istədiyini seçərdi. O, bundan pakdır. O, bir olan, qəhr edən Allahdır.
5 Bir olan, qəhr edən Allah göyləri və yeri haqq ilə yaratdı, gecəni gündüzün üstünə bürüyür, gündüzü də gecənin üstünə bürüyür. Günəşi və ayı faydanıza olan quruluş və sistemdə yaradaraq xidmətinizə vermişdir. Hamısı da müəyyən bir müddətin sonuna (doğru) axıb getməkdədir. Yaxşı bilin ki, O, çox güclü və çox bağışlayandır.
6 O, sizi tək bir nəfisdən yaratdı, sonra ondan zövcəsini yaratdı və sizin üçün heyvanlardan səkkiz cüt endirdi. Sizi analarınızın bətnlərində üç zülmət içində, yaradılışdan sonra bir yaradılışla yaradır. Bax bu, sahiblik, rəhbərlik yalnız Özünə məxsus olan Rəbbiniz Allahdır. Ondan başqa ilah deyə bir şey yoxdur. Elə isə, necə olur ki,

döndərilirsiniz?
**7** Əgər küfr işləsəniz; Allahın ilah və rəbb olduğunu bilərək rədd etsəniz / nankorluq etsəniz, bilin ki, şübhəsiz Allah sizə heç bir ehtiyacı olmayandır və O, qulları üçün küfrə; Özünün ilah və rəbliyinin bilərək rədd edilməsinə / nankorluğa razı olmaz. Və əgər özünüzə verilən nemətlərin qarşılığını ödəsəniz, sizin üçün ona razı olar. Heç bir daşıyıcı, başqa birisinin yükünü çəkməz. Sonra dönüşünüz yalnızca Rəbbinizədir. Beləcə, etdiklərinizi sizə xəbər verəcəkdir. Şübhəsiz ki, O, sinələrin özündə gizli olanı yaxşı biləndir.
(59/39, Zumər / 1-7)

## Nəcm: 228

**8** İnsana bir sıxıntı toxunduğu zaman, bütün könlünü Ona verərək Rəbbinə yalvarar. Sonra ona Öz tərəfindən bir nemət bəxş etdiyi zaman da öncədən Ona yalvardığı halı unudar və Allahın yolundan döndərmək üçün Ona ortaqlar qoşar. De ki: "Küfrünlə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edişinlə] bir az faydalan! Şübhəsiz ki, sən atəşin əhlindənsən."
**9** Yaxud da gecə saatlarında qalxan, boyun əyib təslimiyyət göstərərək, ayaq üstə duraraq, axirətdən çəkinərək daim müti dayanan və Rəbbinin rəhmətinə ümid bəsləyən o kimsə, elə etməyənlə bir ola bilərmi? De ki: "Heç bilən kimsələr və bilməyən kimsələr eyni ola bilərmi?" Həqiqətən, sadəcə təmiz ağıl sahibi olanlar öyüd alarlar / lazımınca düşünərlər.
**10** De ki: "Ey iman etmiş olan qullar![245] Rəbbinizin mühafizəsi altına daxil olun. Bu dünyada yaxşı-gözəl əməl işləyənlərə bir gözəllik var. Şübhəsiz ki, Allahın yer üzü genişdir. Ancaq səbr edənlər, mükafatlarını hesabsız olaraq tam alacaqlar."
**11,12** De ki: "Mən, həqiqətən dini yalnızca Özünə məxsus edərək Allaha qulluq etməklə əmr olundum. Və mənə müsəlmanların ilki olmağım üçün əmr verildi."
**13** De ki: "Şübhəsiz ki, mən Rəbbimə asi olsam, böyük günün əzabından qorxuram."
**14-16** De ki, "Dinimi yalnız Onun üçün pak tutaraq Allaha qulluq edirəm. Buna rəğmən siz, Onun altındakılardan istədiyinizə qulluq edin." De ki: "Şübhəsiz ki, əsl ziyana uğrayanlar, qiyamət günündə özlərini və ailələrini və yaxınlarını ziyana uğradanlardır." *–Diqqətli olun! Bax bu, açıq-aşkar bir ziyanın özüdür. Onların üstlərində oddan təbəqələr, altlarında da təbəqələr vardır. Allah, qullarını bax bununla qorxudur: Ey qullarım! Mənim mühafizəm altına daxil olun.–*
**17,18** Və tağuta[246] qulluq etməkdən çəkinən və Allaha yönələn

kimsələr üçün müjdə var. Haydı, sözü dinləyib və ən gözəlinə uyan qullarımı müjdələ! Bax onlar, Allahın doğru yola yönəltdiyi (Allahın onlara doğru yol göstərəni verdiyi) kimsələrdir. Və həmçinin onlar, qavrama qabiliyyəti / təmiz ağıl sahibi olanların məhz özüdür.
**19** Yaxşı, üzərinə "əzab kəlməsi" haqq olan kimsə necə? Artıq atəşdəki o kimsəni sənmi xilas edəcəksən?
**20** Lakin Rəblərinin mühafizəsi altına daxil olan o kəslər üçün Allahın vədi olaraq altlarından çaylar axan, mərtəbə-mərtəbə qəsrləri var. Allah vədində əsla xilaf çıxmaz.
**21** Sən, şübhəsiz Allahın göydən bir su endirdiyini, onu [müəyyən bir üsulla] yer üzündəki bulaqlara axıtdığını, sonra onunla növbənöv rənglərdə əkin bitirdiyini, sonra onun yetişkinləşdirdiyini və sənin də onu saralmış halda gördüyünü, sonra da onu bir çöpə çevirdiyini görmədinmi / heç düşünmədinmi? Şübhəsiz ki, bunda anlayış qabiliyyəti olanlar; təmiz ağıl sahibləri üçün həqiqətən bir öyüd / xatırlatma vardır.
**22** Bəs, Allah kimin sinəsini islama açarsa, o zaman o, Rəbbindən (tərəfindən) bir işıq üzərində olmazmı? Elə isə, Allahı xatırlamağa qarşı qəlbləri sərt olanların vay halına! Bax onlar, açıq-aşkar bir azğınlıq içindədirlər.
**23** Allah, sözün ən gözəlini oxşar mənalı olaraq, ikili[247] bir kitab şəklində nazil etmişdir. Ondan, Rəblərinə hörməti olanların tükləri biz-biz olar.[248] Sonra dəriləri və qəlbləri Allahın xatırlanmasına qarşı yumşalar. Bax bu, Allahın rəhbəridir. Allah, onunla istədiyinə (doğru) yol göstərər. Hər kimi də Allah azdırarsa, artıq ona doğru yolu göstərən biri yoxdur.
**24** Bəs, qiyamət günü şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərə: "Qazanmış olduğunuzun qarşılığını dadın!" deyilmişkən, özünü əzabın pisliyindən qorumağa çalışan kimsəmi daha xeyirlidir, yoxsa qiyamət günü güvən içində gələcək kəsmi?[249]
**25,26** Onlardan öncəki kimsələr yalanladılar, onlara düşünə bilmədikləri yöndən əzab gəldi. Sonra da Allah, onlara bəsit dünya həyatında rüsvayçılığı daddırdı. Axirət əzabı isə əlbəttə daha böyükdür. Kaş ki, bilsəydilər!
**27,28** Və and olsun ki, Biz düşünüb öyüd alsınlar deyə, ərəbcə rəvan bir oxuma olaraq; Allahın mühafizəsi altına daxil olsunlar deyə bu Quranda insanlar üçün hər cürə örnək verdik.
**29** Allah, mübahisə edən bir neçə ortaqları olan bir adam ilə yalnız bir şəxsə bağlı (və) amanlıqda olan bir adamı örnək verdi. Bu ikisinin halı heç eyni ola bilərmi? *–Bütün tariflər Allaha məxsusdur; başqasını tərifləmək olmaz.–* Əksinə, onların çoxu bilməz.

30 Şübhəsiz, sən mütləq öləcəksən, onlar da mütləq öləcəklər.
31 Sonra şübhəsiz ki, siz qiyamət günü Rəbbinizin hüzurunda
mübahisə edəcəksiniz.
32 Elə isə, Allaha qarşı yalan söyləyəndən və doğru ona gəldiyi zaman
onu yalanlayandan daha səhv; öz zərərinə olan əməli işləyən kim ola
bilər? O kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər]
üçün cəhənnəmdə bir sığınacaq yoxdurmu!?
33 Və doğrunu gətirən və onu təsdiq edən kəs; bax onlar, Allahın
mühafizəsi altına daxil olan kəslərin məhz özüdür.
34,35 Onlar üçün Rəbləri yanında dilədikləri şeylər vardır. Bax bu,
Allahın, onların öncədən etdiklərinin ən pisini örtməsi, işlədiklərinin
ən gözəlinə, əcirlərini qarşılıq olaraq verməsi üçün yaxşı və gözəl əməl
işləyənlərin qarşılığıdır.
36 Allah, quluna kifayət deyilmi? Onlar isə səni, Onun altındakılardan
(bəzi) kimsələrlə qorxudurlar. Və Allah kimi azdırarsa, artıq ona yol
göstərən biri yoxdur.
37 Kimə də Allah yol göstərərsə, artıq onu da azdıran biri yoxdur.
Allah, çox güclü, günahkarı tutub cəzalandıraraq ədaləti bərqərar edən
deyilmi?
38 Və sən, həqiqətən onlara: "O göyləri və yeri kim yaratdı?" deyə
soruşsan, həqiqətən "Allah!" deyəcəklər. De ki: "Elə isə Allahın
altındakılardan çağırdıqlarınızı heç düşündünüzmü? Əgər Allah mənə
bir zərər vermək istəsə, onlar Onun zərərini dəf edə bilən
kimsələrdirmi? Yaxud mənə bir rəhmət diləsə, onlar Onun rəhmətini
əngəlləyə bilən kimsələrdirmi? De ki: "Allah, mənə yetər. İşlərin
nəticəsini buraxanlar, nəticəni yalnızca Ona buraxsınlar."
39,40 De ki: "Ey qövmüm! Siz olduğunuz yerə (vəziyyətə) görə
çalışın (səy göstərin). Şübhəsiz ki, mən də çalışan biriyəm. Artıq
rüsvay edici əzabın kimə gələcəyini və qalıcı bir əzabın kimin üzərinə
enəcəyini yaxında biləcəksiniz."
41 Şübhəsiz ki, Biz bu kitabı sənə, insanlar üçün haqq ilə nazil etdik.
O halda, kim yönəldildiyi doğru yolu tapdısa, artıq öz lehinədir. Kim
də azdısa, artıq o, sırf öz əleyhinə olaraq azar. Və sən onların üzərində
onları ayaqda saxlamaq üçün məsuliyyətli biri deyilsən.
42 Allah, o nəfsləri, ölüm əsnasında, onlara keçmişdə etdiklərini və
etməli olduqları halda etmədiklərini bir-bir xatırlatdırar. Ölməyənləri
də yatdıqlarında; artıq barələrində ölüm gerçəkləşdirdiklərini saxlayar,
digərlərini isə müəyyən bir müddətin sonuna qədər buraxar. Şübhəsiz
ki, bunda düşünən bir camaat üçün nə qədər əlamətlər / işarətlər vardır.
43 Yoxsa onlar, Allahın altındakılardan (özlərinə) bir qrup dəstəkçi,
yardımçı, şəfaətçilərmi qəbul etdilər (seçdilər)? De ki: "Onlar heç bir

şeyə qadir olmasalar və (heç bir şeyi) dərk etməsələr də, belə edəcəksinizmi?”
**44** De ki: “Bütün yardım, dəstək, yaxşılıq Allaha məxsusdur. Göylərin və yerin mülkü yalnızca Onundur. Sonra yalnızca Ona döndərilirsiniz.”
**45** Və Allah “tək” olaraq xatırlandığı zaman axirətə inanmayan kəslərin ürəkləri burxular (sıxılar) və Onun altındakılardan olan kimsələr xatırlandığı zaman dərhal üzləri gülər.
**46** De ki: “Ey göylərin və yerin yoxdan yaradıcısı / parçalayıcısı, görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi və varlıqların ağıl və duyğularla müşahidə (dərk) edilənlərini bilən Allahım! Qulların arasında, ixtilafa düşdükləri (mübahisə etdikləri) o şeylər haqqında Sən hökm verəcəksən.”
**47** Və əgər bütün yer üzündəkilər və onunla birlikdə bir o qədəri də şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kəslərin olsaydı, qiyamət gününün pis əzabından qurtulmaq üçün onu həqiqətən fidyə verərdilər. Və onların heç hesaba almadıqları şeylər, Allah tərəfindən onlar üçün meydana çıxarılar.
**48** Və qazandıqlarının pislikləri (pis nəticələri) onlar üçün meydana çıxmış və haqqında istehza etdikləri şeylər, onların ətrafını hər tərəfdən bürümüşdür.
**49** Bax, insana bir sıxıntı toxununca Bizə yalvarır, sonra ona tərəfimizdən bir nemət bəxş etdiyimiz zaman da: “O, mənə bir bilik üzərində (biliyimə görə) verildi” deyər. Əslində verilən nemətlər, bir imtahan vasitəsidir. Lakin onların çoxu bilməz.
**50** Həqiqətən “O mənə bir bilik üzərində (biliyimə görə) verildi” sözünü, bunlardan öncəki kimsələr də söylədi və o qazandıqları şeylər, onlara fayda vermədi.
**51** Nəhayət, qazandıqları şeylərin pislikləri (pis nəticələri) özlərinə yetişdi. Bunlardan şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləyən kəslər (ki var), onların da qazandıqları şeylərin pislikləri özlərinə yetişəcəkdir. Və onlar aciz qoya bilənlər deyil.
**52** Şübhəsiz Allahın, istədiyinə ruzini yaydığını və məhdudlaşdırdığını hələ də bilmədilərmi? Şübhəsiz ki, bunda iman edəcək bir camaat üçün həqiqətən neçə-neçə əlamətlər / işarətlər vardır.
**53** De ki: “Ey nəfslərinə qarşı həddi aşan qullar![250] Allahın rəhmətindən ümid kəsməyin. Şübhəsiz ki, Allah günahları tamamilə bağışlayar. Şübhəsiz ki, O, çox bağışlayandır, çox mərhəmət edəndir.
**54** Və sizə əzab gəlmədən öncə Rəbbinizə yönəlin və Ona təslim olun. Sonra sizə yardım edilməz.
**55-58** Və qəflətən əzab gəlmədən,

insanın: “Allahın yanında, etdiyim həddi aşmalarıma görə vay halıma! Doğrusu mən istehza edənlərdən idim” deməsindən,
yaxud: “Allah mənə doğru yolu göstərsəydi, hər halda mən Allahın mühafizəsi altına daxil olan kimsələrdən olardım” deməsindən
və ya əzabı gördüyü zaman: “(Kaş) mənə bir geri dönüş (imkanı) olsaydı, mən də o yaxşı və gözəl əməl işləyənlərdən olsaydım” deməsindən öncə, Rəbbinizdən sizə nazil edilənin ən gözəlini izləyin.”
**59** Tam tərsinə, sənə ayələrim gəldi, ancaq sən onları dərhal yalan saydın, böyüklük göstərdin və kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərdən] oldun.
**60** Və o qiyamət günü, Allaha qarşı yalan söyləyən kəsləri üzləri qaralmış olaraq görəcəksən. *–Təkəbbür göstərənlər üçün cəhənnəmdə yermi yoxdur?–*
**61** Allahın mühafizəsi altına daxil olan kəsləri də Allah nailiyyətləri səbəbiylə / sığınacaqlarında (təhlükədən qorunmuş yerlərdə) xilas edər. Onlara pislik toxunmaz (pis vəziyyətə düşməzlər) və onlar üzülməzlər də.
**62** Allah, hər şeyin yaradıcısıdır. O, hər şeyin “müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən”idir.
**63** Bütün göylərin və yerin açarları yalnızca Onundur. Allahın ayələrini ört-basdır edən kimsələr; bax onlar, zərərə uğrayanların məhz özləridir.
**64** De ki: “Buna rəğmən siz, mənə Allahdan başqasına qulluq etməyimi əmr edirsiniz, ey cahillər!”
**65,66** Və and olsun ki, sənə və səndən öncəkilərə belə vəhy edildi: “And olsun ki, əgər ortaq qoşarsan, əməlin həqiqətən boşa gedəcək və həqiqətən itirənlərdən (ziyana uğrayanlardan) olacaqsan. Onun üçün, tam əksinə, yalnız Allaha qulluq et və sahib olduğu nemətlərin qarşılığını ödəyənlərdən ol.”
**67** Və onlar Allahı layiqincə təqdir etmədilər / dəyərləndirə bilmədilər. Və yer üzü bütövlüklə, qiyamət günü Onun ovucundadır. Göylər də Onun qüdrəti ilə bükülmüşdür. O, onların ortaq qoşduqlarından pak və çox ucadır.
**68** Və sur üfürülmüşdür[251] və Allahın istədiyi istisna olmaqla, göylərdə kim varsa, yerdə kim varsa hamısı çarpılıb (vurulub) yıxılmışdır. Sonra ona (sura) başqa bir daha üfürülmüşdür və onlar qalxmışlar, qarşıda (hazır) durub baxırlar.
**69** Və (o günkü) yer üzü Rəbbinin nuru ilə aydınlanmış, kitab qoyulmuş, peyğəmbərlər və şahidlər gətirilmiş və aralarında haqq ilə qərar verilmişdir. Və onlara haqsızlıq edilməz.

**70** Və Allah, (kim) nə əməl etdisə, hər kəsə qarşılığını həqiqətən tam olaraq ödəyəcək. Və Allah onların etdiklərini ən yaxşı şəkildə biləndir.
**71** Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] mütləq dəstə-dəstə cəhənnəmə sövq olunacaq. Nəhayət, oraya çatdıqlarında qapıları açılacaq. Və onun gözətçiləri onlara: "Aranızdan sizə Rəbbinizin ayələrini oxuyan, bu gününüzlə qarşılaşacağınıza dair sizi xəbərdar edən elçilər gəlmədimi?" deyəcəklər. Onlar: "Bəli, gəldi" deyəcəklər. *–Lakin kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üzərində əzab kəlməsi haqq oldu.–*
**72** "Daimi olaraq içində qalmaq üzrə girin cəhənnəmin qapılarından" deyildi. *–Təkəbbür göstərənlərin yeri necə də pisdir!–*
**73** Rəblərinə qarşı Allahın mühafizəsi altına daxil olan kəslər də həqiqətən cənnətə dəstə-dəstə sövq ediləcək. Nəhayət, oraya çatdıqları, qapılar açıldığı və gözətçiləri onlara: "Salam sizlərə, tərtəmiz gəldiniz!" dediyi zaman: "Sonsuz olaraq içində qalmaq üzrə haydı girin oraya!" deyiləcək.
**74** Onlar da: "Bütün təriflər, bizə vədini doğru çıxardan və bizi bu ərzə varis edən və cənnətdə bizi istədiyimiz yerdə məskun edən O Allahadır" dedilər. *–Bax, çalışanların (əməl edənlərin) mükafatı necə də gözəldir! –*
**75** Və sən, kainatdakı bütün gücləri[252] ən böyük taxtın[253] bir kənarından dolaşanlar olaraq,[254] Rəblərinin tərifiylə birlikdə Allahı nöqsan sifətlərdən pak tutduqlarını görərsən. Və onların aralarında mükafat və cəza haqq ilə gerçəkləşdirilmişdir. Və "Bütün təriflər aləmlərin Rəbbi Allahadır!" deyilməkdədir. (59/39, Zumər / 8-75)

## MUMİN (60 – 40) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 229**
**1** Ha / 8, Mim / 40.[255]
**2,3** Bu kitabın nazil edilməsi çox güclü, ən yaxşı bilən, günahı bağışlayan, tövbələri qəbul edən, əzabı çox şiddətli olan, bol nemət; lütf sahibi Allah tərəfindəndir. Ondan başqa ilah deyə bir şey yoxdur. Dönüş yalnızca Onadır.
**4** Allahın ayələri haqqında yalnız kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş kimsələr] mübahisə edər. O halda, onların şəhərlərin içində gəzib dolaşmaları səni aldatmasın.
**5** Onlardan öncə Nuh qövmü və onlardan sonrakı bəzi əleyhdar qrup yalanladı. Hər ümmət, öz elçilərini yaxalamaq üçün cəhd göstərmişdi; haqqı batillə aradan götürmək üçün onunla mübarizə etdilər. Mən də onları yaxaladım. Bax, əzabım necə oldu?

6 Və bax beləcə kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üzərində Rəbbinin "Şübhəsiz ki, onlar atəşin əhlidir" sözü haqq oldu. (60/40, Mumin / 1-6)

## Nəcm: 230

7-9 Ən böyük taxtı[256] daşıyan, bir də ən böyük taxtın xarici kənarında olan kimsələr[257], Rəblərinin tərifiylə birlikdə Onu nöqsan sifətlərdən pak tutarlar və Ona inanarlar. İman etmiş kimsələr üçün bağışlanma diləyərlər: "Rəbbimiz! Sən rəhmət və biliklə hər şeyi əhatə etdin. Onun üçün tövbə edən və Sənin yoluna tabe olan kimsələri bağışla və onları cəhənnəmin əzabından qoru! Rəbbimiz! Onları və onların atalarından, zövcələrindən və soylarından əməlisaleh olan kimsələri onlara vəd etdiyin Ədn cənnətlərinə daxil et. Şübhəsiz ki, Sən ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan və ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edənin Özüsən. Onları pisliklərdən də qoru. Və Sən hər kimi pisliklərdən qoruyarsan, artıq o gün əlbəttə ona rəhmət etmisən. Bax bu, böyük qurtuluşun məhz özüdür." (60/40, Mumin / 7-9)

## Nəcm: 231

10 Şübhəsiz ki, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] səslənilər: "Əlbəttə Allahın buğzu (qəzəbli nifrəti), özünüzə buğzunuzdan (qəzəbli nifrətinizdən) daha böyükdür. Çünki siz imana dəvət olunurdunuz və küfr edirdiniz; Allahın ilah və rəbb olduğunu bilərək rədd edib dururdunuz."

11 Kafirlər dedilər ki: "Ey Rəbbimiz! Sən bizi iki dəfə öldürdün, iki dəfə diriltdin. Artıq günahlarımızı etiraf etdik. İndi bir çıxış yolu varmı?"

12 Bax bunun, səbəbi budur: Siz, "bir və tək" olaraq Allaha dəvət edildiyiniz zaman küfr etdiniz; inanmadınız. Ona ortaq qoşulunca isə inandınız. Artıq hökm, O çox uca və çox böyük olan Allahındır. (60/40, Mumin / 10-12)

## Nəcm: 232

13 Allah, sizə əlamətlərini / işarətlərini göstərən, sizin üçün göydən ruzi endirəndir. Və ancaq könüldən yönələnlər öyüd alarlar.

14 Elə isə kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] xoşlanmasa da dini sadəcə Ona aid edərək Allaha dua edin.

15 O, dərəcələri yüksəldəndir, ən böyük taxtın / ən yüksək mövqenin sahibidir: O, görüşmə (bir araya gəlmə) günü haqqında xəbərdarlıq etmək üçün Öz əmrindən / Öz işindən olan vəhyi qullarından

istədiyinə buraxar (verər).
**16** O görüşmə (bir araya gəlmə) günü, onlar meydana çıxarlar. Onlardan heç bir şey Allaha qarşı gizli qalmaz. –*“Bu gün mülk kimindir?”, “Sadəcə tək və qəhr edici olan Allahındır!”*–
**17** Bu gün hər kəs qazandığının qarşılığını alacaqdır. Bu gün haqsızlıq deyə bir şey yoxdur. Şübhəsiz ki, Allah haqq-hesabı çox tez görəndir.
**18** Yaxınlaşan gün haqqında da onları xəbərdar et. O zaman udqunaraq, dəhşətdən ürpərərək qəlblər qırtlaqlara (gəlib) dayanmışdır. Şirk qoşmaq surətiylə səhv; öz zərərinə olan əməli işləyən kimsə üçün nə istiqanlı bir dost vardır, nə də itaət ediləcək (sözü keçən) bir dəstəkçi, yardımçı, şəfaətçi…
**19** Allah, gözlərin xainliyini və sinələrin gizlədiyini bilir.
**20** Və Allah haqqı gerçəkləşdirir. Onların Onun altındakılardan yalvardıqları kimsələr heç bir şeyi gerçəkləşdirə bilməzlər. Şübhəsiz ki, Allah, ən yaxşı eşidənin, ən yaxşı görənin elə Özüdür.
(60/40, Mumin / 13-20)

## Nəcm: 233

**21** Onlar yer üzündə gəzmədilərmi ki, özlərindən öncəkilərin aqibətləri necə olmuş görsünlər? Onlar yer üzündə qüvvət və əsər (iz) baxımından onlardan daha üstün idilər. Yenə də Allah onları günahları səbəbiylə aldı (məhv etdi). Və onları Allahdan qoruyan biri olmadı.
**22** Bax, bunun səbəbi budur: Onlara elçiləri açıq-aşkar dəlillərlə gəlirdilər, ancaq onlar küfr etdilər; inanmadılar. Belə olduqda, Allah da onları aldı (məhv etdi). Şübhəsiz ki, O, güclüdür, cəzalandırması çox şiddətlidir. (60/40, Mumin / 21-22)

## Nəcm: 234

**23,24** And olsun ki, Musanı Fironun, Hamanın və Qarunun yanına ayələrimizlə və açıq-aşkar bir dəlil ilə elçi olaraq göndərdik, ancaq onlar: “Bu bir sehrbaz, böyük bir yalançıdır” dedilər.
**25** Beləliklə Musa, tərəfimizdən onlara bir haqq ilə gəldiyi zaman, onlar: “Musa ilə birlikdə iman etmiş kəslərin oğullarını qətl edin; təhsilsiz, təlimsiz buraxıb (saxlayıb) cahil (bacarıqsız) bir kütlə halına gətirərək gücsüzləşdirin, qadınlarını isə sağ buraxın [utanca boğun]” dedilər. Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək tədd edənlərin] hiyləsi, boşa çıxmaqdan başqa bir şey deyildir.
**26** Və Firon: “Buraxın məni, öldürüm Musanı, o da Rəbbini çağırsın. **Şüphəsiz mən onun sizin dininizi dəyişdirməsindən və yaxud bu yerdə / ölkəmizdəki anarxiyanı ortaya çıxarmasından; təxribatçı planımızı deşifrə etməsindən qorxuram” dedi.**

**27** Musa da: "Şübhəsiz ki, mən hesab gününə inanmayan hər bir təkəbbür sahibindən, mənim Rəbbim və sizin Rəbbinizə sığınıram" dedi.
**28,29** Və Firon ailəsindən (olub) imanını gizlədən cəsur bir adam: "Bir adamı, 'Rəbbim Allahdır' dediyi üçün öldürəcəksinizmi? Halbuki o, həqiqətən sizə Rəbbinizdən dəlillərlə gəlmişdir. Və əgər o, bir yalançıdırsa, bir də görərsən ki, yalanı öz əleyhinə olmuşdur. Və əgər doğruçudursa sizə etdiyi təhdidlərin bir qismi sizə toxunar. Şübhəsiz ki, Allah, həddi aşan yalançı bir adama doğru yolu göstərməz. Ey qövmüm! Bu gün yer üzündə ortada olan (bilinən) idarəetmə sizindir. Yaxşı, əgər Allahın qəzəbi gələrsə, kim bizə yardım edib (bizi ondan) qurtarar?" dedi.
Firon: "Mən sizə öz rəyimdən başqasını bildirmirəm və mən sadəcə sizə yetkinliyin / ağıllı olmağın yolunu göstərirəm" dedi.
**30-35** Yenə o iman edən kimsə dedi: "Ey qövmüm! Şübhəsiz ki, mən sizin üçün Əhzabın (başına gələn) günün bənzərinin; Nuh qövmünün, Adın, Səmudun və daha sonrakıların macəralarının bənzərinin (başınıza gəlməsindən) qorxuram. Və Allah, qulları üçün bir haqsızlıq, yanlışlıq istəməz. Ey qövmüm! Şübhəsiz ki, mən, sizə gələcək o çığırışma-bağırışma / qaçışma günündən; üz çevirib qaçacağınız gündən qorxuram. Sizin üçün Allahdan qoruyan biri yoxdur. Hər kimi də Allah azdırarsa, artıq onun üçün bir yol göstərən yoxdur. Və and olsun ki, bundan öncə sizə Yusuf dəlillərlə gəlmişdi. O zaman da onun sizə gətirdiyi şeylərdə şübhə edib durmuşdunuz [qəti olmayan, qeyri-kafi məlumata sahib idiniz]. Axırda o öldüyündə də: "Bundan sonra Allah, əsla elçi göndərməz" dediniz. Allah, bu özlərinə gəlmiş bir güc olmadan, Allahın ayələri / əlamətləri / işarətləri haqqında mücadilə edən, həddi aşan, şübhəçi kəsləri bax belə azdırar. Bu hal, Allah qatında və iman edənlər yanında buğz (qəzəbli nifrət) olaraq böyükdür. Bax, Allah, hər lovğalanan zülmkarın qəlbi üzərinə damğa vurar."
**36,37** Və Firon: "Ey Haman! Səbəblərə; göylərin səbəblərinə çatmaq üçün mənə bir qüllə tik ki, Musanın ilahının nə olduğunu anlayım. Və şübhəsiz ki, mən onun yalançı olduğuna inanıram" dedi. Bax beləcə, Firona əməlinin pisliyi süslü göstərildi və yoldan çıxarıldı. Və Firon rejimi, yalnızca itki / zərər və əzab içindədir.
**38-44** Yenə iman edən o kimsə dedi: "Ey qövmüm! Mənə tabe olun ki, sizə ağıllı olmağın yolunu göstərim. Ey qövmüm! Bu bayağı həyat ancaq müvəqqəti bir qazancdır. Axirət isə həqiqətən qalınacaq yurdun məhz özüdür. Hər kim bir pislik edərsə, ona ancaq etdiyinin bir misli ilə cəza verilər. Və kişi və ya qadın, hər kim mömin olaraq yaxşılaşdırmaq qayəsi ilə əməl işləyərsə, artıq onlar, orada hesabsızca

ruzilənmək üzrə cənnətə girərlər." Yenə: "Ey qövmüm! Mənə nə olub ki, siz məni atəşə dəvət edərkən, mən sizi qurtuluşa dəvət edirəm! Siz, məni, Allaha inanmamağa və mənim üçün (haqlarında) heç bilik (məlumat) olmayan şeyləri Ona ortaq qoşmağa dəvət edirsiniz. Mən isə sizi O çox güclü və çox bağışlayan Allaha dəvət edirəm. Heç inkar edilə bilməz ki, gerçəkdən, sizin məni dəvət etdiyiniz şey, dünyada və axirətdə özünə bir çağırışı olmayan şeydir. Və şübhəsiz, dönüşümüz Allahadır. Və şübhəsiz ki, həddi aşanlar, cəhənnəm əhlinin məhz özləridir. Artıq siz mənim, sizin üçün söylədiklərimi yaxında xatırlayacaqsınız. Və mən işimi Allaha həvalə edirəm. Şübhəsiz ki, Allah, qullarını ən yaxşı görəndir!" dedi.
**45,46** Sonra Allah o mömini onların qurduqları hiylələrin şərrindən qorudu. Fironun yaxınlarını isə, əzabın pisi; atəş bürüdü. Onlar davamlı olaraq atəşə təqdim olunurlar (atəşə salınırlar). Qiyamət qopacağı gün isə: "Fironun yaxınlarını əzabın ən şiddətlisinə salın!"
(60/40, Mumin / 23-46)

## Nəcm: 235

**47** Və onlar, atəş içində bir-birləriylə mübahisə edərkən, zəif olanlar, özlərini böyük tutanlara: "Şübhəsiz ki, bizlər sizə tabe olan kimsələr idik. İndi siz bizdən, atəşin bir hissəsini dəf edə bilirsinizmi?" deyərlər.
**48** Özlərini böyük tutanlar: "Şübhəsiz ki, hamımız birlikdə onun içindəyik. Şübhəsiz ki, Allah qullar arasında hökmünü vermişdir" dedilər.
**49** Və atəş içindəki kimsələr, cəhənnəm gözətçilərinə dedilər: "Rəbbinizə dua edin ki, bir gün olsun bizim əzabımızdan bir az yüngülləşdirsin."
**50** Gözətçilər: "Sizə elçiləriniz açıq-aşkar dəlilləri gətirmədilərmi?" deyə soruşarlar. Onlar: "Bəli, gətirmişdilər" deyərlər. Gözətçilər: "Elə isə, özünüz dua edin" deyərlər. Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] duası çaşqınlıqdadır / boşa çıxmışdır. (60/40, Mumin / 47-50)

## Nəcm: 236

**51** Şübhəsiz ki, Biz, elçilərimizə və iman etmiş şəxslərə bu bəsit dünya həyatında və şahidlərin qalxdığı / şahidlik edəcəkləri gündə mütləq yardım edərik.
**52** O gün şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyən kimsələrə üzr diləmələri fayda verməz. Və onlar (Allahın rəhmətindən) uzaqlaşdırılaraq məhrum ediləcəklər, yurdun ən pisi də

onlar üçündür.
**53,54** Və and olsun ki, Biz, təmiz ağıl sahiblərinə bir yol göstərici və bir xatırlatma olmaq üzrə Musaya "yol göstərmə" verdik və İsrail oğullarına o kitabı miras qoyduq.
**55** O halda, səbr et. Şübhəsiz ki, Allahın vədi haqdır. Günahın üçün əfv edilmə istə, davamlı olaraq Rəbbinin tərifiylə birlikdə Onu bütün nöqsanlıqlardan pak tut.
**56** Şübhəsiz ki, özlərinə qəti bir dəlil gəlmədən Allahın ayələri / əlamətləri / işarətləri haqqında mücadilə edənlər; onların sinələrində ancaq yetişə bilməyəcəkləri bir kibir var. Sən dərhal Allaha sığın. Şübhəsiz ki, O, ən yaxşı eşidən və ən yaxşı görəndir.
**57** Əlbəttə, göylərin və yerin yaradılması insanların yaradılmasından daha böyükdür. Amma insanların çoxu bilmir.
**58** Və kor ilə görən eyni olmaz. İman etmiş və yaxşılaşdırmaq məqsədi ilə əməl işləyənlər və pislik edənlər də eyni deyildir. Nə qədər də az düşünürsünüz!
**59** Şübhəsiz ki, o qiyamətin qopma anı, əlbəttə gələcəkdir. Ona heç şübhə yoxdur. Fəqət, insanların çoxu inanmırlar.
**60** Və sizin Rəbbiniz: "Mənə yalvarın, dua edin ki sizə qarşılıq verim. Şübhəsiz ki, Mənə qulluq etməkdən özlərini böyük tutan kimsələr yaxında xorlanmış (alçaldılmış) olaraq cəhənnəmə girəcəkdir" dedi.
**61** Allah, dincəlməyiniz üçün gecəni, göz açan bir aydınlıq [düşüncə inkişaf etdirici] olaraq da gündüzü sizin üçün nizamlayandır. Şübhəsiz ki, Allah insanlara qarşı bir mükafat sahibidir (mükafatlandırıcıdır). Lakin insanların çoxu verilən nemətlərin qarşılığını ödəməz.
**62** Məhz, hər şeyin yaradıcısı (olan) Rəbbiniz Allah budur. Ondan başqa ilah deyə bir şey yoxdur. O halda, necə olur ki, döndərilirsiniz?!
**63** Bax Allahın ayələrini bilə-bilə inkar edən kimsələr bu cür döndərilirlər.
**64** Allah, sizin üçün yer üzünü bir qərargah (məskən) edən, göyü də bir bina edən, sizə surət verən, *–surətlərinizi necə də gözəl vermişdir–* və sizə təmiz şeylərdən ruzi verəndir. Bax O, Rəbbiniz olan Allahdır. *–Baxın Aləmlərin Rəbbi olan Allah necə də comərddir!–*
**65** O, diridir, Ondan başqa ilah deyə bir şey yoxdur. Bu səbəblə, dini sadəcə Onun üçün pak tutanlardan olaraq Ona dua edin. Bütün təriflər yalnız aləmlərin Rəbbi Allahadır; başqasını tərifləmək olmaz."
**66** De ki: "Rəbbimdən mənə açıq-aşkar dəlillər gəldiyi zaman, şübhəsiz ki, mən, sizin Allahı buraxıb o ibadət etdiklərinizə qulluq etməkdən qəti surətdə çəkindirildim və mən aləmlərin Rəbbinə təslim
olmağımla əmr olundum. **67** O, sonra güclü-qüvvəli bir çağa
yetişməyiniz, sonra da qocalmağınız və müəyyən bir müddətə

çatmağınız, həm də ağlınızı işlətməyiniz üçün sizi bir torpaqdan, sonra bir nütfədən, sonra bir embriondan yaradandır. *–Sonra O, sizi zəif, çəlimsiz (çox balaca) bir uşaq olaraq çıxarar. Sizdən bəzisi də, daha öncə vəfat*[258] *etdirilir; keçmişdə etdikləriniz və etməli olduğunuz halda etmədikləriniz bir-bir xatırladılır.–* **68** O, yaşadır və öldürür. Artıq O, bir əmr gerçəkləşdirmək istədikdə, ona sadəcə 'Ol!' deyər, o da dərhal olar." (60/40, Mumin / 51-68)

## Nəcm: 237

**69-76** Allahın ayələri üzərində mübahisə edənləri görmədinmi / heç düşünmədinmi? Necə də döndərilirlər? Kitabı və elçilərimizə göndərdiklərimizi yalan sayanlar əlbəttə gələcəkdə, boyunlarında həlqələr və zəncirlər olaraq qaynar suya sürüklənib, sonra atəşdə yandırıldıqları zaman biləcəklər. Sonra onlara: "Allahın altındakılardan ortaq qoşduğunuz şeylər haradadır?" deyilər. Onlar: "Bizdən qeyb olub getdilər; əslində biz onsuz da əvvəllər heç bir şeyə yalvarmırdıq" deyərlər. Bax, Allah kafirləri [Özünün ilah və rəbb olduğunu bilərək rədd edənləri] yoldan belə azdırar: "Bax bu, yer üzündə haqsız yerə öyünməyinizə və təkəbbürlənməyinizə görədir. Orada əbədi qalmaq üzrə cəhənnəm qapılarına girin!" *–Bax, böyüklənənlərin dayanacağı necə də pisdir!–* (60/40, Mumin / 69-76)

## Nəcm: 238

**77** Artıq sən səbr et, şübhəsiz Allahın vədi haqdır. Artıq onlara etdiyimiz təhdidin bir qismini sənə göstərsək də və ya səni vəfat etdirsək; keçmişdə etdiklərini və etməli olduğun halda etmədiklərini bir-bir xatırlatdırsaq da onlar, yalnızca Bizə döndəriləcəklər.
**78** Və and olsun ki, Biz səndən əvvəl neçə elçilər göndərdik. Onlardan bəzisini sənə anlatdıq, onlardan bəzisini də anlatmadıq. Heç bir elçi Allahın izni / biliyi (məlumatı) olmadan bir əlamət / işarət gətirə bilməz. Artıq Allahın əmri gəlincə də, haqq ilə gerçəkləşdirilər. Batilə meyl edənlər, bax burada itkiyə, zərərə uğrayıb əzab çəkdilər.
(60/40, Mumin / 77-78)

## Nəcm: 239

**79,80** Allah, onlardan bir qisminə minəsiniz deyə sizin üçün heyvanları yaradan, nizamlayandır. Onların bir qisimindən də yeyirsiniz. Və sizin üçün onlarda daha neçə-neçə mənfəətlər vardır. Və Allah, onların üzərində könüllərinizdəki bir arzuya yetişərsiniz deyə heyvanları yaradandır, nizamlayandır. Və siz, onların üzərində və gəmilər üzərində daşınırsınız.

**81** Və Allah sizə əlamətlərini / işarətlərini göstərir. Yaxşı, indi Allahın əlamətlərinin / işarətlərinin hansını tanınmaz hala gətirirsiniz?
(60/40, Mumin / 79-81)

## Nəcm: 240

**82.** Məgər onlar yer üzündə gəzib, özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmədilərmi? Onlar özlərindən həm daha çox, həm də qüvvətcə və yer üzündəki əsərlərinin sağlamlığı baxımından daha güclü idilər. Buna baxmayaraq o qazandıqları şeylər, onlara fayda vermədi.
**83.** Nə vaxt ki, elçiləri onlara açıq-aşkar dəlillərlə gəldi, özlərində olan biliyə (məlumata) görə həyasızlıq etmişdilər. Halbuki o, istehza etdikləri şey onları əhatə etmişdi.
**84.** Sonra da nə zaman ki, qəzəbimizi gördülər: "Allahın birliyinə inandıq və Ona ortaq qoşduğumuz şeyləri qəbul etmədik" dedilər
**85.** Amma qəzəbimizi gördüklərində etdikləri imanları onlar üçün faydalı deyildi. *–Allahın qullarına qarşı davamlı münasibəti ...–* Məhz kafirlər; Allahın ilahlığını və rəbliyini bilərəkdən rədd edən o kimsələr burada ziyan etdilər və zərərə uğradılar. (60/40, Mumin / 82-85)

## FUSSİLƏT [TƏFSİLATLI / AYIRD EDİLMİŞ] (61 – 41) SURƏSİ MƏKKƏ DÖVRÜ

## Nəcm: 241

**1** Ha / 8, Mim / 40.[259]
**2-4** Ərəbcə bir Quran, müjdələyən və xəbərdarlıq edən olaraq, bilən bir camaat üçün ayələri ətraflı olaraq açıqlanmış / bölüm-bölüm ayrılmış, yaratdığı bütün canlılara dünyada daha çox mərhəmət edən, geniş mərhəmət sahibi Allah tərəfindən nazil edilmiş bir kitab! Buna rəğmən, onların çoxu üz çevirmişdir. Artıq onlar qulaq asmazlar.
**5** Və onlar: “Bizi çağırdığın (dəvət etdiyin) o şeyə qarşı qəlblərimiz bir örtük / zireh içindədir, qulaqlarımızda bir ağırlıq və bizimlə sənin aranda da bir pərdə vardır. Artıq sən, edə bildiyini et, biz də həqiqətən (bildiyimizi) edirik” dedilər.
**6,7** De ki: “Mən sadəcə sizin kimi bir bəşərəm. Mənə, ‘Sizin ilahınızın yalnız tək ilah olduğu’ vəhy edilir. Ona görə, Ona doğru yönəlin və Ondan bağışlanma diləyin.” Və zəkatı / vergini verməyən və axirəti bilə-bilə inkar edən o kimsələrin / inanmayanların məhz özü olan (o) ortaq qoşanların vay halına!
**8** *–Şübhəsiz ki, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyənlər, onlar üçün bitməz tükənməz / başa qaxılmaz (minnətsiz) əcr vardır.–*
(61/41, Fussilət / 1-8)

**Nəcm: 242**

9 De ki: "Siz yer üzünü iki mərhələdə yaradanı gerçəkdən örtüb gizləyəcəksinizmi / (Ona) inanmayacaqsınızmı? Bir də Ona tay (ortaqlar) qoşursunuz! O, aləmlərin Rəbbidir."
10 Və O, yer üzünün içində sabit (möhkəm) dağlar yerləşdirdi. Orada bərəkətlər meydana gətirdi. Orada araşdırıb istəyənlər üçün bərabər olaraq / ayrı-seçkilik edilmədən ruziləri dörd mərhələdə nizamladı.
11 Sonra tüstü halında olan göyə yerləşdi / hökmranlıq qurdu,[260] sonra ona və yer üzünə: "İstəyərək və ya istəməyərək gəlin!" dedi. İkisi də: "Biz istəyərək gəldik" dedilər.
12 Beləliklə, Allah, onları iki mərhələdə yeddi göy olmaq üzrə gerçəkləşdirdi və hər göyün öz işini içinə yüklədi. Biz ən yaxın göyü qəndillərlə və mühafizə ilə süslədik. Bax bu, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, çox yaxşı bilənin nizamlamasıdır. (61/41, Fussilət / 9-12)

**Nəcm: 243**

13 Buna rəğmən, onlar yenə də üz döndərərlərsə dərhal de ki: "Mən sizə Ad və Səmud tayfalarının ildırımının bənzəri olan bir ildırıma qarşı xəbərdar etdim."
14 Bir vaxt onlara, "Allahdan başqasına qulluq etməyin!" deyə önlərindən-arxalarından [hər yanlarından] elçilər gəlmişdi. Onlar: "Əgər Rəbbimiz istəsəydi, əlbəttə, mələklər endirərdi. Buna görə biz, sizinlə göndərilən şeyləri həqiqətən bilərəkdən rədd edənlərik / inanmayanlarıq" dedilər.
15 Ad (qövmünə) gəlincə də, onlar yer üzündə nahaq yerə təkəbbür göstərdilər və: "Güc baxımından bizdən daha üstün kim var?" dedilər. Onlar şübhəsiz özlərini yaradan Allahın güc baxımından onlardan daha üstün olduğunu görmədilərmi? Və onlar Bizim ayələrimizi bilə-bilə inkar edirdilər.
16 Buna görə Biz də onlara bu ən bəsit dünya həyatında rəzillik əzabını daddırmaq üçün o uğursuz günlərdə dondurucu bir qasırğa göndərdik. Axirət əzabı isə əlbəttə daha çox rəzil edicidir. Onlara yardım da edilməz.
17 Səmuda gəlincə isə, Biz onlara doğru yolu göstərdik. Fəqət onlar korluğu doğru yoldan artıq sevib tərcih etdilər. Belə olduqda, qazandıqları şeylər səbəbiylə alçaldıcı əzabın ildırımı onları yaxaladı.
18 Və Biz iman etmiş kimsələri və Allahın mühafizəsi altına daxil olan kimsələri qurtardıq. (61/41, Fussilət / 13-18)

## Nəcm: 244

**19** Və Allahın düşmənlərinin bir yerə gətirilib toplandıqları gün artıq onlar atəşə (doğru) göndəriləcəklər.
**20** Nəhayət oraya gəldikləri zaman, onların eşitmə, görmə duyğuları və dəriləri, etdikləri şeylər ilə əlaqəli öz əleyhlərində şahidlik edərlər.
**21-23** Və onlar öz dərilərinə: "Niyə əleyhimizə şahidlik etdiniz?" dedilər. Onlar dedilər ki: "Hər şeyi danışdıran Allah, bizi danışdırdı və sizi ilk dəfə O yaratdı və Ona döndərilməkdəsiniz. Siz, eşitmə, görmə duyğularınız və dəriləriniz əleyhinizə şahidlik edər deyə gizlənmirdiniz (qoxub çəkinmirdiniz). Lakin etdiklərinizdən bir çoxunu Allahın bilməyəcəyinə inandınız. Məhz Sizin bu inancınız; Rəbbiniz haqqında olan bu inancınız, sizi məhv etdi və beləliklə zərərə, itkiyə məruz qalıb ağrı çəkənlərdən oldunuz."
**24** İndi əgər onlar israrla ortaq qoşma inancını, yalan hesab etməyi davam etdirərlərsə, artıq onların qalacaqları yer atəşdir. Və əgər üzrlərini bildirməyə çalışsalar, onlar, üzrü qəbul ediləcək kimsələr deyillər.
**25** Və Biz onlara bir qrup yaşıdlarını / İblislərini qabıq kimi üzərlərinə örtdük, onlar da, önlərində və arxalarında [bütün ətraflarında] olanları onlara süslü (cazibədar) göstərdilər. Gəlib-keçmiş hər kəsdən, özlərindən öncə gəlib-keçmiş ümmətlərdə qüvvədə olan "Söz"[261] onların üzərinə haqq oldu. Şübhəsiz ki, onlar, zərərə / itkiyə məruz qalıb ağrı çəkən kimsələr idilər. (61/41, Fussilət / 19-25)

## Nəcm: 245

**26** Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr]: "Qalib gəlməyiniz üçün bu Quranı dinləməyin, onun içində anlamsız şeylər edin / anlaşılmasını hər cürə yolla əngəlləyin" dedilər.[262]
**27** Artıq Biz, albəttə ki, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] şiddətli bir əzab daddıracağıq. Və həqiqətən onlara, etdikləri əməllərin ən pisini qarşılıq olaraq verəcəyik.
**28** Bax bu, Allahın düşmənlərinin cəzasıdır; atəşdir. Ayələrimizi bilə-bilə inkar edən kimsələr olduqlarına (görə) cəza olaraq, onlar üçün orada sonsuzluq yurdu vardır.
**29** Və o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəslər]: "Rəbbimiz! Bildiyimiz-bilmədiyimiz hər kəsdən (olan) bizi doğru yoldan azdıranları bizə göstər. Onlar ən aşağıdakılardan olsunlar deyə biz onları ayaqlarımızın altında saxlayaq" dedilər.
(61/41, Fussilət / 26-29)

## Nəcm: 246

**30-32** Şübhəsiz, "Rəbbimiz Allahdır" deyib sonra ən doğru olanlar; onların üzərinə, xəbərçi ayələr davamlı enər; "Qorxmayın və üzülməyin. Sizə vəd olunan cənnətlə sevinin. Biz, dünya həyatında və axirətdə sizin yol göstərənləriniz, yardımçılarınız və qoruyanlarınızıq. Cənnətdə, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olan, geniş mərhəmət sahibindən bir ikram olaraq sizin üçün nəfslərinizin arzuladığı hər şey var. Orada istədiyiniz şeylər də sizin üçündür."

**33,34** Və Allaha çağırıb (dəvət edib) / yalvarıb saleh əməl işləyən və "Mən müsəlmanlardanam" deyən kimsədən daha gözəl sözlü kim vardır? Və bütün gözəlliklər / bütün yaxşılıqlar eyni olmaz; bütün çirkinliklər / bütün pisliklər də eyni olmaz. Pisliyi, gözəlin / yaxşılığın ən gözəli / ən yaxşısı ilə dəf et. O zaman səninlə arasında düşmənlik olan (ədavət aparan) kimsə, sanki istiqanlı bir yaxının (olar).

**35** Bu yetkin davranışa ancaq səbr edənlər nail ola bilər, buna ancaq böyük bir pay sahibi olan nail ola bilər.

**36** Və əgər şeytandan gələn pis bir düşüncə səni dürtəcək olarsa (təhrik edərsə), dərhal Allaha sığın. Şübhəsiz ki, O, ən yaxşı eşidənin və ən çox bilənin məhz Özüdür. (61/41, Fussilət / 30-36)

## Nəcm: 247

**37** Və gecə, gündüz, günəş və ay Onun əlamətlərindən / işarətlərindəndir. Günəşə və aya boyun əyib təslimiyyət göstərməyin. Və əgər sadəcə Allaha qulluq edirsinizsə, onları yaratmış olan Allaha boyun əyib təslimiyyət göstərin.

**38** Buna baxmayaraq, onlar əgər təkəbbür göstərsələr bilsinlər ki, Rəbbini yaxşı tanıyan kəslər hər zaman Onun üçün Allahı nöqsan sifətlərdən pak tutarlar və onlar heç usanmazlar.

**39** Şübhəsiz ki, sənin yer üzünü boynu bükük görməyin və Bizim onun üzərinə suyu endirdiyimiz zaman, onun titrəşməsi və qabarması da Onun əlamətlərindən / işarətlərindəndir. Şübhəsiz ki, ona həyat verən, həqiqətən ölüləri də diriildər. Şübhəsiz ki, O, hər şeyə qadirdir.

**40** Şübhəsiz əlamətlərimiz / işarətlərimiz haqqında düzgünlükdən ayrılıb inkara yönələn kimsələr Bizdən gizli qalmaz. O halda, atəşə atılacaq olan kəs daha xeyirlidir, yoxsa qiyamət günü güvən içində gələcək kəs? İstədiyinizi edin. Şübhəsiz ki, Allah etdiyiniz şeyləri ən yaxşı görəndir. (61/41, Fussilət / 37-40)

## Nəcm: 248

**41,42** Şübhəsiz, Öyüd / Quran onlara gəldiyində onu bilərəkdən rədd

edən kimsələr… Və şübhəsiz, o Öyüd / Kitab, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən, təriflənən, tərifə layiq olan tərəfindən endirilmədir. Önündən və arxasından / heç bir tərəfindən batilin ona yol tapa bilmədiyi çox şərəfli bir kitabdır.
**43** Sənin üçün səndən öncəki elçilərə söylənəndən başqa bir şey söylənmir. Şübhəsiz ki, sənin Rəbbin həqiqətən bağışlama sahibidir və ağrı verən bir əzabın sahibidir.
**44** Və əgər Biz o öyüdü / Quranı əcnəbi dildə bir oxuma [kitabı] etsəydik, əlbəttə, onlar: "Ayələri ətraflı olaraq verilməli deyildimi? Əcnəbi dilmi, ərəbcəmi!" deyəcəkdilər. De ki: "O, iman edən kimsələr üçün bir yol göstən və bir şəfadır." İnanmayanlara gəlincə, onların qulaqlarında bir ağırlıq vardır. Və o Öyüd / Quran, onlar üçün bir korluqdur. Onlara çox uzaq bir məkandan səslənilməkdədi.
**45** Və and olsun ki, Biz Musaya Kitabı vermişdik və onda anlaşmazlığa düşüldü. Əgər Rəbbin tərəfindən verilmiş Söz[263] olmasaydı, həqiqətən aralarında (hökm) gerçəkləşdirilmişdi. Və şübhəsiz ki, onlar, bundan [Qurandan] şübhə edərək yetərsiz bir biliyə (məlumata) sahibdirlər. (61/41, Fussilət / 41-45)

## Nəcm: 249

**46** Hər kim saleh əməl işləyərsə, artıq özü üçün işləmiş olar. Kim də bir pislik edərsə, artıq öz əleyhinədir. Və sənin Rəbbin qullara qətiyyən haqsızlıq edən biri deyildir.
**47** O saatın biliyi (məlumatı) sadəcə Allahdadır. Onun biliyi (məlumatı) xaricində heç bir meyvə qabığından çıxmaz, heç bir dişi hamilə qalmaz və doğmaz, bala salmaz. Və Allah, onlara: "Mənim ortaqlarım haradadı?" deyə səsləndiyi gün, onlar: "Bizdən heç bir şahid olmadığını Sənə ərz edirik" deyərlər.
**48** Öncədən ibadət etdikləri şeylər də onlardan uzaqlaşıb qeyb oldu. Onlar, özləri üçün qaçacaq bir yer olmadığını da çox yaxşı anladılar.
**49** İnsan xeyir istəməkdən usanmaz, ona bir pislik üz verdikdə isə dərhal, üzülər, ümidsizliyə qapılar.
**50** Və əgər ona üz verən sıxıntıdan sonra ona Öz tərəfimizdən bir rəhmət daddırsaq, heç şübhəsiz: "Bu mənim haqqımdır. Və qiyamətin qopma anının gələcəyini güman etmirəm. Və əgər Rəbbimə döndəriləcəmsə (qaytarılaramsa), Onun qatında heç şübhəsiz, mənim üçün ən gözəli vardır" deyər. Bu səbəblə kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə], etdiklərini qəti olaraq bildirəcəyik və onlara, mütləq sərt bir cəzadan daddıracağıq.
**51** Və Biz insana nemət verdiyimiz zaman, o, üz çevirər, yan gəzər. Ona bir pislik üz verdikdə isə çoxlu-çoxlu dua sahibidir; elə hey

yalvarar.
**52** De ki: "Heç düşündünüzmü? Əgər Quran, Allah qatından olub və
sonra siz bu gerçəyi ört-basdır etmişsinizsə… Özü uzaq bir ayrılığın
içində olan kimsədən daha azmış kim ola bilər?"
**53** Onun haqq olduğu ortaya çıxana qədər, həm xarici aləmdə, həm öz
bədənlərində[264] əlamətlərimizi / işarətlərimizi onlara göstərəcəyik.
Rəbbinin şübhəsiz hər şeyə şahid olması kifayət deyilmi?
**54** Gözünüzü açın! Şübhəsiz ki, onlar Rəblərinə qovuşacaqlarına
şübhə edirlər. Gözünüzü açın! Şübhəsiz ki, Allah hər şeyi əhatə
edəndir. (61/41, Fussilət / 46-54)

## ŞURA (62 – 42) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 250**
**1,2** Ha / 8, Mim / 40, Eyn / 70, Sin / 60, Qaf / 100.[265]
**3** Ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan /
mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı
alan / sağlam edən Allah, sənə və səndən öncəkilərə bax bu cür vəhy
edər.
**4** Göylərdə və yerdə olan şeylər sadəcə Onundur. O, çox ucadır, çox
böyükdür.
**5** Göylər az qalsın onların üstündən çatlayacaq. Bütün güclər isə
Rəblərinin tərifi ilə birlikdə (Onu) nöqsan sifətlərdən pak tuturlar və
yer üzündə olan kimsələr üçün bağışlanma diləyirlər. Gözünüzü açın!
Şübhəsiz ki, Allah çox bağışlayandır, çox mərhəmət edəndir.
**6** Və Onun altındakılardan (özlərinə) yardımçı, yol göstərən, qoruyucu
(himayə edən) yaxınlar qəbul edən kimsələr; Allah onların üzərində,
etdiklərini qeydə almaqdadır. Və sən onların üzərində, canlı-cansız
bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu
proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən biri deyilsən.
**7** Bax beləcə Biz, şəhərlərin anasını və onun kənarındakı kəsləri
xəbərdar edəsən deyə və özündə heç şübhə olmayan toplanma günü ilə
xəbərdar edəsən deyə sənə ərəbcə bir Quran vəhy etdik.
Bir qrup cənnətdədir, bir qrup da cəhənnəmdədir.
**8** Və əgər Allah istəsəydi, əlbəttə onları öndərli vahid bir toplum
edərdi. Fəqət O, istəyəni rəhmətinin içinə daxil edər. Şirk qoşaraq
səhv; öz zərərinə olan əməli işləyənlər üçün bir qoruyucu (himayə
edən), yol göstərən yaxın və bir yardımçı yoxdur.
**9** Yoxsa Onun altındakılardan bir qrup yardımçılar, yol göstərən,
qoruyucu (himayə edən) yaxınlarmı qəbul edirlər? Bax Allah,
yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxının məhz Özüdür.

Və O, ölüləri dirildir və O, hər şeyə qadirdir. **11** O, göylərin və yerin
yoxdan yaradanıdır / parçalayanıdır. O sizin üçün özünüzdən zövcələr
və heyvanlardan cütlər yaratmışdır. O, sizi bu nizamın içərisində
artırıb yayır. Onun bənzəri olan heç bir şey yoxdur. Və O, ən yaxşı
eşidəndir, ən yaxşı görəndir. **12** Göylərin və yer üzünün kilidləri
yalnızca Onundur. O, istədiyi kimsə üçün ruzini artırar və nizamlayar.
Şübhəsiz ki, O, hər şeyi ən yaxşı biləndir.
**13** Allah, dindən Nuha öhdəlik olaraq verdiyi şeyi, sənə vəhy etdiyimizi, İbrahimə, Musaya, və İsaya öhdəlik olaraq verdiyimiz şeyi həyat yolu (qanun) etdi: "Dini həyata keçirin, yaşadın və onda ayrılığa (ixtilafa) düşməyin." Sənin onları dəvət etdiyin şey, ortaq qoşan kimsələrə ağır gəldi. Allah istədiyini Özünə seçər və qəlbdən yönələni də o dəvət edilən şeyə istiqamətləndirər.
**14** Və onlar, ancaq özlərinə bilik (məlumat) gəldikdən sonra aralarındakı həddi aşmaları üzündən ayrılığa (ixtilafa) düşdülər. Əgər Rəbbin tərəfindən "müəyyən bir müddətin sonuna qədər" söz verilməsəydi, aralarında həqiqətən (hökm) gerçəkləşdirilərdi. Və şübhəsiz ki, onlardan sonra Kitaba varis edilən kəslər, həqiqətən Qurandan qərarsızlığa aparan bir şübhə [qəti olmayan, yetərsiz bilik (məlumat)] içindədirlər.
**15,10** Bax bunun üçün sən, dəvət et və sənə əmr edildiyi kimi doğru ol. Onların boş müvəqqəti arzularına uyma və de ki: "Mən, Allahın kitabdan nazil etdiyinə inandım və mən, aranızda ədaləti bərqərar etmək vəzifəsi ilə əmr olundum. Allah, bizim Rəbbimizdir, sizin də Rəbbinizdir. Bizim etdiklərimiz yalnızca bizə, sizin etdikləriniz də yalnızca sizə aiddir. Sizinlə bizim aramızda heç bir dəlilə yer yoxdur. Allah, bizi bir araya toplayacaqdır. Dönüş də yalnız Onadır. Və haqqında ixtilafa düşdüyünüz hər hansı bir şey (varsa); artıq onun hökmü Allaha aiddir. Bax budur mənim Rəbbim Allah. Mən, işin nəticəsini yalnız Ona tapşırdım və mən, yalnız Ona yönəlirəm."[266]

(62/42, Şura / 1-9, 11-15, 10)

## Nəcm: 251

**16** Və özünə qarşılıq (cavab) verildikdən sonra Allah haqqında mübahisə edənlər (ki var); onların dəlilləri Rəbləri qatında batil olmuşdur (keçərsiz hesab edilmişdir). Və onların üzərində bir qəzəb vardır, şiddətli əzab da onlar üçündür.
**17** Allah, bu kitabı və tərəzini / ölçünü haqq olaraq endirən Zatdır. Və sənə nə bildirir ki, bəlkə də o qiyamətin qopma zamanı çox yaxındır!
**18** Ona inanmayan kimsələr qiyamətin tez gəlməsini istəyirlər. İnananlar isə onun qorxusundan əsirlər və onun gerçək olduğunu

bilirlər. Yaxşı bilin ki, qiyamətin qopma zamanı haqqında mübahisə edənlər həqiqətən geri dönüşü olmayan bir azğınlıq içindədirlər.
19 Allah qullarına çox ərməğan verəndir. Dilədiyini / diləyəni ruziləndirər. Və O, hər şeyə qadirdir, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır.
20 Hər kim axirət əkinini istəyərsə, Biz onun əkinini onun üçün artırarıq. Və hər kim dünya tarlasını istəyərsə, ona da ondan verərik. Və onun üçün axirətdə heç bir nəsib yoxdur. (62/42, Şura / 16-20)

## Nəcm: 252

21 Yoxsa onların, Allahın dində izin vermədiyi bir şeyi onlar üçün qanuniləşdirmiş ortaqlarımı var? Əgər "Fəsl sözü"[267] olmasaydı, həqiqətən aralarında işləri bitirilmişdi. Və şübhəsiz ki, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün ağrılı-acılı bir əzab var.
22 Onlara vaqe olduğunda, qazandıqları şeylərə görə şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələrin qorxudan çaxnaşmaya düşdüklərini görərsən. İman etmiş, sahmana salmaq qayəsi ilə əməl işləmiş kimsələr də cənnət bağçalarındadırlar. Rəblərinin yanında onlar üçün istədikləri şeylər vardır. Bax bu, böyük ərməğanın məhz özüdür.
23 Bax bu, Allahın, iman edən, yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən qullarına müjdələdiyi şeydir. *–De ki: "Mən bu təbliğimə qarşı sizdən yaxınlıqda sevgidən başqa heç bir haqq (mənfəət) istəmirəm."*– Və hər kim yaxşı-gözəl bir əməl işləyərsə, Biz onun üçün o əməlin yaxşılığını -gözəlliyini artırarıq. Şübhəsiz ki, Allah çox bağışlayandır, qarşılığını verəndir.
24 Yaxud da onlar, "Allaha qarşı yalan uydurdumu" deyirlər? Bax, əgər Allah istəyərsə, sənin də qəlbini möhürləyər; batili yox edər və sözləri ilə haqqı gerçəkləşdirər. Şübhəsiz ki, O, sinələrdə olan şeyləri çox yaxşı biləndir. (62/42, Şura / 21-24)

## Nəcm: 253

25 Və O, qullarının tövbəsini qəbul edər, pisliklərini bağışlayar və sizin işləməkdə olduğunuz şeyləri bilir.
26 Və O, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kəslərə qarşılıq verir və onlara ərməğanlarından (onların mükafatını) artıqlaması ilə verir. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün isə, şiddətli bir əzab onlar üçündür.
27 Və əgər Allah ruzini qullarına yaysaydı / döşəsəydi [bolluca ruzi versəydi], həqiqətən yer üzündə azğınlıq edərdilər. Lakin Allah istədiyini müəyyən bir ölçüyə görə endirir. Şübhəsiz ki, O, qullarından

ən çox xəbəri olandır, ən yaxşı görəndir.
**28** Və O, insanlar ümidlərini kəsdikdən sonra yağmuru endirən və Öz rəhmətini yayandır. Və O, təriflənməyə layiq olandır, yardım edən, yol göstərən, qoruyan (himayə edən) yaxındır.
**29** Və göylərin, yer üzünün yaradılması və göylərdə və yerdə hər dabbədən / canlıdan törədib yayması, Onun əlamətlərindən / işarətlərindəndir. Və O, dilədiyi zaman onların hamısını toplamağa qadirdir.
**30** Və sizə müsibətdən üz verən şeylər, məhz öz əllərinizlə qazandıqlarınıza görədir. O da çoxunu əfv edir.
**31** Və siz yer üzündə aciz qoya bilənlər deyilsiniz. Və sizin, Allahın altındakılardan bir yaxınınız yoxdur, yardımçınız da yoxdur.
**32-35** Dənizdə dağlar kimi axıb gedənlər də Onun əlamətlərindən / işarətlərindəndir. Əgər O istəyərsə, küləyi dayandırar və gedən gəmilər dənizin üstündə dayanıb qalar. Şübhəsiz ki, bunda çox səbr edən və özünə verilən nemətlərin qarşılığını daha çox ödəyən hər kəs üçün nə qədər əlamətlər / işarətlər vardır. Yaxud Allah, onların qazandıqları şeylər səbəbiylə o gəmiləri dəyişikliyə / məhvə məruz qoyar. Bir çoxunu da bağışlayar. Və ayələrimiz / əlamətlərimiz / işarətlərimiz haqqında mübarizə aparanlar, özləri üçün qaçacaq bir yer olmadığını bilirlər.
**36-39** Bax, sizə verilən hər hansı bir şey, bəsit dünya həyatının qazancıdır. Sadəcə dünya həyatının müvəqqəti bir mənfəətidir. Allah qatında olanlar [nemətlər, mükafatlar] isə;
iman etmiş və işin nəticəsini sadəcə Rəblərinə tapşıran kimsələr üçün,
günahın [zaman itkisinə səbəb olan şeylərin / xeyir işlərdə yavaş davranmanın / zərər vermənin / qüsur yaratmanın] böyüklərindən və həyasızlıqdan qaçınan və qəzəbləndikləri zaman bağışlayan kimsələr üçün,
Rəblərinin çağırışına (dəvətinə) cavab verən, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirən-ayaqda tutan], işləri də öz aralarında Şura etməkdən; "işin ən yaxşı tərəfini birlikdə tapıb ortaya çıxartmaqdan" ibarət olan, onları ruziləndirdiyimiz şeylərdən Allah yolunda xərcləyərlər / başda yaxınları olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edən kimsələr üçün
və onlar bir haqsızlıq və hücuma məruz qaldıqları zaman bir-birləriylə yardımlaşan / intiqam alan kimsələr üçün daha xeyirli və daha qalıcıdır (baqidir). (62/42, Şura / 25-39)

## Nəcm: 254

**40** Və bir pisliyin cəzası onun kimi bir pislikdir. Amma kim əfv edər və düzəldərsə (yoluna qoyarsa), artıq onun əcri Allaha aiddir. Şübhəsiz ki, O, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənləri sevməz.
**41** Kim də haqsızlığa məruz qaldıqdan sonra haqqını alarsa, bax onların əleyhinə bir yol yoxdur.
**42** Yol ancaq, insanlara haqsızlıq edən və yer üzündə haqsız yerə həddi aşan kimsələr əleyhinədir. Bax onlar üçün ağrılı bir əzab vardır.
**43** Hər kim də səbr edər və qüsuru bağışlayarsa, şübhəsiz məhz bu, həqiqətən əzmkarlıqdır.
**44** Və Allah hər kimi azdırarsa, artıq bundan sonra onun üçün heç bir yardım edən, yol göstərən, qoruyan (himayə edən) yaxın yoxdur. Və sən, əzabı gördükdə şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin: "Geri dönüş yerinə bir yol vardırmı?" dediklərini görərsən.
**45** Və sən, onları alçaqlıqlarına görə başları önə əyilmiş, göz ucuyla gizli-gizli ətrafa baxarkən atəşə sürükləndiklərini görəcəksən. İman etmiş kimsələr də: "Şübhəsiz ki, ziyana uğrayanlar, özlərini və ailələrini, yaxınlarını qiyamət günü ziyana uğradan kimsələrdir" dedilər. Gözünüzü açın! Şübhəsiz ki, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər daimi bir əzab içərisindədirlər.
**46** Onlar üçün Allahın altındakılardan onlara yardım edəcək heç bir yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxın yoxdur. Allah kimi də azdırarsa, artıq onun üçün hər hansı bir yol yoxdur.
**47** Allah tərəfindən özləri üçün dönüş (qayıdış) yeri olmayan, geri qaytarılması mümkün olmayan gün gəlmədən öncə, Rəbbinizin çağırışlarına qarşılıq (cavab) verin. O gün, sizin üçün sığınacaq bir yer yoxdur, sizin üçün tanınmayacaq hala salınmaq / tanınmamaq da yoxdur.
**48** Buna rəğmən əgər onlar üz çevirərlərsə, bilsinlər ki, Biz, səni onların üzərinə bir keşikçi olaraq göndərmədik. Sənə düşən sadəcə təbliğdir. Və Biz, şübhəsiz ki, insana Öz tərəfimizdən bir rəhmət daddırdığımız zaman, ona sevindi; Əgər (öz) əlləriylə etdikləri üzündən onlara bir pislik toxunarsa, o zaman görərsən ki, şübhəsiz ki, o insan çox nankordur. (62/42, Şura / 40-48)

## Nəcm: 255

**49,50** Göylərin və yer üzünün hökmranlığı yalnız Allaha məxsusdur. O, istədiyini yaradar, istədiyinə qız uşağı bəxş edər, istədiyinə də oğlan uşağı bəxş edər.
Yaxud Allah onları oğlan və qız olmaq üzrə cütləşdirər. (O,) istədiyini

də sonsuz edər. Şübhəsiz ki, O, ən yaxşı biləndir, çox güclü olandır.
**51** Və bir vəhy[268] ilə və ya pərdə arxasından yaxud bir elçi göndərib icazəsiylə / biliyi ilə (məlumatı daxilində) istədiyini vəhy etməsi xaricində Allahın bir bəşərə söz söyləməsi olmaz. Şübhəsiz ki, O, çox uca və ucaldandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**52,53** Bax beləcə Biz, sənə də Öz əmrimizdən / Öz işimizdən olan ruhu / Quranı vəhy etdik. Sən, kitab nədir, iman nədir bilməzdin. Fəqət Biz onu, qullarımızdan istədiyimizi onunla doğru yola yönəltdiyimiz (aydınlatdığımız) bir nur / işıq etdik. Heç şübhəsiz, sən də doğru bir yola; göylərdə və yerdə olanların sahibi olan Allahın yoluna istiqamətləndirməkdəsən. Gözünüzü açın, bütün işlər yalnız Allaha dönər (qayıdar). (62/42, Şura / 49-53)

## ZUXRUF (63 – 43) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

### Nəcm: 256

**1** Ha / 8, Mim / 40.[269]
**2,3** Açıq-aşkar / açıqlayan kitab dəlildir ki, Biz onu ağlınızı işlədəsiniz deyə ərəbcə bir oxuma (kitabı) etdik.
**4** Və şübhəsiz Quran, Bizim yanımızdakı ana kitabda; mənbədə həqiqətən çox ucadır və qanunlar ehtiva etməkdədir, sağlamdır / pozulması əngəllənmişdir.
**5** Yaxşı, siz həddi aşan bir camaat oldunuz deyə, Biz, o Öyüdü / Quranı sizə göndərməkdən vaz keçməliyik?
**60** Və əgər Biz, istəsəydik, sizdən, yer üzündə sizin yerinizə keçəcək mələklər yaradardıq.[270]
**6-8** Və Biz öncəkilərə də neçə-neçə peyğəmbərlər göndərmişdik. Onlar, özlərinə gələn hər peyğəmbərə həqiqətən istehza edirdilər (məsxərəyə qoyurdular) və Biz isə qüvvətcə onlardan daha güclü olanları dəyişikliyə / məhvə məruz qoyduq. Öncəkilərin örnəyi də keçdi.
(63/43, Zuxruf / 1-5, 60, 6-8)

### Nəcm: 257

**9** Və heç şübhəsiz, əgər sən onlardan: “Göyləri və yeri kim yaratdı?” deyə soruşsan, mütləq: “Onları ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, çox yaxşı bilən yaratdı” deyəcəklər.
**10** O Allah ki, yer üzünü sizin üçün bir beşik etdi. Orada istiqamətləndirildiyiniz (yönləndirildiyiniz) doğru yolda gedəsiniz deyə bəzi yollar da yaratdı.

11 Və O Allah ki, suyu göydən müəyyən bir ölçü ilə endirdi. Sonra Biz onunla ölü bir diyarı canlandırdıq. Bax, Siz belə çıxarılacaqsınız.
12-14 Və O, bütün cütləri yaratdı və siz onların belinə minib üzərlərində oturursunuz. Sonra onun üzərində oturduğunuz zaman Rəbbinizin nemətini yada salaraq: "Bunları bizim xidmətimizə verən / bunları faydalana biləcəyimiz xüsusiyyətlərdə yaradan Allah qüsurlardan pakdır. Yoxsa bizim bunlara gücümüz çatmazdı. Şübhəsiz ki, biz də yalnızca Rəbbimizə dönəcəyik" deyəsiniz deyə sizin üçün gəmilərdən və heyvanlardan minəcəyiniz şeyləri yaratdı.
15 Və onlar, Onun üçün Öz qullarından bir hissəsini qəbul etdilər (ortaq qoşdular). Şübhəsiz ki, bu insan həqiqətən açıq-aşkar bir nankordur.
16 Yoxsa O, yaratdıqlarından (Özünə) qızları və oğulları sizəmi seçdi?
17 Onlardan birinə, Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] aid etdiyi / qız ilə müjdələndiyi zaman üzü qapqara qaralar. Və o, udqunub duran biridir (udquna-udquna qalar).
18 Süslər içində; zəngin, komfortlu bir həyat sürməklə mübahisələrdə açıq-aşkar ortada olmayan, tezisini müdafiə edə bilməyən; biliksiz, şüursuz, qorxaq kişimi bu cəfəngiyatı ortaya atır? [Və yoxsa onlar, ləl-cəvahiratlar içərisində böyüdülüb, müzakirədə açıq-aşkar olmayanamı üstünlük verirlər?]
19 Onlar Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] qullarından olan mələkləri də dişi hesab etdilər. Onlar, onların yaradılışına şahidmi oldular? Onların şahidlikləri yazılacaq və onlar sorğu-sual olunacaqlar.
20 Və onlar: "Əgər Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah] istəsəydi, biz onlara ibadət etməzdik!" dedilər. Onların buna dair heç bir bilikləri yoxdur. Onlar sadəcə uydururlar.
21 Yoksa Biz özlərinə bundan öncə bir kitab verdik və indi onlar, onu tuturlar (ona istinad edirlər)?
22 Əksinə, onlar: "Şübhəsiz ki, biz atalarımızı bu öndərli camaat üzərində gördük və biz də onların izləri üzərində istiqamətləndiyimiz doğruya yetişmiş kimsələrik" dedilər.

(63/43, Zuxruf / 9-22)

## Nəcm: 258

23 Və bax belə, Biz səndən öncə də hansı şəhərə xəbərdar edən birini göndərmişiksə, həqiqətən oranın lovğa varlıları: "Şübhəsiz ki, biz, atalarımızı bir öndərli camaat üzərində gördük. Biz də həqiqətən onların izlərinə tabe olanlarıq" demişdilər.
24 Xəbərdar etmək üçün göndərilən (elçi): "Əgər sizə atalarınızın

üzərində (sitayiş etdiyini) gördüyünüz şeydən daha doğrusunu gətirmiş olsam da, eləmi?" dedi. Onlar: "Şübhəsiz ki, biz sizinlə göndərilən şeyi bilərək rədd edənlərik / inanmayanlarıq" dedilər.
**25** Belə olduqda, Biz də onları yaxaladıq, cəzalandırmaq surətiylə ədaləti bərqərar etdik. Haydı, yalan hesab edənlərin sonu necə oldu bir
bax! **26,27** *–Və bir zamanlar İbrahim, atasına və qövmünə: "Şübhəsiz ki, mən sizin ibadət etdiyiniz şeylərdən uzağam. –Məni yoxdan yaradandan başqa.– Şübhəsiz ki, artıq O, məni doğru yola yönəldəcəkdir" dedi.* **28** *İbrahim bu sözü, onların dönməsi (qayıtması) üçün ardından gələnlərə həmişəlik qalacaq bir söz etdi.–*
**29** Əksinə, Mən bunları da, atalarını da haqq / gerçək və açıqlayan bir elçi gələnə qədər bəhrələndirdim.
**30** Və haqq / gerçək onlara gəldiyi zaman onlar: "Bu, bir sehrdir və şübhəsiz, biz onu bilərək rədd edənlərik / inanmayanlarıq" dedilər.
**31** Yenə onlar: "Bu Quran, bu iki şəhərdən böyük bir adama endirilməli deyildimi?" dedilər.
**32** Rəbbinin rəhmətini onlarmı bölüşdürürlər? Bu bəsit dünya həyatında, onların dolanışıqlarını aralarında Biz bölüşdürdük, Biz. Bir-birlərinə işlərini gördürsünlər deyə, Biz onların bir qismini (digər) bir qisminin üzərinə dərəcələrlə yüksəltdik. Və Rəbbinin rəhməti onların yığdıqları şeylərdən daha xeyirlidir.
**33-35** Və əgər insanlar, vahid bir öndərli, gerçəyi bilərək rədd edən camaat olmasaydılar, Biz, Rəhmanı [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahı] bilərək rədd edən / inanmayan kimsələrin evlərinə gümüşdən tavanlar və üzərinə çıxacaqları nərdivanlar, onların evləri üçün qapılar, üzərinə söykəndikləri taxtlar və qızıldan süs (bəzək) əşyaları düzəldərdik. Bunların hamısı bəsit dünya həyatının qazancından başqa bir şey deyildir. Axirət isə Rəbbinin qatında, Allahın mühafizəsi altına daxil olan kəslər üçündür.
**36,37** Və hər kim Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] öyüdünə, xatırlanmasına qarşı kor olarsa, Biz ona bir şeytan ürcah edərik, artıq o, onun üçün yaşıddır / tərəfkeşdir; və şübhəsiz ki tərəfkeşlər / yaşıdlar, kor olanları Yoldan çıxararlar. Onlar da özlərinin yönəldikləri (üz tutduqları) yolun doğru yol olduğunu sanarlar.
**38** Nəhayət Bizim (hüzurumuza) gəlincə: "Kaş ki, səninlə mənim aramda şərq ilə qərb arasındakı qədər bir uzaqlıq olsaydı" deyər. *–Elə isə, bu, nə pis bir yaşıddır / tərəfkeşdir!–*
**39** Və bu gün peşmanlıq hiss etməniz sizə heç bir fayda verməyəcək. Siz şirk qoşaraq səhv; öz zərərinizə olan əməli işlədiyiniz zaman həqiqətən əzabda ortaqlarsınız. (63/43, Zuxruf / 23-39)

**Nəcm: 259**
**40** O halda, karlara sənmi eşitdirəcəksən? Yaxud korlara və açıq-aşkar azğınlıq içində olanlara sənmi yol göstərəcəksən?
**41** Artıq əgər Biz, səni götürüb aparsaq belə, şübhəsiz, Biz, onları cəzalandıraraq ədaləti bərqərar edərik.
**42** Yaxud da onlara vəd etdiyimiz əzabı sənə göstərərik. Çünki Biz, onların əleyhinə (cəza verməyə) qadirik.
**43** Elə isə sən, sənə vəhy edilənə sarıl. Şübhəsiz ki, sən çox doğru bir yol üzərindəsən.
**44** Və şübhəsiz ki, sənə vəhy edilən [Quran], sənin üçün də, camaatın (ümmətin) üçün də gerçəkdən bir öyüddür / şan-şərəfdir. Siz ondan sorğu-sual olunacaqsınız.
**61,62** Və şübhəsiz ki, sənə vəhy edilən [Quran], o qiyamətin qopması üçün qəti bir bilikdir (məlumatdır): *"Əsla qiyamətin qopması haqqında şübhəyə düşməyin və mənə tabe olun. Bu, doğru yoldur. Və əsla şeytan sizi yoldan çıxarmasın. Şübhəsiz ki, o, sizin üçün açıq-aşkar bir düşməndir."*[271]
**45** Və sən, səndən öncə elçi olaraq göndərdiyimiz kəslərdən soruş; bax araşdır, düşün, incələ! "Biz Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] altındakılardan, qulluq ediləcək ilahlar tanımışıqmı?" (63/43, Zuxruf / 40-44, 61-62, 45)

**Nəcm: 260**
**46** Və heç şübhəsiz Biz, Musanı ayələrimizlə / əlamətlərimizlə / işarətlərimizlə Firona və onun əyanlarına elçi göndərdik və o: "Gerçəkdən, mən aləmlərin Rəbbinin elçisiyəm!" demişdi.
**47** Sonra da Musa ayələrimizi / əlamətlərimizi / işarətlərimizi onlara gətirincə, onlar həmin ayələrə gülmüşdülər.
**48** Və Bizim onlara göstərdiyimiz hər bir əlamət / işarət bir öncəki əlamətdən / işarətdən həqiqətən daha böyükdür. Və onlar dönərlər (qayıdarlar) deyə Biz onları əzabla yaxaladıq.
**49** Onlar da: "Ey sehrbaz! Səndə olan əhdi / sənə verdiyi söz hörmətinə bizim üçün Rəbbinə dua et. Şübhəsiz ki, biz həqiqətən göstərilən (yönləndirildiyimiz) doğru yola girəcəyik" dedilər.
**50** Fəqət nə zaman ki, əzabı onların üstündən götürdük, o zaman onlar sözlərindən döndülər.
**51-53** Və Firon camaatının içində belə müraciət etdi: "Ey camaatım! Misir hökmdarlığı və altımdan axıb gedən bu çaylar mənim deyilmi? Hələ də görmürsünüz? Yaxud mən, bu zavallıdan; haradasa məqsədini (düz-əməlli) anlada bilməyən bu adamdan daha xeyirli deyiləmmi? Həm də, onun üzərinə qızıl bilərziklər atılmalı və yaxud onunla

bərabər sıx dəstələr halında (səf-səf) mələklər gəlməli deyildimi?" dedi.
**54** Firon öz camaatını təsirsiz; dəyərsiz (cahil) kütlə halına gətirdi, onlar da ona itaət etdilər. Şübhəsiz ki, onlar, haqq yoldan çıxmış camaat idilər.
**55,56** Nəhayət onlar Bizi qəzəbləndirdikləri zaman onları cəzalandıraraq ədaləti bərqərar etdik. Sonra da onların hamısını suda boğduq. Sonra da onları sonradan gələnlər üçün sələf və örnək etdik.

***

**57** Məryəm oğlu İsa bir örnək olaraq anladılınca da, sənin qövmün ondan məsafə saxlayıb gedərlər.
**58** Və sənin qövmün: "Bizim ilahlarımız daha xeyirlidir, yoxsa o Muhəmməd / İsa?" dedilər. Bu örnəyi sırf səninlə mübahisə etmək üçün ortaya atdılar. Əslində onlar, həddindən artıq düşmənçilik edən bir camaatdır.
**59** İsa, sadəcə Bizim ona nemət verdiyimiz və onu İsrail oğullarına örnək etdiyimiz bir quldur.
**63,64** İsa açıq-aşkar dəlillərlə gəldiyi zaman dedi ki: "Mən sizə haqsızlıq və anarxiyanı əngəlləmək üçün qoyulmuş qanun, düstur və qaydaları gətirdim və haqqında ixtilafa düşdüyünüz şeylərin bir qismini sizə açıqlamaq üçün gəldim. O halda, Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin. Şübhəsiz ki, Allah; O, mənim Rəbbimdir və sizin Rəbbinizdir. Elə isə, Ona qulluq edin. Bax bu, doğru bir yoldur."
**65** Fəqət qruplar (firqələr), İsa haqqında öz aralarında anlaşmazlığa (ixtilafa) düşdülər. Artıq acı bir günün əzabına görə, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin vay halına!
**66** Onlar özləri fərqinə varmadan, qəflətən, qiyamət anının özlərinə gəlib çatmasından başqa bir şeymi gözləyirlər?
**67** O gün, Allahın mühafizəsi altına daxil olan kəslər istisna olmaqla, bütün öndərlər / bir-birinin izindən gedənlər, bir-birlərinə düşməndirlər. (63/43, Zuxruf / 46-59, 63-67)

## Nəcm: 261

**68-70** "Ey ayələrimizə iman etmiş və müsəlmanlar olan qullarım! Bu gün sizə qorxu yoxdur və siz üzülməyəcəksiniz. Siz və zövcələriniz hörmət-izzətlə girin cənnətə! **71-73** *–Allahın mühafizəsi altına daxil olan şəxslərin çevrələrində qızıl sinilər, piyalələr gəzdirilər. Orada nəfslərin arzuladığı, gözlərin zövq alacağı hər şey vardır.–* Və siz, orada daimi qalacaqsınız. Və bax bu, etmiş olduğunuz şeylər səbəbiylə, son sahib (varis) edildiyiniz cənnətdir. Orada sizin üçün bir çox

meyvələr vardır. Onlardan yeyəcəksiniz.”
**74-76** Şübhəsiz ki, günahkarlar cəhənnəm əzabında daimidirlər. Onlardan (bu əzab) yüngülləşdirilməyəcəkdir. Onlar, orada da ümidsizdirlər. Və Biz, onlara haqsızlıq etmədik, fəqət onlar, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kəslərin məhz özləri idilər.
**77** Və onlar səslənirlər: “Ey Malik! Rəbbin bizim işimizi bitirsin.” Malik: “Şübhəsiz ki, siz, belə qalacaqsınız” dedi. (63/43, Zuxruf / 68-77)

## Nəcm: 262

**78** And olsun ki, Biz sizə haqqı gətirdik. Lakin sizin çoxunuz haqqı çirkin görürsünüz.
**79** Yoxsa onlar işi sağlammı tutmuşlar / təminat altına almışlar? Bax Biz, şübhəsiz, sağlamçılarıq (sağlam iş tutanlarıq).
**80** Yoxsa onlar, Bizim onların sirlərini və pıçıldaşmalarını həqiqətən eşitmədiyimizimi sanırlar? Bəli! Eşidirik, yanlarında olan elçilərimiz də yazırlar.
**81** De ki: “Əgər Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah] üçün bir övlad olsaydı, o təqdirdə qulluq edənlərin ilki mən olardım.”
**82** Göylərin və yerin Rəbbi, ən böyük taxtın[272] Rəbbi onların vəsf etdikləri şeylərdən pakdır.
**83** Sən dərhal burax onları, onlara söz verilən günlərinə qovuşana qədər boşa (boş yerə) çalışsınlar və oynasınlar.
**84** Və O, göydə və yer üzündə olan ilahdır. Və O, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir, çox yaxşı biləndir.
**85** Və göylərin, yer üzünün və hər ikisinin arasındakıların mülkü sadəcə Özünə aid olan Allah necə də comərddir. Qiyamət anının biliyi də (məlumatı da) yalnızca Onun yanındadır. Və siz sadəcə Ona döndəriləcəksiniz (qaytarılacaqsınız).
**86** Və onların, Onun altındakılardan yalvardıqları kimsələr yardıma, dəstəyə, şəfaətə malik ola bilməzlər. Ancaq haqqa şahid olan Zat, bunun xaricindədir. Onlar da bilirlər.
**87** Yenə and olsun ki, onlardan, özlərini kimin yaratdığını soruşsan, mütləq: “Allah” deyərlər. O halda, necə döndərilirlər!
**88** Və onun, “Ey Rəbbim! Bunlar şübhəsiz imana gəlməz bir camaatdır” deməsi dəlildir ki…
**89** Artıq sən onlardan vaz keç və “Salam!” de. Artıq onlar tezliklə biləcəklər. (63/43, Zuxruf / 78-89)

# DUXAN [DUMAN] (64 – 44) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 263

1 Ha / 8. Mim / 40.[273]
2-7 Açıq-aşkar / açıqlayan Kitaba and olsun ki, şübhəsiz ki, Biz, Öz qatımızdan bir iş olaraq, onu, haqsızlığın və anarxiyanı (fəsadı) əngəlləmək üçün qoyulmuş qanun, düstur və qaydalarla dolu / sağlam, hər işin / yaradılışın ayırd edildiyi, hər şeyin bol-bol verildiyi, qazancın bol olduğu bir gecədə endirdik. Şübhəsiz ki, Biz xəbərdar edənik. Şübhəsiz ki, Biz, Rəbbindən, göylərin, yerin və ikisinin arasındakıların Rəbbindən *–əgər qəti olaraq inanan kimsələrsinizsə–* bir rəhmət olaraq elçi göndərənlərik. Şübhəsiz ki, O, ən yaxşı eşidənin, ən yaxşı bilənin elə Özüdür.
8 Ondan başqa ilah deyə bir şey yoxdur. O, yaşadır və öldürür, sizin
Rəbbinizdir, sizdən öncəki atalarınızın da Rəbbidir. 9 Əksinə, onlar,
yetərsiz bilik (məlumat) içində oynayıb qalırlar. (64/44, Duxan / 1-9)

## Nəcm: 264

10,11 İndi sən, göyün, açıq-aşkar bir qıtlıq gətirəcəyi günü gözlə. O qıtlıq insanları bürüyəcək. Bu, qüssə verən (narahat edən) bir əzabdır.[274]
12 Rəbbimiz! Bizdən əzabı dəf et. Şübhəsiz ki, biz artıq həqiqətən inananlarıq.
13,14 Haradadı onlarda öyüd almaq? Halbuki onlara açıqlayan bir elçi gəlmişdi. Sonra ondan üz çevirdilər və "Öyrədilmiş bir dəli / gizli güclər tərəfindən dəstəklənən biridir!" dedilər.
15 Şübhəsiz, Biz əzabı azacıq dəf edərik, siz həqiqətən dönənlərsiniz.
16 Ən böyük bir yaxalamaqla yaxalayacağımız gün, şübhəsiz, Biz, günahkarı tutub cəza verərək ədaləti bərqərar edənlərik.
(64/44, Duxan / 10-16)

## Nəcm: 265

17-21 Və and olsun ki, Biz onlardan öncə Firon qövmünü imtahan etdik. Və onlara çox hörmətli bir elçi gəlmişdi: "Allahın qullarını mənə geri verin. Şübhəsiz ki, mən sizin üçün göndərilmiş etibarlı bir elçiyəm. Allaha qarşı özünüzü üstün tutmayın (təkəbbür göstərməyin). Şübhəsiz ki, mən sizə açıq-aşkar bir güc gətirirəm. Və şübhəsiz ki, mən, məni daşqalaq edərək öldürməyinizdən Rəbbimə, sizin Rəbbinizə sığındım. Və əgər siz mənə inanmırsınızsa, dərhal yanımdan uzaqlaşın."
22 Sonra da Musa: "Şübhəsiz ki, bunlar günahkar bir qövmdür"

deyərək Rəbbinə yalvardı.
**23,24** – *“Haydı, gecə olunca qullarımı qaçırt. Şübhəsiz ki, siz izlənən kimsələrsiniz, tədbirli olun. Bol suyu / çayı çox sürətli (tərk et) burax. Şübhəsiz ki, onlar suda boğulmuş bir ordudur.”*–
**25-27** Onlar bağçalardan, bulaqlardan, əkinlərdən, yüksək (hörmətli) məqamlarından və içində səfalar sürdükləri neçə-neçə nemətlərdən neçələrini buraxdılar (qoyub getdilər).
**28** Bax belə! Biz onları başqa-başqa qövmlərə miras buraxdıq.
**29** Bax, göy və yer üzü onlardan ötrü ağlamadı. Onlar, möhlət verilənlərdən də olmadı.
**30,31** And olsun ki, Biz İsrail oğullarını o alçaldıcı əzabdan, Firondan qurtardıq. Şübhəsiz ki, o, həddi aşanlardan, özünü üstün tutanlardan (təkəbbür göstərənlərdən) biri idi.
**32** And olsun ki, Biz İsrail oğullarını bilərək aləmlər üzərinə seçkin qılmışdıq (etmişdik).
**33** Biz onlara içində açıq-aşkar bir bəla olan əlamətlərdən / işarətlərdən də vermişdik.
**34-36** Şübhəsiz, məkkəli ortaq qoşanlar deyirlər ki: “Bizim sadəcə ilk ölümümüz var. Biz, təkrar dirildiləcək deyilik. Əgər siz doğru kimsələrsinizsə, sözünüzün sahibisinizsə, haydı, atalarımızı bizə gətirin.”
**37** Onlar daha xeyirlidir, yoxsa Tubbə tayfası və onlardan öncəki kimsələr? Biz, onları dəyişikliyə / məhvə məruz qoyduq. Şübhəsiz ki, onlar günahkarlar idilər. (64/44, Duxan / 17-37)

## Nəcm: 266
**38** Və Biz göyləri, yeri və ikisinin arasındakıları oyun oynayanlar olaraq yaratmadıq.
**39** Biz, o ikisini sadəcə haqq / gerçək ilə yaratdıq. Fəqət onların çoxu bilmir.
**40** Şübhəsiz ki, Ayırd Etmə Günü onların hamısının görüşmə yeridir / qərarlaşdırılmış görüşmə vaxtıdır.
**41,42** O gün Allahın mərhəmət etdiyi kimsələr istisna olmaqla, heç bir yaxının öz yaxınına heç bir faydası olmaz. Onlara yardım da olunmaz. Şübhəsiz ki, Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, geniş mərhəmət sahibinin elə Özüdür.
**43-46** Şübhəsiz, zəqqum ağacı, həddən artıq günahkar olanların yeməyidir. O, ərinmiş mədən kimidir, qızğın bir mayenin qaynaması kimi qarınlarda qaynayar.
**47,48** –*“Tutun bunu, şiddətlə yanan atəşin ortasına sürüyün. Sonra*

*onun başının üstünə qaynar su əzabından tökün.”–*
**49,50** *–“Dad görək! Şübhəsiz ki, sən, çox güclü və çox üstün biri idin! Şübhəsiz ki, məhz bu, sizin olmasına şübhə edib durduğunuz şeydir.”–*

(64/44, Duxan / 38-50)

**Nəcm: 267**

**51-57** Şübhəsiz ki, Allahın mühafizəsi altına daxil olan kəslər, Rəbbindən bir ərməğan olaraq güvənli bir məqamdadırlar; bağçalarda və çeşmə başındadırlar. Onlar üz-üzə oturaraq incə ipəkdən və parlaq atlazdan paltarlar geyinərlər. Bax belə! Biz, onları iri qara gözlülərlə / ən ideal tiplərlə cütləşdirdik (qoşalaşdırdıq). Onlar, orada güvən içində hər növ meyvəni istəyə bilərlər. Onlar orada ilk ölümdən başqa bir ölüm dadmazlar. Və Allah onları cəhənnəm əzabından qorumuşdur. Bax bu, böyük qurtuluşun elə özüdür.
**58** Bax, Biz Quranı onlar öyüd alsınlar deyə sənin dilinlə asanlaşdırdıq.
**59** Artıq sən gözlə. Şübhəsiz ki, onlar (da) gözləyənlərdir.

(64/44, Duxan / 51-59)

## CASİYƏ [DİZ ÇÖKƏN] (65 – 45) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 268**

**1** Ha / 8, Mim / 40.[275]
**2** Bu Kitabın endirilməsi, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən Allah tərəfindəndir.
**3-5** Şübhəsiz, göylərdə və yer üzündə möminlər üçün əlamətlər / işarətlər vardır. Və sizin yaradılışınızda və törədib yaydığı kiçik-böyük bütün canlılarda da qəti biliklə (tam yəqinliklə) inanan bir camaat üçün əlamətlər / işarətlər vardır. Və gecə ilə gündüzün bir-birinin ardınca gəlişində və Allahın göydən bir ruzi endirib, onunla yer üzünü ölümündən sonra diriltdiyi şeydə və küləkləri döndərib dolandırmasında ağlını işlədən bir camaat üçün əlamətlər / işarətlər vardır.
**6** Bax bunlar, Bizim sənə haqq ilə oxumaqda olduğumuz Allahın ayələridir. Sənə onları layiqincə oxuyuruq. Artıq onlar, Allahdan və Onun ayələrindən sonra, hansı sözə / hansı fakta inanacaqlar?

(65/45, Casiyə / 1-6)

**Nəcm: 269**

**7** Çox yalançı, çox günahkar adamların hamısının vay halına!
**8** O, ona oxunan Allahın ayələrini eşidir, sonra da sanki təkəbbüründən onu heç eşitməmiş kimi yenə bildiyini oxuyur. Artıq sən ona,

ağrılı bir əzabı müjdə ver!
**9,10** Və o, ayələrimizdən bir şey öyrəndiyi zaman onunla istehza edir (məsxərəyə qoyur). Bax onlar üçün alçaldıcı bir əzab; qarşılarında cəhənnəm var. Qazandıqları şeylərin və Allahın altındakılardan qəbul etdikləri qoruyucu (himayəçi), yol göstərən yaxınlar onlara heç bir şəkildə faydalı ola bilməz. Və onlar üçün böyük bir əzab vardır.
**11** Bu xəbərdarlıqlar, bir yol göstərmədir. Rəblərinin ayələrini bilərək rədd edən kimsələr üçün də, ən pisindən ağrılı-acılı bir əzab vardır.
(65/45, Casiyə / 7-11)

## Nəcm: 270

**12** Allah, işi olaraq içində gəmilərin üzməsi, sizin də Onun ərməğanlarından (lütf etdiklərindən) ruzi axtarmanız və sizə verilən nemətlərin qarşılığını ödəməniz üçün dənizi əmrinizə verən / faydalanacağınız şəkildə və xassələrdə yaradan Zatdır.
**13** Və O, göylərdə və yer üzündə olan hər şeyi Öz tərəfindən sizin xidmətinizə vermişdir. Şübhəsiz ki, bunda düşünən bir camaat üçün əlamətlər / işarətlər vardır. (65/45, Casiyə / 12-13)

## Nəcm: 271

**14,15** İman etmiş kəslərə söylə: “Allahın hər qövmü öz qazandıqları ilə cəzalandırması üçün, Allahın ciddi şəkildə (boyutda) cəzalandıracağı günləri ümid etməyən; axirətə inanmayan kimsələri bağışlasınlar, özləri cəzalandırmağa qalxmasınlar, Allaha buraxsınlar (tapşırsınlar). Bax, hər kim saleh əməl işləyərsə, öz lehinədir, kim də bir pislik etsə, öz əleyhinədir. Sonra Rəbbinizə döndəriləcəksiniz.”
(65/45, Casiyə / 14-15)

## Nəcm: 272

**16** Və and olsun ki, Biz İsrail oğullarına kitab, hökm; qanun və peyğəmbərlik verdik. Və onlara təmiz, xoş olanlardan ruziləndirdik. Və onları aləmlərə üstün etdik.
**17** Və onlara Allahın Özünə xas işlərinə dair açıq-aşkar dəlillər verdik. Sonra onlar, yalnızca özlərinə bilik (məlumat) gəldikdən sonra aralarındakı paxıllıq üzündən ayrılığa (ixtilafa) düşdülər. Şübhəsiz, Rəbbin, ayrılığa (ixtilafa) düşdükləri şeylər barəsində qiyamət günü aralarında qərar verəcəkdir.
**18** Sonra da səni Allahın Özünə xas işlərindən açıq-aşkar bir yol xəritəsinin / ictimai həyat prinsiplərinin sahibi etdik. Artıq, sən ona tabe ol, bilməyən kimsələrin boş-müvəqqəti arzularına uyma.
(65/45, Casiyə / 16-18)

## Nəcm: 273

19 Şübhəsiz, onlar, Allah qarşısında sənə heç bir şəkildə fayda verə bilməzlər. Və şübhəsiz ki, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin bəzisi bəzisinin yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxınlarıdır. Allah isə Özünün mühafizəsi altına daxil olan kəslərin yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxınıdır.
20 Quran, insanlar üçün qəlblə dərkediş, tam yəqinliklə inanan camaat üçün bir yol göstərmə və rəhmətdir.
21 Yoxsa pislikləri işləyən o kimsələr, özlərini, həyatlarında və ölümlərində, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələr kimi edəcəyimizimi zənn etdilər? Nə pis hökm verirlər!
22 Və Allah göyləri və yer üzünü haqq ilə və hər kəsə etdiyi ilə qarşılıq vermək üçün yaratdı. Və onlara haqsızlıq edilməz.
23 Yaxşı, sən, öz boş-müvəqqəti arzusunu özünə ilah qəbul edən və Allahın bir bilik (məlumat) üzrə onu (doğru yoldan) azdırdığı, qulağı və qəlbini möhürlədiyi və gözünün üstünə bir pərdə çəkdiyi kimsəni gördünmü / heç düşündünmü? Artıq, Allahdan sonra ona kim doğru yol göstərəcəkdir? Yenə də öyüd alıb düşünmürsünüz?"
24 Yenə onlar: "Həyat, ancaq bu dünya həyatından ibarətdir. Ölərik və yaşayarıq. Bizi ancaq keçən uzun zaman dəyişikliyə / məhvə məruz qoyar" dedilər. Halbuki onların buna dair heç bir bilikləri (məlumatları) yoxdur. Onlar, sadəcə zənn edirlər.
25 Onlara ayələrimiz açıq-aşkar oxunduğu zaman da: "Əgər doğru kimsələrsinizsə, atalarımızı gətirin" deməkdən başqa dəlilləri yoxdu.

(65/45, Casiyə / 19-25)

## Nəcm: 274

26,27 De ki: "Allah, sizi dirildər. Sonra O sizi öldürər, sonra da barəsində şübhə olmayan qiyamət günündə bir yerə toplayacaqdır. Fəqət insanların çoxu bilmir. Göylərin və yer üzünün mülkü də sadəcə Allahındır. Qiyamət anının gələcəyi gün; bax o gün, batilə yönələnlər (azanlar) zərərə uğrayacaqlar."
28,29 Və hər başçısı olam camaatı, diz çökmüş (halda) görərsən. Hər başçısı olan camaat, öz kitabına çağırılar: "Bu gün, etdiyiniz əməllərin qarşılığı sizə veriləcəkdir. Bax bu, üzünüzə qarşı haqqı danışan Bizim kitabımızdır. Şübhəsiz ki, Biz sizin etdiklərinizi yazdırırdıq."
30 İman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələr də, artıq, Rəbləri onları rəhmətinə daxil edəcəkdir (qovuşduracaqdır). Bax bu, açıq-aşkar qurtuluşun elə özüdür.
31,32 Bu kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrə] gəldikdə də: "Yaxşı, sizə ayələrim oxunmadı ki, siz

özünüzü böyük tutdunuz (təkəbbür göstərdiniz) və günah işləyən bir camaat oldunuz?" Və "Allahın sözü həqiqətən gerçəkdir; və qiyamət anına gəlincə, onda şübhə yoxdur" deyildiyində, "Qiyamət anının nə olduğunu bilmirik, yalnızca biz, sadəcə zənn edirik, qəti bir bilik (məlumat) əldə etmiş deyilik" dediniz.
**33** Və işlədikləri şeylərin pislikləri özlərinə bəlli oldu və onları, o istehza elədikləri (məsxərəyə qoyduqları) şeylər bürüdü.
**34,35** Və deyilmişdir ki: "Bu gün Biz sizi, sizin bu gününüzə qovuşmağı unutduğunuz kimi unudarıq / tərk edərik / cəzalandırarıq. Yeriniz də atəşdir. Sizin üçün yardımçılardan hər hansı biri də yoxdur. Bax bunlar, sizin Allahın ayələrini məsxərəyə qoymağınız və bəsit dünya həyatının sizi aldatması səbəbiylədir." Artıq bu gün onlar atəşdən çıxarılmaz və üzr diləmələri də qəbul edilməz / Allahı razı salmaları da istənilməz.
**36** Artıq, bütün təriflər, göylərin Rəbbi, yer üzünün Rəbbi və aləmlərin Rəbbi Allaha məxsusdur; başqasını təriflərmək olmaz.
**37** Göylərdə və yer üzündə də böyüklük və hakimiyyət yalnızca Onundur. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir. (65/45, Casiyə / 26-37)

## ƏHQAF (66 – 46) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 275**
**1** Ha / 8, Mim / 40.[276]
**2** Bu kitabın nazil edilməsi ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən Allahdandır.
**3** Biz göyləri, yer üzünü və ikisinin arasındakıları ancaq "haqq" ilə və "müəyyən edilmiş bir vaxtın sonu" ilə yaratdıq. Bu kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] isə xəbərdar edildikləri şeylərdən / xəbərdar edilməkdən üz çevirənlərdir.
**4** De ki: "Allahın altındakılardan yalvardığınız şeyləri gördünüzmü / heç düşündünüzmü? Onlar, yer üzündən nəyi yaratmışlar, mənə göstərin. Yoxsa onların göylərdə bir ortaqlıqlarımı var? Əgər siz doğru kimsələrsinizsə, mənə Qurandan öncə qalmış bir kitab və ya bir bilik (məlumat) gətirin."
**5** Və Allahın altındakılardan, qiyamət gününə qədər özünə heç bir cavab verə bilməyəcək olan kimsələrə dua edən kimsədən daha azğın kim ola bilər? Üstəlik, ibadət edilən kimsələr, o (ibadət edən) kimsələrin yalvarışlarından da xəbərsizdir.

**6** İnsanlar bir yerə toplandığı zaman da, ibadət etdikləri kimsələr (ibadət edənlərin) özlərinə düşmənlər oldular. Və onların, özlərinə ibadət etmələrini qəbul etməyənlərdi.
**7** Və Bizim ayələrimiz onlara açıq-aşkar oxunduğu zaman kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr], özlərinə gələn "haqq" üçün: "Bu, açıq-aşkar bir sehrdir!" dedilər.
**8** Yaxud da onlar, "Quranı, Muhəmməd uydurdu" deyirlər. De ki: "Əgər mən onu uydurmuşamsa, mənə Allahdan olacaq (gələcək) şeyə qadir ola bilməzsiniz; məni Allah kimi cəzalandıra bilməzsiniz. O, sizin nəyin içinə atıldığınızı daha yaxşı bilir. Sizinlə mənim aramda şahid olaraq O yetər. Və O, çox bağışlayandır, çox mərhəmət edəndir."
**9** De ki: "Mən elçilərdən ilk ortaya çıxan biri deyiləm. Və mən, mənə və sizə nə ediləcəyini (olacağını) bilmirəm. Mən sadəcə mənə vəhy edilənə tabe oluram. Və mən sadəcə açıq-aşkar xəbərdar edən biriyəm."
**10** De ki: "Heç düşündünüzmü? Əgər Quran, Allah tərəfindən isə və siz də onu bilərək rədd etmişsinizsə, bununla birlikdə İsrail oğullarından bir şahid də onun bir bənzəri üzərinə şahid olub, inanmışsa, siz də təkəbbür göstərdinizsə… Şübhəsiz ki, Allah şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyənlər topluluğuna yol göstərməz."
**11** Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər], iman etmiş kəslər üçün: "Əgər bir xeyir, mənfəət olsaydı, onlar, o işdə bizim önümüzə keçə bilməzdilər; öncə biz mömin olub mənfəəti biz alardıq" dedilər. Bununla istiqamətləndirildikləri (yönləndirildikləri) doğru yola girməyincə də: "Bu köhnə bir uydurmadır" deyəcəklər.
**12** Qurandan öncə də bir öndər və rəhmət olaraq Musanın kitabı var idi. Bax bu Quran da, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kəsləri xəbərdar etmək, gözəl-yaxşı əməl işləyənləri müjdələmək üçün ərəb dilində / ən mükəmməl ifadə dili ilə təsdiqləyən bir kitabdır.
(66/46, Əhqaf / 1-12)

## Nəcm: 276

**13** Şübhəsiz ki, bax bu: "Rəbbimiz Allahdır" deyib, sonra da ən doğru olan kəslər üçün heç bir qorxu yoxdur və onlar üzülməyəcəklər.
**14** Bax onlar cənnət əhlidirlər. Etməkdə olduqlarına qarşılıq orada sonsuz olaraq qalacaqlar.
**15** Və Biz insana, ana və atasına yaxşılıq-gözəllik etməyi öhdəlik olaraq tapşırdıq. Anası onu zəhmətlə daşıdı və zəhmətlə buraxdı (yerə qoydu) / doğmuşdu. Və onun daşınması və ayrılması otuz aydır. Nəhayət insan, yetkinlik çağına çatdığı və qırx ilə (qırx yaşına)

gəldiyində: “Rəbbim! Mənə və anama-atama ehsan etdiyin nemətlərinə qarşılıq verməyi və Sənin razı olacağın yaxşı əməlləri işləməyi mənə nəsib et. Mənim üçün soyumun içində düzəlişlər et / saleh kimsələr ver. Şübhəsiz ki, mən Sənə yönəldim. Və mən, şübhəsiz, müsəlmanlardanam” dedi.
16 Bax, Müdrikləşmiş, şüurlanmış bu kimsələr, vəd olunduqları doğru bir vəd olaraq və onlara haqsızlıq edilmədən, Allahın onlara əməllərinin (qarşılığını) tam olaraq ödəməsi üçün, onlardan, etdiklərinin ən gözəlini qəbul edəcəyimiz və cənnət əhli arasında pisliklərdən qoruyacağımız kimsələrdir.
17 Və anasına-atasına: “Of sizə! Siz məni, məndən öncə neçə-neçə nəsillər gəlib-keçmiş olduğu halda çıxarılmaqla / öldükdən sonra dirilməkləmi təhdid edirsiniz?” deyən kimsə… Və anası-atası, Allaha yalvararaq: “Vay sənin halına! Gəl iman et, şübhəsiz ki, Allahın vədi gerçəkdir” deyər. Sonra da o: “Bu Quran, öncəkilərin əfsanələrindən başqa bir şey deyildir” deyər.
18 Budur, anası-atası ilə inanc ziddiyyəti (qarşıdurması) olan, axirətə inanmayan övladlar, özlərindən öncə gəlib-keçmiş olan, bilinən-bilinməyən bütün sahələrdən (bütün ümmətlərdən) öndərli camaatlar içərisində,[277] əleyhlərində Söz[278] haqq olmuş (gerçəkləşmiş) kimsələr. Şübhəsiz ki, onlar, həqiqətən itkiyə / ziyana məruz qalıb acı çəkən kimsələr idilər.
19 Və hər kəs üçün işlədikləri şeylərdən müəyyən dərəcələr vardır. *–Və onlar, haqsızlığa məruz qalmadan, Allahın onlara əməllərinin (qarşılığını) tam olaraq ödəməsi üçündür.–*
20 Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] atəş üzərinə yayılacaqları gün: “Siz müvəqqəti dünya həyatınızda bütün gözəl şeylərinizi xərclədiniz, onlar ilə faydalandınız, artıq yer üzündə nahaq yerə təkəbbür göstərməyiniz və haqq yoldan çıxdığınıza görə bu gün alçaldıcı bir əzab ilə qarşılıq görəcəksiniz!”
(66/46, Əhqaf / 13-20)

## Nəcm: 277
21 Ad (qövmünün) qardaşı Hudu da xatırla! Bir vaxt o, Əhqafda öz qövmünü xəbərdar etmişdi. *–Həqiqətən Onun önündə və arxasında [hər yanında], “Allahdan başqasına qulluq etməyin. Şübhəsiz ki, mən sizin üçün böyük bir günün əzabından qorxuram” deyən xəbərdar edənlər gəlib-keçmişdi.–*
22 Onlar: “Sən bizi ilahlarımızdan çevirmək üçünmü gəldin? Əgər doğru danışanlardansansa, haydı, o bizi təhdid etdiyin əzabı dərhal gətir” dedilər.

**23** Ad (qövmünün) qardaşı; Hud: "Şübhəsiz ki, o əzabın nə zaman gələcəyinə dair bilik (məlumat) Allah qatındadır. Mən isə sizə mənimlə göndəriləni təbliğ edirəm. Lakin mən sizi cahillikdə inad edən bir camaat olaraq görürəm" dedi.
**24,25** Nəhayət onu, vadilərinə doğru gələn geniş bir bulud halında gördüklərində: "Bax, belə! Bu, bizə yağmur gətirəcək bir buluddur!" dedilər, Xeyr, əksinə, o, tezləşdirməyə çalışdığınız şeyin məhz özü; Rəbbinin əmri ilə hər şeyi yerlə bir edən, içində ağrılı-acılı bir əzab olan küləkdir… Axırda elə bir hala gəldilər ki, evlərindən başqa heç bir şey görünmürdü. Biz, günahkarlar topluluğunu bax belə cəzalandırarıq.
**26** Və and olsun ki, Biz sizi güclü etmədiyimiz şeylərdə onları güclü etmişdik; sizə vermədiyimiz imkanları onlara vermişdik. Onlara da qulaqlar, gözlər və duyğular vermişdik. Buna rəğmən qulaqları, gözləri və duyğuları onlara heç bir fayda vermədi / onlardan heç bir şeyi uzaqlaşdıra bilmədi. Çünki onlar Allahın ayələrini bilə-bilə inkar edirdilər. İstehza etdikləri şey də onları bürüyüb əhatə etdi.
**27,28** Həqiqətən Biz, öz qonşularınız olan məmləkətləri dəyişikliyə / məhvə məruz qoyduq. Ayələri, onlar (haqqa) dönsünlər deyə təkrar-təkrar açıqladıq. Elə isə, Allahın altındakılardan guya Ona yaxınlığa vəsilə kimi qəbul etdikləri saxta tanrılar, onların əzabını dəf etməyə yardım etməli deyildimi? Əksinə, o saxta tanrılar onlardan ayrılıb qeyb oldular. Bu, onların yalanlarıdır / uydurmaqda olduqları şeydir. (66/46, Əhqaf / 21-28)

## Nəcm: 278

**29** Bir vaxt Biz, gizli agentlərdən (xəfiyyələrdən) Quranı dinləmək istəyən bir qrupu sənə yönəltmişdik. Onlar Qurana (qulaq asmağa) hazır olduqları zaman, "Susun!" dedilər. Sonra Quranı dinləyincə də, hər biri (bir) xəbərdar edən olaraq öz qövmlərinə (toplumlarına) döndülər.
**30-32** Onlar: "Ey qövmümüz! Şübhəsiz ki, biz Musadan sonra nazil edilən və sadəcə içindəkiləri təsdiq edən, haqqa və ən doğru yola yönləndirən bir kitab dinlədik. Ey qövmümüz! Allahın dəvətçisinə qarşılıq (cavab) verin (onu qəbul edin) və ona iman edin ki, Allah günahlarınızı bağışlasın və sizi ağrılı-acılı bir əzabdan qurtarsın. Hər kim Allahın dəvətçisinə qarşılıq (cavab) verməzsə, bilsin ki, yer üzündə Allahı aciz qoya biləcək deyildir. Onun üçün Allahın altındakılardan yardım edən, yol göstərən, qoruyan (himayə edən) yaxın kimsələr də yoxdur. Bax onlar, açıq-aşkar bir azğınlıq içindədirlər" dedilər. (66/46, Əhqaf / 29-32)

**Nəcm: 279**

**33** Onlar, şübhəsiz, göyləri və yer üzünü yaradan və onları yaratmaqla yorulmayan Allahın ölüləri də diriltməyə qadir olduğunu görmədilərmi / düşünmədilərmi? Bəli, şübhəsiz ki, O, hər şeyə qadirdir.

**34** Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrin] atəş üzərinə yayılacaqları gün: "Bu, gerçək deyilmiş, eləmi?" Onlar da: "Bəli; gerçəkmiş. Rəbbimizə and olsun!" dedilər. Allah: "O halda, bilərək rədd edib inad etdiyinizdən / inanmadığınıza görə indi dadın əzabı!" dedi. (66/46, Əhqaf / 33-34)

**Nəcm: 280**

**35** Artıq, elçilərdən əzm sahiblərinin səbr etdikləri kimi, sən də səbr et! Onlar üçün tələsmə. Onlar, özlərinə vəd edilən şeyi gördükləri gün, sanki dünyada sadəcə gündüzün bir saatı qədər qalmış kimidirlər. Bu, bir təbliğdir. Artıq, haqq yoldan çıxan topluluqlardan başqası dəyişikliyə / məhvə məruz qoyularmı? (66/46, Əhqaf / 35)

## ZARİYAT [TOZ QALDIRANLAR] (67 – 51) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 281**

**1-6** O tozladıqca tozlayanlar, arxasından ağırlığı daşıyanlar, sonra asanlıqla axanlar, sonra da bir əmri paylaşdıranlar[279] dəlildir ki, şübhəsiz, təhdid olunduğunuz o şey, mütləq doğrudur. Şübhəsiz, edilənlərin qarşılıqlarının verilməsi də mütləq gerçəkləşəcəkdir.

**7-9** Gözəl yollara sahib olan alimlər[280] dəlildir ki, şübhəsiz ki, siz; müşriklər, elçiyə sehrbaz, şair, məcnun (gizli güclər tərəfindən dəstəklənən); Qurana sehr, şer, qədimlərin nağılları deyərək; təsdiq edib və yalan hesab edərək, qəbul edib və inkar edərək həqiqətən dəyişik qərar içindəsiniz. O vəd edilən qiyamətə və hesablaşmağa inanmaqdan öz istəyi ilə dönən kəs döndərilər; onu kimsə döndərməz. [Gözəl yollara sahib olan alimlər dəlildir ki, şübhəsiz ki, siz həqiqətən dəyişik qərar içindəsiniz. Dəyişik qərardan çevrilən kəs, çevrilər.] (67/51, Zariyat / 1-9)

**Nəcm: 282**

**10-12** Məhv oldu bir sərxoşluq və şüursuzluq içindəki "Din günü nə zamandır?" deyən o həddindən artıq yalançılar!

**13,14** O gün, atəşdə / cəhənnəmdə ağılları başlarına gətirilər: "Dadın atəşdə öz əriməyinizi! Bax bu, sizin tez (gəlib çatmasını) istədiyiniz şeyin özüdür!"

**15-19** Şübhəsiz, Allahın mühafizəsi altına daxil olan kəslər, Rəblerinin onlara verdiyi şeyləri almış olaraq bağçalarda və çeşmələr başındadırlar. Şübhəsiz ki, onlar, bundan öncə yaxşı-gözəl əməl işləyənlər idilər. Onlar gecələr çox az yatırdılar. Onlar, səhərlər də bağışlanma diləyirdilər və onların mallarında istəyən və istəməyən üçün bir haqq vardır.
**20-22** Və heç tərəddüdsüz, yəqinliklə inananlar üçün yer üzündə və (sizin) öz içinizdə neçə-neçə əlamətlər / işarətlər (var). Və sizin ruziniz / sizin ruzi verəniniz, sizin vəd olunduğunuz şeylər göydədir. Hələ də görmürsünüz?
**23** Elə isə göy və yer üzünün Rəbbinə and olsun ki, sizə edilən o vəd, mütləq, eynilə sizin danışmağınız kimi gerçəkdir. (67/51, Zariyat, 10-23)

**Nəcm: 283**
**24** İbrahimin möhtərəm qonaqlarının xəbəri sənə gəldimi?
**25** Bir vaxt onlar İbrahimin yanına girmişdilər və: "Salam!" demişdilər. İbrahim: "Salam, qeyri-adi, kimliyi bəlli olmayan camaat!" dedi.
**26** İbrahim, sonra əhlinə (ailəsinin yanına) getdi və qızıl[281] ilə gəldi.
**27** Sonra qızılı onlara yaxınlaşdırdı: "Nəsiblənmək istəmirsiniz?" dedi.
**28** Sonra onlardan çəkindi. Onlar: "Qorxma!" dedilər və onu çox bilikli bir oğul ilə müjdələdilər.
**29** Belə olduqda arvadı bağıraraq önə gəldi və əlini üzünə vuraraq: "Bir bəxtsiz, bir sonsuz!" dedi.
**30** Qonaqlar: "Rəbbin məhz belə buyurdu. Şübhəsiz ki, Rəbbin, haqsızlıq və qarışıqlığı (anarxiyanı) əngəlləmək üçün qoyulmuş qanun, düstur və qaydaları qoyandır. Özü də ən yaxşı biləndir" dedilər.
**31** Belə olduqda, İbrahim: "Sizin önəmli işiniz nədir, ey elçilər?" dedi.
**32-34** Elçiler: "Şübhəsiz ki, biz, Rəbbinin qatından, həddi aşanlar üçün işarələnmiş, palçıqdan bişirilmiş sərt daşları üzərlərinə yağdırmağımız üçün günahkar bir qövmə göndərildik" dedilər.
**35** Buna görə Biz, möminlərdən orada olan kimsələri çıxartdıq.
**36** Fəqət Biz orada bir evdən başqa Müsəlman (evi) tapa bilmədik.
**37** Və Biz orada ağrılı-acılı bir əzabdan qorxan kimsələr üçün bir əlamət / işarət buraxdıq (qoyduq).
**38,39** Musada da əlamətlər / işarətlər vardır. Bir zaman Biz onu açıq-aşkar bir dəlillə Firona göndərdik, ancaq Firon ordusu, bütün güc mənbələri ilə birlikdə üz çevirdi. Və "Bu, bir sehrbazdır, hətta gizli güclər tərəfindən dəstəklənən / dəli biridir" dedi.
**40** Sonra da Biz, onu və ordularını yaxaladıq və onları bol suda / çayda fırladıb atdıq. O isə məzəmmət edilən (qınanan) / qınayan biridir.

**41,42** Ad (qövmündə) də əlamətlər / işarətlər vardır. Bir zaman Biz onların üzərinə, dəydiyi heç bir şeyi (salamat) buraxmayan, sadəcə onu kül kimi edən, sonsuz (qısır) buraxan bir külək göndərdik.
**43,44** Səmud (qövmündə) də əlamətlər / işarətlər vardır. Bir zaman onlara: "Müəyyən, bir vaxta qədər faydalanın!" deyilmişdi. Sonra onlar Rəblərinin əmrindən çıxdılar və onları, gözləri baxa-baxa ildırım yaxaladı.
**45** Artıq, onlar özlərini ayağa qaldıracaq hər hansısa bir gücə sahib olmadılar. Yardım görənlərdən də olmadılar.
**46** Daha öncə Nuh qövmünü dəyişikliyə / məhvə məruz qoymuşduq. Şübhəsiz ki, onlar, haqq yoldan çıxan qövm idilər. (67/51, Zariyat / 24-46)

**Nəcm: 284**

**47** Və səma; Biz onu qüdrətlə / sağlam vəziyyətdə (möhkəm halda) bina etdik. Heç şübhəsiz ki, Biz, kainatı genişlədənlərik.
**48** Və yer üzü; onu Biz döşədik. Bax, Biz, hər şeyin əmələ gəlib böyüdüyü mühitləri nə gözəl hazırlayanlarıq!
**49** Və Biz, siz yaxşıca düşünərsiniz / öyüd alarsınız deyə, hər şeydən iki cüt (tay) yaratdıq. (67/51, Zariyat / 47-49)

**Nəcm: 285**

**50** Elə isə, Allaha tərəf qaçın, Allaha tərəf qaçın!!! Şübhəsiz ki, mən sizin üçün Onun tərəfindən açıq-aşkar xəbərdar edən biriyəm.
**51** Və Allah ilə bərabər başqa bir tanrı yaratmayın (qəbul etməyin). Şübhəsiz ki, mən sizin üçün Onun tərəfindən açıq-aşkar xəbərdar edən biriyəm.[282] (67/51, Zariyat / 50-51)

**Nəcm: 286**

**52** Bax belə, onlardan öncəkilərə hər hansı bir elçi gəldikdə, onun haqqında da həqiqətən onlar: "Bir sehrbazdır!" və ya "Bir gizli güclər tərəfindən dəstəklənən / dəli biridir!" dedilər.
**53** Onlar, bunu bir-birlərinə öhdəlik olaraqmı ötürdülər? Əksinə, onlar azğın bir camaatdır.
**54,55** Artıq, sən onlardan üz çevir. Artıq, sən qınanacaq deyilsən. Və sən öyüd ver / xatırlat. Çünki şübhəsiz öyüd / xatırlatmaq möminlərə fayda verər. (67/51, Zariyat / 52-55)

**Nəcm: 287**

**56,57** Mən, bilmədiyiniz və bildiyiniz, gəlmiş-keçmiş hər kəsi yalnızca Mənə qulluq etsinlər deyə yaratdım. Mən onlardan hər hansı bir ruzi istəmirəm. Mən, onların Məni yedirtmələrini də istəmirəm.

**58** Şübhəsiz, çox ruzi verən məhz Allah Özüdür, çox çətin (böyük) qüvvətin sahibidir.
**59** Artıq, şübhəsiz ki, şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyənlər üçün yoldaşlarının payı kimi bir pay vardır. Artıq tələsməsinlər.
**60** Artıq onlara vəd edilən günlərinə görə kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslərin] vay halına!

(67/51, Zariyat / 56-60)

## ĞAŞİYƏ (68 – 88) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 288**

**1** (Hər tərəfi) bürüyənin xəbəri sənə gəlib çatdımı?

**2,3** Elə kəslər var ki, o gün, çalışmış, yorulmuş olmasına rəğmən, əyilmiş, alçalmışdır (zəlil düşmüşdür), **4,5** onlar qızğın bir atəşə söykənərlər, qızğın bir qaynaqdan sulanarlar.

**6,7** Onlar üçün qüvvət verməyən və aclığı aradan qaldırmayan quru bir tikandan başqa yemək yoxdur.

**8-16** Elə kəslər də var ki, o gün nemətlər içindədirlər, çalışmaları üçün razıdırlar, yüksək bir cənnətdədirlər, orada boş bir söz eşitməzlər. Orada axan bir qaynaq vardır; orada yüksəldilmiş divanlar, qoyulmuş piyalələr, düzülmüş yastıqlar, yayılmış xalçalar vardır.

(68/88, Ğaşiyə / 1-16)

**Nəcm: 289**

**17** Yaxşı, yenidən dirilməyə inanmayanlar dəvələrə / yağmur gətirən buludlara baxmırlarmı ki, onlar necə yaradılmışdır?

**18** Və göy üzünə baxmırlarmı ki, o necə yüksəldilmişdir?

**19** Və dağlara baxmırlarmı ki, onlar necə dikəldilmişdir?

**20** Və yer üzünə baxmırlarmı ki, o necə yayılmışdır? (68/88, Ğaşiyə / 17-20)

**Nəcm: 290**

**21,22** Haydı, öyüd ver / xatırlat, şübhəsiz ki, sən, sadəcə öyüd verənsən / xatırladansan. Sən, onların üzərində zorla hakim olan biri deyilsən. (68/88, Ğaşiyə / 21-22)

**Nəcm: 291**

**23,24** Ancaq / Gözünüzü açın, kim üz çevirər və küfr edərsə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsə] artıq, Allah, ona ən böyük

əzab ilə əzab edəcək.

**25** Şübhəsiz ki, onların dönüşləri yalnızca Bizədir.

**26** Sonra, şübhəsiz ki, onların haqq-hesabı da yalnızca Bizim üzərimizdədir. (68/88, Ğaşiyə / 23-26)

## KƏHF (69 – 18) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 292**

**1-4** Bütün təriflər, Öz tərəfindən şiddətli əzaba qarşı xəbərdar etmək, yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən möminlərə, şübhəsiz onlar üçün, içində daimi qalanlar olaraq gözəl bir mükafat olduğunu müjdələmək və *"Allah Özünə övlad götürdü"* deyənləri xəbərdar etmək üçün, quluna (elçisinə), nəzarətçi (himayəçi) olaraq, onda (Kitabda) heç bir qusur (ziddiyyət) yaratmadan Kitabı nazil edən Allaha məxsusdur; başqasını tərifləmək olmaz.

**5** (Onların) özlərinin və atalarının, Allahın övlad götürməsinə dair heç bir bilikləri (məlumatları) yoxdur. Ağızlarından çıxan söz nə qədər böyükdür! Onlar sadəcə yalan danışırlar.

**6** Sonra da sən, onlar bu Qurana inanmasalar, onların etdiklərinə görə, üzülməkdən hardasa özünü xarab (həlak) edəcəksən! (69/18, Kəhf / 1-6)

**Nəcm: 293**

**7** Şübhəsiz, Biz yer üzündəki, ona süs olan şeyləri insanların hansının daha gözəl əməl edəcəyini sınamağımız üçün etdik.

**8** Və şübhəsiz, Biz yer üzündə olanları qupquru bir torpaq edəcəyik.

**32** Və onlara, iki adamı örnək ver: Biz bunlardan birinə hər cürə üzümlərdən iki bağ verdik və iki bağın ətrafını xurmalarla bəzədik. Aralarında da bir əkin (yeri) etdik.

**33** Hər iki bağça da heç bir şeyi əskik buraxmadan (olmadan), məhsullarını verdilər. Aralarında da çay (yeri) yardıq / (çay) axıtdıq.

**34** Bu iki bağın sahibi üçün ayrıca başqa gəlir də var idi. Buna görə bu adam yoldaşına danışaraq: "Mən, mal cəhətdən səndən daha çox, insan sayı baxımından da səndən daha qüvvətliyəm!" dedi

**35,36** Və bu adam, özünə haqsızlıq edərək bağına girdi: *"Mən, bunun heç bir zaman yox olacağını sanmıram. Mən Saatın qopacağını (gəlib çatacağını) da zənn etmirəm. Deyək ki, Rəbbimə geri götürüldüm, həqiqətən orada bundan daha yaxşı bir nəticə əldə edərəm"* dedi.

**37-41** Yoldaşı danışaraq ona: *"Səni torpaqdan, sonra bir damcı sudan yaradan, daha sonra da səni yetkin insan halına gətirənəmi inanmırsan? Fəqət mən; O, mənim Rəbbim Allahdır. Və mən kimsəni*

*Rəbbimə ortaq qoşmaram. Öz bağına girdiyin zaman: "MaşaAllah, la quvvətə illa billah [Allah nə istəyərsə o olar. Allahdan başqa heç bir güc yoxdur]" desəydin! Sən hər nə qədər məni, mal və övlad baxımından özündən aşağı görsən də, bəlkə Rəbbim mənə sənin bağından daha xeyirlisini verər. Səninkinin üstünə də göydən fəlakətlər göndərər və sənin bağın sürüşkən bir torpaq halına gələr. Yaxud bağının suyu yerin dibinə çəkilər və bir daha onu axtarıb tapmağa gücün çatmaz."* dedi
**42,43** Və iki bağ sahibi olan o adam, sərvəti ilə (birgə) mühasirə altına alındı / tələf edildi. Belə olduqda, bağında etdiyi xərcləmələrə görə əllərini ovuşdurmağa başladı. Bağça, talvarların üzərinə yıxılıb (çöküb) qalmışdı, o da: *"Ah, nə olaydı, Rəbbimə heç bir şeyi ortaq qoşmasaydım"* deyirdi. O adam üçün Allahın altındakılardan yardım edəcək bir topluluq olmadı. Və özü də qisas alacaq / öz-özünə yardım edəcək biri deyildi.
**44** Bax burada hakimiyyət / yardımçılıq, qoruyuculuq (himayəçilik), yol göstəricilik ancaq haqq olan Allaha aiddir. O, mükafatlandırmaq baxımından ən yaxşı və aqibəti təyin etmək baxımından da ən yaxşı olandır.
**45** Və sən, onlara bəsit dünya həyatının misalını ver: O bəsit dünya həyatı göydən endirdiyimiz bir su kimidir ki, bu su səbəbiylə yer üzünün bitkiləri bir-birinə qarışmış, sonra da küləyin sovurduğu bir çöp qırıntısı olmuşdur. Və Allah, hər şeyə gücünü qəbul etdirəndir.
**46** Mal və oğullar, bəsit dünya həyatının süsüdür. Qalıcı olan, yaxşılaşdırmaq qayəsi ilə işlənən əməllər isə Rəbbinin qatında, savab baxımından daha xeyirlidir, ümid bağlama yönündən də daha xeyirlidir.
**47** Və Bizim dağları hərəkətə gətirdiyimiz gün; və sən yer üzünü çılpaq / dümdüz görəcəksən. Və Biz onları bir yerə topladıq. Beləcə, onlardan heç bir kimsəni (kənarda) buraxmadıq.
**48** Və onlar, səflər (dəstələr) halında Rəbbinin hüzuruna yayılmışlar: "Şübhəsiz, sizi ilk öncə yaratdığımız kimi, Bizə gəldiniz. Əslində siz, sizin üçün görüşmə zamanı gerçəkləşdirməyəcəyimizə batil bir şəkildə inanırdınız."
**49** Və Kitab / əməl dəftəri qoyulmuşdur. Günahkarların ondan qorxduğunu görəcəksən. Və: *"Vay halımıza! Bu necə bir kitabmış ki, böyük-kiçik heç bir şey buraxmadan hamısını saymış"* deyərlər. Və onlar, etdiklərini (öz qarşılarında) hazır görərlər. Və sənin Rəbbin heç kimsəyə haqsızlıq etməz.
**27** Və sən, Rəbbinin kitabından sənə vəhy olunanı oxu / izlə! Rəbbinin sözlərini dəyişdirə biləcək bir kimsə yoxdur. Və sən, Onun

altındakılardan bir sığınacaq tapa bilməzsən.
**28** Və özünü, daimi olaraq Rəblərinin razılığını istəyərək Rəblərinə yalvaran kəslər ilə bərabər səbr edən biri et. Bəsit dünya həyatının süsünü istəyərək onlardan gözlərini də ayırma. Və sən, Bizim xatırlanmamızdan qəlbini əlaqəsiz / duyğusuz etdiyimiz, boş-müvəqqəti arzusuna uymuş və işində həddi aşan kimsəyə uyma.
**29** Və de ki: *"O haqq, Rəbbinizdəndir. O səbəblə də istəyən iman etsin, istəyən bilərək rədd etsin / inanmasın."* Şübhəsiz ki, Biz, şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyənlər üçün divarları onları hər tərəfdən içinə almış bir atəş hazırladıq. Və əgər yağmur yağmasını istəyərlərsə, ərimiş mədən kimi üzlərini yandıran bir su yağdırılar. O, nə pis bir içkidir! Dayanmaq / sığınmaq yeri olaraq da nə qədər pisdir!
**30** Şübhəsiz, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyənlər; şübhə yox ki, Biz, işi gözəl edənlərin qarşılığını (əməyini) itirmərik.
**31** Bax onlar üçün altından çaylar axan Ədn cənnətləri vardır. Onlar, orada taxtlarına söykənmiş olaraq, qızıl bilərziklərlə süslənəcəklər, incə və qalın ipəkdən yaşıl libaslar geyəcəklər. O, nə gözəl qarşılıqdır! Və nə gözəl qalmaq yeridir![283] (69/18, Kəhf / 7-8, 32-49, 27-31)

## Nəcm: 294[284]

**9** Yoxsa sən, Böyük mağara və Rəqim / Kitabə Əhlinin təəccüb ediləcək əlamətlərimizdən / işarətlərimizdən olduqlarınımı sandın?
**10** O igidlər, Böyük mağaraya sığındıqda: "Rəbbimiz! Bizə qatından bir rəhmət ver və bizim üçün bu işimizdən ağlımızın inkişaf etməsini nəsib et" dedilər.
**11** Belə olduqda, Biz, onların qulaqlarının üstünə o böyük mağarada neçə illər vurduq.
**12** Sonra da iki qrupun hansının, onların gözlədikləri müddəti daha yaxşı hesapladığını bildirək / işarələyib göstərək deyə Rəqim / Kitabə Əhlini göndərdik.
**13,16** Biz sənə Kəhf və Rəqim Əhlinin önəmli xəbərlərini gerçək olaraq qissələşdirəcəyik (bir dərs çıxarılmalı hadisə edəcəyik). Şübhəsiz ki, onlar Rəblərinə iman etmiş bir neçə gənc igidlər idi. Biz də onlara (doğru yola) yönləndirməyi artırdıq: "Madam ki, siz, onlardan və Allahdan başqa ibadət etdikləri şeylərdən ayrıldınız, o halda o böyük mağaraya sığının ki, Rəbbiniz sizə Öz rəhmətindən yaysın və işinizdən sizin rastınıza faydalı olanı hazırlasın."
**14,15** Və Biz, onlar ayağa qalxıb: *"Bizim Rəbbimiz göylərin və yerin Rəbbidir. Biz, Onun altındakılara ilah olaraq yalvarmarıq, yoxsa həqiqətən məntiqsiz danışmış olarıq. Bunlar, Allahın altındakılardan ilahlar qəbul edən bizim camaatımızdır. Qəbul etdikləri ilahlara dair*

*nə üçün açıq bir dəlil gətirmədilər? Allaha qarşı yalan uydurandan daha səhv davranan; öz zərərlərinə olan əməli işləyən kim ola bilər?"* dediklərində onların qəlblərini sağlamlaşdırmışdıq (qüvvət vermişdik).
**17** Və sən, vəhy əsasında araşdırma edildiyində xeyirli bir nəticə alındığını; əks halda mənasız bir iş edildiyini görəcəksən. Özləri də ondan geniş bir boşluqdadırlar. Bu, Allahın əlamətlərindən / işarətlərindəndir. Allah kimə (doğru) yol göstərdisə artıq o, yönləndirildiyi doğru yolu tapmışdır. Allah kimi də yoldan azdırdısa, artıq sən ona yol göstərən bir Yaxın Kimsəni əsla tapa bilməzsən.
**18** Və sən Rəqim Əhlini görsəydin oyaq sanardın. Halbuki onlar yuxudadırlar. Və Biz onları sağ tərəfə və sol tərəfə çeviririk. İtləri də girişdə ön ayaqlarını irəli doğru uzatmışdı. Əgər sən onların vəziyyətini yaxşıca bilsəydin, həqiqətən, qaçaraq onlardan uzaqlaşardın və onlardan ürpərərdin.
**19,20** Və beləcə, öz aralarında araşdırma etsinlər (sual-cavab etsinlər) deyə, kitabə əhlini göndərdik. Onlardan bir sözçü: "Nə qədər qaldınız?" dedi. Digərləri: "Bir gün və ya günün bir hissəsi qədər qaldıq" dedilər. Kitabə əhlindən digərləri: "Nə qədər qaldığınızı Rəbbiniz daha yaxşı bilər. İndi siz birinizi bu gümüş pulunuzla şəhərə göndərin, baxsın görsün, hansı yemək daha təmiz isə, ondan sizə yemək gətirsin. Və çox nəzakətli davransın və sizi kimsəyə bəlli etməsin. Şübhəsiz ki, şəhər xalqı, sizə qalib gələrsə sizi daşqalaq edərək öldürərlər və ya sizi öz dinlərinə / həyat tərzlərinə döndərərlər. O zaman da siz, sonsuz olaraq qətiyyən qurtuluşa nail olmayacaqsınız."
**21** Beləliklə, Allahın vədinin haqq olduğunu və qiyamət günündə heç bir şübhə olmadığını bilmələri üçün, onlara xəbərdar (vasitəsi) etdik. O vaxt onlar aralarında işləri haqqında mübahisə edirdilər. Dedilər ki: "Üzərlərində sadə bir bina tikin. Rəbləri onları daha yaxşı bilər." Onların işləri barədə qalib olanlar: "Üzərlərində həqiqətən bir məscid [inandırma yerləri / axirətin varlığını isbat edəcək məktəblər] tikəcəyik" dedilər.
**22-25** "Onlar, üç nəfərdir, dördüncüsü itləridir" deyəcəklər. Onlar kimsəsiz yeri daşlamaq kimi [qeyri-dəqiq, əsassız, baş(ların)dan eləmək üçün], "Beş nəfərdir, altıncısı itləridir" deyəcəklər, "Onlar yeddi nəfərdir, səkkizincisi itləridir" və onlar: "Onlar, onların o böyük mağaralarında üç yüz il qaldılar" deyərlər. Və doqquz da artırdılar. De ki: "Onların sayını Rəbbim daha yaxşı bilir." Onları ancaq çox az kimsə bilir. Bu səbəblə onlar haqqında ortada olan (bildirdiyimiz) şeydən başqası ilə bir mübahisəyə girişmə və bunlar haqqında onların heç birindən də bir şey soruşma! Və heç bir şey üçün, "Allahın istəməsi xaricində, şübhəsiz mən sabah onu edəcəyəm" demə. Və tərk

etdiyin vaxt Allahı yad et və "Ümid edirəm ki, Rəbbim məni, doğruya bundan daha yaxın olana çatdırar" de!
26 De ki: "Allah, kitabə əhlinin nə qədər qaldıqlarını ən yaxşı biləndir." Göylərin və yerin görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi yalnız Ona məxsusdur. O, nə gözəl görür, O nə gözəl eşidir! Onlar üçün, Onun altındakılardan bir yardım edən, yol göstərən, qoruyan (himayə edən) yaxın bir adam yoxdur. Allah, Öz hökmranlığına kimsəni ortaq etməz. (69/18, Kəhf / 9-13, 16, 14-26)

## Nəcm: 295

50 Və bir vaxt Biz, təbiət qüvvələrinə, "Adəmə boyun əyib təslimiyyət göstərin" demişdik, İblis / zehin qabiliyyəti xaricində hamısı boyun əyib təslimiyyət göstərdi. İblis, görünməz varlıqlardandı / enerjidəndi. Sonra da öz Rəbbinin əmrinə əks getdi. İndi siz, Mənim altımdakılardan onu və onun soyunu yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxınlarmı qəbul edirsiniz? Həm də onlar sizin düşməniniz olduğu halda. Şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün nə pis bir dəyişdirmədir bu!
51 Mən onları, göylərin və yer üzünün yaradılışına və özlərinin yaradılışına şahid etmədim və Mən heç bir zaman yoldan azdıranları yardımçı seçmiş deyiləm.
52 Və o gün Allah: "Səhv olaraq inandığınız Mənim ortaqlarımı haydı çağırın" deyər. Sonra onlar da onları çağırdılar, ancaq onlar (çağırışlarına) cavab vermədilər. Və Biz, onların arasına atəşdən bir əngəl qoymuşuq.
53 Və günahkarlar atəşi görmüşlər və artıq, özlərinin ona düşəcəklərinə qəti inanmışlar. Ondan qaçıb sığınacaq bir yer də tapa bilmədilər.
54 Və şübhəsiz, Biz, bu Quranda insanlar üçün hər örnəkdən ətraflı şəkildə açıqladıq. İnsan isə, mübahisə etməsi hər şeydən daha çox olandır.
55 Və onlara doğru yol [kitab, elçi] gəldiyi zaman, insanların iman etmələrinə və Rəblərindən günahlarının bağışlanmasını istəmələrinə mane olan durum, sadəcə "əvvəlkilər ilə əlaqəli baş verənlərin (tətbiqlərin) onlara gəlməsi ya da önlərinə əzabın gəlməsidir."
56 Və Biz, elçiləri ancaq müjdə verənlər və xəbərdar edənlər olaraq göndəririk. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] də haqqı batillə ləğv etmək / ortadan qaldırmaq üçün mücadilə edirlər. Və onlar ayələrimizi və təhdid edildikləri şeyləri məsxərəyə qoydular.
57 Və Rəbbinin ayələri ilə öyüd verilib / xatırladılan, ancaq onlardan

məsafələnib uzaqlaşan və iki əlinin qabaqcadan göndərdiklərini / elədiklərini unudan [tərk edən, nəzərə almayan] kimsədən daha səhv; öz zərərinə olan əməli işləyən kim ola bilər? Şübhəsiz ki, Biz onların qəlblərinin üzərinə, Quranı yaxşıca anlamalarına əngəl pərdələr, qulaqlarında da ağırlıq yaratdıq. Sən onları doğru yola çağırsan da, onlar bu halda əsla yönləndirildikləri doğru yola girməzlər.
**58** Bununla bərabər, sənin rəhmət sahibi Rəbbin çox bağışlayandır. Əgər sənin rəhmət sahibi Rəbbin işlədikləri günahlar üzündən onları dərhal yaxalasaydı, onlara əzabı həqiqətən tez verərdi. Əksinə, onlara vəd edilən bir zaman var. Onlar Onun altındakılardan bir sığınacaq əsla tapa bilməzlər.
**59** Və budur, şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işlədikləri zaman dəyişikliyə / məhvə məruz qoyduğumuz şəhərlər! Biz onların dəyişikliyə / məhvə məruz qalmaları üçün də müəyyən bir zaman təyin etmişdik. (69/18, Kəhf / 50-59)

## Nəcm: 296

**60** Və bir vaxt Musa (yanındakı) gənc oğlana: "Mən iki alim adamın toplandığı yerə çatana qədər dayanmayacağam yaxud illərlə gedəcəyəm" demişdi.
**61** Beləliklə, "iki alim adamın toplandığı yerə" çatdıqlarında ikisi də halsızlıqlarını / sıxıntılarını[285] tərk etdi. O zaman halsızlıq / sıxıntı, alim kimsənin yardımı ilə yox olub getdi.
**62** Bu şəkildə keçdikləri zaman Musa (yanındakı) gənc oğlana: "Gətir nahar yeməyimizi, gerçəkdən biz bu səfərimizdə yorulduq" dedi.
**63** Gənc oğlan: "Gördünmü / heç düşündünmü? O Qayaya sığındığımız vaxt doğrusu mən halsızlıqdan / sıxıntıdan qurtuldum, onu söyləməyimi də həqiqətən eqoistliyim əngəllədi. Halsızlıq / sıxıntı təəccüblü bir şəkildə alim adamda qeyb olub getdi" dedi.
**64** Musa, "Bax bu axtardığımızdı!" dedi. Dərhal izlərini təqib edərək qayıdıb geri döndülər.
**65** Bu vaxt qullarımızdan bir qul tapdılar ki, Biz ona qatımızdan bir rəhmət vermiş və tərəfimizdən bir bilik öyrətmişdik.
**66** Musa ona: "Doğru yol barədə sənə öyrədiləndən mənə də öyrətməyin üçün sənə tabe ola bilərəmmi?" dedi.
**67,68** Alim və rəhmətə nail olan qul: "Şübhəsiz ki, sən mənimlə bərabər səbr etməyə taqətin çatmaz. Və qavraya bilmədiyin biliyə necə səbr edəcəksən?!" dedi.
**69** Musa: "İnşaAllah məni səbr edən biri (olduğumu) görəcəksən və sənin heç bir işinə qarşı gəlmərəm" dedi.
**70** Alim və rəhmətə nail olan qul: "O halda, əgər mənə tabe

olacaqsansa, məndən heç bir şey haqqında sual soruşma, ta ki, mən sənə öyüd olaraq ondan söz açana qədər.”
**71** Beləcə, ikisi getdilər; nəhayət gəmiyə mindiklərində, Alim və rəhmətə nail olan qul gəmidə qüsurlar yaratdı. Musa: “İçindəkiləri boğmaq üçünmü onu deşdin / onda qüsurlar yaratdın? Həqiqətən sən təəccüblü bir şey etdin!” dedi.
**72** Alim və rəhmətə nail olan qul: “Mən, ‘Şübhəsiz ki, sən mənimlə bərabər olmağa səbr edə bilməzsən’ demədimmi?” dedi.
**73** Musa: “Unutduğum şeylə məni cəzalandırma və işimə görə mənə çətinlik çıxarma!” dedi.
**74** Yenə getdilər. Nəhayət bir cavana rast gəldilər; Alim və rəhmətə nail olan qul onu öldürdü. Musa: “Bir nəfsin qarşılığı (qisası) olmadan, tərtəmiz bir nəfsimi öldürdün? Həqiqətən, çox anlaşılmaz bir şey etdin!” dedi.
**75** Alim və rəhmətə nail olan qul: “Mən sənə ‘Həqiqətən sən mənimlə birlikdə əsla səbr edə bilməzsən’ demədimmi?” dedi.
**76** Musa: “Əgər bundan sonra səndən bir şey soruşsam, artıq mənimlə yoldaşlıq etmə! Həqiqətən, qovsan, incimərəm” dedi.
**77** Beləcə, yenə getdilər. Nəhayət bir kənd əhalisinə çatanda onlardan yemək istədilər. Buna baxmayaraq onlar da, bunları qonaq etməkdən çəkindilər. Bu vaxt orada uçmaq üzrə olan bir divar gördülər. Alim və rəhmətə nail olan qul onu düzəltdi. Musa: “İstəsəydin, bunun qarşılığında həqiqətən bir muzd alardın” dedi.
**78-82** Alim və rəhmətə nail olan qul: “Bax bu, aramızın ayrılmasıdır. İndi sənə o səbr edə bilmədiyin şeylərin birinci mənalarını xəbər verim:
Gəmi hadisəsinə gəlincə; o, dənizdə işləyən bəzi yoxsullarındı. Bax, o səbəblə mən onu qüsurlu hala gətirmək istədim. Yaxınlıqda da sağlam, bütün sağlam, gözəl gəmiləri qəsb edib alan bir kral vardı.
Cavana da gəlincə; onun ana-atası mömin kimsələrdi. Bax o səbəblə biz, onun, ana-atasını azdırmasından və küfrə [Allahın ilahlığını və rəbliyini bilərək rədd etməyə] sürükləməsindən qorxduq. Sonra da ‘Rəbləri onun yerinə onlara paklıq baxımından daha xeyirli və mərhəmət baxımından da daha yaxınını versin’ istədik.
Divara da gəlincə; o, şəhərdəki iki yetim oğlanındı və onun altında onlar üçün bir xəzinə vardı. Ataları da yaxşı bir zat idi. Bax, onun üçün *–Rəbbindən bir rəhmət olmaq üzrə–* Rəbbin onların yetkinlik yaşına (həddi-buluğa) çatmalarını, xəzinələrini (tapıb) çıxartmalarını istədi. Və mən onu [divarı düzəltmək işini] öz fikrimlə etmədim. Bax Sənin, üzərində səbr etməyə taqətin çatmayan şeylərin ilk plandaki mənası!” (69/18, Kəhf / 60-82)

## Nəcm: 297[286]

83 Və səndən iki çağ sahibi[287] haqqında soruşurlar. De ki: "Sizə ondan, bir xatırlatma / öyüd oxuyacağam:
84 Şübhəsiz, Biz iki çağ sahibi üçün yer üzündə iqtidar verdik və ona hər şeydən bir səbəb verdik.
85 Sonra o, bir səbəbə tabe oldu.
86 Nəhayət o, vəhyin batdığı yerə çatdığı zaman, vəhyi, qara bir palçıqda batmaqda olduğunu gördü [orada ilahi prinsiplər həyatdan çıxarılmışdı]. Bir də bunun yanında bir camaat gördü. Biz dedik ki: "Ey Zülqərneyn! Onları ya cəzalandırırsan və ya onların haqqında yaxşı-gözəl davranırsan."
87,88 O dedi ki: "Kim şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləsə, həqiqətən ona əzab edəcəyik; Sonra Rəbbinə geri döndəriləcək, sonra O da onu görülməmiş bir əzabla əzaba düçar edər. Amma hər kim iman edər və saleh əməl işləyərsə, artıq buna da ən gözəl qarşılıq vardır. Və Biz onun üçün əmrimizdən asan olanı söyləyəcəyik."[288]
89 Sonra iki çağ sahibi, bir səbəbə tabe oldu.
90 Nəhayət, vəhyin doğduğu yerə vardı. Vəhyi bir camaat üzərinə doğduğunu gördü. Belə ki, Biz onlar üçün, vəhy olmayan biliklərlə (məlumatlarla) bir sipər hazırlamışdıq.
91 Bax belə! Və Biz onun yanında olan şeyləri bilik baxımından əhatə etmişdik.[289]
92 Sonra iki çağ sahibi, bir səbəbə tabe oldu.
93 Nəhayət, iki müqavilə arasına gəlib çatdıqda, iki camaatın [Mədinə və Məkkə camaatının] altındakılardan, demək olar ki, heç söz anlamayan bir camaat [Xeybər yəhudilərini] gördü.
94 Söz anlamaz camaat [Xeybər yəhudiləri] dedilər ki: "Ey iki çağın sahibi! Şübhəsiz ki, axın edənlər[290] və onların sərkərdəsi [Muhəmməd və ordusu] bu torpaqlarda fəsad törədir [əkinçilikdən anlamırlar, əraziyə heyif edirlər]. Onun üçün, bizimlə onlar arasında bir sənəd tərtib etməyin şərti ilə, sənə bir vergi versək olarmı?"
95 İki çağ sahibi dedi ki: "Rəbbimin mənə verdiyi imkanlar daha xeyirlidir. Haydı, siz mənə öz qüvvənizlə yardım edin, sizinlə onların arasında çox sağlam bir müqavilə / sənəd düzəldim. Mənə, incə zəkanızla hazırladığınız təklif mətnlərini gətirin."
96 Nəhayət, hədəflər bərabər olduğu zaman: "Hazırlayın müqaviləni!" dedi. Nəhayət, müqavilə hazırlanınca, 'Gətirin mən də imzalayım' dedi.
97 Artıq, söz anlamaz o camaat, sağlam şəkildə hazırlanan müqaviləni aşmağa gücləri çatmadı, onu zədələməyə də (pozmağa da) gücləri çatmadı.[291]

98 İki çağ sahibi dedi ki: "Sağlam şəkildə hazırlanan bu müqavilə Rəbbimdən bir rəhmətdir. Artıq, Rəbbimin vədi gəldiyi vaxt, onu düppədüz edəcək. Rəbbimin vədi də haqdır." (69/18, Kəhf / 83-98)

## Nəcm: 298

99 Və Biz, qiyamət günü ortaq qoşan kimsələri dalğalar halında bir-birlərinə qarışdıqları halda qoymuşuq. Sura da üflənmişdir. Beləcə, ortaq qoşan kimsələrin hamısını bir yerə toplamışıq.
100,101 Və Biz, cəhənnəmi o gün, Məni xatırladan əlamətlərimdən / işarətlərimdən gözləri bir örtük içində olan və vəhyə qulaq verməyə gücləri olmayan kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün elə hey genişləndirdik.
102 Bəs o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr], Mənim altımdakılardan bəzi yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxınlar qəbul edəcəklərinimi sandılar? Şübhəsiz ki, Biz cəhənnəmi kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrə] bir qonaqlıq [ziyafət] (!) olaraq hazırladıq.
103 De ki: "Əməllər baxımından ən çox zərərə uğrayanlar barəsində xəbər verimmi? 104 Onlar, süni olaraq, gözəl əməl işlədiklərini sanarkən, dünyadakı işləri də boşa gedən kimsələrdir."
105 Bax onlar, Rəblərinin ayələrini və Ona qovuşmağı bilərək rədd etmiş / inanmamış kimsələrdi, buna görə də etdikləri bütün əməlləri boşa getdi. Artıq qiyamət günü onlar üçün heç bir ölçü qurmayacağıq / heç bir dəyər verməyəcəyik.
106 İşlədikləri küfrləri; Allahın ilah və rəbb olduğunu bilərək rədd etmələri, Mənim ayələrimi və elçilərimi məsxərəyə qoymaları səbəbiylə, onların cəzaları cəhənnəmdir.
107,108 Şübhəsiz, iman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləmiş bu kimsələr, içlərində daimi qalmaq üzrə Firdovs bağçaları onlar üçün təqdim olunmuşdur. Onlar, oradan heç ayrılmaq istəməzlər.
109 De ki: "Rəbbimin sözləri üçün, dəniz mürəkkəb olsa, Rəbbimin sözləri bitmədən öncə dəniz tükənərdi, hətta bir o qədərini də əlavə etsək belə."
110 De ki: "Mən ancaq sizin kimi bir bəşərəm (insanam). Mənə ilahınızın ancaq bir ilah olduğu vəhy olunur. Onun üçün hər kim Rəbbinə qovuşmağı ümid edirsə, saleh əməli işləsin və Rəbbinə qulluqda, heç kimsəni (Rəbbinə) ortaq etməsin." (69/18, Kəhf / 99-110)

# NƏHL [BAL ARISI] (70 – 16) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 299**

**1** Allahın əmri mütləq gələcək. Artıq onu tələsib istəməyin. Allah, onların ortaq qoşduqları şeylərdən pakdır və ucadır.

**2** Allah, qullarından istədiyinə, xəbərçi ayələri / vəhyi, Özünə xas bir iş olaraq ruh / can ilə birlikdə: "Şübhəsiz ki, Məndən başqa ilah yoxdur, o halda Mənim mühafizəm altına daxil olun deyə xəbərdar edin" vəzifəsiylə nazil edər.

**3** Allah, göyləri və yer üzünü haqq ilə yaratdı. O, onların ortaq qoşduqları şeylərdən ucadır.

**4** Allah, insanı bir nütfədən yaratdı. Bir də görürsən ki, o, açıq-aşkar bir düşməndir.

**5** Heyvanları O yaratmışdır. Onlarda sizi isidəcək şeylər və bir çox faydalar vardır. Siz, onlardan bir qismini də yeyirsiniz.

**6** Və heyvanlarda, axşam vaxtı gətirdikdə və səhər vaxtı göndərdikdə, sizin üçün bir gözəllik var.

**7** Və heyvanlar, ancaq canınızın bir hissəsi tükənərək / çox yorularaq yetişə biləcəyiniz bir məmləkətə yüklərinizi daşıyırlar. Şübhəsiz ki, sizin Rəbbiniz, həqiqətən çox şəfqətlidir, çox mərhəmətlidir.

**8** Və Allah, onlara minəsiniz, həm də zinət olsun deyə, atları, qatırları və uzunqulaqları yaratdı. Bilmədiyiniz şeyləri də O yaradır.

**9** Yolun doğrusu yalnızca Allaha borcdur. Yolun əyrisi də vardır. Və əgər Allah istəsəydi, sizi toplu halda doğru yola yönəldərdi.

**10,11** O, sizin üçün göydən bir su endirdi. İçkiləriniz ondandır. Heyvanları otlatdığınız ağaclar-bitkilər də ondandır. Allah, su ilə sizin üçün əkin, zeytun, xurmalıqlar, üzümlər və bütün meyvələrdən bitirir. Şübhəsiz ki, bunda yaxşı-yaxşı düşünən bir camaat üçün həqiqətən bir əlamət / işarət vardır.

**12** Və Allah, gecəni, gündüzü, günəşi və ayı sizin əmrinizə verdi / sizin faydalanmağınıza uyğun xüsusiyyətlərdə yaratdı. Bütün ulduzlar da Onun əmrinə boyun əymişlər. Şübhəsiz ki, bunda ağlını işlədən bir camaat üçün əlamətlər / işarətlər vardır.

**13** Yer üzündə sizin üçün müxtəlif rənglərdə yaratdığı şeyləri də sizin xidmətinizə (ixtiyarınıza) vermişdir. Şübhəsiz ki, bunda öyüd alan bir camaat üçün həqiqətən bir əlamət / işarət vardır.

**14** Və O, dənizdən təzə ət yeyəsiniz və ondan taxdığınız süs (zinət) əşyasını çıxarasınız deyə, ərməğanlarından ruzi axtarmağınız üçün və

sizə verilən nemətlərin qarşılığını ödəməyiniz üçün dənizi sizin əmrinizə verəndir. *–Gəmilərin dənizdə suyu yararaq getdiklərini görürsən.–*

**15,16** Və Allah sizə süfrə olması üçün yer üzünün içində sabit-sağlam dağlar, çaylar və siz yönəldiyiniz doğru yolu tapa biləsiniz deyə yollar və daha neçə əlamətlər buraxdı. Və onlar ulduzlarla / dəstə-dəstə Quran ayələriylə yollarını taparlar.

**17** Elə isə yaradan / Allah, yarada bilməyən uydurma ilahlar kimi ola bilərmi? Hələ də düşünməyəcəksiniz?

**18** Və əgər Allahın nemətlərini sayası olsanız, onları saya bilməzsiniz. Şübhəsiz ki, Allah qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və lütfü bol olandır, geniş mərhəmət sahibidir.

**19** Və Allah, gizlədiyinizi və açıqladığınızı bilir. (70/16, Nəhl / 1-19)

## Nəcm: 300

**20,21** Və onların, Allahın altındakılardan yalvardıqları şeylər hər hansı bir şey yaratmazlar, özləri yaradılmışdır, ölülərdir, diri deyillər. Nə zaman diriləcəklərini də tam bilə-bilməzlər.

**22** Sizin ilahınız tək olan ilahdır. Artıq, axirətə inanmayan bu kimsələr; onların qəlbləri, (Allahı) tanıtmamağa çalışmaqdadır və onlar, özlərinin böyük olduğuna inanan kimsələrdir.

**23** Heç şübhə yoxdur ki, Allah onların gizlədiklərini və aşkar etdiklərini bilir. Şübhəsiz ki, Allah, özlərinin böyük olduğuna inananları sevməz.

**24,25** Və onlara: “Rəbbiniz nə nazil etmişdi?” deyildiyi zaman, onlar, qiyamət günü öz günahlarını tam olaraq yüklənmək və nadanlıqları üzündən azdırdıqları kimsələrin günahlarından bir qismini də yüklənmələri üçün: “Əvvəlkilərin əfsanələri” dedilər. Diqqət edin, yükləndikləri şey necə də pisdir!

**26** Şübhəsiz ki, onlardan əvvəlki kimsələr tələ qurdular, Allah da onların divarlarına bünövrəsindən vurdu. Sonra da tavan başlarına çökdü. Və onlara əzab, ağıllarına gətirə bilmədikləri bir yöndən gəldi.

**27** Sonra qiyamət günü Allah onları rəzil-rüsvay edəcək və: “Bir vaxt uğrunda düşmənçilik etdiyiniz ortaqlarım haradadır?” deyəcəkdir. Özlərinə bilik verilmiş olan kimsələr: “Şübhəsiz ki, bu gün rəzillik-rüsvaylıq və pislik kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] üzərinədir.” deyəcəklər. (70/16, Nəhl / 20-27)

## Nəcm: 301

28 Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr özlərinə haqsızlıq etmiş kimsələr olaraq, mələklərin, keçmişdə etdiklərini və etmələri lazım gəldiyi halda etmədiklərini bir-bir xatırlatdırdıqları kimsələrdir. Artıq, tabeçilik göstərərək: “Biz, heç bir pislik etmirdik” (deyərlər). Əksinə, şübhəsiz Allah, sizin etdiklərinizi çox yaxşı biləndir.

29 “O halda içində daimi qalanlar olaraq cəhənnəmin qapılarına girin!” deyilər. Bax, təkəbbürlülərin yeri necə də pisdir!

30-32 Və Allahın mühafizəsi altına daxil olan kimsələrə: “Rəbbiniz nə nazil etmişdi?” deyilincə, onlar: “Xeyir [yaxşılıq]” deyərlər. Bu dünyada gözəl-yaxşı əməl işləyənlərə yaxşılıq-gözəllik vardır. Axirət yurdu isə həqiqətən daha xeyirlidir. Və Allahın mühafizəsi altına daxil olan kimsələrin yurdu; Ədn cənnətləri nə gözəldir! Onlar oraya girəcəklər. Onun altından çaylar axar. Orada onlar üçün istədikləri şeylər vardır. Allah, Özünün mühafizəsi altına daxil olan kəslərə bax belə qarşılıq verər. Allahın müdafiəsi altına daxil olan kəslər o kimsələrdir ki, mələklər onları xoş (qarşılayıb) rahat qəbul edərək, onlara keçmişdə etdiklərini və etmələri lazım olduğu halda etmədiklərini bir-bir xatırlatdırarlar. “Sizə salam olsun, etmiş olduğunuz işlərin qarşılığı olaraq girin cənnətə!” deyərlər.

(70/16, Nəhl / 28-32)

## Nəcm: 302

33,34 Onlar özlərinə, təbiət güclərinin gəlməsindən və ya Rəbbinin əmrinin gəlməsindən başqa bir şeymi gözləyirlər?! Onlardan öncəkilər də belə etmişdilər. Və Allah onlara haqsızlıq etmədi, fəqət onlar şirk qoşaraq özlərinə haqsızlıq etmişdilər, səhv; öz zərərlərinə olan əməli işləmişdilər. Bunun üçün, etdiklərinin cəzası nəhayət özlərinə yetişdi. İstehza etdikləri şey də özlərini bürüdü.

35 Və Allaha ortaq qoşan bu kimsələr: “Allah istəsəydi, biz və atalarımız Onun altındakılardan heç bir şeyə ibadət etməzdik və Onun altındakılardan heç bir şeyi haram etməzdik / müqəddəs qəbul etməzdik” dedilər. Özlərindən əvvəlki kimsələr belə etdilər. Bax, Elçilər üzərində, ancaq açıq-aydın bir təbliğdən başqa nə olur?

36 Və and olsun ki, Biz hər ümmətə: “Allaha qulluq edin və tağutdan[292] çəkinin” deyə bir elçi göndərdik. Artıq, Allah bu ümmətlərdən bir qisminə doğru yolu göstərdi, bir qisminə də azğınlıq haqq olmuşdur. İndi yer üzündə bir gəzib-dolaşın və baxın görün yalanlayanların aqibəti necə olmuşdur?

**37** Sən, onların doğru yolda olmalarını həddən artıq istəsən də, artıq, Allah azdırdığı kimsəni doğru yola yönəltməz. Onlar üçün heç bir yardımçı da yoxdur.

**38,39** Və kafirlər, "Allah, ölən kimsəni diriltməz!" deyə ən güclü andlarıyla Allaha and içdilər. Xeyr, Allah ölüləri, üzərinə aldığı gerçək bir vəd olaraq dirildəcəkdir ki, onların, haqqında ixtilafa düşdükləri şeyi onlar üçün ortaya qoysun və gerçəkləri ört-basdır edən kimsələrin yalançı olduqlarını bildirsin. Amma insanların çoxu bilmir.

**40** Biz bir şeyi istədiyimiz zaman, Bizim ona sözümüz sadəcə "Ol!" deməmizdir. O da dərhal olar. (70/16, Nəhl / 33-40)

## Nəcm: 303

**41,42** Və haqsızlığa məruz qaldıqdan sonra Allah yolunda hicrət edən kəslər, həqiqətən, Biz onları, səbr edən və işin nəticəsini sadəcə Rəblərinə həvalə edən bu kimsələri bu dünyada gözəl bir şəkildə yerləşdirəcəyik. O birinin / axirətin muzdu isə daha böyükdür. Kaş ki, biləydilər!

**43,44** Və Biz səndən öncə də, sadəcə özlərinə vəhy etdiyimiz yetkin insanları açıq dəlillərlə və yazılı sənədlərlə elçi olaraq göndərdik. Əgər bilmirsinizsə, buyurun Tövrat və İncili bilən alimlərdən soruşun. Biz sənə də o öyüdü / Quranı, onlara endirilmiş olanı ortaya çıxarasan deyə, onların da yaxşı-yaxşı düşünmələri üçün nazil etdik.

**45-47** Bəs, hiyləgərcə pislikləri planlayanlar; Allahın onları yerə batırmayacağından, yaxud bilməyəcəkləri bir yerdən əzabın gəlməyəcəyindən, yaxud onlar gəzib-dolanarkən Allahın onları yaxalamasından *–üstəlik, onlar aciz qoya bilənlər də deyillər–* yaxud da onları tədriclə / qorxu içində yaxalamasından əminmi oldular? Bax, şübhəsiz, sizin Rəbbiniz, həqiqətən çox şəfqətlidir, çox mərhəmətlidir.

**48** Onlar, kölgələri Allaha boyun əyərək, kiçilərək sağdan sola dönən, Allahın yaratdığı bəzi şeyləri görmədilərmi / bunları heç düşünmədilərmi?

**49,50** Və göylərdə və yer üzündə olan canlılar və təbiət qüvvələri, təkəbbür göstərmədən Allaha boyun əyərlər. Özlərinin üstündəki Rəblərindən qorxarlar və əmr olunduqları şeyləri edərlər.

(70/16, Nəhl / 41-50)

## Nəcm: 304

**51** Və Allah buyurdu: "İki ilah qəbul etməyin. O, ancaq tək olan ilahdır. O halda, yalnız Məndən qorxun / yalnız Mənə qulluq edin

[yalnız Mənə qarşı adam olun].”

**52** Göylərdə və yer üzündə olan şeylər də yalnız Onundur. Din də daima Onundur. Belə olduğu halda, siz özünüzü Allahdan başqasının mühafizəsi altınamı daxil edirsiniz?

**53** Və yaxşılıq adına sahib olduğunuz nə varsa, Allahdandır. Sonra sizə bir zərər toxunduğu zaman, dərhal yalnız Ona sığınırsınız.

**54,55** Sonra, zərəri sizdən dəf edincə, sizdən bir qrup küfr işləmək; özlərinə verdiklərimizi ört-basdır etmək / verdiklərimizə nankorluq etmək üçün Rəblərinə ortaq qoşarlar. *–Haydı, indi bəhrələnin! Fəqət yaxında biləcəksiniz.–*

**56** Və ortaq qoşanlar, özlərinə ruzi olaraq verdiyimiz şeylərdən bilmədikləri şeylərə pay ayırırlar. *–Allaha and olsun ki, siz uydurduğunuz bu şeylərdən həqiqətən sorğu-sual olunacaqsınız.–*

**57** Və onlar Allaha qızlar isnad edirlər. *–Allah, bundan pakdır.–* Özləri üçün də iştahlandıqları (istədikləri) oğlan uşaqlarıdır.

**58** Və onlardan biri qız doğum xəbəri ilə müjdələndiyi zaman, içi qəzəblə dolaraq üzü qapqara qaralar.

**59** Ona verilən xəbərin / müjdənin pisliyinə görə tayfasından gizlənər; alçaqlıq və hörmətsizliyə rəğmən qızı yanındamı saxlasın, yoxsa torpağamı basdırsın?! Diqqət edin, onların verdikləri hökm / adətləri necə də pisdir!

**62** Və bəyənmədiklərini Allah üçün ayırırlar. Və dilləri, ən gözəlin özlərinə aid olduğunu, yalan yerə söyləyir. Heç şübhəsiz ki, onlar üçün ancaq atəş vardır və onlar, öndən itələnəcəklər.

**60** Axirətə iman etməyən kimsələr üçün pisliyin eynisi var. Ən uca örnək isə, Allahındır. O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

**61** Və əgər Allah, səhv işləri səbəbiylə insanları sorğulayıb cəzalandırsaydı, yer üzündə irili-xırdalı bütün canlılardan heç bir şey buraxmazdı. Lakin onları müəyyən bir müddətə qədər təxirə salar. Artıq, onlara verilən müddətin sonu gəlincə də, nə bir saat yubana bilərlər, nə də önə keçə bilərlər.

**63** Allaha and olsun ki, Biz həqiqətən səndən öncə bəzi ümmətlərə elçilər göndərdik, ancaq şeytan onlara əməllərini bəzəyib gözəl göstərdi. Bax o şeytan, bu gün onların qoruyan (himayə edən), yol göstərən yaxınıdır. Və onlar üçün acı bir əzab vardır.

**64** Və Biz, sənə Quranı, sırf haqqında anlaşmazlığa düşdükləri şeyləri onlar üçün aşkara çıxarasan deyə və iman edəcək bir camaata bir yol

göstərən, bir rəhmət olaraq nazil etdik. (70/16, Nəhl / 51-59, 62, 60-61, 63-64)

## Nəcm: 305

65 Və Allah göydən bir su endirdi və onunla yer üzünü ölümündən sonra diriltdi. Şübhəsiz ki, bunda dinləyən bir camaat üçün həqiqətən bir əlamət / işarət var.

66 Şübhəsiz ki, sizin üçün keçi, qoyun, dəvə, inəkdə də bir ibrət var. Biz, sizə onların qarnındakı nəcis ilə qan arasındakı şeylərdən, içənlərin boğazından asanlıqla keçən xalis süd içirdirik.

67 Və xurma ağaclarının meyvələrindən və üzümlərdən *–ki, siz ondan içki və gözəl ruzi əldə edirsiniz–* sizə içirdirik. Şübhəsiz ki, bunda ağlını işlədən bir camaat üçün həqiqətən bir əlamət / işarət / var.

68,69 Və Rəbbin bal arısına dağlarda, ağaclarda və qurulacaq çardaqlarda evlər / yuvalar düzəltməsini, sonra ‘Meyvələrin hamısından ye və Rəbbinin asanlaşdırdığı yollara gir’ deyə vəhy etdi. Onların qarınlarından rəngləri müxtəlif olan bir içki çıxar ki, onda insanlar üçün şəfa vardır. Şübhəsiz ki, bunda yaxşı-yaxşı düşünən bir camaat üçün, həqiqətən bir əlamət / işarət var.

70 Və sizi Allah yaratdı, sonra da sizi vəfat[293] etdirəcəkdir; sizə keçmişdə etdiklərinizi və etməniz lazım olduğu halda etmədiklərinizi bir-bir xatırlatdıracaq. İçinizdən bəziləri də, bildikdən sonra heç bir şey bilməsin deyə, ömrün ən pis zamanına çatdırılar. Şübhəsiz ki, Allah çox bilikli və çox qüdrətlidir.

71 Və Allah ruzi baxımından birinizi digərinizdən üstün etmişdir. Özlərinə üstünlük verilənlər, öz ruzilərini; yeyib-içməklərini, sərvətlərini, əhdnamələrlə himayələrindəki kimsələrə,[294] hamısının ruzisi bərabər olmaq üzrə verməzlər. O halda, bunlar Allahın nemətini bilərək ört-basdırmı edirlər?

72 Və Allah sizin üçün özünüzdən zövcələr yaratdı, o zövcələrinizdən də oğullar və nəvələr verdi. Sizə xoş, gözəl, faydalı şeylərdən də ruzilər verdi. İndi onlar batilə inanırlar və Allahın nemətini ört-basdırmı edirlər?

73 Və onlar, Allahın altındakılardan, göylərdən və yer üzündən özləri üçün ruzi olaraq heç bir şeyə malik olmayan və qadir olmayan şeylərə ibadət edirlər.

74 Artıq, Allah üçün örnəklər gətirməyin. Şübhəsiz ki, Allah bilir, siz bilməzsiniz.

75 Allah, heç bir şeyə gücü çatmayan və başqasının malı olmuş bir qul ilə Bizim özünə gözəl bir ruzi verib və ondan gizli və açıq olaraq Allah

yolunda xərcləyən / yaxınlarının nəfəqələrini (ehtiyacını) təmin edən bir kimsəni örnək verdi: Bunlar eyni ola bilərlərmi? *–Bütün təriflər Allaha məxsusdur; başqasını tərifləmək olmaz.–* Əksinə, insanların çoxu bilməz.

**76** Allah iki adamı da örnəkləşdirdi: Bunlardan biri dilsizdir, heç bir şeyə gücü çatmaz; qoruyucusuna (himayəçisinə) bir yükdür. Onu haraya göndərsə, bir xeyir gətirə bilməz. İndi, bu adamla, ədalətlə əmr edən və doğru yolda olan adam eyni ola bilərmi? (70/16, Nəhl / 65-76)

## Nəcm: 306

**77** Və göylərin və yerin görünməyəni, eşidilməyəni, hiss edilməyəni sadəcə Allaha aiddir. Qiyamətin qoparılması da yalnızca göz açıb-bağlamaq kimidir və ya o, daha yaxındır. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.

**78** Və Allah sizi analarınızın bətnlərindən heç bir şey bilmədiyiniz halda çıxartdı və sahib olduğunuz nemətlərin qarşılığını ödəyəsiniz deyə eşitmə, görmə duyğularını və könüllər verdi.

**79** Göy boşluğunda, bir əmrə boyun əydirilən quşlara / buludlara baxmadılarmı? Onları Allahdan başqası saxlamır. Bunda, inanan bir camaat üçün əlbəttə ki, əlamətlər / işarətlər vardır.

**80** Və Allah evlərinizi sizə bir dinclik və istirahət yeri etdi. Və heyvanların dərilərindən səfər vaxtı və mənzil tutub istirahət etdiyiniz evlərdə, (heyvanların) yunlarından, (yaz aylarında qırxılan qoyunun) yunlarından və tüklərindən müəyyən vaxta qədər döşəmə əşyası və qazanc təmin etdi.

**81** Və Allah, yaratdıqlarından sizin üçün kölgələr düzəltdi və sizin üçün dağlardan sığınacaqlar düzəltdi. Sizi istidən-soyuqdan qoruyacaq libaslar və sizi öz qəzəbinizdən qoruyan geyimlər var etdi. Bax beləcə, Allah, müsəlman olasınız deyə üzərinizə nemətini tamamlamaqdadır.

**82** Buna baxmayaraq, əgər üz çevirərlərsə, artıq sənə düşən sadəcə açıq-aşkar bir təbliğdir.

**83** Onlar, Allahın nemətini bilirlər, sonra onu tanınmaz hala gətirirlər. Onların çoxu kafirlərdir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrdir]. (70/16, Nəhl / 77-83)

## Nəcm: 307

**84** Və hər ümmətdən bir şahid gətirəcəyimiz gün, artıq, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] icazə verilməz. Onlardan üzr diləmələri də istənilməz.

**85** Və o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələr, əzabı gördükləri zaman, artıq, onlardan (əzab) yüngülləşdirilməz və onlara vaxt (möhlət) verilməz.

**86** Və ortaq qoşan o kimsələr, ortaq qoşduqları şeyləri gördükləri zaman: "Rəbbimiz! Bax bunlar, Sənin altındakılardan bizim özlərinə yalvardığımız ortaqlarımız olan kimsələrdir" dedilər. Qoşduqları ortaqlar da dərhal onlara, "Şübhəsiz ki, siz həqiqətən yalançılarsınız" deyə söz atdılar.

**87** Və onlar, o gün, Allaha təslim oldular. Uydurmuş olduqları şeylər də onlardan uzaqlaşıb getdi.

**88** Küfr işləyən; Allahın ilah və rəbb olduğunu bilərək rədd edən və Allah yolundan çevirən bu kimsələr, Biz törətdikləri fəsad səbəbiylə onlara əzab üstündən əzab artırdıq.

**89** Və Biz o gün, hər ümmətin içində, özlərindən öz əleyhlərinə bir şahid göndərəcəyik. Səni də onların üzərinə şahid gətirəcəyik. Biz bu kitabı da, hər şeyi açıqlayan və müsəlmanlara bir yol göstərən, bir rəhmət və bir müjdə olaraq sənə nazil etdik. (70/16, Nəhl / 84-89)

## Nəcm: 308

**90** Şübhəsiz, Allah, ədaləti, yaxşı-gözəl əməl işləməyi və yaxınlara verməyi əmr edir; həyasızlığı, pis işləri və azğınlığı nəhy (qadağan) edir. O, düşünüb öyüd alarsınız deyə sizə öyüd verir.

**91** Və əhdnamə bağladığınızda Allahın əhdini / Allaha verdiyiniz sözləri yerinə yetirin. Andlarınızı / əhdnamələrinizi sağlam etdikdən və Allahı özünüzə qəti olaraq zamin etdikdən sonra da onları pozmayın. Şübhəsiz ki, Allah işlədiyiniz şeyləri bilir.

**92** Bir ümmət, digər bir ümmətdən daha çoxdur deyə, andlarınızı aranızda aldatma vasitəsi edərək, ipliyini sağlam olaraq əyirdikdən sonra, onu söküb pozan qadın[295] kimi də olmayın. Şübhəsiz ki, Allah sizi bununla sınayır. Haqqında anlaşmazlığa düşdüyünüz şeyləri qiyamət günü sizə mütləq açıqlayacaqdır.

**93** Və Allah istəsəydi, əlbəttə, hamınızı vahid bir ümmət edərdi. Fəqət Allah istədiyini azdırar və istədiyinə də doğru yolu göstərər/ istəyəni azdırar, istəyənə də doğru yolu göstərər. Və şübhəsiz ki, siz, bütün etdiklərinizdən sorğu-sual olunacaqsınız / məsuliyyətli tutulacaqsınız.

**94** Və andlarınızı aranızda aldatma və fəsada / anarxiyaya vasitə etməyin. Sonra ayaq sağlam basdıqdan sonra sürüşər və Allah yolundan azdığınız üçün pisliyi dadarsınız. Böyük əzab da sizin üçündür.

**95** Və Allahın əhdini / Allaha verilən sözləri az bir dəyər qarşılığında satmayın. Əgər bilirsinizsə həqiqətən Allah qatında olan; o, sizin üçün daha xeyirlidir.

**96** Sizin yanınızda olan tükənər, Allahın qatında olan isə qalıcıdır. Və Biz həqiqətən səbr edənlərə mükafatlarını, etdiklərinin daha gözəli olaraq qarşılıq verəcəyik.

**97** Kişi-qadın, mömin olaraq kim yaxşı əməl işləyərsə, həqiqətən onu gözəl bir həyat ilə yaşadarıq. Və həqiqətən onların muzdlarını, işlədikləri əməllərin daha gözəli ilə mükafatlandıracağıq.

**98** Elə isə, Quran öyrənib-öyrətdiyin zaman Rəcim Şeytandan; [ağlınıza dərhal gələn, yaxşı-yaxşı düşünmə (götür-qoy etməyin) nəticəsi olmayan, sizi məhv edəcək əsassız düşüncələr yaradan zehin qabiliyyətindən] Allaha sığın / sığındığına inan.

**99,100** Şübhəsiz ki, iman edən və işin nəticəsini Rəbbinə həvalə edən kimsələr üzərində Şeytani Rəcimin heç bir məcburedici gücü yoxdur. Onun məcburedici gücü, ancaq onu (özünə) yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxın qəbul edənlər və Allaha ortaq qoşan kimsələrin üzərindədir. (70/16, Nəhl / 90-100)

## Nəcm: 309

**101** Və Biz bir ayə yerinə başqa bir ayə gətirdiyimiz zaman *–Allah nə nazil etdiyini daha yaxşı bilməsinə rəğmən–* onlar, "Sən, ancaq bir uyduransan" dedilər. İşin doğrusu, onların çoxu bilmir.

**102** De ki: "Allah, onu; nazil etdiyini, Rəbbindən ruhülqüds; "Cəmiyyəti canlandıran Allah prinsipi" olaraq, iman etmiş kimsələri gücləndirib kökləşdirmək / tutunmaları üçün və müsəlmanlara bir müjdə və yol göstərən olmaq üzrə, haqq ilə nazil etmişdir.

**103** Və həqiqətən Biz bilirik ki, onlar "Sadəcə, ona bir bəşər öyrədir" deyirlər. Peyğəmbərə öyrətdiyini zənn etdikləri adamın dili başqadır. Quran isə açıq-aşkar bir ərəbcədir.

**104** Şübhəsiz, Allahın ayələrinə iman etməyən kimsələr; Allah onlara yol göstərməz və onlar üçün çox acı bir əzab vardır.

**105** Yalanı, yalnızca Allahın ayələrinə inanmayan kimsələr uydurar. Və bax onlar, yalançıların məhz özüdür.

**106** Hər kim iman etdikdən sonra küfr edər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edər], *–qəlbi imanla sakit olduğu (rahatlıq tapdığı) halda, təzyiqlə məcbur edilən kəs istisna olmaqla–* və sinəsini küfrə; inanmamağa açarsa, artıq, onların üzərinə Allahdan bir qəzəb var. Bunlar üçün böyük bir əzab da var.

**107** Bu, onların dünya həyatını axirətə görə daha sevimli (cazibədar) görmələrindən və şübhəsiz Allahın da kafirlər dəstəsinə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən dəstəyə] doğru yolu göstərməməsi səbəbiylədir.

**108** Onlar, qəlbləri, qulaqları və gözləri Allah tərəfindən möhürlənən / damğalanan kimsələrdir. Onlar, maraqsız, biliksiz və duyğusuz olanların məhz özləridir.

**109** Məhz onların axirətdə ziyana uğrayanlardan olmasına dair şübhə deyə bir şey yoxdur. (70/16, Nəhl / 101-109)

## Nəcm: 310

**110** Sonra şübhəsiz, sənin Rəbbin, (özünə) əziyyət edildikdən sonra hicrət edən, sonra səy göstərən və səbr edən kimsələr üçündür. Şübhəsiz ki, sənin Rəbbin bundan sonra həqiqətən çox bağışlayandır, çox mərhəmətlidir.

**111** O gün, hər kəs öz nəfsinin hayında olaraq gələcək və hər kəs etdiyi şeylərin (qarşılığını) tam olaraq alacaq. Və onlar haqsızlığa məruz qalmayacaq. (70/16, Nəhl / 110-111)

## Nəcm: 311

**112** Və Allah bir şəhəri[296] misal çəkdi: Bu şəhər, təhlükəsiz, dinc idi və oraya hər bir yerdən bol-bol ruzi gəlirdi. Lakin onlar Allahın nemətlərinə qarşı nankorluq etdilər. Allah da onlara etdikləri şeylər üzündən aclıq və qorxu libasını geydirdi / aclıq və qorxu fəlakətini daddırdı.

**113** Və and olsun ki, onlara öz içlərindən bir elçi gəlmişdi, ancaq onu yalan saymışdılar. Belə olduqda, onlar şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işlərkən, əzab onları yaxaladı. (70/16, Nəhl / 112-113)

## Nəcm: 312

**114** Artıq, Allahın sizə ruzi olaraq verdiyi şeylərdən halal və təmiz olaraq yeyin. Allahın nemətinin qarşılığını ödəyin; əgər sadəcə Ona qulluq edəcəksinizsə.

**115** Allah, sizə ancaq leşi, qanı, donuzun ətini və Allahdan başqası adına kəsilənləri haram etdi. Artıq hər kim hücum etmədən və həddi aşmadan məcburiyyət qarşısında qalarsa, bilsin ki, şübhəsiz, Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.

**116** Və öz dillərinizin yalan danışmasıyla Allaha (qarşı) yalan uydurmaq üçün, “Bu halaldır, bu haramdır!” deməyin. Şübhəsiz ki, Allaha (qarşı) yalan uyduran kimsələr nicat tapmazlar.

**117** Onların dünya mənfəəti çox az bir qazancdır. Və onlar üçün çox şiddətli bir əzab vardır.

**118** Biz sənə anlatdıqlarımızı [leşi, qanı, donuzun ətini], daha öncə yəhudilərə də haram etmişdik. Və Biz onlara haqsızlıq etmədik. Amma onlar şirk qoşaraq özlərinə haqsızlıq edirdilər. (70/16, Nəhl / 114-118)

## Nəcm: 313

**119** Sonra şübhəsiz, sənin Rəbbin, bir cahilliklə günah işləyən, sonra bunun ardınca tövbə edən və düzəldən kimsələr üçündür. Şübhəsiz ki, sənin Rəbbin bundan sonra həqiqətən çox bağışlayan və çox mərhəmət edəndir.

**120,121** Şübhəsiz, İbrahim səmimiyyətlə Allaha boyun əyən, ortaq qoşma inancından dönmüş, Allahın nemətlərinə qarşılıq ödəyən tək başına bir ümmət idi. Və o, ortaq qoşanlardan olmadı. Və Allah, onu seçdi və ən doğru yola yönəltdi.

**122** Və Biz İbrahimə dünyada yaxşılıq-gözəllik verdik. Və şübhəsiz ki, o, axirətdə də həqiqətən salehlərdəndir.

**123** Sonra sənə: “Küfrdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməkdən], ortaq qoşmaqdan dönmüş bir adam olan və ortaq qoşanlardan olmayan İbrahimin dininə / həyat tərzinə tabe ol” deyə vəhy etdik. (70/16, Nəhl / 119-123)

## Nəcm: 314

**124** Səbt; düşünüb-daşınma günü,[297] ancaq, səbt / düşünüb-daşınma günü mövzusunda anlaşmazlığa (ixtilafa) düşən kimsələr üzərinə edildi (qərarlaşdırıldı). Və şübhəsiz ki, sənin Rəbbin, onların (öz) içlərində anlaşmazlığa düşdükləri şeylər haqqında qiyamət günü (onların) arasında həqiqətən hökm verəcəkdir. (70/16, Nəhl / 124)

## Nəcm: 315

**125** Rabbinin yoluna, haqsızlığı, fəsadı və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qanun, düstur və qaydalarla, gözəl öyüdlə çağır! Və onlarla ən gözəl şəkildə mücadilə et. Şübhəsiz ki, Rəbbin Öz yolundan azanları ən yaxşı biləndir və O, yönəldikləri doğru yolda olanları da ən yaxşı biləndir. (70/16, Nəhl / 125)

**Nəcm: 316**

**126** Və əgər cəza verəcək olsanız da, sizin cəzalandırıldığınızın misli ilə (eynisi ilə) cəza verin. Və əgər səbr edərsinizsə, əlbəttə o, səbr edənlər üçün daha xeyirlidir.

**127** Sən səbrli ol! Sənin səbr etməyin də ancaq Allah ilədir. Onlar üçün üzülmə! Onların qurduqları hiylələrdən sıxıntıya düşmə!

**128** Şübhəsiz ki, Allah, Özünün mühafizəsi altına daxil olan kəslərin və yaxşılaşdıran-gözəlləşdirən (işlər görən) kəslərin məhz özləri ilə birlikdədir. (70/16, Nəhl / 126-128)

## NUH (71 – 71) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 317**

**1** Şübhəsiz, Biz, onlara çox şiddətli bir əzab gəlməmişdən öncə qövmünü xəbərdar et, deyə Nuhu öz qövmünə elçi göndərdik.

**2-4** Nuh dedi ki: "Ey qövmüm! Şübhəsiz ki, mən sizin üçün açıq-aşkar xəbərdarlıq edən biriyəm. Allaha qulluq edin, Onun mühafizəsi altına daxil olun və mənə itaət edin ki, günahlarınızı bağışlasın və sizə müəyyən bir müddətin sonuna qədər möhlət versin. Şübhəsiz ki, Allahın nizamladığı / müəyyən etdiyi vaxtın sonu gəlincə, təxirə salınmaz. Əgər bilsəydiniz."

**5-12** Nuh dedi ki: *"Rəbbim! Şübhəsiz ki, mən, öz qövmümü gecə-gündüz / davamlı olaraq dəvət etdim. Fəqət mənim dəvətim, onların sadəcə qaçmalarını artırdı. Və şübhəsiz ki, mən onları, Sənin onları bağışlamağın üçün hər dəfə dəvət edəndə, onlar barmaqlarını qulaqlarına tıxadılar, libaslarına büründülər, inadkarlıq etdilər və təkəbbürləndikcə də təkəbbürləndilər. Sonra şübhəsiz mən onları yüksək səslə çağırdım. Sonra şübhəsiz, onlar üçün elan etdim. Onlar üçün gizli-gizli də söylədim. Sonra dedim ki: Rəbbinizin sizi bağışlamasını istəyin. Həqiqətən O, çox bağışlayandır. Üzərinizə göydən bol yağmur yağdırsın. Sizə mallar və oğullar ilə yardım göstərsin, sizin üçün bağçalar yaratsın, çaylar yaratsın.* **13** *Sizə nə olur ki, Allah üçün "ağır davranış"ı gözləmirsiniz? (Allahın əzəmətindən çəkinmirsiniz?)*

**14** *Halbuki O, sizi həqiqətən müxtəlif cür / mərhələ-mərhələ* yaratmışdır. **15,16** *Allahın yeddi göyü təbəqələr halında / ahənkli bir şəkildə necə* yaratdığını *və ayı onların içində bir işıq etdiyini, günəşi də bir lampa (çıraq) etdiyini görmədinizmi?* **17** *Və Allah, sizi yer üzündən bir bitki olaraq bitirdi.* **18** *Sonra sizi oraya geri çevirəcək və sizi bir çıxışla çıxaracaq.* **19,20** *Və Allah sizin üçün yer üzünü, yer üzünün geniş yollarında gəzəsiniz deyə döşəmişdir*."

**21-24** Nuh: "Rəbbim! Şübhəsiz ki, qövmüm mənə üsyan etdi. Malı və övladı özünə zərərdən başqa bir şey verməyən kimsəyə tabe oldular. Və onlar böyük hiylələr qurdular. Və 'Əsla ilahlarınızı tərk etməyin. Və əsla Vədd, Suva, Yağus, Yəuq və Nəsri[298] buraxmayın' dedilər. Həqiqətən bir çoxlarını da azdırdılar. Sən də o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin sadəcə azğınlığını artır" dedi.
**26-28** Və Nuh dedi ki: "Bu yerdə gəzən kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərdən] bir nəfəri belə buraxma. Şübhəsiz ki, Sən onları buraxsan (saxlasan), onlar Sənin qullarını yoldan çıxararlar və sadəcə din-iman tanımayıb pisliyə batan və kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] uşaqlar doğarlar. Rəbbim! Mənim üçün, ana-atam üçün, mömin olaraq evimə girən kəslər üçün və mömin kişilər və mömin qadınlar üçün məğfirət et / hamımızı bağışla! Şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün də sadəcə yox olmağı (həlak olmağı) artır."
**25** Onlar, xətalarına görə suda boğuldular, sonra da atəşə soxuldular. Sonra da özləri üçün Allahın altındakılardan yardımçılar tapa bilmədilər.[299] (71/71, Nuh / 1-24, 26-28, 25)

## İBRAHİM (72 – 14) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 318**
**1-3** Əlif / 1, Lam / 30, Ra / 200.[300] Bu Bizim, insanları Rəblərinin izni / biliyi (məlumatı) ilə qaranlıqlardan aydınlığa; *ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, tərifլənənin, tərifə layiq olanın; göylərdə olan şeylər, yer üzündə olan şeylər Özünün olan Allahın yoluna* çıxartmağın üçün sənə nazil etdiyimiz bir kitabdır. Və dünya həyatını axirətdən üstün tutan, Allahın yolundan çevirən və onun əyriliyini istəyən kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrin], şiddətli bir əzaba görə vay halına! Bax bunlar, çox uzaq bir azğınlıq içindədirlər.
**4** Və Biz onlara, (Allahın əmrlərini) açıqca ortaya qoysun deyə, hər bir peyğəmbəri yalnız öz qövmünün dilində göndərdik. Artıq, Allah dilədiyini / diləyəni azdırar, dilədiyini / diləyəni də doğru yola yönəldər. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**5** Və and olsun ki Musanı, "Qövmünü qaranlıqlardan aydınlığa çıxart, onlara Allahın günləri ilə öyüd ver" deyə ayələrimizlə elçi göndərdik. Şübhə yox ki, bunda, çox səbr edən və özünə verilən nemətlərin qarşılığını çox-çox ödəyən hər kəs üçün neçə-neçə əlamətlər / işarətlər

vardır.
6,7 Və bir vaxt Musa qövmünə demişdi ki: “Allahın üzərinizdəki
nemətini xatırlayın; o vaxt O, sizə ən pis işgəncələr edən, oğullarınızı
boğan; təhsilsiz, tərbiyəsiz, [peşəsiz] buraxaraq [bacarıqsız (qara) bir
kütləyə çevirərək] gücsüzləşdirən və qadınlarınızı sağ buraxan [utanca
boğan] Firon ailəsindən qurtardı. Və bax bunda, Rəbbiniz tərəfindən
sizə çox böyük yıpranaraq bir sınaq [vermək] vardır. Və o vaxt
Rəbbiniz elan etmişdi: “And olsun ki, sahib olduğunuz nemətlərin
qarşılığını ödəsəniz, əlbəttə sizə artıraram, əgər nankorluq etsəniz,
şübhəsiz ki, Mənim əzabım çox çətindir (şiddətlidir).”
8 Yenə Musa dedi ki: “Əgər siz və yer üzündəki kimsələr, toplu halda
hamınız küfr işləsəniz [Allahın ilah və rəbb olduğunu bilərək rədd
etsəniz / nankorluq etsəniz], yaxşı bilin ki, Allah həqiqətən çox zəngin,
heç bir şeyə möhtac olmayandır, təriflənən, tərifə layiq olandır.”
9 Sizdən öncəkilərin; Nuh qövmünün, Ad, Səmud və onlardan sonra
gələnlərin xəbərləri sizə gəlmədimi? Onları Allahdan başqası bilməz.
Elçiləri onlara açıq-aşkar dəlillərlə gəldi, onlar isə əllərini, elçilərin
ağızlarına apardılar. Və: “Biz sizinlə göndərilən şeyi bilərək rədd
etdik / inanmadıq və şübhəsiz biz, bizi dəvət etdiyiniz şey haqqında
yetərsiz bilik (məlumat) sahibiyik və şəkk-şübhə içindəyik” dedilər.
10 Elçiləri dedi ki: “Göyləri və yeri yoxdan yaradan, sizi günahlarınızı
bağışlamaq üçün çağıran və müəyyən edilmiş bir vaxtın sonuna qədər
sizi təxirə salan (möhlət verən) Allah haqqında yetərsiz bilikmi
(məlumatmı) var?” Onlar: “Siz sadəcə bizim kimi bir bəşərsiniz, bizi
atalarımızın ibadət etdiklərindən saxlamaq istəyirsiniz. O halda, bizə
açıq-aşkar bir dəlil gətirin!” dedilər.
11,12 Elçiləri onlara dedilər ki: “Biz, ancaq sizin kimi bir bəşərik.
Lakin Allah, qullarından dilədiyinə nemət verir. Və Allahın izni / bili-
yi (məlumatı) olmadıqca bizim sizə bir dəlil gətirməyimiz mümkün
deyil. Onun üçün də iman edənlər işin nəticəsini sadəcə Allaha
tapşırsınlar. Və bizə yollarımızı göstərmişkən, nə üçün biz nəticəni
Allaha tapşırmayaq?! Və əlbəttə biz, bizə etdiyiniz əziyyətlərə səbr
edəcəyik. Nəticəni buraxanlar da yalnız Allaha nəticəni buraxsınlar.”
13,14 Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən
kimsələr], elçilərinə: “Ya sizi həqiqətən yurdumuzdan çıxaracağıq, ya
da siz mütləq bizim dinimizə / həyat tərzimizə dönəcəksiniz!” dedilər.
Rəbləri də elçilərinə: “Biz şirk qoşaraq səhv; öz zərərinə olan əməli
işləyənləri həqiqətən dəyişikliyə / məhvə məruz qoyacağıq və onlardan
sonra sizi mütləq o yerdə yerləşdirəcəyik. Bu, məqamımdan və
təhdidimdən qorxan üçündür” deyə vəhy etdi.
15-17 Elçilər, fəth istədilər. Bütün inadkar dikbaşlar da itkiyə, zərərə

məruz qalıb acı çəkdi. Ardınca cəhənnəm vardır. Və o, irinli su ilə sulanacaq. İrinli suyu qurtum-qurtum içəcək, uda bilməyəcək. Və hər tərəfdən ona ölüm gələcək, fəqət o heç ölməyəcək. Ardından da çox ağır bir əzab gələcəkdir.

**18** Kafirlərin [Rəblərini bilərək rədd edən / inanmayan kimsələrin] vəziyyəti, onların etdikləri eynilə fırtınalı bir gündə küləyin şiddətlə sovurduğu bir kül kimidir. Qazandıqlarından heç bir şeyi əldə tuta bilməzlər. Bax bu, uzaq azğınlığın məhz özüdür.

**19,20** Göyləri və yer üzünü Allahın gerçək (haqq) ilə yaratdığını görmədinmi / heç düşünmədinmi? O istəsə, sizi aparar və yeni bir xalq / yaradılış gətirər. Bu, Allaha görə çətin deyildir.

(72/14, İbrahim / 1-20)

## Nəcm: 319

**21** Onlar cəm halda Allah üçün ortaya çıxdılar. Sonra da zəif olan kəslər, təkəbbürlü kəslərə: "Şübhəsiz ki, bizlər, sizlərə tabe olan kimsələr idik. Yaxşı, indi siz, Allahın əzabından bir şeyi bizdən dəf edə bilərsinizmi?" dedilər. O təkəbbür göstərənlər: "Allah bizi doğru yola yönəltsəydi, biz həqiqətən sizə yol göstərici olardıq. Bizlər ağlayıb-sızlasaq və ya səbr etsək də bizim üçün eynidir. Bizim üçün qaçacaq hər hansısa bir yer yoxdur" dedilər.

**22** Və iş bitincə şeytan [İblis / zehin qabiliyyəti] onlara, "Şübhəsiz ki, Allah sizə gerçək vədi vəd etdi, mən də sizə vəd etdim, dərhal da xilaf çıxdım. Onsuz da mənim sizə qarşı heç bir məcburedici qüvvəm yox idi. Ancaq mən sizi çağırdım, siz də mənə qarşılıq verdiniz. O səbəblə məni qınamayın, öz-özünüzü qınayın! Mən sizi qurtara bilmərəm, siz də mənim qurtarıcım deyilsiniz! Şübhəsiz ki, mən öncədən məni Allaha ortaq qoşmağınızı da qəbul etməmişdim" dedi. *–Şübhəsiz, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün acı bir əzab vardır!* **23** *İman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyənlər də, Rəblərinin izni ilə / biliyi ilə (məlumatı daxilində), içində daimi qalmaq üzrə, altından çaylar axan cənnətlərə daxil edilərlər. Oradakı salamlaşma qarşılamaları, "Salam"dır. –* (72/14, İbrahim / 21-23)

## Nəcm: 320

**24,25** Görmədinmi / heç düşünmədinmi, Allah necə bir örnək verdi? Gözəl bir söz, kökü möhkəm, qol-budağı göydə olan, Rəbbinin izni ilə / biliyi ilə (məlumatı daxilində) hər an məhsul verən gözəl bir ağac kimidir. Və onlar öyüd alsınlar deyə, Allah insanlara bu cür örnəklər verir.

**26** Pis bir sözün durumu da, yerdən qoparılmış, sabit qalmaq imkanı

olmayan pis bir ağaca bənzəyər.
**27** Allah, iman edənləri, bəsit dünya həyatında və axirətdə sabit bir sözə / imana sabitləyər. Allah, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənləri da azdırar. Və Allah, dilədiyi şeyi edər.
**28,29** Allahın nemətlərini nankorluğa dəyişdirən və cəmiyyətlərini dəyişikliyə / məhvə məruz qalma yurduna / cəhənnəmə soxanları görmədinmi? Onlar cəhənnəmə girəcəklər. O, necə də pis bir qərargahdır!
**30** Və nankorlar, Onun yolundan azdırmaq üçün Allaha ortaqlar yaratdılar. De ki: "Faydalanın, artıq, şübhəsiz, dönüşünüz atəşədir." (72/14, İbrahim / 24-30)

## Nəcm: 321
**31** İman edən qullarıma söylə: Səlatı iqamə etsinlər [maddi və zehni baxımdan dəstək olsunlar; cəmiyyəti maarifləndirmə qurumlarını qursunlar-ayaqda tutsunlar] və alış-veriş və dostluğun olmayacağı bir günün gəlməsindən öncə, özlərinə ruzi olaraq verdiyimiz şeylərdən açıq və gizli olaraq Allah yolunda xərcləsinlər / yaxınlarının nəfəqələrini (ehtiyaclarını) təmin etsinlər."
**32-34** Allah, göyləri və yeri yaradan, göydən su endirib onunla sizin üçün ruzi olaraq müxtəlif meyvələr bitirəndir. Və Allah, əmrinə görə dənizdə üzüb getmələri üçün gəmiləri əmrinizə (ixtiyarınıza) verdi / sizin faydalanacağınız xüsusiyyətlərdə yaratdı, çayları da əmrinizə verdi. Davamlı olaraq dönüş halında olan günəşi və ayı da sizin əmrinizə verdi / onları da faydalanacağınız xüsusiyyətlərdə yaratdı. Gecəni və gündüzü də sizin əmrinizə verdi. Və O, Ondan istədiyiniz hər şeydən sizə verdi. Allahın nemətini saymaq istəsəniz də saya bilməzsiniz! Şübhəsiz ki, insan həqiqətən çox səhv; öz zərərinə olan əməli işləyən, çox nankor biridir.
**35-41** Və bir zaman İbrahim: "Rəbbim! Bu şəhəri güvənli (əmin-amanlıq yeri) et! Məni və oğullarımı bütlərə ibadət etməkdən uzaq et! Rəbbim! Şübhəsiz ki, bütlər insanlardan bir çoxunu azdırdılar. İndi kim mənə tabe olarsa (arxamca gələrsə), artıq o, şübhəsiz ki, məndəndir; kim mənə qarşı gələrsə... Artıq, Sən, şübhəsiz ki, çox bağışlayan və çox mərhəmət edənsən. Rəbbimiz! Şübhəsiz ki, mən övladlarımdan bir hissəsini səlat etmələri [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmə qurumlarını qurmaq-ayaqda tutmaları] üçün, Sənin Toxunulmaz evinin yanında, əkinsiz bir vadiyə yerləşdirdim. Rəbbimiz! Verdiyin nemətlərin qarşılığını ödəmələri üçün artıq Sən də insanlardan bir qisminin könüllərini onlara meyl etdir. Və onlara bəzi meyvələrdən ruzi ver. Rəbbimiz! Şübhəsiz ki,

Sən bizim gizlədiyimiz şeyləri və aşkar etdiyimiz şeyləri bilirsən. *–Və yerdə və göydə heç bir şey Allaha gizli qalmaz. – Bütün təriflər,* qocalıq çağımda mənə İsmail və İshaqı lütf edən Allahadır; başqasını təriflәmәk olmaz. Şübhəsiz ki, Rəbbim duamı çox yaxşı eşidəndir. Rəbbim! Məni səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olan; cəmiyyəti maarifləndirmə qurumlarını quran-ayaqda tutan] biri et! Soyumdan (gələnləri) də. Rəbbimiz! Duamı da qəbul et! Rəbbimiz! Hesabın qurulduğu gündə mənim üçün, anam-atam üçün və möminlər üçün bağışlanmaq lütf et!" demişdi. (72/14, İbrahim / 31- 41)

## Nəcm: 322

**42,43** Əsla şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərin etdiklərindən Allahın xəbərsiz / məlumatsız olduğunu sanma! Ancaq O, onları, başlarını qaldıraraq qaçacaqları, gözlərin hədəqəsindən çıxacağı bir gün üçün təxirə salır. Onların baxışları özlərinə dönməz və onların könülləri bomboşdur.
**44,45** Və sən insanları, əzabın gələcəyi gün ilə xəbərdar et. Artıq, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələr, "Ey Rəbbimiz! Bizə yaxın bir vaxta qədər möhlət ver, Sənin dəvətini qəbul edək və elçilərə tabe olaq." deyərlər. *–Daha öncə siz, sizin üçün bitişin / tükənişin / məhv olmağın olmadığına dair and içməmişdiniz-mi? Həm də siz, şirk qoşaraq özlərinə haqsızlıq edənlərin yurdlarında sakin oldunuz. Onlara necə etdiyimiz sizə açıq-aşkar bəlli olmuşdu. Və sizə örnəklər də vermişdik.–*
**46** Və gerçəkdən onlar, hiylələrini qurdular. Onların hiylələri, Allah qatındadır. Hiylələri, dağları yerindən oynadacaq olsa belə…
**47** O halda əsla Allahın, elçilərinə olan vədinə xilaf çıxacağını sanma! Şübhəsiz ki, Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, günahkarı yaxalayıb cəzalandıraraq ədaləti təmin etmək prinsipinə sahibdir.
**48-51** O gün, Allahın, hər nəfsi qazandığı ilə qarşılığını verməsi üçün, yer üzü başqa bir yer üzüylə dəyişdiriləcək, göylər də (həmçinin). Və onlar, Bir və gücünə qarşı dayana bilinməyən Allah üçün ortaya çıxacaqlar. O gün, günahkarları zəncirlənmiş olaraq görərsən. Onların köynəkləri qətrandandır, üzlərini də atəş bürüyəcəkdir. Şübhəsiz ki, Allah çox tez haqq-hesab görəndir. (72/14, İbrahim / 42-51)

## Nəcm: 323

**52** Bax, sənə nazil edilən bu Kitab, onunla xəbərdar edilsinlər, Allahın ancaq bir olan ilah olduğunu bilsinlər və təmiz ağıl sahibləri; anlayış qabiliyyəti olanlar öyüd alsınlar deyə insanlara bir xəbərdarlıqdır

(təbliğdir). (72/14, İbrahim / 52)

## ƏNBİYA (73 – 21) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 324**

1 İnsanlar üçün hesablaşma (vaxtı) yaxınlaşdı. Onlar isə laqeydliklə (məhəl qoymadan), uzaq duran kimsələrdir.

2,3 Rəblərindən onlara gələn hər yeni öyüdü / xatırlatmanı ancaq oyun kimi qəbul edərək, qəlbləri əylənərək dinləyirlər. Və şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələr, aralarında bu pıçıltını gizlədilər: "Bu, sizin kimi bir insandan başqa bir şey ola bilərmi? Artıq, gözünüz görə-görə sehrəmi gedirsiniz?"

4 De ki: "Mənim Rəbbim göydə və yerdə hər sözü bilir. Və O, ən yaxşı eşidən, ən yaxşı biləndir."

5 Əksinə, onlar: "Bunlar, qarma-qarışıq xəyallardır; yox-yox, onu özü uydurdu; yox-yox, o bir şairdir. Haydı, elə isə öncəki göndərilənlər kimi bizə bir əlamət / işarət gətirsin" dedilər.

6 Onlardan öncə məhv etdiyimiz heç bir məmləkət iman etməmişdi. İndi bunlarmı iman edəcəklər?

7 Və Biz səndən öncə də ancaq özlərinə vəhy etdiyimiz yetkin kimsələri göndərdik / elçi etdik.
Haydı, siz bilmirsinizsə Öyüd / Kitab Əhli olanlardan / vəhy biliyi (məlumatı) olanlardan soruşun.

8 Və Biz o elçiləri yemək yeməyən cəsəd etmədik. Onlar daimi qalanlar / ölümsüz də deyildilər.

9 Sonra Biz, onlara verdiyimiz o sözü yerinə yetirdik. Beləcə, onları və istədiyimiz kimsələri qurtardıq. Həddini aşanları da dəyişikliyə / məhvə məruz qoyduq.

10 Heç şübhəsiz, Biz sizə, içində öyüdünüz / şan-şərəfiniz olan bir kitab nazil etdik. Buna rəğmən, hələ də ağıllanmayacaqsınızmı?

11 Biz, şirk qoşmaq surətiylə səhv; öz zərərinə olan əməli işləyən neçə -neçə şəhərləri də qırıb məhv etdik. Onlardan sonra da başqa qövmləri yaratdıq.

12 Belə ki, onlar əzabımızın şiddətini hiss etdikləri zaman ondan
sürətlə uzaqlaşıb qaçırdılar. 13 *–Sürətlə uzaqlaşıb qaçmayın, sorğu-*
*sual olunmanız üçün, içində qudurub azdığınız şeylərə və evlərinizə dönün. –*

14 Onlar: "Vay bizim halımıza! Şübhəsiz ki, biz, həqiqətən, yanlış işlər görənlər; öz zərərlərinə iş görənlər imişik" dedilər.

15 Bax, onların bu çağırışları (naləleri), onları biçilmiş bir əkin və sönmüş ocaq / kül halına gətirənə qədər bitmədi. (73/21, Ənbiya / 1-15)

## Nəcm: 325

**16** Və Biz göyü, yer üzünü və aralarındakı şeyləri, oyun oynayanlar olaraq yaratmadıq.
**17** Əgər Biz, bir əyləncə düzəltmək istəsəydik, əlbəttə onu Öz qatımızdan edərdik, əgər Biz (elə) edənlər olsaydıq.
**18** Əksinə, Biz, haqqı batilin başına çırparıq, (o) da onun beynini parçalayar. Bir də baxarsan ki, batil yox olub getmişdir. Və Allaha yaraşdırdığınız sifətlərə görə vay sizin halınıza!
**19,20** Göylərdə və yer üzündə olan kimsələr də yalnızca Onundur. Onun qatında olan kimsələr də Onun qulluğundan böyüklənməzlər və yorulmazlar, gecə-gündüz ara vermədən Onu nöqsan sifətlərdən pak tutarlar.
**21** Yoxsa onlar, yer üzündən bəzi ilahlar qəbul etdilər və o (ilahlar) onları canlandıracaqlar / dirildəcəklər?
**22** Əgər yerdə və göydə Allahdan başqa ilahlar olsaydı, bunların ikisi də həqiqətən fəsad (qarışıqlıq) içində olardı / nizamları pozulardı. O halda ən böyük taxtın[301] Rəbbi olan Allah, onların yaraşdırdığı şeylərdən pakdır.
**23** Ərşin Rəbbi Allah, etdiyindən məsul olmaz, onlar isə məsul olacaqlar.
**24** Yoxsa onlar, Onun altındakılardan bəzi ilahlar qəbul etdilər? De ki: "Qəti dəlilinizi gətirin. Bax bu, mənimlə bərabər olanların öyüdü və məndən öncəkilərin öyüdüdür." Əksinə, onların çoxu gerçəyi bilməz. Artıq, onlar üz çevirənlərdir. (73/21, Ənbiya / 16-24)

## Nəcm: 326

**25** Və Biz səndən öncə elə bir peyğəmbər göndərmədik ki, ona: "Gerçək bu ki, Məndən başqa ilah deyə bir şey yoxdur. Onun üçün Mənə qulluq edin" deyə vəhy etmiş olmayaq.
**26-28** Və onlar: "Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah], Özünə övlad götürdü!" dedilər. Rəhman, bundan pakdır. Əksinə, onlar, lütf göstərilmiş qullardır. Onlar, Onun sözünün önünə keçə bilməzlər; onlar, yalnız Onun əmri ilə iş görərlər. O, Rəhmanın övladları saydıqları şeylərin önlərində və arxalarında olanı bilir. Və onlar, Onun razı olduğu kimsələrdən başqasına yardım etməzlər / dəstək olmazlar. Bununla birlikdə onlar, Ona (Allaha) duyduqları dərin hörmət və sevgiyə görə, ondan uzaqlaşma qorxusundan tir-tir titrəyərlər.
**29** Və onlardan hər kim: "Mən, şübhəsiz Onun altındakılardan bir ilaham" deyərsə, artıq, Biz onu cəhənnəmlə cəzalandırarıq. Bax, şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləyənləri Biz belə

cəzalandırarıq. (73/21, Ənbiya / 25-29)

**Nəcm: 327**

30 Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr], göylər və yer bitişik bir halda idi, Bizim o ikisini ayırdığımızı və həyatı olan (canlı olan) hər şeyi sudan yaratdığımızı görmədilərmi? Buna rəğmən, hələ də inanmırlarmı?
31 Və Biz, yer üzünün içində, sizə süfrə olsun deyə sağlam dirəklər yaratdıq. Və orada, yönəldildikləri yollarını tapsınlar deyə çoxlu yollar yaratdıq.
32 Və Biz, göy üzünü qorunmuş bir tavan etdik. Onlar isə, göy üzünün ayələrindən üz çevirənlərdir.
33 Və O, gecəni, gündüzü, günəşi və ayı yaradandır. Hamısı bir orbitdə üzməkdədir.
34 Biz, səndən öncə də heç bir bəşər üçün sonsuzluq bəxş etmədik. Yaxşı, sən öldün, onlar daimi olaraq qalanlardır?
35 Hər kimliyi olan varlıq (hər canlı varlıq) ölümü dadacaqdır. Və əridib saflaşdırmaq üzrə sizi Biz, şər və xeyir ilə sınayarıq. Və siz, yalnız Bizə döndəriləcəksiniz. (73/21, Ənbiya / 30-35)

**Nəcm: 328**

36 Və bu kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəslər], səni gördükləri zaman, sadəcə, səni məsxərəyə qoyurlar; “İlahlarınızı elə hey yad edən budurmu?” Halbuki onlar Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] xatırlanmasını, öyüdünü, Kitabı, Quranı bilərək rədd edənlərin məhz özüdür.
37 İnsan, çox tələskən xarakterdə yaradılmışdır. Sizə yaxında əlamətlərimi göstərəcəyəm. İndi siz Məndən tələsik istəməyin.
38 Və inkar edən kəslər, “Əgər doğrulardansınızsa, bu vəd nə zamandır?” deyirlər.
39 Bu kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kəslər] atəşi üzlərindən və arxalarından dəf edə bilməyəcəkləri və qətiyyən yardım da olunmayacaqları zamanı bir bilsələr!
40 Əslində bu əzab onlara qəflətən gələcək və onları təəccübləndirəcək (mat qoyacaq). Artıq, onu geri çevirməyə gücləri çatmayacaq və onlara möhlət verilməyəcək.
41 Və heç şübhəsiz səndən əvvəl bir çox elçiyə istehza edildi, içlərindən istehza edənləri o istehza etdikləri şey bürüdü.
42 De ki: “Gecə və gündüz vaxtı sizi Rəhmandan [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahdan] kim qoruya bilər?”

Əslində onlar, Rəblərinin xatırlanmasından, öyüdündən üz çevirənlərdir.
**43** Yoxsa onlar üçün, Bizim altımızdakılardan, onlara əngəl olan bəzi tanrılarmı var? O uydurma tanrıların onlara yardım etməyə gücləri çatmaz. Onlara Bizim tərəfimizdən də bir dəstək olmaz.
**44** Əslində Biz, o kafirləri və atalarını, ömür onlara uzun gələnə qədər bəhrələndirdik. Yaxşı, indi Bizim yer üzünə gəlib onu ətrafından əskiltdiyimizi görmürlərmi? O halda, üstün gələn onlardırmı?
**45** De ki: "Mən sizə ancaq vəhy ilə xəbərdarlıq edirəm." Xəbərdarlıq edildikləri zaman karlar çağırışa qulaq asmazlar.
**46** Və şübhəsiz, Rəbbinin əzabından bir yel onlara toxunarsa, mütləq "Vay halımıza! Şübhəsiz ki, biz səhv; öz zərərlərinə olan əməli işləyənlərmişik" deyəcəklər.
**47** Biz qiyamət günü üçün "haqq edilən pay tərəziləri qoyarıq; heç bir kimsə, heç bir şəkildə haqsızlığa məruz qalmaz. O şey bir xardal dənəsi ağırlığında olsa belə onu gətirərik. Və hesab görənlər olaraq Biz yetərik. (73/21, Ənbiya / 36-47)

**Nəcm: 329**

**48,49** Və and olsun ki, Musa və Haruna Furqanı və görülməyən, eşidilməyən, hiss edilməyən kimsəsiz yerdə Rəblərinə hörmətlə, sevgiylə, biliklə ürpərən, qiyamətin qopmasından içləri titrəyən, Allahın mühafizəsi altına daxil olan kəslər üçün bir işığı və öyüdü verdik.
**50** Bax bu Quran da Bizim nazil etdiyimiz mübarək bir öyüddür. İndi siz bunu tanıtmayan, tanınmasına mane olan kimsələrsiniz?
**51** Və and olsun ki, Biz daha öncə İbrahimə rüşdünü (yetkinlik)
vermişdik. Və Biz onu bilənlər idik. **52** Bir vaxt İbrahim atasına və
qövmünə: "İsrarla tapındığınız (ibadət etdiyiniz) o heykəllər nədir?"
demişdi.
**53** Onlar: "Biz atalarımızın bunlara tapındığını gördük" dedilər.
**54** İbrahim: "And olsun ki, siz və atalarınız açıq-aşkar bir azğınlıq içindəsiniz" dedi.
**55** Onlar: "Sən bizə haqqı gətirdin, yoxsa sən oyun oynayanlardansanmı?" dedilər.
**56,57** İbrahim dedi ki: "Əksinə, Rəbbiniz göylərin və yerin Rəbbidir ki, onları O, yoxdan yaratmışdır. Mən də buna şahidlik edənlərdənəm. Allaha and olsun ki, siz çıxıb getdikdən sonra, mən bütlərinizə həqiqətən bir hiylə quracağam."
**58** Sonra da İbrahim, ona müraciət etsinlər deyə, onlara aid böyüklərindən başqa bunları parça-parça etdi.

59 Qövmü: "Bizim tanrılarımıza bunu kim etdi? Şübhəsiz ki, o, həqiqətən səhv, öz zərərlərinə olan əməli işləyənlərdəndir" dedilər.
60 Bəziləri: "Onları yad edən bir gənc (olduğunu) eşitdik. Onun adına 'İbrahim' deyilir" dedilər.
61 Onlar: "O halda ona şahid olmaları üçün İbrahimi insanların gözləri önünə gətirin" dedilər.
62 Onlar: "Ey İbrahim! Bunu tanrılarımıza sənmi etdin?" dedilər.
63 İbrahim: "Əksinə, onu bu böyükləri etdi. Danışa bilirlərsə, haydı özlərindən soruşun" dedi.
64 Belə olduqda, öz vicdanlarına döndülər və: "Şübhəsiz, siz səhv; öz zərərinə olan əməli işləyənlərin məhz özüsünüz" dedilər.
65 Sonra onlar yenə öz başlarına (etiqadlarına) qayıtdılar: "And olsun ki, bunların danışmayacağını bilirdin" dedilər.
66,67 İbrahim: "O halda, Allahın altındakılardan sizə heç bir şəkildə fayda verməyən və sizə zərər verməyən şeylərəmi tapınırsınız (ibadət edirsiniz)? Sizə də, Allahın altındakılardan tapındıqlarınıza da vay olsun! Siz hələ də ağıllanmayacaqsınızmı?" dedi.
68 Qövmü: "Əgər iş görənsinizsə, bunu yandırın [atəşə verin, sıxıntıya soxun] və tanrılarınıza yardım edin" dedilər.
69 Biz: "Ey atəş! İbrahimə qarşı soyuq və təhlükəsiz ol" dedik.
70 Və ona bir rejim qurmaq istədilər, ancaq Biz özlərini daha çox zərərə / itkiyə məruz qalıb acı çəkən kimsələr etdik.
71 İbrahimi də, Lutu da aləmlər üçün, içində bolluq (bərəkət) olan torpaqlar üçün qurtardıq.
72 Və Biz ona İshaqı, əlavə olaraq da Yəqubu bəxş etdik. Və hamısını yaxşı kimsələr etdik.
73 Və Biz onları, Bizim əmrimizlə doğru yol göstərən öndərlər etdik. Və Biz onlara xeyirli işlər görməyi, səlatı iqamə etməyi [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirmə qurumlarını qurmağı və ayaqda tutmağı], zəkatı / vergini verməyi vəhy etdik. Və onlar, sadəcə Bizə qulluq edənlər idilər.
74 Və Lut; Biz ona bir hökm, bir bilik verdik. Onu çirkin işlər görən şəhərdən qurtardıq. Şübhəsiz ki, onlar pis bir qövm idilər, haqq yoldan çıxmış kimsələr idilər.
75 Və Biz Lutu rəhmətimizin içinə daxil etdik. Şübhəsiz ki, o, salehlərdəndir.
76 Və Nuhu; Bir vaxt o daha öncə nida etmişdi, Biz də ona cavab vermişdik. Sonra da Biz onu və ailəsini, yaxınlarını, iman edənlərini böyük sıxıntıdan qurtardıq.
77 Və ayələrimizi yalanlayan qövmünə qarşı ona yardım etdik. Şübhəsiz ki, onlar pis bir qövmdülər və Biz onları toplu halda suda

boğduq.
78 Davud və Süleymanı da; bir vaxt onlar, camaatın qoyunlarının, gecə vaxtı içinə yayıldığı əkin sahəsi haqqında hökm verirdilər. Biz də, cəmiyyətin qanunlarının nə olduğunu bilirdik.
79 Sonra da Biz, onu Süleymana dərhal yaxşıca dərk etdirdik. Və hamısına qanun və bilik verdik. Davudla bərabər Allahı nöqsan sifətlərdən pak tutsunlar deyə, dağları və quşları ram etdik / onları insanların faydalanacağı ölçülərdə yaratdıq. Və Biz edənlərik.
80 Və Biz, sizin pisliyinizdən sizi qorumaq üçün, sizin üçün zireh düzəltməyi ona öyrətdik. Artıq, siz özünüzə verilən nemətlərin qarşılığını ödəyənlərsinizmi?
81 Və Süleymana, içində bərəkətlər yaratdığımız torpağa doğru onun əmri ilə axıb gedən qasırğa halındakı küləyi (ona) boyun əydirdik. Və Biz hər şeyi bilənlərik.
82 Və şeytanlardan onun üçün dalğıclıq edən və bundan daha aşağı işlər görən şeytanları da (ona) boyun əydirdik. Və Biz onları qoruyurduq.
83,84 Və Əyyub; bir vaxt o: "Şübhəsiz ki, mənə zərər toxundu. Sən mərhəmətlilərin ən mərhəmətlisisən" deyə Rəbbinə nida etmişdi və Biz, onun üçün qarşılıq vermişdik. Sonra ondan zərərli olan şeyləri qaldırdıq. Və qatımızdan bir rəhmət və qulluq edənlərə bir öyüd olsun deyə, ona ailəsini, yaxınlarını və itirdikləriylə bir mislini də (əlavə) verdik.
85 Və İsmail, İdris və Zülkifl, hamısı səbr edən kimsələrdən idi.
86 Onları da rəhmətimizə daxil etdik. Şübhəsiz ki, onlar saleh kəslərdən idilər.
87 Və Zünnunu [qılınc sahibini, neynəvalını]; bir vaxt o, qəzəblənərək getmişdi və onu sıxıntıya salmayacağımızı sanmışdı. Sonra da qaranlıqlar içində: "Səndən başqa ilah deyə bir şey yoxdur! Səni pak tuturam. Şübhəsiz ki, mən səhv; öz zərərinə olan əməli işləyənlərdən oldum!" deyə səslənmişdi.
88 Sonra da Biz, ona cavab verdik və Onu, qəmdən / üzüntüdən qurtardıq. Və bax, iman edənləri Biz belə qurtararıq.
89,90 Və Zəkəriyya; bir vaxt o, Rəbbinə: "Rəbbim! Məni tək başıma buraxma, Sən varislərin ən xeyirlisisən!" deyə səslənmişdi və Biz, onun üçün qarşılıq vermişdik. Və ona Yəhyanı ehsan (bəxş) etdik. Və onun üçün zövcəsini düzəltdik / doğmağa qabil hala gətirdik. Şübhəsiz ki, onlar xeyirlərdə yarışırlar, ümid edərək və qorxaraq [və adam kimi adam olaraq] Bizə yalvarırdılar. Və Bizə qarşı dərin hörmət bəsləyirdilər.
91 Və o, ismətini diqqətlə qoruyan qadın; Bax Biz, onu güvənli

(mötəbər) biliyimizlə biliklǝndirdik. Və onu və oğlunu aləmlər üçün bir əlamət / işarət etdik.
**92** Şübhəsiz, bu, vahid bir ümmət olaraq sizin ümmətinizdir. Mən də sizin Rəbbinizəm. O halda Mənə qulluq edin.
**93** Halbuki ortaq qoşanlar, işlərini aralarında parça-parça etdilər. Hamısı yalnız Bizə dönənlərdir.
**94** Elə isə, kim inanmış olaraq yaxşılaşdırmaq qayəsi ilə işlər görərsə, onun əməyi üçün haqsızlıq edilməyəcəkdir. Biz, heç şübhəsiz ki, onu yazanlarıq.
**95** Və dəyişikliyə / məhvə məruz qoyduğumuz bir şəhərə qadağa qoyulmuşdur: "Şübhəsiz ki, bunlar dönməyəcəklər!"
**96** Hatta axın edənlər və (onların) sərkərdəsi[302] açıldığı zaman, onlar yüksək təpədən axın edib çıxarlar.
**97** Və gerçək vəd yaxınlaşdığı zaman kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəslərin] gözləri bərələr: "Vay halımıza! Həqiqətən biz bundan biliksiz / xəbərsiz idik. Əslində biz səhv; öz zərərinə olan əməli işləyən kimsələr idik." (73/21, Ənbiya / 48-97)

## Nəcm: 330

**98** Həqiqətən, siz və Allahın altındakılardan tapındıqlarınız (ibadət etdikləriniz) cəhənnəmin odunusunuz / yanacağısınız; siz oraya girəcəksiniz.
**99,100** Əgər Allahın altındakılardan tapınılan (ibadət edilən) şeylər ilah olsaydılar, oraya girməzdilər. Və hamısı orada təməlli qalacaq. Orada onlar üçün ancaq inilti var. Bunlar orada bir şey də eşitməzlər.
(73/21, Ənbiya / 98-100)

## Nəcm: 331

**101,102** Şübhəsiz, tərəfimizdən onlara "Ən gözəl" hazırlanan kimsələr; bax onlar, cəhənnəmdən uzaqlaşdırılmışdırlar. Onlar cəhənnəmin uğultusunu eşitməzlər. Onlar, nəfslərinin istədiyi şeylər içində daimi qalacaqlar.
**103** O ən böyük qorxu onları üzməz və xəbərçilər onlara: "Bax bu, sizə söz verilmiş olan gününüzdür" deyə ağıllarına gətirərlər (xatırladarlar). (73/21, Ənbiya / 101-103)

## Nəcm: 332

**104** Biz göyü, kitabların bürmələndiyi kimi bürmələdiyimiz zaman, ilk dəfə yaratmağa başladığımız kimi *–qatımızdan verilmiş bir söz olaraq–* onu yenidən var edəcəyik. Şübhəsiz ki, Biz edənlərik.
(73/21, Ənbiya / 104)

**Nəcm: 333**

**105** Və and olsun ki, Biz Öyüddən / Tövratdan sonra, Zəburda da "Şübhəsiz ki, yer üzünə ancaq Mənim saleh qullarım mirasçı olacaq" deyə yazdıq.
**106** Şübhəsiz, Quranda, qulluq edən camaat üçün həqiqətən göndərilmiş bir mesaj vardır.
**107** Biz, səni də ancaq aləmlər üçün bir rəhmət olaraq / rəhmət üçün göndərdik.
**108** De ki: "Mənə 'ilahımız ancaq tək bir ilahdır' deyə vəhy olunur. İndi siz müsəlmanlarsınızmı?"
**109-111** Buna rəğmən, əgər üz döndərərlərsə: "Sizə ən doğru / eyni (olduğu kimi) / tərəfsiz olaraq açıqladım və təhdid olunduğunuz şeyin yaxın, yaxud da uzaq olduğunu bilmirəm. Şübhəsiz ki, Allah, sözdən aşkar etdiyinizi də, gizlədiyiniz şeyləri də bilir. Və bəlkə bu gecikmə sizi imtahana çəkmək və bir müddətə qədər bəhrələndirmək üçündür, mən bilmirəm" de.
**112** De ki: "Rəbbim! Aramızda gerçəklə hökm et" və "Bizim Rəbbimiz, o yaratdığı bütün canlılara dünyada daha çox mərhəmət edən Allahdır, sizin aid etdiklərinizə (bənzətdiyiniz sifətlərə) qarşı yardımı istənəndir." (73/21, Ənbiya / 105-112)

## MUMİNUN [İMAN EDƏNLƏR] (74 – 23) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 334**

**1** Həqiqətən, inananlar öz vəziyyətlərini qorudular / zəfər qazandılar.
**2** Onlar, səlatlarında [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmək işlərində] özlərini gözə soxmayan (sadə) / səmimi olan kimsələrdir.
**3** Və onlar, boş şeylərdən üz çevirən kimsələrdir,
**4** Və onlar zəkatı işləyən/ vergini verən kimsələrdir,
**5-7** Və onlar, iffətlərini qoruyan kimsələrdir, *–zövcələri və yaxud müqavilələrinin sahib olduqları*[303] *istisnadır, çünki buna görə qınanmazlar, halbuki bunun xaricinə çıxmaq istəyənlər, bax onlar, məhz həddi aşanların özüdür.–*
**8** Və onlar, əmanətlərinə və əhdlərinə riayət edən kimsələrdir.
**9** Və onlar, səlatlarını [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını] qoruyan kimsələrdir.
**10,11** Bax onlar, içində təməlli qalacaqları Firdovs cənnətinə son sahib olan son sahiblərin məhz özüdür. (74/23, Muminun / 1-11)

**Nəcm: 335**
**12-16** Və and olsun ki, Biz insanı seçilmiş bir palçıqdan yaratdıq. Sonra onu çox möhkəm bir qərargahda (yerdə) bir nütfə etdik. Sonra o nütfəni bir embrion elədik. Sonra o embrionu bir parça ət elədik. Sonra o bir parça əti sümüklər olaraq yaratdıq. Axırda o sümüklərin (üstünə) də bir ət geydirdik. Sonra onu bir başqa yaradılışda yenidən qurduq. Bax, yaradanların ən gözəli olan Allah necə də comərddir! Sonra şübhəsiz siz, bunların ardından həqiqətən öləcəksiniz. Sonra şübhəsiz ki, siz, qiyamət günündə dirildiləcəksiniz. (74/23, Muminun / 12-16)

**Nəcm: 336**
**17** Və and olsun ki, Biz sizin üstünüzdə yeddi yol yaratdıq. Və Biz, yaratmaqda biliksiz, əlaqəsiz, xəbərsiz deyilik.
**18** Və Biz göydən müəyyən miqdarda su endirdik, sonra onu yer üzündə durultduq. Və şübhəsiz ki, Bizim, onu aradan qaldırmağa da həqiqətən gücümüz çatar.
**19** Sonra da Biz, onun sayəsində sizin üçün xurma və üzümdən bağçalar meydana gətirdik. Bunlarda sizin üçün bir çox meyvələr vardır ki, onlardan yeyirsiniz.
**20** Və Turi Sina (dağından) çıxan, yağ bitirən, yeyənlərə qatıq (çörəklə az-az yeyilən şey) olan bir ağac meydana gətirdik.
**21,22** Dört ayaqlı, iki dırnaqlı gövşəyən və ot yeyən heyvanlarda da sizin üçün həqiqətən bir ibrət vardır. Onların qarınlarındakı şeylərdən sizə içirdirik. Onlarda sizin üçün bəzi faydalar daha vardır. Və siz, onlardan yeyirsiniz, onların üzərində və gəmilərin üzərində daşınırsınız / yüklənirsiniz. (74/23, Muminun / 17-22)

**Nəcm: 337**
**23** And olsun ki, Biz Nuhu öz qövmünə elçi göndərdik və o: "Ey qövmüm! Allaha qulluq edin. Sizin üçün Ondan başqa ilah yoxdur. Hələ də Allahın mühafizəsi altına daxil olmayacaqsınızmı?" dedi.
**24,25** Belə olduqda, qövmünün kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] öncüləri: "Bu, sizin kimi bir bəşərdən başqa bir şey deyildir. Sizə üstün olmaq istəyir. Əgər Allah istəsəydi, əlbəttə mələklər endirərdi. Biz əvvəlki atalarımızdan bunu eşitmədik. Bu, yalnızca özündə, dəlilik olan bir adamdır. Elə isə, bir vaxta kimi onu ümidlə gözləyin" dedilər.
**26** Nuh: "Rəbbim! Məni yalançı saymalarına qarşı mənə yardım et!" dedi.
**27-29** Belə olduqda, Biz ona: "Bizim nəzarətimiz altında və vəhyimiz ilə gəmini düzəlt. Sonra Bizim əmrimiz gəldiyi və təndir qaynayınca,

hər cinsdən cütlər halında iki dənə və bir də, onlardan, daha öncə öz əleyhində Söz[304] keçmiş olanların xaricindəki ailəni, yaxınlarını, sənə iman edənləri gəmiyə mindir. Şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləyənlər barədə Mənə müraciət etmə. Şübhəsiz ki, onlar boğulmuşlardır; qəti surətdə suda boğulub öləcəklər. Sonra sən və bərabərindəki kəslər gəmiyə yerləşdiyində: 'Bütün təriflər, bizi şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən tayfanın əlindən qurtaran Allah üçündür; başqasını tərifləməyin' de! Və: 'Rəbbim! Məni bolluq olan bir yerə endir / mənə bol nemət ver. Sən, sığınacaq verənlərin / nemət verənlərin ən yaxşısısan' de" deyə vəhy etdik.
**30** Şübhəsiz, bunda həqiqətən bəzi əlamətlər / işarətlər vardır. Və Biz, həqiqətən sınayanlarıq.
**31** Sonra, Biz onların ardınca başqa bir nəsil yaratdıq.
**32** Sonra da onlara, "Allaha qulluq edin, sizin üçün Ondan başqa bir ilah yoxdur. Hələ də Allahın mühafizəsi altına daxil olmayacaqsınız?" deyə xəbərdarlıq edən, öz içlərindən bir elçi göndərdik.
**33-38** Və elçinin qövmündən, küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş], axirətə qovuşmağı yalanlamış və bu bəsit dünya həyatında özlərinə rifah (xoş güzəran) verdiyimiz kodamanları *(kodaman - görkəmli, pullu və məqam sahibi olan kimsələr üçün kinayəli şəkildə deyilir.)* belə dedilər: "Bu, sadəcə sizin kimi bir bəşərdir, sizin yediyiniz şeylərdən yeyir, sizin içdiyiniz şeylərdən içir. Və əgər, özünüz kimi bir bəşərə itaət etsəniz, şübhəsiz ki, o zaman siz, həqiqətən ziyana uğrayarsınız. Sizə, həqiqətən siz ölüb torpaq və sür-sümük olduğunuz halda, mütləq surətdə (qəbirlərinizdən) çıxarılacağınızımı vəd edir? Təhdid olunduğunuz şey, heç olmayacaq bir şeydir! Sadəcə bəsit dünya həyatımız (var)! Biz, ölərik, yaşayarıq. Və biz, dirildiləsi deyilik. Elçi, sadəcə Allah haqqında yalan uyduran bir adamdır və biz ona inanmırıq."
**39** Elçi: "Rəbbim, məni yalançı hesab etmələrinə qarşı mənə yardım et!" dedi.
**40** Allah: "Çox az bir zaman sonra onlar mütləq peşman olacaqlar!" dedi.
**41** Sonra da çığlıq onları haqq ilə yaxaladı. Beləcə, onları çör-çöp (kimi) etdik. Artıq uzaqlıq, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən camaata məxsusdur.
**42** Sonra Biz onların ardınca başqa nəsillər yaratdıq.
**43** Heç bir öndərli camaat, öz əcəlini önə ala bilməz, təxirə də sala bilməz.
**44** Sonra Biz bir-birinin ardınca elçilərimizi göndərdik. Hər nə vaxt ki, bir ümmətə elçiləri gəldi, onlar bu elçini yalanladılar, Biz də onları bir-

birinin ardınca göndərdik və onları (geniş şəkildə bəhs edilən) əhvalata çevirdik. *–Artıq, uzaqlıq iman etməyən camaata məxsusdur; cəhənnəm olsunlar!–*
**45,46** Sonra da Musa və qardaşı Harunu ayələrimizlə / əlamətlərimizlə / işarətlərimizlə və açıq-aşkar bir güc ilə Firona və əyanlarına göndərdik / elçi etdik. Belə olduqda, özlərinin böyüklüyünə inandılar və böyüklük göstərən bir camaat oldular.
**47** Sonra da: "Bu ikisinin camaatları bizə qulluq etdiyi halda, biz, bizim bənzərimiz olan bu iki bəşərə inanacağıqmı?" dedilər.
**48** Beləliklə, onlar ikisini də yalanladılar, dəyişikliyə / məhvə məruz qalanlardan oldular.
**49** Və and olsun, Biz, Musaya o kitabı verdik ki, onlar (özlərinə) göstərilən doğru yola girsinlər.
**50** Və Biz, Məryəmin oğlunu və İsanın anasını bir əlamət / işarət etdik və ikisini, yaşayış üçün yararlı, suyu olan bir təpəyə yerləşdirdik.
**51** Ey elçilər! Təmiz, xoş, faydalı şeylərdən yeyin və saleh əməli işləyin. Şübhəsiz ki, Mən sizin etdiklərinizi çox yaxşı bilənəm.
**52** Və bax bu, vahid bir ümmət olaraq sizin ümmətinizdir. Mən də sizin Rəbbinizəm. O halda, Mənim mühafizəm altına daxil olun.
**53** Sonra insanlar öz aralarındakı işlərini parça-parça böldülər. Hər qrup (firqə), özündə olan ilə sevinib lovğalanmaqdadır (iftixar etməkdədir).
**54** İndi sən onları (müəyyən) bir vaxta kimi azğınlıqları ilə baş-başa burax!
**55,56** Onlar, onları xeyirlərdə tələsdirmək üçün, onlara maldan və oğullardan bir şeylər verdiyimizimi sanırlar? Tam əksinə, işin fərqinə varmırlar (nə olduğunu anlamırlar). (74/23, Muminun / 23-56)

## Nəcm: 338
**57-61** Şübhəsiz, Rəblərinə duyduqları dərin heyranlıq və hörmət səbəbindən, Ondan uzaqlaşmaq qorxusuyla tir-tir titrəyən, Rəbbinin ayələrinə inanan kimsələr, Rəblərinə ortaq tanımayan kimsələr, şübhəsiz özləri, Rəblərinə dönəcəklər deyə, verdiklərini qəlbləri ürpərərək verən kimsələr; bax onlar yaxşılıqlarda yarışanlardır və yaxşılıqlar üçün öndə gedənlərdir. (74/23, Muminun / 57-61)

## Nəcm: 339
**62** Və Biz heç kimsəni, gücünün çatdığından başqası ilə; imkanı xaricindəki bir şeylə məsuliyyətli tutmarıq. Yanımızda da, haqqı danışan bir kitab var və onlar, haqsızlığa uğradılmaz.
**63** Əksinə, onların qəlbləri bu xüsusda örtük içindədir (qapalıdır). Və

onların bundan aşağı bəzi pis işləri var ki, onlar pis işləri edib durarlar.
**64** Nəhayət, onların komfort (naz-nemət) içində olanlarını əzabla yaxaladığımızda, dərhal fəryad edərlər.
**65-67** Bu gün fəryad etməyin! Şübhəsiz ki, siz, Bizdən yardım görə bilməzsiniz. Şübhəsiz ki, ayələrimiz sizə oxunurdu, ancaq buna qarşı siz təkəbbür göstərərək və gecə vaxtı ağzınıza gələni danışaraq, arxanızı dönüb gedirdiniz. (74/23, Muminun / 62-67)

## Nəcm: 340

**68** Onlar, Quranı heç düşünmədilərmi? Yoxsa onlara, daha öncə keçmişdəki atalarına gəlməyən bir şeymi gəldi?
**69** Ya da onlar, elçilərini tanımadılarmı ki, onlara gələn elçini tanıtmamağa çalışan kimsələrdirlər?
**70** Yoxsa, "Onda bir dəlilik var" deyirlər? Əksinə, elçiləri, onlara haqqı gətirmişdir. Onların çoxu da haqq üçün xoşlanmayan kimsələrdir.
**71** Və əgər haqq, onların ehtiraslarına tabe olsaydı; həqiqətən göylər, yer üzü və bunlarda olan kimsələr pozulub gedərdi. Əslində, Biz onların şanını / öyüdlərini gətirdik; sonra da onlar, öz şanlarından / öyüdlərindən üz çevirənlərdir.
**72** Yoksa sən onlardan bir vergimi istəyirsən? Bax, Rəbbinin vergisi daha xeyirlidir. Və Rəbbin, ruzi verənlərin ən xeyirlisidir.
**73,74** Və şübhəsiz sən, həqiqətən onları ən doğru bir yola çağırırsan. Axirətə inanmayan bu kimsələr isə, həqiqətən bu yoldan azanlardır.
**75** Və əgər onlara mərhəmət edib, məruz qaldıqları sıxıntını aradan qaldırsaydıq, həqiqətən yaxşıca (əməlli-başlı) korlaşaraq azğınlıqlarında tamamilə inadkarlıq göstərərdilər.
**76** Və and olsun, Biz onları əzab ilə yaxaladıq; buna rəğmən, Rəblərinə boyun əymədilər və Allaha qarşı zəlillər olduqlarını heç göstərmədilər.
**77** Elə ki, onların üzərlərinə, əzabı çox şiddətli (olan) bir qapı açdığımız zaman, bir də görərsən ki, onlar orada ümidsiz (halda) qalmışlar!
**78** Və Allah sizin üçün eşitməyi, gözləri və qəlbləri inşa edəndir. Özünüzə verilən nemətlərin qarşılığını necə də az ödəyirsiniz!
**79** Və Allah, sizi yer üzündə törədib yaradandır. Və sadəcə Ona (görə) cəm ediləcəksiniz.
**80** Və Allah dirildir və öldürür. Gecə ilə gündüzün bir-birini izləməsi də yalnızca Onun üçündür. Hələ də ağlınızı işlətməyirsiniz?
(74/23, Muminun / 68-80)

**Nəcm: 341**

**81** Əslində onlar, (özlərindən) öncəkilərin söylədiklərinin oxşarını söylədilər.

**82,83** Onlar: "Biz öldükdən sonra torpaq və sür-sümük olduğumuz halda, həqiqətən dirildiləcəyikmi? And olsun ki, biz və atalarımız bundan öncə bununla qorxudulmuşduq. Bu, əvvəlkilərin nağıllarından başqa bir şey deyildir!" dedilər.

**84** De ki: "Əgər bilirsinizsə (cavab verin), bu yer üzü və onun içindəki kimsələr kimə aiddir?"

**85** Onlar: "Allaha aiddir" deyəcəklər. "Elə isə, siz düşünüb-daşınmırsınız?" de.

**86** De ki: "Yeddi göylərin Rəbbi və çox böyük taxtın[305] Rəbbi kimdir?"

**87** Onlar, "Allahındır / Allahdır" deyəcəklər. Sən: "Elə isə, Allahın mühafizəsi altına daxil olmayacaqmısınız?" de.

**88** De ki: "Əgər bilirsinizsə (cavab verin); hər şeyin mülkiyyəti və idarəsi Öz əlində olan və Özü hər şeyi qoruyub nəzarət edən, fəqət Özü qorunmayan kimdir?"

**89** Onlar, "Allahındır / Allahdır" deyəcəklər. Sən: "Elə isə necə ovsunlanırsınız?" de.

**90** Əslində Biz onlara haqqı gətirdik, onlar isə həqiqətən yalançıdırlar.

(74/23, Muminun / 81-90)

**Nəcm: 342**

**91,92** Allah, övlad deyə bir şey götürməmişdir; Onunla bərabər heç bir ilah da yoxdur. Əks təqdirdə, hər ilah mütləq özünün yaratdığı şeylə birlikdə gedərdi və mütləq digərlərindən üstün olmağa (çalışardı). Görünməyəni, eşidilməyəni, hiss edilməyəni və aşkarda olanı bilən Allah, onların bənzətdikləri şeylərdən pakdır. O, onların ortaq qoşduqları şeylərdən də çox ucadır. (74/23, Muminun / 91-92)

**Nəcm: 343**

**93,94** De ki: "Rəbbim! Onların təhdid olunduqları şeyləri mənə mütləq göstərəcəksən, Rəbbim! Bu durumda məni, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələrin topluluğunun içində saxlama."

**95** Və şübhəsiz, onlara vəd etdiyimiz şeyləri sənə göstərməyə, əlbəttə ki, Bizim gücümüz çatar.

**96** Sən, pisliyi ən gözəl bir şeylə dəf et. Biz onların yaraşdırdıqları şeyləri çox yaxşı bilirik.

**97,98** Və de ki: "Rəbbim! Şeytanların qışqırtmalarından (təhriklərindən) Sənə sığınıram! Və Rəbbim! Onların yanımda

olmalarından da Sənə sığınıram.” (74/23, Muminun / 93-98)

## Nəcm: 344

**99,100** Nəhayət, onlardan birinə ölüm gəldiyi zaman: “Rəbbim, tərk etdiyim şeylərdə saleh əməli işləməyim üçün məni geri döndər” dedi. Qətiyyən onun düşündüyü kimi deyil! Bu, şübhəsiz ki, onun söylədiyi bir sözdür. Onların təkrar dirildiləcəkləri günə qədər onların arxalarında bir əngəl var.
**101** Artıq Sura üfürüldüyü zaman,[306] bax o gün aralarında nəsil-nəcabət əlaqəsi yoxdur, kimsə kimsədən bir şey istəyə də bilməz.
**102** Beləliklə, kimlərin tərəziləri ağır gələrsə, bax onlar əsl qurtuluşa yetişənlərdir.
**103** Kimlərin də tərəziləri yüngül gələrsə, artıq bunlar da özlərinə əziyyət (ziyan) edənlərdir; cəhənnəmdə daimi qalanlardır.
**104** Orada onlar, dişləri ağarmış halda ikən ataş üzlərini yalayar.
**105** Mənim ayələrim sizə oxunmadımı? Siz də onları yalanlayırdınızmı?
**106,107** Dediler ki: “Rəbbimiz! Azğınlığımız bizə qalib gəldi və biz haqq yoldan azan bir topluluq olduq. Rəbbimiz! Bizi buradan çıxar. Əgər bir daha eynisini edərsək, bax o zaman gerçəkdən biz səhv; öz zərərinə olan əməli işləyənlərik.”
**108** Allah dedi ki: “Çökün oraya! Mənimlə də danışmayın.
**109** Şübhəsiz, Mənim qullarımdan bir qrup: “Rəbbimiz! Biz iman etdik; artıq bizi bağışla, bizə mərhəmət et, Sən mərhəmətlilərin ən yaxşısısan!” deyirdilər. **110** Bax siz onları məsxərəyə qoyurdunuz;
nəhayət onlar da, sizə Mənim xatırlanmamı, öyüdümü unutdurdu / tərk
etdirdi. Və siz onlara gülürdünüz. **111** Şübhəsiz ki, bu gün Mən, səbr
etmələrinə qarşılıq, onları mükafatlandırdım; onlar, qazanclı çıxanların məhz özüdür.”
**112** Allah: “Yer üzündə il sayı olaraq neçə il qaldınız?” dedi.
**113** Onlar: “Bir gün, yaxud günün bir hissəsi qədər qaldıq. Bunu sayanlardan soruş” dedilər.
**114** Allah: “Siz sadəcə lap az bir vaxt qaldınız; kaş ki, siz bilmiş olaydınız!” dedi. (74/23, Muminun / 99-114)

## Nəcm: 345

**115** Yaxşı siz, Bizim sizi sadəcə boş yerə yaratdığımızı və şübhəsiz sizin yalnızca Bizə döndərilməyəcəyinizimi sandınız?
**116** Bax gerçək sahib, yönətici Allah, ucalar ucasıdır. Ondan başqa ilah deyə bir şey yoxdur. O, hörmətli, ən böyük rəhbərlik məqamının[307] Rəbbidir.

**117** Hər kim, heç bir dəlili olmadığı halda, Allah ilə birlikdə digər bir ilaha yalvararsa, bilsin ki, o kimsənin hesabı ancaq Rəbbinin yanındadır. Şübhəsiz ki, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] öz vəziyyətlərini qoruya bilməzlər, zəfər qazana bilməzlər. (74/23, Muminun / 115-117)

**Nəcm: 346**

**118** Və de ki: "Rəbbim! Bağışla və mərhəmət et! Və Sən mərhəmətlilərin ən xeyirlisisən." (74/23, Muminun / 118)

## SƏCDƏ (75 – 32) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 347**

**1** Əlif / 1, Lam / 30, Mim / 40.[308]
**2** Özündə şübhə olmayan bu kitabın nazil edilməsi aləmlərin Rəbbindəndir.
**3** Yoxsa onlar, "Onu özündən uydurdu!" deyirlər? Əksinə, Quran, yönəldikləri doğru yola yetişərlər deyə, səndən əvvəl özlərinə bir xəbərdarlıq edən gəlməyən camaatı xəbərdar edəsən deyə Rəbbindən gələn gerçəkdir. (75/32, Səcdə / 1-3)

**Nəcm: 348**

**4** Allah, göyləri, yeri və ikisinin arasındakıları altı mərhələdə yaradan və ən böyük taxt üzərində də hakimiyyət qurandır.[309] Onun altındakılardan sizə bir yardımçı, yol göstərən, qoruyan (himayə edən) yaxın və bir dəstəkçi, şəfaətçi yoxdur. Hələ də düşünüb ibrət almayacaqsınız?
**5** Allah, göydən yerə, sistemləri tənzimləyər, sonra da sistemlər, ölçüsü, sizin saydıqlarınızdan min il olan bir gündə Allaha yüksələr; geri dönər, sistem çökər, pozular.
**6** Bax, Allah hiss edilə bilənləri, hiss edilə bilməyənləri, keçmişi, gələcəyi biləndir; ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, geniş mərhəmət sahibidir.
**7** O, yaratdığı hər şeyi ən gözəl edən və insanı yaratmağa bir palçıqdan
başlayandır. **8** Sonra onun soyunu soyca təmiz, dəyərsiz bir sudan
yaratmışdır. **9** Sonra onu düzəldib bir formaya saldı və onu
biliklendirdi.[310] Sizin üçün də qulaq, gözlər və könüllər yaratdı. Sahib olduğunuz nemətlərin qarşılığını necə də az ödəyirsiniz!
(75/32, Səcdə / 4-9)

**Nəcm: 349**

**10** Və onlar: "Biz, yer üzünün içində yox olduqdan sonra, gerçəkdən

biz yeni bir xilqətdəmi olacağıq?" dedilər. Əslində, onlar öz Rəblərinə qovuşmağı, Onun hüzuruna çıxmağı bilərək rədd edən / inanmayan kimsələrdir.
**11** De ki: "Sizə ölümlə vəzifələndirilmiş qüvvə, sizi vəfat[311] etdirəcək; sizə keçmişdə etdiklərinizi və etməli olduğunuz halda etmədiklərinizi bir-bir xatırlatdıracaq, sonra Rəbbinizə döndəriləcəksiniz."
**12** Günahkarları, Rəblərinin hüzurunda başları önə əyilmiş olaraq: "Ey Rəbbimiz! Gördük və dinlədik, indi bizi geri qaytar ki, saleh bir əməl işləyək, biz artıq qəti bir şəkildə inanırıq" deyərkən bir görsən!
**13** Və əgər Biz, istəsəydik hər adama doğru yolu verərdik. Lakin Məndən: "Bütün bilinən, bilinməyən, keçmişdən, gələcəkdən[312] hər kəsdən cəhənnəmi əlbəttə tamamilə dolduracağam" sözü haqq olmuşdur.
**14** "Elə isə bu gününüzlə qarşılaşmağı unutduğunuzdan / tərk etdiyinizə görə dadın əzabı! Heç şübhəsiz ki, Biz cəzalandırdıq sizi. Və etdiklərinizə qarşılıq (olaraq) sonsuzluq əzabını dadın!"

(75/32, Səcdə / 10-14)

## Nəcm: 350

**15** Həqiqətən, Bizim ayələrimizə ancaq öyüd verildiyi zaman boyun əyib təslimiyyət göstərərək yerlərə qapanan və Rəblərinin tərifiylə birlikdə nöqsan sifətlərdən pak tutan və təkəbbür göstərməyən kimsələr inanarlar.
**16** Onların yanları, yan yatdıqları yerlərdən uzaqlaşar; onlar kef etməzlər, onlar qorxu və ümid içində Rəblərinə dua edərlər və onlara verdiyimiz ruzilərdən Allah yolunda xərcləyərlər / başda yaxınları olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edərlər.

(75/32, Səcdə / 15-16)

## Nəcm: 351

**17** Bax, heç kəs, etdiklərinin qarşılığında özü üçün gözaydınlığı olan şeylərdən nələrin gizlənib saxlandığını bilmir!
**18** Yaxşı, iman edən kimsə, yoldan çıxan kimsə kimidirmi? Bunlar eyni olmazlar.
**19** İman edən və sahmana salmaq qayəsi ilə əməl işləyən kimsələrə gəlincə; artıq etdiklərinə qarşılıq bir qarşılanma olaraq sığınacaq bağçaları yalnızca onlar üçündür.
**20,21** Və yoldan çıxanlara gəlincə, onların gedəcəkləri yer də Atəşdir. Hər (dəfə) çıxmaq istədiklərində, yenidən oraya çevriləcəklər və onlara: "Yalan saydığınız Atəşin əzabını dadın!" deyiləcək. Heç

şübhəsiz, (Rəblərinə) dönərlər deyə onlara, böyük cəzanın bir az yüngülündən, ən yaxın cəzadan da daddıracağıq.
**22** Və Rəbbinin ayələri ilə özünə öyüd verilən, sonra da onlardan üz çevirən kimsədən daha səhv; öz zərərinə olan əməli işləyən kimdir? Şübhəsiz ki, Biz, günahkarları tutub cəzalandıraraq ədaləti təmin edənlərik. (75/32, Səcdə / 17-22)

**Nəcm: 352**

**23** Və and olsun ki, Biz vaxtilə Musaya o kitabı verdik. *–İndi sən ona qovuşmaqdan şübhə içində olma.–* Və Biz, onu İsrail oğulları üçün bir yol göstərən etdik.
**24** Və onlardan, səbr etdikləri zaman, Bizim əmrimizlə doğru yola sövq edən öndərlər təyin etdik. Və onlar, Bizim ayələrimizə / əlamətlərimizə / işarətlərimizə qəti bir şəkildə inanırdılar.
**25** Şübhəsiz, sənin Rəbbin; Allah, onların anlaşılmazlığa (ixtilafa) düşdükləri şeylər haqqında qiyamət günü aralarında hökm edəcəkdir.
(75/32, Səcdə / 23-25)

**Nəcm: 353**

**26** Yurdlarında gəzib-dolaşdıqları, özlərindən öncəki neçə-neçə nəsilləri dəyişikliyə / məhvə məruz qoymağımız da, onlara yol göstərmədimi? Şübhəsiz ki, bunda neçə-neçə əlamətlər / işarətlər var. Hələ də qulaq asmayacaqlarmı?
**27** Yaxud da, Bizim qup-quru yerə suyu buraxıb onunla heyvanların və özlərinin yediyi əkini çıxarmağımızı da görmədilər? Hələ də görməzlər?
**28** Bir də onlar: "Əgər doğru kimsələrsinizsə, nə zamandır o məhkəmə?" deyirlər.
**29** De ki: "Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə], o məhkəmə günündə iman etmələri fayda verməz və onlara vaxt da (möhlət də) verilməz."
**30** Artıq sən onlardan uzaq dur və gözlə. Şübhəsiz ki, onlar gözləyənlərdir. (75/32, Səcdə / 26-30)

## TUR (76 – 52) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 354**

**1-8** Turun qaldırılması, yayılmış incə dəri üzərinə sətir-sətir yazılan Allahın nazil etdiyi bütün kitablar,
Allahın abad evi; Kəbəni, Fil əshabının dağıtmasına izn verməməsi,
Ad və Səmud qövmlərinin dəyişikliyə / məhvə məruz qoyulması,
Nuh qövmünün suda boğdurulması, Firon və yaxınlarının suda

boğulmaları, Səba xalqının sel fəlakəti ilə cəzalandırılması,
Səmud ölkəsi kimi neçə-neçə məmləkətlərin quraqlıqla, göllərinin, çaylarının qurudulub hər yanının səhralaşması ilə cəzalandırılması dəlildir ki, şübhəsiz, Rəbbinin əzabı, həqiqətən vaqe olacaqdır, ona əngəl olacaq (heç bir güc) yoxdur.[313]
**9,10** O gün göy lərzəyə gəldikcə lərzəyə gələr, dağlar da (yerindən qopub) hərəkət etdikcə hərəkət edər.
**11,12** Elə isə, o gün boş işlərlə oynayıb duran, yalanlayanların vay halına!
**13-16** O gün, (haqqı) yalan sayanlar cəhənnəm atəşinə itələndikcə itələnərlər. *–Bax bu, yalanlayıb durduğunuz atəşdir! Yaxşı, bu da bir sehrdir? Yoxsa siz görmürsünüz? Söykənin oraya! İstər səbr edin, istər səbr etməyin, artıq sizin üçün eynidir. Siz, sadəcə etdiklərinizin qarşılığını alacaqsınız!–* (76/52, Tur / 1-16)

## Nəcm: 355

**17-20** Şübhəsiz, Allahın mühafizəsi altına daxil olan kəslər, Rəblərinin onlara verdiyi ilə sıra-sıra düzülmüş taxtlara söykənərək, zövqü-səfa sürərək cənnətlərdədirlər, nemətlər içindədirlər. Və Rəbləri onları cəhənnəm əzabından qorumuşdur. Biz onları iri gözlülərlə də qoşalaşdırdıq. *–"Etdiklərinizə qarşılıq nuşcanlıqla yeyin, için!"–*
**21** Və iman edən, soyları da iman ilə özlərinə tabe olan kimsələr; Bax Biz, onların soylarını da özlərinə qatdıq. Onların əməllərindən bir şey əskiltmədik. Hər kəs öz qazandığının girovudur.
**22** Onlar üçün canlarının istədiyi meyvələr və ətlərdən bol-bol sərgilədik.
**23** Orada, özündə (içində) boş sözə, cəfəngiyyata və günaha təhrik olmayan bir qədəhi (bir-birinə) vurarlar.
**24** Və özlərinə aid bəzi cavan oğlanlar onların ətrafında fırlanarlar; onlar sanki sədəfləri içində gizlənmiş inci kimidirlər.
**25-28** Bir-birlərinin üzünə çevrilib soruşurlar: "Gerçəkdəm biz, daha öncə ailəmizin içində (olarkən) qorxanlardan idik. Allah bizə lütf etdi və bizi adamın içinə işləyən əzabdan qorudu. Şübhəsiz ki, biz daha öncə, Ona yalvarırdıq. Şübhəsiz ki, O, yaxşılıq edənin, mərhəmət edənin məhz Özüdür!"
**29** Haydı, sən öyüd ver! Artıq sən Rəbbinin neməti sayəsində kahin və gizli güclər tərəfindən dəstəklənən / dəli biri deyilsən.
**30** Yaxud onlar: "Bir şairdir, zamanın fəlakətlərinə uğramasını gözləyirik" deyirlər?
**31** Sən de ki: "Gözləyin, mən də sizinlə bərabər gözləyənlərdənəm."
**32** Onların ağıllarımı bunu əmr edir, yoxsa onlar azğın bir camaatdır?

**33,34** Yaxud, vəhy edilənləri, "Özündən uydurub söylədi"mi deyirlər? Əslində, onlar inanmırlar. Yaxşı, əgər doğru kimsələrdirsə, onun kimi bir sözü onlar da gətirsinlər.
**35** Yoxsa onlar heç bir şeysizmi yaradıldılar? Yoxsa özləri yaradandırlar?
**36** Yoxsa göyləri və yer üzünü özlərimi yaratdılar? Əslində, onlar qəti bilik sahibi deyillər.
**37** Yoxsa Rəbbinin xəzinələri onların yanındadır? Yaxud özləri hakimdirlər?
**38** Yoxsa özləri üçün dinləyəcəkləri bir nərdivanlarımı var? Elə isə dinləyənləri, açıq bir dəlil gətirsin.
**39** Ya da qızlar Ona, oğullar sizəmi (aiddir)?
**40** Yoxsa sən onlardan bir muzd istəyirsən və buna görə də onlar, borca görə ağır bir yük altınamı girdilər?
**41** Yoxsa görünməyən, eşidilməyən, hiss edilməyən, keçmiş, gələcək onların yanındadır və (bunu) onlarmı yazırlar?
**42** Yoxsa hiyləgər bir planmı qurmaq istəyirlər? Fəqət kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrin] özləri hiyləgər bir plana düşənlərdir.
**43** Yoxsa onlar üçün Allahdan başqa bir ilahmı var? Allah, onların ortaq qoşduqları şeylərdən pakdır.
**44** Və göydən düşməkdə olan bir parça görsələr, "Üst-üstə yığılmış buludlardır" deyərlər.
**45** Artıq onları, huşsuz düşüb yıxılacaqları günlərinə qovuşana qədər burax.
**46** O gün, hiyləgər planları onlara heç bir şəkildə fayda verməz və onlara yardım olunmaz.
**47** Bəli, şübhəsiz, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələrə, bundan aşağı bir əzab var, amma onların çoxu bilmir.
**48,49** Və sən Rəbbinin hökmü üçün səbr et. Artıq şübhəsiz sən Bizim gözlərimizin önündəsən. Qalxdığın zamanda, gecənin bir qismində və ulduzlar batarkən / Nəcmlərin sonunda Rəbbinin tərifi ilə birlikdə Onu nöqsan sifətlərdən pak tut. Haydı, Onu bütün nöqsan sifətlərdən pak tut! (76/52, Tur / 17-49)

## MULK [HÖKMRANLIQ] (77 – 67) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 356**

**1** Hökmranlıq (Öz) əlində olan Allah, necə də comərddir! Və O, hər şeyə qadirdir.
**2** O, hansınızın əməlcə daha yaxşı-gözəl olduğunu sınamaq üçün

ölümü və həyatı yaratdı. O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır.
3,4 O, yeddi göyü, bir-biri üzərinə ahəngli bir şəkildə yaradandır. Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] yaratmasında bir çatlaqlıq-uyğunsuzluq görə bilməzsən. Haydı, gözünü çevir (bax), bir nöqsan görürsənmi? Sonra gözünü iki dəfə daha çevir. Gözün, aciz olaraq və çox yorğun olduğu halda sənə dönəcəkdir.
5 Və and olsun ki, Biz ən yaxın göyü qəndillərlə süslədik və onları, kahinlərin uydurmaları üçün material [meteorların yer üzünə düşməsi ilə, insanların kosmosdakı varlıqları tanımalarıyla şeytanların; kahinlərin, falçıların saxtakarlıqlarının ortaya çıxması üçün material] etdik. Və onlar üçün alovlu atəş əzabını hazırladıq. (77/67, Mulk / 1-5)

## Nəcm: 357

6 Kafirlər [Rəblərini bilərək rədd edənlər / iman etməyənlər] üçün də cəhənnəm əzabı vardır. Və o, necə də pis dönüş yeridir!
7 Oraya atıldıqları zaman, o qaynayarkən, onun qorxunc səsini eşidərlər.
8 O, az qalsın öfkəsindən çatlayacaq. Hər nə zaman oraya bir camaat atılsa, onun gözətçiləri onlardan soruşar: “Sizə xəbərdarlıq edən biri gəlmədimi?”
9 Onlar deyərlər ki: “Bəli, bizə xəbərdarlıq edən gəldi, lakin biz (onu) yalanladıq və ‘Allah heç bir şey nazil etmədi, siz ancaq böyük bir azğınlıq içindəsiniz’ dedik.”
10 Və onlar deyərlər ki: “Əgər biz dinləmiş olsaydıq, yaxud ağlımızı işlətsəydik, bu çılğın atəşin əshabı içində olmazdıq.”
11 Beləliklə, günahlarını etiraf etdilər. Artıq, ən xırda, toz-duman olmaq (məhv olmaq), çılğın atəşin əshabı üçündür. (77/67, Mulk / 6-11)

## Nəcm: 358

12 Şübhəsiz ki, görünməyən, eşidilməyən, hiss edilməyən kimsəsiz yerdə Rəblərindən hörmətlə, sevgiylə və biliklə ürpərənlər; bağışlanmaq və böyük bir mükafat, onlar üçündür.
13 Və sözünüzü istər gizləyin, istər onu açığa vurun; şübhəsiz ki, Allah, sinələrin özünü ən yaxşı biləndir.
14 Yaradan bilməzmi? / O, yaratdığını bilməzmi? Və O, daha çox lütf edən, gizliləri biləndir, hər şeyin iç üzünü, gizli tərəflərini də yaxşı biləndir.
15 Allah, yer üzünü sizə təslim edəndir. Haydı, onun çiyinlərində;

təpələrində / işinizə yarayan yerlərində gəzin və Allahın ruzisindən yeyin. Və dirilmə, ancaq Onadır. (77/67, Mulk / 12-15)

## Nəcm: 359

**16** Ucalardan uca olan Allahın[314] sizi yerə batırmasından güvəndəsinizmi? Bir də görərsən ki, (qəfildən) çalxalanmışdır.
**17** Yaxud da siz, ucalardan uca olan Allahın üzərinizə daş yağdıran bir qasırğa göndərməyəcəyindən güvəndəsinizmi? Artıq, xəbərdarlığımın necə olduğunu yaxında biləcəksiniz.
**18** Və and olsun, onlardan öncəkilər də yalanladılar. Yaxşı, Məni tanımamağın / tanıtmamağa çalışmağın (nəticəsi) necə oldu?
**19** Və onlar, üstlərindəki sıra-sıra sıralanmış və bükülmüş halda uçan şeylərə göz atmırlarmı? Onları Rəhmandan [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahdan] başqası saxlamır. Şübhəsiz ki, O, hər şeyi ən yaxşı görəndir.
**20** Rəhmanın [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allahın] altındakılardan sizə yardım edəcək bu əsgərləriniz kimlərdir? Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər], sadəcə bir aldanış içərisindədirlər.
**21** Və ya Allah, ruzini kəsərsə, sizə ruzi verəcək o kimsə kimdir? Əslində onlar azğınlıq və nifrətdə dirənib durmaqdadırlar (inadkarlıq etməkdədirlər).
**22** İndi, üzü üstə qapanaraq sürünənmi daha doğru gedər, yoxsa ən doğru yolda dümdüzmü gedən?
**23** De ki: "O, sizi inşa edən, sizə qulaq, gözlər və könüllər yaradandır. Sahib olduğunuz nemətlərin qarşılığını necə də az ödəyirsiniz?"
**24** De ki: "O, sizi yer üzündə törədib artırandır və siz cəm edilib Ona götürüləcəksiniz."
**25** Bir də onlar: "Əgər doğru kimsələrdənsinizsə, bu təhdid nə zamandır?" deyirlər.
**26** De ki: "Həqiqətən bu təhdidin biliyi Allahın yanındadır. Mən isə yalnızca açıq-aşkar bir xəbərdar edənəm."
**27** Artıq onlar, onu yaxınlaşmış görüncə kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] üzləri pisləşdi. Və (onlara): "Bax, bu, çağırıb durduğunuz şeydir!" deyildi.
**28** De ki: "Heç düşündünüzmü? Əgər Allah məni və mənimlə bərabər olanları dəyişikliyə / məhvə məruz qoysa, yaxud bizə mərhəmət etsə, bəs, kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələri] acı bir əzabdan kim qoruyacaq?"
**29** De ki: "O, yaratdığı bütün canlılara dünyada daha çox mərhəmət edəndir. Biz, Ona iman gətirdik və (işlərin) nəticəsini sadəcə Ona

həvalə etdik. Artıq kimin açıq-aşkar bir azğınlıq içində olduğunu yaxında biləcəksiniz.”
**30** De ki: “Heç düşündünüzmü? Əgər suyunuz yerin dibinə çəkdirilərsə, sizə kim bir axar (bulaq) suyu gətirə bilər?”
(77/67, Mulk / 16-30)

## HAQQƏ (78 – 69) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 360**
**1** Gerçəkləşəcək olan!
**2** “Gerçəkləşəcək olan” nədir?
**3** “Gerçəkləşəcək olan” nədir, (bunu) sənə nə bildirdi?
**13-17** Sura bircə dəfə üfürüldüyü,[315] yer üzü və dağlar yerindən qaldırılıb bir həmlədə bir-birinə çırpılaraq darmadağın olduğu zaman, bax o gün, “o hadisə” olmuşdur. Və göy yarılmışdır, artıq o, o gün dayaqsızdır. Bütün qüvvələr, səmanın ətrafındadır. O gün Rəbbinin böyük taxtını;[316] varlığını, birliyini, ucalığını, ən uca məqam sahibi olduğunu, məhv edilən keçmiş varlıqların yerinə yaradılan, daha yaxşı, daha mükəmməl yeni varlıqlar əks etdirərlər.
**18** O gün siz geniş bir şəkildə yayılacaqsınız, sizdən heç bir gizli şeyiniz gizli qalmayacaq.
**19-24** Bax kitabı sağından verilən kəsə gəlincə; bax o: “Alın, oxuyun kitabımı. Şübhəsiz ki, mən, hesabıma qovuşacağıma inanırdım / həqiqətən bilirdim” deyər. Artıq o, meyvələri sallanan yüksək bir cənnətdə məmnun bir həyatdadır. *–Keçmiş günlərdə etdiyiniz işlərdən ötrü nuşcanlıqla yeyin, için!–*
**25-29** Və kitabı solundan verilən kimsəyə gəlincə, o: “Kaş ki, kitabım mənə verilməsəydi, hesabımın da nə olduğunu bilməsəydim. Nə olardı o iş bitmiş olsaydı. Malım mənə heç bir fayda vermədi. Gücüm / nüfuzum da məndən yox olub getdi” deyər.
**30-37** *–Onu tutun, sonra da bağlayın. Sonra cəhənnəmə söykəyin onu. Sonra da onu yetmiş arşın zəncir içərisində cəhənnəmə salın! Şübhəsiz ki, o, çox böyük olan Allaha inanmırdı. Miskini yedirtməyə də rəğbət oyatmırdı. Bu səbəblə, bu gün burada onun üçün heç bir səmimi dost yoxdur. Sadəcə xəta edənlərin yeməyi olan bir irindən başqa yemək də yoxdur.–* (78/69, Haqqə / 1-3, 13-37)

**Nəcm: 361**
**4** Səmud və Ad, fəlakət qapısını şiddətlə çalanı, dəhşətə salanı yalanladılar.
**5** Sonra, Səmud qövmünə gəlincə; onlar qorxunc bir səslə dəyişikliyə /

məhvə məruz qoyuldular.
**6** Ad qövmünə gəlincə; onlar gurultulu və azğın bir fırtına ilə dəyişikliyə / məhvə məruz qoyuldular.
**7** Allah, o fırtınanı onların üzərlərinə yeddi gecə və səkkiz gün; gecəli gündüzlü, dalbadal müsəllət etmişdi (əsdirdi). Belə ki, o qövmü, fırtınanın içində, içi boş xurma kötükləri kimi yerə sərilmiş halda görərsən.
**8** Bax, indi onlara aid hər hansısa bir qalıq görə bilirsənmi?
**9** Firon, ondan öncəkilər və altı-üstünə gətirilənlər də, o xəta ilə gəldilər.
**10** Sonra da onlar Rəblərinin elçisinə qarşı gəldilər və Rəbləri, onları çox şiddətli bir əzabla yaxaladı.
**11,12** Şübhəsiz, Biz, onu sizə bir ibrət edək və dərk edən qulaqlar bunu dərk edib yadda saxlasın deyə sular qabarınca sizi gəmidə Biz daşıdıq.[317] (78/69, Haqqə / 4-12)

**Nəcm: 362**
**38-43** Artıq gördüklərinizə və görmədiklərinizə and olsun ki, şübhəsiz ki, Quran, şərəfli bir Elçi sözüdür. Və o, bir şair sözü deyildir. *–Siz necə də az inanırsınız!–* (O,) bir kahin sözü də deyildir. *–Siz necə də az düşünürsünüz / öyüd alırsınız!–* Quran, aləmlərin Rəbbindən nazil edilmədir.
**44-47** Əgər Elçi / Muhəmməd, bəzi sözləri Bizim sözlərimiz kimi ortaya çıxartsaydı, həqiqətən ondan bütün gücünü alardıq. Sonra Ondan can damarını həqiqətən kəsərdik. Artıq sizdən heç biriniz Ona qalxan da ola bilməzdiniz.
**48** Və şübhəsiz, Quran, Allahın mühafizəsi altına daxil olan kəslər üçün bir öyüddür.
**49** Və Biz, həqiqətən sizdən yalan sayanların varlığını bilirik.
**50** Və şübhəsiz, Quran, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün bir həsrətdir.
**51** Və şübhəsiz Quran, qəti məlumatın gerçəyidir.
**52** O halda, çox böyük (olan) Rəbbinin adını təmizə çıxart!
(78/69, Haqqə / 38-52)

## MƏARİC (79 – 70) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 363**
**1-3** Bir istəyən, "yüksəlmə zamanlarının" sahibi Allahdan, onu müdafiə edəcək heç kimin olmadığı; *əngəllənə bilməyən, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] xas olan,*

"olacaq azabı" istədi.
**4** Xəbərçi ayələr və vəhy, ölçüsü əlli min il olan bir gün içində Ona yüksələr / yer üzündən çəkilər.
**5** O halda, sən, gözəl bir səbr ilə səbr et.
**6,7** Şübhəsiz, Biz, olacaq əzabı çox yaxın görərkən, onlar onu çox uzaq görürlər.
**8-10** O gün göy ərimiş bir mədən kimi olar. Dağlar da atılmış rəngli yun kimi olar. Və bir isti; yaxın dost başqa bir isti; yaxın dostdan soruşmaz.
**11-14** Bir-birlərinə göstərildikləri halda, günahkar, o günün əzabından qurtulmaq üçün oğullarını, zövcəsini və qardaşını, onu saxlayıb-bəsləyən, içində yetişdiyi bütün ailəsini və yer üzündə olanların hamısını fidyə / qurtulmaq qarşılığı olaraq vermək sonra da özünün qurtulmasını istəyər.
**15-18** Qətiyyən o günahkarın düşündüyü kimi deyil! O, arxasını dönən və üz çevirəni, toplayıb kassada yığanı çağıran, qovurub soyan, alovlanan bir atəşdir. (79/70, Məaric / 1-18)

**Nəcm: 364**
**19-21** Şübhəsiz, insan dözümsüz və kəmhövsələ yaradılmışdır; ona pislik üz verdikdə, şikayətlənər. Ona bir xeyir nəsib olduqda / varlandırıldıqda isə kiçik bir yardımı belə əngəlləyər.
**22** Ancak "səlatçılar" [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyi prinsip halına gətirənlər] bunun xaricindədir.
**23** Səlatçılar ki, səlatlarını [maddi və zehni baxımdan dəstək olmağı; cəmiyyəti maarifləndirməyi] davam etdirənlərdir.
**24,25** Və səlatçılar o kimsələrdir ki, onların mallarında, istəyən və istəməkdən utanan yoxsullar üçün bəlli bir haqq vardır.
**26** Və səlatçılar, cəza gününü təsdiq edərlər.
**27** Və səlatçılar, Rəblərinin əzabından qorxanlardır.
**28** *–Şübhəsiz, Rəblərinin əzabından güvəndə olmaq olmaz.–*
**29-31** Və səlatçılar, irzlərini qoruyanlardır. *–Ancaq zövcələri və ya müqavilələrinin sahib olduqları*[318] *istisnadır. Çünki onlara yaxınlaşdıqlarında, qınanmazlar. Bundan artığını istəyənlər; bax onlar həddi aşanların məhz özüdür.–*
**32** Və səlatçılar, əmanətlərinə və əhdlərinə riayət edərlər.
**33** Və səlatçılar, şahidliklərini yerinə yetirərlər.
**34** Və səlatçılar, səlatlarını [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə prinsiplərini] hifz edərlər.
**35** Bax bu səlatçılar cənnətlərdə qarşılanarlar. (79/70, Məaric / 19-35)

**Nəcm: 365**

**36,37** İndi kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrə] nə olub ki, hər tərəfdən, qrup-qrup boyunlarını uzadaraq sənə doğru qaçırlar?
**38** Onlardan hər biri, bir nemət cənnətinə daxil ediləcəyinimi ümid edir?
**39** Qətiyyən onların düşündüyü kimi deyil! Biz, onları bildikləri şeydən yaratdıq.
**40,41** Artıq xeyr. Məşriqlərin və məğriblərin Rəbbinə and olsun ki, onların yerinə onlardan daha xeyirli olanları gətirməyə həqiqətən Bizim gücümüz çatar. Və Biz, qarşısı alınanlar deyilik (heç kəs Bizim önümüzə keçə bilməz).
**42** Sən onları dərhal burax, vəd edilən günlərinə qovuşanadək boş şeylərlə məşğul olsunlar və oynamağa davam etsinlər.
**43** O gün onlar qəbirlərdən tullana-tullana (tələm-tələsik) çıxarlar. Sanki dik (qoyulmuş) bir şeyin yanına qaçırlar.
**44** Gözləri təhqirdən aşağı salınmış və özləri də hörmətsiz olan bir halda. Bax bu, onların təhdid edildikləri gündür! (79/70, Məaric / 36-44)

## NƏBƏ [ÖNƏMLİ XƏBƏR] (80 – 78) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 366**

**1-3** Nə haqqında; Özlərinin, onun barəsində ayrı-ayrı (ixtilaflı) inanca sahib olduqları böyük, önəmli o xəbər haqqındamı soruşurlar?
**4** Qətiyyən onların düşündüyü kimi deyil! Onlar yaxında biləcəklər.
**5** Yenə də, qətiyyən onların düşündüyü kimi deyil! Onlar yaxında biləcəklər.
**6,7** Biz yer üzünü bir beşik, dağların da hər birini bir dirək etmədikmi?
**8** Və Biz sizi cüt-cüt yaratdıq.
**9** Və Biz, sizin yuxunuzu bir dincəlmə etdik.
**10** Və Biz, gecəni bir libas etdik.
**11** Və Biz, gündüzü bir dolanışıq vaxtı etdik.
**12** Və sizin üstünüzdə yeddi sağlam (şeyi) bina etdik.
**13** Və işıq saçan bir qəndil etdik. (80/78, Nəbə / 1-13)

**Nəcm: 367**

**14-16** Və Biz, sıxışdırılmış buludlardan, şırıl-şırıl tökülən su endirdik ki, ondan dənələr, otlar, bir-birinə sarmaşan bağlar və bağçalar çıxaraq.
**17** Şübhəsiz, Ayırma günü qərarlaşdırılmış bir görüşmə vaxtıdır.
**18** O gün Sura üfürülər;[319] siz də dərhal bölük-bölük gələcəksiniz.

**19** Göy üzü də qapı-qapı açılmışdır.
**20** Dağlar da hərəkətə gətirilib ilğıma dönmüşdür.
**21,22** Şübhəsiz, cəhənnəm, azğınlar üçün son məskən olaraq, gözləmə / pusqu yeridir.
**23** Orada darlıq / qıtlıq içində qalacaqlar.
**24** Orada bir sərinlik və içəcək bir şey dada bilməzlər.
**25,26** Ancaq etdiklərinə uyğun bir cəza olaraq, qaynar su və irin dadarlar.
**27** Şübhəsiz, onlar haqq-hesabı ümid etmirdilər.
**28** Və ayələrimizi / əlamətlərimizi / işarətlərimizi elə hey yalanladılar.
**29** Halbuki Biz hər şeyi yazaraq saydıq, (ortaya) tökdük.
**30** *–Haydı, dadın! Bundan belə sizə əzabdan başqa bir şey artırmayacağıq.–*
**31-37** Həqiqətən Allahın mühafizəsi altına daxil olan kəslər üçün, Rəbbindən; göylərin, yerin və ikisi arasındakıların Rəbbindən; Rəhmandan [yaratdığı bütün canlılara dünyada daha çox mərhəmət edən Allahdan] bir qarşılıq və yetərli bir bəxşiş olaraq sığınacaqlar / qurtuluş məkanları; sulu bağlar-bağçalar, üzümlər, hamısı eyni səviyyədə tumurcuqlar; çiçək bağçaları, dolu-dolu su qabları var. Onlar, orada boş bir söz və yalan eşitməzlər. *–Onlar, Onun hüzurunda söz söyləməyə qadir olmazlar.–* (80/78, Nəbə / 14-37)

## Nəcm: 368

**38-40** Nazil edilmiş ayələr və vəhy, şahid olaraq səf-səf düzüldükləri gün, Rəhmanın [yaratdığı bütün canlılara dünyada daha çox mərhəmət edən Allahın] icazə verdikləri xaricində heç kimsə danışa bilməz. Və o icazə verilən də, doğrunu söyləyər: *“Bax bu, haqq gündür. Artıq kim istəsə, Rəbbinə sığınar. Şübhəsiz ki, Biz sizə yaxın bir əzab ilə xəbərdarlıq etdik.”* O gün, adam iki gücünün / mülk və çevrəsinin nə təqdim etdiyinə baxar / etdikləri ilə üz-üzə gələr və kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] kəs: “Ah, nə olaydı, mən bir torpaq olsaydım” deyər. (80/78, Nəbə / 38-40)

# NAZİAT (81 – 79) SURƏSİ
# MƏKKƏ DÖVRÜ

## Nəcm: 369

**1-5** Kainatdakı cazibə qüvvəsi, kainatdakı itələmə qüvvəsi, ulduzlar; qalaktikalar; günəş, ay və bunların öz oxu ətrafında və bağlı olduğu ulduz çevrəsindəki orbitlərdə üzməsi, bu sayədə gecə, gündüz və digər həyat şərtlərinin, qabarma və çəkilmə hadisəsinin, gecə-gündüzün, mövsümlərin yaranması,

bütün canlı növlərinin və bitkilərin həyat şəraitinin nizamlanması dəlildir ki,
Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər üçün daimi sıxıntı, böhran və vicdan əzabına səbəb olan,
möminlərə həm asan olan, həm də asanlaşdıran, onlara müjdələr verən, onların xoşbəxtliyini təmin edən,
əldən ələ, dildən dilə, könüldən könülə gəzən, həmişə önə keçən, önəm verdirən, fərdi və ictimai bütün işləri tənzimləyən, hər işə aid əmrlərinin və qadağalarının olması; qanunlar qoyan Quran ayələri dəlildir ki,[320]

**26** Şübhəsiz, bunda; *"O gün, adamın iki gücünün / mülk və çevrəsinin nə təqdim etdiyinə baxıb / etdikləri ilə üz-üzə gəlib və kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] kəsin 'Ah, nə olaydı, mən bir torpaq olsaydım' deməsində"*, hörmətlə, sevgiylə və biliklə ürpərən kimsələr üçün bir ibrət var.[321] (81/79, Naziat / 1-5, 26)

**Nəcm: 370**

**10,11** Onlar, "Biz təkrar əvvəlki halımıza göndəriləcəyik, eləmi? Biz, çürümüş sümüklər olduqdan sonramı?" deyirlər.
**12** Dedilər ki: "Elə isə, bu çox zərərli bir dönüşdür."
**27-33** Yaradılış baxımından siz daha çətinsiniz, yoxsa göy? Göyü, Allah yaratdı; boyunu yüksəltdi, sonra da onu nizama saldı, gecəsini qaranlıq etdi və işığın parlaqlığını artırdı. Və ondan sonra, sizin və heyvanlarınız üçün faydalansın deyə, yer üzünü döşədi / yer üzündən suyunu və otlağını çıxartdı, dağları da sabitlədi / sağlam bir şəkildə yerləşdirdi.
**6** O gün, titrədən titrədəcək.
**7** Onun arxasından ikinci bir sarsıntı gələcək.
**8** Ürəklər o gün (qorxudan) titrəyərək döyünər.
**9** Onların gözlərində hörmət olacaq.
**13** Bax o, tək bir hayqırmadır.
**14** Bir də görərsən ki, onlar meydandadır.
**34** Artıq o ən böyük fəlakət gəldiyi vaxt,
**35** O gün, insan nə etdiyini çox yaxşı anlayacaq.
**36** Görən kimsələr üçün cəhənnəm açıq-aşkar göstəriləcək.
**37-39** Artıq azmış və dünya həyatına üstünlük vermiş kimsəyə gəlincə, bax şübhəsiz, cəhim / cəhənnəm, (onun üçün) təyin edilmiş yerin məhz özüdür.
**40,41** Rəbbinin məqamından qorxan və özünü boş və müvəqqəti arzudan uzaq tutan kimsəyə gəlincə; artıq, heç şübhəsiz cənnət, (onun

üçün) sığınılacaq (içində yaşanacaq) yerin məhz özüdür.
(81/79, Naziat / 10-12, 27-33, 6-9, 13-14, 34-41)

**Nəcm: 371**

**42** Səndən o qiyamətin qopacağı vaxtı soruşurlar; o nə vaxt lövbər salacaq?
**43** Onun xatırlanması üçün səndə nə var ki?
**44** Onun nəticəsi sadəcə sənin Rəbbinə aiddir.
**45** Sən, ancaq qiyamətin qopma zamanına, hörmətlə, sevgiylə, biliklə ürpərti duyan kəslərin uyarıcısısan.
**46** Sonra onlar onu görəcəkləri gün, dünyada bir axşam və ya səhərdən artıq qalmamış kimi (olacaqlar). (81/79, Naziat / 42-46)

**Nəcm: 372**

**15** Musanın xəbəri sənə gəldimi?
**16,17** Bir vaxt Rəbbi ona müqəddəs Tuva vadisində / iki dəfə təmizlənmiş vadidə səslənmişdi: "Fironun yanına get! Şübhəsiz ki, o, azdı (həddini aşdı)."
**18,19** Sonra de ki: "Pak olmaq istəyirsənmi? Və səni Rəbbinə yönləndirim ki, Ona qarşı hörmətlə, sevgiylə və biliklə ürpərəsən!"
**20** Sonra da Musa Firona o ən böyük əlaməti / işarəti göstərdi.
**21-24** Sonra da Firon, yalanladı və qarşı gəldi. Sonra tez arxasını çevirdi. Sonra toplayıb səsləndi və: "Mən, sizin ən uca rəbbinizəm!" dedi.
**25** Allah da, (onu) dünya və axirət əzabıyla yaxaladı. (81/79, Naziat / 15-25)

## İNFİTAR (82 – 82) VƏ İNŞİQAQ (83 – 84) SURƏLƏRİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 373**

**1-5** Göy çatladığı zaman, ulduzlar tökülüb dağıldığı zaman, dənizlər yarılıb axıdıldığı zaman, qəbirlər alt-üst edildiyi zaman; hər kəs, qabaqcadan göndərdiyi və geridə buraxdığı şeyləri öyrənmişdir.
(82/82, İnfitar / 1-5)

**Nəcm: 374**

**6-8** Ey insan! Üstün kərəm sahibi olan, səni yaradan, sonra da sənə bir nizam daxilində surət verən, sonra da səni tarazlayan, istədiyi bir surətdə səni tərtib edən Rəbbinə qarşı səni aldadan şey nədir?
**9-12** Qətiyyən sizin düşündüyünüz kimi deyil! Əslində siz, şübhəsiz üzərinizdə, etdiyiniz şeyləri əzbərləyən, hörmətli yazanlar (mötəbər katiblər) olmasına rəğmən, Dini yalan sayırsınız.
**13** Şübhəsiz ki, "əbrar / yaxşı adamlar", əlbəttə bol nemətlərin,

xoşbəxtlik cənnətinin içindədirlər.
**14-16** Din-iman tanımayıb pisliyə batmış olanlar da həqiqətən cəhənnəmdədirlər. Din günü ondan (uzaqlaşıb) itməmək üzrə, oraya söykənəcəklər.
**17** Din gününün nə olduğunu sənə nə bildirdi? **18** Sonra bir dəfə daha,
Din gününün nə olduğunu sənə nə bildirdi? **19** Din günü heç kimsə
heç kimsəyə ağalıq edə bilməz. Və o gün; **İnşiqaq 1-5** Gök yarıldığı,
Rəbbinə qulaq asdığı və gerçəkləşdirildiyi zaman; yer üzü də dümdüz
olduğu, içində nə varsa atdığı, boşaldığı və Rəbbinə qulaq asdığı və
gerçəkləşdirildiyi zaman **19** hökm Allaha aiddir.
**6** Ey insan! Şübhəsiz ki, sən Rəbbinə doğru qaçdıqca qaçan birisən. Sonunda da Ona qovuşacaqsan.
**7-9** Artıq, kitabı sağ əlinə verilən kəsə gəlincə; o, asan bir haqq-hesaba çəkiləcək və o, sevincli olaraq yaxınlarının yanına dönəcəkdir.
**10-14** Kitabı arxa tərəfindən verilən kəsə gəlincə, o, ölümü çağıracaq və alovlu atəşə girəcək. Şübhəsiz ki, o, yaxınlarının arasında sevincli idi. Şübhəsiz ki, o, əsla (Rəbbinə) dönməyəcəyinə əmin idi.
**15** Xeyir, şübhəsiz, Rəbbi onu çox yaxşı görəndir.
**16-19** O halda, o şəfəq, gecə və içində saxladığı şeylər yığıldığı zaman o ay dəlildir ki, siz həqiqətən haldan-hala düşürsünüz [davamlı dəyişəcəksiniz, əsla yox olub getməyəcəksiniz].
**20,21** O halda, onlara nə olur? İman etmirlər və onlara Quran oxunduğu vaxt boyun əyib təslimiyyət göstərmirlər / razı olmurlar?
**22** Əksinə, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] yalan sayırlar.
**23** Halbuki Allah, içlərində saxladıqlarını ən yaxşı biləndir.
**24** Artıq sən onlara ağrılı-acılı bir əzabı müjdələ!
**25** Ancaq iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələr bunun xaricindədir, onlar üçün tükənməz bir muzd / mükafat vardır. (82/82, İnfitar / 6-19 + 83/84, İnşiqaq / 1-25)

## RUM (84 – 30) SURƏSİ
## MƏKKƏ DÖVRÜ

**Nəcm: 375**
**1** Əlif / 1, Lam / 30, Mim / 40.[322]
**2-6** Rumlular / Bizanslılar, yer üzünün ən alçaq / çökək yerində məğlub oldular. Onlar, bu məğlubiyyətlərinin ardından bir neçə il içində qalib gələcəklər. Bundan öncə və sonra əmr Allahındır. Və o gün möminlər, Allahın yardımıyla sevinəcəklər. Allah, Özünün bir vədi olaraq, istədiyinə yardım edər, qalib edər. Allah vədindən dönməz. Amma insanların çoxu bilməz. O, ən üstün, ən güclü, ən

şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, geniş mərhəmət sahibidir.
7 İnsanların çoxu, bəsit dünya həyatında görünəni (zahirini) bilirlər. Və onlar, axirəti önəmsəmiyənlərin məhz özüdürlər. (84/30, Rum / 1-7)

## Nəcm: 376

8 Öz-özlüklərində heç düşünmədilərmi ki, Allah göylərdə, yerdə və bu ikisi arasında olan hər şeyi ancaq haqq ilə və müəyyən edilmiş bir vaxt üçün yaratmışdır? Və şübhəsiz ki, insanlardan çoxu, Rəblərinə qovuşmağı həqiqətən bilərək rədd edənlərdir / iman etməyənlərdir.
9 Onlar, yer üzündə gəzib-dolanaraq, özlərindən öncəkilərin aqibətlərinin necə olduğuna baxmadılarmı? Onlar özlərindən daha güclü idilər; yer üzünü qazıb altını üstünə çevirmişdilər, onu (yer üzünü) bunların abad etdiklərindən daha çox abad etmişdilər. Elçiləri də onlara neçə-neçə açıq-aydın dəlilləri gətirmişdilər. O halda, Allah onlara haqsızlıq edəsi deyildi, fəqət onlar şirk qoşaraq özlərinə haqsızlıq etməkdə idilər.
10 Sonra Allahın ayələrini / əlamətlərini / işarətlərini yalan saydıqları üçün, pislik edən o kimsələrin aqibəti, "ən pis" oldu. Onlar istehza da edirdilər. (84/30, Rum / 8-10)

## Nəcm: 377

11,12 Allah, ilk olaraq yaradar, sonra onu geri qaytarar. Sonra da Ona döndərilirsiniz. Qiyamətin qopma anında da günahkarlar, naümid olarlar.
13 Onlar üçün ortaq qoşduqlarından, şəfaət; yardım, müdafiə edənlər də tapılmaz. Və onlar, öz ortaqlarını rədd etdilər / qəbul etmədilər.
14 Və Saatın qopduğu gündə də, bax o gün onlar ayrılarlar.
15 İndi, iman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləmiş kimsələrə gəlincə; artıq onlar, bir bağça içində sevindirilərlər.
16 Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə], ayələrimizi və axirət görüşməsini yalanlayan bu kimsələrə də gəlincə, bax onlar əzab içində hazır saxlanılarlar.
17,18 O halda, etməli olduğunuz (şey), axşama yetişdiyinizdə, səhərə yetişdiyinizdə, gecə əsnasında, günortaya yetişdiyinizdə; hər zaman Allahın (isim və sifətlərini) bütün nöqsan sifətlərdən təmizə çıxarmalısınız (pak tutmalısınız)! Göylərdə və yerdə də bütün təriflər sadəcə Ona aiddir; başqasını tərifləmək olmaz.
19 O, ölüdən dirini çıxarar, diridən də ölünü çıxarar və yer üzünə ölümündən sonra həyat verər. Sizlər də bax elə çıxarılacaqsınız.
(84/30, Rum / 11-19)

## Nəcm: 378

20 Onun sizi bir torpaqdan yaratması da Onun əlamətlərindən / işarətlərindəndir. Sonra da siz, indi, dağılıb yayılan bir bəşərsiniz.
21 Yenə Onun əlamətlərindən / işarətlərindəndir ki, sizin üçün nəfslərinizdən onlara isinəsiniz deyə zövcələr yaratmış, aranıza bir sevgi və mərhəmət qoymuşdur. Şübhəsiz ki, bunda yaxşı-yaxşı düşünən bir camaat üçün neçə-neçə əlamətlər / işarətlər vardır.
22 Yenə göylərin və yerin yaradılışı, dillərinizin və rənglərinizin müxtəlifliyi Onun əlamətlərindən / işarətlərindəndir. Şübhəsiz ki, bunda alimlər üçün neçə-neçə əlamətlər / işarətlər vardır.
23 Yenə gecədə və gündüzdə yatmağınız və nemətlərindən ruzi axtarmağınız Onun əlamətlərindən / işarətlərindəndir. Şübhəsiz ki, bunda qulaq asan bir camaat üçün neçə-neçə əlamətlər / işarətlər vardır.
24 Yenə Onun ayələrindəndir ki, sizə həm qorxu və həm də ümid vermək üçün şimşəyi göstərir. Və göydən bir su endirir sonra onunla yer üzünə ölümündən sonra həyat verir. Şübhəsiz ki, bunda ağlını işlədən bir camaat üçün neçə-neçə əlamətlər / işarətlər vardır.
25 Göyün və yer üzünün Öz əmri ilə dayanması yenə Onun əlamətlərindən / işarətlərindəndir. Sonra sizi yer üzündən yalnız bir çağırışla çağırdığı zaman, bir də görərsiniz ki, çıxarılırsınız.
46 Sizə rəhmətindən daddırsın, əmri ilə gəmilər üzüb getsin və sahib olduğunuz nemətlərin qarşılığını ödəyərsiniz deyə ərməğanlarından ruzi axtarmağınız üçün külələri müjdəçilər olaraq göndərməsi də Onun əlamətlərindən / işarətlərindəndir.
26 Göylərdə və yerdə kim varsa, hamısı Onundur. Hamısı də Ona ehtiram edənlərdir.
27 Və O, yaratmağı başladan, sonra onu çevirib yenidən (təkrar) edəndir. Və bu Ona çox asandır. Və göylərdə və yerdə ən uca örnək Onundur. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.[323]

(84/30, Rum / 20-25-46, 26-27)

## Nəcm: 379

28 Allah, sizə özünüzdən bir məsəl çəkir: Heç sizə ruzi olaraq verdiyimiz şeylərdə qanun ilə sizə təslim edilən kəslərdən[324] ortaqlarınız varmı ki, onlarla siz eyni olasınız və özünüzə (məxsus işlərdə) çəkindiyiniz / (özünüzə) dəyər verdiyiniz kimi onlardan da qarşılıqlı olaraq çəkinəsiniz / bir-birinizə eyni dəyəri verəsiniz və eyni olasınız? Biz, ağlını işlədən bir camaat üçün ayələri bax belə

açıqlayırıq.
**29** Əksinə, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələr, nadanlıqla boş, müvəqqəti arzularına uydular. Yaxşı, Allahın çaşdırdığını kim yola gətirə bilər? Onlar üçün yardım edəcək heç kimsə yoxdur. (84/30, Rum / 28-29)

## Nəcm: 380

**30** O halda sən üzünü, köhnə inanclarını tərk edən biri olaraq dinə, *insanları ilk olaraq yoxdan yaradan Allahın fitrətinə (xüsusiyyətinə)* tərəf yönəlt. Allahın yaratmasında dəyişiklik ola bilməz. Ən doğru / dayanıqlı din, budur. Fəqət insanların çoxu bilmir.
**31,32** Qəlbən Ona yönələnlər olaraq, Allahın mühafizəsi altına daxil olun, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradın-ayaqda tutun], ortaq qoşanlardan; dinlərini parça-parça (firqə-firqə) bölmüş, parçalayıcı qruplara ayrılmış kimsələrdən də olmayın. *–Hər parçalayıcı qrup öz yanlarındakı şeylərlə (sevinib) qürrələnməkdədir.–* (84/30, Rum / 30-32)

## Nəcm: 381

**33,34** İnsanlara bir sıxıntı toxununca da, Rəblərinə yönələrək Ona yalvarırlar. Sonra, onlara Özündən bir rəhmət daddırınca, bir də görərsən ki, içlərindən bir qrup, onlara verdiyimiz nemətlərə nankorluq etmək üçün Rəblərinin ortaqları olduğunu qəbul edirlər. *–Haydı, bəhrələnin görüm! Yaxında biləcəksiniz.–*
**35** Yoxsa Biz onlara bir dəlil nazil etmişik və o dəlil, onların Allaha ortaq qoşduqları şeylərimi söyləyir?
**36** Biz insanlara bir rəhmət daddırdığımız zaman da, onunla sevinib qudurğanlıq edirlər (yoldan çıxırlar). Əllərinin öncədən etdiyi şeylər səbəbiylə onlara bir pislik üz versə, dərhal ümidsizliyə düşürlər.
**37** Onlar, şübhəsiz Allahın istədiyi kimsəyə ruzini bol verdiyini və (yaxud) məhdudlaşdırdığını da görmədilərmi? Şübhəsiz ki, bunda iman edən bir camaat üçün əlamətlər / işarətlər vardır.
**38** Elə isə, yaxınlarına; yurdlarından çıxarılan fəqirlərə, miskinə və yolçuya (yolda qalana) haqqını ver. Bu, Allahın rizasını istəyənlər üçün daha xeyirlidir. Və bunlar öz vəziyyətini qoruyan, zəfər qazanan kimsələrin məhz özüdür.
**39** Və insanların malları içində artsınlar (mal-mülkü artsın) deyə ribadan (sələmdən) verdikləriniz, Allah yanında artmaz. Allahın rizasını diləyərək zəkatdan / vergilərinizdən verdikləriniz… Bax, o kimsələr, qat-qat artıranların məhz özüdür! (84/30, Rum / 33-39)

**Nəcm: 382**
**40** Allah, sizi yaradan, sonra sizə ruzi verən, sonra sizi öldürən və sizi dirildəndir. Heç sizin ortaq qoşduqlarınızdan, bunlardan birini edən kimsə varmı? Allah, onların ortaq qoşduqlarından pak və çox ucadır.
**41** İnsanlar [bəlkə] dönərlər deyə; öz əlləri ilə qazandıqları şeylər səbəbindən, etdiklərinin bir qismini onlara daddırmaq üçün quruda və dənizdə qarışıqlıq (fəsad) ortaya çıxdı.
**42** De ki: “Yer üzündə gəzib-dolanın və bundan öncəkilərin aqibəti necə olub bir baxın. Onların çoxu ortaq qoşanlar idi.”
**43-45** Elə isə, Allah tərəfindən, qarşısıalınmaz bir gün gəlməmişdən öncə üzünü ən doğru / qoruyan dinə çevir. O gün onlar, Allahın, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə ərməğanlarından qarşılıq verməsi üçün dəstə-dəstə ayrılarlar. Şübhəsiz ki, O, kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənləri] sevməz. Kim küfr işləyərsə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsə], artıq bu rəddi / iman etməməsi öz əleyhinədir. Kim də saleh əməli işləyərsə, artıq onlar da özləri üçün döşək / rahat bir yer hazırlamış olarlar.
**48** Allah küləkləri göndərəndir. Sonra küləklər, bir buludu sovururlar (hərəkətə gətirirlər). Sonra Allah onu göy üzündə necə istəyərsə elə yayar və onu parça-parça edər. Sonra da sən, onun dərinliklərindən yağmur çıxdığını görərsən. Bax Allah, onu qullarından istədiyi kimsələrə göndərdiyi vaxt, onlar müjdələnirlər, sevinirlər.
**49** Halbuki onlar, öncədən; daha öncə üzərlərinə endirilmədən əvvəl qəti surətdə ümid kəsmişdilər.
**50** Elə isə, Allahın rəhmətinin əsərlərinə bir bax; (gör) yer üzünü ölümündən sonra necə dirildir? Şübhə yoxdur ki, O, həqiqətən ölüləri dirildir və O, hər şeyə qadirdir.
**51** Və and olsun ki, Biz bir külək göndərsək və Allahın rəhmətinin əsəri olan bitkilərin saraldığını görsələr, mütləq onun arxasından küfr etməyə, Bizim ilah və rəbb olduğumuzu bilərək rədd etməyə başlayarlar.
**52** Buna görə də, sən ölülərə eşitdirə bilməzsən. O dəvəti, arxalarını çevirib gedən karlara da dinlədə bilməzsən.
**53** Sən korları da azğınlıqlarından doğru yola götürə bilməzsən. Sən ayələrimizi ancaq, iman edən kimsələrə eşitdirə bilərsən; artıq onlar Müsəlmanlardır.
**54** Allah, sizi gücsüz olaraq yaradandır. Sonra gücsüzlüyün arxasından qüvvət gətirdi. Sonra qüvvətin arxasından gücsüzlük və qocalıq gətirdi. O, istədiyini yaradır. Və O, ən yaxşı biləndir, ən yaxşı qadir olandır. (84/30, Rum / 40-45, 48-54)

## Nəcm: 383

**55** Və qiyamətin qopacağı gün günahkarlar bir saatdan artıq qalmadıqlarına and içərlər. Onlar bax belə döndərilirdilər.
**56** Özlərinə bilik və iman verilən kimsələr də deyəcəklər ki: “And olsun ki, Allahın yazısında, dirilmə gününə qədər qaldınız. Bax bu, ölümdən sonra dirilmə günüdür. Fəqət siz bunu bilmirdiniz.”
**57** Artıq o gün şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərə, bəhanələri fayda verməz. Onlar, bağışlanmazlar. (84/30, Rum / 55-57)

## Nəcm: 384

**58** Və and olsun ki, Biz, insanlar üçün bu Quranda bütün nümunələrdən həqiqətən nümunələr gətirdik. Və and olsun ki, sən onlara bir ayə də gətirsən o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr]: “Siz, sadəcə, batil şeyləri ortaya qoyanlarsınız” deyəcəklər.
**59** Bilməyən kimsələrin qəlbləri üzərinə Allah bax belə damğa vurar.
**47** Və and olsun ki, Biz səndən öncə bəzi elçiləri öz qövmlərinə göndərdik və onlar onlara (elçilər qövmlərinə) açıq-aşkar dəlilləri gətirdilər. Sonra Biz, günah işləyən kimsələri tutub cəzalandıraraq ədaləti təmin etdik. Möminlərə yardım etmək də, Bizim üzərimizdə bir haqq idi.[325]
**60** İndi sən səbirli ol. Şübhəsiz ki, Allahın vədi haqdır. Qəti iman etməmiş kimsələr, səni əsla yüngüllüyə vadar etməsinlər.
(84/30, Rum / 58-59, 47, 60)

# ƏNKƏBUT [DİŞİ HÖRÜMÇƏK] (85 – 29) SURƏSİ MƏKKƏ DÖVRÜ

## Nəcm: 385

**1** Əlif / 1, Lam / 30, Mim / 40.[326]
**2,3** İnsanlar, sınanmadan, “İman etdik” deməklə, buraxılacaqlarını sandılar? Və and olsun ki, Biz onlardan öncəkiləri də saflaşdırmaq üçün atəşlərə / sıxıntılara salmışdıq. Artıq əlbəttə Allah, doğru kimsələri bildirəcəkdir / işarələyib göstərəcəkdir və əlbəttə, yalançıları da mütləq bildirəcəkdir / işarələyib göstərəcəkdir.
**4-6** Yoxsa pislik edənlər, Bizdən önə keçə biləcəklərini / Bizdən qaça biləcəklərini sanırlar? Mənimsədikləri bu mühakimə necə də pisdir! Kim Allahla qarşılaşacağına ümid bəsləyirsə, heç şübhəsiz ki, Allahın təyin etdiyi zaman mütləq gələcəkdir. Və O, ən yaxşı eşidəndir, ən yaxşı biləndir. Və kim səy göstərərsə, ancaq özü üçün səy göstərər. Şübhəsiz ki, Allah, həqiqətən aləmlərdən zəngindir.
**7** Və iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələr,

onların pisliklərini əlbəttə örtəcəyik və həqiqətən onlara etdiklərinin daha gözəli ilə qarşılıq verəcəyik.
8 Və Biz insana, ata-anasına qarşı yaxşı davranmasını öhdəlik olaraq çatdırdıq. Əgər o ikisi, səni, haqqında biliyin (məlumatın) olmayan bir şeyi Mənə ortaq qoşmaq üçün məcbur edərlərsə, artıq o ikisinə itaət etmə. Dönüşünüz ancaq Mənədir. O zaman, sizə nə etdiklərinizi xəbər verəcəyəm.
9 İman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələri də, həqiqətən onları saleh kəslərin arasına daxil edəcəyik.
10 İnsanlardan bəziləri də var ki: “Biz Allaha iman etdik” deyər, sonra da Allah uğrunda əziyyət olunduğu zaman, insanların verdiyi sıxıntını Allahın əzabı kimi qəbul edər. Və əgər Rəbbindən bir yardım gəlsə, həqiqətən, “Şübhəsiz ki, biz sizinlə bərabər idik” deyəcəklər. Halbuki Allah onların sinələrindəkiləri; nələr düşünüb planladıqlarını ən yaxşı bilən deyilmi?
11 Və Allah, əlbəttə iman etmiş kəsləri bilər / bildirər / işarələyib göstərər, əlbəttə ikiüzlüləri də bilər / bildirər / işarələyib göstərər.
(85/29, Ənkəbut / 1-11)

## Nəcm: 386

12 Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər], möminlərə: “Bizim yolumuza tabe olun, həqiqətən sizin xətalarınızı / günahlarınızı biz yüklənərik” dedilər. Halbuki onların xətalarından, nə olursa olsun heç bir şeyi onlar daşıyası deyillər. Onlar, şübhəsiz ki, yalançıdırlar.
13 Onlar, əlbəttə öz yüklərini və öz yükləri ilə yanaşı neçə-neçə yükləri də daşıyacaqlar. Və uydurduqları şeylərdən (ötrü) qiyamət günü mütləq sorğu-sual olunacaqlar.
18 Və əgər siz yalanlasanız, bilin ki, sizdən öncəki bəzi ümmətlər də yalanlamışdı. Elçiyə düşən də açıq-aşkar təbliğdən başqa bir şey deyildir.[327]
(85/29, Ənkəbut / 12-13, 18)

## Nəcm: 387

19 Onlar, Allahın yaratmağa necə başlatdığını, sonra da bunu təkrarladığını da görmədilərmi? Şübhəsiz ki, bu, Allaha görə çox asandır.
20-22 De ki: “Yer üzünü gəzib-dolaşın və Onun yaratmağa necə başladığına bir baxın. Sonra Allah, son quruluşu inşa edəcək. Şübhəsiz ki, Allah hər şeyə qadirdir. O, istədiyi kimsəyə əzab edər, istədiyi kimsəyə də rəhmət edər. Və siz yalnızca Ona döndəriləcəksiniz. Və siz yer üzündə və göydə aciz qoyanlar deyilsiniz. Və sizin üçün Allahın altındakılardan bir qoruyucu (himayə edən), yol göstərən yaxın və

yardımçı yoxdur."
23 Və Allahın ayələrini / əlamətlərini / işarətlərini və Ona qovuşmağı bilərək rədd edən / iman etməyən kimsələr, bax onlar Mənim rəhmətimdən ümidlərini üzənlərdir və onlar üçün ağrılı-acılı bir əzab vardır. (85/29, Ənkəbut / 19-23)

**Nəcm: 388**
14 Və and olsun ki, Biz Nuhu öz qövmünə elçi göndərdik, (onların) arasında əlli ili sıxıntısız, neçə-neçə uzun sıxıntılı illər qaldı. Nəhayət, onlar şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləməyə davam edərkən, tufan onları yaxaladı.
15 Beləcə Biz, onu və gəmidə olanları qurtardıq və gəmini / cəzanı / qurtuluşu aləmlərə bir əlamət / işarət etdik.
16,17 İbrahimi də elçi göndərdik / qurtardıq. Bir vaxt o, öz qövmünə: "Allaha qulluq edin və Onun mühafizəsi altına daxil olun. Əgər bilsəniz, bu sizin üçün daha xeyirlidir. Şübhəsiz ki, siz Allahın altındakılardan bəzi bütlərə ibadət edirsiniz və yalan uydurursunuz. Xəbəriniz olsun ki, sizin Allahın altındakılardan məbud deyə o ibadət etdikləriniz, sizin üçün ruzi verməyə qadir deyillər. Onun üçün ruzini Allah yanında axtarın və Ona qulluq edin və sahib olduğunuz nemətlərin qarşılığını Ona ödəyin. Yalnızca Ona döndəriləcəksiniz" demişdi.
24 Sonra İbrahimin qövmünün cavabı, yalnız belə oldu: "Onu öldürün və ya yandırın / böyük sıxıntıya soxun." Sonra da Allah onu atəşdən / sıxıntıdan qurtardı. Şübhəsiz bunda, iman edən bir camaat üçün əlamətlər / işarətlər vardır.
25 Və İbrahim dedi ki: "Siz, sırf dünya həyatında öz aranızdakı sevgi üçün Allahın altındakılardan bəzi bütlər qəbul etdiniz. Sonra qiyamət günü biri-digərini tanımayacaq, biri-digərini kənarlaşdırıb, gözündən uzaqlaşdıracaqdır. Gedəcəyiniz yer də cəhənnəmdir. Və sizin üçün yardımçı da yoxdur."
26 Belə olduqda ona Lut inandı. Və İbrahim dedi ki: "Mən Rəbbimə hicrət edəcəyəm. Şübhəsiz ki, O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edənin məhz Özüdür."
27 Və Biz ona İshaqı və Yəqubu bəxş etdik. Və soyu içində peyğəmbərlik və Kitab verdik. Və Biz Ona dünyada muzdunu verdik. Şübhəsiz ki, o, axirətdə də salehlərdəndir.
28,29 Lutu da göndərdik. Bir vaxt o, qövmünə: "Şübhəsiz ki, siz, həqiqətən aləmlərdən sizdən öncə keçmiş olanların etmədiyi bir həyasızlığı edirsiniz! Siz həqiqətən, kişilərə yaxınlaşacaq, yol kəsəcək

və məclislərinizdə ədəbsizlik edəcəksiniz?” demişdi. Bunun üzərinə, qövmünün cavabı sadəcə belə oldu: “Doğru söyləyənlərdənsənsə, Allahın əzabını bizə gətir!”
30 Lut: “Ey Rəbbim! Bu qarışıqlıq (fəsad) çıxardan camaata qarşı mənə yardım et!” dedi.
31 Və elçilərimiz İbrahimə müjdəni gətirdiklərində: “Biz bu şəhərin əhalisini məhvə məruz qoyacağıq” dedilər. *–Şübhəsiz ki, oranın əhalisi şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələr idi.–*
32 İbrahim: “Şübhəsiz orada Lut var!” dedi. Onlar: “Biz orada kimlərin olduğunu çox yaxşı bilirik. Onu və geridə qalanlardan biri olan arvadı xaricində, ailəsini əlbəttə qurtaracağıq” dedilər.
33,34 Elçilərimiz Lutun yanına gəldikləri zaman, o, onlara görə narahat oldu. Və onların üzündən əli-qolu bağlandı qaldı. Və elçilər: “Qorxma, narahat olma! Şübhəsiz ki, biz, səni və geridə qalanlardan biri olan arvadın xaricində yaxınlarını qurtaracağıq. Şübhəsiz ki, biz, bu şəhər əhalisinin üzərinə, haqq yoldan çıxmaqda indakarlıq göstərdikləri səbəbiylə səmadan bir əzab endirəcəyik.” dedilər.
35 Və and olsun ki, Biz ağlını işlədən bir camaat üçün o (şəhərdən) açıq-aşkar bir əlamət / işarət qoyduq.
36 Mədyənə də qardaşları Şüeybi göndərdik. Sonra Şüeyb: “Ey qövmüm! Allaha qulluq edin, axirət gününə ümid edin, yer üzündə fəsadçılar olaraq qarma-qarışıqlıq yaratmayın!” dedi.
37 Bunun üzərinə Onu yalanladılar, sonra da onları bir sarsıntı yaxaladı və yurdlarında dizüstə çöküb qaldılar.
38 Ad və Səmud qövmlərini dəyişikliyə / məhvə məruz qoyduq. Onların dəyişikliyə / məhvə məruz qalmaları, onların yurdlarından sizə həqiqətən aydın olmuşdur. Və şeytan onlara, etdiklərini süslədi və onları yoldan çıxardı. Halbuki onlar görüb anlayan kimsələr idi.
39 Qarunu, Fironu və Hamanı da məhv etdik. And olsun ki, Musa onlara açıq-aşkar dəlillər ilə gəlmişdi, ancaq onlar yer üzündə təkəbbür göstərmişdilər. Halbuki onlar, (Bizim iradəmizin önünə) keçənlər deyillər.
40 Bax, (onların) hamısını günahları səbəbiylə yaxaladıq. Onlardan bəzilərinin üzərinə daşlar sovuran küləklər göndərdik, onlardan bəzilərini qorxunc bir səs yaxaladı, onlardan bəzilərini yerin dibinə batırdıq, onlardan bəzilərini də suda boğduq. Və Allah onlara haqsızlıq etmirdi. Lakin onlar şirk qoşmaq surətiylə özlərinə haqsızlıq edirdilər.
(85/29, Ənkəbut / 14-17, 24-40)

## Nəcm: 389

41 Allahın altındakılardan yardımçı, yol göstərən, qoruyucu (himayə

edən) yaxın qəbul edənlərin vəziyyəti, özünə ev quran dişi hörümçəyin vəziyyəti kimidir. Şübhəsiz ki, evlərin ən çürüyü də həqiqətən dişi hörümçək evidir. Kaş ki, onlar bilsəydilər.
42 Şübhəsiz ki, Allah, onların, Özünün altındakılardan hansı şeyə yalvardıqlarını bilir. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
43 Və Biz, bu nümunələri insanlara veririk. Onları da alimlərdən başqası dərk edə bilməz.
44 Allah, göyləri və yeri haqq ilə yaratdı. Şübhəsiz, bunda iman edənlər üçün həqiqətən bir əlamət / işarət vardır. (85/29, Ənkəbut / 41-44)

## Nəcm: 390

45 Sən, sənə kitabdan vəhy ediləni oxu / izlə və səlatı iqamə et [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yarat-ayaqda tut]. Həqiqətən səlat [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumu] həddini aşmaqdan, pisliklərdən çəkindirər. Və Allahın yad edilməsi əlbəttə daha böyükdür. Və Allah, etdiyiniz şeyləri bilir.
46 Onlardan şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər xaric, Kitab əhli ilə ancaq ən gözəl bir yolla mübarizə aparın və: "Biz, bizə nazil olana və sizə nazil olana iman etdik. Bizim ilahımız və sizin ilahınız birdir. Biz, sadəcə Allah üçün islamlaşdıran kimsələrik."-deyin. (85/29, Ənkəbut / 45-46)

## Nəcm: 391

47 Və bax beləcə Biz, sənə Kitabı nazil etdik və özlərinə Kitab verdiklərimiz Qurana inanırlar. Və əhli-kitabın xaricindəkilərdən / ərəblərdən də ona iman edənlər var. Və Bizim ayələrimizi ancaq kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək ört-basdır edən kimsələr] bilə-bilə rədd edər.
48 Və sən bundan əvvəl hər hansı bir kitabdan oxumurdun; sən Quranı özündən yazmırsan. Əgər belə olsaydı, batilə inananlar həqiqətən şübhə duyacaqdılar (şübhələnəcəkdilər).
49 Əksinə, Quran, bilik verilənlərin sinələrində açıq-aşkar ayələrdir. Bizim ayələrimizi də ancaq səhv; öz zərərinə olan əməli işləyənlər bilə-bilə rədd edərlər.
50 Və onlar, "Ona Rəbbindən əlamətlər / işarətlər endirilməli deyildimi?" dedilər. De ki: "Əlamətlər / işarətlər ancaq Allahın qatındadır. Mən isə ancaq açıq-aşkar bir xəbərdarlıq edənəm."
51 Onlara oxunan Kitabı həqiqətən Bizim sənə nazil etməyimiz onlara

yetərli olmadımı? Bunda, inanan bir camaat üçün əlbəttə ki, bir rəhmət və bir öyüd var.
52 De ki: "Mənimlə sizin aranızda şahid olaraq Allah yetər. O, göylərdə və yerdə olan şeyləri bilir. Batilə inanan və Allahı bilərək rədd edən / iman etməyən kimsələr, bax onlar zərərə / itkiyə uğrayıb acı çəkənlərin məhz özüdür. (85/29, Ənkəbut / 47-52)

## Nəcm: 392

53 Və səndən, əzabın tez-tələsik (gəlməsini) istəyirlər. Əgər müəyyənləşdirilmiş / adı qoyulmuş bir vaxt sonu olmasaydı, əzab onlara əlbəttə gəlmişdi. Və o əzab, heç fərqində olmadıqları bir anda onlara qəflətən mütləq gələcəkdir.
54,55 Səndən əzabı tez-tələsik istəyirlər. Şübhəsiz ki, cəhənnəm, həqiqətən onları üstlərindən və ayaqlarının altından bürüdüyü gündə, kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənləri] qaplayacaq. Və O: "Etmiş olduqlarınızı dadın!" deyər. (85/29, Ənkəbut / 53-55)

## Nəcm: 393

56 Ey iman etmiş qullarım! Şübhəsiz ki, Mənim yer üzüm genişdir. O halda, yalnız Mənə qulluq edin.
57 Hər kimliyi olan varlıq (hər canlı varlıq) ölümü dadacaqdır. Sonra da yalnızca Bizə döndəriləcəksiniz.
58,59 Və iman etmiş, yaxşılaşdırmaq qayəsi ilə əməl işləmiş kimsələr, əlbəttə Biz onları, içində daimi qalacaqları cənnətdə, altlarından çaylar axan köşklərdə yerləşdirəcəyik. Çalışanların, səbir edən və işin nəticəsini sadəcə Rəblərinə həvalə edən kəslərin mükafatı necə də gözəldir! (85/29, Ənkəbut / 56-59)

## Nəcm: 394

60 Öz ruzisini daşıya bilməyən irili-xırdalı neçə-neçə canlı da vardır ki, onları da, sizi də Allah ruziləndirir. Və O, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
61 Yenə and olsun ki, onlardan soruşsan: "Göyləri və yeri kim yaratdı, günəşi və ayı kim nəzarəti altında saxladı / qulların faydalanacağı quruluş və xüsusiyyətdə kim yaratdı?" Şübhəsiz: "Allah" deyəcəklər. O halda, necə döndərilirlər?
62 Allah, qullarından istədiyinə ruzini artırar və onun üçün nizamlayar. Şübhəsiz ki, Allah hər şeyi ən yaxşı biləndir.
63 Və and olsun, əgər onlardan soruşsan: "Kim göydən suyu endirib və onunla yer üzünü ölümündən sonra diriltdi?" Şübhəsiz: "Allah" deyəcəklər. De ki: "Bütün təriflər Allaha məxsusdur; başqası təriflənə

bilməz." Əksinə, onların çoxu ağıllarını işlətməzlər.
**64** Və bu müvəqqəti dünya həyatı, sadəcə bir əyləncə və oyundur. Şübhəsiz son yurd isə həqiqətən həyatın məhz özüdür. Kaş ki, onlar bilsəydilər.
**65,66** Bax onlar, gəmiyə mindiklərində, dini yalnız Allaha məxsus edərək Ona yalvarırlar. Sonra nə zaman ki onları quruya çıxarıb qurtardı, bir də görərsən ki, onlar özlərinə verdiklərimizə nankorluq etmək və qazanclı çıxmaq üçün Allahın ortaqları olduğunu qəbul edirlər. Artıq onlar yaxında biləcəklər. (85/29, Ənkəbut / 60-66)

**Nəcm: 395**

**67** Yoksa sahillərində insanların zorla qamarlanıb götürülməsinə rəğmən, Məkkəni güvənli, toxunulmaz etdiyimizi də görmədilərmi? Hələ də batiləmi inanırlar və Allahın nemətinə (qarşı) nankorluqmu edirlər?
**68** Və Allaha qarşı yalan uyduran, yaxud özünə (haqq) gəldiyində, haqqı yalanlayandan daha səhv; öz zərərinə olan əməli işləyən kim ola bilər? Məgər kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün Cəhənnəmdə bir yermi yoxdur?!
**69** Və Biz, Bizim uğrumuzda cəhd göstərənləri, əlbəttə Öz yollarımıza yönəldəcəyik. Və şübhəsiz ki, Allah, yaxşı-gözəl əməl işləyənlərlə bərabərdir. (85/29, Ənkəbut / 67-69)

## MUTƏFFİFİN [HİYLƏGƏRLƏR] (86 – 83) SURƏSİ MƏKKƏ DÖVRÜ

**Nəcm: 396**

**1-3** Vay halına, başqalarından bir şey aldıqda tam ölçən, özləri ölçdükləri və ya çəkdikləri zaman əskik ölçən hiyləbazların!
**4-6** Onlar, böyük bir gün üçün; aləmlərin Rəbbinin hüzurunda insanların ayaq üstündə duracaqları gün üçün təkrar dirildiləcəklərini bilmirlərmi?
**7-13** Qətiyyən onların düşündüyü kimi deyil! Şübhəsiz, "din-iman tanımadan pisliyə batanların" qeydiyyatı, həqiqətən Siccindədir. *–Və Siccinin nə olduğunu sənə nə bildirdi? O, rəqəmlənmiş / yazılmış bir qeyddir! O gün yalanlayanların; qarşılıq gününü yalanlayanların vay halına! Və qarşılıq gününü, ona ayələrimiz oxunduğu zaman "Keçmişdəkilərin nağıllarıdır" deyən, hədlərini aşan günahkarlardan başqası yalan hesab etməz.–*
**14** Qətiyyən onların düşündüyü kimi deyil! Onların qazandıqları, qəlbləri üzərinə pas olmuşdur.
**15** Qətiyyən onların düşündüyü kimi deyil! Şübhəsiz ki, onlar, o gün

Rəblərindən həqiqətən pərdələnmişdilər.
**16** Sonra onlar, heç şübhəsiz ki, cəhənnəmə girəcəklər.
**17** Sonra da: “Bax bu, o yalan hesab etdiyiniz şeydir” deyilər.
**18-21** Qətiyyən onların düşündüyü kimi deyil! “Əbrarın” / yaxşı adamların qeydiyyatı, həqiqətən İlliyyindədir. *–İlliyyinin nə olduğunu sənə nə bildirdi? Yaxınlaşdırılmışların şahid olduğu rəqəmlənmiş / yazılmış bir qeyddir!–*
**22-28** Şübhəsiz ki, “Əbrar / yaxşı adamlar” əlbəttə, Nəimin içindədirlər, taxtlar üzərində gözləməkdədirlər. Üzlərində nemətin aydınlığını (nurunu) görərsən. Onlara, möhürlü saf bir içkidən su verilər ki, onun möhürü / nəticəsi müşkdür. Qarışığı Təsnimdəndir. Yaxınlaşdırılmışların içəcəkləri bir çeşmədəndir. *–Artıq yarışanlar, bax bunda yarışmalıdırlar.–* (86/83, Mutəffifin / 1-28)

## Nəcm: 397

**29** Şübhəsiz, günah işləyən o kimsələr, iman edən kimsələrdən bəzisinə / elçilərə gülürdülər. **30** Onlarla rastlaşanda da bir-birlərinə
qaş-göz işarəsi edirdilər. **31** Öz yaxınlarının yanına döndükləri zaman
da zövq almış kimi dönürdülər. **32** Və möminlərin bəzilərini / elçiləri
gördükləri zaman: “Şübhəsiz ki, bax bunlar, həqiqətən azmışlardır” deyirdilər.
**33** Halbuki möminlərin bəzisi / elçilər, bu günahkarların üzərinə nəzarətçi olaraq göndərilməmişdilər / elçi edilməmişdilər.[328]
**34-36** Bax bu gün də iman etmiş kimsələr, taxtlar üzərində: “Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr] işlədiklərinin cəzasını gördülərmi?” deyə baxaraq, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] güləcəklər.
(86/83, Mutəffifin / 29-36)

# BƏQƏRƏ (87 – 2) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

## Nəcm: 398[329]

**1** Əlif / 1, Lam / 30, Mim / 40.[330]
**2-4** Bax bu kitab; özündə heç şübhə yoxdur, kimsəsiz yerlərdə iman edən, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını quran-ayaqda tutan], özlərini ruziləndirdiyimiz şeylərdən Allah yolunda xərcləyən / başda yaxınları olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edən, sənə nazil olana və səndən öncə nazil olana iman edən, Allahın mühafizəsi altına daxil olan kəslər *–ki, bunlar axirətə də qəti surətdə iman*

*edərlər–* üçün bir yolgöstərəndir.
**5** Bax bunlar, Rəbbi tərəfindən göstərilən bir yol üzərindədirlər. Yenə bax bunlar, qurtulanların, qazanclı çıxanların məhz özləridir.

(87/2, Bəqərə / 1-5)

**Nəcm: 399**

**6** Şübhəsiz ki, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr]; onları xəbərdar etsən də, xəbərdar etməsən də onlar üçün eynidir – onlar iman etməzlər.
**7** Allah, onların qəlbləri və qulaqları üzərinə möhür vurmuşdur; onların gözlərinin üzərində pərdələr var. Və böyük əzab onlar üçündür.
**8,9** İnsanlardan bir qismi də, *–iman edən kəslər olmamalarına rəğmən–* "Allaha və axirət gününə iman etdik" deyərlər. Allahı və iman etmiş kimsələri aldatmağa çalışırlar. Halbuki onlar, sadəcə özlərini aldadırlar və bunun şüurunda deyillər.
**10** Onların qəlblərində xəstəlik var; onların düşüncə tərzləri xarabdır və Allah, onların xəstəliyini; azğınlığını artırar. Yalan söylədiklərinə hörə də onlar üçün acı bir əzab vardır.
**11** Onlara, "Yer üzündə qalmaqal (fəsad) çıxartmayın" deyildiyində də: "Biz ancaq düzəldən (sahmana salan) kəslərik" deyərlər.
**12** Diqqətli olun! Şübhəsiz ki, onlar, qalmaqal / qarışıqlıq çıxardanların məhz özüdür, lakin bunu dərk etmirlər.
**13** Və onlara, "İnsanların iman etdiyi kimi iman edin" deyilincə, "Biz, o ağlı çatmayanların iman etdiyi kimi iman edəcəyik?" deyərlər. Diqqətli olun! Şübhəsiz ki, ağlı çatmayanlar məhz onlar özləridir. Lakin bilmirlər.
**14** Onlar, iman etmiş kimsələrə rast gəldikləri zaman da: "İman etdik!" dedilər. Pis niyyətli başçılarıyla (dostlarıyla) təkbətək qaldıqlarında isə: "Şübhəsiz ki, biz sizinlə bərabərik, biz sadəcə istehza edənlərik (ələ salanlarıq)" dedilər.
**15** Allah onlarla istehza edər (ələ salar) və öz azğınlıqları içində sərsəri vəziyyətdə gəzmələrinə vaxt verər / icazə verər.
**16** Bax onlar, doğru yol qarşılığında azğınlığı satın alan kimsələrdir və onların ticarəti xeyir gətirmədi və onlar yönəldildikləri doğru yolu tapan kimsələr olmadılar.
**17** Onların vəziyyəti, bəzən, bir od yandırmaq istəyən kimsənin vəziyyəti kimidir. Od, od yandıran kimsənin ətrafını aydınladınca, Allah, onların nurlarını aradan qaldırdı və onları qaranlıqlar içində
görə bilməz bir halda buraxdı. **18** *–Kardırlar, laldırlar, kordurlar!*

*Artıq onlar dönə bilməzlər.–*

**19** Bəzən də onların vəziyyəti; içində qaranlıqlar, göy gurultusu və şimşək olan, göydən boşalan bir yağmur kimidir. Onlar, ölüm qorxusuyla, ildırımların (səsindən) barmaqlarını qulaqlarına tıxayırlar. *–Halbuki, Allah kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənləri] hər tərəfdən əhatə etmişdir.–*

**20** O şimşək az qala gözlərini alacaq. Şimşək önlərini aydınlatdığı zaman, aydınlığın içində yeriyərlər, qaranlıq üzərlərinə çökdüyü zaman da dayanıb durarlar. Allah istəsəydi, eşitmələrini də, görmələrini də aradan qaldırardı. Şübhəsiz ki, Allah, hər şeyə ən çox qadir olandır. (87/2, Bəqərə / 6-20)

## Nəcm: 400

**21,22** Ey insanlar! Allahın mühafizəsi altına daxil olasınız deyə, sizi və sizdən öncəkiləri yaradan, yer üzünü sizin üçün bir döşək, göyü də bir bina edən, göydən su endirib, onunla sizin üçün ruzi olaraq məhsullardan çıxardan Rəbbinizə qulluq edin. Artıq siz də bilə-bilə Allaha ortaqlar qoşmayın.

**23** Və əgər qulumuza nazil etdiyimizə şübhə edirsinizsə, haydı [qulumuza nazil etdiyimiz surələrin] onun bənzəri olan bir surə də siz gətirin, Allahın altındakılardan bütün şahidlərinizi də çağırın. Əgər doğru kimsələrsinizsə.

**24** Sonra, əgər bunu etmədinizsə və əsla edə bilməyəcəksiniz; Elə isə kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün hazırlanmış, yanacağı insanlar və daşlar olan atəşdən qorunun.

(87/2, Bəqərə / 21-24)

## Nəcm: 401

**25** İman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə də, “Şübhəsiz ki, onlar üçün altından çaylar axan cənnətlər olduğunu” müjdələ. Onlar, oradakı hər hansı bir meyvədən hər ruziləndirilmələrində, “Bu, bizim daha öncə ruziləndiyimiz şeydir” deyərlər. Və onlara onun bənzəyənləri verildi. Orada çox təmiz zövcələr də yalnızca onlarındır. Və onlar, orada daimi qalanlardır.

(87/2, Bəqərə / 25)

## Nəcm: 402

**26,27** Şübhəsiz ki, Allah, bir ağcaqanadı, hətta lap daha kiçik olan bir şeyi məsəl (nümunə) çəkməkdən çəkinməz. Bax, iman edən kimsələr

bilirlər ki, şübhəsiz o haqdır, Rəblərindəndir. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] də artıq, “Allah belə bir məsəl (nümunə) ilə nə demək istədi?” deyərlər. Allah, çəkdiyi məsəllərlə (nümunələrlə) bir çoxlarını çaşdırar, onunla bir çoxlarına da (doğru yolu) göstərər. Allah, onunla sadəcə, söz verib əhdləşdikdən sonra Allaha verdikləri sözü pozan, Allahın birləşdirməsini əmr etdiyi şeyi; iman-əməl ayrılmazlığını (birliyini) pozan və yer üzündə fəsad törədən, haqq yoldan çıxmış kimsələri çaşdırır. Bax bunlar, zərərə uğrayanların məhz özüdür.

**28** Siz, necə küfr edərsiniz; Allahın ilah və rəbb olduğunu necə bilərək rədd edərsiniz? Halbuki siz, ölülər idiniz və sizlərə O, həyat verdi. Sonra O, sizləri öldürəcək, sonra dirildəcəkdir. Sonra da Ona döndəriləcəksiniz.

**29** O, yer üzündə nə varsa, hamısını sizin üçün yaradandır. Sonra da O, səmaya hökmranlıq qurdu;[331] onları yeddi göy olaraq nizamladı. O, hər şeyi ən yaxşı biləndir. (87/2, Bəqərə / 26-29)

## Nəcm: 403

**30** Və bir zaman Rəbbin təbiətdəki güclərə: “Şübhəsiz ki, Mən yer üzündə bir xəlifə gətirən Zatam” demişdi. Təbiətdəki güclər: “Orada fəsad törədən, qan tökən birinimi yaradacaqsan? Halbuki biz, Sənin tərifinlə birlikdə Səni bütün nöqsanlıqlardan pak tuturuq və Sənin tərtəmiz; bütün pislik və nöqsanlıqlardan uzaq olduğunu car çəkirik” demişdilər. Sənin Rəbbin, “Mən sizin bilmədiyiniz şeyləri çox yaxşı bilirəm” demişdi.

**31** Və sənin Rəbbin, Adəmə bütün o isimləri öyrətdi. Sonra hamısını təbiətdəki güclərə göstərdi və: “Haydı, xəbər verin Mənə bunların isimlərini, əgər doğru kimsələrsinizsə” dedi.

**32** Təbiətdəki güclər dedilər ki: “Sən hər cür nöqsanlıqdan paksan! Sənin, bizə öyrətmiş olduğunun xaricində bizim üçün bilik deyə bir şey yoxdur. Şübhəsiz ki, Sən, ən yaxşı bilənin, ən yaxşı qanun qoyanın məhz Özüsən.”

**33** Sənin Rəbbin dedi ki: “Ey Adəm! Xəbər ver onlara, onların isimlərini.” Sonra da Adəm onlara, onların isimlərini xəbər verincə, sənin Rəbbin dedi: “Mən sizə deməmişdim ki, şübhəsiz Mən, göylərin və yerin görünməyənini, eşidilməyənini, hiss edilməyənini, keçmişi və gələcəyi bilirəm?! Və Mən, sizin aşkar etdiklərinizi və (gizli) saxladıqlarınızı bilirəm?!”

**34** Və bir vaxt Biz, təbiətdəki güclərə: “Adəmə boyun əyib təslimiyyət

(tabeçilik) göstərin" demişdik, ancaq İblis / düşüncə qabiliyyəti xaricində təbiətdəki güclər dərhal boyun əyib təslimiyyət (tabeçilik) göstərmişdi. İblis boyun qaçırdı, böyükləndi. Və o, hər şeyi bilərək rədd edənlərdən idi.

**35** Və Biz: "Ey Adəm! Sən və zövcən cənnətdə sakin olun / buranı yurd tutun, ikiniz də ondan istədiyiniz yerdə bol-bol bəhrələnin və bu girift (bir-birinin içinə girərək həll olunmaz dərəcədə qarışıq olan, çaşqın, dolaşıq) şeyə yaxınlaşmayın; mal / qızıl-gümüş hərisi olmayın, yoxsa öz nəfsinə haqsızlıq edənlərdən olarsınız" dedik.

**36** Belə olduqda şeytan; İblis / düşüncə qabiliyyəti onları oradan uzaqlaşdırdı, içində olduqları mühitdən çıxartdı. Və Biz: "Bir-birinizə düşmən olaraq enin, orada müəyyən bir vaxta qədər sizin üçün qərar tutacağınız bir yer və bir bəhrələnmə (imkanı) var" dedik.

**37-39** Sonra da Adəm, Rəbbindən bəzi kəlmələr aldı / ona vəhy edildi; Biz dedik ki: "Hamınız oradan enin. Artıq sizə Mənim tərəfimdən bir yolgöstərən gəldiyində, kim göstərilən yola tabe olarsa, onlar üçün heç bir qorxu yoxdur; onlar qəm-qüssə də görməyəcəklər. Və küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş] və ayələrimizi yalan saymış kimsələr; bax onlar, atəşin əhlidir. Onlar orada təmelli qalanlardır."[332] Sonra da Allah onun tövbəsini qəbul etdi. Həqiqətən, O, tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verənin və çox mərhəmətli olanın məhz Özüdür. (87/2, Bəqərə / 30-39)

## Nəcm: 404

**40** Ey İsrail oğulları! Sizə nemət olaraq verdiyim nemətimi xatırlayın, Mənim əhdimə / Mənə verdiyiniz sözə vəfa göstərin ki, Mən də sizin əhdinizə vəfa göstərim. Və sadəcə Məndən qorxun / sadəcə Mənə ibadət edin [Mənə qarşı adam olmalısınız]. **41** Sizin yanınızda olan Tövratı təsdiqləyici olaraq nazil etdiyim Qurana iman edin, Onun haqq kitab olduğunu bilərək rədd edənlərin ilki siz olmayın. Mənim ayələrimi çox az bir bədələ satmayın. Və sadəcə Mənim mühafizəm altına daxil olun. **42** Və siz bilə-bilə haqqı batillə qarışdırmayın, haqqı gizlətməyin. **43** Səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını qurun-ayaqda tutun], zəkatı / vergini verin, Allahın bir olduğunu deyənlərlə birlikdə siz də Allahın bir olduğunu deyin.

**44** Siz, insanlara "birr"i / yaxşı adam olmağı buyuracaqsınız və özünüzə əhəmiyyət verməyəcəksiniz? Halbuki Kitabı (davamlı olaraq) oxuyursunuz. Hələ də başa düşmürsünüz?

**45,46** Bir də səbir etməklə, səlatla [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə işləri ilə] yardım istəyin. *–Şübhəsiz, səlat və səbirlə yardım istəmək, hörmətli olanlardan; gerçəkdən Rəblərinə qovuşacaqlarına və gerçəkdən özlərinin Ona dönəcəklərinə iman edən kimsələrdən başqasına çox ağır gələr.–*

***

**47** Ey İsrail oğulları! Sizə verdiyim neməti və şübhəsiz Mənim sizi aləmlərə üstün etdiyimi xatırlayın.

**48** Və heç bir kimsənin başqa bir kəsə hər hansı bir şey üçün qarşılıq ödəmədiyi, heç bir kimsədən yardımın, şəfaətin qəbul edilmədiyi, kimsədən fidyə / qurtulmaq üçün verilən qarşılığın qəbul edilmədiyi və heç bir kimsənin yardım olunmadığı günə qarşı Allahın mühafizəsi altına daxil olun.

**49** Və bir vaxt Biz sizi, sizə ən pis əzabı verən, oğullarınızın boğazını üzən; təhsilsiz, təlimsiz saxlayıb ixtisassız (bacarıqsız) bir kütlə yaradaraq gücsüzləşdirən, qadınlarınızı sağ buraxan Fironun yaxınlarından qurtarmışdıq. *–Və bunda sizə Rəbbiniz tərəfindən böyük bir bəla vardı.–*

***

**50** Və Bir zamanlar Biz, bol suyu / çayı sizin üçün yarıb, sizi qurtarmış və siz baxarkən (gözünüzün qabağında) Fironun yaxınlarını da suda boğmuşduq.

***

**51** Və bir vaxt Biz Musaya qırx gecəni vəd vermiş, sonra da siz, öz mənliyinizə haqsızlıq edərək, onun arxasından qızılı ilah qəbul etmişdiniz.

**52** Sonra Biz, sahib olduğunuz nemətlərin qarşılığını ödəyərsiniz deyə, bundan sonra sizi əfv etmişdik.

**53** Və bir vaxt Biz, yönləndirildiyiniz doğru yolu taparsınız deyə, Musaya, o kitabı və Furqanı vermişdik.

**54** Və bir zamanlar Musa öz qövmünə demişdi: “Ey qövmüm! Şübhəsiz ki, siz qızıla tapınmaqla öz-özünüzə haqsızlıq etdiniz. Gəlin, dərhal Yaradanınıza tövbə edin və mənliklərinizi dəyişdirin. Belə etməyiniz Yaradanınızın yanında sizin üçün xeyirlidir.” Sonra da Yaradanınız tövbənizi qəbul etdi. Şübhəsiz, Yaradanınız, tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verənin və geniş mərhəmət sahibinin məhz Özüdür.

***

**55** Bir zamanlar da siz: “Ey Musa! Biz, Allahı aşkar surətdə görmədikcə sənə əsla iman etməyəcəyik” demişdiniz və belə olduqda, gözünüz görə-görə sizi ildırım vurmuşdu.

**56** Sonra Biz, sizə verilən nemətlərin qarşılığını ödəyərsiniz deyə sizi ölümünüzün ardından diriltdik / zillətdən qurtarıb şərəfli vəziyyətə gətirdik.

**57** Və üstünüzə o buludu kölgə etdik və üzərinizə qüdrət halvası və bildirçin / bal endirdik. *–Və sizə verdiyimiz ruzilərin xoş olanlarından yeyin.–* Onlar Bizə qarşı haqsızlıq etmədilər, lakin onlar şirk qoşmaq surətiylə öz mənliklərinə haqsızlıq edirdilər.

***

**58** Və bir zamanlar Biz belə demişdik: “Bu şəhərə daxil olun və onun nemətlərindən dilədiyiniz şəkildə bol-bol yeyin. O qapıdan da boyun əyib təslimiyyət göstərərək; onlara təbəə / vətəndaş olaraq, azğınlıq, səhv, öz zərərinizə olan işi etmədən daxil olun və ‘hittə’ [bizi bağışla] deyin. Ki, sizə xətalarınızı bağışlayaq, yaxşı-gözəl əməl işləyənlərə nemətlərimizi daha da artıracağıq.”

**59** Belə olduqda, o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələr, sözü, özlərinə söylənildiyindən başqa bir şəklə (formaya) dəyişdirdilər. Biz də etdikləri haqq yoldan çıxış qarşılığında, o şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən kimsələrin üstünə göydən bir əzab endirdik.

***

**60** Və bir zamanlar Musa, qövmü üçün su istəmişdi, Biz, “Biliklərini (təcrübəni) daş ürəkli qövmünə tətbiq et!” dedik. Belə olduqda, o daş ürəkli qövmdən on iki tayfa – məmləkət əhalisi ayrılmışdı (yaranmışdı). Yaranan hər məmləkətin əhalisi özünün su götürəcəyi yeri qəti surətdə öyrəndi / işarələdi. *–Allahın ruzisindən yeyin-için və fəsad törədərək yer üzündə həddi aşmayın.–*

***

**61** Və bir zamanlar siz: “Ey Musa! Biz, eyni yeməyə əsla dözə bilmərik, artıq bizim üçün Rəbbinə dua et ki, bizə yerin yetişdirdiyi şeylərdən; tərəvəzindən, qabağından, sarımsağından, mərciməyindən və soğanından çıxarsın” demişdiniz. Musa da sizə: “O üstün olanı daha aşağı olanla dəyişdirməkmi istəyirsiniz? Bir qəsəbəyə / Misirə enin, o vaxt istədiyiniz şeylər sizin olacaq” demişdi. Və üzərlərinə alçaqlıq və miskinlik damğası vuruldu və axırda Allahdan bir qəzəbə düçar oldular. Bax bu, küfr etmələri; Allahın ayələrini bilərək rədd etmələri və peyğəmbərləri haqsız yerə öldürmələri səbəbiylədir. Bax bu, asi

olduqlarına və hədlərini aşdıqlarına görə idi. (87/2, Bəqərə / 40-61)

## Nəcm: 405

63 Bir zamanlar Biz, sizdən, "Allahın mühafizəsi altına daxil olmağınız üçün verdiyimiz şeyi qüvvətlə tutun (əlinizdə möhkəm saxlayın) və içindəkiləri yadınızdan çıxartmayın!" deyə sağlam bir söz almışdıq və sizin üstününüzü; seçilmiş olanınız Musanı Tura / dağa yüksəltmişdik / çıxartmışdıq.[333]

64 Bir də siz, bundan sonra üz çevirdiniz. Bax əgər üzərinizdə Allahın ərməğanı və rəhməti olmasa idi, həqiqətən siz zərərə uğrayanlardan olmuşdunuz.

65 Və siz içinizdən səbtdə (şənbə günündə) / düşünmə günündə hədlərini aşan kimsələri də əlbəttə bilirsiniz. Bax buna görə onlara: "Səfil [qovulmuş kimsələr halında] meymunlar olun!" dedik.

66 Sonra da alçalmış meymunluğu, (öz) müasirlərinə (eyni dövrdə yaşayanlara) və sonrakılara gözəl bir dərs və Allahın mühafizəsi altına daxil olan kəslər üçün bir nəsihət / öyüd etdik.

***

67 Və bir vaxt Musa öz qövmünə: "Şübhəsiz ki, Allah, sizə bir inək kəsməyinizi əmr edir!" demişdi. Onlar, "Sən, bizi ələ salırsan?" dedilər. Musa, "Mən, cahillərdən biri olmaqdan Allaha sığınıram" dedi.

68 Onlar, "Bizim üçün Rəbbinə dua et, o inək hər nə cür isə onu bizim üçün aşkar etsin" dedilər. Musa dedi: "Rəbbim deyir ki: 'Şübhəsiz ki, o inək çox qoca deyil, çox körpə də deyil, ikisinin arasında; ən yaxşı yardım, xidmət və verim vaxtındadır.' Haydı, əmr olunduğunuz şeyi edin."

69 Onlar, "Bizim üçün Rəbbinə dua et, onun rəngi nə cür isə onu bizim üçün aşkar etsin" dedilər. Musa dedi: "Şübhəsiz, Rəbbim deyir ki: 'Şübhəsiz ki, o inək, rəngi baxanlara sevinc bəxş edən, [sarı;] sapsarı bir inəkdir."

70 Onlar: "Bizim üçün Rəbbinə dua et, o, nədir; bizim üçün aşkar etsin, şübhəsiz ki, o inək bizə mütəşabih gəldi (tam aydın olmadı) və biz şübhəsiz ki, Allah istəyərsə, həqiqətən yönəldildiyimiz doğru yolu tapmış kimsələrik" dedilər.

71 Musa, "Şübhəsiz, Rəbbim deyir ki: "O inək, zəlil olmayan / cütə qoşulmayan, yer şumlamayan, əkin suvarmayan, azad gəzən və heç ləkəsi olmayan bir inəkdir." Onlar dedilər: "Bax indi tam gerçəyi gətirdin!" Nəhayət, onu kəsdilər. Amma az qalmışdı ki, (bu işi)

etməyəcəkdilər.[334]

***

72 Və bir vaxt siz[335] bir adamı öldürmüşdünüz və onun haqqında bir-birinizlə vuruşmuşdunuz. Halbuki Allah gizlədiyinizi (aşkara) çıxarandır.

73 Sonra Biz: "Öldürülən şəxsdən gələcək sıxıntı səbəbiylə Musanı yola çıxarın" dedik. Allah, ölüləri bax belə dirildər, bitib-tükənənlərə yol göstərər və ağıllı davranasınız deyə sizə əlamətlərini / işarətlərini göstərər.

74 Sonra da qəlbləriniz qatılaşdı; bax, onlar daş kimidir, hətta daha da qatıdır. Və şübhəsiz, daşlardan elələri vardır ki, onlardan çaylar fışqırar, elələri vardır ki, yarılar və ondan su çıxar, elələri də var ki, Allahın hörmət, sevgi və biliyi ilə ürpərməsindən (yuvarlanıb) düşərlər. Allah etdiklərinizdən xəbərsiz, qafil deyildir.

(87/2, Bəqərə / 63-74)

## Nəcm: 406

75 İndi siz, onların sizə inanacaqlarınımı ümid edirsiniz? Halbuki onlardan bir zümrə, Allahın kəlamına qulaq asırlar, sonra, onu yaxşıca anladıqdan sonra, bilə-bilə onu dəyişdirib pozarlar (təhrif edərlər).

76 Və onlar, iman etmiş kimsələrlə rastlaşdıqlarında, "İman etdik" deyərlər, bir-birləriylə baş-başa qaldıqları zaman isə: "Allahın sizin əleyhinizdə hökm verdiyi şeyləri, Rəbbinizin yanında əleyhinizə dəlil olaraq istifadə etsinlər deyəmi onlara söyləyirsiniz? Hələ də ağıllanmayacaqsınız?" dedilər.

77 Onlar, şübhəsiz Allahın, onların sirr olaraq saxladıqları şeyləri və aşkar etdikləri şeyləri bildiyini bilmirlərmi?

78 Bunlardan bir qismi də, yersiz düşüncələrdən başqa Kitabı bilməyən, oxuma-yazma bilməyən / analarından doğulduqları kimi qalmış kimsələrdir. Bunlar, sadəcə zənn edirlər. (87/2, Bəqərə / 75-78)

## Nəcm: 407

62 Şübhəsiz bu, iman etmiş şəxslər, yəhudiləşmiş şəxslər, Nəsranilər və Sabiilər / Yəhya peyğəmbərin dinindən olanlar [səmimi dindarlar]; (bunlardan) hər kim Allaha və axirət gününə iman edər və saleh əməli işləyərsə, artıq Rəbləri qatında bunlar üçün əcirləri var. Bunlara bir qorxu yoxdur. Bunlar qəm-qüssə də görməyəcəklər.[336] (87/2, Bəqərə / 62)

## Nəcm: 408

**79** Artıq vay olsun o kimsələrə ki, öz əlləri ilə kitab yazarlar, sonra da bir az pula satmaq üçün, “Bu, Allah qatındandır!” deyərlər. Artıq o əlləriylə yazdıqları üzündən onlara vay olsun! O qazandıqları şeylər üzündən onlara vay olsun!

**80** Və onlar dedilər ki: “Atəş bizə bir neçə gündən artıq əsla toxunmayacaq.” De ki: “Allahdan bir zəmanət, bir sözmü aldınız? Allah, verdiyi sözə əsla xilaf çıxmaz. Yoxsa siz, Allaha qarşı bilmədiyiniz şeylərimi söyləyirsiniz?”

**81** Bəli, kim bir pislik qazandısa və xətası özünü əhatə etdisə, bax bunlar atəş əhlidir. Onlar, orada daimi qalacaqlar.

**82** İman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləmiş kimsələr də; bax onlar, cənnət əhlidir. Onlar, orada daimi qalacaqlar.

(87/2, Bəqərə / 79-82)

## Nəcm: 409

**83** Və bir vaxt Biz, İsrail oğullarının ‘qəti sözünü’ almışdıq: “Allahdan başqasına qulluq etməyəcəksiniz, ana-ataya, yaxınlığı olanlara, yetimlərə, miskinlərə də yaxşılıq edəcəksiniz, insanlara gözəlliyi söyləyin, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını qurun-ayaqda tutun] və zəkatı / vergini verin.” Sonra çox az bir qisminiz istisna olmaqla üz çevirdiniz. Və siz üz çevirən kimsələrsiniz.

**84,85** Və bir vaxt Biz, sizin qəti sözünüzü almışdıq: “Qanlarınızı tökməyəcəksiniz, bir-birlərinizi yurdlarınızdan çıxartmayacaqsınız.” Sonra siz, şahidlik edərək təsdiqlədiniz. Sonra, siz, bax o kimsələrsiniz; bir-birinizi öldürürsünüz və sizdən bir qrupu yurdlarından çıxarırsınız. Onların əleyhində günah və düşmənçilikdə yardımlaşırsınız. Əgər onlar sizə əsir olaraq gəlirlərsə də, onlar üçün fidyə / qurtarmaq üçün qarşılıq almağa çalışırsınız. Halbuki o (iş); onların çıxardılmaları, sizə haramlaşdırılmışdır. Yaxşı, siz Kitabın bir bölümünə iman edib və bir bölümünə iman etmirsiniz? O halda, içinizdən belə edənlərin alacağı qarşılıq, dünya həyatında bir rüsvayçılıqdan başqa nədir? Qiyamət günü də əzabın ən şiddətlisinə uğradılarlar. Allah etdiklərinizdən məlumatsız, qafil deyil.

**86** Bax onlar, axirət qarşılığında bəsit dünya həyatını satın almış kimsələrdir. Artıq bunlardan əzab yüngülləşdirilməz, onlara yardım da olunmaz.

**87** Və and olsun ki, Musaya Kitabı verdik. Və ondan sonra bir-birinin

ardınca elçilər göndərdik. Məryəm oğlu İsaya da açıq-aydın dəlillər verdik və onu Allahın vəhyi ilə gücləndirdik. Yaxşı siz, bir elçinin sizə, nəfslərinizin xoşlanmadığı bir şey gətirdiyi hər səfərində (ona qarşı) böyüklük göstərmədinizmi?! Sonra da bir qismini yalanladınız, bir qismini də öldürürdünüz. (87/2, Bəqərə / 83-87)

## Nəcm: 410

88 Və onlar dedilər: "Bizim qəlblərimiz örtülüdür / heç bir şey işləməz." Əksinə; Allah, gerçəyi bilərək rədd etmələrinə görə onları uzaqlaşdırmış / rəhmətindən məhrum etmişdir. Buna görə çox azı iman edir!

89 Onlara Allah qatından, özləri ilə birlikdə olanı doğrulayan bir kitab; Quran gəlincə də *–ki bunlar daha əvvəllər kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] qarşı zəfər qazanmaq istəmişdilər və o tanıdıqları onlara gəlmişdi–* onu özləri örtdülər. Artıq Allahın uzaqlaşdırması / rəhmətindən məhrum etməsi, Allahın ilahlığını və rəbliyini örtənlərin üzərinədir.

90 Onların, özlərini qarşılığında satdıqları şey; Allahın qullarından dilədiyinə Öz ərməğanlarından endirməsini qısqanaraq, Allahın nazil etdiyi şeyləri; Quranı bilərək rədd etməkləri necə də çirkindir! Bax buna görə qəzəb üstünə qəzəbə düçar oldular. Alçaldıcı əzab da yalnızca gerçəkləri bilərək rədd edənlər üçündür.

91 Və onlara: "Allahın nazil etdiyinə iman edin" deyildiyi zaman, onlar: "Biz özümüzə nazil edilənə iman edərik" dedilər. Və onlar, Allahın nazil etdiyi, özlərinin bərabərindəki olan şeyi doğrulayan bir haqq olmasına rəğmən, özlərinə nazil edilənlərdən sonrasını bilərək rədd edib atırlar. De ki: "Yaxşı, əgər möminlər idinizsə, (bəs) nə üçün daha öncə Allahın peyğəmbərlərini öldürürdünüz?" (87/2, Bəqərə / 88-91)

## Nəcm: 411

92 Və and olsun ki, Musa sizə açıq-aydın dəlillərlə gəlmişdi. Sonra siz, öz mənliyinizə haqsızlıq edən kimsələr olaraq, arxasından "qızılı" ilahlaşdırdınız.

93 Və bir vaxt Biz sizdən, "Sizə verdiyimiz Kitabı qüvvətlicə alın və dinləyin" deyə sağlam söz almış və sizin üstününüzü / seçilmişiniz Musanı Tura yüksəltmişdik / çıxartmışdıq. Demişdilər ki: "Dinlədik və asi olduq / yaxşıca sarıldıq." Və gerçəyi bilərək rədd etmələri üzündən qızılın ilahlığı qəlblərinə yeridilmişdi. De ki: "Əgər iman edənlərsinizsə, inancınızın sizə əmr etdiyi şey necə də çirkindir!"[337]

**94** De ki: “Allah yanında ‘son yurd’ başqalarının deyil, yalnız sizin üçündürsə, əgər doğrulardansınızsa, haydı dərhal ölümü arzulayın.”

**95** Halbuki əlləriylə işlədikləri üzündən ölümü sonsuzadək arzulamazlar. Allah isə öz mənliklərinə haqsızlıq edən o kimsələri çox yaxşı biləndir.

**96** Və sən, həqiqətən onları, insanların (arasında) yaşamağa ən həris, Allahın ortağı olduğunu qəbul edən kimsələrdən də daha həris (olduqlarını) görərsən. Onların hər biri min il ömür verilməyi arzulayar; halbuki ömürlənmək / çox uzun yaşamaq onu əzabdan uzaqlaşdıran deyil. Allah onların etdikləri şeyləri çox yaxşı görəndir.

**99** Və and olsun ki, Biz sənə açıq-aşkar ayələr nazil etdik. Bunları da haqq yoldan çıxanlardan başqası bilərək rədd edib görməzlikdən gəlməz.

**100** Haqq yoldan çıxanlar, nə zaman bir əhd üzərində andlaşma etsələr, onlardan bir qrup onu atmadımı? Əslində onların çoxu iman etmirlər.

**101** Və nə zaman Allah tərəfindən onlara, yanlarındakı kitabı təsdiq edən bir elçi gəldi, daha öncə özlərinə Kitab verilən kimsələrdən bir qrup, sanki bilməzlərmiş kimi, Allahın kitabını arxalarına atdılar.

**97** De ki: “Kim Cibrilə / Qurana düşməndirsə, öfkəsindən, qısqanclığından çatlasın, gəbərsin. *–Şübhəsiz ki, Allah Cibrili / Quranı, Özünün biliyi ilə, iki əlinin arasındakıları / içindəkiləri təsdiq edən, iman edənlər üçün bir yol göstərən və müjdə olaraq, sənin qəlbinə nazil etmişdir. Onlar da bax buna görə düşmən olmuşdular.–*

**98** **Kim ki Allaha, mələklərinə, elçilərinə, Cibrilə / Qurana, Mikailə / Elçi Muhəmmədə[338] düşməndirsə, kədərindən, qəhrindən ölsün.”** ***–Şübhəsiz, bax bu üzdən, Allah da kafirlərə [Özünün ilah və rəbb olduğunu bilərək rədd edənlərə] düşməndir.–*** (87/2, Bəqərə / 92-98)

## Nəcm: 412

**102** Və özlərinə Kitab verilənlər, Süleymanın mülkünə dair şeytanların oxuduqları şeylərə uydular. Halbuki küfr etməmişdi; Süleyman Allahın ilah və rəbb olduğunu bilərək rədd etməmişdi, amma o şeytanlar küfr etmişdi; bilərək rədd etmişdilər; insanlara sehr və Babildə iki peyğəmbərə / iki krala; Harut və Maruta nazil edileni öyrədirdilər. Halbuki Harut və Marut: “Biz saflaşmağınız üçün atəşdən bir materialıq (vasitəyik), əsla küfr etmə; gerçəyi bilərək rədd etmə!” demədikcə heç kimsəyə heç bir şey öyrətməzdilər. Sonra hər kəs, o

ikisindən kişi ilə zövcəsinin arasını açan şeyləri öyrənirdilər. *–Lakin onlar onunla Allahın biliyi olmadan heç kəsə zərər verə bilməzlər.–* Hər kəs özlərinə zərər verəni, fayda verməyəni öyrənirdilər. And olsun ki, onu satın alanın axirətdə heç bir nəsibi (payı) olmayacağını da həqiqətən bilirdilər. Və o, mənliklərini qarşılığında satdıqları o şey, necə də çirkin bir şeydi! Kaş ki, bilsəydilər!

**103** Və onlar əgər iman etsəydilər və Allahın mühafizəsi altına daxil olsaydılar, həqiqətən, Allahdan bir mükafat (onlar üçün), daha yaxşı olacaqdı. Kaş ki, bilsəydilər! (87/2, Bəqərə / 99-103)

## Nəcm: 413

**104** Ey iman etmiş kimsələr! "Raina" [sən bizim çobanımızsan / sən bizi güd, biz səni güdək] deməyin, "unzurna" [gözün bizdə olsun] deyin və qulaq asın. Çox ağrılı əzab da yalnız kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçündür.

**105** Kitab əhlindən küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] bu kimsələr və ortaq qoşanlar, Rəbbinizdən sizə bir xeyir nazil olmasını istəməzlər. Allah isə, rəhmətini istədiyi kimsəyə məxsus edər. Və Allah, çox böyük ərməğan sahibidir. (87/2, Bəqərə / 104-105)

## Nəcm: 414

**106** Biz, bir ayədən / əlamətdən / işarətdən hər nəyi ləğv etsək və ya söylətdirməsək, ondan daha yaxşısını, yaxud bənzərini gətirərik. Sən, Allahın şübhəsiz, hər şeyə ən yaxşı qadir olduğunu bilmədinmi?

**107** Göylərin və yerin hökmranlığının şübhəsiz yalnız Allaha aid olduğunu və sizin üçün Allahın altındakılardan bir yaxın və bir yardımçı olmadığını bilmədinmi? (87/2, Bəqərə / 106-107)

## Nəcm: 415

**108** Yoxsa siz Elçinizi, bundan öncə Musanın sorğu-suala tutulduğu kimi, sorğu-suala çəkməkmi istəyirsiniz? Və hər kim imanı küfrlə dəyişdirərsə, artıq o, düz yolun ortasını itirmiş olar.

**109** Kitap əhlindən bir çoxu, gerçək onlar üçün ortaya qoyulduğu halda, mənliklərindəki qısqanclığa görə sizi iman etməyinizdən sonra kafir [Allahın ilah və rəbb olduğunu bilərərək rədd edən] kimsələr olmağa çevirmək istəyərlər. Buna rəğmən siz, Allahın əmri gələnə qədər əfv ilə, xoş rəftar ilə davranın. Şübhəsiz ki, Allah hər şeyə ən yaxşı qadirdir.

**110** Və siz, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma;

cəmiyyəti maarifləndirmə qurumlarını yaradın-ayaqda tutun] və zəkatı / vergini verin! Özünüz üçün öncədən hər nə yaxşılıq edərsəniz, Allah qatında onu taparsınız. Şübhəsiz ki, Allah, etdiklərinizi ən yaxşı görəndir. (87/2, Bəqərə / 108-110)

## Nəcm: 416

**111** Bir də iman edənləri Yəhudiləşdirmək, Xristianlaşdırmaq istəyənlər: "Yəhudi və Xristianlardan başqası əsla cənnətə girməyəcək" dedilər. Bu, onların öz xülyalarıdır (əsassız düşüncələridir). De ki: "Əgər doğru kimsələrsinizsə, dəlilinizi gətirin."

**112** Xeyr, əksinə, kim yaxşılaşdıran-gözəlləşdirən biri olaraq özünü Allah üçün islamlaşdırarsa, bax onun, Rəbbi qatında mükafatı vardır. Onlara heç bir qorxu da yoxdur və onlar üzülməzlər.

**113** Və Yəhudilər dedilər: "Xristianlar bir şey üzərində deyillər / onların önəmli bir yanları yoxdur." Xristianlar da dedilər: "Yəhudilər bir şey üzərində deyillər / onların önəmli bir yanları yoxdur." Halbuki onlar, kitabı oxuyurlar. Bilməyən kimsələr də onların sözü kimisini dedilər. Artıq, içində anlaşılmazlıq etdikləri şeylərdə, qiyamət günü aralarında Allah hökm verəcəkdir. (87/2, Bəqərə / 111-113)

## Nəcm: 417

**114** Və Allahın tanıdıldığı-öyrədildiyi məktəblərini, içərilərində Allahın adı xatırlanmasın deyə əngəlləyən və onların yıxılması üçün çalışan adamdan daha öz mənliyinə haqsızlıq edən kim ola bilər?!.. Belələrinin, Allahın tanıdıldığı-öyrədildiyi o məktəblərə girmələri ancaq qorxa-qorxa olacaqdır. Onlar üçün dünyada bir rəzillik vardır. Bunlar üçün axirətdə də böyük bir əzab vardır.

**115** Və şərq-qərb [hər tərəf] yalnızca Allahındır. Elə isə hər hansı tərəfə yönələrsinizsə, artıq orası Allahın üzüdür. Şübhəsiz ki, Allah, biliyi və rəhməti geniş və sərhədsiz olandır, ən yaxşı biləndir.

(87/2, Bəqərə / 114-115)

## Nəcm: 418

**116** Bir də onlar, "Allah (Özünə) övlad götürdü" dedilər. *–O, onların yaraşdırdıqları bütün nöqsanlıqlardan pakdır.–* Əksinə, göylərdə və yer üzündə nə varsa, yalnızca Onundur. Hamısı Ona daim hörmətlə yanaşanlardır.

**117** Göyləri və yeri yoxdan var edəndir. Və O, bir işin olmasına qərar verdiyi zaman, artıq ona yalnızca: "Ol!" deyər, o da dərhal olar.

**118** Və bilməyən kimsələr: "Allah bizimlə danışmalı, yaxud bizə də bir əlamət / işarət gəlməli deyildimi?!" dedilər. Bunlardan öncəkilər də eyni belə, bunların dedikləri kimi demişdilər. Onların qəlbləri bir-birinə bənzərdir. Biz həqiqətən, qəti bilik ilə biliklənmək istəyən camaat üçün ayələri açıq-aşkar ortaya qoyduq.

**119** Şübhəsiz Biz, səni haqq ilə müjdələyən və xəbərdarlıq edəsən deyə göndərdik. Sən, cəhənnəm əhlinə görə məsuliyyət daşımayacaqsan.

**120** Və sən onların dinlərinə / həyat tərzlərinə tabe olmadıqca, Yəhudilər və Nasara / Xristianlar səndən əsla razı olmazlar. De ki: "Şübhəsiz ki, Allahın (doğru) yol göstərməsi, yol göstərməyin məhz özüdür." Və əgər bilikdən, sənə gəlib çatan şeydən sonra bunların boş və müvəqqəti arzularına tabe olsan, sənin üçün Allah qatında heç bir yaxın olmaz, heç bir yardım edən də olmaz.

**121** Özlərinə kitabı verdiyimiz kimsələr onu, oxunmasının-izlənməsinin haqqını verərək oxuyarlar-izləyərlər. Bax onlar, ona iman edərlər. Hər kim ki, Kitabı bilərək rədd edərsə, bax onlar zərərə uğrayanların məhz özüdür. (87/2, Bəqərə / 116-121)

## Nəcm: 419

**122** Ey İsrail oğulları! Sizlərə ehsan etdiyim nemətimi və şübhəsiz sizi aləmlərə üstün etdiyimi xatırlayın!

**123** Kimsənin yerinə heç kimsə bir şey ödəməyəcəyi, heç kimsədən qurtulmaq üçün verilən qarşılıq qəbul edilməyəcəyi, yardımın, şəfaətin heç kimsəyə fayda verməyəcəyi və günahkarların yardım olunmadığı günə qarşı Allahın mühafizəsi altına daxil olun. (87/2, Bəqərə / 122-123)

## Nəcm: 420

**124** Və bir vaxt Rəbbi İbrahimi, bəzi kəlmələr / yaralar, sıxıntılar ilə sınamış, o da onları tam olaraq yerinə yetirmişdi. Rəbbi: "Mən, səni insanlara öndər edənəm" demişdi. İbrahim: "Soyumdan da öndərlər et!" dedi. Rəbbi: "Mənim əhdim / yerinə yetirilməsi üçün verdiyim söz, öz mənliyinə haqsızlıq edən kimsələrə yetişməz!" dedi.

**125** Və Biz, bir zaman bu Beyti / ilk inşa edilən məktəbi, insanlar üçün bir savab qazanmaq / dönüş yeri və bir güvən yeri etmişdik. *–Siz də İbrahimin vəzifəsini icra etdiyi yerdən bir səlat yeri [maddi və zehni baxımdan dəstəyin; cəmiyyəti maarifləndirmək işinin yerinə yetirilməsi üçün bir yer] seçin.–* Və Biz, İbrahim ilə İsmailə: "Beytimi, gəzib-dolananlar, ibadət edənlər və boyun əyib təslimiyyət göstərənlər,

Allahın birliyini zikr edənlər üçün tərtəmiz tutun" deyə əhd almışdıq.

**126** Və bir zaman İbrahim: "Rəbbim! Buranı güvənli bir şəhər et, xalqını; onlardan Allaha və son günə iman edənləri meyvələrlə ruziləndir" demişdi. Allah dedi ki: "Kafiri [ilah və rəbb olduğumu bilərək rədd edən kimsəni] belə çox az qazanclandıraram (faydalandıraram), sonra da onu atəşin əzabına sürükləyərəm. Və (ora) necə də pis gediləcək yerdir!"

**127-129** Və bir vaxt İbrahim və İsmayıl Beytin bünövrəsini ucaltdılar: "Rəbbimiz! Bizdən qəbul et! Şübhəsiz, Sən ən yaxşı eşidənin, ən yaxşı bilənin məhz Özüsən. Rəbbimiz! Bizim ikimizi Sənin üçün sağlamlaşdıran [əmin-amanlıq, xoşbəxtlik qazandıran, insanların İslam dininə daxil olmasını təmin edən] biri et. Soyumuzdan da Sənin üçün sağlamlaşdıran [əmin-amanlıq, xoşbəxtlik qazandıran, insanların İslam dininə daxil olmasını təmin edən] bir öndərli camaat gətir. Və bizə, qulluq üsullarını göstər, tövbəmizi də qəbul et. Şübhəsiz ki, Sən günahdan dönmələri daha çox qəbul edənin və çox mərhəmətli olanın məhz Özüsən. Rəbbimiz! Bir də, onlara öz içlərindən bir peyğəmbər göndər ki onlara Sənin ayələrini oxusun, onlara kitabı və haqsızlıq, fəsad və qarmaqarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanunları və prinsipləri öyrətsin, onları təmizləsin. Heç şübhəsiz ki, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan; sağlam edənin məhz Özüsən."

**130** Və İbrahimin dinindən / həyat tərzindən, özünü ağılsızlaşdıran kimsədən başqa kim üz çevirər? Və Biz onu dünyada seçmişdik. Heç şübhəsiz ki, o, axirətdə də yaxşılardan biridir.

**131** Rəbbi Ona, "Sağlamlaşdıran [əmin-amanlıq, xoşbəxtlik qazandıran] biri ol!" dediyi zaman İbrahim: "Mən aləmlərin Rəbbi üçün sağlamlaşdıran [əmin-amanlıq, xoşbəxtlik qazandıran, insanların İslam dininə daxil olmasını təmin edən] biri oldum" dedi.

**132** İbrahim də müsəlman olmağı, öz oğullarına və Yəquba: "Ey oğullarım! Şübhəsiz ki, bu dini sizə Allah seçdi. Onun üçün yalnızca Sağlamlaşdıran [əmin-amanlıq, xoşbəxtlik qazandıran, insanların İslam dininə daxil olmasını təmin edən] kəslər olaraq ölün!" deyə vəsiyyət etdi. (87/2, Bəqərə / 124-132)

## Nəcm: 421

**142** İnsanlardan ağlı kəsməyənlər deyəcəklər: "Bunları, mövcud hədəfdən / strategiyadan çevirən nədir?" De ki: "Şərq və qərb [hər tərəf] yalnız Allahındır. O, dilədiyi / diləyən kimsəni

ən doğru yola yönəldər.”

**143** Və bax beləcə Biz, sizi xeyirli bir öndərli camaat etdik ki, siz insanların üzərində şahid olasınız, Elçi də sizin üzərinizdə şahid olsun. Üzərində olduğun bu hədəfi / strategiyanı təyin etməyimiz də yalnızca, Elçiyə tabe olan kimsələri iki dabanı üzərində geri dönəcək kimsələrdən ayırmağımız; işarələyib göstərməyimiz / bildirməyimiz üçündür. Təsbit etdiyimiz bu hədəf / strategiya, əlbəttə, Allahın yol göstərdiyi kimsələrin xaricindəkilərə çox böyükdür. Və Allah, imanınızı itirəsi deyil. Heç şübhəsiz ki, Allah, bütün insanlara çox şəfqətlidir, çox mərhəmətlidir.

**144** Biz, sənin Bizdən nə gözlədiyini həqiqətən görürük. Artıq səni razı olacağın bir hədəfə / strategiyaya (tərəf) çevirəcəyik. Haydı, üzünü Məscidülhərama / toxunulmaz təhsil-təlim qurumuna tərəf çevir; ağlın-fikrin həmişə təhsildə-təlimdə olsun. Siz də, harada olursunuz olun, üzünüzü onun tərəfinə çevirin! Özlərinə Kitab verilən kimsələr də, həqiqətən, onun Rəbbindən gələn bir gerçək olduğunu bilirlər. Və Allah, onların etdiklərindən xəbərsiz, məlumatsız deyildir.

**145** Və and olsun ki, sən, o Kitab verilən kimsələrə, bütün ayələri də gətirsən, yenə də sənin hədəfinə / strategiyana tabe olmazlar. Sən də onların hədəfinə / strategiyasına tabe olan biri deyilsən. Onsuz da onlar da bir-birlərinin hədəflərinə / strategiyalarına tabe deyillər. Yenə and olsun ki, sənə gələn bu qədər bilikdən sonra, sən onların boş-müvəqqəti arzularına tabe olsan, o zaman heç şübhəsiz sən, öz mənliyinə haqsızlıq edən kimsələrdən olarsan.

**146** *Özlərinə Kitab verdiyimiz bu kimsələr, Peyğəmbəri öz oğullarını tanıdıqları kimi tanıyırlar. Şübhəsiz ki, onlardan bir qismi də bilmələrinə rağmən, həqiqətən haqqı gizləyirlər.*

**147** Haqq Rəbbindəndir. O halda, əsla şübhəyə düşənlərdən olma!

**148** Və hər kəs üçün bir yön vardır; o, ona yönələndir. O səbəblə, həmişə xeyirlərə qaçın (tələsin), yarışın / xeyirləri önə gətirin. Harada olursunuz olun, Allah hamınızı bir yerə toplayar. Şübhəsiz ki, Allah hər şeyə ən yaxşı qadir olandır.

**149** Və haradan çıxırsan çıx, dərhal üzünü Məscidülhərama / toxunulmaz təhsil-təlim qurumuna tərəf çevir. Şübhəsiz ki, bu, Rəbbindən gələn bir haqqdır. Allah etdiklərinizdən məlumatsız və biganə deyil.

**150,151** Və haradan çıxırsan çıx, dərhal üzünü Məscidülhərama / toxunulmaz təhsil-təlim qurumuna tərəf çevir. Və siz, harada olursunuz olun, insanlardan, *–onlardan şirk qoşaraq səhv; öz*

*zərərlərinə olan əməli işləyən kimsələr xaric*– sizin əleyhinizdə bir dəlil olmaması üçün, Mənim sizə, içinizdən, sizə ayələrimizi oxuyan, sizi saflaşdıran, sizə kitabı və haqsızlıq, fəsad və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanunu və prinsipləri öyrədən və sizə bilmədiyiniz şeyləri öyrədən bir elçi göndərməyim kimi, sizə olan nemətimi tamamlamağım üçün və doğru yolu tapa bilməyiniz üçün üzünüzü dərhal ona tərəf çevirin. Artıq onların qarşısında hörmətlə, sevgiylə və biliklə ürpərməyin, Mənim qarşımda hörmətlə, sevgiylə və biliklə ürpərin.

**152** Elə isə Məni xatırlayın ki, Mən də sizi xatırlayım. Və Mənə, verdiyim nemətlərin qarşılığını ödəyin, Mənə nankorluq etməyin / verdiyim nemətləri görməməzlikdən gəlməyin. (87/2, Bəqərə / 142-152)

## Nəcm: 422[339]

**196** Və həcci / proqramlı ilahiyyat təhsilini və ümrəni / seminar, simpozium kimi qısa müddətli təhsilləri Allah üçün tamamlayın (başa vurun). Buna rəğmən, əgər siz tutulub saxlanılsanız / sizə maneə törədilsə, o zaman ilahiyat təhsili alanlara sizə asan gələn şeylərlə dəstək olun! Bununla bərabər bu ilahiyyat təhsili alanlara hədiyyə; verəcəyiniz dəstək, yerinə çatana qədər başlarınızı qırxdırmayın.[340] Artıq içinizdən xəstə olana və ya başını qırxdırmaqdan bir narahatlığı olana oruc və ya sədəqə yaxud da ibadətdən; hər hansı bir qulluq vəzifəsindən bir fidyə / qarşılıq (verməlidir)! Artıq əmin olduğunuz zaman da hər kim ümrədə / qısamüddətli təhsildə həccə; proqramlı ilahiyyat təhsilinə qədər qazanc əldə etdisə, artıq hədiyyədən; təhsilə dəstəkdən (özünə) asan gələn (bir şey etsin)! Fəqət kim (buna imkan) tapmasa, artıq üç gün həcdə; proqramlı ilahiyyat təhsili müddətində, yeddi (gün) də döndüyünüzdə oruc tutsun! Bu da tam on (gün) edər. Bu hökm, ailəsi Məscidülhəramda; toxunulmaz ilahiyyat təhsili mərkəzində hazır olmayanlar üçündür. Allahın mühafizəsi altına daxil olun və şübhəsiz Allahın cəzasının çox şiddətli olduğunu bilin.

**197** Həcc / proqramlı ilahiyyat təhsili, bilinən aylardır. Artıq hər kim o aylarda həcci / proqramlı ilahiyyat təhsilini başlayıb özünə fərz (vacib) edərsə / mütləq edəcəyəm deyərsə, artıq həcc; proqramlı ilahiyyat təhsili müddətində qadına yaxınlaşmaq / çirkin söz söyləmək, günah işləmək və dava-dalaş etmək yoxdur (olmaz). Siz nə xeyir işləsəniz də, Allah onu bilir. Və azuqə tədarük edin. Şübhəsiz ki, ən xeyirli azuqə Allahın mühafizəsi altına daxil olmaqdır. Və ey dərk etmə qabiliyyətləri olanlar! Mənim mühafizəm altına daxil olun!

**198** Rəbbinizdən bir ərməğan (nemət) istəməyinizdə heç bir qadağa

(günah) yoxdur. Artıq Ərəfatdan; təhsil qurumlarından ayrılıb axın etdiyinizdə, Məşərülhəramda; toxunulmaz şüur qazanma mərkəzində dərhal Allahı xatırlayın. Və Onu, Onun sizə göstərdiyi kimi xatırlayın. Və siz bundan öncə gerçəkdən azğınlardan idiniz.

**200-203** Sonra da Allaha qarşı vəzifələrinizi yerinə yetirdiyinizdə, eyni atalarınızı xatırladığınız kimi, hətta daha qüvvətli bir xatırlamaqla Allahı xatırlayın. Və Allahı sayı bəlli olan günlərdə xatırlayın. Artıq kim iki gün içində tələsərsə, ona günah yoxdur. Kim də təxirə salarsa ona da günah yoxdur. Bu, Allahın mühafizəsi altına daxil olan kimsələr üçündür. Allahın mühafizəsi altına daxil olun və şübhəsiz, özünüzün Onun hüzurunda toplanacağınızı bilin. **199** Sonra da insanların axın-axın gəldiyi yerdən siz də gəlin və Allahdan bağışlanmaq istəyin. Şübhəsiz ki, Allah çox bağışlayandır, çox mərhəmət edəndir. Bax insanlardan bəzisi: “Ey Rəbbimiz! Bizə dünyada ver!” deyən kimsələrdir. Onun üçün də axirətdə haqqına düşən heç bir pay yoxdur.

**201** Yenə onlardan “Rəbbimiz! Bizə dünyada bir gözəllik-yaxşılıq və axirətdə də bir gözəllik-yaxşılıq ver və bizi atəşin əzabından qoru!” deyənlər var.

**202** Bax onlar, özləri üçün qazandıqlarından haqqına düşən bir pay var. Və Allah, hesabı çox tez çəkəndir.

**204** İnsanlardan eləsi də vardır ki, onun bəsit dünya həyatı haqqındakı sözü sənin xoşuna gələr və o, qəlbindəkinə Allahı şahid tutar. Və o, düşmənçiliyi ən yaman olandır.

**205** O, dönüb gedən kimi / bir tapşırıq alıb gedən kimi yer üzündə fəsad çıxartmaq, əkini / mədəniyyəti / qadınları və nəsli dəyişikliyə / məhvə məruz qoymaq üçün çalışar. Allah isə fəsadı sevməz.

**206** Ona, “Allahın mühafizəsi altına daxil ol!” deyildiyi zaman da təkəbbürü, gücü, onu günah işləməyə sürükləyər. Bax beləsinə cəhənnəm kifayətdir. O, necə də pis bir döşəkdir (yataqdır)!

**207** İnsanlardan eləsi də vardır ki, Allahın rizasına yetişmək üçün özünü satar [Allah yolunda malını-mülkünü xərcləyər, canını ortaya qoyar]. Və Allah, qullarına çox şəfqətlidir.

**158** Şübhəsiz ki, Səfa və Mərvə Allahın əlamətlərindən bir neçəsidir. Onun üçün hər kim Beyti / İlahiyyat təhsilinin mərkəzi olan Kəbəni nəzərdə tutub Beytə getsə və ya ümrə / qısamüddətli təhsil alarsa, buralarda gəzməsində ona bir qadağa (günah) yoxdur. Hər kim də, könüllü olaraq bir xeyir işləyərsə, şübhəsiz, Allah qarşılıq verəndir, ən yaxşı biləndir.[341] (87/2, Bəqərə / 196-198, 200-203, 199, 201-202, 204-207, 158)

Nəcm: 423

**133** Yoxsa siz, Yəquba ölüm halı gəldiyi zaman, oğullarına: "Məndən sonra nəyə qulluq edəcəksiniz?" dediyi zaman, onların: "Biz, bir tək ilah olaraq sənin ilahına və ataların İbrahim, İsmail və İshaqın ilahına qulluq edəcəyik. Və biz, sadəcə Onun üçün islamlaşdıranlarıq" dediklərinə şahidlər idinizmi?!

**134** Onlar, gəlib keçən bir öndərli camaatdır. Onların qazandıqları özlərinədir, sizin qazandıqlarınız da özünüzədir. Siz onların etdiklərinə cavabdeh deyilsiniz.

**135** Və Yəhudilər: "Yəhudi olun ki, yönəldildiyiniz doğru yolu tapasınız"; Xristianlar da: "Xristian olun ki, yönəldildiyiniz doğru yolu tapasınız" dedilər. Sən de ki: "Əksinə, küfrdən, Allaha ortaq qoşmaqdan dönən biri olaraq, Allahın ortaqlarının olacağını qəbul etməyən İbrahimin dininə / həyat tərzinə (tabe oluruq)!"

**136** Deyin ki: "Biz Allaha, bizə nazil edilənə, İbrahimə və İsmailə və İshaqa və Yəquba və (onun) nəvələrinə nazil edilənə, Musaya və İsaya verilənə və peyğəmbərlərə Rəblərindən verilənlərə iman etdik; onlardan heç birini digərindən ayırmarıq və biz ancaq Onun üçün islamlaşdıranlarıq [sağlamlaşdıran / sağlamlıq-xoşbəxtlik qazandıran biriləriyik]."

**137** Artıq əgər möminləri Yəhudiləşdirmək, Xristianlaşdırmaq istəyənlər, sizin iman etdiyiniz kimi iman edərlərsə, artıq həqiqətən yönəldildikləri doğru yolu taparlar. Yox, əgər üz çevirərlərsə, onlar sadəcə parçalanmış vəziyyətdədirlər. Bax onlara qarşı sənə Allah yetər. Və O, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.

**138** Allahın dininə! Din ortaya qoymaqda Allahdan daha gözəl olan kimdir? Və biz, sadəcə Ona qulluq edənlərik.

**139,140** De ki: "Allah, sizin Rəbbiniz və bizim Rəbbimiz olmasına rəğmən, Onun haqqındamı bizimlə höcətləşirsiniz? Bir də, bizim əməllərimiz yalnızca bizə, sizin əməlləriniz də yalnızca sizə aiddir. Və biz sadəcə Onun üçün, (Onun) Özünü bütün nöqsanlıqlardan pak tutan kimsələrik. Yoxsa siz deyirsiniz ki: "Şübhəsiz, İbrahim, İsmail, İshaq, Yəqub və nəvələri də, hamısı Yəhudi və ya Xristian idilər"? De ki: "Siz daha yaxşı bilirsiniz, yoxsa Allahmı? Allahdan gələn bir şahidliyi öz yanında (gizlədib) saxlayandan daha çox özünə haqsızlıq edən kim ola bilər? Allah etdiklərinizdən məlumatsız, xəbərsiz də deyildir."

**141** Onlar, gəlib keçən bir öndərli camaatdırlar. Onların öz qazandıqları özlərinə aiddir, sizin qazandıqlarınız da sizə aiddir. Siz onların etdiklərinə cavabdeh deyilsiniz. (87/2, Bəqərə / 133-141)

## Nəcm: 424

**153** Ey iman etmiş kimsələr! Səbr etməklə və səlatla [maddi və zehni baxımdan dəstək olmaqla; cəmiyyəti maarifləndirməklə] yardım istəyin. Şübhəsiz ki, Allah səbr edənlərlə bərabərdir.

**154** Və Allah yolunda öldürülənlərə, "Ölülər" deməyin. Əslində onlar diridirlər. Fəqət sizin şüurunuz kəsmir (dərk etmirsiniz).

**155,156** Və həqiqətən də Biz, qorxudan, aclıqdan bir şeylərlə və mallardan, canlardan və məhsullardan azaltmaqla sizi zəiflədəcəyik / imtahan edəcəyik. Özlərinə bir müsibət gəldiyi zaman: "Biz şübhəsiz Allaha aidik və yalnız Ona dönəcəyik" deyən bu səbr edənlərə də müjdə ver!

**157** Bax onlar; Rəblərindən, müəyyən dəstəklər və rəhmət olunanlardır. Bax onlar, yönəldildikləri doğru yolu tapanların da məhz özüdür. (87/2, Bəqərə / 153-157)

## Nəcm: 425

**159,160** Şübhəsiz ki , nazil etdiyimiz açıq dəlilləri və doğru yol göstəricisini, Biz, kitabda insanlara açıq-aşkar göstərdikdən sonra, (onu) gizləyən kimsələr; bax onlar; onları Allah və uzaqlaşdıranlar, uzaqlaşdırıb (qovub) gözdən salar. Ancaq günahdan dönən və sahmana salanlar və açıq dəlilləri və doğru yol göstəricisini açıq-aşkar ortaya qoyanlar başqadır. Bax, onlar ki var, Mən onların tövbəsini qəbul edərəm. Və Mən tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verən, daha çox mərhəmət edənəm. (87/2, Bəqərə / 159-160)

## Nəcm: 426

**161,162** Küfr edib [Allahın ilah və rəbb olduğunu bilərək rədd edib] və bu halda ölənlər, məhz onlar, Allahın, təbii qüvvələrin / vəhylərin və insanların hamısının (özlərindən) uzaqlaşdırıb rədd etdikləridir. Onlar uzaqlaşdırılmış (tərk edilmiş) olaraq təməlli qalıcıdırlar. Nə onlara əzab yüngülləşdiriləcək, nə də onlara baxılacaq.

**163** Və sizin ilahınız vahid tək ilahdır. Ondan başqa ilah deyə bir şey yoxdur. O, yaratdığı bütün canlılara dünyada daha çox mərhəmət edəndir, geniş mərhəmət sahibidir.

**164** Şübhəsiz ki, göylərin və yerin yaradılışında, gecə və gündüzün bir -birinin ardınca gəlməsində,
insanlara yarayan şeylərlə dənizdə axıb gedən gəmilərdə,
Allahın səmadan bir su endirib və onunla yer üzünü ölümündən sonra diriltməsində,
yer üzündə hər hərəkət edən canlılardan yaymasında,

küləkləri (bir səmtdən başqa səmtə) çevirməsində,
göy ilə yer üzü arasında əmrə hazır olan buludda, şübhəsiz ağlını işlədən bir camaat üçün əlbəttə əlamətlər / işarətlər var.
**165,166** İnsanlardan eləsi də Allahın altındakılardan bəzi (şeyləri Allaha) tay tutan kimsələrdir. Onları, Allahı sevər kimi sevirlər. Halbuki iman etmiş kimsələr, Allaha sevgi cəhətdən daha qüvvətlidir. Və şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən o kimsələr, əzabı görəcəkləri zaman, özlərinə tabe olunan kimsələr, əzabı görərək özlərinə tabe olanlardan qaçıb uzaqlaşdıqları və əzabı gördükləri və onlarla bağlar kəsildiyi zaman, bütün qüvvətin Allaha aid olduğunu və Allahın əzabının gerçəkdən çox şiddətli olduğunu kaş ki, görsəydilər.
**167** Onlara tabe olanlar da: “Ah, bizim üçün dünyaya bir dönüş olsaydı və onların bizdən uzaqlaşdıqları kimi biz də onlardan uzaqlaşsaydıq!” deyərlər. Bax beləcə, Allah onlara bütün əməllərini, üzərlərinə yığılmış peşmanlıq və üzüntülər halında göstərəcəkdir. Onlar bu atəşdən çıxanlar da deyillər. (87/2, Bəqərə / 161-167)

## Nəcm: 427

**168** Ey insanlar! Yer üzündəki halal və təmiz, xoş, faydalı şeylərdən yeyin və şeytanın addımlarını izləməyin. Şübhəsiz ki, o, sizin üçün açıq-aşkar bir düşməndir.
**169** O, sizə yalnızca pisliyi, həddi aşmağı; çirkinliyi-həyasızlığı və Allah haqqında bilmədiyiniz şeyləri söyləməyinizi əmr edər.
**170** Və onlara, “Allahın nazil etdiyinə tabe olun!” deyildiyi vaxt, “Əksinə, biz atalarımızı nəyin üzərində görmüşüksə, ona tabe olacağıq!” dedilər. Ataları heç bir şey anlamaz və yönəldildikləri doğru yolu tapa bilməyən kəslər olsalardamı? (87/2, Bəqərə / 168-170)

## Nəcm: 428

**171** Və kafirlərin bir qisminin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] halı, sadəcə bir çığırma və ya bağırmadan başqasını eşitməyən şeylərə çoban hayqırışı / qarğa hayqırışı edən kimsənin halı kimidir; (onlar) kardırlar, laldırlar və kordurlar. Buna görə də anlamazlar.
**259** Bir qisim küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş] kəslərin halı da, evlərinin banları çökmüş bir şəhərə yolu düşən kimsə kimidir. O kimsə: “Bunu, bu ölümündən sonra Allah necə dirildəcək?!” deyərək inancsızlığını ortaya qoydu. Belə olduqda, Allah onu yüz il öldürdü, sonra diriltdi. Allah, “Nə qədər qaldın?” dedi. O, “Bir gün yaxud bir günün bir hissəsi (qədər) qaldım” dedi. Allah, “Əksinə, sən yüz il qaldın, belə olduğu halda, yeməyinə-içməyinə bax,

hələ xarab olmayıb, eşşəyinə də bax. *–Biz, bunu, sən biləsən və səni insanlar üçün bir ayə edək deyə (belə) etdik.–* O sümüklərə də bax, (gör) onları necə qaldırırıq. Sonra onlara necə ət geydiririk?" dedi. Beləcə, ona açıq-aşkar bəlli olunca: "Şübhəsiz ki, Allahın hər şeyə qadir olduğunu daha yaxşı bilirəm" dedi. (87/2, Bəqərə / 171, 259)

## Nəcm: 429

**172** Ey iman etmiş kəslər! Əgər siz yalnızca Ona qulluq edirsinizsə, sizi ruziləndirdiyimiz şeylərin xoş, təmiz və faydalı olanlarından yeyin və verdiyi nemətlərin qarşılığını Allaha ödəyin.
**173** O sizə sadəcə ölü heyvanı, qanı, donuzun ətini və Allahdan başqası adına kəsilən heyvanları haram etdi. Sonra kim bunlardan yeməyə məcbur qalarsa, başqasının haqqına təcavüz etməmək və zərurət ölçüsünü keçməmək üzrə, ona bir günah yoxdur. Şübhəsiz ki, Allah çox bağışlayandır, çox mərhəmətlidir. (87/2, Bəqərə / 172-173)

## Nəcm: 430

**174** Şübhəsiz, Allahın kitabdan nazil etdiyi bir şeyi gizləyən və gizlədiyi şeyi çox az bir bədəllə satanlar; bax onlar, qarınlarına atəşdən başqa bir şey yeməzlər. Və qiyamət günü Allah onlarla danışmaz və onları təmizə çıxarmaz və onlara ağrı-acı verən bir əzab vardır.
**175** Bax onlar, doğru yol qarşılığı azğınlığı, bağışlanmaq qarşılığı əzab satın alan kimsələrdir. Bunlar, atəşə qarşı nə qədər də dözümlüdürlər!
**176** Bax bu, şübhəsiz ki, Allahın Kitabı haqq ilə nazil etməsi səbəbi ilədir. Və şübhəsiz, Kitab haqqında anlaşılmazlığa düşən bu kimsələr həqiqətən çox uzaq bir parçalanma içərisindədirlər. (87/2, Bəqərə / 174-176)

## Nəcm: 431

**177** Üzünüzü şərq və qərb yönünə çevirməyiniz "yaxşı adam olmaq" deyildir. Amma "Yaxşı adamlar" Allaha, Axirət gününə / Son Günə, mələklərə, Kitaba, peyğəmbərlərə iman edən; Allaha / mala / malını verməyə məhəbbəti olduğu halda, malını əqrəbalara, yetimlərə, miskinlərə, yolçuya və dilənçilərə və azadlığı olmayanlara verən və səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradan və ayaqda tutan], zəkatı / vergini verən kimsələrdir. Həm də, söz verdiklərində sözlərini əskiksiz yerinə yetirən, sıxıntı, xəstəlik və savaş zamanlarında səbr edən kimsələrdir. Bax onlar, özü-sözü doğru olanlardır. Və bax onlar, Allahın mühafizəsi altına daxil olan kəslərin məhz özüdür. (87/2, Bəqərə / 177)

**Nəcm: 432**

**178** Ey iman etmiş kəslər! Ölümlü hadisələrdə qisas; tərəflər arasında ədalətli qarşılıq sizə vacib edildi. Azad şəxs qarşılığında azad şəxs, qul qarşılığında qul, qadın qarşılığında qadın… Amma hər kim, ölənin qardaşı tərəfindən bir şey qarşılığı bağışlanarsa, o zaman ürfə (adətə, qayda-qanuna) uymalı, ona gözəlliklə ödəməlidir. Bu, Rəbbiniz tərəfindən bir yüngülləşdirmə və bir rəhmətdir. Artıq kim hədləri aşarsa, ağrı-acı verən əzab onun üçündür.

**179** Ey anlama qabiliyyətləri olanlar! Allahın mühafizəsi altına daxil olarsınız deyə bu ədalətli qarşılıq prinsipində sizin üçün həyat var.

(87/2, Bəqərə / 178-179)

**Nəcm: 433**

**180** Sizdən birinizə ölüm hazır olduğu vaxt, əgər bir xeyir / mal qoyub gedərsə, Allahın mühafizəsi altına daxil olan kəslər üçün bir haqq olaraq, atası-anası və ən yaxın əqrəbası üçün ürfə (adətə, qayda-qanuna) uyğun; hər kəs tərəfindən qəbul edilən bir şəkildə vəsiyyət etmək vacib vəzifə edildi.

**181** Artıq hər kim, bunu eşitdikdən sonra onu dəyişdirərsə, onun günahı ancaq onu dəyişdirənlərin üzərinədir. Şübhəsiz ki, Allah ən yaxşı eşidəndir, ən yaxşı biləndir.

**182** Artıq hər kim vəsiyyət edənin bir xəta işləməsindən və ya bir günaha girməsindən qorxar və onların arasını düzəldərsə, ona heç bir günah yoxdur. Şübhəsiz ki, Allah çox bağışlayandır, çox mərhəmət edəndir. (87/2, Bəqərə / 180-182)

**Nəcm: 434**

**183,184** ***Ey iman etmiş kimsələr! Qarşılıqlı, birlikdə oruc tutmaq [yeməyi, içməyi, cinsi əlaqəni və danışmağı tərk etmək]***[342] **Allahın mühafizəsi altına daxil olasınız deyə, sizdən öncəkilərə,** *'saylı günlərdə, o səbəblə sizdən hər kim xəstə olarsa və yaxud əkinçilik, ticarət, hərbi xidmət, təhsil-tədris kimi gediş gəlişli; hərəkətli bir iş üzrə olarsa* saylı günlər daxilində xəstə və səfərdə olmadığı digər günlər sayı qədər oruc olmalıdır. *Oruca gücünü itirənlər/gücü olanlar üzərinə isə bir yoxsulun yeməyi, qurtulmaq üçün borcdur. Hər kim könüllü xeyirxahlıq-yaxşılıq edərsə bu özü üçün çox xeyirlidir/ faydalıdır. Və əgər bilirsinizsə oruc tutmağınız sizin üçün xeyirlidir/ faydalıdır'* **şəklində fərz qılındığı kimi, sizə də fərz qılındı.**

**185** Ramazan ayı ki, Quran, insanlara bir yolgöstərən olaraq və furqandan, yol göstərmədən açıq-aydın açıqlamalar olaraq onda nazil edilmişdir. Bu səbəblə sizdən hər kim bu aya şahid olarsa (yetişərsə)

dərhal onda oruc tutsun. Hər kim xəstə və ya səfərdədirsə; *əkinçilik, ticarət, hərbi xidmət, təhsil-tədris kimi gediş gəlişli; hərəkətli bir iş üzərindədirsə* RAMAZAN AYI içində xəstə və səfərdə olmadığı digər günlərin sayı qədər oruc olmalıdır. Allah, sizə rahatlıq diləyir, sizə çətinlik diləməz. Bu rahatlıq; fidyənin olmaması, yolda olanlara və xəstə olanlara icazə verilməsi, Allahın mühafizəsi altına daxil olmanız və (günlərin) sayını; neçə gün oruc oldunuzsa orucunuzu ən yüksək dəyərdə gerçəkləşdirməyiniz, sizə yol göstərdiyinə görə Allahı böyük tutmağınız və Allahın verdiyi nemətlərin qarşılığını ödəyəsiniz deyədir.
**187** *Qarşılıqlı, birlikdə oruc tutmaq [yeməyi, içməyi, cinsi əlaqəni və danışmağı tərk etmək]* gecəsində qadınlarınızla cinsi əlaqəylə bağlı sözlər, cinsi əlaqə sizə halal edildi. Onlar sizin üçün bir libasdır, siz də onlar üçün bir libassınız. Allah sizin özünüzə xainlik etdiyinizi bildi, sonra tövbənizi qəbul etdi və sizi bağışladı. Artıq qadınlarınıza yaxınlaşın və Allahın sizin üçün yazdığı şeylərdən axtarın. Və fəcrdən, ağ sap qara sapdan daha yaxşı, sizin üçün üzə çıxana (seçilənə) qədər yeyin-için. Və gecəyə qədər orucunuzu tamamlayın. Və siz ilahiyyat təhsili mərkəzlərində proqramlı ibadət halında olarkən onlara yaxınlaşmayın. Bunlar Allahın hədləridir, artıq Allahın hədlərinə yaxınlaşmayın. Allah, Özünün mühafizəsi altına daxil olsunlar deyə, ayələrini insanlar üçün bax belə açıq-aydın ortaya qoyar.
**186** Və qullarım səndən Mənim haqqımda soruşduqları zaman, bilin ki, şübhəsiz Mən çox yaxınam. Mənə yalvarınca, yalvaranın yalvarışına cavab verərəm. O halda, rüşdə çatmaları üçün onlar da Mənə qarşılıq versinlər (çağırışımı qəbul etsinlər) və Mənə iman etsinlər.[343] (87/2, Bəqərə / 183-185, 187, 186)

## Nəcm: 435

**188** Aranızda mallarınızı da batil səbəblərlə yeməyin. İnsanların mallarından bir qismini bilərək və günah (yolu) ilə yemək üçün mallarınızı hakimlərə verməyin. (87/2, Bəqərə / 188)

## Nəcm: 436

**189** Sənə hilallardan (təzə ay barədə) sual verirlər. De ki: “Onlar, insanlar və həcc / proqramlı ilahiyyat təhsilinin dövrləri üçün zaman ölçüləridir.” Evlərinizə arxa tərəflərindən girməyiniz / dində Allahın prinsiplərindən başqa prinsiplər mənimsəməyiniz, “yaxşı adam olmaq” deyil. “Yaxşı adam olmaq”, Allahın mühafizəsi altına daxil olmaqdır. Elə isə, evlərinizə qapılarından girin; dini, din sahibi Allahın müəyyən etdiyi çərçivədə yaşayın. Və müvəffəqiyyətə çatanlardan,

qurtulanlardan olmağınız üçün Allahın mühafizəsi altına daxil olun.
(87/2, Bəqərə / 189)

**Nəcm: 437**

**190** Və sizinlə savaşan kimsələrlə Allah yolunda savaşın; ölün, öldürün. Və həddi aşmayın. Şübhəsiz ki, Allah həddi aşanları sevməz.
**191** Və onları harada tutsanız, öldürün, çıxardıqları yerdən siz də onları çıxardın. Və insanları dindən çıxarmaq; ortaq qoşmağa [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyə] sürükləmək, öldürməkdən daha şiddətlidir. Məscidülhəram; toxunulmaz ilahiyyat təhsili mərkəzi yanında onlar, orada sizinlə savaşmadıqca onlarla savaşmayın. Buna rəğmən onlar, sizinlə savaşarlarsa, dərhal onları öldürün. Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] cəzası bax belədir.
**192** Bununla bərabər, əgər vaz keçərlərsə, bilin ki, şübhəsiz Allah çox bağışlayandır, çox mərhəmət edəndir.
**193** Və insanları dindən çıxarmaq; ortaq qoşmağa [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyə] sürükləmək fəaliyyəti qalmayıb din yalnız Allahın olana qədər onlarla savaşın. Artıq əgər vaz keçsələr, düşmənçilik, öz mənliklərinə haqsızlıq edənlərdən başqasına yoxdur.
**194** Toxunulmazlıq ayı, haram aya qarşılıqdır. Və bütün toxunulmazlıqlar / bağlayıcı hökmlər bir-birinə qarşılıqdır. O halda, kim sizə hücum edərsə, siz də ona etdiyi hücumun eynisiylə hücum edin. Və Allahın mühafizəsi altına daxil olun. Və bilin ki, Allah, Öz mühafizəsi altına daxil olan kəslər ilə bərabərdir.
**195** Və Allah yolunda malınızı xərcləyin / başda yaxınlarınız olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edin, özünüzü əllərinizlə təhlükəyə atmayın və yaxşılaşdırın-gözəlləşdirin. Şübhəsiz ki, Allah, yaxşılaşdıranları-gözəlləşdirənləri sevər. (87/2, Bəqərə / 190-195)

**Nəcm: 438**

**208** Ey iman etmiş kəslər! Hamınız toplu halda (birlikdə) İslama-sülhə -güvənliyə-sağlamlığa daxil olun və şeytanın addımlarını izləməyin. Şübhəsiz ki, o, sizin üçün açıq-aşkar bir düşməndir.
**209** Buna rəğmən, əgər siz açıq-aşkar dəlillər gəldikdən sonra yenə azsanız, bilin ki, şübhəsiz Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
(87/2, Bəqərə / 208-209)

**Nəcm: 439**

**210** Onlar, sadəcə Allahın bulud kölgələri içində gəlməsini, təbii güclərin [şüa, radiasiya və meteorların] gəlməsini və işin bitirilməsini-mi gözləyirlar? Halbuki bütün işlər, yalnızca Allaha döndərilir.
**211** İsrail oğullarına, Bizim, onlara açıq-aşkar əlamətdən / işarətdən neçə dənə verdiyimizi soruş. Allahın nemətini hər kim özünə gəldikdən sonra dəyişdirərsə, artıq şübhəsiz ki, Allahın əzabı çox şiddətlidir.
**212** Bəsit dünya həyatı, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] üçün süslü (bəzəkli) göstərildi. Onlar, iman edənlərlə əylənirlər. Halbuki Allahın mühafizəsi altına daxil olan kəslər, qiyamət günü onların üstündədir. Allah, dilədiyi kimsəyə hesabsız ruzi verər. (87/2, Bəqərə / 210-212)

**Nəcm: 440**

**213** İnsanlar vahid bir öndərli cəmiyyət idi, Allah (onlara) müjdə vermələri və xəbərdarlıq etmələri üçün peyğəmbərlər göndərdi və anlaşılmazlıq etdikləri mövzularda insanlar arasında hökm etsinlər deyə, onların bərabərində haqq ilə kitab nazil etdi. Və məhz o Kitab verilənlər, özlərinə bu qədər dəlillər gəldikdən sonra, aralarındakı azğınlıq üzündən anlaşılmazlığa (ixtilafa) düşdülər. Belə olduqda, Allah, Öz biliyi ilə, iman edənləri, onların haqqında anlaşılmazlığa (ixtilafa) düşdükləri haqqa yönləndirdi. Və Allah, istədiyi kimsəni / istəyən kimsəni ən doğru yola yönəldir. (87/2, Bəqərə / 213)

**Nəcm: 441**

**214** Yoxsa siz, özünüzdən öncə gəlib keçənlərin halı sizə gəlmədən cənnətə daxil olacağınızımı sandınız? Onlara yoxsulluqlar, sıxıntılar üz verdi və sarsıldılar, hətta elçi və bərabərində iman edənlər: “Allahın yardımı nə zamandır?” deyirdilər. *–Diqqət edin! Gerçəkdən, Allahın yardımı çox yaxındır.–* (87/2, Bəqərə / 214)

**Nəcm: 442**

**215** Onlar, Allah yolunda nəyi xərcləyəcəklərini / nəfəqələşdirəcəklərini (verməli olduqlarını) səndən soruşurlar. De ki: “Xeyirdən / maldan; zamandan, bilikdən verdiyiniz şeylər / təmin etdiyiniz nəfəqələr, ana-ata, ən yaxınlar, yetimlər, miskinlər və yolda qalanlar üçündür.” Və nə xeyir işləsəniz, artıq şübhəsiz ki, Allah onu ən yaxşı biləndir.
**216** Və savaş sizin üçün xoş olmayan bir şey olmasına rəğmən, sizə vacib görəv olaraq verildi. Ola bilər ki, siz, sizim üçün xeyirli olan bir şeydən xoşlanmazsınız. Yenə ola bilər ki, siz, sizin üçün pis, zərərli

olan bir şeyi sevərsiniz. Və Allah bilir, siz bilməzsiniz.
(87/2, Bəqərə / 215-216)

**Nəcm: 443**

**217** Səndən, toxunulmaz ay haqqında və o toxunulmaz olan ayda savaşmaq haqqında soruşurlar. De ki: "O ayda savaşmaq, böyük günahdır. Və Allahın yolunda olmağa maneə törətmək, Onu və Məscidülhəramı / ilahiyat təhsil mərkəzini bilərək rədd etmək / görməzlikdən gəlmək və Məscidülhəramın əhalisini; orada təhsil-təlimlə məşğul olanları və qısamüddətli təhsildə iştirak edənləri oradan çıxartmaq, Allah yanında daha böyükdür (böyük günahdır). Və insanları dindən çıxartmaq; ortaq qoşmağa [Allahın ilah və rəbb olduğunu örtməyə] sürükləmək, öldürməkdən daha böyükdür (böyük günahdır)." Onlar, əgər bacarsalar, sizi dininizdən döndərmək üçün sizinlə savaşmaqdan heç bir zaman geri çəkilməzlər. Sizdən də hər kim dinindən dönüb və kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri kimi can verərsə, artıq onun bütün əməlləri, dünyada və axirətdə boşa getmişdir. Və bax onlar, atəşin əhlidir. Onlar orada daimi qalanlardır.
**218** Şübhəsiz ki, iman edən kimsələr, (öz) yurdlarından başqa yurdlara köçən kimsələr və Allah yolunda səy göstərən kimsələr, Allahın rəhmətinə ümid bəsləyirlər. Və Allah, çox bağışlayandır, çox mərhəmət edəndir. (87/2, Bəqərə / 217-218)

**Nəcm: 444**

**219,220** Səndən ağlı qarışdıran, örtən şeylər haqqında / ağlı örtməkdən və şans oyunları haqqında soruşurlar. De ki: "Bu ikisində böyük bir zaman itkisinə səbəb olma / xeyir işlərdə yavaşlama / zərər vermə / qüsur yaratma, bir də insanlar üçün bəzi mənfəətlər vardır. Zaman itkisinə səbəb olma / xeyir işlərdə yavaşlama / zərər vermə / qüsur yaratma halları, mənfəətlərindən daha böyükdür." Yenə səndən, nəyi Allah yolunda xərcləyəcəklərini soruşurlar. De ki: "Ehtiyacdan artığını xərcləyin." Allah, yaxşı-yaxşı düşünərsiniz deyə ayələrini bax belə sizin üçün ortaya qoyur. Səndən yetimlər haqqında da soruşurlar. De ki: Onlar üçün, "yaxşılaşdırmaq", ən yaxşısıdır. Əgər onlara qarışarsanız, artıq onlar sizin qardaşlarınızdır. Allah, fəsad törədənlərlə yaxşılaşdıranı bir-birindən seçər. Əgər Allah istəsəydi, sizi çətinliyə salardı. Şübhəsiz ki, Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
(87/2, Bəqərə / 219-220)

**Nəcm: 445**

**221** Və ortaq qoşan qadınları, iman edincəyə qədər nikahlamayın. İman edən, kafirlərin himayəsindəki bir qul qadın, *–sizin çox xoşunuza gəlsə də–* ortaq qoşan bir qadından daha xeyirlidir. Ortaq qoşan kişiləri də iman edincəyə qədər nikahlamayın; İman edən bir qul kişi, *–sizin çox xoşunuza gəlsə də–* ortaq qoşan bir kişidən daha xeyirlidir. Ortaq qoşanlar atəşə çağırırlar, Allah isə Öz biliyi ilə cənnətə və bağışlanmağa çağırır. O, öyüd alıb düşünərlər deyə, insanlar üçün ayələrini ortaya qoyar. (87/2, Bəqərə / 221)

**Nəcm: 446**

**222** Səndən qadınların aybaşı halı barəsində də soruşurlar. De ki: "O, bir əziyyətdir. Onun üçün aybaşı halında qadınlardan çəkilin və təmizlənənə qədər onlarla cinsi əlaqədə olmayın. Artıq yaxşıca təmizləndikləri zaman da Allahın əmr etdiyi yerdən onlara varın. Şübhəsiz ki, Allah, xətadan yaxşıca dönənləri sevər və çox təmizlənənləri sevər." (87/2, Bəqərə / 222)

**Nəcm: 447**

**223** Qadınlarınız, sizin üçün bir tarladır / mədəniyyətdir. Elə isə tarlanıza / mədəniyyətinizə dilədiyiniz kimi varın. Özünüz üçün də öncədən göndərin və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Ona qovuşacağınızı da bilin. *–Və möminlərə müjdə ver!–*
(87/2, Bəqərə / 223)

**Nəcm: 448**

**224** Və yaxşılardan olmağınıza, Allahın mühafizəsi altına daxil olmağınıza, insanların arasını düzəltməyinizə, Allahı, andlarınız üçün əngəl etməyin; "Edərdim, amma Allaha and içdim, artıq andımı poza bilmərəm" deməyin. Və Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**225** Allah, sizləri andlarınızdakı boş sözlərdən məsul (sorğu-suala) tutmaz; amma şüurlu (şəkildə) edilmiş hərəkətləriniz səbəbiylə məsul (sorğu-suala) tutar. Allah çox bağışlayandır, çox həlimdir.
(87/2, Bəqərə / 224-225)

**Nəcm: 449**[344]

**226** Qadınlarından ila edənlər/onlara yaxınlaşmamağa and içənlər üçün, dörd ay gözləmək (müddəti) var. Sonra əgər dönərlərsə, artıq şübhəsiz, Allah, çox bağışlayandır, çox mərhəmət edəndir.
**227** Əgər boşamağa qərar vermişlərsə, şübhəsiz ki, Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir. (87/2, Bəqərə / 226-227)

**Nəcm: 450**

228 Boşanmış qadınlar da, öz-özlərinə üç adət (aybaşı) dövrü qədər gözləyərlər. Əgər Allaha və axirət gününə iman edirlərsə, Allahın onların bətnlərində yaratdığını gizlətmələri, onlara halal olmaz. Və onların ərləri barışmaq istəyərlərsə o vaxt içərisində onları geri almağa daha çox haqq sahibidirlər. Və onların zərərlərinə olanlar kimi, ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilmiş bir şəkildə onların faydalarına olanlar da var. Kişilər üçün də, onların üzərində bir dərəcə var. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

229 Boşamaq iki dəfədir. Bundan sonrası ya ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilmiş şəkildə saxlamaq, və ya yaxşılıqla sərbəst buraxmaqdır. Onlara verdiklərinizdən bir şey almağınız da sizin üçün halal olmaz. Ancaq ikisinin də Allahın hədlərini qoruya bilməməkdən qorxmaları başqadır. Artıq əgər siz, dövlət görəvlilərinin, bunların, Allahın hədlərini qorumayacaqlarından qorxarsanız, qadının fidyə / ayrılmaq üçün bədəl (müəyyən haqq) verməsində ikisinə də vəbal (günah) yoxdur. Bax bunlar, Allahın hədləridir. Artıq bunları aşmayın. Hər kim ki, Allahın hədlərini aşarsa, artıq bax onlar, öz mənliklərinə haqsızlıq edənlərin məhz özüdür.

230 Əgər o, qadını boşayarsa, artıq bundan sonra o qadın, ondan başqa bir ər ilə nikahlanmadıqca ona halal olmaz. Sonra əgər ikinci ər onu boşayarsa, Allahın hədlərini qoruya biləcəklərini zənn etdilərsə, bir-birlərinə dönmələrində hər ikisinə də vəbal (günah) yoxdur. Allahın, bilən bir camaat üçün ortaya qoyduğu hədlər, bax bunlardır.

231 Qadınları boşadığınız zaman, iddətlərini (gözləmə müddətlərini) də bitirdiklərində, artıq onları ya məruf ilə saxlayın və ya məruf ilə sərbəst buraxın, haqlarına (hüquqlarına) təcavüz (etmək) üçün zərərlərinə olaraq onları saxlamayın. Hər kim bunu edərsə, öz mənliyinə haqsızlıq etmiş olar. Allahın ayələrini oyun-oyuncaq kimi qəbul etməyin. Allahın üzərinizdəki nemətini, sizə onunla öyüd vermək üçün nazil etdiyi kitabı və haqsızlıq, fəsad və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsipləri xatırlayıb düşünün. Həm də Allahın mühafizəsi altına daxil olun və şübhəsiz Allahın hər şeyi ən yaxşı bilən olduğunu bilin.

232 Və siz qadınları boşayıb, sonra onlar müddətlərinin sonuna gəldikləri zaman, ərləri ilə aralarında ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilən şəkildə razılaşdıqları zaman, onları ərləriylə nikahlanacaqlar deyə sıxışdırıb əngəlləməyin. Bax bu,

sizdən Allaha və axirət gününə iman edən kimsələrin onun vasitəsiylə öyüdlənəcəyidir. Bax bu, sizin üçün daha uyğun və daha pakdır. Və Allah bilir, siz bilməzsiniz. (87/2, Bəqərə / 228-232)

**Nəcm: 451**

**233** Analar, (öz) uşaqlarını, *–əmizdirmənin tamamlanmasını istəyənlər üçün–* tam iki il əmizdirərlər. Uşaq özünə aid olan ataya da əmizdirənlərin yeməkləri və geyimləri ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilən şəkildə, bir borcdur. İnsan sadəcə gücünə; tutumuna görə məsul olar. Uşağı səbəbiylə bir ana və uşağı səbəbiylə bir ata da zərərə soxulmasın. Varisə də bunun eynisi borcdur. Əgər ana və ata bir-birləriylə istişarə (məsləhət) edib, öz razılıqlarıyla uşağı süddən ayırmaq istəyərlərsə, onlara bir vəbal (günah) yoxdur. Əgər uşaqlarınızı əmizdirmək istəyərsəniz, verəcəyinizi ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildə təslim etdiyiniz zaman, bunda da sizə bir vəbal (günah) yoxdur. Və Allahın mühafizəsi altına daxil olun və şübhəsiz Allahın etdiklərinizi çox yaxşı görən olduğunu bilin. (87/2, Bəqərə / 233)

**Nəcm: 452**

**234** Aranızdan, keçmişdə etdikləri və etməli olduğu halda etmədiklərini bir-bir xatırlatdırılanlar; ölənlər və geridə zövcələr buraxan kimsələrin xanımları da, öz yanlarından dörd ay on gün gözləyərlər. Sonra vaxtları sona çatdığı zaman, artıq özləri haqqında ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilən şəkildə etdikləri işdə sizin [bunu edənlər və bunu izləyənlər] üçün bir vəbal (günah) yoxdur. Və Allah sizin etdiklərinizdən xəbərdardır.

**235** Və bu qadınlara evlənmək istəyinizi üstüörtülü bir şəkildə bildirməkdə və ya bunu içinizdə saxlamağınızda sizə bir günah yoxdur. Şübhəsiz ki, Allah, sizin onları xatırlayacağınızı bilir. Fəqət ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilmiş bir şəkildə, bir söz söyləməkdən başqa bir şəkildə, onlarla gizlicə sözləşməyin. Vacib olan vaxt sona çatıncaya qədər də nikah əqdinə qəti qərar verməyin. Bilin ki, şübhəsiz, Allah içinizdəkini bilir. Elə isə Ondan çəkinin. Yenə bilin ki, şübhəsiz, Allah qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, çox həlimdir.

**236** Əgər qadınları, onlara toxunmadan və ya onlar üçün bir mehr[345] hazırlamadan / müəyyən etmədən boşayarsanız, sizə bir vəbal (günah) yoxdur. Və onları qazanclandırın. Geniş (imkanı) olan (öz) vəziyyətinə görə, əli aşağı olan da (öz) vəziyyətinə görədir. Ürfə (Adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildə

qazanc, gözəl-yaxşı əməl işləyənlər üzərində bir borcdur.

**237** Və əgər onları, onlara toxunmadan öncə boşasanız və mehri də müəyyən etmiş olsanız, o zaman borc, o müəyyən etdiyiniz miqdarın yarısıdır. Ancaq qadınlar və yaxud nikah əqdini əlində tutan kimsə / vəlisi (vəkili) bağışlayarsa başqa. Və bağışlamağınız, Allahın mühafizəsi altına daxil olmaq üçün daha yaxındır. Aranızdakı üstünlüyü də unutmayın. Şübhəsiz ki, Allah etdiklərinizi ən yaxşı görəndir. (87/2, Bəqərə / 234-237)

## Nəcm: 453

**238,239** Səlatları [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını] və ən xeyirli səlatı [maddi və zehni baxımdan dəstək olmağın; cəmiyyəti maarifləndirməyin ən faydalı olanı; həftəlik cəmlənmək günü səlatını][346] hamılıqla birlikdə qoruyun. Və Allah üçün daim ehtiram göstərərək (ayağa) qalxın; işə girişin; təhsil-tədris və sosial yardım qurumunu işlədin. Amma əgər qorxulu bir ortamda olursunuzsa, o zaman piyada və ya minik üstündə gedərkən; hərəkət halında qoruyun, yerinə yetirin. Sonra da güvənliyə yetişdiyinizdə, bilmədiyiniz şeyləri sizə öyrətdiyi kimi Allahı dərhal xatırlayın. (87/2, Bəqərə / 238-239)

## Nəcm: 454

**240** Və sizdən zövcələr buraxaraq ölənlər, zövcələri üçün bir ilədək evlərindən çıxarılmamaq şərti ilə onlara yetəcək bir malı vəsiyyət edərlər. Artıq onlar çıxarlarsa, ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilmiş şəkildə onların elədiklərində sizin üçün bir vəbal (günah) yoxdur. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyandır, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

**241** Boşanmış qadınların ürfə (adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilmiş şəkildə bir bəhrələnmə / nəfəqə alma (ehtiyaclarının təmin edilməsi) Allahın mühafizəsi altına daxil olan kəslərin üzərində bir vəzifədir.

**242** Bax Allah, ağıllarınız dərk etsin deyə ayələrini sizə belə açıqlayır.

(87/2, Bəqərə / 240-242)

## Nəcm: 455

**243** Özləri minlərlə adam olduğu halda ölüm qorxusuyla yurdlarından çıxan, sonra da Allahın onlara “Ölün / canınız çıxsın!” deyib, sonra da onlara bir həyat verdiyi kimsələri görmədinmi / heç düşünmədinmi? Şübhəsiz, Allah insanlara lütf edəndir. Lakin insanların bir çoxu

özlərinə verilən nemətlərin qarşılığını ödəmirlər.

**244** Və Allah yolunda savaşın. Şübhəsiz ki, Allahın ən yaxşı eşidən və ən yaxşı bilən olduğunu da bilin.

**245** Kimdir o kəs ki, Allaha gözəl bir ödünc versin, Allah da onun bir xeyli qatlarını artırsın? Allah darlıq da verir, genişlik də verir. Və yalnız Ona döndəriləcəksiniz.

**246** İsrail oğullarının Musadan sonra böyüklərini görmədinmi / heç düşünmədinmi? Bir vaxt onlar öz peyğəmbərlərindən birinə: "Bizə bir hökmdar göndər ki, Allah yolunda savaşaq!" demişdilər. Peyğəmbər: "Sizə savaşmaq fərz edilərsə, görəsən vuruşmaqdan qaçınarsınızmı?" dedi. İsrail oğullarının böyükləri dedilər: "Bizə nə olub ki, yurdlarımızdan və övladlarımızdan ayrıldığımız halda, Allah yolunda savaşmayaq?" Sonra da savaşmaq onlara görəv olaraq verildikdə, onlardan çox az bir qismi istisna olmaqla, üz çevirdilər. Və Allah, o öz mənliklərinə haqsızlıq edənləri ən yaxşı biləndir.

**247** Peyğəmbərləri də onlara: "Şübhəsiz ki, Allah, sizə hökmdar olaraq Talutu göndərdi" demişdi. İsrail oğulları: "O, bizim üzərimizdə necə hökmdar ola bilər, halbuki hökmdar olmağa biz ondan daha çox haqq sahibiyik, ona mal-dövlət olaraq bir genişlik, bir bolluq da verilməmişdir" dedilər. Peyğəmbərləri: "Onu sizin başınıza Allah seçmişdir və onu bilik və vücud baxımıdan üstün etmişdir" dedi. Allah da, mülkünü istədiyi kimsəyə verər. Və Allah, biliyi və rəhməti geniş və hədsiz olandır, çox yaxşı biləndir.

**248** Peyğəmbərləri də: "Şübhəsiz ki, onun hökmdarlığının əlaməti / işarəti, sizə, güclü varlıqların daşıdığı, içində Rəbbinizdən qəlbi təskin edən güvən və sakitlik hissi / mənəvi güc (bəxş edən), Musa və Harun ailələrinin buraxdıqlarından bir, güclü varlıqların daşıdığı, qalıntı olan o tabutun gəlməsi olacaqdır. Əgər iman etmiş kimsələrsinizsə, şübhəsiz ki, bunda sizin üçün həqiqətən bir əlamət / işarət vardır" dedi.

**249** Sonra Talut, ordu ilə ayrılarkən dedi ki: "Şübhəsiz ki, Allah sizi həqiqətən bir çayla imtahan edəcək. Artıq kim ondan içərsə, məndən deyildir. Kim də, *–ancaq əliylə bir ovuc alan istisna olmaqla–* ondan dadmasa, bax o, məndəndir." Sonra da aralarında çox azı istisna olmaqla, ondan içdilər. Talut və onunla birlikdə olan iman edən kimsələr çayı keçdiklərində İsrail oğulları: "Bizim bu gün, Calut ilə ordusunun qarşısında dayanmağa gücümüz yoxdur" dedilər. Allaha qovuşacaqlarına həqiqətən iman edənlər: "Neçə-neçə az dəstələr, Allahın izni ilə neçə-neçə çox dəstələrə qalib gəlmişdilər. Allah, səbr edənlərlə bərabərdir!" dedilər.

**250** Və onlar, Calut və ordusu üçün ortaya çıxdıqları zaman: *“Rəbbimiz! Bizə çoxlu-çoxlu səbr ver ki, gücümüz azalmasın, zəiflik göstərməyək, boyun əyməyək, qədəmlərimzi möhkəmləndir və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] dəstəsinə qarşı bizə yardım et!”* dedilər

**251** Sonra da, Allahın izni ilə / məlumatı daxilində Calut və ordusunu darmadağın etdilər. Davud da Calutu öldürdü və Allah ona hökmdarlıq, fəsadın və qarışıqlığın qarşısını almaq üçün qoyulmuş qayda-qanun və prinsipləri verdi. Ona istədiyi şeylərdən də öyrətdi. Əgər Allahın, insanların bir qismini digər bir qisimiylə qorumasaydı, yer üzü həqiqətən fəsada uğrayardı. Fəqət Allah, aləmlər üzərində böyük bir lütf sahibidir.

**252** Bax bunlar, Allahın ayələridir. Biz, onları sənə haqq olaraq oxuyuruq. Şübhəsiz sən də həqiqətən göndərilənlərdənsən.

**253** Budur elçilər; Biz onların bəzisini bəzisindən üstün etdik. Onlardan bir qismi Allahın tək tərəfli olaraq söz söylədiyi / yaraladığı, çox sıxıntılar yaşatdığı və bəzisinin dərəcələrini üstün etdiyi kimsələrdir. Və Məryəm oğlu İsaya açıq dəlillər verdik və onu Allahın vəhyi ilə gücləndirdik. Və əgər Allah istəsəydi, onların ardınca gələnlər, açıq mesajlar onlara gəlib çatdıqdan sonra bir-birlərini öldürməzdilər. Lakin ayrılığa (ixtilafa) düşdülər və onlardan bəzisi iman etdi, bəzisi küfr etdi [Allahın ilah və rəbb olduğunu bilərək rədd etdi]. Və əgər Allah istəsəydi bir-birlərini öldürməzdilər. Lakin Allah istədiyini edər. (87/2, Bəqərə / 243-253)

## Nəcm: 456

**254** Ey iman etmiş kimsələr! Heç bir alış-verişin, heç bir dostluğun və heç bir yardımın, şəfaətin olmadığı bir gün gəlmədən öncə, sizə verdiyimiz ruzilərdən Allah yolunda xərcləyin / başda yaxınlarınız olmaqla başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edin. Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] öz mənliklərinə haqsızlıq edənlərin məhz özləridir. (87/2, Bəqərə / 254)

## Nəcm: 457

**255** Allah, Ondan başqa ilah deyə bir şey yoxdur, hər zaman diridir, hər şeyi ayaqda tutan, qoruyan, diri və bütün kainatın idarəsini Özü edəndir. Onu əsla mürgüləmə və yuxu tutmaz. Göylərdə olan şeylər və yer üzündə olan şeylər yalnız Onun üçündür. Onun izni / məlumatı olmadan yanında yardım, şəfaət edə bilən kim imiş? O, onların

önlərində və arxalarında olan şeyləri bilir. Onlar isə, Onun istədiyindən başqa, biliyindən heç bir şeyi qavraya bilməzlər. Onun kürsüsü göyləri və yer üzünü əhatə etmişdir. Onların ikisinin də qorunması Ona çətin gəlməz. Və O, çox ucadır, ucaldandır, sonsuz böyükdür. (87/2, Bəqərə / 255)

## Nəcm: 458

**256** Dində zorlamaq / diksindirmək yoxdur; iman küfrdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməkdən]; yaxşı pisdən, gözəl çirkindən, doğruluq azğınlıqdan həqiqətən yaxşıca ayrılmışdır. O halda kim tağuta[347] küfr edər (inkar edər); onu tanımayıb (rədd edərək) Allaha iman edərsə, qopmaq bilməyən ən sağlam bir dəstəkdən yapışmışdır. Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.

**257** Allah, iman edənlərin yardımçı, yol göstərici, qoruyucu (himayə edən) yaxınıdır; onları qaranlıqlardan aydınlığa çıxarır. Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] gəlincə; onların yardımçı, yol göstərici, qoruyucu (himayə edən) yaxını tağutdur ki, onları aydınlıqdan qaranlıqlara çıxarır. Bunlar cəhənnəm əhlidir. Onlar orada daimi qalıcıdırlar. (87/2, Bəqərə / 256-257)

## Nəcm: 459

**258** Allah, ona hökmdarlıq verdi deyə, Rəbbi haqqında İbrahimlə mübahisə edən kimsəni görmədinmi / heç düşünmədinmi? Bir vaxt İbrahim: "Mənim Rəbbim dirildən və öldürəndir" demişdi. O: "Mən dirildir və öldürürəm" demişdi. İbrahim: "Elə isə, şübhəsiz ki, Allah, günəşi məşriqdən gətirir, bacarırsansa, sən onu məğribdən gətir!" deyincə, o kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] adam çaşıb qaldı. *–Və Allah öz mənliklərinə haqsızlıq edənlər topluluğuna doğru yolu göstərməz.–* (87/2, Bəqərə / 258)

## Nəcm: 460

**260** Bir zamanlar İbrahim də: "Ey Rəbbim! Ölüləri necə diriltdiyini mənə göstər!" demişdi. Allah: "İman etmədinmi ki?" dedi. İbrahim, "İman etdim, fəqət qəlbim bütün sual işarələrini aradan qaldıraraq rahatlığa qovuşsun deyə" dedi. Allah: "Dərhal quşlardan dördünü tut və onları özünə öyrət. Sonra hər dağın üzərinə onlardan bir parça (birini) burax. Sonra da quşları çağır, qaça-qaça / sürətlə sənə gələcəklər. Və bil ki, Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun

qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir" dedi.

(87/2, Bəqərə / 260)

## Nəcm: 461

**261** Mallarını Allah yolunda xərcləyən / başda yaxınları olmaqla başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edən kimsələrin örnəyi yeddi sünbül bitirən və hər sünbülündə yüz ədəd dən olan dənin örnəyi kimidir. Allah istədiyinə qat-qat artırar. Və Allah, biliyi və rəhməti geniş və hədsiz olandır, çox yaxşı biləndir.

**262** Allah yolunda mallarını xərcləyən / başda yaxınları olmaqla başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edən, sonra verdiklərinin arxasından minnət qoymayan və incitməyən bu kimsələrin mükafatları Rəblərinin yanındadır. Onlar üçün heç bir qorxu yoxdur və onlar üzülməyəcəklər.

**263** Ürfə (Adətə, qayda-qanuna) uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildəki söz və bağışlamaq, arxasında incitmək, minnət olan bir sədəqədən daha xeyirlidir. Allah zəngindir / heç bir şeyə möhtac deyildir, həlimdir.

**264** Ey iman etmiş kimsələr! Allaha və son günə iman etmədiyi halda malını insanlara göstərmək üçün xərcləyən [kimsə kimi, minnət qoyaraq və əziyyət edərək sədəqələrinizi puç etməyin.] Bax onun durumu, üzərində bir az torpaq olan, üzərinə bir leysan yağdığı zaman, leysanın çılpaq olaraq buraxdığı qayanın durumu kimidir. Onlar qazandıqlarından heç bir şey əldə edə bilməzlər. Və Allah, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] topluluğuna doğru yolu göstərməz.

**265** Allahın razılığını qazanmaq və özlərini sağlamlaşdırmaq üçün xərcləyənlərin / başda yaxınları olmaqla başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edənlərin durumu da üzərinə bol yağmur yağıb və məhsulunu ikiqat verən, məhsuldar torpaqlardakı bir bağçanın durumuna bənzəyir. Belə bir bağçaya bol yağmur yağmasa da bir çiskin (kifayət edər)… Allah etdiklərinizi ən yaxşı görəndir.

**266** Hansı biriniz istəyər ki, onun xurmalıq və üzümlüklərdən (ibarət) bir bağçası olsun, altından çaylar axsın, içində hər cür məhsulu olsun, öz üzərinə də qocalıq çöksün və zəif soyu olsun, bu vaxt ona odlu bir fırtına düşsün, o bağça yansın?! Bax Allah, yaxşı-yaxşı düşünərsiniz deyə ayələrini sizə bu cür açıqlayar.

**267** Ey iman etmiş kimsələr! Qazandıqlarınızdan, sizin üçün yerdən çıxardıqlarımızın təmizindən Allah yolunda xərcləyin. Özünüzün göz yummadan almayacağınız pis şeyləri verməyə cəhd etməyin. Və

şübhəsiz Allahın çox zəngin olduğunu / heç bir şeyə möhtac olmadığını, tariflənən / tərifə layiq olduğunu bilin.

**268** Şeytan, sizi fəqirliklə qorxudur və sizə çirkinliyi-həyasızlığı əmr edir. Allah isə, sizə Öz tərəfindən bağışlanmaq və bol ehsan vəd edir. Və Allah, biliyi və rəhməti sonsuz geniş olandır, ən yaxşı biləndir.

**269** Allah, istədiyinə haqsızlığı, fəsadı və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsiplər verir. Və kimə haqsızlığı, fəsadı və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsiplər verilərsə, gerçəkdən ona daha çox xeyir verilmişdir. Qavramaq qabiliyyəti olanlardan başqası da yaxşıca düşünə bilməz.

**270** Nəfəqə (başqalarının ehtiyacını təmin etmək) üçün nəyi xərclədinizsə və ya nəzir olaraq nəyi nəzir elədinizsə, şübhəsiz, Allah onu bilir. Və öz mənliklərinə haqsızlıq edən kimsələr üçün heç bir yardımçı yoxdur.

**271** Sədəqələri aşkarda verərsəniz, artıq o, nə yaxşı olar; əgər onları gizlədib fəqirlərə versəniz, artıq bu, sizin üçün daha xeyirlidir və günahlarınızdan bir qismini örtər. Və Allah, işlədiyiniz şeylərdən xəbərdardır.

**272** Onları doğru yola gətirmək sənin boynunda bir borc deyildir, ancaq Allah istədiyi kimsəni doğru yola gətirər. Və xeyirdən Allah yolunda xərclədiyiniz / başda yaxınlarınız olmaqla başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin etdiyiniz şeylər sırf özünüz üçündür. Və siz yalnızca Allahın razılığını qazanmağın xaricində xərcləməzsiniz. Və xeyirdən nə xərcləyərsəniz, o, sizə tam olaraq ödənəcəkdir. Və siz, haqsızlığa məruz qalmayacaqsınız.

**273** Allah yolunda xərcləməyiniz, yer üzündə gəzib-dolanmağa gücü çatmayan, özlərini Allah yoluna həsr edən fəqirlər üçün olsun. Utancaq olduqlarından, bilməyənlər, onları zəngin sanırlar. *–Sən onları işarətlərindən tanıyarsan.–* Arsızlıq edərək insanlardan istəməzlər. Və siz, xeyirdən nəyi xərcləyərsəniz, bilin ki, şübhəsiz Allah, onu çox yaxşı biləndir.

**274** Mallarını hər zaman, gizlicə və açıq şəkildə Allah yolunda xərcləyən kimsələr; bax onların, Rəbləri yanında mükafatları vardır. Və onlara hər hansısa bir qorxu yoxdur və onlar üzülməzlər.

(87/2, Bəqərə / 261-274)

## Nəcm: 462

**275** O ribanı [əməksiz, risksiz, işləyib səy göstərmədən asanca əldə edilən qazancları][348] yeyən kəslər, şeytanın bir toxunuşla toxunduğu

kəsin qalxmasından başqa cürə qalxa bilməzlər. Bu, şübhəsiz ki, onların: “Alış-veriş, riba kimidir” demələri səbəbiylədir. Halbuki, Allah alış-verişi halal, bu ribanı haram etmişdir. Özünə Rəbbindən bir öyüd gəlib, etdiyindən əl çəkənin keçmişi özünə, işi Allaha aiddir. Və kim ki, yenidən dönərsə, bax onlar atəşin dostlarıdır. Onlar orada daimi qalacaqlar.

**276** Allah, ribanı yox edər, sədəqələri artırar. Allah, həddindən artıq nankor və günahkar kimsələri sevməz.

**277** Həqiqətən iman gətirən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradan-ayaqda tutan] və zəkatı / vergini verən şəxslərin Rəbləri qatında mükafatları var. Və onlar üçün heç bir qorxu yoxdur, onlar üzülməzlər.

**278** Ey iman etmiş kimsələr! Əgər möminsinizsə, Allahın mühafizəsi altına daxil olun və ribadan qalanı buraxın.

**279** Artıq belə etməsəniz, o zaman Allah və Elçisindən sizə savaş (mübarizə) olduğunu / gülünc vəziyyətə düşəcəyinizi; pərişan ediləcəyinizi bilin. Əgər tövbə edərsəniz, artıq sərmayələriniz sizindir. Haqsızlıq etməsəniz, haqsızlığa da məruz qalmazsınız.

**280** Əgər borclu çətinlikdədirsə, (vəziyyəti) asanlaşana qədər möhlət verilməlidir! Əgər bilirsinizsə, sədəqə olaraq verməyiniz, sizin üçün daha xeyirlidir.

**281** Və Allaha (tərəf) döndəriləcəyiniz günə qarşı Allahın mühafizəsi altına daxil olun. Sonra da hər kəs qazancını tam olaraq alar. Və onlar haqsızlığa məruz qalmazlar. (87/2, Bəqərə / 275-281)

## Nəcm: 463

**282** Ey iman etmiş kimsələr! (Əvvəlcədən) müəyyənləşdirilmiş bir vaxta [qədər] borc alıb verdikdə onu dərhal yazın. Aranızda bir katib də ədalətlə yazsın. Və o katib, Allahın ona öyrətdiyi kimi yazmaqdan çəkinməsin və yazsın. Boynunda haqq olan kəs də söyləyib yazdırsın və Rəbbi olan Allaha təqvalı davransın və ondan [haqqdan] bir şey əskiltməsin. Əgər haqq öz əleyhinə olan adam [borclu] ağlı kəsməyən və ya zəif biri isə və ya şəxsən söyləyib yazdırmağa gücü çatmayan biri isə, vəlisi (qəyyumu) ədalətlə söyləyib yazdırsın. Kişilərinizdən iki nəfəri də yaxşı şahid tutun. Əgər iki kişi şahid olmasa, o zaman bir kişi ilə iki qadın olsun; iki qadının olması, bunlardan biri yanılarsa, çaşarsa, o biri xatırlatsın deyədir. *–Şahidlər, razı qalacağınız, yaxşı şahidlik edəcək kimsələrdən olsun.–* Şahidlər də çağırıldıqları zaman,

boyun qaçırmasınlar. Siz, kiçik və ya böyük [olan borcu] vədəsinə qədər yazmağa ərinməyin. Bu, Allah yanında daha haqqa uyğundur, şahidlik üçün daha sağlam, şübhəyə düşməmək baxımından da daha əlverişlidir. Aranızda dərhal dövr edən bir ticarət istisnadır; onu yazmamağınızda sizin üçün bir günah yoxdur. Alqı-satqı etdiyiniz vaxt yenə şahid tutun. Yazan və şahidlik edən bir zərər görməsin. Əgər (belə) edərsəniz [onlara zərər verərsəniz], şübhəsiz o, sizə toxunacaq bir fisq [günah] olar. Allaha da təqvalı davranın. Allah sizə öyrədir və Allah, hər şeyi ən yaxşı biləndir.

**283** Və əgər siz, bir səfərdə olar və bir katib də tapa bilməzsəniz, o vaxt bir girov alın! Yox, əgər bir-birinizə güvənirsinizsə, güvənilən adam, üzərindəki əmanəti ödəsin. Və Rəbbi olan Allahın mühafizəsi altına daxil olsun. Şahidliyi də gizlətməyin. Onu kim gizlədərsə, artıq şübhəsiz, onun qəlbi günahkardır. Və Allah, etdiklərinizi çox yaxşı biləndir.

**284** Göylərdə olan şeylər və yer üzündə olan şeylər Allahındır. Siz içinizdəkiləri açığa çıxarsanız da, gizli saxlasanız da Allah onunla sizi hesaba çəkər. Sonra istədiyi kimsəni bağışlayar, istədiyi kimsəyə də əzab verər. Və Allah, hər şeyə ən yaxşı qadir olandır.

(87/2, Bəqərə / 282-284)

## Nəcm: 464

**285,286** Elçi, öz Rəbbindən ona nazil edilənə iman etdi, möminlər də. Hamısı Allaha, təbii güclərinə / xəbərçi ayələrinə, kitablarına və elçilərinə iman etdilər: "Biz Allahın elçiləri arasında fərq qoymuruq." Və: *"Biz eşitdik və itaət etdik. Rəbbimiz! Bağışlamağını diləyirik, dönüş ancaq Sənədir. Ey Rəbbimiz! Əgər tərk etdiksə, yaxud da yanıldıqsa, bizi tutub sorğuya çəkmə! Ey Rəbbimiz! Bizə bizdən öncəkilərə yüklədiyin kimi ağır məsuliyyət / (bizi) sıxıntıya salacaq şeylər yükləmə! Ey Rəbbimiz! Bizə gücümüzün çatmayacağı yükü də yükləmə! Və əfv et bizi, bağışla bizi, mərhəmət et bizə! Sən bizim yardımçı, yol göstərici, qoruyucu (himayə edən) yaxınımızsan. Və kafirlər topluluğuna [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər topluluğuna] qarşı bizə yardım et"* dedilər.

Allah heç kimsəyə gücünün çatacağından başqa; imkanı xaricində yük yükləməz. Hər kəsin qazandığı öz xeyrinə və özü etdiyi zərərinədir.

(87/2, Bəqərə / 285-286)

# ƏNFAL (88 – 8) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

## Nəcm: 465

**1** Səndən savaşın bəxşişləri; [əlavə qazancları] barədə soruşurlar. De ki: "Ənfal / savaş bəxşişləri; [əlavə qazancları], Allah və Elçisi / xalq üçündür. Ona görə də, siz möminsinizsə, Allahın mühafizəsi altına daxil olun, bir-birinizlə aranızı düzəldin, Allaha və Elçisinə də itaət edin.
**2-4** Heç şübhəsiz möminlər ancaq, Allah xatırlandığı zaman ürəkləri ürpərən,
Onun ayələri ona oxunduğu zaman, iman baxımından güclənən və (işlərin) nəticəsini yalnızca Rəblərinə tapşıran,
səlatı iqamə edən [maddi və yaxud zehni baxımdan dəstək olan; cəmiyyəti maarifləndirmə qurumlarını yaradan-ayaqda tutan]
və Bizim onlara ruzi olaraq verdiyimiz şeylərdən Allah yolunda xərcləyən kimsələrdir. Bax bunlar, gerçəkdən iman edənlərin məhz özüdür. Onlar üçün Rəbləri qatında dərəcələr, bağışlanma və dəyərli bir ruzi vardır. (88/8, Ənfal / 1-4)

## Nəcm: 466[349]

**5,6** Və onlar, Gerçək açıq-aydın (ortaya) qoyulduqdan sonra, sanki göz görə-görə –*Rəbbinin səni, gerçək ilə evindən çıxartması, şübhəsiz ki, möminlərin bir hissəsinin də qətiyyən xoşlarına gəlməmişdi*– Ölümə sürüklənirlərmiş kimi, gerçək barəsində səninlə mübahisə edirdilər.
**7,8** Və bir vaxt Allah sizə, iki dəstədən birinin mütləq sizin olacağını vəd edirdi. Siz isə şanı və şərəfi olmayan şeyin / soyğunun sizin olmasını istəyirdiniz. Allah da, Öz kəlmələriylə haqqı bərqərar etmək və günahkarların xoşuna gəlməsə də gerçəyi ortaya qoymaq və batili məhv etmək üçün kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] ardını kəsmək; haqq dini inkişaf etdirmək istəyirdi.
**9** O zaman siz, Rəbbinizdən yardım diləyirdiniz, Rəbbiniz də: "Şübhəsiz Mən, məhz arxa-arxaya min xəbərçi ayə ilə sizə yardım edirəm" deyə sizə qarşılıq vermişdi.
**10** Allah bunu, sırf sizə bir müjdə olsun və bununla qəlbləriniz sakit olsun deyə etmişdi. Və yardım ancaq Allah qatındadır. Şübhəsiz ki, Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**11** Bir vaxt Rəbbiniz, yenə Öz qatından arxayınlıq olsun deyə (sizi) yuxuya daldırırdı. Sizi təmizləmək, pis niyyətli adamın pisliklərini / zərərini sizdən dəf etmək, ürəklərinizə qüvvət vermək və ayaqlarınızı

sabitləşdirmək; qədəmlərinizi sağlamlaşdırmaq üçün göydən üzərinizə su endirirdi.
**12** Və o zaman Rəbbin təbii gücləri proqramlaşdırırdı: “Şübhəsiz ki, Mən sizinlə bərabərəm, haydı, iman etmiş kimsələrə səbat verin. Mən, kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] ürəyinə qorxu salacağam, dərhal onların boyunlarının üstünə və bütün barmaq uclarına / oynaqlarına qədər vurun!”
**13** Kafirlərin belə cəzalandırılması, Allaha və Elçisinə qarşı gəlmələri səbəbiylədir. Və kim Allaha və Elçisinə qarşı gələrsə, bilsin ki, Allahın əzabı çox çətindir (şiddətlidir)!
**14** Budur, bunu dadın. Şübhəsiz ki, axirətdə kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün atəşin əzabı da var.

(88/8, Ənfal / 5-14)

## Nəcm: 467

**15** Ey iman etmiş kimsələr! Toplu halda kafirlərlə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərlə] qarşılaşdığınız zaman, dərhal onlara arxa çevirməyin.
**16** Ve belə bir gündə hər kim onlara *–təzədən qayıdıb vuruşmaq üçün geri çəkilmək və ya başqa bir dəstədə yenidən mövqe seçmək kimi hallar istisna olmaqla–* arxa çevirərsə, həqiqətən Allahın qəzəbinə düçar olar və onun gedəcəyi yer cəhənnəmdir. Ora da ki, nə pis bir dönüş yeridir.
**17** Artıq, onları siz öldürmədiniz, lakin onları Allah öldürdü. Atdığın zaman da sən atmadın, lakin Allah atdı. Və möminləri bundan gözəl bir bəla ilə bəlaya düçar etmək / gözəl sınamaq üçün idi. Şübhəsiz ki, Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**18** Bilin! Şübhəsiz ki, Allah kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] hiyləsini zəifləndəndir.
**19** Fəth istəyirsinizsə, bax, sizə fəth gəlmişdir. Və əgər son versəniz, bu da sizin üçün daha yaxşıdır. Yox, əgər dönərsəniz, Biz də dönərik. Dəstəniz hər nə qədər çox olsa da, sizə heç bir şəkildə, heç bir zaman fayda verməyəcək. Və şübhəsiz ki, Allah möminlərlə bərabərdir.

(88/8, Ənfal / 15-19)

## Nəcm: 468

**20** Ey iman etmiş kimsələr! Allaha və Elçisinə itaət edin. Eşitdiyiniz halda ondan üz çevirməyin!
**21** Vəhyə qulaq asmadıqları halda “Eşitdik / vəhyə qulaq asdıq” deyənlər kimi də olmayın!
**22** Şübhəsiz, yer üzündə gəzib-dolaşan canlıların Allah qatında ən pisi, ağlını işlətməyən bu karlar və lallardır.

23 Və əgər Allah, onlarda xeyir olduğunu bilsəydi, əlbəttə, onlara
eşitdirərdi. Və əgər eşitdirsəydi, yenə də onlar, geri çəkilənlər olaraq,
arxa çevirərdilər.
24 Ey iman etmiş kimsələr! Elçi sizi, sizə həyat verəcək şeylərə
çağırdığı zaman, Allaha və Elçinə qarşılıq verin. Və bilin ki, Allah,
insan ilə qəlbi arasına girər. Və siz mütləq Onun hüzurunda
toplanacaqsınız.
25 Və sadəcə sizdən öz mənliklərinə haqsızlıq edənlərə toxunmayan
sosial atəşlərdən özünüzü qoruyun və heç şübhəsiz Allahın əzabının
çətin (şiddətli) olduğunu bilin.
26 Və xatırlayın; bir vaxt siz sayca az idiniz, yer üzündə zəif
qalmışdınız, insanların sizi ələ keçirməsindən qorxurdunuz və Allah,
sizə verilən nemətlərin qarşılığını ödəyərsiniz deyə (sizə) sığınacaq
vermişdi, sizi yardımı ilə gücləndirmişdi və sizə təmiz-xoş şeylərdən
ruzilər vermişdi.
27,28 Ey iman etmiş kimsələr! Allaha və Elçiyə xəyanət etməyin. Bilə
-bilə öz əmanətlərinizə də xəyanət etməyin. Şübhəsiz ki, mallarınızın
və övladlarınızın, həqiqətən bir imtahan vasitəsi; sizi dindən çıxarda
biləcək bir varlıq olduğunu və həqiqətəndə Allah qatında çox böyük
əcr olduğunu bilin.
29 Ey iman etmiş kimsələr! Allahın mühafizəsi altına daxil olarsanız,
O, sizə haqqı batildən ayırd edə biləcək bir anlayış verər və sizdən
pisliklərinizi örtər və sizi bağışlayar. Allah çox böyük lütf sahibidir.

(88/8, Ənfal / 20-29)

## Nəcm: 469

30 Və bir zaman, bu kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək
rədd edənlər] səni tutub bağlamaq və ya öldürmək və yaxud qovub
çıxartmaq üçün sənə qarşı hiylə qururdular. Və onlar hiylə qurarkən
Allah da cəzalandırırdı. Və Allah, cəzalandıranların ən xeyirlisidir.
31 Onlara ayələrimiz oxunduğu zaman: "Eşitdik, istəsək bunun
kimisini biz də söyləyərik, bu, keçmişdəkilərin əfsanələrindən başqa
bir şey deyildir" demişdilər.
32 Bir vaxt da onlar: "Ey Allahım! Əgər bu, Sənin qatından gəlmiş bir
haqqın / gerçəyin məhz özüdürsə, heç dayanma, üstümüzə göydən
daşlar yağdır və ya bizə çox acı verən bir əzab ver" demişdilər.
33 Halbuki sən (onların) içlərində ikən Allah onlara əzab verən
deyildi. Bağışlanmaq dilədikləri müddətcə də Allah onlara əzab verən
deyil. (88/8, Ənfal / 30-33)

## Nəcm: 470

**34** Və onlar Məscidülhəramı / toxunulmaz ilahiyat təhsili mərkəzini ayaqda tutan qəyyumları / vəqf yönəticiləri olmadıqları halda, ona (yaxınlaşmağı) qadağan etdiklərində, Allahın onlara əzab verməməsi üçün nə səbəbləri var? Onu ayaqda tutan qəyyumlar / vəqf yönəticiləri sadəcə Allahın mühafizəsi altına daxil olan kimsələrdir. Lakin onların çoxu (bunu) bilmir.
**35** Və onların Beytin / Kəbənin yanındakı dəstək vermələri, sadəcə fit çalmaq və əl çalmaqdan (ibarət) bir nümayişdir. *–Elə isə küfr etdiyinizə [Allahın ilah və rəbb olduğunu bilərək rədd etdiyinizə] görə bu əzabı dadın!–*
**36,37** Şübhəsiz, mallarını Allah yolundan döndərmək üçün xərcləyən kafirlər [Allahın ilah və rəbb olduğunu örtən kəslər]; yenə də onu sərf edəcəklər. Sonra onlara bir peşmanlıq üz verəcək, sonra da onlar, Allahın, murdarı təmizdən ayırması üçün, və bir də murdar qismini bir -birinin üzərinə mindirib hamısını bir araya gətirməsi, sonra da hamısını birdən cəhənnəmə qoyması üçün məğlub olacaqlar. Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] cəhənnəmə toplanacaqlar. Bax bunlar, itkiyə və zərərə uğrayıb acı çəkən o kimsələrin içində qalanların məhz özləridir.
**38** Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrə] de ki: "Əgər bu işə son verərlərsə, daha öncə etdikləri bağışlanacaq. Yenə də dönərlərsə, şübhəsiz ki, öncəki öndərli cəmiyyətlərə tətbiq olunan qaydalar davam edər." (88/8, Ənfal / 34-38)

## Nəcm: 471

**39** Və insanları dindən çıxartma fəaliyyəti qalmayıb, din tamamilə Allaha məxsus olana qədər onlarla savaşın. Artıq əl çəkərlərsə, bilinsin ki, şübhəsiz Allah, onların etdiklərini ən yaxşı görəndir.
**40** Və əgər onlar geri çəkilərlərsə, bilin ki, həqiqətən Allah sizin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınınızdır. O, nə gözəl yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxındır, nə gözəl yardımçıdır.
**41** Yenə, bilin ki, əgər siz Allaha, haqq ilə batilin ayırd edildiyi o gün; iki ordunun qarşı-qarşıya gəldiyi Bədr günü, qulumuza nazil etdiyimiz ayələrə iman etmisinizsə, hər hansı bir şeydən qənimət olaraq əlinizə keçirtdiyimiz şeylər; artıq onların beşdə biri, Allah, Elçi, xüsusilə də yaxınlığı olanlar; yurdlarından çıxarılan fəqirlər, yetimlər, miskinlər və yolda qalmışlar üçündür. Və Allah, hər şeyə qadirdir.
**42** O vaxt siz, vadinin yaxın bir yamacında idiniz, onlar da uzaq yamacında idilər. Karvan da sizdən aşağıda idi. Əgər onlarla

razılaşmış olsaydınız, əlbəttə ki, görüş yerində münaqişə çıxarardınız. Fəqət olması lazım gələn işi Allahın gerçəkləşdirməsi üçün; dəyişikliyə / məhvə məruz qalanlar açıq-aşkar bir dəlil gördükdən sonra məhv olsun, sağ qalanlar da yenə açıq-aşkar bir dəlildən sonra yaşasın deyə... Şübhəsiz ki, Allah ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**43** O vaxtlar Allah sənə yuxunda onları az göstərirdi. Əgər Allah, onları sənə çox göstərsəydi, həqiqətən qorxardınız və savaş barədə anlaşmazlığa düşərdiniz. Fəqət Allah təhlükəsizliyi təmin etdi. Şübhəsiz ki, O, könüllərdə olanı ən yaxşı biləndir.
**44** Və o vaxt, olması lazım gələn bir işi gerçəkləşdirmək üçün, onlarla qarşılaşdığınız vaxt onları sizin gözünüzə az göstərirdi. Sizi də onların gözündə azaldırdı. Və bütün işlər yalnızca Allaha döndərilər.

(88/8, Ənfal / 39-44)

## Nəcm: 472

**45** Ey iman etmiş kimsələr! Bacarmağınız / zəfər qazanmağınız üçün, bir dəstə ilə üz-üzə gəldikdə səbat göstərin və Allahı çox-çox xatırlayın.
**46** Yenə Allaha və Onun Elçisinə itaət edin, bir-birinizlə mübahisə etməyin. Sonra qorxuya düşərsiniz və gücünüz-canınız gedər. Və səbr edin. Şübhəsiz ki, Allah, səbr edənlərlə bərabərdir.
**47** Özlərini bəyənən və (özlərini) insanlara göstərərək yurdlarından çıxan və Allah yoluna əngəl qoyan kimsələr kimi də olmayın. Və Allah onların etdiklərini əhatə edəndir. (88/8, Ənfal / 45-47)

## Nəcm: 473

**48,49** Bir vaxt o münafiqlər və qəlblərində xəstəlik olan; [xəstə zehniyyətli] kimsələr, "Bu adamları dinləri aldatdı" dedikləri əsnada, o pis niyyətli sərkərdə, onlara (öz) əməllərini gözəl göstərmiş və onlara: "Bu gün sizi insanlardan məhv edəcək kimsə yoxdur və mən də sizin yardımçınızam" demişdi. Sonra da, nə zaman ki, iki dəstə bir-birini gördü, o, iki topuğu üstündə geriyə döndü və: "Şübhəsiz, mən sizdən uzağam. Şübhəsiz ki, mən sizin görmədiyinizi görməkdəyəm, şübhəsiz ki, mən Allahdan qorxmaqdayam" dedi. Və Allah, nəticələndirməsi / cəzalandırması çox şiddətli olandır. Və hər kim işin nəticəsini Allaha həvalə edərsə, bilsin ki, şübhəsiz Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**50,51** Və sən, (bu iş üçün tapşırıq alan) görəvli qüvvələrin, kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrin]

üzlərinə və arxalarına vuraraq: "Dadın görək qızğın atəşin əzabını! Bax bu, sizin öz əllərinizlə meydana gətirdiyiniz şeylər səbəbiylədir. Və şübhəsiz ki, Allah, qullara heç bir şəkildə haqsızlıq edən biri deyildir" deyə, onların keçmişdə etdiklərini və etmələri lazım olduğu halda etmədiklərini bir-bir xatırlatdırarkən bir görsəydin.

**52** Eynilə Fironun yaxınları və onlardan öncəkilərin getdikləri (rəftarları) kimi, onlar da Allahın ayələrini / əlamətlərini / işarətlərini tanımadılar, Allah da onları günahlarına görə yaxaladı. Şübhəsiz ki, Allah çox güclüdür, cəzası / nəticələndirməsi çox şiddətli olandır.

**53** Bu, şübhəsiz ona görədir ki, bir cəmiyyət özündə olanı dəyişdirməyincə, Allah o cəmiyyətə verdiyi neməti dəyişdirməz və şübhəsiz Allah ən yaxşı eşidən, ən yaxşı biləndir.

**54** Eynilə Fironun yaxınları və onlardan öncəkilərin getdikləri (rəftarları) kimi, onlar da Rəblərinin ayələrini / əlamətlərini / işarətlərini yalan hesab etdilər. Biz onları günahlarına görə dəyişikliyə / məhvə məruz qoyduq; Fironun yaxınlarını suda boğduq. Hamısı da öz mənliklərinə haqsızlıq edən kimsələr idilər.

**55,56** Şübhəsiz, Allah qatında canlıların ən pisi kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən], iman etməyən kimsələr; onlarla əhd bağladığın halda hər dəfəsində əhdlərini pozan kimsələrdir. Onlar Allahın mühafizəsi altına daxil olmazlar. (88/8, Ənfal / 48-56)

## Nəcm: 474

**57** Artıq onları hərbdə; fəsad törətmək işində tutarsansa, ibrət almaları üçün onlarla birlikdə arxalarındakı kəsləri də dağıt.

**58** Əgər bir camaatdan; xainlik etməsindən qorxarsansa, eyni şəkildə əhdləşməni pozduğunu özlərinə bildir. Şübhəsiz ki, Allah xain kimsələri sevməz.

**59** Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr], özlərinin önə keçdiklərini də sanmasınlar. Şübhəsiz ki, onlar aciz qoya bilməzlər. (88/8, Ənfal / 57-59)

## Nəcm: 475

**60** Və siz də gücünüzün çatdığı qədər onlara qarşı hər növ qüvvə toplayın və savaş atları[350] hazırlayın ki, onlarla, Allaha düşmən olanları, öz düşmənlərinizi və Allahın bilib də sizin bilmədiyiniz, bunlardan aşağı [daha] başqalarını qorxudasınız [adam edəsiniz]. Və Allah yolunda nə xərcləsəniz, o sizə əskiksiz ödənər və haqsızlığa məruz qalmazsınız.

**61** Və əgər onlar sülh üçün yaxınlaşarlarsa, sən də sülhə yaxınlaş! Və işin nəticəsini Allaha həvalə et. Şübhəsiz ki, Allah, ən yaxşı eşidənin,

ən yaxşı bilənin məhz Özüdür.
**62,63** Və əgər onlar sənə hiylə qurmaq istəyərlərsə, bil ki, şübhəsiz, sənə Allah yetər. O səni Öz yardımı ilə və möminlərlə gücləndirəndir və möminlərin könüllərini (ülfətlə) birləşdirəndir. Sən, yer üzündə nə varsa hamısını cəm halda xərcləsəydin, yenə də onların könüllərini birləşdirə bilməzdin. Amma Allah onların arasını birləşdirdi. Şübhəsiz ki, O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**64** Ey Peyğəmbər! Sənə və möminlərdən sənə tabe olan kimsələrə Allah yetər!
**65** Ey Peyğəmbər! Möminləri savaşa təşviq et. Əgər sizdən səbirli iyirmi adam olarsa, iki yüzə qalib gələrlər. Və əgər sizdən yüz olarsa, şübhəsiz bunlar, anlayışsız bir camaat olduqlarına görə, kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kəslərdən] min nəfərə qalib gələrlər.
**66** İndi Allah, sizin (yükünüzü) yüngülləşdirdi və sizdə şübhəsiz bir zəiflik olduğunu bildi. O halda, sizdən səbirli yüz adam olarsa iki yüzə qalib gələrlər. Və sizdən min olarsa Allahın izni ilə / biliyi ilə iki minə qalib gələrlər. Və Allah səbr edənlərlə bərabərdir.
**67** Yer üzündə ağır gəlmədikcə; savaşda mütləq və tam üstünlük əldə etmədikcə, özü üçün əsirlər yaratması (almaq) heç bir peyğəmbərə uyğun deyil. Siz, dünyanın genişliyini istəyirsiniz, Allah da axirəti istəyir. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**68** Əgər Allahdan bir yazı olmasaydı, həqiqətən, aldığınız şeylərə görə sizə böyük bir əzab üz verərdi.
**69** Artıq əldə etdiyiniz qənimətdən halal və xoş olaraq yeyin və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz ki, Allah çox bağışlayandır, çox rəhm edəndir.
**70** Ey Nəbi! Əsirlərdən əlinizdə olan kimsələrə de ki: “Əgər Allah sizin qəlblərinizdə bir xeyir (olduğunu) bilərsə, sizdən alınandan daha xeyirlisini sizə verər və günahlarınızı bağışlayar. Və Allah, çox bağışlayıcıdır, çox mərhəmət edicidir.”
**71** Və əgər sənə xəyanət etmək istəyərlərsə, yaxşı bilsinlər ki, bundan öncə onlar, Allaha xainlik etdilər, Allah da möminlərə onlardan daha artıq imkan verdi. Və Allah, çox yaxşı biləndir, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir. (88/8, Ənfal / 60-71)

**Nəcm: 476**

72 Şübhəsiz iman etmiş, (öz) yurdlarından köç etmiş, Allah yolunda malları və canları ilə savaşan və sığınacaq verib yardım edən bu kimsələr; bəli məhz bunlar, bəzisi bəzisinin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxını olanlardır. İman edən və hicrət etməyən kimsələrə gəlincə, hicrət edənə qədər onlarla yaxınlığınız olmasın. Və din uğrunda yardım istəyərlərsə, aranızda əhdləşməsi olan bir xalqın zərərinə olmadan, onlara yardım etməlisiniz. Və Allah, etdiklərinizi çox yaxşı görəndir!
73 Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr] də, bir-birlərinin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlarıdır. Əgər siz də onu etməsəniz; möminlər olaraq bir-birinizin vəlisi [yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınları] olmasanız, yer üzündə böyük bir qarışıqlıq (fəsad) və insanları dindən döndərmə işləri ortaya çıxar.
74 Və iman edən, hicrət edən və Allah yolunda var gücüylə səy edən o kimsələr ilə sığınacaq verən və yardım edən kimsələr; bax bunlar, gerçək möminlərin məhz özüdür. Bunlar üçün bir bağışlanmaq və dəyərli bir ruzi vardır.
75 Və bundan sonra, iman edən və sizinlə birlikdə yurdlarından köç edən və var gücü ilə səy edən kimsələr; artıq onlar da sizdəndirlər. Əqrəba olanlar da, Allahın kitabına görə, bir-birlərinə daha yaxındırlar. Şübhəsiz ki, Allah hər şeyi ən yaxşı biləndir.

(88/8, Ənfal / 72-75)

## ALİ-İMRAN (89 – 3) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 477**

1 Əlif / 1, Lam / 30, Mim / 40.[351]
2 Allah, Özündən başqa tanrı deyə bir şey olmayandır, hər zaman diridir, qəyyumdur [hər şeyi ayaqda tutandır, qoruyandır].
3,4 Allah, sənə, sadəcə içindəkiləri təsdiqləyici olaraq bu kitabı haqq ilə nazil etdi. O, daha öncə insanlara doğru yol göstəricisi olaraq Tövratı və İncili də nazil etmişdi. Furqanı da O nazil etdi. Şübhəsiz ki, kafirlər [Allahın ayələrini bilərək rədd edən bu kimsələr] üçün çətin (şiddətli) bir əzab var. Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, günahkarları tutub cəzalandırmaq surətiylə ədaləti təmin edəndir.
5 Şübhəsiz Allah, yer üzündə və göydə heç bir şey Özünə gizli qalmayandır.
6 O, sizi, bətnlərdə istədiyi şəkilə salandır. Özündən başqa ilah deyə

bir şey yoxdur. O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**7-9** Allah, sənə bu kitabı nazil edəndir. Bu kitabdan bir qismi qanun ehtiva edən ayələrdir ki, bunlar kitabın anasıdır. Digərləri də bir-birinə bənzəyən oxşar mənalıdırlar. Amma, vəziyyət belə ikən, qəlblərində əyrilik / uyğunsuzluq olan kimsələr,
insanları dindən çıxartmaq,
ortaq qoşmağa sürükləmək
və onun mənalarından ən uyğununu təsbitinə uyğunlaşdırmaq üçün dərhal ondan bir-birinə bənzəyən oxşar mənalı olanlarının arxasına düşərlər. Halbuki onun mənalarından ən uyğun olanının təsbitini ancaq Allah və: *–"Biz buna iman etdik, hamısı Rəbbimizin qatındandır. Rəbbimiz! Bizə doğru yolu göstərdikdən sonra qəlblərimizi döndərmə (azdırma)! Bizə Öz yanından rəhmət lütf et! Şübhəsiz ki, Sən, bol-bol lütf edənin məhz özüsən. Rəbbimiz! Şübhəsiz Sən, insanları, barəsində heç bir şübhə olmayan gün üçün toplayansan. Şübhəsiz ki, Allah verdiyi sözdən dönməz" deyən–* o bilikdə mütəxəssis olanlar bilərlər. Və sadəcə qavrama qabiliyyətləri olanlar öyüd alarlar.
(89/3, Ali-İmran / 1- 9)

## Nəcm: 478

**10,11** Şübhəsiz, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr] onların malları və övladları, *–eyni Fironun yaxınları və onlardan öncəkilər kimi–* Allahdan (gələn) heç bir şeyi dəf edə bilməz. Və onlar atəşin yanacağıdır. Fironun yaxınları və onlardan öncəkilər, ayələrimizi yalanladılar, Allah da onları günahlarına görə yaxaladı. Və Allah, cəzası / yaxalaması çox çətin (şiddətli) olandır.
**12** Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrə] de: "Siz, yaxında məğlubiyyətə uğrayacaq və cəhənnəmə toplanacaqsınız." Və o, nə pis bir döşəkdir (yataqdır)!
(89/3, Ali-İmran / 10-12)

## Nəcm: 479

**13** Qarşılaşan iki birlikdə sizin üçün həqiqətən bir əlamət / işarət var; birliyin biri, Allah yolunda savaşırdı; digəri də kafir [Allahın ilah və rəbb olduğunu örtən / inanmayan] idi. Onları, gözləriylə özlərinin iki misli (qədər) görürdülər. Və Allah, istədiyini yardımıyla gücləndirər. Şübhəsiz ki, bunda bəsirət sahibləri; sağlam fikirli kimsələr üçün həqiqətən bir ibrət var. (89/3, Ali-İmran / 13)

## Nəcm: 480

14 Qadınlara, oğullara, ölçülərlə yığılmış qızıl və gümüşə, sərbəst (qaçan) gözəl atlara, ətindən və südündən faydalanılan heyvanlara və əkinlərə duyulan ehtiraslı, həddindən artıq istək, insanlara süslü / cazibədar edildi (göstərildi). Bunlar, bəsit dünya həyatının qazancıdır. Və gediləcək gözəl yer, Allahın Öz qatında olandır.

15-17 De ki: "Sizə bundan daha xeyirli olanı bildirimmi? Allahın mühafizəsi altına daxil olmuş; "Rəbbimiz! Şübhəsiz ki, biz iman etdik, artıq bizim günahlarımızı bağışla və bizi Atəşin əzabından qoru!" deyən, səbr edən; müqavimət göstərən, doğru olan, daim ehtiram göstərən, Allah yolunda xərcləyən və səhərlər də bağışlanmaq diləyən kəslər üçün Rəblərinin qatında, içində təməlli qalacaqları, altından çaylar axan cənnətlər, çox təmiz zövcələr və Allahın razılığı vardır. Və Allah, qulları ən yaxşı görəndir. (89/3, Ali-İmran / 14-17)

## Nəcm: 481

18 Allah, təbiətdəki güclər / xəbərçi ayələr və haqqı müdafiə edən bilik sahibləri, şübhəsiz Allahdan başqa ilah deyə bir şeyin olmadığına şahidlik etdi. O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandan, ən yaxşı qanun qoyandan başqa ilah deyə bir şey yoxdur.

19 Şübhəsiz Allah yanında din, İslamdır. Özlərinə Kitab verilən kimsələr də, ancaq özlərinə o bilik gəldikdən sonra aralarındakı qısqanclığa görə (paxıllıq üzündən) ayrılığa (ixtilafa) düşdülər. Hər kim Allahın ayələrini ört-basdır edərsə; Artıq Şübhəsiz ki, Allah, hesabı tezləşdirəndir.

20 Buna rəğmən əgər səninlə mübahisə edərlərsə de ki: "Mən bütün mənliyimi Allah üçün İslamlaşdırdım / mən müsəlman oldum. Mənə tabe olanlar da müsəlman oldular." Kitab verilənlərə və Böyük Şəhərlilərə de: "Siz də sağlamlaşdırdınızmı / İslamı qəbul etdinizmi?" Əgər sağlamlaşdırarlarsa / İslama daxil olarlarsa, artıq yönəldildikləri doğru yola yetişmişdirlər. Və əgər arxa çevirərlərsə, sənə düşən sadəcə mesajı çatdırmaqdır. Və Allah, qullarını ən yaxşı görəndir.

21 Şübhəsiz, Allahın ayələrini ört-basdır edən, haqsız yerə peyğəmbərləri öldürən və insanlardan ədaləti əmr edən kimsələri öldürən kəslər; sən dərhal bunları acıqlı (şiddətli) bir əzabla müjdələ!

22 Bax bunlar, dünyada və axirətdə əməlləri puç olan kimsələrdir. Onlar üçün heç bir yardımçı da yoxdur.

23 Özlərinə Kitabdan bir nəsib verilən bu kimsələri görmədinmi / heç düşünmədinmi? Onlar, aralarında hökm vermək üçün Allahın kitabına çağırılırlar, sonra onlardan bir qismi aralanaraq geri çəkilirlər.

**24,25** Bu, onların, "Atəş bizə bir neçə gündən artıq qətiyyən toxunmayacaqdır" demələri səbəbiylədir. Onların uydurmuş olduqları şeylər də (öz) dinlərində onları aldatmaqdadır. Elə isə, barəsində heç şübhə olmayan o gündə onları bir araya topladığımız və heç kimsəyə haqsızlıq edilmədən hər kəsə qazandıqları şeylər tamamilə ödəndiyi zaman necə olacaq? (89/3, Ali-İmran / 18-25)

## Nəcm: 482

**26,27** De ki: "Ey hökmranlığın hökmranı Allahım! Sən hökmranlığı istədiyin kimsəyə verərsən, istədiyin kimsədən də hökmranlığı çəkib alarsan, istədiyin kimsəni güclü edərsən, istədiyin kimsəni də alçaq, rəzil edərsən. Xeyir Sənin əlindədir. Şübhəsiz, Sən hər şeyə qadirsən! Sən gecəni gündüzün içinə soxarsan, gündüzü gecənin içinə soxarsan; Sən, ölüdən diri çıxararsan, diridən ölü çıxararsan. Sən, istədiyinə də hesabsız ruzi verərsən." (89/3, Ali-İmran / 26-27)

## Nəcm: 483

**28** Möminlər özlərindən səviyyəsiz, kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələri] yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar qəbul etməsinlər / yönətici etməsinlər, həyatlarını onların əllərinə təslim etməsinlər. Artıq onu hər kim edərsə, Allahdan heç bir şeyi yoxdur. Ancaq onlardan bir qorunmaq / təqiyyə edərək qorunmağınız başqadır. Allah sizi Özündən (Öz əzabından) çəkindirir. Və yaradılış / axır dönüş yalnızca Allahadır.
**29** De ki: "Sinələrinizdəki şeyləri gizlətsəniz də, aşkar etsəniz də, Allah onu bilir. Və Allah, göylərdə olan şeyləri və yerdə olan şeyləri bilir. Və Allah, hər şeyə qadirdir."
**30** O gün hər adam, işlədiyi xeyir əməlləri, işlədiyi pis əməlləri (qarşısında) hazırlanmış görər. Özü ilə pis əməlləri arasında şübhəsiz, çox uzaq bir məsafə olmasını istəyər. Allah sizi Özünün (əzabından) çəkindirir. Şübhəsiz ki, Allah, qullarına çox şəfqətlidir.
**31** De ki: "Əgər siz Allahı sevirsinizsə, o zaman mənə tabe olun ki, Allah sizi sevsin və günahlarınızı sizin üçün bağışlasın. Və Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir."
**32** De ki: "Allaha və Elçiyə itaət edin!" Artıq üz çevirərlərsə, bilin ki, şübhəsiz Allah, kafirləri [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən kimsələri] sevməz. (89/3, Ali-İmran / 28-32)

## Nəcm: 484[352]

**33,34** Şübhəsiz Allah, Adəmi, Nuhu, İbrahim ailəsini və İmran ailəsini

*–bir-birinin soyundan olmaq üzrə–* aləmlər üzərinə seçilmiş (üstün) etdi. Və Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**35** Bir zaman İmranın arvadı: "Rəbbim! Həqiqətən mən, bətnimdəkini tam azad olaraq sənin üçün nəzir edirəm. Sən də məndən qəbul et, şübhəsiz Sən ən yaxşı eşidənsən, ən yaxşı bilənsən" demişdi.
**36** Onu doğunca da: "Rəbbim, şübhəsiz mən, onu qız (olaraq) doğdum; *–Halbuki Allah onun doğduğu şeyi daha yaxşı bilir–* oğlan, qız kimi deyil. Və şübhəsiz ona Məryəm adını verdim. Və şübhəsiz Mən, onu və soyunu şeytani-rəcimdən; qovulmuş / qatil, əsassız söz və düşüncə çıxardan, qaranlığa daş atan şeytandan sənə sığındırıram" dedi.
**37** Belə olduqda, Rəbbi Məryəmi gözəl bir (şəkildə) qəbul etdi. Və onu gözəl bir bitki olaraq bitirdi və ona; Məryəmə, İsanı qeyri-qanuni şəkildə doğmayıb, Allahın iradəsi çərçivəsində atasız doğmasına Zəkəriyyanı zamin etdi. Zəkəriyya nə zaman onun yanına / xüsusi otağına girsə, onun yanında bir ruzi görərdi. Zəkəriyya: "Ey Məryəm! Bu, sənin üçün haradandır?" dedi. Məryəm də: "O, Allah qatındandır!" dedi. Şübhəsiz Allah, istədiyini hesabsız ruziləndirir.

***

**38** *–Orada Zəkəriyya, Rəbbinə yalvardı: "Rəbbim! Mənə qatından təmiz bir nəsil ver. Şübhəsiz Sən, duanı ən yaxşı eşidənsən" dedi.*
**39** *Sonra Zəkəriyya, xüsusi kürsüdə dayanıb səlat edərkən [təhsil-təlimlə məşğul olarkən] xəbərçi ayələr ona: "Şübhəsiz Allah sənə, Allahdan bir kəlməni təsdiq edən, ağa / bir öndər, iffətli bir peyğəmbər olaraq, salehlərdən Yəhyanı müjdələyir" deyə səsləndilər.*
**40** *Zəkəriyya: "Rəbbim! Mənə qocalıq gəlib çatmışkən, arvadım da qısır (sonsuz) ikən, mənim necə oğlum ola bilər?" dedi. Allah: "Elədir, Allah istədiyini edər" dedi.*
**41** *Zəkəriyya: "Rəbbim! Mənim üçün bir əlamət / işarət göstər" dedi. Allah: "Sənin əlamətin / işarətin, işarə istisna olmaqla, insanlarla üç gün danışmamağındır. Və Rəbbini çox xatırla, hər zaman (Onu) nöqsan sifətlərdən pak tut" dedi.–*
**42,43** Və bir vaxt xəbərçi ayələr: "Ey Məryəm! Şübhəsiz Allah səni seçdi, səni çox təmiz biri etdi və səni aləmlərin qadınlarından üstün tutdu. Ey Məryəm! Rəbbinə ehtiram et, Ona boyun əyib təslimiyyət göstər və Allahın bir olduğunu təsdiqləyən kişilərlə bərabər sən də Allahın bir olduğunu təsdiqlə" demişdilər.
**44** Bax bu, (sənin) hiss etmək imkanının olmadığı, keçmişin önəmli xəbərlərindən sənə vəhy etdiklərimizdir. Və Məryəmə hansı zamin olacağına (görə) qələmlərini atdıqları vaxt sən yanlarında deyildin. Onlar mübahisə edərkən də sən yanlarında deyildin.

**45-46** Bir zaman xəbərçi ayələr: "Ey Məryəm! Allah səni, Öz tərəfindən bir kəlmə ilə müjdələyir. Onun adı, Məryəm oğlu İsa Məsihdir. Dünya və axirətdə hörmətlidir. Və O, yaxınlaşdırılanlardan və salehlərdəndir. Həm də yüksək məqamda olaraq və yetkin biri olaraq insanlarla danışacaq. **48** Və Allah, Ona kitabı, haqsızlığı, fəsadı və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsipləri və Tövrat ilə İncili öyrədəcək.

**49-51** Və onu İsrail oğullarına; *'Bu bir gerçəkdir ki, mən sizə Rəbbinizdən bir əlamət / işarət gətirdim / işarət ilə gəldim; şübhəsiz ki, mən sizin üçün palçıqdan; gildən; saxsıdan quş formasında bir şey; 'buxurdan (ətirli tüstü yandırmaq üçün qab)' düzəldərəm. Sonra onun içinə üfürərəm; aerozol hazırlayaram, Allahın izni ilə xəstəlik əmələ gətirən şeylər quş olar / uçub gedər. Mən,* [sonradan olan] koru, [ilan, əqrəb və kərtənkələ zəhərləməsini / bağ, bağça və tarlalardakı zərərli bitkiləri Allahın izni ilə / biliyi ilə aradan qaldırar] ve abraşı (ala xallı, səpki xəstəliklərini) yaxşılaşdırar, *sosial ölüləri Allahın izni ilə dirildərəm. Ərzaqlarınızı və evlərinizdə yığıb saxlayacağınız taxıllarınızı; sonra yemək üçün yığıb saxladıqlarınızı sizə xəbər verərəm. –Əgər iman edənlərsinizsə, bunda sizin üçün həqiqətən bir əlamət / işarət var.– Tövratdan sadəcə İncildə olanları təsdiqləyənəm. Sizə qadağan edilənlərin bir qismini sərbəst edəcəyəm (icazə verəcəyəm). Sizə Rəbbinizdən bir əlamət / işarət də gətirdim. Artıq Allahın mühafizəsi altına daxil olun və mənə itaət edin. Şübhəsiz Allah, mənim Rəbbimdir və sizin Rəbbinizdir. Onun üçün Ona qulluq edin! Bax bu, doğru yoldur'* deyə bir elçi edəcək" demişdilər.

**47** Məryəm: "Rəbbim! Mənə bir bəşər toxunmamışkən, mənim uşağım necə ola bilər?" dedi. Allah dedi: "Elədir! Allah istədiyi şeyi yaradar; O, bir işə qərar verdiyi zaman, onun üçün 'Ol!' deyər, o da dərhal olar."[353]

**52,53** Sonra İsa, onların küfrünü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmələrini] hiss edincə: "Allah yolunda mənim yardımçılarım kimlərdir?" dedi. Həvarilər: "Allahın yardımçıları bizik, biz Allaha iman etdik, bizim şübhəsiz müslümlər (təslim olanlar) olduğumuza şahid ol. *–Rəbbimiz! Biz, sənin nazil etdiyinə iman etdik, elçiyə də tabe olduq. Artıq bizi şahidlərlə bərabər yaz."*– dedilər.

**54** Və iman etməyənlər pis plan qurdular, Allah da onların pis planlarını boşa çıxardı. Və Allah, pis planları boşa çıxaranların ən xeyirlisidir.

**55-57** Bir vaxt Allah demişdi: "Ey İsa! Şübhəsiz ki, Mən sənə keçmişdə etdiklərini və etməli olduğun halda etmədiklərini bir-bir xatırlatdıracağam / öldürəcəyəm, səni Özümə yüksəldəcəyəm və səni

kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrdən] təmizləyəcəyəm. Və sənə tabe olan kimsələri, qiyamətə qədər kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrdən] üstün edəcəyəm. Sonra dönüşünüz yalnızca Mənədir. Sonra da ayrılığa (ixtilafa) düşdüyünüz şeylər barəsində aranızda hökm edəcəyəm. Kafirlərə [Mənim ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrə] gəlincə də, onlara dünyada və axirətdə şiddətli bir əzabla əzab edəcəyəm. Onlar üçün heç bir yardımçı da olmayacaq. İman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə gəlincə də, Allah, onların mükafatlarını tam olaraq ödəyəcəkdir. Və Allah, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənləri sevməz."
58 Bax bu, Biz bunu sənə, ayələrdən və qanunlar ehtiva edən xatırladıcılardan / öyüdlərdən / Qurandan oxuyuruq.
59 Şübhəsiz ki, Allah qatında İsanın durumu, Adəmin / hər insanın durumu kimidir; O, onu torpaqdan yaratdı, sonra ona "Ol!" dedi, o da dərhal oldu.
60 Bu gerçək, sənin Rəbbindəndir, elə isə şübhə edənlərdən olma.
61 Sənə bilik gəldikdən sonra artıq kim bu mövzuda səninlə mübahisə edərsə, dərhal de: "Gəlin oğullarımızı və oğullarınızı, qadınlarımızı və qadınlarınızı, özümüzü və özünüzü çağıraq, sonra da bir-birimizi uzaqlaşdırıb gözdən salaq (nifrin edək), sonra da Allahın uzaqlaşdırıb gözdən salmasını (lənətini) yalançıların üzərinə etməsini istəyək."
62 Şübhəsiz ki, bu, həqiqətən gerçək qissənin məhz özüdür. Allahdan başqa heç bir tanrı da yoxdur. Və şübhəsiz ki, Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edənin məhz Özüdür.
63 Artıq üz çevirərlərsə, bilinsin ki, Allah, fəsad törədənləri ən yaxşı biləndir. (89/3, Ali-İmran / 33-46, 48-51, 47, 52-63)

## Nəcm: 485

64 De ki: "Ey Kitab əhli! Sizinlə bizim aramızda ortaq olan bir sözə; **'Allahdan başqasına qulluq etməyək, Ona heç bir şeyi tay tutmayaq və Allahın altındakılardan bəzimiz bəzimizi rəbb qəbul etməyək'** prinsipinə (təref) gəlin. Buna rəğmən, əgər Kitab Əhli üz çevirərlərsə, artıq: "Şübhəsiz, bizim müsəlmanlar olduğumuza şahid olun" deyin.
65 Ey Kitab əhli! Tövrat və İncil ondan sonra nazil edildiyi halda, nə üçün İbrahim haqqında mübahisə edirsiniz? Hələ də ağlınızı işlətməyəcəksiniz?
66 Baxın, siz bunlarsınız. Bir az biliyiniz olan şey haqqında mübahisə

etdiniz, yaxşı, heç biliyiniz olmayan şey haqqında nə üçün mübahisə edirsiniz? Və Allah bilir, siz bilməzsiniz.
67 İbrahim, Yəhudi və Nəsrani / Xristian deyildi. Amma o, haqqa dönmüş bir müslümdü / İslamlaşdıran şəxs idi. O, ortaq qoşanlardan da deyildi.
68 Şübhəsiz ki, insanların İbrahimə ən yaxın olanları, əlbəttə ona tabe olanlar, bu Peyğəmbər (Muhəmməd) və iman edən bu kimsələrdir. Allah, möminlərin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınıdır.

***

69 Kitap əhlindən bir tayfa sizi azdırmaq istədi. Halbuki onlar, sadəcə özlərini azdırırlar, fərqinə də varmırlar.
70 Ey Kitab əhli! Siz şahid olduğunuz halda, nə üçün Allahın ayələrini bilərək rədd edirsiniz?
71 Ey Kitab əhli! Sizlər bildiyiniz halda, nə üçün haqqı batilə qarışdırır və gerçəyi gizləyirsiniz?
72-74 Kitap əhlindən bir qrup da, möminlərin dönmələri üçün: “Nazil edilənə günün başlanğıcında iman edin və sonunda da bilərək rədd edin / iman etməyin. Və sizə verilənin bənzərinin bir kimsəyə verilmiş olduğuna, yaxud Rəbbinizin yanında sizin əleyhinizə dəlillər gətirəcəkləri xüsusunda öz dininizə tabe olanlardan başqasına inanmayın” dedilər. De ki: “Şübhəsiz doğru yolu göstərmək, Allahın doğru yolu göstərməsidir.” De ki: “Şübhəsiz ki, lütf Allahın əlindədir, onu istədiyinə verər. Və Allah, biliyi və rəhməti geniş və hədsiz olandır, çox yaxşı biləndir. Rəhmətini istədiyinə məxsus edər. Və Allah, böyük lütf sahibidir.”
75 Və Kitab əhlindən eləsi vardır ki, əgər onlara bir yük əmanət təslim etsən, onu sənə geri verər. Onlardan eləri də vardır ki, ona bir ədəd qızıl pul əmanət etsən, (başının) üzərində durmasan onu sənə geri verməz. Bu, onların: “Ümmilərin / Böyük şəhərlilərin bizim əleyhimizə yol tapmaqları mümkün deyil” demələrinə görədir. Onlar, bildikləri halda, Allah haqqında yalan da söyləyərlər.
76 Xeyr, kim Onun əhdinə / Ona verdiyi sözə vəfalı olarsa və Allahın mühafizəsi altına daxil olarsa, bilsin ki, şübhəsiz Allah, Özünün mühafizəsi altına daxil olan kəsləri sevər.
77 Şübhəsiz, Allahın əhdini / Allaha verdikləri sözləri və andlarını az bir pula satan bu kimsələr; bax onlar, axirətdə özlərinə heç bir pay olmayanlardır. Və Allah qiyamət günü onlarla danışmayacaq, onlara baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Çox acıqlı (şiddətli) əzab da onlar üçündür.
78 Və Kitab əhlindən ağılsız, sərsəri bir qrup da var ki, bəzi söz və

prinsipləri, kitabdan olmamasına rəğmən, siz onu kitabdan sanasınız deyə, dillərini kitaba doğru əyib-bükərlər. O, Allah qatından olmadığı halda, “Bu, Allah qatındandır!” deyərlər. Özləri bilərəkdən Allaha qarşı yalan da söyləyərlər. (89/3, Ali-İmran / 64-78)

## Nəcm: 486

**79** Allahın ölümlü kimsələrdən, özünə kitab, qanunvericilik və icra etmək (səlahiyyəti) və peyğəmbərlik verdiyi heç bir kimsə üçün, insanlara: “Allahın altındakılardan (biri) olan mənə, qul / kölə olun” demək yaraşmaz. Fəqət, (belə): “Öyrətdiyiniz və dərs aldığınız / oxuduğunuz kitab gərəyincə (bildirdiyi kimi), Rəbbə səmimi qullar olun” deməsi yaraşar.

**80** Və Allah sizə, təbii gücləri; zorakıları, zorakı rejimləri və peyğəmbərləri özünüzə rəbb qəbul etməyinizi əmr etməz. Siz müsəlman olduqdan sonra, sizə küfrü [Özünün ilah və rəbb olduğunu bilərək rədd etməyi] heç əmr edərmi?! (89/3, Ali-İmran / 79-80)

## Nəcm: 487

**81** Və bir vaxt Allah peyğəmbərlərdən: “And olsun ki, sizə kitabdan və haqsızlığın, fəsadın və qarışıqlığın qarşısını almaq üçün qoyulmuş qayda-qanun və prinsiplərdən verdim, sonra yanınızda olanı təsdiqləyici bir elçi gəldiyində, ona mütləq iman edəcək və ona yardım edəcəksiniz!” (deyə) sağlam sözünü almışdı. Allah, “Bunu təsdiq edib, qəbul etdinizmi? Və bu xüsusda ağır əhdimi üzərinizə götürdünüzmü / verdiyiniz sözü həqiqətən yerinə yetirəcəksinizmi?” dedi. Onlar: “Təsdiq etdik!” dedilər. Allah: “Elə isə, şahid olun, Mən də sizinlə bərabər şahid olanlardanam” dedi.

**82** Artıq bundan sonra hər kim dönərsə, artıq onlar haqq yoldan çıxanların məhz özüdür. (89/3, Ali-İmran / 81-82)

## Nəcm: 488

**83** Yaxşı, onlar, göylərdə və yerdə olan hər kəs, istər istəməz Onun üçün İslamlaşmış ikən və özləri də sadəcə Ona döndəriləcəkləri halda, Allahın dinindən başqasınımı axtarırlar?

**84** De ki: “Biz Allaha, bizə nazil edilən Qurana, İbrahimə, İsmailə, İshaqa, Yəquba və nəvələrinə nazil edilənə, Musaya, İsaya və peyğəmbərlərə Rəblərindən verilənlərə iman etdik. Onlardan heç biri arasında fərq qoymuruq. Və biz, yalnız Onun üçün İslamlaşanlarıq.”

**85** Və kim İslamdan başqa bir din axtararsa, o təqdirdə heç bir zaman ondan qəbul edilməyəcək. Və İslamdan başqa din axtaran kimsə, axirətdə zərər edənlərdən olacaqdır.

**86** İman etmələrindən və şübhəsiz elçinin haqq olduğuna şahid olduqdan və özlərinə açıq-aydın dəlillər gəldikdən sonra küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] bir camaata Allah necə doğru yolu göstərər? Və Allah, şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyən camaata doğru yolu göstərməz. (89/3, Ali-İmran / 83-86)

**Nəcm: 489**

**87,88** Bax onların cəzaları, Allahın, təbii güclərin / xəbərçi ayələrin, insanların hamısının uzaqlaşdırıb gözdən salması (lənətləməsi), daimi olmaq üzrə şübhəsiz onların üzərlərindədir. Onlardan bu əzab yüngülləşdirilməz və onlara möhlət verilməz.
**89** Ancaq bundan sonra şüurlanaraq xətalarından dönən və düzəldənlər istisnadır. Şübhəsiz, Allah, çox bağışlayan və çox mərhəmət edəndir.
**90** Şübhəsiz, iman etmələrinin arxasından, küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən], sonra da küfrü [həqiqəti örtmək işini] artıran bu kimsələr; onların xətalardan dönmələri əsla qəbul olunmayacaqdır. Və bax onlar azğınların məhz özləridir.
**91** Şübhəsiz ki, küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] və bu durumda olduqları halda, ölən bu kəslərin heç birindən, yer üzü dolusu qızıl *–onu fidyə / qurtulmağa qarşılıq versələr belə–* əsla qəbul edilməyəcəkdir. Bax dözülməz əzab onlar üçündür. Onlar üçün heç bir yardımçı da yoxdur. (89/3, Ali-İmran / 87-91)

**Nəcm: 490**

**92** Sevdiyiniz şeylərdən Allah yolunda xərcləmədikcə, əsla "yaxşı adamlıq" mərtəbəsinə çata bilməzsiniz. Və siz, hər nəyi bağışlayarsanız həqiqətən Allah, onu ən yaxşı biləndir.
(89/3, Ali-İmran / 92)

**Nəcm: 491**

**93,94** Tövrat nazil olmamışdan öncə, İsrailin / Yəqubun özünə haram etdiyi xaricində, yeməklərin hamısı İsrail oğulları üçün halal idi. De ki: "Əgər doğru kimsələrsinizsə, dərhal Tövratı gətirin və onu oxuyun. Artıq kim bundan sonra Allaha qarşı yalan uydurarsa, artıq bax onlar səhv, öz zərərinə olan əməli işləyənlərin məhz özüdür."
**95** De ki: "Allah doğru söyləmişdir. Elə isə ortaq qoşmaqdan, [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməkdən] əl çəkən biri olaraq İbrahimin dininə tabe olun. Və o, ortaq qoşanlardan deyildi." (89/3, Ali-İmran / 93-95)

**Nəcm: 492**

**96,97** Şübhəsiz, insanlar üçün bərəkətli və aləmlərə yol göstərmək üçün qoyulan ilk ev, Məkkədəkidir. Onda açıq-aşkar əlamətlər / işarətlər; İbrahimin öz vəzifəsini icra etdiyi yer [öyrədilib, yetişdirilib ortaq qoşmağa qarşı hərəkətə (mübarizəyə) başladığı yer] var. Və oraya kim daxil olarsa, güvəndədir. Və (o yerin) yoluna gücü çatan hər kəsin Beyti / ilahiyyat təhsili mərkəzini niyyət etməsi (özü üçün bir hədəf halına gətirməsi), ilahiyyat təhsili üçün oraya getməsi Allahın insanlar üzərində bir haqqıdır. Kim də gerçəyi ört-basdır edərsə, bilsin ki, şübhəsiz, Allah bütün aləmlərdən zəngindir. (89/3, Ali-İmran / 96-97)

**Nəcm: 493**

**98** De ki: “Ey Kitab əhli! Allah etdiklərinizə şahid olduğu halda, nə üçün Allahın ayələrini örtürsünüz?”
**99** De ki: “Ey Kitab əhli! Siz şahid olduğunuz halda nə üçün Allahın yolunu əyri göstərməyə çalışaraq iman edən kimsələri Allahın yolundan döndərirsiniz? Allah etdiklərinizdən xəbərsiz deyildir.” (89/3, Ali-İmran / 98-99)

**Nəcm: 494**

**100** Ey iman etmiş kimsələr! Özlərinə Kitab verilənlərdən hər hansı bir dəstəyə itaət edərsəniz, iman etməyinizdən sonra sizi, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] olaraq döndərərlər.
**101** Sizə Allahın ayələri oxunduğu halda və Onun Elçisi də aranızda ikən necə olur ki, küfr edirsininiz [Allahın ilah və rəbb olduğunu bilərək rədd edirsiniz]? Hər kim, Allaha möhkəm bağlanarsa, həqiqətən o, ən doğru yola yönəldilmişdir.
**102** Ey iman etmiş kimsələr! Allahın mühafizəsi altına daxil olan kəslər olmağınız üçün necə mühafizə altına alınmağınız lazımdırsa, özünüzü o cür Allahın mühafizəsi altına daxil edin və ancaq müslimlər olaraq can verin.
**103** Və hamınız birlikdə Allahın ipinə möhkəm sarılın / Allahın ipi ilə qorunun, ayrılmayın və Allahın üzərinizdəki nemətini xatırlayın: Bir vaxt siz, bir-birinizə düşmən idiniz və Allah, qəlbləriniz arasında ülfət yaratdı. Sonra da siz, Onun neməti sayəsində qardaşlar olmuşdunuz. Siz, bir atəş çuxurunun tam kənarında idiniz və oradan sizi O qurtarmışdı. Bax Allah, yönəldildiyiniz doğru yolu tapa biləsiniz deyə əlamətlərini / işarətlərini sizin üçün belə ortaya qoyar.
**104** Və içinizdən xeyirə çağıra, hər kəs tərəfindən qəbul edilən yaxşı şeyləri əmr edən, vəhy və ümumi ağıl ilə pisliyi – çirkinliyi qəbul

edilən şeyləri əngəlləyən bir öndərli camaat olsun. Və bax onlar, qurtuluşa yetişənlərin məhz özüdür.
**105-107** Özlərinə açıq-aşkar dəlillər gəldikdən sonra parçalanan və ayrılığa (ixtilafa) düşən kimsələr kimi də olmayın. Bax bunlar, bəzi üzlərin ağardığı, bəzi üzlərin qaraldığı gündə böyük bir əzab onlar üçündür. Artıq üzləri qaralan kimsələrə: “Siz iman etdikdən sonra yenidən kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] birimi oldunuz? Elə isə, küfr etməyinizə [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyinizə] görə dadın cəzanı!” (deyiləcək). Üzləri ağaran kimsələr də, bilin ki, Allahın rəhməti içərisindədirlər. Onlar orada daimi qalanlardır.
**108** Bunlar, Allahın ayələridir. Biz, sənə gerçək olaraq oxuyuruq. Allah aləmlərə heç bir haqsızlığı, yanlış etməyi istəməz.
**109** Və göylərdə və yer üzündə olan şeylər Allahındır. Və bütün işlər yalnızca Allaha döndərilər.
**110** Siz, insanlar üçün (ortaya) çıxarılmış ən xeyirli ümmətsiniz. Hər kəs tərəfindən yaxşı qəbul edilən şeyləri əmr edir, vəhy və ümumi ağıl ilə pisliyi, çirkinliyi qəbul edilən şeylərin qarşısını alır və Allaha iman edirsiniz. Kitab əhli də iman etsəydi, özləri üçün əlbəttə daha xeyirli olardı. Onların bəziləri möminlərdir, bir çoxu da yoldan çıxmış kimsələrdir.
**111** Onlar sizə əziyyətdən başqa bir zərər verə bilməzlər. Əgər sizinlə savaşarlarsa, sizə arxalarını çevirib qaçarlar. Sonra onlar, yardım olunmazlar.
**112** Onlar harada olurlarsa olsunlar, üzərlərinə alçaqlıq damğası vurulmuşdur. Və *–Allahın sözləşməsinə və insanların sözləşməsinə bağlı qalanlar xaric–* onlar Allahın qəzəbinə uğradılar və üzərlərinə də miskinlik (damğası) vurulmuşdur. Bu, onların Allahın ayələrini ört-basdır etmələri və haqsız yerə peyğəmbərləri öldürmələri səbəbiylədir. Bu, üsyan etmələri və həddi də aşmaları səbəbiylədir.
**113,114** Hamısı eyni deyillər. Kitab Əhli içərisində doğruluq üzərində olan bir öndərli camaat vardır ki, onlar, gecə saatlarında boyun əyib təslimiyyət göstərərək Allahın ayələrini oxuyurlar. Allaha və axirət gününə iman edirlər, hər kəs tərəfindən yaxşı qəbul edilən şeyləri əmr edirlər, hər kəs tərəfindən pisliyi qəbul edilən şeylərdən çəkindirməyə çalışırlar, xeyir işlərdə də bir-birləriylə yarışırlar. Və bax onlar, yaxşı insanlardandır.
**115** Və onlar xeyirdən nə işləyərlərsə, əsla gizlədilməyəcək / qarşılıqsız buraxılmayacaqlar. Və Allah, Özünün mühafizəsi altına daxil olan kəsləri ən yaxşı biləndir.
**116** Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu

kimsələrin] malları və övladları, Allahın qatında onlara əsla bir fayda verməyəcək. Və bax onlar, atəş əhlidirlər. Onlar orada daimi qalacaqlar.
**117** Onların bu bəsit dünya həyatında xərclədiklərinin durumu, şirk qoşmaq surətiylə özlərinə haqsızlıq edən bir camaatın əkinlərini vurub və onları (əkinləri) dəyişikliyə / məhvə məruz qoyan, içində qovurucu soyuqluğu olan küləyin durumu kimidir. Və Allah, onlara haqsızlıq etmədi. Fəqət onlar, şirk qoşmaq surətiylə özlərinə haqsızlıq edirlər.
**118** Ey iman etmiş kimsələr! Öz səviyyənizdə olmayanlardan (özünüzə) sirdaş / möhkəm dost tutmayın. Onlar, sizə zərər etməkdən geri qalmazlar. Onlar, sıxıntıya düşməyinizi istədilər. Həqiqətən kinləri ağızlarından çölə çıxmışdır (məlum olmaqdadır). Sinələrində gizlədikləri şeylər də daha böyükdür. Əgər siz ağlınızı işlədəcəksinizsə, Biz sizin üçün ayələri / əlamətləri / işarətləri həqiqətən açıqlamışıq.
**119** Bax siz elə kimsələrsiniz ki, onları sevərsiniz, halbuki onlar sizi sevməzlər, siz kitabın hamısına iman edirsiniz, onlar isə sizinlə görüşdükləri zaman: "İman etdik" deyərlər, (bir-birləri ilə) baş-başa qaldıqları zaman isə sizə olan kinlərindən dolayı barmaqlarının uclarını gəmirirlər. De ki: "Kininizlə ölün / gəbərin!" Şübhəsiz ki, Allah, sinələrin özünü / könülləri ən yaxşı biləndir.
**120** Sizə bir yaxşılıq toxunsa acığlarına gedər və əgər sizə bir pislik üz versə onunla sevinərlər. Və əgər səbr etsəniz və Allahın mühafizəsi altına daxil olarsanız, onların hiylələri sizə heç bir şəkildə zərər verə bilməz. Şübhəsiz ki, Allah onları öz etdikləri şeylərlə əhatə etmişdir.
(89/3, Ali-İmran / 100-120)

## Nəcm: 495[354]

**121** Və bir vaxt sən səhər tezdən möminləri savaş mövqelərinə yerləşdirmək üçün öz əhlindən (ailəndən) ayrılmışdın. *–Və Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir!–* **122** O zaman sizdən iki qrup, Allah onların yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxını olmasına rəğmən, dağılmağa üz tutmuşdu. *–Artıq, iman edənlər, işin nəticəsini yalnızca Allaha həvalə etsinlər!–*
**123-127** Və and olsun, siz gücsüz ikən, Allah, özünüzə verilən nemətlərin qarşılığını ödəyərsiniz deyə, sizə Bədrdə yardım etdi: *Bir vaxt sən iman edənlərə: "Rəbbinizin nazil edilən / çatdırılan üç min xəbərçi ayə ilə sizə yardım etməsi sizin üçün kafi deyilmi?" deyirdin. Əgər səbr edər və Allahın mühafizəsi altına daxil olarsanız, bəli, sizi Rəbbiniz dəstəkləyər. Və əgər onlar, qəflətən üzərinizə gəlsələr, Rəbbiniz sizə işarələnmiş / öyrədən / göndərilən beş min xəbərçi ayə*

*ilə yardım edər. Və Allah bu yardımı sizə sırf bir müjdə olsun və qəlbləriniz bununla dinclik tapsın deyə etdi. Və bu yardım, sırf Allah, kafirlərdən [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrdən] bir qisminin kökünü kəssin yaxud onları pərişan etsin və məğlub olan kimsələr olaraq dönüb getsinlər deyə, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan və ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən Allah qatındandır.* Elə isə Allahın mühafizəsi altına daxil olun.

**128** Bu işdən sənə (aid olan) heç bir şey yoxdur. Allah, ya onların tövbəsini qəbul edər, yaxud onlara əzab edər. Artıq, şübhəsiz ki, onlar səhv; öz zərərinə olan əməli işləyənlərdir.

**129** Göylərdə olan şeylər və yer üzündə olan şeylər Allahındır. O, istədiyini bağışlayar, istədiyinə əzab edər. Və Allah, çox bağışlayan, çox mərhəmət edəndir. (89/3, Ali-İmran / 121-129)

## Nəcm: 496

**130** Ey iman etmiş kimsələr! Qat-qat artırılmış olaraq ribanı [əməksiz, xidmətsiz, risksiz qazancı] yeməyin. Qurtuluşa yetişməniz üçün
Allahın mühafizəsi altına daxil olun. **131** Kafirlər [Allahın ilah və rəbb
olduğunu bilərək rədd edən kimsələr] üçün hazırlanan atəşdən də
çəkinin. **132** Mərhəmət olunmanız üçün Allaha və Elçiyə itaət edin.

**133-135** Və Rəbbinizdən bağışlanmağa (tələsən), bolluqda və qıtlıqda Allah yolunda xərcləyən, qəzəbini udan, insanları əfv edən, çirkin bir həyasızlıq işlədikləri ya da öz-özlərinə haqsızlıq etdikləri zaman, Allahı xatırlayıb dərhal günahlarına görə bağışlanma istəyən, –*Allahdan başqa günahları bağışlayan kimdir?*– etdikləri pis şeylərdə bilə-bilə israr etməyən, Allahın mühafizəsi altına daxil olan kəslər üçün hazırlanmış, eni (genişliyi) göylərlə yer qədər olan cənnətə doğru gedin (tələsin). Və Allah, gözəl-yaxşı əməl işləyənləri sevər.

**136** Bax bunların qarşılığı, Rəblərindən bağışlanmaq və içində sonsuzadək qalacaqları, altından çaylar axan cənnətlərdir. Əməl sahiblərinin (alacağı) qarşılıq / mükafat necə də gözəldir!

**137** Həqiqətən sizdən öncə vaqeələr (ilahi planlar) gəlib keçdi. Haydı, yer üzündə gəzib-dolaşın, yalanlayanların aqibətinin necə olduğuna bir baxın.

**138** Bu əmrlər, insanlar üçün bir açıqlama və Allahın mühafizəsi altına daxil olan kəslər üçün bir yol göstərmə və öyüddür.

**139** Ruhdan düşməyin və üzülməyin! Və əgər iman edənlərsinizsə, ən üstün olan sizsiniz.

**140,141** Əgər sizə bir yara dəymişsə, o camaata da (ona) bənzər bir yara toxunmuşdu. Və bax o günlər (ki var); Biz onları (o günləri), Allahın sizdən iman edən kimsələri bildirməsi / işarələyib göstərməsi və sizdən şahidlər tutması, Allahın iman edən kimsələri təmizləməsi və kafirləri [Özünün ilah və rəbb olduğunu bilərək rədd edənləri] də məhv etməsi üçün insanlar arasında elə hey dolandırırıq. Və Allah, şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənləri sevməz.

**142** Yoxsa, Allah, içinizdən səy göstərənləri bildirmədən / işarələyib göstərmədən, səbr edənləri də bildirmədən / işarələyib göstərmədən cənnətə girəcəyinizimi sandınız?

**143** And olsun ki, siz ölümlə qarşılaşmadan öncə onu arzulayırdınız. Budur, baxıb-izləyərkən onu gerçəkdən gördünüz.

**144** Və Muhəmməd ancaq bir elçidir. Həqiqətən ondan öncə də elçilər gəlib getmişlər. İndi əgər o ölərsə və ya öldürülərsə gerimi dönəcəksiniz? Kim ki, əgər geri dönərsə, bilsin ki, Allaha heç bir şəkildə zərər verə bilməz. Və Allah, sahib olduğu nemətlərin qarşılığını ödəyənlərə qarşılıq verəcəkdir.

**145** Və hər kəs sadəcə Allahın biliyi ilə vaxtı müəyyən edilmiş bir yazı (qədər) olaraq ölər. Və kim dünya qarşılığını istəyərsə, ona ondan verərik. Kim də axirət qarşılığını istəyərsə ona da ondan verərik. Və Biz, sahib olduğu nemətlərin qarşılığını ödəyənlərə qarşılıq verəcəyik.

**146** Neçə-neçə peyğəmbərlər də vardı ki, onlarla birlikdə bir çox Allah adamları savaşdılar; Allah yolunda onlara üz verən şeylərdən süstləşmədilər, zəiflik göstərmədilər və boyun əymədilər. Və Allah səbr edənləri sevər.

**147** Onların sözləri də sadəcə: “Rəbbimiz! Bizim günahlarımızı və işlərimizdə həddi aşmalarımızı bağışla və qədəmlərimizi möhkəmləndir, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] dəstəsinə qarşı bizə yardım et!” idi.

**148** Buna görə Allah, onlara dünya qarşılığını və axirət qarşılığının gözəlliyini verdi. Və Allah, yaxşılaşdıran-gözəlləşdirən kəsləri sevər.

**149** Ey iman etmiş kimsələr! Əgər siz kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrə] tabe olsanız, onlar sizi topuqlarınız (dabanlarınız) üstündə geriyə çevirərlər, siz də itkiyə məruz qalanlardan olarsınız.

**150** Əslində Allah, sizin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınınızdır. Və O, yardım edənlərin ən xeyirlisidir.

**151** Allahın, haqqında heç bir dəlil nazil etmədiyi şeyləri Ona ortaq qoşmalarına görə, Biz kafirlərin [Allahın ilah və rəbb

olduğunu bilərək rədd edən kimsələrin] qəlblərinə qorxu salacağıq. Onların gedəcəkləri yer Atəşdir. Şirk qoşaraq səhv, öz zərərlərinə olan əməli işləyənlərin sığınacağı necə də pisdir!

**152** Və siz, Allahın biliyi ilə düşmənlərinizi doğrayıb-tökərkən, Allah sizə olan vədini doğru olaraq gerçəkləşdirdi. Allah sizə sevdiyiniz şeyləri göstərdikdən sonra zəiflədiniz, o iş haqqında mübahisə və üsyan etdiniz. Sizdən bəzisi dünyanı istəyirdi, bəzisi də axirəti istəyirdi. Sonra Allah sizi sınamaq üçün onlardan geri çevirdi və həqiqətən sizi bağışladı. Və Allah, möminlərə qarşı çox lütfkardır.

**153** Və bir vaxt siz yuxarı qaçırdınız, heç kimsəyə baxmırdınız. Elçi də kənardan sizi çağırırdı. Buna görə Allah, əlinizdən çıxana və başınıza gələnə üzülməyəsiniz deyə sizə kədər üstünə kədər ilə qarşılıq verdi. Allah, etdiklərinizdən xəbərdardır.

**154** Sonra Allah, o kədərin ardınca üzərinizə bir güvən, sizdən bir qrupu örtüb bürüyən bir yuxu nazil etdi. Bir qrup da nəfslərinin sevdasına düşdü; Allaha qarşı həqiqətdən uzaq cahiliyyət zənni olaraq, zənnə qapılırdılar. Onlar: "Bu işdən bizə bir şey varmı?" deyirdilər. *–De ki: "Bütün işlər Allaha aiddir.–* Onlar, sənə açıb bildirməyəcəkləri şeyləri öz daxillərində saxlayırdılar. Onlar: "Bizə bu işdən bir şey olsaydı, (elə) buradaca öldürülməzdik" deyirdilər. De ki: "Əgər siz, evlərinizdə olsaydınız belə, üzərlərinə öldürülmə yazılmış olanlar həqiqətən yan gəlib yatacaqları [öldürüləcəkləri] yerlərə çıxıb gedəcəkdi." Və o, Allahın sinələrinizdəkini sınaması və qəlblərinizdəkini təmizləməsi üçündür. Və Allah sinələrinizdəkini çox yaxşı biləndir.

**155** Şübhəsiz, iki camaatın qarşılaşdığı gün, sizdən üz çevirib gedən kimsələr (ki var), şeytan onların qazandıqları şeylərin acısıyla ayaqlarını büdrətmək istədi. Yenə də Allah onları həqiqətən əfv etdi. Şübhəsiz ki, Allah çox bağışlayandır, çox həlimdir.

**156** Ey iman etmiş kəslər! Allahın ilah və rəbb olduğunu tanımayan və yer üzündə gəzib-dolaşan yaxud da qazaya (İslam dini uğrunda savaşa) çıxan qardaşları üçün, "Yanımızda olsaydılar ölməzdilər, öldürülməzdilər" deyən bu kəslər kimi olmayın. *–Həqiqətən Allah, bunu, onların qəlblərində bir yara edəcək.–* Və Allah, həyat verər və öldürər. Və Allah etdiklərinizi ən yaxşı görəndir.

**157** Əgər Allah yolunda öldürülər və ya ölərsəniz, Allahdan bir bağışlanma və rəhmət, həqiqətən onların yığdıqlarından daha
xeyirlidir. **158** And olsun, ölsəniz və ya öldürülsəniz də həqiqətən
Allah(ın hüzurun)a toplanacaqsınız.

**159** Bax sən, sırf Allahın rəhməti səbəbiylə onlara qarşı yumşaq

davrandın. Əgər qaba, daşürəkli olsaydın, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq onları bağışla, onlar üçün bağışlanmaq dilə. İşlərdə onlarla məsləhətləş; işin ən gözəlini ortaqlaşaraq (köməkləşərək) tapıb ortaya çıxart, bir dəfə də əzm etdinmi, artıq işin nəticəsini Allaha həvalə et. Şübhəsiz ki, Allah, işin nəticəsini Ona həvalə edənləri sevir.

**160** Allah sizə yardım edərsə, heç kim sizə qalib gələ bilməz. Əgər sizi yardımsız buraxarsa, artıq ondan sonra kim sizə yardım edə bilər? Elə isə möminlər sadəcə Allaha, işin nəticəsini həvalə etsinlər.

**161** Və heç bir peyğəmbərin dövlət malına xəyanət etməsi mümkün deyil. Və kim dövlət malına xəyanət edərsə, qiyamət günündə, xəyanət etdiyi dövlət malı ilə gələr. Sonra da hər kəsə qazandığının qarşılığı tamamilə ödənər. Və onlar, haqsızlığa uğramazlar.

**162** Yaxşı, Allahın rizasına tabe olan kimsə, Allahın qəzəbinə uğrayan və gedəcəyi yer cəhənnəm olan kimsə kimi ola bilərmi? O, necə də pis dönüş yeridir!

**163** Onlar, Allah yanında dərəcə-dərəcədir. Allah onların etdiklərini ən yaxşı görəndir.

**164** And olsun ki Allah, möminlərə özlərindən, onlara Öz ayələrini oxuyan, onları təmizləyən (saflaşdıran) və onlara kitab və haqsızlıq, fəsad və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsipləri öyrədən bir peyğəmbər göndərməklə böyük bir yaxşılıq etmişdir. Halbuki onlar, daha öncə açıq-aşkar bir azğınlıqda idilər.

**165** (Sizin başqalarına) İki qatını yaşatdığınız bir müsibət, özünüzə toxununca, "Bu məğlubiyyət haradan gəldi!?" dediniz, eləmi? De ki: "Başınıza gələn bu məğlubiyyət, sizin özünüzdəndir." Şübhəsiz Allah, hər şeyə ən yaxşı qadir olandır.

**166-168** İki topluluğun qarşılaşdığı gündə sizə toxunan şeylər də Allahın izniylədir / biliyi ilədir. Və möminləri bildirsin / işarələyib göstərsin və münafiqliq edən kimsələri *–özləri oturduqları halda, qardaşları barəsində: "Əgər bizə itaət etsəydilər öldürülməzdilər" deyən kimsələri–* bildirsin / işarələyib göstərsin deyədir. Və onlara: "Gəlin, Allah yolunda savaşın və ya müdafiə olunun" deyilmişdi. Onlar: "Biz, savaşmağı bilsəydik mütləq sizə tabe olardıq" dedilər. Onlar o gün imandan çox, Allahın ilah və rəbb olduğunu örtməyə yaxındılar. Onlar qəlblərində olmayan şeyləri ağızlarıyla söyləyirlər. Allah, gizlədikləri şeyləri daha yaxşı biləndir. De ki: "Əgər doğru kimsələrsinizsə, haydı, ölümü özünüzdən uzaqlaşdırın."

**169-171** Allah yolunda öldürülənləri də əsla ölülər sanmayın.

Tamamilə tərsinə, onlar diridirlər, Allahın ərməğanlarından verdiyi şeylərlə sevincli olaraq Rəbləri qatında ruzilənməkdədirlər. Arxalarından onlara hələ (gedib) çatmayan kimsələrə, onlar üçün heç bir qorxu olmayacağını və üzülməyəcəklərini müjdələmək istəyərlər. Onlar, Allahdan (gələn) bir neməti, ərməğanı və Allahın möminlərin əcrini həqiqətən itirməyəcəyini müjdələmək istəyərlər.

**172,173** Özlərinə bir yara toxunduqdan sonra Allah və Elçinin dəvətinə qatılan kimsələr; insanlar onlara: "Şübhəsiz insanlar sizə qarşı birləşdilər, onlardan ürpərin" dediklərində, bununla, onların inancını (daha da) gücləndirdiyi və: "Allah bizə yetər. O, necə də gözəl bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edəndir!" deyən kimsələr, onlardan yaxşılaşdıran-gözəlləşdirən və Allahın mühafizəsi altına daxil olan kimsələrə böyük bir mükafat var.

**174** Sonra da onlar, özlərinə heç bir pislik toxunmadan, Allahın neməti və ərməğanıyla geri döndülər və Allahın rizasına uydular. Və Allah, çox böyük lütfün sahibidir.

**175** Şübhəsiz ki o şeytan / pis niyyətli insan, öz yaxınlarını qorxudar. Onlardan qorxmayın, əgər möminsinizsə, Məndən qorxun.

**176** Küfrdə [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməkdə] yarışan bu adamlar da səni üzməsin. Onlar, Allaha heç bir şəkildə əsla zərər verə bilməzlər. Allah onlara axirətdə heç bir pay verməməyi istəyir. Və onlar üçün çox böyük bir əzab var. (89/3, Ali-İmran / 130-176)

## Nəcm: 497

**177** Şübhəsiz, iman qarşılığında küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyi] satın alan kimsələr, Allaha heç bir şəkildə əsla zərər verə bilməzlər. Və onlar üçün çox ağrılı-acılı bir əzab var.

**178** Allahın ilah və rəbb olduğunu tanımayan bu kimsələr, şübhəsiz Bizim onlara möhlət verməyimizin, özləri üçün xeyirli olduğunu sanmasınlar. Şübhəsiz Biz, onlara daha çox günaha girsinlər deyə möhlət veririk. Və onlar üçün alçaldıcı bir əzab var.

**179** Allah, murdar olanı təmiz olandan ayırd edənə qədər möminləri, sizin öz üzərində olduğunuz şeyin üzərində qoyacaq deyil. Allah sizləri görünməyən, eşidilməyən, hiss edilməyən, keçmiş, gələcək üzərində biliklənən biri də etməyəcək. Lakin Allah elçilərindən istədiyini seçər. Elə isə Allaha və Elçisinə iman edin. Və əgər iman edər və Allahın mühafizəsi altına daxil olarsanız, bax o zaman sizin

üçün çox böyük bir qarşılıq var.

**180** Və Allahın, onlara fəzlindən bəxş etdiyi nemətlərə qarşı xəsislik edənlər, bunun özləri üçün xeyirli olduğunu sanmasınlar. Tamamilə tərsinə, o, özləri üçün zərərlidir. Xəsislik etdikləri şey, qiyamət günündə boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası yalnızca Allaha aiddir. Və Allah etdiklərinizdən xəbərdardır.

(89/3, Ali-İmran / 177-180)

## Nəcm: 498

**181,182** Allah, "Şübhəsiz ki, Allah fəqirdir (kasıb), biz isə zənginik!" deyən kimsələrin sözünü həqiqətən eşitdi. Onların söylədikləri şeyləri və peyğəmbərləri haqsız yerə öldürmələrini yazacağıq. Və Biz: "Dadın o yandıranın əzabını! Bu, öz əllərinizin qabaqcadan göndərdiklərinin qarşılığıdır" deyəcəyik. Və şübhəsiz ki, Allah, qullara əsla haqsızlıq edən biri deyildir.

**183** "Allah fəqir (kasıb), biz isə zənginik" deyənlər, *"Atəşin yeyəcəyi bir qurbanı bizə gətirmədikcə heç bir elçiyə iman etməyəcəyimizə dair Allah, bizimlə qəti surətdə əhd bağladı"* deyə cəfəngiyyat danışan kimsələrdir. De ki: "Həqiqətən məndən öncə, sizə bəzi elçilər açıq-aşkar dəlillərlə və sizin dediyiniz şeylə gəldilər, yaxşı, *–əgər doğru kimsələrsinizsə–* bəs nə üçün onları öldürdünüz?"

**184** Əgər indi səni yalanladılarsa, bil ki, səndən öncə açıq-aydın dəlillər, səhifələr və aydınlıq gətirən kitab ilə gələn elçilər də yalanlanmışdılar. (89/3, Ali-İmran / 181-184)

## Nəcm: 499

**185** Hər mənliyi olan varlıq (hər canlı varlıq) ölümü dadacaqdır. Və şübhəsiz qiyamət günü əcirləriniz sizə əskiksiz veriləcək. Kim atəşdən uzaqlaşdırılıb, cənnətə daxil edilərsə, bilsin ki, o, gerçəkdən qurtuluşa yetişmişdir. Və bəsit dünya həyatı, aldadıcı bir faydalanmadan başqa bir şey deyil.

**186** Heç şübhəsiz siz, mallarınız və canlarınız barədə cəfa çəkəcəksiniz / imtahan olunacaqsınız. Sizdən öncə Kitab verilən kimsələrdən və ortaq qoşan kimsələrdən bir çox qüssə verən; ürək sıxan, əsəb korlayan şeylər də eşidəcəksiniz. Əgər səbr etsəniz və Allahın mühafizəsi altına daxil olsanız, şübhəsiz məhz bu, qətiyyət tələb etdirən işlərdəndir. (89/3, Ali-İmran / 185-186)

## Nəcm: 500

**187** Və bir vaxt Allah, Kitab verilən kimsələrdən sağlam sözünü almışdı: **“Kitabı mütləq insanların önünə açıq-aşkar qoyacaqsınız, onu gizlətməyəcəksiniz.”** Onlar isə bunu arxalarına atdılar və onu az bir bədəl qarşılığında satdılar. Gör, satın aldıqları şeylər necə də pisdir! (89/3, Ali-İmran / 187)

## Nəcm: 501

**188** O etdikləri şeylərlə sevinən və etmədikləri şeylərlə də təriflənmək istəyənləri əsla hesaba alma! Onların əzabdan qurtula biləcəkləri bir yerdə olacaqlarını da sanma! Və onlar üçün çox ağrılı-acılı bir əzab var.

**189** Göylərin və yer üzünün idarə edilməsi Allaha məxsusdur. Və Allah hər şeyə ən yaxşı qadir olandır. (89/3, Ali-İmran / 188-189)

## Nəcm: 502

**190-194** Göylərin və yer üzünün yaradılışında, gecənin və gündüzün arxa-arxaya gəlişində, əlbəttə, ayaq üstəykən, oturarkən və yanları üzərinə yatarkən Allahı xatırlayan; göylərin və yerin yaradılışı barəsində: *“Rəbbimiz! Sən, bunu boş yerə yaratmadın, Sən, bütün nöqsanlıqlardan paksan. Artıq bizi Atəşin əzabından qoru! Rəbbimiz! Şübhəsiz Sən, kimi o atəşə daxil edərsənsə, artıq onu həqiqətən rüsvay etmisən. Şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün heç bir yardımçı yoxdur. Rəbbimiz! Şübhəsiz ki, biz: ‘Rəbbinizə iman edin!’ deyə çağıran bir carçını eşitdik və dərhal iman etdik. Rəbbimiz! Artıq bizim günahlarımızı bağışla, pisliklərimizi ört və bizi ‘yaxşı adamlar’ ilə birlikdə keçmişdə etdiklərimizi və etməli olduğumuz halda etmədiklərimizi bir-bir xatırlatdır / öldür. Rəbbimiz! Və bizə, elçilərin vasitəsi ilə vəd etdiyin şeyləri ver, qiyamət günü bizi rüsvay etmə. Şübhəsiz Sən, verdiyin sözdən dönməzsən”* deyə yaxşı-yaxşı düşünən, anlayış qabiliyyətləri olanlar üçün neçə-neçə əlamətlər / işarətlər var.

**195** Belə olduqda, Rəbləri onlara qarşılıq verdi: “Şübhəsiz Mən, sizdən kişi olsun, qadın olsun *–ki hamınız eynisiniz–* çalışanın əməlini itirmərəm. O səbəblə, hicrət edənlər, (öz) yurdlarından çıxarılanlar, Mənim yolumda əziyyət edilənlər, savaşanlar və öldürülənlər; əlbəttə onlardan pisliklərini örtəcəyəm və Allah qatından bir savab olaraq, onları altından çaylar axan cənnətlərə qoyacağam. Və Allah, savabın gözəli Öz qatında olandır.” (89/3, Ali-İmran / 190-195)

**Nəcm: 503**

**196,197** Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kəslərin] şəhərlərdə gəzib-dolaşması, çox az bir qazanc (xeyir baxımından az olan bir şey), əsla səni aldatmasın. Sonra onların gedəcəkləri yer cəhənnəmdir və o, necə də pis bir yataqdır!

**198** Amma, Rəblərinin mühafizəsi altına daxil olan kəslərə gəlincə, onlar üçün, Allah qatından bir yolçu (müsafir) ziyafəti olaraq, altlarından çaylar axan, içində təməlli qalacaqları cənnətlər var. Və Allah qatındakı, "yaxşı adamlar" üçün daha yaxşıdır.

**199** Şübhəsiz ki, Kitab əhlindən Allaha iman edənlər, sizə nazil edilənə və özlərinə nazil edilənə *–Allaha səmimiyyətlə ehtiram göstərənlər olaraq–* iman edənlər də var. Onlar, Allahın ayələrini az bir dəyərə dəyişməzlər. Bax onlar, mükafatları Rəbləri qatında olanlardır. Şübhəsiz Allah, tez haqq-hesab edəndir.

**200** Ey iman etmiş kimsələr! Qurtulmağınız, müvəffəqiyyət qazanmağınız üçün səbr edin və bir-birinizi səbrli olmağa sövq edin, bir-birinizə bağlanın və Allahın mühafizəsi altına daxil olun.

(89/3, Ali-İmran / 196-200)

## ƏHZAB (90 – 33) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 504**

**1** Ey Peyğəmbər! Allahın mühafizəsi altına daxil ol, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] və münafiqlərə itaət etmə. Şübhəsiz ki, Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır.

**2** Və Rəbbindən sənə vəhy edilən şeylərə tabe ol. Şübhəsiz Allah, sizin nə etdiyinizi ən çox biləndir.

**3** Və işin nəticəsini Allaha həvalə et, "bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən" olaraq da Allah yetər. (90/33, Əhzab / 1-3)

**Nəcm: 505**

**4** Allah, bir kişinin sinə boşluğunun içində iki qəlb yaratmadı; bir insan həm mömin, həm kafir ola bilməz, mütləq bundan biridir. Və Zihar etdiyiniz;[355] özlərini analarınıza bənzədərək and içdiyiniz zövcələrinizi də sizin analarınız olaraq qəbul etmədi. Övladlığa götürdüklərinizi də sizin öz uşaqlarınız saymadı. Bu, sizin ağzınızla (öz dilinizlə) söylədiklərinizdir. Allah isə haqqı söyləyir. Və Yola yönəldir.

**5** Övladlığa götürdüklərinizi öz (gerçək) atalarına nisbət edərək

çağırın; bu, Allah yanında daha haqqa (ədalətə) uyğundur. Əgər atalarını tanımırsınızsa, artıq onlar dində sizin qardaşlarınız və müqavilə ilə yaxınlıq qurduqlarınızdır. Qəlblərinizin qəsdən etdikləri; şüurlu, planlı – proqramlı etdiyiniz şeylər xaricində xəta olaraq etdiklərinizdə isə sizin üçün bir vəbal yoxdur. Və Allah, çox bağışlayandır, çox mərhəmət edəndir. (90/33, Əhzab / 4-5)

## Nəcm: 506

6 Peyğəmbər, möminlərə öz nəfslərindən daha yaxın, Peyğəmbərin zövcələri möminlərin analarıdır. Və əqrəbalar, Allahın yazısında hamısı eyni dərəcədədir, *–qoruyucu (himayə edən) yaxınlarınıza hər kəs tərəfindən məqbul sayılan bir davranış nümayiş etdirməyiniz xaricində–* möminlərdən və mühacirlərdən daha üstündürlər. Bu, kitabda yazılmışdır. (90/33, Əhzab / 6)

## Nəcm: 507

7,8 Və bir vaxt Biz, doğru (danışan) kimsələri doğru bildiklərindən məsuliyyətə cəlb etmək üçün peyğəmbərlərdən; Nuhdan, İbrahimdən, Musadan və Məryəm oğlu İsadan "qəti söz"lərini almışdıq. Səndən də "qəti söz" aldıq. Biz, onlardan ağır bir "qəti söz" aldıq. Və Allah, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün acı verəcək bir əzabı hazırladı. (90/33, Əhzab / 7-8)

## Nəcm: 508[356]

9 Ey iman etmiş kimsələr! Allahın üzərinizdəki nemətini xatırlayın. Bir vaxt sizə ordular gəlmişdi, Biz onların üzərlərinə bir külək və sizin görmədiyiniz ordular göndərmişdik. Və Allah, işlədiklərinizi çox yaxşı görəndir.

10 Bir vaxt onlar, üst tərəfinizdən və sizdən daha aşağıdan sizə gəlmişdilər. Və bir vaxt gözlər (bayılan adamların gözləri kimi) əyilmiş, ürəklər ağıza gəlmişdi. Və siz Allah haqqında elə hey zənnə qapılırdınız.

11 Bax burada möminlər yıpradılmaq surətiylə imtahan edilmiş və çox şiddətli bir sarsıntı ilə sarsılmışdılar.

12 Və o vaxt münafiqlər və qəlblərində bir xəstəlik olanlar; [pis düşüncəli kimsələr]: "Allah və Elçisi bizə bir aldanmadan başqa bir vəd etməmişdir" deyirdilər.

13 Və bir vaxt bunlardan bir qrup: "Ey Yəsrib / Mədinə əhalisi! Sizin üçün qalacaq yer yoxdur, dərhal (geri) dönün" deyirdilər. Onlardan bir qismi də, "Evlərimiz həqiqətən müdafiəsizdir" deyərək Peyğəmbərdən icazə istəyirdilər. Halbuki evləri müdafiəsiz deyildi. Onlar, sadəcə

(olaraq) qaçmaq istəyirdilər.
**14** Əgər onların üzərinə (hücum çəkilib) evlərinin hər bir bucağından girilsəydi, sonra da ictimai yanğın çıxarmaları istənilsəydi (xalq arasında fəsad çıxarmaları tələb olunsaydı), mütləq bunu yerinə yetirərdilər. Bunu (etmək üçün) çox da gözləməzdilər.
**15** Və heç şübhəsiz onlar, bundan öncə, arxalarını dönüb qaçmayacaqlarına (dair) Allaha and içərək ‘qəti söz’ vermişdilər. Və Allahın əhdi / Allaha qarşı verilən sözlər məsuliyyət gətirir.
**16** De ki: “Əgər ölməkdən və ya öldürməkdən qaçırsınızsa, qaçmaq sizə heç bir zaman fayda verməz. Və o zaman sadəcə, çox az bəhrələndiriləcəksiniz (çox az müddət dünyada dolanıb-keçinəcəksiniz).”
**17** De ki: “Əgər Allah, sizə bir pislik dilədisə və ya sizə bir rəhmət (yaxşılıq) dilədisə, sizi Allahdan kim qoruya bilər?” Həm onlar özlərinə Allahın altındakılardan bir yol göstərən, qoruyucu (himayə edən) yaxın tapa bilməzlər, bir yardımçı da (tapa bilməzlər).
**18,19** Şübhəsiz Allah, sizdən o əngəlləyənləri, tənbəllik edənləri və sizi qısqanaraq, qardaşlarına: “Bizə tərəf gəlin!” deyənləri bilir. Və onlar, sıxıntıya (dözməyə), çox az gəlirlər. Sonra o qorxu gəlincə, sən onları, ölüm (qorxusundan) bayılan kimsə kimi gözləri dönərək sənə baxdıqlarını gördün. Sonra o qorxu sovuşanda, yaxşılığa qısqanclıq edərək sizə qarşı iti dillərini işə saldılar. Bax bunlar iman etmədilər, Allah da əməllərini puç etdi. Və bu, Allah üçün çox asandır.
**20** Onlar, birləşmiş düşmən dəstələrinin (çıxıb) getmədiyini sanırdılar. Əgər düşmən birlikləri gələsi olarsa, çöldə bədəvi Ərəblərin içində öz yerlərini alıb, sizin xəbərlərinizdən soruşmağı istəyərlər. Və əgər onlar içinizdə olsaydılar, ancaq çox az savaşardılar.
**21** And olsun ki, Allahın Elçisində, sizin; Allaha və son günə ümid bəsləyən və Allahı daha çox xatırlayan kimsələr üçün gözəl bir örnək vardır.
**22** Möminlər, birləşmiş düşmən dəstələrini gördükləri zaman da: “Bax bu, Allahın və Elçisinin bizə vəd etdiyi şeydir. Allah və Elçisi doğru söylədi” dedilər. Bu, onların sadəcə imanını və güvənliklərini artırdı.
**23,24** Möminlərdən elə kimsələr var ki, Allaha, imanları gərəyi etmələri gərəkən şeylərə sədaqət göstərdilər. Bax, onlardan eləsi əhdini gerçəkləşdirən (nəzirini verən) / canını verən kimsədir, eləsi də gözləyən kimsədir. *–Onlar, Allahın doğru kimsələri doğruluqları səbəbiylə mükafatlandıracağı, istəyərsə münafiqlərə də əzab edəcəyi və ya tövbə nəsib edəcəyi üçün, sərbəst bir şəkildə davranıb davranışlarında dəyişiklik etmədilər.–* Şübhəsiz ki, Allah çox bağışlayandır, çox mərhəmət edəndir.

**25** Və Allah kafirləri [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən kəsləri] hər hansı bir xeyirə yetişmədən kinləriylə geri çevirdi. Və Allah, möminlərə savaşda kafi gəldi. Və Allah çox güclüdür, mütləq üstün olandır.
**26,27** Həm də Allah, Kitab əhlindən kafirlərlə yardımlaşanları (öz) qalalarından endirdi. Və qəlblərinə qorxu saldı: Siz onların bir qismini qətl edirdiniz, bir qismini də əsir alırdınız. Və Allah, onların ərazilərinə, yurdlarına, mallarına və hələ ayaq basmadığınız bir yerə sizi son sahib etdi. Və Allah, hər şeyə ən yaxşı qadir olandır.
(90/33, Əhzab / 9-27)

## Nəcm: 509

**28,29** Ey Peyğəmbər! Zövcələrinə söylə: "Əgər siz bəsit dünya həyatını və onun süslü cazibəsini istəyirsinizsə, gəlin sizə boşanma bədəli ödəyim və gözəl bir buraxma (ayrılma) tərzi ilə sizi buraxım. Əgər siz Allahı, Elçisini və son yurdu istəyirsinizsə, artıq heç şübhəsiz Allah, sizdən yaxşılaşdıran-gözəlləşdirənlər üçün çox böyük bir əcir hazırlamışdır."
**30,31** Ey Peyğəmbərin qadınları! Sizdən kim açıq, bir çirkin utanmazlıq edərsə, günahın cəzası iki qat olaraq artırılar. Bu da Allaha görə çox asandır. Sizdən kim də Allaha və Elçisinə həmişə ehtiram göstərərsə və saleh əməl işləyərsə, ona da əcrini iki dəfə verərik. Və Biz ona üstün bir ruzi də hazırlamışıq.
**32-34** Ey Peyğəmbərin qadınları! Siz qadınlardan hər hansısa biri deyilsiniz; əgər Allahın mühafizəsi altına daxil olarsanız, artıq cazibədar söz söyləməyin ki, sonra qəlbində xəstəlik olan; [pis düşüncəli] kimsə tamah edər. Sözü ürfə [adət-ənənəyə] uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildə söyləyin. Evlərinizdə ləyaqətli (vüqarlı) olun, ilk cahiliyyət (dövrünün) dəbdəbəsi kimi dəbdəbəli görünməyin, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradın-ayaqda tutun], zəkatı / vergini verin, Allaha və Elçisinə itaət edin. *–Ey Əhli-beyt! Gerçəkdən Allah, sizdən kiri uzaqlaşdırmaq və sizi təmizləmək istəyir.–* Və evlərinizdə oxunan Allahın ayələrini və haqsızlıq, fəsad və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsipləri xatırlayın. Heç şübhəsiz Allah, çox lütf edəndir, gizlini biləndir, hər şeyin iç üzünü, gizli tərəflərini də yaxşı biləndir. (90/33, Əhzab / 28-34)

## Nəcm: 510

**35** Şübhə yoxdur ki, İslam dininə daxil olan kişilər və İslam dininə daxil olan qadınlar, mömin kişilər və mömin qadınlar, ehtiram

göstərən kişilər və ehtiram göstərən qadınlar, doğru kişilər və doğru qadınlar, səbr edən kişilər və səbr edən qadınlar, xuşulu (qəlbləri Allah qarşısında qorxu və ehtiramla dolu olan) kişilər və xuşulu (qəlbləri Allah qarşısında qorxu və ehtiramla dolu olan) qadınlar, sədəqə verən kişilər və sədəqə verən qadınlar, oruc tutan kişilər və oruc tutan qadınlar, ismətlərini qoruyan kişilər və ismətlərini qoruyan qadınlar, Allahı çox xatırlayan kişilər və Allahı çox xatırlayan qadınlar; Allah, onlar üçün bir bağışlanma və çox böyük bir mükafat hazırlamışdır.
(90/33, Əhzab / 35)

## Nəcm: 511

**36** Və Allah və Elçisi bir işə hökm verdiklərində, heç bir mömin kişi və mömin qadın üçün öz işlərində sərbəstlik (öz ixtiyarları ilə hərəkət etmək) yoxdur. Və kim Allaha və Elçisinə üsyan edərsə o, açıq bir azğınlıqla azmışdır.
**37** Bir vaxt sən, Allahın nemət verdiyi və sənin də nemət verdiyin adama: “Zövcəni yanında saxla və Allahın mühafizəsi altına daxil ol!” deyirdin və insanlardan çəkinərək Allahın aşkar edəcəyi şeyi öz içində gizli tuturdun. Halbuki Allah, Özünə hörmətlə, sevgiylə, biliklə ürpərməyinə daha çox layiqdi. Artıq Zeyd,[357] Zeynəbdən əlaqəsini kəsincə, Biz Zeynəbi səninlə evləndirdik. (Belə etdik) ki, beləliklə övladlıqlarının özlərindən əlaqələrini kəsdikləri zaman, övladlıqlardan ayrılan qadınla evlənmək mövzusunda möminlər üzərində bir çətinlik olmasın. Allahın əmri yerinə yetirilmişdir.
**38,39** Allahın ona fərz etdiyi şeydə Peyğəmbər üzərinə, daha öncə gəlib-keçən kimsələrdə; Allahın verdiyi elçilik görəvini təbliğ edən, Ona hörmətlə, sevgiylə, biliklə ürpərən və Allahdan başqa kimsəyə hörmətlə, sevgiylə, biliklə ürpərməyən kimsələrlə əlaqəli Allahın qayda-qanununda (heç) bir çətinlik yoxdur. Allahın əmri, nizamlanmış, müəyyən edilmiş bir qədərdir. Hesab çəkən olaraq Allah yetər.
**40** Muhəmməd, sizin (aranızdaki) kişilərdən heç birinin atası deyil. Ancaq O, Allahın elçisi və peyğəmbərlərin sonuncusudur.[358] Və Allah, hər şeyi ən yaxşı biləndir. (90/33, Əhzab / 36-40)

## Nəcm: 512

**41,42** Ey iman edən kəslər! Allahı xatırlamanız, ‘daha çox xatırlamaq’ şəklində olsun. Və Onu hər zaman nöqsan sifətlərdən pak tutun (təmizləyin).
**43,44** O, sizləri qaranlıqlardan aydınlığa çıxartmaq üçün sizə dəstək verəndir. Onun təbiətdəki gücləri / nazil etdiyi xəbərçi ayələri dəstək

verirlər. Və O, möminlərə (qarşı) çox mərhəmətlidir. Ona qovuşacaqları gün, onların salamlaşmaları, "salam"dır. Allah da onlar üçün dəyərli bir mükafat hazırlamışdır. (90/33, Əhzab / 41-44)

## Nəcm: 513

**45-48** Ey Peyğəmbər! Şübhəsiz ki, Biz, səni, bir şahid, bir müjdəçi, bir xəbərdarlıq edən, Öz izni ilə / biliyi ilə Allaha dəvət edən biri və işıq saçan bir çıraq olaraq göndərdik / elçi etdik. Sən də iman edənlərə, şübhəsiz onlar üçün Allahdan böyük bir ərməğan (bəxşiş) olduğunu müjdələ. Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] və münafiqlərə itaət etmə, onların verdiyi əziyyətləri burax, əhəmiyyət vermə. Və sən, işin nəticəsini Allaha həvalə et. Və "bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən" olaraq Allah yetər.
(90/33, Əhzab / 45-48)

## Nəcm: 514

**49** Ey iman etmiş kimsələr! Mömin qadınları nikah edib, sonra onlara toxunmadan boşadığınız zaman, artıq sizin üçün (onların) üzərlərində sayacağınız bir gözləmə müddəti yoxdur. Dərhal onları bəhrələndirin (faydalanacaqları bir şey verin) və onları gözəl bir şəkildə (sərbəst) buraxın. (90/33, Əhzab / 49)

## Nəcm: 515

**50** Ey Peyğəmbər! Şübhəsiz Biz, mehrlərini[359] verdiyin zövcələrini;
Allahın qənimət olaraq sənə verdiklərindən, müqavilə ilə malik olduğunu / savaş əsirlərindən himayənə verilmiş xanımları;
əminin, bibinin, dayının və xalanın qızlarından səninlə birlikdə hicrət edənləri
və özünü Peyğəmbərə hibə edən (bağışlayan), Peyğəmbərin də nikahlamaq istədiyi Mömin qadını *–möminlərin səviyyəsindən aşağı olmaq üzrə və sadəcə sənə xas olaraq–* sənə halal etdik. Biz öz zövcələri və müqavilələrinin malik olduqları şeylər[360] barəsində sənin xaricindəki möminlərə nəyi vacib etdiyimizi qəti surətdə bildik, daha öncə açıqladıq. Bu hal; sənə xas olaraq gətirilən çoxarvadlılıq və digər xüsusi maddələr, sənin üçün bir çətinlik olmasın deyədir. Və Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.
**51** Onlardan istədiyini geri buraxa, istədiyini də yanına götürə bilərsən. Ayrıldıqlarından, istədiklərinə dönməkdə artıq sənin üçün bir qorxu yoxdur. Onların gözlərinin aydınlanıb kədərlənməmələrinə və

onlara verdiyinlə hamısının razı olmalarına ən yaxın olan budur. Allah qəlblərinizdə olanları bilir. Allah, hər şeyi biləndir, çox həlimdir.
52 Bundan sonra (bunlardan başqa) qadınlar və bunları başqa qadınlar ilə dəyişdirmək *–gözəllikləri xoşuna gəlsə belə–* sənə halal olmaz. Ancaq andının malik olduğu / müharibə əsiri olub, sənin himayənə verilən istisnadır; onu nikahlaya bilərsən. Allah, hər şeyə nəzarət edib, (hər şeyi) yoxlayandır. (90/33, Əhzab / 50-52)

## Nəcm: 516

53 Ey iman edən kimsələr! Peyğəmbərin evlərinə sadəcə *–vaxta baxmadan–* yeməyə icazə verilincə daxil olun. Amma dəvət olunduğunuzda dərhal girin. Artıq yeməyi yedikdən sonra da dərhal dağılışın. Söz (söhbət) üçün gözləməyin. Şübhəsiz ki, bu hərəkətiniz Peyğəmbərə əziyyət verir, sonra da O, sizdən çəkinir. Allah isə haqdan / gerçəkdən çəkinməz. Onun xanımlarından (lazımlı) bir şey istədiyiniz zaman da pərdə arxasından / otaqlarına girmədən istəyin. Belə etməyiniz, sizin qəlbləriniz və onların qəlbləri üçün daha təmizdir. Və sizin, Allahın Elçisinə əziyyət etməyiniz və özündən sonra xanımlarını da, nikah etməyiniz sonsuzadək mümkün olmayan bir şeydir. Bu, Allah qatında çox böyük (bir günahdır).
54 Siz bir şeyi aşkar etsəniz, yaxud onu gizləsəniz, bilin ki, şübhəsiz Allah, hər şeyi ən yaxşı biləndir.
55 Peyğəmbərin zövcələrinə, ataları, oğulları, qardaşları, qardaşlarının oğulları, bacılarının oğulları, qadınlar və müqavilələrinin sahib olduğu kimsələr[361] haqqında bir günah yoxdur. *–Və siz / Peyğəmbərin zövcələri, Allahın mühafizəsi altına daxil olun.–* Şübhəsiz Allah, hər şeyə ən yaxşı şahiddir.
56 Şübhəsiz Allah və təbiətdəki gücləri / nazil etdiyi Quran ayələri Peyğəmbəri dəstəkləyirlər / yardım edirlər / arxa-dayaq olurlar. Ey iman etmiş kimsələr! Siz də Peyğəmbərə dəstək olun / Ona yardım edin / arxa-dayaq olun və onun güvənliyini tam bir güvənliklə təmin edin!
57 Şübhəsiz, Allaha və Elçisinə əziyyət verənlər (ki var); Allah onları dünyada və axirətdə kənarlaşdırmışdır. Və onlar üçün alçaldıcı bir əzab hazırlamışdır.
58 Mömin kişilərə və mömin qadınlara etmədikləri bir şey səbəbiylə əziyyət edən kimsələr də, həqiqətən, artıq bir iftira və açıq-aşkar bir vəbal yüklənmişlər. (90/33, Əhzab / 53-58)

## Nəcm: 517

59 Ey Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin qadınlarına

söylə, üzərlərinə üst paltarlarından örtsünlər. Tanınıb əziyyət edilməmələri üçün, bu daha uyğundur. Allah çox bağışlayandır və çox mərhəmət edəndir. (90/33, Əhzab / 59)

## Nəcm: 518

**60-62** And olsun ki, əgər o münafiqlər və qəlblərində bir xəstəlik olan; [pis düşüncəli] bu kimsələr və Mədinədə ortalığı qarışdıranlar, bu etdiklərindən əl çəkməsələr, həqiqətən onları uzaqlaşdırmaq surətiylə səni onların üstünə müsəllət edərik (qaldırarıq). Sonra onlar, səninlə orada qısa bir müddətdən artıq qonşu qala bilməzlər; Allahın, daha öncə gəlib-getmiş kimsələr haqqındakı qayda-qanununa (uyğun) olaraq, harada olarlarsa ələ keçərlər və amansızlıqla öldürülərlər. Və sən Allahın qayda-qanununda əsla bir dəyişiklik tapa bilməyəcəksən!
(90/33, Əhzab / 60-62)

## Nəcm: 519

**63,73** İnsanlar səndən qiyamətin qopma vaxtını soruşurlar. De ki: "Onun biliyi (məlumatı), Allahın; münafiq kişilərə, münafiq qadınlara, ortaq qoşan kişilərə, ortaq qoşan qadınlara əzab etməsi; və Allahın, mömin kişilərin və mömin qadınların tövbələrini qəbul etməsi üçün ancaq Allahın yanındadır. Nə bilirsən, bəlkə də qiyamətin qopma vaxtı yaxındadır. Və Allah çox bağışlayandır, çox mərhəmət edəndir."[362]
(90/33, Əhzab / 63, 73)

## Nəcm: 520

**64-66** Həqiqətən Allah kafirləri [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən kimsələri] uzaqlaşdırıb gözdən salmış və içində sonsuzadək qalmaları üçün, onlara çılğın bir atəş hazırlamışdır. Onlar orada, bir qoruyucu (himayə edən) yaxın və yardımçı tapa bilməzlər. Üzləri atəşin içində o yan-bu yana çevrildiyi gün, "Ah, kaş ki, Allaha itaət etsəydik, elçiyə itaət etsəydik!" deyəcəklər.
**67,68** Və dedilər ki: "Ey Rəbbimiz! Şübhəsiz biz, ağalarımıza və böyüklərimizə itaət etdik, onlar da bizi (haqq) yoldan azdırdılar. Ey Rəbbimiz! Onlara əzabdan ikiqat ver və onları tamamilə uzaqlaşdır / rəhmətindən məhrum et." (90/33, Əhzab / 64-68)

## Nəcm: 521

**69** Ey iman etmiş kəslər! Siz Musaya əziyyət edən kimsələr kimi olmayın. Bax, Allah Musanı, əziyyət edənlərin söylədiklərindən (böhtanlardan) təmizə çıxardı. Və o, Allah qatında mövqe sahibi / dəyərli biri idi.
**70,71** Ey iman etmiş kimsələr!  Allahın mühafizəsi altına daxil olun və

sağlam dəlilli söz söyləyin. (Belə edin) ki, Allah işlərinizi lehinizə düzəltsin, günahlarınızı da bağışlasın. Hər kim Allaha və Elçisinə itaət edərsə, artıq o, gerçəkdən çox böyük bir zəfər ilə qurtulmuş olar.
(90/33, Əhzab / 69-71)

**Nəcm: 522**

**72** Şübhəsiz Biz, əmanəti [bütövlüyü, qüsursuzluğu, mükəmməlliyi] göylərin, yerin və dağların üzərinə sərdik, yayqınlaşdırdıq, ancaq onlar, onu daşımağa / gizləməyə, tanınmaz hala gətirməyə, gözdən salmağa yanaşmadılar, bütünlüyün, qüsursuzluğun, mükəmməlliyin götürülüb aparılmasından, tanınmaz hala gətirilməsindən qorxdular. Və onu insan daşıdı / gizlədi, tanınmaz hala gətirdi, gözdən saldı [ona xəyanət etdi]. Şübhəsiz insan, çox səhv davranan; öz zərərlərinə olan əməli işləyən və çox cahildir. (90/33, Əhzab / 72)

## MUMTƏHİNƏ (91 – 60) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 523**

**1** Ey iman etmiş kimsələr! Əgər Mənim yolumda səy göstərmək və Mənim rizamı qazanmaq üçün çıxdınızsa, sizə haqdan gələn şeyləri bilərək rədd etdikləri / iman etmədikləri halda, onlara sevgi göstərərək / onlara (olan) sevgini gizləyərək Mənə düşmən olanları və öz düşməninizi yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar (olaraq) qəbul etməyin / onları yönətici etməyin. Onlar, Rəbbiniz olan Allaha iman etdiyinizə görə Elçini və sizi yurdunuzdan çıxarırlar. Halbuki Mən, sizin gizlədiyiniz şeyləri və aşkar etdiyiniz şeyləri ən yaxşı bilənəm. Və sizdən kim bunu edərsə, artıq o, həqiqətən yolun tam ortasından azmışdır.
**2** Əgər onlar sizi ələ keçirərlərsə, sizin üçün düşmən olacaqlar, əllərini və dillərini pisliklə sizə uzadacaqlar. Və onlar, “Kaş ki, küfr etsəniz [Allahın ilah və rəbb olduğunu bilərək rədd etsəniz] / iman etməsəniz” deyə arzu etməkdədirlər.
**3** Qiyamət günü əqrəbalarınız və övladlarınız sizə əsla fayda verməzlər. Allah aranızı ayırar. Və Allah, etdiklərinizi ən yaxşı görəndir. (91/60, Mumtəhinə / 1-3)

**Nəcm: 524**

**4,5** İbrahimdə və onunla bərabər olanlarda –*İbrahimin, atası üçün, “Sənin üçün həqiqətən bağışlanma diləyəcəyəm. Və Allahdan olan heç bir şeyə gücüm çatmaz” deməsi xaric*– həqiqətən sizin üçün gözəl bir örnək var. Bir vaxt İbrahim və İbrahim ilə bərabər olanlar, öz

qövmlərinə belə demişdilər: “Biz, sizdən və sizin Allahın altındakılardan tapındığınız (ibadət etdiyiniz) şeylərdən uzağıq. Biz sizi silib atdıq. Və siz, bir tək Allaha iman etməyənə qədər sizinlə bizim aramızda sonsuzadək bir düşmənçilik və nifrət olacaqdır! Rəbbimiz! Yalnız Sənə təvəkkül etdik, Sənə yönəldik. Və dönüş ancaq Sənədir. Rəbbimiz! Bizi, kafirlər [Sənin ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün bir atəşə atılma / imtahan vasitəsi etmə! Bizi bağışla! Rəbbimiz! Şübhəsiz Sən, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, ən yaxşı qanun qoyanın, (etdiyini) ən sağlam edənin məhz Özüsən!”
**6** And olsun, onlarda sizin üçün; Allaha və axirət gününə ümid bəsləyən kimsələr üçün gözəl bir örnək vardır. Kim üz çevirərsə bilsin ki, şübhəsiz Allah, zənginin, tərifə layiq olanın məhz Özüdür.
(91/60, Mumtəhinə / 4-6)

## Nəcm: 525

**7** Ola bilsin ki, Allah, sizlərlə, onlardan (onların içindən) özlərinə düşmənçilik bəslədiyiniz kimsələr arasında bir sevgi yaradar. Allah, ən yaxşı qadir olandır. Və Allah, çox bağışlayandır, çox mərhəmət edəndir.
**8** Allah, din haqqında sizinlə savaşmayan və sizi yurdlarınızdan çıxarmayan kimsələrə yaxşılıq etməyi və onlarla haqqa uyğun davranmağı sizə qadağan etməz. Şübhəsiz ki, Allah haqqa uyğun davrananları sevər.
**9** Allah, ancaq sizi, sizinlə din haqqında savaşan, sizi yurdlarınızdan çıxaran və çıxarılmanız üçün yardımlaşan kimsələri vəliləşdirməyinizi [qoruyucu (himayə edən), nəzarətçi, yönətici etmənizi] qadağan edər. Kim onları vəliləşdirərsə, bax onlar, səhv; öz zərərinə olan əməli işləyənlərin məhz özüdür. (91/60, Mumtəhinə / 7-9)

## Nəcm: 526

**10** Ey iman etmiş kimsələr! Mömin qadınlar mühacirlər olaraq sizə gəldiyi zaman, dərhal onları sorğu-suala çəkin. *–Allah onların imanlarını daha yaxşı bilir.–* Əgər siz də onların iman etmiş qadınlar olduğunu öyrənsəniz, artıq onları kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] geri döndərməyin (göndərməyin). Hicrət edən mömin qadınlar, onlara halal deyil. Onlar da bunlara halal olmaz. İman etməmiş keçmiş ərlərinə sərf etdiklərini verin. Mehrlərini[363] özlərinə verdiyiniz zaman, onlarla evlənməyinizdə sizə bir günah yoxdur. Kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] qadınları nikahınızda saxlamayın, sərf etdiyinizi / ödədiyiniz

mehri geri istəyin. Onlar da sərf etdiklərini / sizə xərclədiklərini geri istəsinlər. Bax bu, Allahın hökmüdür ki, aranızda O hökm edər, Allah, çox biləndir, çox yaxşı qanun qoyandır.
11 Əgər zövcələrinizdən biri, sizdən, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] qaçar, siz də qisas alarsınızsa (eynisini edərsinizsə), zövcələri gedənlərə, xərclədikləri qədər verin. Və siz, Özünə iman etdiyiniz Allahın mühafizəsi altına daxil olun.
(91/60, Mumtəhinə / 10-11)

## Nəcm: 527

12 Ey Peyğəmbər! İman etmiş qadınlar sənə, Allaha heç bir şeyi ortaq qoşmamaları, oğurluq etməmələri, zina etməmələri, uşaqlarını öldürməmələri, əlləri ilə ayaqları arasında bir iftira uydurub gətirməmələri, hər kəs tərəfindən qəbul edilən / vəhyə uyğun xüsuslarda (məsələlərdə) sənə üsyan etməmələri üzrə bağlılıq (sədaqət) andı içərək gələrlərsə, dərhal onların bağlılıq (sədaqət) andlarını qəbul et və onlar üçün Allahdan bağışlanma dilə. Şübhəsiz Allah, çox bağışlayan, çox mərhəmət edəndir. (91/60, Mumtəhinə / 12)

## Nəcm: 528

13 Ey iman etmiş kimsələr! Allahın qəzəb etdiyi camaatı vəliləşdirməyin [yönətici, nəzarətçi etməyin]. Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] məzarlıq əhlindən ümid kəsdiyi kimi, həqiqətən onlar, axirətdən ümid kəsmişlər.
(91/60, Mumtəhinə / 13)

# NİSA (92 – 4) VƏ (93 – 99) ZİLZAL SURƏLƏRİ MƏDİNƏ DÖVRÜ

## Nəcm: 529

1 Ey insanlar! Sizi tək bir nəfsdən yaradan, ondan zövcəsini yaradan və hər ikisindən bir çox kişi və qadın törədib yayan Rəbbinizin mühafizəsi altına daxil olun. Və Onun (adı ilə), bir-birinizdən (müxtəlif şeylər) dilədiyiniz Allahın və əqrəbalığın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, sizin üzərinizdə nəzarətçidir.
2 Və yetimlərinizə mallarını verin. Təmizi pislə dəyişməyin. Onların mallarını öz mallarınıza qataraq yeməyin. Bunu etmək həqiqətən böyük bir günahdır.
3 Və əgər yetimləriniz barəsində haqqa uyğun davranmaqdan qorxursunuzsa; o təqdirdə yetimlərin qadınlarından / yetimlərə baxmaq məcburiyyətində qalmış qadınlardan sizin üçün xoş olanlarından iki-iki, üç-üç, dörd-dörd nikahlayın. Əgər o təqdirdə də ədalətə riayət edə bilməyəcəyinizdən qorxdunuzsa, bir dənəsini ya da qanunlar

çərçivəsində himayənizdə olan qadını[364] nikahlayın. Bu, haqsızlıq etməməyiniz üçün ən uyğunudur.
**4** Və yetimlərin qadınlarına mehrlərini[365] könül xoşluğu ilə verin. Artıq özləri alacaqlarından bir qismini sizə xoşluqla verərlərsə / bağışlayarlarsa, onu nuşcanlıqla, çəkinmədən yeyin.
**5** Və Allahın, dolanmağınız üçün sizə verdiyi mallarınızı bu ağlı kəsməyənlərə / hələ rəşid olmamış (yetkinlik yaşına çatmamış) yetimlərə verməyin. Və onları o mallardan ruziləndirin və onları geyindirin. Və onlara ürfə uyğun / hər kəs tərəfindən yaxşı olduğu qəbul edilən söz söyləyin.
**6** Və bu yetimlərinizi nikaha çatana qədər ciddi bir təhsil verərək (onları) kamilləşdirin. Sonra da əgər onların rüşd / yetkinlik çağına çatdığını hiss edərsəniz, mallarını özlərinə dərhal təslim edin. Onlar böyüyəcəklər deyə onların mallarını israf edərək yeməyin. Və kim zəngindirsə, artıq o iffətli [sadə, səbirli] davransın; hər hansısa bir ödəniş almasın. Kim də fəqirdirsə, artıq o da ürfə uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildə yesin. Sonra da yetimlərin mallarını özlərinə təslim etdiyiniz zaman onların üzərinə şahid tutun. Haqq-hesab çəkməyə Allah yetər.
**7** Ana-ata və əqrəbaların ölüb və geridə buraxdıqları şeylərdə kişi (cinsindən) yetimlərə bir pay var. Ana-ata və əqrəbaların ölüb və geriyə buraxdıqlarından az olsa da, çox olsa da, vacib edilmiş bir nəsib olaraq qız yetimlərə də bir pay var.
**8** Mirasın bölüşdürülməsində yaxınlar, yetimlər və yoxsullar hazır olduğu zaman (iştirak etdikdə), onları da ondan ruziləndirin və onlara ürfə uyğun / hər kəs tərəfindən yaxşı olduğu qəbul edilən söz söyləyin.
**9** Və özləri arxalarında zəif soy buraxdıqları təqdirdə narahatçılıq keçirənlər, ürpərsinlər! Və Allahın mühafizəsi altına daxil olsunlar və əsaslı söz söyləsinlər.
**10** Həqiqətən yetimlərin mallarını haqsız yerə yeyən kimsələr, mütləq qarınlarının içində atəş yeyərlər. Və yaxında atəşi alovlu cəhənnəmə yaslanacaqlar. (92/4, Nisa / 1-10)

## Nəcm: 530

**33** Və Biz, ana, ata və əqrəbaların buraxıb (getdikləri) hər şey üçün mirasçılar müəyyən etdik. Andla bağlı olduğunuz kimsələrin; sözlə, sənədlə, qanuni borclu olduğunuz kimsələrin və vəsiyyətlə haqq sahibi olan kimsələrin nəsiblərini də dərhal verin. Şübhəsiz Allah, hər şeyə ən yaxşı şahiddir.
**11** Allah, sizə övladlarınız haqqında Allahdan bir bölgü müəyyənləşdirmiş [və bunu] öhdənizə qoymuşdur: Kişi üçün, iki

qadının payı qədərdir. Əgər hamısı qadın olmaq üzrə ikidən çoxdurlarsa, o zaman geridə buraxılmış şeylərin (mirasın) üçdə-ikisidir. Və əgər bir tək qadın isə, o zaman ona yarısıdır. Əgər ölən, ana və ata ilə birlikdə uşaqları da buraxmışsa, ana-atanın hər birinə altıda-bir; əgər ölənin övladı yoxdursa, mirasçı olaraq ana-atası qalmışsa, o zaman anası üçün üçdə-birdir. Əgər ölənin qardaşları varsa, anası üçün altıda-birdir. Bu paylar, ölənin etdiyi vəsiyyət və borclarından sonradır. Atalarınız və uşaqlarınız; hansının sizə fayda baxımından daha yaxın olduğunu siz bilməzsiniz. Şübhəsiz Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır.
**176** Səndən kəlalə / birinci dərəcədə mirasçısı olmayan şəxslər haqqında fətva istəyirlər. De ki: "Allah, sizə fətva verəcək." Uşağı olmayan, bacısı olan bir şəxs ölərsə, buraxdığı şeyin yarısı bacınındır. Və bacının uşağı yoxdursa, qardaş ona mirasçı olar. Əgər uşaqsız qardaşa mirasçı olan bacılar iki nəfərdirsə, uşaqsız ölən qardaşın buraxdığının (qoyub getdiyinin) üçdə-ikisi onlarındır. Əgər uşaqsız ölən adamın qardaşları və bacıları varsa, o zaman kişi üçün iki qadının payı (qədər pay) var. Allah, azmayasınız deyə açıqca izah edir və Allah, hər şeyi ən yaxşı biləndir.
**12** Əgər xanımlarınızın uşaqları yoxdursa, buraxdıqlarının yarısı sizindir. Əgər bir uşaqları varsa, o zaman etmiş olduğu vəsiyyət və borcdan sonra, mirasın dörddə-biri sizindir. Əgər siz uşaq buraxmadan ölərsəniz, geriyə buraxdığınızın dörddə-biri xanımlarınızındır. Əgər uşaqlarınız varsa, o zaman buraxdığınızın, etdiyiniz vəsiyyət və borcdan sonra, səkkizdə-biri xanımlarınızındır. Əgər ölən bir kişi və ya qadın, birinci dərəcədən mirasçısı; həyat yoldaşı, uşağı və ana-atası olmadan miras buraxır və özünün bir qardaş və ya bacısı varsa, etmiş olduğu vəsiyyət və borcdan sonra, onlardan hər birinə, zərərə məruz qoymadan, altıda-biridir. Əgər mövcud olan qardaşlar bundan daha çoxdursa, bu təqdirdə qardaşlar, üçdə-birə ortaqdırlar. Bunlar, Allah tərəfindən çatdırılmış bir öhdəlikdir. Və Allah, ən yaxşı bilən və çox həlimdir.[366] (92/4, Nisa / 33, 11, 176, 12)

## Nəcm: 531
**29** Ey iman etmiş kəslər! Mallarınızı *–öz razılığınızla həyata keçirdiyiniz ticarət istisna olmaqla–* aranızda haqsız yolla yeməyin, özünüzü öldürməyin. Şübhəsiz Allah, sizə çox mərhəmətlidir.
**30** Və kim, düşmənçilik və şirk qoşmaqla səhv; öz zərərinə olan bir əməli işləyərək bu qadağaları edərsə, yaxında Biz onu atəşə salarıq. Və onu atəşə atmaq, Allah üçün çox asandır.
**31** Əgər siz, qadağan olunmuş şeylərin böyüklərindən çəkinərsəniz,

pisliklərinizi sizdən örtərik. Və sizi şərəfli giriş yerinə daxil edərik.
32 Və Allahın bəzinizə, digərlərinizdən artıq verdiyi şeyləri arzulamayın. Kişilərə qazandıqlarından bir pay var. Qadınlara da qazandıqlarından bir pay var. Və Allahın fəzlindən istəyin. Şübhəsiz Allah, hər şeyi ən yaxşı biləndir.
13 Bax bunlar, Allahın hədləridir. Kim Allaha və Elçisinə itaət edərsə, Allah onu, içində daimi qalacaqları, altlarından çaylar axan cənnətlərə daxil edər. Bax bu da, çox böyük qurtuluşdur.
14 Və kim Allaha və Onun Elçisinə qarşı gələr və Onun hədlərini aşarsa, Allah onu, içində daimi qalmaq üzrə cəhənnəmə daxil edər. Və alçaldıcı əzab onun üçündür. (92/4, Nisa / 29-32, 13-14)

## Nəcm: 532

**15 Qadınlarınızdan həddi aşanlara / cinsi pozğunluq edənlərə qarşı, özünüzdən onların əleyhinə dərhal dörd şahid gətirin; əgər onlar şahidlik edərlərsə, artıq o qadınları, bu zillət, cahillik, düşkünlük, sıxıntılı, bədbəxt hal, onları üst mərtəbəyə çatdırana, şərəfli, yüksək, üstün əxlaq sahibi edincəyə qədər ya da Allah onlara bir yol açıncaya qədər evlərdə tutun (saxlayın).**
**16 Sizdən cinsi pozğunluq edən iki kişi (isə), dərhal hər ikisinə də əziyyət edin. Əgər tövbə edərlər və (özlərini) düzəldərlərsə artıq onlardan kənar durun (onlara əziyyət etməkdən əl çəkin). Şübhəsiz ki, Allah tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verəndir, çox mərhəmət edəndir.** (92/4, Nisa / 15-16)

## Nəcm: 533

17 Allahın üzərinə götürdüyü (qəbul etdiyi) tövbə, ancaq cəhalət səbəbiylə pislik edənlərin, sonra dərhal (həmin vaxt) tövbə edənlərinkidir. Bax bunlar, tövbələri Allah tərəfindən qəbul edilənlərdir. Allah, ən yaxşı biləndir, ən yaxşı hökm qoyandır.
18 Və tövbə, elə hey pisliklər edib, (sonra) onlardan birinə ölüm çatınca: “Mən, indi gerçəkdən tövbə etdim” deyənlər və kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biriləri olaraq ölənlər üçün deyil. Bax bunlar, Bizim, onlar üçün ağrılı-acılı bir əzab hazırladıqlarımızdır. (92/4, Nisa / 17-18)

## Nəcm: 534

19 Ey iman etmiş kəslər! Qadınlara zorla mirasçı olmanız / mallarından istifadə etmək məqsədi ilə onların sizdən ayrılmasını əngəlləməniz sizə halal olmaz. Və onlara verdiyinizin bir qismini götürməyiniz üçün, açıq bir fahişə [çirkin bir həyasızlıq / zina]

işləmədikləri müddətcə onları sıxışdırmayın. Və onlarla ürfə uyğun / hər kəs tərəfindən yaxşı olduğu qəbul edilən yollarla münasibətdə olun. Və əgər onlardan xoşlanmadınızsa, siz bir şeydən xoşlanmasanızda, Allah, sizin xoşlanmadığınız şeydə bir çox xeyir yaratmış ola bilər.
**20** Və əgər bir zövcənin yerinə (başqa) bir zövcə dəyişdirmək istədinizsə, onlardan birinə yığın-yığın (mal) vermiş olsanız belə, artıq ondan bir şey geri almayın. Onu bir iftira və açıq bir günah olaraq alarsanmı?
**21** Və bir-birinizlə qaynaşıb baş-başa qalmışkən və onlar sizdən möhkəm bir söz almışkən, verdiyinizi necə alarsınız?
**22** Və qadınlardan atalarınızın (özlərinə) nikahladıqlarını nikahlamayın. Ancaq keçən keçmişdir. Şübhəsiz bu, çirkin bir həyasızlıqdır və qəzəb duyulan bir iyrənclikdir. O necə də pis bir yoldu!
**23,24** Sizə analarınız, qızlarınız, bacılarınız, xalalarınız, bibiləriniz, qardaşınızın qızları, bacınızın qızları, sizi əmizdirmiş olan analarınız, süd bacılarınız, qadınlarınızın (arvadlarınızın) anaları, (cinsi) yaxınlıq etdiyiniz qadınlarınızın keçmiş ərlərindən doğub evinizdə olan ögey qızlarınız, *–(anasıyla cinsi) yaxınlıq etməmişsinizsə, sizə bir qorxu yoxdur–* öz sülbünüzdən gələn oğullarınızın xanımları və iki bacının arasını birləşdirməniz *–keçmişdə olub-keçənlər istisnadır–* (iki bacını birlikdə almaq), andlarınızın (müqvilələrinizin) sahib olduqları istisna olmaqla, muhsən / nikahlı qadınlar da haram edildi. Allah çox əfv edici, çox mərhəmətlidir. Bunlar, Allahın üzərinizə yazdığıdır.
Bunların xaricində, iffətlərinizi qoruyub fahişəlik (namussuzluq) etməmək üçün öz mallarınızla muhsinləşəcək / evlənəcək qadın axtarmaq sizə halal edildi. Elə isə onlardan nə ilə faydalandınızsa, məcburi bir görəv olaraq mehrlərini ödəyin. Məcburi (olanı) ödəmənizdən sonra, razılaşdığınız şeydə sizə bir məsuliyyət (günah) yoxdur. Şübhəsiz Allah, ən yaxşı bilən və haqsızlıq, fəsad və qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsipləri qoyandır.
**25** Və sizdən hər kim azad mömin qadınları nikah edəcək bir imkana sahib deyilsə, ona da, qanuni çərçivədə himayənizə verilən, mömin gənc qızlarınızdan / xidmətçilərinizdən nikahlamaq (icazəsi) var. Və Allah, sizin imanınızı daha yaxşı bilir. Sizin bəziniz bəzinizdəndir (hamınız bir-birinizdənsiniz). O halda, fahişəlik (namussuzluq) etməyən, gizli aşnası olmayan, sahibi olan qadınlardan yaxınlarının izni ilə / məlumatı ilə qanuni çərçivədə himayənizə verilən qadınları[367] nikahlayın və ürfə uyğun / hər kəs tərəfindən qəbul edilən

bir şəkildə mehrlərini[368] verin. Sahibləri olduğu halda fahişəlik edərlərsə, o zaman onlara azad qadınlara verilən əzabın yarısı verilər. –*Bax bu, sizdən günah işləməkdən ürpərən kimsələrədir.*– Və əgər səbr edərsəniz sizin üçün daha xeyirlidir. Və Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.
**26** Allah, sizin üçün aşkar etmək, sizi, sizdən öncəkilərin (yaxşı) işlərinə yönəltmək və xətalardan dönməyinizi qəbul etmək istəyir. Və Allah, çox yaxşı biləndir, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**27** Və Allah, sizin tövbənizi qəbul etmək istəyir. Şəhvətlərinə uyan kimsələr də, sizin doğru yoldan böyük bir əyriliklə azmağınızı istəyirlər.
**28** Allah, sizdən (yükünüzü) yüngülləşdirmək istəyir. Və şübhəsiz insan çox zəif yaradılmışdır. (92/4, Nisa / 19-28)

**Nəcm: 535**
**34** Allahın, bəzi şeyləri bəzisindən çox (üstün) etməsi, həmçinin kişilərin (öz) mallarından nəfəqə təmin etmələri (ehtiyaclarını qarşılamaları) səbəbiylə kişilər, qadınların üzərində yaxşı qoruyucu (himayə edən) və yaxşı nəzarətçidirlər. Vəziyyət belə olunca, saleh qadınlar Allaha itaət edənlərdir; Allahın qoyduğu qanunlara tabe olanlardır, Allahın qoruduğu şey səbəbiylə, başlarına hələ gəlməyən, lakin gələ biləcək fəlakətlərə qarşı qoruyanlardır. Dikbaşlıq edərək özünü sataşma və təcavüz riskinə atmasından qorxduğunuz qadınlara da öyüd verin və yan gəlib yatdıqları yerlərdə; öz ölkənizin sərhədləri daxilində (onları) hicrət etdirin (köçürdün) və onlara təzyiq edin. Bundan sonra sizə ehtiram göstərərlərsə, artıq onların əleyhində başqa bir yol axtarmayın. Allah çox ucadır, çox böyükdür.
**35** Və əgər ər-arvadın arasının dəyməsindən qorxursunuzsa, o zaman bir münsif kişinin yaxınlarından, bir münsif də qadının yaxınlarından onların yanına göndərin. Bu ər-arvad gerçəkdən barışmaq istəyərlərsə, Allah ər-arvadın arasını düzəldər. Şübhəsiz ki, Allah çox yaxşı biləndir, hər şeyin iç üzünü, gizli tərəflərini də yaxşı biləndir.
**128-130** Və əgər bir qadın, ərinin vəziyyətindən; qaba hərəkət etməsindən və yaxud özündən uzaqlaşmasından qorxarsa, artıq (öz) aralarında barışıq etmələrində, onlara bir günah yoxdur. Və barışıq xeyirlidir. Və nəfslər qısqanclığa hazır vəziyyətdədir. Əgər yaxşılaşdırsanız-gözəlləşdirsəniz və Allahın mühafizəsi altına daxil olsanız, artıq şübhəsiz Allah, etdiklərinizdən xəbərdardır. Və qadınlarınız arasında ədalətli davranmağa nə qədər çalışsanız da

(buna) əsla gücünüz çatmaz. Elə isə birinə tamamilə meyl edib, və digərini asılı vəziyyətdə qoymayın. Və əgər düzəldərsəniz (yaxşılaşdırarsanız) və Allahın mühafizəsi altına daxil olarsanız, artıq şübhəsiz Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir. Əgər onlardan ər-arvad ayrılarlarsa, Allah, hamısını geniş ərməğanlarından zənginləşdirər. Və Allah, elmi və rəhməti geniş və sərhədsiz olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / (etdiyini) sağlam edəndir.[369] (92/4, Nisa / 34-35, 128-130)

## Nəcm: 536

**36-38** Və Allaha qulluq edin və Ona heç bir şeyi ortaq qoşmayın. Və anaya-ataya, əqrəbaya, yetimlərə, yoxsullara, əqrəba (yaxın) olan qonşulara, uzaq qonşulara, yanında olan yoldaşa, yolda qalanlara, qanunlar çərçivəsində himayənizə verilmiş kimsələrə[370] yaxşılıq edin. Şübhəsiz Allah, təkəbbürlənən və öyünən; xəsislik edən, insanlara xəsisliyi əmr edən və Allahın onlara ərməğanlarından verdiklərini gizləyən kimsələri və Allaha və axirət gününə iman etmədikləri halda, insanlara özlərini göstərmək üçün mallarını xərcləyən kimsələri sevməz. Və Biz, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] alçaldıcı bir əzab hazırladıq. Və şeytan kimin üçün yaşıd / yaxın yoldaş olarsa, o necə də pis bir yoldaşdır!
**39** Bir də bunlar, Allaha və axirət gününə iman etsəydilər və Allahın onları ruziləndirdiyi şeylərdən Allah yolunda xərcləsəydilər, ziyanamı düşəcəkdilər? Və Allah, onları çox yaxşı biləndir.
**40** Şübhəsiz, Allah zərrə qədər haqsızlıq etməz. Və əgər (işlənən bir əməl) yaxşılıq isə onu qat-qat artırar. Və Öz qatından böyük bir əcir verər.
**41** Hər ümmətdən bir şahid gətirdiyimiz və səni də bax onların üzərinə bir şahid olaraq gətirdiyimiz zaman gör necə (olacaq)?
**42** İnkar edən və Elçiyə üsyan edən kimsələr, o gün torpağa qarışıb getməyi istəyərlər. Allahdan da, heç bir sözü gizləyə bilməzlər.
(92/4, Nisa / 36-42)

## Nəcm: 537

**43** Ey iman etmiş kəslər! Sərxoş ikən, nə söylədiyinizi bilənə qədər, cünub[371] ikən də *–yolda olanlar bu hökmə daxil deyil–* yuyundurulana qədər, səlata [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarına] yaxınlaşmayın / camaat içinə çıxmayın. Əgər xəstəsinizsə və ya səfərdəsinizsə və yaxud biriniz ayaqyolundan gəldisə və ya qadınlarla təmasda oldusa, su da tapa

bilməmişsinizsə o zaman, dərhal tərtəmiz bir torpağa yönəlin. Sonra da üzlərinizi və əllərinizi əl ilə silin. Şübhəsiz Allah, çox əfv edəndir, çox bağışlayandır. (92/4, Nisa / 43)

## Nəcm: 538

**44** Özlərinə Kitabdan bir nəsib verilən kimsələri görmürsənmi? Onlar azğınlığı satın alırlar və sizin haqq yoldan azmağınızı istəyirlər.
**45** Və Allah sizin düşmənlərinizi daha yaxşı bilir. Və yol göstərən, qoruyucu (himayə edən) yaxın olaraq, Allah yetər. Yardımçı olaraq da Allah yetər.
**46** Yəhudiləşənlərdən bir qismi kəlmələrin yerlərini / əsl mənalarını dəyişdirirlər, dillərini əyib-bükərək və dinə hücum edərək Peyğəmbərə qarşı, "Eşitdik və qarşı gəldik / yaxşıca sarıldıq", "Eşit, eşitməz olasan", "raina" [bir-birimizi güdək, bizim çobanımız] deyirlər. Əgər onlar: "Eşitdik, itaət etdik; eşit və bizə nəzər sal!" desəydilər, şübhəsiz özləri üçün daha xeyirli və daha sağlam / doğru olacaqdı; fəqət bilə-bilə gerçəyi qəbul etməmələri səbəbiylə Allah onları uzaqlaşdırıb gözdən salmışdır. Artıq çox az inanırlar. (92/4, Nisa / 44-46)

## Nəcm: 539

**47** Ey Kitab verilmiş kimsələr! Biz, bəzi üzləri silib, ənsələrinə çevirmədən, yaxud Səbt xalqını[372] uzaqlaşdırıb gözdən saldığımız kimi onları uzaqlaşdırmadan öncə, yanınızda olanı təsdiqləmək üzrə nazil etdiyimiz bu kitaba iman edin. Və Allahın əmri yerinə yetəcək.
**48** Şübhəsiz Allah, Özünə ortaq qəbul edilməsini əsla bağışlamaz. Bunun altındakı günahları istədiyi kimsələr üçün bağışlayar. Kim Allah üçün ortaq tanıyarsa, şübhəsiz çox böyük bir günah işləmiş olar. (92/4, Nisa / 47-48)

## Nəcm: 540

**49** Özlərini təmizə çıxaranları görmürsənmi? Əksinə, Allah, istədiyi kimsəni təmizə çıxarar. Onlara qıl qədər haqsızlıq edilməz.
**50** Gör Allahın əleyhinə necə yalan uydururlar. Açıq-aşkar bir günah olaraq bu yetər.
**51** Özlərinə Kitabdan bir nəsib verilən bu kimsələri görmürsənmi?! Onlar, bütə və tağuta[373] iman edirlər. Və Allaha iman etməyən kimsələr üçün, "Bunlar, möminlərdən daha doğru bir yoldadır" deyirlər.
**52** Bax onlar, Allahın uzaqlaşdırdığı kimsələrdir. Allah kimi uzaqlaşdırıb gözdən salarsa, artıq ona yardım edən birini əsla tapa bilməzsən.

**53** Yoxsa onlar üçün dünya hökmranlığından bir paymı var? Əgər elə olsaydı, insanlara bir xurma çəyirdəyinin oyuğunu belə verməzdilər.
**54** Yoxsa onlar insanları, Allahın onlara ərməğan olaraq verdiyi şey üçünmü qısqanırlar? Baxın, şübhəsiz Biz, İbrahim soyuna da Kitab və haqsızlığın, fəsadın və qarışıqlığın qarşısını almaq üçün qoyulmuş qayda-qanun və prinsipləri vermişdik. Həm də onlara böyük bir hökmranlıq vermişdik.
**55** Bax yəhudilərdən bir qismi ona iman etdi. Bir qisimi də ondan üz çevirdi. Və çılğın alovlu atəş olaraq cəhənnəm yetər. (92/4, Nisa / 49-55)

## Nəcm: 541

**56** Şübhəsiz ki, ayələrimizə iman etməmiş bu kəsləri Biz, yaxında atəşə atacağıq. Dəriləri bişdikcə, əzabı dadsınlar deyə, dərilərini başqa dərilər ilə dəyişdirəcəyik. Şübhəsiz Allah, çox güclüdür, ən yaxşı qanun qoyandır.
**57** Və iman edən və sahmana salmaq məqsədi ilə işlər görənləri içində sonsuz olaraq qalmaq üzrə, altlarından çaylar axan cənnətlərə qoyacağıq. Onlara orada tərtəmiz [kin güdməyən, qısqanclıq duymayan] zövcələr vardır. Və onları, sıx bir kölgəliyə daxil edəcəyik.
(92/4, Nisa / 56-57)

## Nəcm: 542

**58** Şübhəsiz Allah, sizə, əmanətləri öz sahiblərinə verməyinizi və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etməyinizi əmr edir. Şübhəsiz Allah, bununla sizə necə də gözəl öyüd verir. Şübhəsiz Allah, ən yaxşı eşidən, ən yaxşı görəndir.
**59** Ey iman etmiş kimsələr! Allaha itaət edin, Elçiyə və sizdən olan əmr sahiblərinə / əsas yönəticiyə itaət edin. Sonra, əgər hər hansı bir şeydə anlaşılmazlığa (ixtilafa) düşərsəniz; Allaha və axirət gününə iman edən kimsələrsinizsə, onu Allah və Elçiyə həvalə edin. Bu, daha yaxşıdır və ən uyğun həll yolunu tapmaq baxımından da daha gözəldir.
(92/4, Nisa / 58-59)

## Nəcm: 543

**60** Qəti olaraq, iman etməməklə əmr olunduqları tağutu[374] aralarında münsif etmək istəyərək özlərinin, sənə nazil edilənə və səndən öncə nazil edilənə iman etdiklərini irəli sürən bu kəsləri görmədinmi? / heç düşünmədinmi? Şeytan da onları uzaq / geri dönülməz bir azğınlıqla azdırmaq istəyir.
**61** Və onlara: “Allahın nazil etdiyinə və Elçiyə tərəf gəlin!” deyilincə, o münafiqlərin səndən uzaqlaşdıqca uzaqlaşdıqlarını görərsən.
**62** (Öz) əlləri ilə etdikləri üzündən özlərinə bir müsibət üz verdiyi

zaman gör necə oldu!
**63** Sonra, "Biz, sadəcə yaxşılıq etmək və barışdırmaq istədik" deyə Allaha and içərək sənə gəldilər. Bax onlar, Allahın, qəlblərindəkini bildiyi kimsələrdir; artıq sən, onlardan kənarlaş və onlara öyüd ver. Və onlara, özləri haqqında, dərindən təsir edəcək gözəl söz söylə!
(92/4, Nisa / 60-63)

## Nəcm: 544

**64** Və Biz, hər elçini sadəcə, Allahın izni ilə / biliyi ilə itaət olunsun deyə göndərdik. Və əgər onlar şirk qoşmaq surətiylə özlərinə haqsızlıq etdikləri zaman sənə gəlsəydilər, Allahdan bağışlanmalarını istəsəydilər, sən də onlar üçün bağışlanma istəsəydin, həqiqətən Allahın tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verən, çox mərhəmət edən olaraq görərdilər.
**65** Artıq, xeyr! Rəbbinə and olsun ki, onlar öz aralarında çıxan ixtilaflı işlərdə səni münsif edib sonra da sənin verdiyin hökmə qarşı içlərində heç bir sıxıntı duymadıqca və tam bir güvənliklə güvənlik təmin etmədikcə iman etmiş ola bilməzlər.
**66** Əgər Biz, onlara: "Özünüzü öldürün və ya yurdlarınızdan çıxın!"
deyə yazsaydıq, içlərindən çox azı xaric, bunu etməzdilər. Və əgər
onlar, öyüdləndikləri şeyləri etsəydilər, əlbəttə, özləri üçün daha
xeyirli və səbat etmədə daha qüvvətli olardı. **67,68** Və o zaman
həqiqətən onlara Öz nəzdimizdən çox böyük bir mükafat verərdik. Və
onları həqiqətən doğru yola yönəldərdik.
**69** Kim də Allaha və Elçiyə itaət edərsə, artıq onlar, Allahın,
peyğəmbərlərdən, ən doğru kimsələrdən, şəhidlərdən və salehlərdən
özlərinə nemət verdiyi kəslərlə bərabərdir. Və bunlar yoldaş olaraq
necə də gözəldir! **70** Bu, Allahdan bir ərməğandır. Ən yaxşı bilən
olaraq Allah yetər. (92/4, Nisa / 64-70)

## Nəcm: 545

**71** Ey iman etmiş kəslər! Tədbirinizi alın, sonra da onlara qarşı ya kiçik dəstələr halında səfərə çıxın və ya hamınız birlikdə səfərə çıxın.
**72** Şübhəsiz sizdən bir qisimi də həqiqətən ağır davranır. Sonra sizə bir müsibət üz verincə: "Həqiqətən Allah mənə lütf etdi ki, onlarla bərabər şahid olmadım" deyər.
**73** Və əgər sizə Allahdan bir ərməğan yetişərsə, həqiqətən, sanki sizinlə özü arasında heç sevgi yox imiş kimi, şübhəsiz: "Ah, nə olardı, onlarla bərabər olaydım və çox böyük bir müvəffəqiyyət əldə edəydim!" deyəcəkdir.
**74** O halda bəsit dünya həyatını, axirəti qarşılığında satacaq kimsələr,

Allah yolunda savaşsınlar. Hər kim, Allah yolunda savaşar, öldürülər və ya qalib gələrsə, artıq Biz, ona çox böyük bir mükafat verəcəyik.
**75** Sizə nə olub ki, Allah yolunda və: "Ey Rəbbimiz! Bizləri, xalqı öz mənliklərinə haqsızlıq edən kimsələr olan, bu məmləkətdən çıxart, nəzdindən bizə bir qoruyucu (himayə edən), yol göstərən yaxın, yaxşı bir yardımçı göndər" deyən zəif kişilər, qadınlar və uşaqlar uğrunda savaşmırsınız?
**76** İman etmiş kimsələr, Allah yolunda savaşırlar. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslər] də tağut yolunda savaşırlar. O halda siz şeytanın yaxınları, yardımçıları ilə savaşın. Şübhəsiz ki, şeytanın hiyləsi çox zəifdir. (92/4, Nisa / 71-76)

## Nəcm: 546

**77,78** Özlərinə, "Əlinizi çəkin, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradın, ayaqda tutun], zəkatı / vergini verin" deyilənləri görmədinmi / heç düşünmədinmi? Sonra savaş üzərlərinə yazıldığında, onlardan bir qrup, Allaha hörmətlə, məhəbbətlə və biliklə duyduqları ürpərti kimi, yaxud daha şiddətli olaraq insanlara hörmətlə, məhəbbətlə və biliklə ürpərti duyar. Və: "Rəbbimiz, niyə savaşı üzərimizə yazdın, bizi yaxın bir zamana (qədər) təxirə salmalı deyildinmi?" dedilər. De ki: "Dünyanın mənfəəti çox azdır. Axirət isə Allahın mühafizəsi altına daxil olan kəslər üçün daha xeyirlidir və siz 'bir xurma çəyirdəyindəki nazik bir ip qədər' belə haqsızlığa uğradılmayacaqsınız. Harada olursunuz olun, ölüm sizə yetişər, əhənglə / betonla son dərəcə sağlam tikilmiş qalalar içində olsanız belə." Və onlara bir yaxşılıq üz verərsə, "Bu, Allahdandır!" deyərlər, bir pisliyə uğrayarlarsa, "Bu, səndəndir!" deyərlər. De ki: "Hamısı Allahdandır." Bunlara rəğmən bu camaata nə olub ki, az qala tamamilə söz anlamayacaqlar? (92/4, Nisa / 77-78)

## Nəcm: 547

**79** Sənə yaxşılıqdan-gözəllikdən isabət edən şeylər, məhz Allahdandır. Sənə pislikdən isabət edən şeylər də sənin özündəndir. Və Biz səni insanlara bir elçi olaraq göndərdik. Yaxşı bir şahid olaraq da Allah yetər.
**80** Kim Elçiyə itaət edərsə, artıq o, Allaha itaət etmiş olar. Kim də üz çevirərsə, artıq Biz, səni o üz çevirənlərə qoruyucu (himayə edən) / gözətçi olaraq göndərmədik.
**81** Və onlar sənə, "Baş üstə!" deyərlər. Fəqət sənin yanından çıxdıqlarında, içərilərindən bəzisi, gecə vaxtı, sənin dediyindən başqasını qurarlar. Amma Allah, onların gecələr qurduqlarını yazır.

Artıq sən, onlardan kənarlaş. Və işin nəticəsini Allaha həvalə et. “Bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən” olaraq da Allah yetər. (92/4, Nisa / 79-81)

## Nəcm: 548

**82 Onlar hələ də Quranı arxa-arxaya düzərək lazım olduğu kimi düşünməzlərmi? Əgər o, Allahdan başqası tərəfindən olsaydı, mütləq, onun içində bir çox qarışıqlıqlar tapardılar.**
83 Və onlara güvəndən (əmin-amanlıqdan) və ya qorxudan bir əmr gəldiyində, onu dərhal yayırlar. Halbuki onu Elçiyə və özlərindən olan görəvli (səlahiyyətli) kimsələrə götürsəydilər, onlardan nəticə çıxarmağa gücü çatan kimsələr, onu bilərdilər. Və əgər Allahın üzərinizdəki ərməğanları və rəhməti olmasaydı *–çox azınız istisna olmaqla–* həqiqətən şeytana uyardınız. (92/4, Nisa / 82-83)

## Nəcm: 549

84 Artıq Allah yolunda savaş! Sən ancaq özünə cavabdehsən. Möminləri də təşviq et. Ola bilsin ki, Allah kafirlərin [Özünün ilah və rəbb olduğunu bilərək rədd edənlərin] təzyiqini qırar. Və Allah, təzyiq etmək cəhətdən daha güclüdür, (qərardan) döndərmək baxımından da daha güclüdür. (92/4, Nisa / 84)

## Nəcm: 550

85 Kim xeyir və yaxşılıqlara vasitəçi olmaqla yardım edərsə, bundan ona bir pay var. Kim də pisliyə dəlil olmaq və yardım etməklə və ya pislik cığırını açmaqla yardım edərsə, ondan da ona bir günah payı var. Allah hər şeyə qadirdir.
86 Siz bir salam ilə salamlaşdığınız zaman da, dərhal ondan daha gözəli ilə salam verin və ya verilən salamı eynilə qaytarın. Şübhəsiz Allah, hər şeyin haqq-hesabını ən yaxşı edəndir. (92/4, Nisa / 85-86)

## Nəcm: 551

87 Allah, Özündən başqa ilah deyə bir şey olmayandır. O, mütləq sizi, gerçəkləşməsində şübhə olmayan qiyamət günündə toplayacaqdır. Və Allahdan daha doğru sözlü kimdir?
88 Yaxşı, Allah onları qazandıqları günah üzündən tərsinə döndərdiyi halda, siz, necə olur ki, münafiqlər haqqında iki qrupa ayrılırsınız? Allahın azdırdığı kimsələrə (doğru) yol göstərməkmi istəyirsiniz? Və Allah, kimi azdırarsa, artıq sən onun üçün əsla bir yol tapa bilməzsən.
89,90 Münafiqlər, özləri Allahın ilah və rəbb olduğuna iman etmədikləri kimi, sizin də iman etməməyinizi, beləliklə, onlarla eyni

olmağınızı arzu etdilər. Ona görə, onlar Allah yolunda yurdlarından hicrət edənə qədər onlardan (özünüzə) yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar qəbul etməyin. Əgər bundan üz çevirərlərsə, sizinlə aralarında anlaşma olan bir camaata sığınan kimslər, yaxud sizinlə və ya öz camaatlarıyla savaşmaqdan sinələri sıxılaraq sizin yanınıza gələnlər istisna olmaqla, onları ələ keçirdin və tapdığınız yerdə öldürün; onlardan (özünüzə) bir yaxın və bir yardımçı qəbul etməyin. Sonra, əgər Allah istəsəydi, onları sizə müsəllət edərdi (üstünüzə qaldırardı), onlar sizinlə savaşardılar. Artıq əgər onlar sizdən kənarlaşıb, sizinlə savaşmaz və sizə sülh təklif edərlərsə, Allah sizin üçün onların əleyhinə (çıxmağa) bir yol qoymamışdır.
**91** Sizdən güvəndə olmaq və öz camaatlarından güvəndə olmaq istəyən digərlərinə rast gələcəksiniz. Bunları, nə zaman dinsizliyə, ortaq qoşmağa geri döndərərlərsə, onun içinə başıaşağı qərq olarlar / dərhal atılarlar. Elə isə bunlar, əgər sizdən uzaq durmazlarsa və sizə sülh təklif etməzlərsə və güclərini çəkməzlərsə dərhal onları tapdığınız yerdə ələ keçirdin və öldürün. Və məhz bunlar, onların əleyhində sizə verdiyimiz açıq-aşkar ixtiyardır. (92/4, Nisa / 87-91)

## Nəcm: 552

**92** Və səhvən olması istisna, bir mömininin, digər bir mömini öldürməsi mümkün olan şey deyil. Və kim bir mömini, qəsdsiz / qəza ilə öldürərsə, bir mömin köləni azad etməli və ölənin ailəsinə / varislərinə təslim ediləcək bir qanbahası verməlidir. *–Ancaq ölənin ailəsinin bağışlaması istisnadır.–* Əgər öldürülən, mömin olmaqla bərabər sizə düşmən (olan) bir camaatdandısa, o zaman öldürənin, mömin bir köləni azad etməsi lazımdır. Əgər öldürülən, sizinlə aralarında əhdləşmə olan bir camaatdandısa, öldürənin, ölənin ailəsinə qanbahası verməsi və mömin bir köləni azad etməsi lazımdır. Bunlara gücü çatmayanın da **Allah tərəfindən nəzərdə tutulmuş tövbə olaraq** arxa -arxaya iki ay oruc tutması lazımdır. Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır.
**93** Və kim bir mömini qəsdən [bilə-bilə, istəyərək] öldürərsə, bax onun cəzası, içind daimi qalmaq üzrə cəhənnəmdir. Və Allah, ona qəzəb etmiş, onu uzaqlaşdırmış, rəhmətindən məhrum buraxmış və onun üçün çox böyük bir əzab hazırlamışdır. (92/4, Nisa / 92-93)

## Nəcm: 553

**94** Ey iman etmiş kimsələr! Allah yolunda səfərə çıxdığınız zaman, dərhal yaxşı-yaxşı araşdırın. Və sizə salam verən kimsəyə, dünya həyatının mənfəətini güdərək, “Sən mömin deyilsən” deməyin. Artıq

Allah yanında çox qənimətlər vardır. Öncə siz də elə idiniz, Allah sizə lütf etdi. Onun üçün yaxşı-yaxşı araşdırın. Şübhəsiz Allah, etdiklərinizdən xəbərdardır.
**95,96** Möminlərdən üzrsüz səbəbə oturanlarla Allah yolunda (öz) mallarıyla, canlarıyla səy göstərənlər eyni olmazlar. Allah, mallarıyla, canlarıyla səy göstərənləri, dərəcə etibarilə oturanlardan üstün etdi. Və Allah, onların hamısına "ən gözəl"i vəd etmişdir. Və Allah, cəhd göstərənlərə, oturanlardan böyük bir əcr; Öz qatından dərəcələr, bir bağışlama və mərhəmət artırmışdır. Və Allah, çox bağışlayan, çox mərhəmət edəndir. (92/4, Nisa / 94-96)

## Nəcm: 554

**97,98** Özlərinə haqsızlıq edərkən, keçmişdə etdiklərini və etməli olduqları halda etmədiklərini, həqiqətən görəvli qüvvələrin bir-bir xatırlatdırdıqları bu kimsələrin vəziyyətinə gəlincə; görəvli qüvvələr: "Nə işdə idiniz?" deyərlər. Onlar: "Biz yer üzündə gücsüzləşdirilmiş kimsələr idik" deyərlər. Görəvli qüvvələr: "Allahın yer üzü geniş deyildimi, siz, orada hicrət edəydiniz də?" deyərlər. Artıq, *–Kişilərdən, qadınlardan və uşaqlardan köçməyə gücü çatmayan, yönləndirildikləri doğru yolu tapa bilməyən kimsələr istisna olmaqla– bax* bunların gedəcəkləri yer cəhənnəmdir. Və o, necə də pis gediş yeridir!
**99** Bax onlar (ki var), Allahın bu kimsələri əfv etməsi ümid edilir. Allah, çox əfv edən, çox bağışlayandır.
**100** Kim ki, Allah yolunda yurdundan köçərsə, yer üzündə sığınacaq çox yer və genişlik tapar. Kim Allaha və Elçisinə qatılmaq üzrə evindən çıxar, sonra ona ölüm gələrsə, o adamın əcri / mükafatı şübhəsiz Allaha düşmüşdür. Allah çox bağışlayandır, çox mərhəmət edəndir. (92/4, Nisa / 97-100)

## Nəcm: 555

**101** Və yer üzündə səfərə çıxdığınız zaman kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] sizə bir pislik edəcəyindən qorxarsanızsa səlatdan [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə işinizdən] qısaltmağınızda [təhsili-təlimi qısa etməyinizdə] sizin üçün bir qorxu yoxdur. Şübhəsiz kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək edən kimsələr], sizin üçün açıq-aşkar düşməndirlər.
**102** Və sən səfərdə olanların içində olub, onlar üçün təhsil-təlim verdiyin zaman içlərindən bir qismi səninlə bərabər dursunlar / təhsilə qatılsınlar. Silahlarını da yanlarında saxlasınlar. Bunlar, yetərli bilik (məlumat) alıb qane olduqlarında, arxa tərəfinizə keçsinlər. Sonra

təhsil-təlim almamış digər bir qismi gəlsin, səninlə bərabər təhsil-təlim öyrənsinlər, tədbirlərini və silahlarını (öz yanlarına) alsınlar. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] istəyərlər ki, silahlarınızdan və əşyanızdan xəbərsiz vəziyyətdə olasınız, sizə ani bir basqın etsinlər. Əgər sizə yağmurdan bir əziyyət yetişərsə və ya xəstə olarsanız, silahlarınızı buraxmağınızda sizin üçün bir qorxu yoxdur. Tədbirinizi də alın. Şübhəsiz Allah, kafirlər [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün alçaldıcı bir əzab hazırlamışdır.

**103** Təhsil-təlimi tamamladıqdan sonra, artıq Allahı ayaq üstə, oturaraq, uzanarkən xatırlayın. Sükunət tapdığınızda / güvənə (arxayınçılığa) çıxdığınızda, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradın, ayaqda tutun]. Heç şübhəsiz səlat [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə vəzifəsi], keçmişdən bəri möminlər üzərinə vaxtı müəyyən edilmiş bir yazıdır (qərardır).

**104** Və düşmən camaatı təqib etməkdə süstlük göstərməyin. Əgər siz ağrı-acı çəkirdinizsə, artıq şübhəsiz ki, onlar da sizin ağrı-acı çəkdiyiniz kimi ağrı-acı çəkirlər. Və siz, Allahdan onların ümid etməyəcəkləri şeyləri ümid edirsiniz. Və Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır. (92/4, Nisa / 101-104)

## Nəcm: 556

**105** Şübhəsiz Biz, Allahın sənə göstərdiyi kimi insanlar arasında hökm edəsən deyə, Kitabı haqq olaraq nazil etdik. Sən də xainlər üçün
müdafiəçi olma! **106** Və Allahdan bağışlanma dilə. Həqiqətən, Allah
çox bağışlayandır, çox mərhəmət edəndir. **107** Özlərinə xainlik
edənləri də müdafiə etmə. Şübhəsiz ki, Allah, həddindən artıq dərəcədə xainlik edən günahkarları sevməz. (92/4, Nisa / 105-107)

## Nəcm: 557

**108** Onlar, insanlardan gizlətmək istəyərlər, (ancaq) Allahdan gizlətmək istəməzlər. Halbuki onlar gecə (vaxtı), Allahın razı olmadığı şeyləri söz olaraq / qərar olaraq planlayarkən Allah onlarla bərabərdir. Və Allah, onların etdiklərini əhatə edəndir.

**109** Haydı, siz bəsit dünya həyatında onları müdafiə etdiniz. Yaxşı, qiyamət günündə Allaha qarşı onları kim müdafiə edəcək? Yaxud kim onlara "işlərini bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən" olacaq?

**110** Kim bir pislik işləyər yaxud öz-özünə haqsızlıq edər, sonra da Allahdan bağışlanma diləyərsə, Allahın çox bağışlayan və çox

mərhəmətli (olduğunu) görər.
111 Kim də, bir günah qazanarsa, öz əleyhinə qazanmış olar. Və Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır.
112 Kim də bir xəta və ya bir günah qazanar, sonra da onu bir günahsızın üzərinə atarsa, o zaman həqiqətən bir iftira və açıq-aşkar bir günah yüklənmiş olar. (92/4, Nisa / 108-112)

## Nəcm: 558

113 Əgər sənin üzərində Allahın ərməğanları və mərhəməti olmasaydı, həqiqətən onlardan bir qisim ağılsız və beyinsiz səni azdırmağa çalışmışdı. Halbuki onlar, özlərindən başqasını azdırmazlar və sənə heç bir zərər verə bilməzlər. Allah sənə Kitabı və haqsızlığın, fəsadın, qarışıqlığın qarşısını almaq üçün qoyulmuş qayda-qanun və prinsipləri nazil etmiş və sənə bilmədiyin şeyləri öyrətmişdir. Allahın sənin üzərindəki ərməğanı çox böyükdür. (92/4, Nisa / 113)

## Nəcm: 559

114 Bir sədəqəni yaxud ürfə uyğun / hər kəs tərəfindən qəbul edilən şeyləri və yaxud da insanlar arasını düzəltməyi əmr edən şəxsin (fısıldaşmağı, söhbəti) istisna olmaqla, onların fısıldaşmaqlarının çoxunda bir xeyir yoxdur. Kim bunları Allahın rizasını qazanmaq üçün edərsə, Biz, yaxında ona çox böyük bir mükafat verəcəyik.
115 Və kim, doğru yol ona açıq-aşkar ortaya çıxdıqdan sonra Elçiyə qarşı çıxar və möminlərin yolundan başqasını izləyərsə, Biz, onu döndüyü şeyə (doğru) döndərərik və onu cəhənnəmə salarıq. O da nə pis bir gediş yeridir!
116 Heç şübhəsiz, Allah, Özünə ortaq qəbul edənləri bağışlamaz. Bunun aşağısında qalanları isə, onlardan istədiyini bağışlayar. Kim, Allaha ortaq qəbul edərsə əlbəttə o uzaq bir azğınlıqla azmışdır.
117 Onlar, Allahın altındakılardan, yalnızca dişilərə yalvarırlar. Və onlar ancaq inadkar şeytana yalvarırlar.
118,119 Allah İblisi uzaqlaşdırdı. Və İblis, "Əlbəttə Sənin qullarından müəyyən bir pay alacağam, onları mütləq azdıracağam, onları boş xülyalara salacağam və onlara əmr edəcəyəm ki, ətindən-südündən faydalanılan heyvanların qulaqlarını yaracaqlar, həm də onlara əmr edəcəyəm, Allahın yaratdığını / ölçüləndirdiyini pozacaqlar[375]" dedi. Və hər kim Allahın altından şeytanı yol göstərən, qoruyucu (himayə edən) yaxın qəbul edərsə, o zaman şübhəsiz o, açıq-aşkar bir ziyan ilə ziyana uğrayar.
120 İblis, onlara vəd edir və onları xülyalara salır. Halbuki şeytan onlara yalandan başqa bir şey vəd etməz.

**121** Bax bunlar, gedəcəkləri yer cəhənnəm olanlardır. Onlar oradan qaçmağa bir yer də tapa bilməzlər.
**122** Və iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə (gəlincə) də; Biz onları, Allahın gerçək bir vədi olmaq üzrə, içində sonsuz qalıcılar olaraq, altlarından çaylar axan cənnətlərə salacağıq. Və söz baxımından Allahdan daha doğru kim ola bilər?
**123** Bu iş, sizin xülyalarınızla və Kitab əhlinin xülyalarıyla deyil. Kim pislik edərsə, onunla cəzalandırılar. Və o, özü üçün Allahın altındakılardan bir yol göstərən, qoruyucu (himayə edən) yaxın və yaxşı bir yardımçı tapa bilməz.
**124** Və kişi olsun, və ya qadın olsun, kim mömin olaraq yaxşılaşdırmaq qayəsi ilə işlər görərsə, artıq bax onlar, cənnətə daxil olarlar. Və xurma çəyirdəyinin arxasındakı çökəklik qədər haqsızlığa uğradılmazlar.
**125** Və din baxımından, yaxşılaşdıran-gözəlləşdirən biri olaraq, özünü Allah üçün İslamlaşdıran və hənif [köhnə inanclarından dönən biri olaraq], İbrahimin dininə tabe olan kimsədən daha yaxşı-gözəl kim ola bilər? Və Allah, İbrahimi, [arxadan gələn nəsillərə] "cığır açan-iz qoyan; imam-öndər" təyin etdi.
**126** Və göylərdə olan şeylər və yer üzündə olan şeylər, yalnızca Allahındır. Və Allah, hər şeyi yaxşıca əhatə edəndir. (92/4, Nisa / 114-126)

## Nəcm: 560

**127** Səndən o qadınlar [yetimlərə baxmaqla məsul qadınlar] haqqında fətva istəyirlər. De ki: "Onlar haqqında fətvanı Allah və 'onlara vacib edilmiş olanı vermədiyiniz və onları nikahlamağa rəğbət etmədiyiniz qadınların yetimləri haqqında və əzilmək istənən uşaqlar haqqında və yetimlər üçün həqqaniyyəti ayaqda tutmağınız (qorumağınız) haqqında, Kitabda / Quranda sizə oxunanlar' verir. Və xeyirdən nə işləyərsəniz, bilin ki, şübhəsiz Allah, onu ən yaxşı biləndir.
(92/4, Nisa / 127)

## Nəcm: 561

**131** Göylərdə olan şeylər və yer üzündə olan şeylər yalnızca Allahındır. And olsun Biz, sizdən öncə özlərinə Kitab verilən kimsələrə və sizə, Allahın mühafizəsi altına daxil olmağınızı öhdəlik olaraq çatdırdıq. Əgər küfr edərsəniz [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsəniz / iman etməzsəniz], bilin ki, göylərdə olan şeylər və yer üzündə olan şeylər yalnızca Allahındır. Allah, heç bir şeyə möhtac olmayandır, hər cür tərifə artıqlaması ilə layiq olandır.
**132** Göylərdə olan şeylər və yer üzündə olan şeylər yalnızca

Allahındır. “Bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən” olaraq da Allah yetər.
**133** Ey insanlar! Əgər Allah, istəyərsə, sizi aparar və başqalarını gətirər. Və Allah, buna ən yaxşı qadir olandır.
**134** Kim, dünya savabını istəyirdisə, bilsin ki, dünya və axirət savabı yalnızca Allah qatındadır. Və Allah, çox yaxşı eşidən və çox yaxşı görəndir. (92/4, Nisa / 131-134)

## Nəcm: 562

**135** Ey iman etmiş kimsələr! Özünüz, ana-atanız və yaxın əqrəbanız əleyhinə də olsa, Allah üçün şahidlik edən kimsələr olaraq həqqaniyyəti tamamilə ayaqda tutanlar (qoruyanlar) / nəzərə alanlar olun. İstər zəngin olsun, istər fəqir olsun, bilin ki Allah, ikisinə də daha yaxındır. Artıq ədaləti yerinə yetirmək üçün boş, müvəqqəti arzunuza uymayın. Əgər (dilinizi) əyib-bükərsəniz və ya kənar durarsanız, bilin ki, şübhəsiz Allah, etdiklərinizdən xəbərdardır.
**136** Ey iman etmiş kəslər! Allaha, Elçisinə, Elçisinə nazil etdiyi Kitaba və daha öncə nazil etdiyi kitaba aid gizli, qapalı; narahatlıq və qorxu verəcək bir şey buraxmayın (saxlamayın). Və kim Allahı, mələklərini, kitablarını, elçilərini və son günü örtərsə; tam açıqlamazsa, həqiqətən o, çox uzaq bir azğınlığa azmışdır.
(92/4, Nisa / 135-136)

## Nəcm: 563

**137** Şübhəsiz iman edib sonra küfr edən [bilərək rədd edən / iman etməyən], sonra iman edib təkrar küfr edən [bilərək rədd edən / iman etməyən], sonra da Allahın ilah və rəbb olduğunu bilərək rədd etmələrini artıran bu kimsələr; Allah onları bağışlayacaq və onları (doğru) bir yola yönləndirəcək deyil.
**138,139** Möminlərin altındakılardan, küfrə [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyə] azanları (özlərinə) yol göstərən, qoruyucu (himayə edən) yaxın qəbul edən bu münafiqlərə, şübhəsiz, çox ağrılı-acılı bir əzabın onlar üçün olduğunu müjdə ver! Onların yanında şan və şərəfmi axtarırlar? Halbuki şan və şərəfin hamısı (bütünlüklə) Allahındır. (92/4, Nisa / 137-139)

## Nəcm: 564

**140,141** Və Allah, sizə Quranda: *“Allahın ayələrinin bilərək rədd edildiyini və onlarla istehza edildiyini eşitdiyiniz zaman, başqa bir sözə dalmadıqları müddətcə onlarla bərabər oturmayın. Əks halda siz*

*də onlar kimi olarsınız."* deyə nazil etdi. Şübhəsiz Allah, sizi gizlicə izləyən kimsələrin / münafiqlərin və kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] hamısını cəhənnəmdə toplayandır. Artıq Allah tərəfindən sizə bir zəfər olarsa onlar: "Biz sizinlə bərabər deyildikmi?" deyərlər. Kafirlər [Allahıni ilah və rəbb olduğunu bilərək rədd edənlər] üçün bir pay olunca da: "Sizin üstünlüyünüzü təmin etmədikmi, sizi möminlərdən qorumadıqmı?" deyərlər. Artıq Allah, qiyamət günündə aranızda hökmünü verəcəkdir. Allah, möminlərin əleyhinə kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] əsla bir yol verməyəcək.
**142,143** Şübhəsiz ki, münafiqlər, Allahı aldatmağa çalışırlar. Halbuki O, onları aldadandır. Və onlar, səlata [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirməyə] qalxdıqları / cəmiyyət içinə çıxdıqları zaman, ikisi arasında tərəddüddə qalanlar olaraq, tənbəl-tənbəl qalxarlar, möminlərlə və kafirlərlə olmazlar, insanlara özlərini göstərərlər. Və Allahı ancaq, çox az olaraq xatırlayarlar. Və Allah, kimi azdırarsa, sən artıq ona bir yol tapa bilməzsən.
(92/4, Nisa / 140-143)

## Nəcm: 565

**144** Ey iman etmiş kimsələr! Özünüzdən səviyyəcə aşağı olan kafirləri [Allahın ilah və rəbb olduğunu bilə-bilərək rədd edən kimsələri] yol göstərən, qoruyucu (himayə edən) yaxınlar qəbul etməyin / yönətici etməyin. Öz əleyhinizdə Allaha açıq-aşkar bir dəlilmi vermək istəyirsiniz?
**145,146** Şübhəsiz ki, münafiqlər *–tövbə edənlər, islah edənlər, Allaha möhkəmcə sarılanlar və dinlərini Allah üçün təmizləyən kimsələr istisnadır; artıq bunlar, möminlərlə bərabərdirlər və Allah, möminlərə böyük bir əcir verəcək–,* Atəşdən, ən aşağı təbəqədədirlər. Sən də onlara yardım edən birini tapa bilməzsən.
**147** Əgər sizə verilən nemətlərin qarşılığını ödədinizsə və iman etmişsinizsə, sizə əzab vermək Allahın nəyinə gərəkdir? Allah, edilənlərin qarşılığını verəndir və ən yaxşı biləndir. (92/4, Nisa / 144-147)

## Nəcm: 566

**148** Allah, haqsızlığa uğrayanlar istisna olmaqla, pis sözün açıqca söylənməsini sevməz. Və Allah, ən yaxşı eşidən, ən yaxşı biləndir.
**149** Əgər bir xeyri aşkara çıxarar, yaxud onu gizləyərsəniz, yaxud da bir pisliyi əfv edərsəniz, bilin ki, şübhəsiz Allah, çox bağışlayandır, ən yaxşı qadir olandır.
**150,151** Allaha və elçilərinə iman etməyərək küfr edən [Allahın ilah

və rəbb olduğunu bilərək rədd edən], “Biz, bir qisminə iman edirik, bir qisminə iman etmərik” deyərək Allah və elçilərinin arasını ayırmağı istəyən və beləliklə də imanla küfr [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmək] arasında bir yol tutmağa çalışan kimsələr; bax onlar, gerçək kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] məhz özüdür. Və Biz, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrə] alçaldıcı bir əzab hazırlamışıq.
**152** Allaha və elçilərinə iman edənlər və onlar arasında ayrı-seçkilik etməyən kimsələr; bax onlar, Allahın çox yaxında mükafatlarını verəcəyi kimsələrdir. Və Allah, çox bağışlayandır, çox mərhəmət edəndir. (92/4, Nisa / 148-152)

**Nəcm: 567**
**153** Kitab Əhli, səndən, onlara göydən bir kitab endirməyini istəyirlər. Və həqiqətən onlar Musadan bundan daha böyüyünü istəmişdilər və: “Allahı bizə açıq-aşkar göstər” demişdilər. Sonra da haqsızlıqları səbəbiylə onları ildırım vurdu. Sonra da özlərinə açıq-aydın dəlillər gəldiyi halda qızılı (özlərinə) ilah qəbul etmişdilər. Sonra Biz onları bundan ötrü də əfv etdik. Və Biz Musaya açıq-aşkar bir dəlil verdik.
**154-158** Və söz vermələri ilə birlikdə, üstünlərini / ən dəyərlilərini / Musanı Tur (dağına) yüksəltdik.[376] Və onlara: “O qapıdan boyun əyib təslimiyyət göstərərək daxil olun” dedik. Yenə onlara: “Təfəkkür / qulluq günündə hədləri aşmayın” dedik. Sonra da onların öz sözlərini pozmaları, Allahın ayələrinə iman etməmələri, peyğəmbərləri haqsız yerə öldürmələri və: “Qəlblərimiz örtülüdür / sünnətsizdir” deməələri *–əksinə, Allah, küfr etmələri [Özünün ilah və rəbb olduğunu bilərək rədd etmələri] səbəbiylə onların qəlblərinə damğa vurmuşdur. Onların az qismi istisna olmaqla, iman etməzlər–* və Allahın ilah və rəbb olduğuna iman etməmələri və Məryəmin əleyhində böyük böhtanlar söyləmələri; “Biz, Allahın Rəsulu Məryəm oğlu İsa Məsihi gerçəkdən öldürdük” demələri səbəbiylə onlardan sağlam bir söz aldıq. Halbuki Onu öldürmədilər və onu asmadılar [ona qarşı sərt hərəkət etmədilər]. Amma onlar üçün, İsa, bənzədildi. Gerçəkdən, Onun haqqında anlaşılmazlığa (ixtilafa) düşənlər, mütləq əskik bir məlumata sahibdirlər. Onların zənnə uymaqdan başqa bununla əlaqəli heç bir bilikləri yoxdur. Onu qətiyyən öldürmədilər. Əksinə, Allah onu, Özünə yüksəltdi / dərəcəsini artırdı. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
(92/4, Nisa / 153-158)

## Nəcm: 568

**160,161** Sonra da Yəhudiləşən kimsələrin haqsız davranışları, onların bir çox kimsələri Allah yolundan döndərmələri, qadağan edildiyi halda riba almaları [əməksiz, xidmət etmədən, risksiz qazanc təmin etmələri] və insanların mallarını haqsız yerə yemələri səbəbiylə, onlara halal edilmiş təmiz şeyləri haram etdik. Və Yəhudiləşənlərdən [olan] kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] can yandıran bir əzab hazırladıq.
**162** Fəqət bu Yəhudiləşənlərdən bilikdə dərinləşmiş olanlar və iman edənlər, sənə nazil edilənə və səndən öncə nazil edilənlərə iman edərlər. Onlar, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirən, ayaqda tutan], vergini verən, Allaha və axirət gününə iman edənlərdir. Bax onlar, Bizim böyük bir mükafat verəcəyimiz kimsələrdir.

(92/4, Nisa / 160-162)

## Nəcm: 569

**163-165** Şübhəsiz Biz, Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy etdiyimiz kimi, sənə də vəhy etdik. İbrahimə, İsmailə, İshaqa, Yəquba, nəvələrinə, İsaya, Əyyuba, Yunusa, Haruna və Süleymana, daha öncə barələrində sənə anlatdığımız elçilərə, barələrində sənə anlatmadığımız elçilərə, elçilərdən sonra insanların Allaha qarşı bir dəlilləri (bəhanəsi) olmasın deyə, müjdə vermək və xəbərdarlıq etmək üçün vəhy etmişdik. Davuda da Zəburu verdik. Və Allah, Musaya söz söylədikcə söylədi / onu yaraladıqca yaraladı, ona çox sıxıntı çəkdirdi. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**166** Fəqət Allah, sənə nazil etdiyinə *–Ki, onu Öz biliyi ilə nazil etmişdir–* şahidlik edər. Bütün ayələr də şahidlik edərlər. Şahid olaraq da Allah yetər.
**159** And olsun, Kitab Əhlindən, ölmədən öncə sənə nazil edilənə / Qurana iman etməyəcək kimsə yoxdur. Qiyamət günü də, sənə nazil edilən / Quran, onların əleyhinə yaxşı bir şahid olacaqdır.[377]

(92/4, Nisa / 163-166, 159)

## Nəcm: 570

**167** Şübhəsiz, küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] və Allah yolundan döndərən bu kimsələr, həqiqətən uzaq bir azğınlığa düşmüşlər.
**168,169** Şübhəsiz küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] və şirk qoşmaq surətiylə səhv; öz zərərinə olan əməli

işləyən bu kimsələr (ki var); Allah onları bağışlayası deyil. Onları, içində təməlli və sonsuzadək qalacaqları cəhənnəm yolundan başqa bir yola da yönləndirəcək deyil. Və bu, Allaha çox asandır.

(92/4, Nisa / 167-169)

## Nəcm: 571

**170** Ey insanlar! Şübhəsiz Elçi, sizə, Rəbbinizdən haqqı gətirdi. Elə isə öz xeyrinizə olaraq haqqa iman edin. Əgər iman etməsəniz, bilin ki, göylərdə və yer üzündə olan şeylər Allahındır. Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır.

**174** Ey insanlar! Həqiqətən Rəbbinizdən sizə açıq-aşkar bir dəlil gəldi. Və Biz sizə açıq-aşkar / açıqlayan bir işıq endirdik.

**175** Artıq, Allaha iman edən və açıq-aşkar işığa möhkəm sarılan kimsələr (ki var); Allah onları, Özündən bir rəhmətə və əlavə bir ərməğan olaraq bol nemətə salacaq və ən doğru yol olaraq Özünə yönəldəcəkdir.[378] (92/4, Nisa / 170, 174-175)

## Nəcm: 572

**171** Ey Kitab Əhli! Dininizdə ifrata varmayın. Və Allah haqqında gerçək olmayan bir şey söyləməyin. Məryəm oğlu İsa Məsih, sadəcə Allahın elçisi və Məryəmə ilqa etdiyi (təlqin etdiyi) / çatdırdığı kəlməsi və Özündən bir ruhdur, vəhy vasitəsi ilə doğulmuş biridir. Artıq, Allaha və elçilərinə iman edin. Və "üçdür" deməyin. Son qoyun, sizin üçün daha yaxşı olar. Allah, ancaq tək bir ilahdır. O, Özü üçün bir uşağın olmasından pakdır. Göylərdə olan şeylər və yer üzündə olan şeylər yalnızca Onundur. "Bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən" olaraq Allah yetər.

**172** Məsih və yaxınlaşdırılmış mələklər [İsaya iman edənlərin İsaya yardım etdiyinə inandıqları güclər], Allahın bir qulu olmaqdan əsla çəkinməzlər. Və kim Ona qulluq etməkdən çəkinər və təkəbbür göstərərsə, bilsin ki, O, onların hamısını yaxında; **Zilzal 1-3** *Yer üzü, öz sarsıntısıyla sarsıldığı, yer üzü ağırlıqlarını çıxardığı və insanın, "Bu yer üzünə nə olur?" dediyi zaman* **172** *Öz hüzuruna toplayar.* **Zilzal 4-6** *Bax o gün yer üzü, şübhəsiz Rəbbinin ona vəhy etməsi səbəbiylə bütün xəbərlərini bir-bir söyləyər. O gün insanlar, əməlləri göstərilsin / əməllərini görsünlər deyə dəstə-dəstə ortaya çıxacaqlar.* **Zilzal 7,8** *Artıq hər kim, zərrə qədər bir xeyir işləyərsə onu görəcək, hər kim də zərrə qədər bir şər işləyərsə onu görəcək.*

**173** Artıq iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələr (ki var); Allah onların mükafatlarını əskiksiz verəcək və (Öz)

ərməğanlarından onlara daha artığını da bağışlayacaq; qulluq etməkdən çəkinib təkəbbür göstərən kimsələr də; (Allah) onlara çox ağrılı-acılı bir əzabla əzab edəcək. Onlar, özləri üçün Allahın altındakılardan bir qoruyucu (himayə edən), yol göstərən yaxın və yaxşı bir yardımçı tapa bilməzlər.[379]

(92/4, Nisa / 171-172 + 93/99, Zilzal / 1-8 + 92/4, Nisa / 173)

## HƏDİD (94 - 57) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

### Nəcm: 573

1 Göylərdə və yer üzündə olan şeylər, Allahı hər cürə nöqsanlıqlardan pak tutdular. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

2 Göylərin və yer üzünün hökmranlığı sadəcə Onundur. O, dirildir və öldürür. O, hər şeyə ən yaxşı qadir olandır.

3 O, İlkdir, Sondur, Açıqdadır, İçəridədir və O, hər şeyi ən yaxşı biləndir.

4 O, göyləri və yeri altı mərhələdə yaradan, sonra ən böyük taxt üzərində hakimiyyət quran, yer üzünə girəni, ondan çıxanı, göydən enəni, ona çıxanı biləndir. Və harada olursunuz olun, O, sizinlə bərabərdir. Və Allah etdiklərinizi ən yaxşı görəndir.

5 Göylərin və yer üzünün hökmranlığı yalnızca Onundur. Və bütün işlər yalnızca Allaha döndərilir.

6 O, gecəni gündüzün içinə salar, güzdüzü də gecənin içinə salar. O, sinələrin özünü ən yaxşı biləndir. (94/57, Hədid / 1-6)

### Nəcm: 574

7 Allaha və Elçisinə iman edin. Sizi, sonradan sahibi etdiyi şeylərdən Allah yolunda xərcləyin / əvvəla öz yaxınlarınız olmaqla başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edin. Artıq Sizdən iman edən və xərcləyən kimsələr; onlar üçün çox böyük qarşılıq vardır.

8 Sizə nə olub ki, Elçi sizi Rəbbinizə iman etməyiniz üçün dəvət etdiyi halda, Allaha iman etmirsiniz? Halbuki O, *–əgər siz iman edənlərsinizsə–* sizdən iman edəcəyiniz üçün ‘qəti söz’ almışdı.

9 Allah, sizi qaranlıqlardan aydınlığa çıxarmaq üçün quluna açıq-aşkar ayələri nazil edəndir. Və şübhəsiz Allah, sizə (qarşı) çox şəfqətli, çox mərhəmətlidir. (94/57, Hədid / 7-9)

## Nəcm: 575

**10** Göylərin və yerin son sahibliyi Allahın olmasına rəğmən, nə üçün siz Allah yolunda xərcləmirsiniz? Sizdən, fəthdən öncə xərcləyən və savaşan kimsə eyni olmaz. Onlar, dərəcə baxımından, sonradan Allah yolunda xərcləyən və savaşan kimsələrdən daha böyükdür. Bununla bərabər, Allah hamısına da "ən gözəli" vəd etmişdir. Və Allah, etdiklərinizdən xəbərdardır.

**11** Kimdir o, Allaha gözəl bir ödünc verəcək adam ki, Allah da onun üçün qat-qat artırsın! Onun üçün şərəfli bir mükafat da var.

(94/57, Hədid / 10-11)

## Nəcm: 576

**12** O gün, iman edən kişiləri və iman edən qadınların, əllərinin arasında və sağlarında işıqları olduğu halda qaçdığını görəcəksən. *–Bu gün müjdəniz, altlarından çaylar axan, içlərində sonsuzadək qalacağınız cənnətlərdir. Bax bu, çox böyük qurtuluşun məhz özüdür!–*

**13** O gün münafiq kişilər və münafiq qadınlar, o iman edən kimsələrə: "Bizə baxın, sizin işığınızdan alaq" deyərlər. (Onlara) deyildi ki: "Arxanıza dönün, işıq axtarın!" Sonra da aralarına içində rəhmət, çölündə də öz yönündən əzab olan qapılı bir sur (böyük divar) çəkilər.

**14,15** Onlara: "Biz sizinlə bərabər deyildikmi?" deyə səslənərlər. Möminlər: "Bəli amma, siz öz canlarınızı atəşə atdınız, baxıb gözlədiniz, şübhəyə düşdünüz və xam xəyallar sizi aldatdı. Nəhayət, Allahın əmri gəlib çatdı. O, çox aldadan da sizi, Allah ilə aldatdı. Bu gün artıq sizdən qurtulmaq üçün fidyə qəbul edilməz, kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərdən] də. Sizin gedəcəyiniz yer atəşdir. O, sizə yaraşandır. O, necə də pis bir dönüş yeridir!" (94/57, Hədid / 12-15)

## Nəcm: 577

**16** İman edənlər üçün hələ vaxtı gəlib çatmadımı ki, qəlbləri Allahı xatırlamaq və haqdan gələn (şey) üçün ürpərsin, (beləliklə) daha öncə özlərinə Kitab verilmiş, sonra üzərlərindən uzun zaman keçmiş, bu səbəbdən qəlbləri qatılaşmış kimsələr kimi olmasınlar. Onların çoxu da yoldan çıxmışdır.

**17** Allahın, yer üzünü, ölümündən sonra diriltdiyini bilin. Bəlkə ağlınızı işlədərsiniz deyə, Biz, sizin üçün ayələri açıq-aşkar ortaya qoyduq.

**18** Şübhəsiz sədəqə verən kişilər, sədəqə verən qadınlar və Allaha

gözəl bir ödünc verənlər; onlar üçün (bunların qarşılığı) qat-qat artırılacaq. Onlar üçün çox şərəfli bir mükafat da var.

**19** Allaha və Elçilərinə iman edən kimsələr; bax onlar, Rəbləri yanında ən doğru kimsələrin və şəhidlərin məhz özləridir. Onların qarşılıqları (mükafatları) və işıqları var. İnkar edən və ayələrimizi yalanlayan kimsələr də, onlar cəhənnəmin əhlidirlər.

**20** Bilin ki, müvəqqəti dünya həyatı, ancaq bir oyun, cazibədar bir əyləncə, bir süs, öz aranızda öyünmək, mal və övladları çoxaltmaq yarışıdır. *–Bir yağmur örnəyi kimi; onun bitirdiyi əkin əkinçilərin xoşuna gəlmişdir, sonra quruyar, bir də baxarsan ki, sapsarı olmuş, sonra o, çör-çöp olmuşdur.–* Axirətdə isə şiddətli bir əzab; Allahdan bir bağışlama və bir razılıq var. Dünyadakı müvəqqəti həyat aldatma malından, (aldatma) vəsaitindən başqa bir şey deyil.

**21** Rəbbinizdən bir bağışlanma, Allaha və elçilərinə iman edənlər üçün hazırlanmış, genişliyi göylə yerin genişliyi kimi olan cənnət üçün yarışın. Bax bu, Allahın, istədiyinə verdiyi ərməğandır. Onu istədiyinə verər. Və Allah, böyük ərməğan sahibidir.

**22-24** Yer üzündə və (insanların) özlərinin içində müsibətdən isabət edən şeylər, *–əlinizdən çıxana üzülməyəsiniz və Allahın sizə verdiyi şeylərlə qürrələnməyəsiniz deyə–* Bizim onu yaratmamızdan öncə, həqiqətən bir kitabdadır. Şübhəsiz bu, Allaha görə çox asandır. Və Allah, xəsislik edən və insanlara da xəsisliyi əmr edən, özünü bəyənib böyüklənən kimsələri sevməz. Kim üz çevirərsə də, bilin ki, şübhəsiz Allah, çox zəngin, heç bir şeyə möhtac olmayanın, təriflənən, tərifə layiq olanın məhz Özüdür. (94/57, Hədid / 16-24)

**Nəcm: 578**

**25** And olsun ki, Biz, elçilərimizi açıq-aydın dəlillərlə göndərdik və onlarla (elçilərlə) birlikdə kitabı və ölçünü nazil etdik ki, insanların həqqaniyyəti ayaqda tutsunlar, (haqqa uyğun davransınlar), Allahın, (Öz) dininə və elçilərinə, heç kimin görmədiyi və tanımadığı yerlərdə yardım edənləri bildirsin / işarələyib göstərsin. Biz özündə böyük bir qüvvət və insanlar üçün faydaları olan dəmiri də nazil etdik. Şübhəsiz Allah, çox qüvvətlidir, mütləq üstündür.

**26** Və and olsun, Nuhu və İbrahimi elçi göndərdik, peyğəmbərliyi və kitabı bu ikisinin soyları içində davam etdirdik. Sonra da onlardan bir qismi doğru yolu tapan, onlardan bir çoxu da haqq yoldan çıxmış kimsələrdir.

**27** Sonra, bunların izindən ard-arda elçilərimizi göndərdik. Məryəm

oğlu İsanı da (onların) arxalarınca göndərdik; ona İncili verdik və ona tabe olan kimsələrin qəlblərinə bir şəfqət və mərhəmət qoyduq. Uydurduqları rahiblik [Malı-mülkü, həyat yoldaşı, övladı tərk edib zahid bir həyat yaşamaq "prinsipi]; onu, onların üzərinə Biz yazmadıq. Sadəcə Allah rizasını qazanmaq üçün ortaya çıxardılar. Sonra da buna layiqincə riayət etmədilər. Sonra da Biz, onlardan iman edən kimsələrə qarşılıqlarını verdik. Onlardan bir çoxu da haqq yoldan çıxmış olanlardır. (94/57, Hədid / 25-27)

**Nəcm: 579**

**28,29** Ey iman etmiş kimsələr! Allahın mühafizəsi altına daxil olun, Onun Elçisinə iman edin ki –*Kitab Əhli, Allahın ərməğanlarından heç bir şey əldə edə bilməyəcəklərini və şübhəsiz ərməğanların Allahın əlində olduğunu, onu istədiyinə verdiyini bilsinlər deyə*– Allah sizə (Öz) rəhmətindən iki pay versin, sizin üçün işığında yeriyəcəyiniz bir işıq etsin və sizi bağışlasın. Allah çox bağışlayan, çox mərhəmət edəndir. Və Allah, böyük ərməğan sahibidir. (94/57, Hədid / 28-29)

## MUHƏMMƏD (95 – 47) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 580**

**1** İnkar edən və Allahın yolundan saxlayan kimsələr (ki var); Allah onların işlərini azdırdı / boşa çıxartdı.

**2** Və iman edən, yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən və Rəbləri tərəfindən bir gerçək olaraq Muhəmmədə nazil edilənə iman edən kimsələr (ki var); Allah, onların pisliklərini örtdü və vəziyyətlərini düzəltdi.

**3** Allahın belə etməsi, şübhəsiz, kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən / iman etməyən kimsələrin] batilə uymaqları, şübhəsiz iman edən kimsələrin də Rəblərindən gələn gerçəyə uymaqları səbəbiylədir. Allah insanlara, onların örnəklərini belə verir. (95/47, Muhəmməd / 1-3)

**Nəcm: 581**

**4-6** Artıq, Allahın ilah və rəbb olduğuna iman etməyən kimsələrlə qarşılaşdığınız / savaşdığınız zaman, dərhal boyunları vurmaq… / ölümünə savaşın. Sonra onlara üstün gəldiyiniz zaman, dərhal bağı möhkəm bağlayın / sağlam qərarlar qəbul edin. Sonra hərb; darmadağın etmək işi başa çatdıqda, onları ya məccani [qarşılıqsız olaraq], ya da qurtulmalıq qarşılığı (fidyə alaraq) buraxın. Bax belə!

Əgər Allah istəsəydi, əlbəttə, onları cəzalandırıb ədaləti təmin edərdi. Fəqət belə olması, sizi biri-birinizlə sınamaq üçündür. Allah yolunda öldürülən / öldürən / savaşan kimsələrə gəlincə; Artıq Allah, onların əməllərini əsla boşa çıxartmaz. Allah onları (doğru yola) yönəldəcək, vəziyyətlərini düzəldəcək və onları, özlərinə tanıtdığı cənnətə daxil edəcəkdir. (95/47, Muhəmməd / 4-6)

## Nəcm: 582

**7** Ey iman etmiş kimsələr! Əgər siz, Allaha yardım edərsəniz, O da
sizə yardım edər və qədəmlərinizi sabit tutar. **8** İnkar edən kəslərə
(gəldikdə) isə, artıq, məhv olmaq onlar üçündür! Və Allah, onların
işlərini azdırmışdır. **9** Bu, şübhəsiz onların, Allahın nazil etdiklərini
bəyənmədiklərinə görədir. Artıq Allah da, onların əməllərini boşa çıx-
artmışdır.
**10** Yaxşı, onlar yer üzündə səfər etmədilərmi? Beləcə, özlərindən öncəkilərin aqibətinin necə olduğunu bir görsünlər. Allah, onları yerlə bir etdi. Bu kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərə] də onların bənzərləri var.
**13** Və qüvvət baxımından, səni çıxaran şəhərdən daha şiddətli (qüvvətli) neçə-neçə şəhərlər (var idi); onları dəyişikliyə / məhvə məruz qoyduq. Belə ki, onlar üçün yardımçı deyə bir şey olmadı.
**12** Şübhəsiz Allah, iman edib saleh əməllər işləyən kimsələri altından çaylar axan cənnətlərə daxil edər. İnkar edən kimsələr isə, bəhrələnərlər və ətindən, südündən faydalanılan heyvanların yeməsi kimi yeyərlər, atəş də onlar üçün bir dincəlmə yeridir.
**11** Məhz möminlərin bəxtiyar olması, kafirlərin (isə) pərişan olması bu səbəbdəndir ki, şübhəsiz, Allah iman edən kimsələrin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınıdır, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən / iman etməyən kimsələr] üçün (isə) heç bir yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxın yoxdur.[380] (95/47, Muhəmməd / 7-10, 13, 12, 11)

## Nəcm: 583

**14,15** Yaxşı, Rəbbi tərəfindən açıq-aşkar bir dəlil üzərində olan kimsə, əməlinin pisliyi özünə süslü göstərilən və boş, müvəqqəti arzularına uyan kimsələr kimi; Atəşdə sonsuz olaraq qalacaq olan və qaynar su içirdilib, bağırsaqları parça-parça olan kimsələr kimidirmi? Allahın mühafizəsi altına daxil olan kəslərə vəd edilən cənnətin örnəyi (belədir): "Orada dəyişməyən (xarab olmayan) təmiz sudan çaylar, dadı dəyişməyən süddən çaylar, içənlərə ləzzət verən şərabdan çaylar və süzülmüş baldan çaylar var. Onlar üçün cənnətdə hər növ meyvə və

Rəblərindən bir bağışlanma var. (95/47, Muhəmməd / 14-15)

## Nəcm: 584

**16** Onlardan sənə qulaq asanlar da var. Elə ki, onlar sənin yanından çıxdıqları zaman, özlərinə bilik verilən kimsələrə: "O, bayaq nə dedi?" dedilər. Bax onlar, Allahın qəlblərini damğaladığı və öz boş, müvəqqəti arzularına uyan kimsələrdir.
**17** Və yönəldildikləri doğru yola girmiş kimsələrə (gəldikdə isə); Allah, onlara doğru yollarını gücləndirmiş və onlara Allahın mühafizəsi altına daxil olmağı vermişdir.
**18** Artıq onlar, qiyamətin qopma anının özlərinə qəflətən gəlməsindən başqasınımı gözləyirlər? Bax, şübhəsiz o qiyamətin əlamətləri gəlmişdir. Artıq o, onlara gəldiyi zaman, onların öyüd alması, onlar üçün nə ifadə edər ki?!
**19** Elə isə, şübhəsiz Allahdan başqa ilah deyə bir şeyin olmadığını bil! Öz günahın üçün, mömin kişilər və mömin qadınlar üçün bağışlanmaq dilə. Və Allah, sizin gəzib dolaşdığınız yeri və durduğunuz yeri bilir.
(95/47, Muhəmməd / 16-19)

## Nəcm: 585

**20,21** İman edən kimsələr: "Kaş ki, bir surə nazil olaydı!" deyərlər. Amma qanunlarla təchiz edilmiş bir surə nazil edildiyi və içərisində savaşdan bəhs edildiyi zaman, qəlblərində xəstəlik olanların [düşüncəsi, imanı xarab olanların], ölüm qorxusuyla huşunu itirən bir kimsənin baxmağı kimi sənə baxdığını görərsən. Artıq itaət və ürfə uyğun / hər kəs tərəfindən yaxşı olduğu qəbul edilən söz onlara daha yaxındır. Sonra iş qətiləşincə artıq Allaha sədaqət göstərsəydilər, həqiqətən özləri üçün daha xeyirli olardı.
**22** Yaxşı, siz idarəçiliyi ələ keçirsəniz, yer üzündə fəsad çıxartmağı və əqrəbalıq bağlarınızı parça-parça etməyimi ümid etdiniz?
**23** Bax onlar, Allahın uzaqlaşdırdığı, sonra qulaqlarını kar, gözlərini kor etdiyi kimsələrdir.
**24** Yaxşı, onlar Quranı [arxa arxaya düzərək] düşünmürlərmi? Yoxsa qəlbləri üzərində qıfıllarımı var?
**25** Şübhəsiz doğru yol özlərinə açıq-aşkar bəlli olduqdan sonra yenidən küfrə [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyə] dönən kimsələr (ki var), şeytan onlara (küfrü; günahı) xoş bir şey olaraq göstərmiş və onları uzun əməllərə (arzulara) salmışdır.
**26** Bunun səbəbi, onların, Allahın nazil etdiyini bəyənməyən kimsələrə: "Bəzi işlərdə biz, sizə itaət edəcəyik" deməl追ridir. Halbuki Allah, onların gizlətdiklərini bilir.

27 Yaxşı, (bu iş üçün tapşırıq alan) görəvli güclər onların üzlərinə və arxalarına vuraraq onlara keçmişdə etdiklərini və etməli olduqları halda etmədiklərini bir-bir xatırlatdırarkən necə olacaq?!
28 Bu, onların Allahı qəzəbləndirən şeylərə uymaları və Onun rizasını bəyənməmələrinə görədir. Allah, onların əməllərini boşa çıxartmışdır.
29 Yoxsa qəlblərində xəstəlik olan [pis düşüncəli] kimsələr elə güman edirlər ki, Allah onların kinlərini əsla ortaya çıxartmayacaq?
30 Əgər Biz istəsəydik, həqiqətən onları sənə göstərərdik. Sonra da sən onları nişanlarından tanıyardın. Yenə də sən, onları sözlərinin üslubundan həqiqətən tanıyarsan. Allah isə işlərinizi bilir.
31 Və həqiqətən Biz, içinizdən səy göstərənləri və səbr edənləri bildirməyimiz / işarələyib göstərməyimiz üçün sizi yıprandıracağıq / sınağa çəkəcəyik. Xəbərlərinizi də yıprandıracağıq / sınağa çəkəcəyik.
32 Şübhəsiz ki, Allahın ilah və rəbb olduğuna iman etməyən, Allahın yolundan saxlayan və özlərinə doğru yol açıq-aşkar bəlli olduqdan sonra Elçiyə qarşı gələn bu kəslər (ki var); onlar, Allaha heç bir şəkildə zərər verə bilməzlər. Və Allah, onların işlərini boşa çıxardacaqdır. (95/47, Muhəmməd / 20-32)

## Nəcm: 586

33 Ey iman etmiş kimsələr! Allaha itaət edin, Elçiyə itaət edin və əməllərinizi boşa çıxartmayın.
34 Şübhəsiz ki, küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən / iman etməyən], Allahın yolundan azdıran, sonra da küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri olaraq ölən kimsələr (ki var), Artıq əsla Allah onlara məğfirət etməyəcəkdir / onları bağışlamayacaqdır.
35 Elə isə zəiflik göstərməyin və siz üstün ikən sülhə çağırmayın. Allah da sizinlə bərabərdir. Və Allah, sizin əməllərinizi (əməllərinizin mükafatını) əsla əskiltməyəcək.
36 Şübhəsiz bu dünyadakı bəsit həyat, ancaq bir oyun və əyləncədir. Əgər iman edər və Allahın mühafizəsi altına daxil olarsanız, Allah sizə mükafatlarınızı verər, sizdən mal-dövlətinizi də istəməz.
37 Əgər Allah, sizdən mal-dövlətinizi istəyib və sizi (buna) məcbur etsəydi, xəsislik edərdiniz. Sizin kinlərinizi də (ortaya) çıxarardı.
38 Bax siz, Allah yolunda xərcləməyə çağırılan kimsələrsiniz. Belə olduğu halda, sizdən bəziləri xəsislik edir. Və kim xəsislik edərsə, artıq öz mənliyindən (özünə qarşı) xəsislik edir. Və Allah zəngindir, siz isə fəqirlərsiniz (yoxsulsunuz). Əgər siz üz çevirərsəniz, Allah yerinizə sizdən başqa bir camaat gətirər. Sonra onlar, sizə bənzəməzlər (sizin kimi olmazlar). (95/47, Muhəmməd / 33-38)

# RƏ'D (96 – 13) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

**Nəcm: 587**

**1** Əlif / 1, Lam / 30, Mim / 40, Ra / 200.[381] Bax bunlar, Kitabın ayələridir. Rəbbindən sənə nazil edilən şey haqdır / gerçəkdir. Lakin insanların çoxu iman etmirlər.

**2-4** Allah, göyləri gördüyünüz şəkildə, dirəklər olmadan yüksəldən, sonra ən böyük taxt üzərində hökmranlıq quran,[382] günəşə və aya boyun əydirən / varlıqların faydalanacağı xüsusiyyətlərdə yaradan Zatdır. *–Hamısı da müəyyən bir vaxtın sonuna (doğru) axıb gedir.–* O, işi idarə edər, Rəbbinizə qovuşacağınız günə inanarsınız deyə ayələri ətraflı olaraq açıqlayar. Və O, yeri uzadan, orada sabit dağlar və çaylar yaradandır. Və O, orada bütün meyvələrdən iki tay yaratdı. O, gecəni gündüzün üstünə örtür. Şübhəsiz bunda yaxşı-yaxşı düşünən bir camaat üçün əlamətlər / işarətlər var. Və O, yer üzündə bir tək su ilə sulanan bir-birinə qonşu qitələr, üzüm bağçaları, əkinlər, haçalı-haçasız xurmalıqlar yaradandır. Və Biz, meyvələri, qoxuları, dadları baxımından onların bəzisini bəzisindən üstün tuturuq. Şübhəsiz ki, (bunda) ağlını işlədən bir camaat üçün bəzi əlamətlər / işarətlər var.

(96/13, Rə'd / 1-4)

**Nəcm: 588**

**5** Və əgər sən təəccüblənirsənsə, əsl təəccübləniləsi olan (şey) onların: "Biz torpaq olduqdan sonra, biz gerçəkdən yeni bir yaradılışda olacağıq?" sözləridir. Bax bunlar, Rəblərinə iman etməmiş kimsələrdir. Və bax bunlar, boyunlarında dəmir halqalar olanlardır. Və bax bunlar, atəşdən bəhrələnənlərdir, onlar orada daimi qalacaqlar.

**6** Və onlar səndən, yaxşılıqdan öncə pisliyi tezləşdirməyini istəyirlər. Halbuki onlardan öncə onlara iz buraxan cəzalar gəlib keçmişdir. Və gerçəkdən, sənin Rəbbin, yanlış işlərinə qarşılıq insanlar üçün həqiqətən mərhəmət sahibidir. Və həqiqətən sənin Rəbbinin əzabı / sorğu-suala tutması çox çətindir.
**7** Və küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən / iman etməyən bu kimsələr]: "Rəbbindən ona bir əlamət / işarət endirilməli deyildimi?" deyirlər. Sən ancaq bir xəbərdar edənsən. Və hər camaat üçün bir yol göstərən var.

(96/13, Rə'd / 5-7)

**Nəcm: 589**

**8** Allah, "Hər (bir) dişinin nəyi daşıdığını və bətnlərin nəyi əskildir, nəyi artırdığını" bilir. Və hər şey, Onun qatında (müəyyən) bir ölçü ilədir.

**9** Allah, görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi,

gələcəyi və aşkarda olanı biləndir, çox böyükdür, ucalardan ucadır.
**10** Sizdən, sözü gizləyən kimsə və onu aşkar edən kimsə, gecə gizlənənlə, gündüz aşkara çıxan kimsə eynidir.
**11** Hər kəs üçün, iki əlinin arasından və arxasından *–Allahın işindən (bir iş) olaraq–,* onu izləyib qoruyan təqibçilər var. Gerçək, bir xalq, öz mənliklərində (nəfsində) olanı dəyişdirmədikcə, Allah heç bir şeyi dəyişdirməz. Və Allah, bir topluluğa pislik (etmək) istəsə, artıq onun geri çevrilməsi mümkün deyil. Onlar üçün Onun altındakılardan bir yardım edən, qoruyan (himayə edən), yol göstərən bir yaxın da yoxdur.
**12** O, sizə qorxu və ümid içində şimşəyi göstərən və yağmur yüklü buludları ortaya çıxarandır.
**13** Göy gurultusu, Onun tərifiylə birlikdə, təbiət qüvvələri / zalım yönəticilər də Onun qorxusuna görə Onu nöqsan sifətlərdən pak tuturlar. Və O, ildırımları göndərər, onunla istədiyini vurar. Onlar isə Allah haqqında mücadilə etməkdədirlər. Halbuki Allahın vurması çox çətin olandır.
**14** Gerçəyin yalvarışı (dua) yalnızca Onadır. Ortaq qoşanların, Onun altındakılardan yalvardıqları kimsələr (ki var); onlar, onlara heç bir şeylə cavab verə bilməzlər. Onlar, ancaq ağzına gəlməməsinə rəğmən ağzına su gəlsin deyə iki ovucunu açan (adamlar) kimidir. Və kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] duası sadəcə bir azğınlıq içindədir.
**15** Və yerdə və göylərdə olan kimsələr və kölgələri, istər-istəməz hər zaman yalnızca Allaha boyun əyib təslimiyyət göstərirlər.
(96/13, Rə'd / 8-15)

## Nəcm: 590

**16** De ki: "Göylərin və yerin Rəbbi kimdir?" De ki: "Allahdır." De ki: "Allahın altındakılardan, öz-özlərinə xeyir verməyə və zərər verməyə gücü olmayanları yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar olaraqmı qəbul edirsiniz?" De ki: "Heç kor ilə görən eyni ola bilərmi? Ya da qaranlıqlarla aydınlıq eyni ola bilərmi?" Ya da Allaha, Onun kimi yarada bilən bəzi ortaqlar tapdılar və bu yaratma onlara görə bir-birinə bənzərmi göründü? De ki: "Allah, hər şeyin yaradıcısıdır. Və O, birdir, hər şeydən üstündür və qəhr edəndir."
**17** Allah, göydən bir su endirdi, vadilər öz ölçüsündə sel olub axdılar. Sonra da sel, suyun üzünə çıxan bir köpüyü yükləndi. Bir zinət əşyası (düzəltmək) və ya bir fayda əldə etmək üçün, atəşdə əritdiklərinin üzərində də bənzər bir köpük var. *–Allah, haqq və batili belə örnək verər.–* Sonra köpük atılar gedər, insanlara faydası olan isə yerdə

qalar. Bax Allah, örnəkləri belə verər.
18 Rəblərinə tabe olanlar üçün "ən gözəl" var. Ona tabe olmayanlar isə, yer üzündə olan nə varsa hamısı və onunla birlikdə bir misli daha (əlavə edilərək) onların olsa, onu qurtulmaq fidyəsi olaraq verərdilər. Bax onlar, hesabın pisi özləri üçün olanlardır. Gedəcəkləri yer də cəhənnəmdir. Ora da nə yaman yataqdır!
19-24 Yaxşı, şübhəsiz Rəbbindən sənə nazil edilənin gerçək olduğunu bilən kimsə, kor olan kimsə kimi ola bilərmi? Şübhəsiz ki, ancaq anlamaq qabiliyyəti olan kəslər;
Allaha verdiyi sözləri yerinə yetirən və əhdləşməni pozmayan,
Allahın, birləşdirilməsini istədiyi şeyi; iman və əməli birləşdirən,
Rəblərinə hörmətlə, sevgiylə, biliklə ürpərən və hesabın pisliyindən qorxan kəslər,
Rəblərinin razılığını qazanmaq arzusuyla səbr etmiş,
səlatı iqamə etmiş [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə  qurumlarını meydana gətirmiş, ayaqda tutmuş],
onlara verdiyimiz ruzilərdən gizli və açıq (şəkildə) Allah yolunda xərcləmiş
və çirkinlikləri gözəlliklərlə ortadan qaldıran kəslər öyüd alıb düşünürlər. Bax onlar (ki var), bu yurdun aqibəti; Ədn cənnətləri onlarındır. Onlar, atalarından, zövcələrindən və soylarından əməlisaleh olanlar Ədn cənnətlərinə daxil olacaqlar. Görəvli güclər / xəbərçi ayələr də hər qapıdan yanlarına girərlər: "Səbr etdiyiniz şeylərə qarşılıq sizə salam olsun! Bu yurdun sonu nə gözəldir!"
25 Allaha andla 'qəti söz' verdikdən sonra (bu andı) pozan və Allahın, birləşdirilməsini əmr etdiyi şeyləri; iman və əməli kəsən / bir-birindən ayıran və yer üzündə fəsad çıxardan kimsələr (ki var); bax onlar uzaqlaşdırılanlardır. Yurdun pisi də onlar üçündür.
26 Və Allah, istədiyi kimsəyə ruzini həm genişləndirər, həm də məhdudlaşdırar. Onlar isə bəsit dünya həyatı ilə fərəhləndilər. Halbuki bəsit dünya həyatı, axirətdə sadəcə bir qazancdır (uğurdur).
27-29,31 Yenə o kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr]: "(Məgər) ona Rəbbindən bir əlamət / işarət endirilməli deyildimi, əgər onunla (Quranla) dağların yeridildiyi, yerin parçalandığı və ya ölülərin danışdırıldığı bir Quran olsaydı…" deyirlər. De ki: "Şübhəsiz Allah, istədiyini çaşdırar və könüldən bağlanan kimsələri; iman edən və qəlbləri, Allahı xatırlamaqla zehnindəki bütün sual işarələrini aradan qaldıraraq rahatlığa qovuşan kəsləri Özünə yönəldər." Gözünüzü açın! Qəlblər, yalnız və yalnız Allahı xatırlamaqla; zehnindəki bütün sual işarələrini aradan qaldırmaqla rahatlığa qovuşar. İman etmiş və yaxşılaşdırmaq qayəsi ilə

əməl işləmiş kimsələr (ki var); tuba; gözəlliklər, müjdələr və gözəl dönüş yeri sadəcə onlar üçündür. Əslində bütün əmrlər Allahındır. İman edənlər hələ də anlamadılar ki, əgər Allah istəsəydi, həqiqətən insanların hamısına (doğru) yol göstərərdi. İnkar edən kimsələrə (gəldikdə isə), Allahın vədi gələnə qədər, işlədikləri əməllərə görə ya başlarına ağır bir bəla gələcək və ya (onların) yurdlarının yaxınlığına enəcək [qurtula bilməyəcəklər]. Şübhəsiz Allah, verdiyi sözdən dönməz / təyin etdiyi vaxtı unutmaz.[383] (96/13, Rə'd / 16-29, 31)

## Nəcm: 591

30 Bax belə, səni, onlar Rəhmana [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allaha] iman etmədikləri halda, sənə vəhy etdiklərimizi onlara oxuyasan deyə, onlardan öncə neçə-neçə öndərli camaatlar gəlib-keçmiş olan bir öndərli camaat içərisində elçi etdik. De ki: "Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah], mənim Rəbbimdir, Ondan başqa ilah deyə bir şey yoxdur. Mən, işin nəticəsini yalnızca Ona həvalə etdim, dönüşüm də yalnızca Onadır."
32 And olsun ki, səndən öncəki elçilərlə də istehza edilmişdi. Və Mən, kafirlərə [Mənim ilah və rəbb olduğumu bilərək rədd edən / iman etməyən kəslərə] möhlət verdim. Sonra da onları yaxaladım, haydı, baxaq (görək) Mənim əzabım necə olurmuş!
38 And olsun ki, Biz səndən öncə də peyğəmbərlər göndərdik. Onlara da zövcələr və nəsil [oğlan-qız uşaqları] verdik. Heç bir peyğəmbər üçün Allahın izni / biliyi olmadan hər hansı bir əlamət / işarə gətirə bilməz. Hər vaxtın sonu üçün bir yazı vardır.
39 Allah, istədiyini məhv edər, istədiyini də yerində saxlayar. Kitabın anası; Biliyin qaynağı da yalnızca Onun qatındadır.[384]
(96/13, Rə'd / 30, 32, 38-39)

## Nəcm: 592

33 Yaxşı, o, qazandığı şeylər ilə birlikdə hər bir adamın üzərində duran / görən və nəzarət edən kimdir? Onlar isə Allaha ortaqlar qəbul etdilər. De ki: "Onları isimləndirin! Yoxsa siz, Ona yer üzündə bilmədiyi bir şeyimi, ya da sözdən açıq olanımı xəbər verəcəksiniz? Əslində kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kəslərə] (öz) planları gözəl göstərildi və (onlar) Yoldan azdırıldılar. Allah, kimi azdırarsa, artıq onun üçün yol göstərən kimsə yoxdur.
34 Onlar üçün bu bəsit dünya həyatında bir əzab vardır. Axirət əzabı isə həqiqətən daha əzicidir (şiddətlidir). Onları Allahdan qoruyacaq biri də yoxdur. (96/13, Rə'd / 33-34)

**Nəcm: 593**
35 Allahın mühafizəsi altına daxil olan kəslərə vəd edilən cənnətin örnəyi belədir: Onun altından çaylar axar, onların nəsibləri; meyvələri, rəngləri, dadları və kölgələri daimidir. Bax bu, Allahın mühafizəsi altına daxil olan kəslərin aqibətidir. Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərin] aqibəti də Atəşdir. (96/13, Rə'd / 35)

**Nəcm: 594**
36 Və özlərinə Kitab verdiyimiz kimsələr, sənə nazil edilən ilə sevinirlər. Əleyhdar qrup yaradanlardan (elə kəslər də var ki), onların bir qismini tanınmaz hala salan kəslər də vardır. De ki: "Mən, ancaq Allaha qulluq etməklə və Ona ortaq qəbul etməməklə əmr olundum. Mən yalnızca Ona dəvət edirəm, dönüşüm də yalnız Onadır."
37 Və Biz, beləcə, Quranı Ərəbcə; mükəmməl bir qanun olaraq nazil etdik. Və əgər sənə gələn bilikdən sonra onların boş-müvəqqəti arzularına uysan, Allah tərəfindən sənə "bir yardımçı, yol göstərən yaxın və bir qoruyucu (himayə edən)" yoxdur.
40 Və onlara vəd etdiyimizin bir bölümünü sənə göstərsək, yaxud keçmişdə etdiklərini və etməli olduğun halda etmədiklərini bir-bir sənə xatırlatdırsaq, şübhəsiz yenə də sənə düşən sadəcə təbliğ etməkdir. Bizə düşən də haqq-hesab etməkdir.[385] (96/13, Rəd / 36-37, 40)

**Nəcm: 595**
41 Və onlar, şübhəsiz Bizim yer üzünə gəldiyimizi, onu ətrafından nöqsanlaşdırdığımızı (əskiltdiyimizi) görmədilərmi? Allah hökm edər. Onun hökmünü əngəlləyə biləcək heç bir kimsə yoxdur. Və O, haqq-hesabı çox cəld edəndir.
42 Onlardan öncəki kimsələr də hiylələr qurmuşdular. Fəqət bütün hiylələri pozub cəzalandırmaq Allaha aiddir. O, hər kəsin nə qazandığını bilir. Bu yurdun aqibətinin kim üçün olduğunu, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] də yaxında biləcəklər.
43 Və küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş] o kəslər: "Sən elçi deyilsən" deyirlər. De ki: "Mənimlə sizin aranızda ən yaxşı şahid olaraq Allah və Kitabın biliyinə sahib olan kəs yetər." (96/13, Rə'd / 41-43)

# RƏHMAN (97 – 55) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

## Nəcm: 596

**1-4** Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah], Quranı / öyrənib-öyrətməyi öyrətdi, insanı yaratdı, ona xeyir və şəri, yaxşını, pisi ayırmağı öyrətdi.
**5** Günəş və ay bir hesab ilə axıb getməkdədir.
**6** Gövdəsiz bitkilər və ağaclar da boyun əyib təslimiyyət göstərməkdədirlər.
**7-9** Və səmanı da yaratdı, onu yüksəltdi və tərəzidə / ölçüdə / tarazlıqda həddi aşmayasınız deyə tərəzini / ölçünü / tarazlığı qoydu. Ölçünü həqqaniyyətlə (haqqa uyğun) saxlayın / ayaqda tutun, tərəziyə / ölçüyə / tarazlığa zərər verməyin. (97/55, Rəhman / 1-9)

## Nəcm: 597

**33** Ey cin və ins[386] topluluqları! Əgər göylərin və yerin kənarlarının bəzisindən aşıb keçməyə gücünüz çatırsa, dərhal aşın, ancaq üstün bir güc olmadan aşa bilməzsiniz.
**34** Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
**31** Ey ağırlığı olan iki qrup! Yaxında sizin haqq-hesabınıza baxacağıq.
**32** Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
**35** İkinizin də üzərinə atəşdən alov və tüstü göndərilər və sizə yardım olunmaz.
**36** Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
**10-12** Və (üstündə) meyvələr və salxımlı xurma ağacları, yarpaqlı dənlər və xoş qoxulu bitkilər olan yer üzünü yaratdı, onu oranın varlıqları üçün alçaltdı (alçaq döşədi).
**13** Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
**14,15** O, görünən, bilinən varlıqları bişmiş gil kimi quru palçıqdan / dəyişkən bir maddədən yaratdı. Görünməz varlıqları, (görünməz) gücləri də atəşin dumansızından / enerjidən yaratdı.
**16** Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
**17** Rəhman [yaratdığı bütün canlılara dünyada çox mərhəmət edən Allah], iki məşriqin Rəbbi və iki məğribin Rəbbidir.
**18** Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?

19 İki dənizi bir-birinə qovuşmaq üçün açıb buraxdı. 20 Aralarında
bir əngəl var, bir-birlərinə keçib qarışmırlar.
21 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
22 İkisindən inci və mərcan çıxar. [Hər ikisindən də sizin faydanıza olan bir çox şey; qida və süs aləti, içmə suyu, suvarma suyu və nəqliyyatda asanlıq əldə edilər.]
23 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
24 Dənizdə uca dağlar kimi yüksəldilən gəmilər də Onundur.
25 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
26,27 Yer üzünün üzərindəki hər kəs gəlib keçicidir (müvəqqətidir). Və o cəlal və kərəm sahibi (olan) Rəbbinin bizzat Özü baqi qalar.
28 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
29 Göylərdə və yerdə olan kimsələr, Ondan istəyərlər. O, hər an bir işdədir.
30 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
37 Sonra da göy yarılıb zeytun yağı kimi bir gül olduğu zaman…
38 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
39 Artıq bax o gün, bildik-bilmədik, gəlmiş-gələcək heç kimsə, bir başqasının günahından məsuliyyət daşımır.
40 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
41 Günahkarlar, nişanlarından tanınar, alınlarından və ayaqlarından tutularlar.
42 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
43 Bax bu, günahkarların yalanladığı Cəhənnəmdir. 44 Onlar, onunla
qaynar su arasında dolanıb durarlar.
45 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
46 Və Rəbbinin məqamından qorxan kimsələr üçün iki cənnət var.
47 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
48 İkisinin də budaqları var.
49 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?

50 İkisində də axıb gedən iki bulaq var.
51 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
52 İkisində də hər meyvədən cüt-cüt var.
53 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
54 Astarları qalın ipəkdən / atlazdan olan döşəklərə yaslanmış kimsələr olaraq, iki cənnətin də dərilməsi yaxındır.
55 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
56 Oralarda, daha öncə bildik, bilmədik, keçmiş, gələcək heç kimsə tərəfindən toxunulmamış; əl və göz dəyməmiş, baxışlarını dikənlər (gözlərini dikib baxan kimsələr) var.
57 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
58 Sanki onlar yaqut və mərcandırlar.
59 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
60 Yaxşılaşdırmanın - gözəlləşdirmənin qarşılığı yaxşılaşdırma-gözəlləşdirmədən başqası ola bilərmi?
61 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
62 Bu ikisindən aşağı iki cənnət daha var.
63 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
64 Bunlar yamyaşıldırlar.
65 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
66 İkisində də dayanmadan fışqıran iki bulaq var.
67 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
68 İkisində də meyvə, xurma və nar var.
69 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
70 O meyvələrin içlərində yaxşılıqlar-gözəlliklər var.
71 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
72 Çadırlara qapanmış parlaq gözlülər var.
73 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
74 Bunlardan öncə onlara bildik-bilmədik heç kimsə toxunmamışdır.

75 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
76 Yaşıl yastıqlara və "Əbqəri" (gözəl naxışlı) sərgilərə; heyrətamiz (şəkildə) gözəl işlənmiş döşəkcələrə yaslananlar olaraq…
77 Bəs siz ikiniz, Rəbbinizin gücünün çatdıqlarının; bənzərsiz gücünün, bənzərsiz nemətlərinin hansını yalan sayırsınız?
78 Əzəmət və böyüklük sahibi, əmr və qadağa qoymaq haqqına sahib, izzət sahibi Rəbbinin adı, necə də comərddir![387]

(97/55, Rəhman / 33-34, 31-32, 35-36, 10-30, 37-78)

## İNSAN / DƏHR (98 – 76) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 598**

1 İnsana görə, hələ özü xatırlanacaq bir şey deyilkən, dəhrdən / milyardlarla ildən bir müddət keçdimi? Əlbəttə ki, keçdi!
2,3 Şübhəsiz Biz, insanı qarışıq bir nütfədən yaratdıq. Onu yıpradacağıq (taqətdən salacağıq) / ona öhdəliklər qoyacağıq. Bu səbəblə onu çox yaxşı eşidən, çox yaxşı görən (halda) yaratdıq; yaxşını -pisi ayıracaq bilikləri (məlumatları) göndərərək biliklındirdik. Şübhəsiz Biz, ona yolu göstərdik, istər özünə verilən nemətlərin qarşılığını ödəyən biri olsun, istər nankor.
4 Şübhəsiz Biz, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün zəncirlər, boyunduruqlar və alovlu bir atəş hazırldıq.
5-22 Şübhəsiz, "yaxşı adamlar", kafur qatılmış bir qabdan içərlər, fışqırdıqca-fışqıracaq bir bulaqdan ki, ondan, verdikləri sözləri yerinə yetirən, pisliyi (vahiməsi) yayılan bir gündən qorxan və "Biz sizi, ancaq Allah rizası üçün yedirdirik və sizdən bir qarşılıq və təşəkkür gözləmirik; bəli, biz sərt çöhrəli, çatıq qaşlı bir gündə Rəbbimizdən qorxarıq" deyərək Allahın sevgisi üçün / (öz nəfslərinin) sevməsinə rəğmən, yeməyi yoxsula, yetimə və əsirə verən Allah qulları içərlər.
Allah da buna görə onları o günün pisliyindən (təhlükəsindən) qoruyar; onlara aydınlıq və sevinc rast gələcək, səbr etmələrinə qarşılıq onlara cənnəti və ipəkləri verəcək; orada taxtlarda (əyləşmiş olaraq) qalacaqlar; orada bir günəş, nə də dondurucu bir soyuq görməyəcəklər və bağçanın kölgələri onların üzərlərinə salxacaq və alçaldıqca alçalacaq (əyildikcə əyiləcək). Və (onların) aralarında gümüş bir qab və büllur kasalar gəzdiriləcək, *–onların (özlərinin) ayarladığı büllurları gümüşdəndir–*. Və orada onlara, qarışığı zəncəfil olan bir qabdan su verilər, orada Səlsəbil deyilən bir bulaqdan… Və aralarında böyüməyən, yaşlanmayan uşaqlar gəzib - dolaşar; onları

gördüyündə, (ətrafa) səpilmiş tək-tək inci (olduqlarını) sanacaqsan! Oranı gördüyündə, xoşbəxtlik və böyük bir mülk və idarəçilik görəcəksən; üzərlərində incə, yaşıl ipəkli, parlaq atlazdan geyimlər (libaslar) olacaq; gümüş bilərziklərlə süslənmiş olacaqlar; Rəbləri onlara tərtəmiz bir içki içirdəcək. Şübhəsiz ki, bu, sizin üçün qarşılıqdır. (Sizin) çalışmalarınız da qarşılığı verilməyə (mükafatlandırılmağa) layiqdir. (98/76, İnsan / 1-22)

**Nəcm: 599**

**23** Şübhəsiz Biz, bəli Biz, Quranı sənə hissə-hissə (tədricən) nazil etdik.
**24-26** O halda, Rəbbinin hökmü üçün səbr et. Onlardan [bir sıra] günahkarlara, [yaxud bir sıra] həddini aşan nankorlara itaət etmə və daim / hər zaman Rəbbinin ismini xatırla. Gecənin bir hissəsində də Ona boyun əyib təslimiyyət göstər. Və Onu uzun gecədə hər cür nöqsanlıqdan təmizə çıxart (pak tut).
**27** “Sən elçi deyilsən” deyənlər, tez gəlib keçən dünyanı sevirlər və ağır bir günü arxalarına atırlar.
**28** Biz, onları Biz yaratdıq. Bədənlərini Biz sağlam etdik. İstədiyimizdə də (onları) bənzərləriylə dəyişdirdikcə dəyişdirərik.
**29** Şübhəsiz bu, bir öyüddür. Artıq istəyən kəs Rəbbinə tərəf yol tutar (qəbul edər).
**30,31** Və siz, Allah istəmədikcə, istəyə bilməzsiniz. Şübhəsiz Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır, istədiyini Öz rəhmətinə salar. Şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlərə də, ağrılı-acılı bir əzab hazırlamışdır. (98/76, İnsan / 23-31)

## TALAQ (99 – 65) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 600**

**1** Ey Peyğəmbər! Qadınları boşadığınız zaman onları iddə[388] müddətində boşayın və iddəni hesablayın. Və Rəbbiniz Allahın mühafizəsi altına daxil olun. Açıq-aşkar bir azğınlıq, iffətsizlik etməyincə, onları evlərindən çıxarmayın, (onlar) özləri də çıxmasınlar. Bunlar Allahın hədləridir. Artıq kim, Allahın hədlərini aşarsa, həqiqətən özünə haqsızlıq etmiş olar. (Sən) bilməzsən, ola bilər ki, Allah bundan sonra bir iş ortaya çıxarar.
**2,3** Artıq, müddətlərinin sonuna yetişdiklərində onları ürfə uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildə saxlayın, yaxud adət-ənənəyə uyğun / hər kəs tərəfindən məqbul hesab edilən bir şəkildə onlardan ayrılın. Və aranızdan ədalətli iki nəfəri şahid tutun. Şahidliyi də Allah

üçün ayaqda tutun. Bax bu, Allaha və son günə iman edən kimsəyə edilən öyüddür. Və kim Allahın mühafizəsi altına daxil olarsa, Allah ona bir çıxış yolu təmin edər (göstərər) və onu hesaba qatmadığı bir yöndən ruziləndirər. Kim də işin nəticəsini Allaha həvalə edərsə, O, ona yetər. Şübhəsiz Allah, Öz əmrini yerinə yetirib, gerçəkləşdirəndir. Allah, həqiqətən hər şey üçün bir ölçü qoymuşdur, müəyyən etmişdir. (99/65, Talaq / 1-3)

## Nəcm: 601

**4** Və qadınlarınızdan aybaşı olmaqdan kəsilənlər və aybaşı olmayanlar; əgər şübhə edərsəniz, onların gözləmə müddəti üç aydır. Hamilə olanların da gözləmə müddəti, yüklərini (yerə) buraxmaları; doğmaları və ya uşaq salmalarıdır. Kim Allahın mühafizəsi altına daxil olarsa, Allah ona işində asanlıq təmin edər. (99/65, Talaq / 4)

## Nəcm: 602

**5** Bax bu, Allahın sizə nazil etdiyi əmridir. Kim də Allahın mühafizəsi altına daxil olarsa, Allah onun pisliklərini örtər və onun üçün mükafatı böyükdür.
**6** O qadınları, imkanınız daxilində yaşadığınız yerin bir hissəsində sakin edin və onları sıxışdırmaq üçün onlarla bir-birinizin zərərinə olacaq hər hansısa bir şey etməyin. Əgər hamilədirlərsə, yüklərini buraxıncaya qədər onlar üçün xərcləyin / nəfəqə verin. Sonra sizin üçün uşaq əmizdirirlərsə, onlara qarşılığını verin və (öz) aranızda ürfə uyğun / hər kəs tərəfindən qəbul edilən bir şəkildə müşavirə edin. Və əgər çətinlik çəkərsəniz, artıq xərci ataya aid olmaq üzrə, başqa bir qadın əmizdirsin.
**7** Geniş imkanları olanlar, geniş imkanlarına görə xərcləsinlər / nəfəqə versinlər (ehtiyaclarını qarşılasınlar). Ruzisi məhdud olan da, artıq Allahın ona verdiyindən versin. Allah, heç bir kəsə, ona verdiyi şeydən başqasıyla öhdəlik qoymaz. Allah, bir çətinliyin ardından bir asanlıq təmin edəcək. (99/65, Talaq / 5-7)

## Nəcm: 603

**8** Şəhərlərdən neçəsi var ki, Rəblərinin və Onun elçilərinin əmrinə baş qaldırdı və Biz də onları çətin bir hesaba çədik və onlara görünməmiş, eşidilməmiş bir əzabla əzab etdik.
**9** Beləcə onlar, işlərinin vəbalını daddılar. İşlərinin nəticəsi də tam bir zərərə / itkiyə məruz qalaraq acı çəkmək olmuşdur.
**10,11** Allah, onlara şiddətli bir əzab hazırlamışdır. O halda, ey anlama qabiliyyətləri olan iman etmiş kimsələr! Allahın mühafizəsi altına

daxil olun. Həqiqətən Allah, iman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləmiş kimsələri, qaranlıqlardan aydınlığa çıxartmaq üçün, sizə bir öyüd, sizə Allahın açıq-aydın ayələrini / əlamətlərini / işarətlərini oxuyan bir elçi nazil etdi. Və hər kim, Allaha inanar və saleh əməl işləyərsə, Allah onu, altlarından çaylar axan, içində sonsuzadək qalacaqları cənnətlərə daxil edər. Allah, onun üçün ruzini gözəlləşdirmişdir.

12 Allah, yeddi göyü və yerdən də onlar qədərini yaradandır. Allahın hər şeyə qadir olduğunu və Allahın biliyinin, hər şeyi əhatə etdiyini biləsiniz deyə, (Allahın) əmri göylər və yer arasında enər.

(99/65, Talaq / 8-12)

## BƏYYİNƏ (100 – 98) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 604**

1-3 Kitab əhlindən və ortaq qoşanlardan küfr etmiş [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş] bu kimsələr, özlərinə açıq dəlil; içində çox təmiz / ən sağlam yazılar olan, çox təmiz səhifələri oxuyan, Allah tərəfindən göndərilmiş bir elçi gələnə qədər sərbəst buraxılmadılar, diqqətdən kənarda qalmadılar.

4 Və Kitab verilən o kəslər, ancaq özlərinə açıq dəlil gəldikdən sonra ayrılığa (ixtilafa) düşdülər.

5 Halbuki onlara sadəcə, dini yalnız Allah üçün pak tutan kəslər halında sadəcə Allaha qulluq etmələri, səlatı iqamə etmələri [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirmələri, ayaqda tutmaları], zəkat / vergini vermələri əmr edilmişdi. Və bax bu, doğru / əskiksiz / aşınmaz (köhnəlməz) dindir.

6 Şübhəsiz Kitab əhlindən və müşriklərdən küfr edən bu kəslər, içində daimi qalanlar olaraq cəhənnəmin atəşi içindədirlər. Bax məhz onlar, yaradılanların ən şərliləridir.

7 Şübhəsiz, məhz iman edən və saleh əməllər işləyən kimsələr, yaradılanların ən xeyirliləridir.

8 Onların, Rəbləri qatındakı mükafatları, içində daimi qalanlar olaraq altlarından çaylar axan Ədn cənnətləridir. Allah, onlardan razı olmuş, onlar da Ondan razı olmuşlar. Bax bu mükafat, Rəbbinə biliklə, sevgiylə, ehtiramla ürpərən kimsələr üçündür. (100/98, Bəyyinə / 1-8)

## HƏŞR (101 – 59) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 605[389]**

1 Göylərdə və yer üzündə olan şeylər, Allahı hər cür nöqsanlıqdan pak

tutdular. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
2 Allah, Kitab Əhlindən Allahın ilah və rəbb olduğuna iman etməyən kimsələri, ilk toplanış üçün (öz) yurdlarından çıxarandır. Siz, onların çıxacaqlarını güman etməmişdiniz. Onlar da, şübhəsiz qalalarının, onları Allahdan qoruyacağına mütləq şəkildə inanırdılar, ancaq Allahın əzabı, onlara hesaba qatmadıqları yerdən gəldi. Və Allah, onların ürəklərinə, evlərini öz əlləriylə və möminlərin əlləriylə xarab ediləcəyi qorxusunu saldı. Ey sağlam düşüncə sahibləri (müdriklər)! Artıq ibrət alın!
3 Və əgər Allah, onların haqqında sürgünü yazmasaydı, həqiqətən, onlara dünyada əzab verərdi. Axirətdə də onlar üçün Atəşin əzabı var.
4 Bax dünyada sürgün, axirətdə atəş cəzası, onların Allaha və Elçisinə qarşı çıxıb arxa çevirmələri səbəbiylədir. Və kim Allaha qarşı çıxıb arxa çevirərsə, bilsin ki, şübhəsiz Allah, əzabı / sorğu-suala çəkməsi çox çətindir (şiddətlidir).
5 Xurma ağaclarından hər hansısa bir şey kəsməyiniz və ya onları kökləri üzərində (salamat) buraxmağınız daima Allahın izni ilə / biliyi ilə və Onun, haqq yoldan çıxan kimsələri rəzil-rüsvay etməsi üçündür.
(101/59, Həşr / 1-5)

## Nəcm: 606

6 Və Allahın, onlardan (Öz) Elçisinə verdiyi "fəy"lər [savaşmadan zəhmətsizcə əldə edilən gəlirlər]; siz, o gəlirlər üçün at oynatmadınız, dəvə də sürmədiniz; heç zəhmət çəkmədiniz. Fəqət Allah, elçilərini, istədiyi kimsələrin üzərinə müsəllət edər (göndərər). Və Allah, hər şeyə ən yaxşı qadirdir.
7,8 Allahın, o şəhərin əhalisindən, Elçisinə verdiyi "fəy"lər [savaşmadan zəhmətsizcə əldə edilən gəlirlər], yalnız içərinizdəki zənginlər arasında dövlət (olmasın); gücün gətirdiyi rifah olmasın deyə, Allaha, Elçiyə, yaxın olanlara; köç (hicrət) edən fəqirlərə *–onlar ki, Allahın ərməğan və rizasını axtararkən yurdlarından və mallarından çıxarılmışdırlar, Allaha və Elçisinə yardım edərlər; bax onlar, məhz doğru olanlardır–* yetimlərə, miskinlərə, (yolda qalmış) yolçulara aiddir. Elçi, sizə nə verdisə, onu dərhal alın. Sizi nədən çəkindirdisə, ondan geri çəkilin. Allahın da mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, sorğu-suala çəkməsi / əzabı çox çətin (şiddətli) Olandır!
9 Onlardan öncə o yurda və imana sahib olan kimsələr, özlərinə (öz yanlarına) köç edənləri sevərlər, onlara verilənlərdən ötrü qəlblərində

bir ehtiyac duymazlar. Özlərinin ehtiyacları olsa belə, onları özlərindən üstün tutarlar. Kim ki, nəfsinin xəsisliyindən qorunarsa, bax onlar, məhz müvəffəqiyyətə nail olanlardır.
**10** Və Peyğəmbər dövründəki iman edənlərdən sonra gələn kimsələr: “Rəbbimiz! Bizi və iman ilə bizdən önə keçmiş qardaşlarımızı bağışla, qəlblərimizdə iman etmiş kimsələr üçün kin yaratma! Rəbbimiz! Şübhəsiz Sən çox şəfqət və mərhəmət göstərən, çox əsirgəyən, asanlıq təmin edənsən, geniş mərhəmət sahibisən!” deyərlər. (101/59, Həşr / 6-10)

## Nəcm: 607

**11** Kitab Əhlindən Allahın ilah və rəbb olduğuna iman etməyən qardaşlarına: “And olsun, əgər siz (öz) yurdunuzdan çıxarılsanız, həqiqətən biz də sizinlə bərabər çıxarıq, sizin əleyhinizdə heç kəsə sonsuzadək itaət etmərik. Əgər sizinlə savaşılarsa, şübhəsiz ki, sizə yardım edərik!” deməkdə olan, münafiqləşən kimsələri görmədinmi / heç düşünmədinmi? Və Allah, şahidlik edər ki, şübhəsiz onlar həqiqətən yalançıdırlar.
**12** And olsun, əgər onlar çıxarılsalar, onlarla bərabər çıxmazlar. Yenə and olsun, əgər onlarla savaşılarsa, onlara yardım etməzlər; and olsun, əgər yardım etsələr belə, mütləq arxalarını çevirib qaçarlar. Sonra da onlara yardım edilməz.
**13** Həqiqətən siz, onların qəlblərində qorxu baxımından, Allahdan daha çətinsiniz (şiddətlisiniz). Onların, Allahdan çox sizdən qorxmaqları, şübhəsiz bunların yaxşı anlamayan bir camaat olmasındandır.
**14-16** Onlar, birlik halında sizinlə savaşmazlar, ancaq, möhkəmləndirilmiş şəhərlərdə yaxud divarların ardından savaşarlar. Öz aralarındakı çəkişmələri, özlərindən az öncə işlərinin günahını dadan, axirətdə də özləri üçün acı bir əzab olan kimsələrin vəziyyəti kimi çox çətindir. Sən onların birlik halında (olduqlarını) sanırsan, halbuki onların qəlbləri, eynilə, insana “Küfr et [Allahın ilah və rəbb olduğunu bilərək rədd et” deyib, və (insan) küfr edincə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edincə] isə “Həqiqətən mən, səndən uzağam; şübhəsiz mən, aləmlərin Rəbbi olan Allahdan qorxuram” deyən o şeytanın örnəyində olduğu kimi darma-dağınıqdır. Belədir, çünki onlar, ağlını işlətməyən bir topluluqdur.
**17** Axırda ikisinin də aqibəti, daimi olaraq Atəşin içində qalmalarıdır. Və bax bu, şirk qoşaraq, küfr edərək səhv, öz zərərlərinə olan əməli işləyənlərin cəzasıdır. (101/59, Həşr / 11-17)

**Nəcm: 608**

**18,19** Ey iman edən kəslər! Allahın mühafizəsi altına daxil olun; hər kəs sabah üçün nə hazırladığına bir baxsın. Və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, işlərinizdən xəbərdardır. Və Allaha əhəmiyyət verməyən kimsələr kimi olmayın: Beləcə Allah, onlara özlərini önəmsətməz. Bax onlar, məhz yoldan çıxmış kimsələrdir.
**20** Atəşin əhli və cənnətin əhli eyni olmaz. Cənnət əhli məhz qurtulanlardır.
**21** Əgər Biz, bu Quranı bir dağa / çox iri cüssəli, məsuliyyət daşıyan bir varlığa nazil etsəydik, Allaha olan hörmətlə, sevgiylə və biliklə ürpərməsi səbəbindən onun səmimiyyətlə ehtiram göstərdiyini, baş əydiyini və parça-parça olduğunu görərdin. Və Biz, bu örnəkləri yaxşı-yaxşı düşünərlər deyə insanlara veririk. (101/59, Həşr / 18-21)

**Nəcm: 609**

**22** O, Özündən başqa ilah deyə bir şey olmayan Allahdır. Görünməyəni və görünəni biləndir. O, yaratdığı bütün canlılara dünyada çox mərhəmət edəndir, geniş mərhəmət sahibidir.
**23** O, Özündən başqa ilah deyə bir şey olmayan Allahdır. O, bütün kainatın hökmdarıdır, tərtəmizdir, hər cür pislik və nöqsanlıqdan uzaqdır, hər cür qüsurdan uzaqdır; ən sağlam, güvən verən, hifz edən, qoruyan, təsdiq edən və etibarlı, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, istədiyini zorla etdirən, əlçatmaz, əzəmətli, ehtiyacları aradan qaldıran, işləri düzəldən, dərman verən, böyüklük və ululuqda tək olan; hər şeydə və hər hadisədə böyüklüyünü göstərəndir. Allah, onların ortaq qoşduqları şeylərdən pakdır.
**24** O, yaradan, qüsursuz yaradan, hər şeyə şəkil və surət verən Allahdır. Ən gözəl isimlər Onun üçündür. Göylərdə və yer üzündə olanlar Onu nöqsan sifətlərdən pak tuturlar. Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir. (101/59, Həşr / 22-24)

## NUR (102 – 24) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 610**

**1** Nazil etdiyimiz və hissə-hissə ayırdığımız bir surə! Öyüd alasınız deyə onda açıq-aşkar ayələr də nazil etdik.
**2** Zina edən qadın və zina edən kişi, dərhal hər birini yüz qamçı ilə qamçılayın, Allaha və axirət gününə inanırsınızsa, Allahın dinində sizi,

onlara qarşı mərhəmət hissi [bu işdən] saxlamasın! Və möminlərdən bir qrup onların cəzalandırılmasına şahid olsun.
4 Və evli, azad qadınlara zina isnad edib, sonra dörd şahid gətirə bilməyən kimsələr; dərhal bunları səksən qamçı ilə qamçılayın və onların şahidliyini ömürləri boyu qəbul etməyin. Və onlar məhz yoldan çıxanlardır.
6,7 Zövcələrinə zina isnad edib özlərindən başqa şahidləri olmayanlar (ki var); onların hər birinin şahidliyi, özünün doğru söyləyənlərdən olduğuna dair dörd dəfə, beşincidə də, əgər yalan söyləyənlərdəndirsə, Allahın uzaqlaşdırıb gözdən salmasının (Allahın lənətinin) öz üzərinə olmasına Allahı şahid tutmasıdır.
8,9 Qadının, ərinin yalan danışanlardan olduğuna dair dörd dəfə, beşincidə də, əgər əri doğru söyləyənlərdəndirsə, Allahın qəzəbinin öz üzərinə olmasına Allahı şahid tutması, cəzanı özündən dəf edər.
5 Ancaq iftira atdıqdan sonra tövbə edən; iftira atdığını etiraf edən və bir daha etməyəcəyinə (dair) söz verən və (özünü) düzəldən kimsələr istisnadır. Artıq, şübhəsiz Allah, çox bağışlayandır, çox mərhəmətlidir.
10 Bəs Allahın sizə ərməğanları və rəhməti olmasaydı!.. Və şübhəsiz Allah, tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verən, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən olmasaydı…
3 Zina edən kişi, zina edən və ya ortaq qoşan bir qadından başqası ilə evlənmir; zina edən bir qadınla da ancaq zina edən və ya ortaq qoşan kişi evlənir. Və bu; belə bir evlilik qaydası, möminlərə haram edilmişdi.[390] (102/24, Nur / 1-2, 4, 6-9, 5, 10, 3)

## Nəcm: 611[391]

11 Şübhəsiz, bu ağır iftiranı gətirənlər, sizdən bir qrupdur.
*–Bunu özünüz üçün bir pislik saymayın; əksinə, o, sizin üçün bir yaxşılıqdır.–* Onlardan, hər bir adama, günahdan qazandığı var. Onlardan günahın böyüyünü söyləyən kimsə üçün də çox böyük bir əzab var.
12 Bunu eşitdiyiniz zaman, mömin kişilər və qadınlar, bu iftiranı eşitdiklərində özləri üçün xeyir olduğunu zənn etmələri və “Bu açıq-aşkar bir iftiradır!” deməli deyildilərmi?
13 Bu iddianı ortaya atanlar, buna dair dörd şahid gətirməli deyildilərmi? Madam ki, şahidlər gətirmədilər, elə isə onlar, Allah yanında əsl yalançıdırlar.
14 Əgər dünyada və axirətdə Allahın ərməğanı və mərhəməti olmasaydı, içinə düşdüyünüz şeylərdə həqiqətən sizə böyük bir əzab toxunardı.

**15** Bir vaxt siz bu iftiranı, bir-birinizin dilindən alıb və barəsində məlumat sahibi olmadığınız bu uydurma xəbəri ağızlarınızla söyləyirsiniz və bunun önəmsiz olduğunu sanırsınız. Halbuki bu, Allah qatında çox böyük (günahdır).
**16** Və onu eşitdiyiniz zaman, "Bunu danışıb durmaq bizə yaraşmaz. Sübhanəkə! Allahım sən paksan, bu, çox böyük bir iftiradır…" desəydiniz!
**17** Əgər siz iman etmiş kimsələrsinizsə, onun bir bənzərini sonsuzadək bir daha təkrarlamamağınızı Allah sizə öyüd edir.
**18** Və Allah, ayələrini sizin üçün açıqlayır və Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır. (102/24, Nur / 11-18)

## Nəcm: 612

**19** Şübhəsiz, iman edən kimsələrin içində, həddi aşmaların və iffətsizliyin yayılmasını sevən kimsələr üçün dünyada və axirətdə ağrılı-acılı bir əzab var. Və Allah bilir, siz bilməzsiniz.
**20** Və sizin üstünüzdə Allahın ərməğanı və mərhəməti (olmasaydı) və şübhəsiz Allah, çox şəfqətli və çox mərhəmətli olmasaydı!..
**21** Ey iman etmiş kimsələr! Şeytanın addımlarını izləməyin. Və kim şeytanın addımlarını izləyərsə, bunu bilsin ki, o, həddi aşmaları, iffətsizlikləri və bütün çirkinlikləri əmr edər. Və əgər üstünüzdə Allahın ərməğan və mərhəməti olmasaydı, sizdən heç bir kimsə sonsuzadək təmizə çıxmazdı. Fəqət Allah, istədiyini təmizə çıxarar. Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**23** Şübhəsiz, azad, evli, heç bir şeydən xəbəri olmayan mömin qadınlara zina isnad edən kimsələr, dünya və axirətdə uzaqlaşdırılmışlardır. Və onlar üçün çox böyük bir əzab var.
**24** O gün onların dilləri, əlləri və ayaqları, etdikləri işlər barəsində (onların) öz əleyhlərinə şahidlik edəcək.
**25** O gün Allah, onlara (etdiklərinin) gerçək qarşılıqlarını əskiksiz verəcək. Onlar da Allahın, açıq-aşkar haqqın məhz Özü olduğunu biləcəklər.
**26** Pis qadınlar pis kişilər, pis kişilər də pis qadınlar üçündür; təmiz qadınlar təmiz kişilər, təmiz kişilər də təmiz qadınlar üçündür / pis sözlər, çirkin işlər pis kimsələrə yaraşır. Yaxşı-gözəl söz və işlər də, yaxşı-gözəl kimsələrə yaraşır. Bax onlar, iftira atanların söylədiklərindən çox uzaq olanlardır. Onlar üçün bağışlanma və dəyərli bir ruzi var.
**22** Və sizdən üstünlük və genişlik (rifah) sahibi olan kimsələr əqrəbaya, miskinlərə, Allah yolunda köç edənlərə (heç bir şey) verməməyə and içməsinlər; bağışlasınlar, xoş davransınlar. Allahın

sizi bağışlamasını sevməzsinizmi? Allah qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.[392] (102/24, Nur / 19-21, 23-26, 22)

## Nəcm: 613

27 Ey iman etmiş kimsələr! Öz evinizdən başqa evlərə, gəldiyinizi fərq etdirib ev sahibinə salam vermədikcə girməyin. Bu, düşünüb öyüdlənməyiniz üçün, sizin üçün daha yaxşıdır.
28 Sonra da orada kimsəni tapa bilməsəniz, artıq sizə icazə verilincəyə qədər oraya girməyin. Və əgər sizə, "Geri dönün!" deyilərsə, dərhal dönün; bu, sizin üçün daha təmiz (bir davranışdır). Və Allah, etdiyiniz şeyləri ən yaxşı biləndir.
29 İçində sizə aid hər hansısa bir dəyərli şey olan, yaşayış olmayan evlərə girməyinizdə sizin üçün bir qorxu yoxdur. Və Allah, sizin aşkar etdiyiniz şeyləri və gizlədiyiniz şeyləri bilir. (102/24, Nur / 27-29)

## Nəcm: 614

30 Mömin kişilərə, baxışlarından bir bölümünü tənzimləmələrini və ismətlərini qorumalarını söylə. Bu, onlar üçün daha təmiz (bir davranışdır). Şübhəsiz Allah, onların nə etdikləri barədə dərin biliyə (məlumata) sahibdir.
31 Mömin qadınlara da, baxışlarından bir bölümünü tənzimləmələrini və ismətlərini qorumalarını söylə. Zinətlərini də *–açıqda olanlar istisna olmaqla–* bəlli etməsinlər. Örtüklərini də sinələrinin açıq (yarıq) qalan yerlərinin üzərinə sallasınlar (çəksinlər). Və süslərini, ərləri, ataları, ərlərinin ataları, oğulları, ərlərinin oğulları, qardaşları, qardaşlarının oğulları, bacılarının oğulları, qadınlar, andlarının sahib olduqları,[393] qadına ehtiyac duymayan kişilərdən onların xidmətində olanlar və qadınların müdafiəsiz yerlərini [arxalarını və cinsiyyət üzvlərini] hələ anlayacaq yaşa gəlməmiş uşaqlar xaricində qalanlar üçün bəlli etməsinlər. Süslərindən gizlədiklərinin bilinməsi üçün ayaqlarını (yerə) vurmasınlar. Və ey möminlər! Müvəffəqiyyətə çatmağınız üçün hamınız birlikdə xətalarınızdan Allaha (tərəf) dönün!
(102/24, Nur / 30-31)

## Nəcm: 615

32 Və sizdən həyat yoldaşı olmayanları, kişi kölələrinizdən və qadın kölələrinizdən yaxşı olanları evləndirin. Əgər bunlar fəqir olarlarsa / olacaqlarsa, Allah Öz lütfündən onları zənginləşdirər. Şübhəsiz ki, Allah, biliyi və rəhməti geniş və hədsiz olandır, ən yaxşı biləndir.
33 Və evlənməyə imkan tapa bilməyənlər; Allah, öz lütfündən onlara

var-dövlət (imkan) verənə qədər iffətlərini qorusunlar. Qanunlar çərçivəsində himayənizə verilənlərdən azadlıq yazışması / müqaviləsi bağlamaq istəyənlərlə, əgər onlarda bir yaxşılıq (xeyir) görürsünüzsə, dərhal yazışma / müqavilə bağlayın. Allahın sizə verdiyi Allahın malından siz də onlara verin. Və bəsit dünya həyatının müvəqqəti mənfəətlərini əldə edəcəksiniz deyə, sərbəstliklərini qazanmaq, evlənmək istəyən gənclərinizi həddi aşmağa / baş qaldırmağa məcbur etməyin, onları mütləq azadlıqlarına qovuşdurun. Kim onları buna məcbur edərsə, bilinməlidir ki, heç şübhəsiz Allah, onların məcbur edilmələrindən sonra çox bağışlayan və mərhəmətlidir.
**34** Və and olsun ki, Biz sizə açıq-aydın bildirən ayələr, sizdən öncə (gəlib) keçən insanlardan örnəklər və Allahın mühafizəsi altına daxil olan kəslər üçün öyüdlər nazil etdik. (102/24, Nur / 32-34)

## Nəcm: 616

**35** Allah, göyləri və yer üzünü; kainatı aydınladan tək Zatdır, başqasının aydınlatması mümkün deyil. Onun nurunun; Quranın örnəyi, içində qəndil olan bir qəndil yuvası kimidir; o qəndil bir şüşə içindədir; o şüşə, sanki inciyə bənzər bir ulduz kimidir ki, şərqə, qərbə nisbət edilməyən; dünyanın hər yerində olan bərəkətli bir zeytun ağacındandır. *–O ağacın yağı, az qala ona atəş toxunmasa belə, işıq verir.–* Nur üstünə nurdur. Allah, diləyən kimsəni nuruna yönəldər. Allah, insanlar üçün örnəklər verir və Allah, hər şeyi ən yaxşı biləndir.
(102/24, Nur / 35)

## Nəcm: 617

**36-38** Allahın, ucaldılmasına və içərisində Öz isminin xatırlanmasına izin verdiyi evlərdə, davamlı olaraq Onu pak tutan elə kişilər var ki, ticarət və alış-veriş onları, Allahı xatırlamaqdan, səlatı iqamə etməkdən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirməkdən, ayaqda tutmaqdan] və zəkatı / vergilərini verməkdən yayındırmaz. Onlar, Allah, özlərinə işlədikləri əməllərin ən gözəli ilə qarşılıq versin və onlara ərməğanlarından artırsın deyə, qəlblərin və gözlərin tərs döndüyü bir gündən qorxarlar. Və Allah, istədiyi kəsləri hesabsız ruziləndirir.
**39,40** Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kəslər]; onların əməlləri, kimsəsiz səhralardakı ilğım kimidir ki, susamış olan (kimsə) onu su zənn edər, ona çatdığında da, orada hər hansısa bir şey tapa bilməz. Yanında Allahı tapmışdır. Sonra da Allah onun hesabını əskiksiz ödəmişdir. Allah, hesabı çox tez görür. Yaxud çox dərin, geniş bir dənizdəki sıx qaranlıqlar kimidir; onu dalğa üstünə

dalğa bürüməkdə; üstündə də bulud var. Üst-üstə qaranlıqlar… Kimə, əlini çıxarıb uzatsa, az qala onu belə görə bilməz. Və Allah, kimə nur verməmişsə, artıq o kimsə üçün nurdan hər hansısa bir şey yoxdur. (102/24, Nur / 36-40)

## Nəcm: 618
41 Göylərdə və yer üzündə olanların, yanaşı dəstələr halında uçanların [quşların, arıların, buludların, boranların] Allahı hər cür nöqsanlıqdan pak tutduqlarını görmədinmi / heç düşünmədinmi? Hamısı öz pak tutma işini və dəstəyini / təbiətə verəcəyi töhfəni həqiqətən bilməkdədir. Allah da, onların işlədiklərini ən yaxşı biləndir.
42 Göylərin və yer üzünün hökmranlığı yalnızca Allaha aiddir. Dönüş də ancaq Allahadır.
43 Şübhəsiz Allahın, buludları sürüklədiyini, sonra onları bir araya gətirdiyini, sonra da üst-üstə yığdığını görmədinmi / heç düşünmədinmi? Sonra da görürsən ki, bunların arasından yağmuru çıxarır. Və O, göydən, içində dolu olan dağ kimi buludları endirər və istədiyini onun hədəfi halına gətirər, istədiyindən də onu uzaq tutar. Şimşəyin parıltısı az qala gözləri kor edir!
44 Allah, gecəni və gündüzü çevirər (dəyişdirər). Şübhəsiz, sağlam düşüncə sahibləri üçün həqiqətən bir ibrət var.
45 Və Allah hər canlını sudan yaratdı. Bax bunlardan bəzisi qarnı üzərində yeriməkdə, bəziləri iki ayaq üzərində yeriməkdə, bəzisi də dörd ayaq üzərində yeriməkdədir. Allah istədiyini yaradır. Heç şübhəsiz Allah, hər şeyə ən yaxşı qadir olandır.
46 And olsun ki, Biz, açıq-aydın ortaya qoyan ayələr nazil etdik. Və Allah, diləyən kimsəni doğru yola yönəldir. (102/24, Nur / 41-46)

## Nəcm: 619
47 Və onlar: "Allaha və Elçiyə iman etdik, itaət etdik" deyirlər. Sonra da onlardan bir qrup, arxasından geri çəkilirlər (üz çevirirlər) və bunlar mömin deyillər.
48 Və aralarında hökm etməsi üçün Allaha və Elçisinə (tərəf) çağırıldıqları zaman, görərsən ki, onlardan bir qrup (üz çevirib)
kənarlaşmışlar. 49 Amma əgər haqq öz xeyirlərinə isə, ona
(peyğəmbərə) könüldən bağlı kimsələr olaraq gələrlər.
50 Yaxşı, onların qəlblərində bir xəstəlikmi var; onların düşüncəsimi korlanıb? Yoxsa şübhəyəmi düşdülər? Yoxsa Allahın və Elçisinin onlara haqsızlıq edəcəyindənmi qorxurlar? Əksinə, onlar səhv davrananların; öz zərərinə olan əməli işləyənlərin məhz özləridir!
51 Aralarında hökm verməsi üçün Allaha və Elçisinə (tərəf) dəvət

edildiklərində, möminlərin sözü ancaq: “Eşitdik və itaət etdik” deməleri oldu. Bax bunlar, məhz qurtuluşa yetişənlərdir.
52 Və kim Allaha və Elçisinə itaət edər, Allaha hörmət, sevgi və biliklə ürpərəti duyarsa və Onun mühafizəsi altına daxil olarsa, bax onlar məhz müvəffəqiyyətə çatanlardır.
53 Və o münafiqlər, sən həqiqətən onlara əmr etdiyin təqdirdə mütləq savaşa çıxacaqlarına dair ən ağır andları ilə Allaha and içdilər. De ki: “And içməyin. İtaət, ürfə uyğun / hər kəs tərəfindən yaxşı olduğu qəbul edilən şəkildə olur! Şübhəsiz Allah, etdiklərinizdən xəbərdardır.”
54 De ki: “Allaha itaət edin, Elçiyə itaət edin.” Artıq, əgər üz çevirərsəniz, bunu bilin ki, onun öhdəsində olan, sadəcə onun yükləndiyidir. Sizin öhdənizdə də sizə yüklənəndir. Əgər Elçiyə itaət edərsinizsə, yönləndirildiyiniz doğru yola girərsiniz. Elçinin öhdəsində olan da, sadəcə açıq-aşkar mesajı çatdırmaqdır. (102/24, Nur / 47-54)

## Nəcm: 620
55 Və Allah sizdən iman etmiş və yaxşılaşdırmaq qayəsi ilə əməl işləmiş kimsələrə, onlardan öncəkiləri başqalarının yerinə gətirdiyi kimi, yer üzündə onları da başqalarının yerinə gətirəcəyini, onlar üçün bəyənib seçdiyi dini onlar üçün mütləq bərqərar edəcəyini və qorxularından sonra, onları mütləq güvənə (xatircəmliyə) çıxardacağını vəd etdi. Onlar Mənə qulluq edərlər, Mənə heç bir şeyi ortaq qoşmazlar. Bundan sonra da kim küfr edərsə [Mənim ilah və rəbb olduğumu bilərək rədd edərsə / iman etməzsə], artıq bax onlar, məhz yoldan çıxanlardır.
56 Və rəhmətə qovuşmağınız üçün səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını qurun, ayaqda tutun], zəkatı / vergini verin və o Elçiyə itaət edin.
57 Kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələrin] yer üzündə aciz qoyacaqlarını qətiyyən güman etmə / qətiyyən güman etməsinlər! Onların da gedəcəyi yer Atəşdir. Həqiqətən də o, necə də pis bir gediş yeridir! (102/24, Nur / 55-57)

## Nəcm: 621
58 Ey iman etmiş kimsələr! Qanunlar çərçivəsində himayənizdə olanlar[394] və sizdən yetkinlik yaşına (həddi-büluğa) çatmayanlarınız üç halda; Səhər təhsil-tədrisdən öncə, günorta vaxtı paltarınızı çıxardığınızda, gecə təhsil-tədrisindən sonra izin istəsinlər. Bunlar, sizin üçün açıq və müdafiəsiz (olduğunuz) üç zamandır. Bunların xaricində nə sizə, nə də onlara bir günah yoxdur. Aranızda gəzərlər,

bəziləriniz bəzilərinizdən üstündür. Allah, ayələri sizin üçün bax belə açıqlayır. Allah, çox yaxşı biləndir, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**59** Və sizdən olan uşaqlar yetkinlik yaşına (həddi-büluğa) çatdıqları zaman, artıq özlərindən öncəki kəslər; böyük qardaşları, böyük bacıları icazə istədikləri kimi icazə istəsinlər. Allah, Öz ayələrini sizin üçün bax belə açıqlayar və Allah, çox yaxşı biləndir, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**60** Və nikah ümidi qalmayan yaşlanmış qadınlar, artıq zinətlərini zahirə çıxarmadan üst paltarlarını çıxarmalarında onlar üçün bir qorxu yoxdur. Və iffətli olmaları özləri üçün daha xeyirlidir. Və Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**61** Kora günah yoxdur; topala günah yoxdur; xəstəyə günah yoxdur; sizin üçün də öz evlərinizdə və ya atalarınızın evlərində və ya analarınızın evlərində və ya qardaşlarınızın evlərində və ya bacılarınızın evlərində və ya əmilərinizin evlərində və ya bibilərinizin evlərində və ya dayılarınızın evlərində və ya xalalarınızın evlərində və ya açarlarına sahib olduğunuz yerlərdə yaxud dostunuzun evlərində yemək yeməyinizdə bir qorxu yoxdur. Hamılıqla birlikdə və ya ayrı-ayrı yeməyinizdə də bir qorxu yoxdur. Artıq evlərə girdiyiniz zaman, Allah tərəfindən bərəkətli və gözəl bir həyat diləyi olaraq özünüz üçün güvənlik yaradın. Bax Allah, ağlınızı işlədəsiniz deyə sizin üçün ayələrini bu cür ortaya qoyar.

(102/24, Nur / 58-61)

## Nəcm: 622

**62** Möminlər ancaq, Allaha və Elçisinə iman etmiş, Elçi ilə birlikdə ictimai bir işlə məşğul olarkən ondan izin istəmədikcə çıxıb getməyən kimsələrdir. Şübhəsiz səndən izin istəyən bu kimsələr (ki var); bax onlar, Allaha və Elçisinə iman etmiş kimsələrdir. Elə isə, bəzi işləri üçün səndən izin istədiklərində, sən də onlardan istədiyinə izin ver, onlar üçün Allahdan bağışlanmaq dilə. Şübhəsiz Allah, çox bağışlayandır, çox mərhəmət edəndir.
**63** Aranızda Elçini çağırmağı, bəzinizin bəzinizi çağırması kimi etməyin. Gizlənərək sovuşub gedənləri Allah həqiqətən bilməkdədir. Bu səbəblə, Onun əmrinə zidd davrananlar, özlərinə ictimai bir yanğının (bəlanın) toxunmasından və ya özlərinə çox ağrılı-acılı bir əzabın toxunmasından qorxsunlar.
**64** Gözünüzü açın! Şübhəsiz, göylərdə və yer üzündə olan şeylər Allahındır. O, sizin nəyin üzərində (hansı yolda) olduğunuzu həqiqətən bilir. Ona döndəriləcəkləri gündə də, etdiklərini dərhal

onlara xəbər verəcəkdir. Və Allah, hər şeyi ən yaxşı biləndir.

(102/24, Nur / 62-64)

## HƏCC (103 – 22) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 623**

**1,2** Ey insanlar! Rəbbinizin mühafizəsi altına daxil olun, şübhəsiz, qiyamətin qopma anının sarsıntısı çox böyük bir şeydir. Onu görəcəyiniz gün, hər əmzikli qadın əmizdirdiyindən əl çəkər. Və hər hamilə qadın yükünü yerə qoyar. Və sən, insanları sərxoş olmadıqları halda sərxoş görərsən. Lakin Allahın əzabı çox şiddətlidir.

**3,4** İnsanlardan bəziləri də Allah haqqında biliksizcə mübahisə edir və hər bir azğın şeytanı izləyir. *–Azğın şeytan haqqında: "Şübhəsiz, kim şeytanı (özünə) yol göstərən, himayə edən bir yaxın qəbul edərsə, artıq o (şeytan), həqiqətən şeytanı özünə vəliləşdirəni azdırar və onu cəhənnəmin əzabına yönəldər." deyə yazıldı.–*

**5** Ey insanlar! Əgər öldükdən sonra dirilməkdən şübhədəsinizsə, bilin ki, nə olduğunuzu sizə (görə) ortaya qoymaq üçün, şübhəsiz Biz, sizi torpaqdan, sonra nütfədən, sonra bir embriondan, sonra forması qeyri-müəyyən bir ət parçasından yaratmışıq. Və Biz, istədiyimizi bəlli bir vaxta qədər bətnlərdə saxlayarıq. Sonra sizi bir uşaq olaraq, sonra da yetkinlik çağına yetişməyiniz üçün çıxardarıq. Bununla bərabər, bəzilərinizə keçmişdə etdiklərini və etməli olduğu halda etmədiklərini bir-bir xatırladarlar / ölümü gerçəkləşdirərlər. Bəziləriniz də, öncəki biliyindən sonra heç bir şey bilməmək üzrə, ömrünün ən rəzil zamanına çatdırılar. Bir də yer üzünü görərsən ki, sönmüşdür; sonra Biz, onun üzərinə su endirdiyimiz zaman (o,) hərəkətə keçər, qabarar və hər gözəl cütdən bitkilər bitirər.

**6** Bax bu, şübhəsiz ki Allahın haqq olması, şübhəsiz sadəcə Onun, ölüləri diriltməsi və şübhəsiz sadəcə Onun hər şeyə ən yaxşı qadir olması səbəbiylədir.

**7** Qiyamət isə şübhəsiz gələcəkdir. Qətiyyən onda şübhə yoxdur. Və şübhəsiz ki, Allah, qəbirlərdə olan kimsələri diriləcəkdir.

(103/22, Həcc / 1-7)

**Nəcm: 624**

**8** İnsanlardan bəziləri də Allah haqqında biliksizcə; yol göstəricisi olmadan, aydınladan bir kitabı olmadan mübahisə edirlər.

**9** Onun belini əyib-bükməsi / özünü böyük göstərməsi, Allah yolundan azdırmaq üçündür. Bu dünyada onun üçün bir rüsvayçılıq var. Və Biz, qiyamət günündə ona yandırıcı cəhənnəmin əzabını daddıracağıq.

**10** Bax bu, öz iki əlinin önə çıxardığı şeylər və şübhəsiz Allahın, yaxşı qulluq edənlərə haqsızlıq edən biri olmaması səbəbiylədir.
**11-13** İnsanlardan bəzisi də Allaha, qeyri-müəyyən bir tərəfdə / qərarsız, xalis yolu olmayan bir şəkildə qulluq edər. O səbəblə əgər ona bir yaxşılıq (xeyir) gələrsə, onunla zehnindəki bütün sual işarələrini aradan qaldıraraq rahatlığa qovuşar. Və əgər ona bir sosial yanğın / sıxıntı gələrsə, üz döndərər. O, dünyanı da, axirəti də itirdi. Bax bu, açıq-aşkar itkinin məhz özüdür. O, Allahın altındakılardan özünə zərər və mənfəət verə bilməyəcək şeylərə yalvarır. Bax bu, çox uzaq azğınlığın məhz özüdür. O, zərəri faydasından daha yaxın olana yalvarır. Yalvardığı o şey necə də pis bir yardımçı, qoruyan (himayə edən) və necə də pis yoldaşdır.
**14** Şübhəsiz Allah, iman edən və yaxşılaşdırmaq qayəsi ilə işlər görən kimsələri altından çaylar axan cənnətlərə daxil edər. Şübhəsiz Allah, istədiyi şeyləri edər.
**15** (Hər) kim, Allahın, dünyada və axirətdə ona yardım etməyəcəyini sanırdısa, dərhal səmimiyyətlə Bizə yönəlsin, bir də, Allahın altındakılardan, ona zərər və mənfəət verə bilməyəcək o şeylər ilə əlaqəsini kəssin. Sonra da baxsın görək bu planı, onu qəzəbləndirən şeyi / başındakı vəsvəsəni aradan qaldıracaqmı?[395]
**16** Və baxın Biz, Quranı beləcə açıq-aşkar ayələr şəklində nazil etdik. Və şübhəsiz Allah, istədiyi kimsələrə / istəyən kimsələrə yol göstərər.
(103/22, Həcc / 8-16)

## Nəcm: 625

**17** Şübhəsiz o iman etmiş kimsələr, Yəhudi olmuş kimsələr, Sabiilər / Yəhya peyğəmbərin dinindən olanlar, Xristianlar, Məcusilər və tay (ortaq) qoşanlar; şübhəsiz Allah, qiyamət günü bunların arasını ayıracaqdır (bunları bir-birindən ayıracaqdır). Şübhəsiz Allah, hər şeyə ən yaxşı şahiddir. (103/22, Həcc / 17)

## Nəcm: 626

**18** Göylərdə və yer üzündə olan kimsələrin, günəş, ay, ulduzlar, dağlar, ağaclar, hərəkət edən canlılar və insanların çoxunun Allaha boyun əyib təslimiyyət göstərdiklərini görmədinmi / heç düşünmədinmi? Bir çoxu da, üzərlərinə əzab haqq olanlardır. Və Allah, kimi alçaldarsa, artıq onu yüksəldəcək biri yoxdur. Şübhəsiz Allah, istədiyini işləyər. (103/22, Həcc / 18)

## Nəcm: 627

**19-22** Bu ikisi; mömin ilə kafir [Allahın ilah və rəbb olduğunu bilərək

rədd edən kəs], Rəbləri haqqında mübahisəyə girmiş iki düşməndir. Artıq kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün atəşdən paltarlar biçilmişdir. Başlarının üstündən qaynar su tökülər. Bununla qarınlarındakı şeylər və dəriləri əridilər. Və onlar üçün dəmirdən toppuzlar var. Qəm-qüssənin (çoxluğundan) ötrü, oradan nə zaman çıxmaq istəsələr, oraya geri çevrilərlər və: "Yandırıcı əzabı dadın!" (deyilər).
**23** Şübhəsiz, Allah, iman edən və yaxşılaşdırmaq qayəsi ilə işlər görənləri, altından çaylar axan cənnətlərə daxil edəcək. Onlar orada qızıldan bilərziklər və incilər ilə süslənərlər. Oradakı paltarları da
ipəkdəndir. **24** Və onlar sözdən, gözəl / xoş olana yönəlmişlərdir. Həm
də təriflənməyə layiq olan Allahın yoluna yönəlmişlərdir.

(103/22, Həcc / 19-24)

## Nəcm: 628

**25** Şübhəsiz, küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən], Allahın yolundan və insanlar üçün *–orada (özünü) ibadətə həsr edən və ya kənardan gələnin eyni olması üzrə–* hazırlanan Məscidülhəramdan [toxunulmazlığı olan ilahiyyat məktəbindən] uzaqlaşdırağa çalışan kimsələr və orada haqsızlıqla yanlış yola azmaq istəyən kimsə (ki var); Biz, ona ağrılı-acılı bir əzabdan daddırarıq.
**26-29** Və Biz bir zamanlar, "Əsla Mənə heç bir şeyi ortaq qoşma; gəzişənlər, orada haqsızlığa baş qaldıranlar, Allahın təkliyini təsdiq edənlər, boyun əyib təslimiyyət göstərənlər üçün evimi tərtəmiz et, onlara aid bəzi mənfəətlərə şahid olmaları və Allahın onlara ruzi olaraq verdiyi heyvanların üzərində, bəlli günlərdə Onun adını xatırlamaları üçün insanlar arasında ilahiyyat təhsili-təlimi veriləcəyini elan et. *–Siz də onlardan yeyin və çətinlik çəkən fəqiri də yedirin.–* Yeriyərək və ya yorğun düşmüş minik (heyvanlarının) üstündə hər dərin vadini aşaraq (keçərək) sənin yanına gəlsinlər! Sonra kirlərini aradan qaldırıb təmizlənsinlər. Əhdlərini (nəzirlərini) yerinə yetirsinlər. Köhnə evdə / azad evdə / Kəbədə gəzsinlər" deyə, o evin / Kəbənin yerini, İbrahim üçün hazırlamışdıq.
**30,31** Bax belə! Və kim, Allahın toxunulmaz etdiklərinə ehtiram göstərərsə, artıq bu (əməli), özü üçün Rəbbinin qatında xeyirdir. Sizə bildiriləndən başqa bütün heyvanlar sizə halal edilmişdir. O halda, Allaha yönəlmişlər olaraq, Ona ortaq qəbul edənlər olmayaraq, o bütlərdən olan murdarlıqdan çəkinin, yalan sözdən də çəkinin. Allaha kim ortaq qoşarsa, artıq o kimsə, göydən düşən və quşların qapdığı və ya küləyin onu kimsəsiz bir yerə sürüklədiyi şey kimidir.

(103/22, Həcc / 25-31)

**Nəcm: 629**

**36** İribuynuzlu heyvanları da; Biz, onları sizin üçün Allahın varlığının işarətlərindən etdik. Sizin üçün onlarda xeyir vardır. O səbəblə, ön ayaqlarının biri bağlı halda kəsərkən / cərgə halında olarkən üzərlərində Allahın adını xatırlayın. Sonra yanları yerə yaslandığı vaxtda onlardan yeyin, ehtiyacını gizləyənə və istəyənə də yedirin. Beləcə Biz, onları, özünüzə verilən nemətlərin qarşılığını ödəyəsiniz deyə sizə boyun əydirdik.

**32,33** Bax belə! Hər kim Allahın varlığına işarət olan şeylərə ehtiram göstərərsə, –*şübhəsiz ki, bu ehtiram göstərmə, qəlblərin Allahın mühafizəsi altına daxil olmasındandır*– sizin üçün onlarda bəlli bir vaxta qədər bəzi faydalar var. Sonra, bunların gedəcək yeri; Beyti-ətiqə / köhnə evə / azad evə / Kəbəyədir.[396] (103/22, Həcc / 36, 32-33)

**Nəcm: 630**

**34,35** Və Biz, hər öndərli cəmiyyət üçün, Allahın onlara ruzi olaraq verdiyi qüsursuz heyvanların üzərində Onun adını xatırlasınlar deyə, bir qulluq forması etdik. Sizin ilahınız bir tək ilahdır. O səbəblə, yalnız Onun üçün Müsəlman olun. Allah xatırlandığı vaxt qəlbləri titrəyən, başlarına gələnə səbr edən, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirən, ayaqda tutan] və özlərini ruziləndirdiyimiz şeylərdən Allah yolunda xərcləyən, Allaha səmimi qəlbdən boyun əyən o kimsələri müjdələ.

**37** Onların ətləri və qanları qətiyyən Allaha yetişməyəcək. Ona, ancaq sizdən, "Allahın mühafizəsi altına daxil olmaq" yetişər. Sizə göstərdiyi üzrə Allahı böyük tutasınız deyə, o (gördüyünüz) iribuynuzlu heyvanları, sizə bax belə boyun əydirdi [heç dəyişmədən, inkişaf etmədən sizə boyun əyəcək xüsusiyyətlərdə yaratdı]. Və yaxşı, gözəl əməl işləyənləri müjdələ.

**38** Şübhəsiz Allah, iman edən kimsələri müdafiə edir. Şübhəsiz Allah, həddindən artıq xain və son dərəcə nankorların heç birini sevməz.

(103/22, Həcc / 34-35, 37-38)

**Nəcm: 631**

**39-41** Özlərinə savaş elan edilən kimsələrə, özləri haqsızlığa uğramaları; onlar, başqa (şey üçün) deyil, sırf "Rəbbimiz Allahdır" dedikləri üçün haqsız yerə yurdlarından çıxarılmaları səbəbiylə savaşmalarına izin verildi.

Və şübhəsiz ki, Allah, onları zəfərə yetişdirməyə ən yaxşı qadir olandır. Əgər Allah, bir qisim insanları digər bir qismi ilə dəf edib

qarşısını almasaydı, mütləq surətdə, fidan, tumurcuq, ağacdakı meyvə, toplanmış taxıl, paxlalı bitkilər, susuz torpaqlardakı tikanlar, tikilmiş bina nə varsa hamısı, bütün alış-veriş yerləri; bazarlar, bütün Səlat; dəstək yerləri (iş; məşğulluq və istehsal yerləri, təhsil və təlim müəssisələri və təhlükəsizlik mərkəzləri) və içərisində Allahın ismi çoxlu-çoxlu xatırlanan məscidlər yerlə bir edilərdi.
Allah, Özünə yardım edənlərə *–onları yurdlandırıb gücləndirsək səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını meydana gətirən, ayaqda tutan], zəkatı / vergilərini verən, ürfə uyğun / hər kəs tərəfindən qəbul edilən yaxşı şeyləri əmr edən, vəhy və ortaq (ümumi) ağıl ilə pisliyi, çirkinliyi qəbul edilən şeylərdən çəkindirən kimsələrə–* həqiqətən yardım edər. Heç şübhəsiz Allah, çox güclüdür, mütləq qalibdir. İşlərin nəticəsi də sadəcə Allaha aiddir. (103/22, Həcc / 39-41)

**Nəcm: 632**

**42-44** Və əgər onlar səni təkzib edərlərsə, bil ki, onlardan öncə Nuhun qövmü, Ad, Səmud, İbrahimin qövmü, Lutun qövmü, Mədyən əhalisi də təkzib etmişdilər. Musa da təkzib edildi və Mən, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrə] bir müddət (möhlət) verdim. Sonra da onları yaxaladım. Gör, Məni tanımamaq necə imiş!
**45** Sonra neçə-neçə şəhərlər də var idi ki, şirk qoşmaq surətiylə səhv; öz zərərlərinə olan əməli işləyərkən Biz onları dəyişikliyə / məhvə məruz qoyduq. Artıq tavanları çökmüş, divarları üstünə uçub tökülmüşdür; neçə-neçə tərk edilmiş quyular və əhənglə / betonla sağlamlaşdırılmış (möhkəmləndirilmiş) bomboş saraylar qaldı!
**46** Məgər onlar, yer üzündə gəzib dolaşmadılarmı ki, özlərinin düşünən qəlbləri və eşidən qulaqları olsun. Bax, şübhə yoxdur ki, gözlər kor olmaz, fəqət sinələrin içindəki qəlblər kor olur.
**47** Və səndən əzabı tezləşdirməyini istəyirlər. Halbuki Allah sözündən əsla çıxmayacaq. Və şübhəsiz Rəbbinin qatında bir gün, sizin saydığınız min il kimidir.
**48** Və şirk qoşmaq surətiylə səhv; öz zərərlərinə olan əməli işləyən neçə-neçə şəhərlər (var idi); Mən onlara möhlət verdim, nəhayət onları yaxaladım. Dönüş, sadəcə Mənədir.
**49,50** De ki: "Ey insanlar! Mən, sizin üçün sadəcə açıq-aşkar / açıqlayıb anlatan bir xəbərdarçıyam. Artıq, iman etmiş olanlar və yaxşılaşdırmaq qayəsi ilə işlər edənlər (ki var); bağışlanma və hörmətli ruzi sadəcə onlar üçündür."
**51** Ayələrimiz haqqında acizləşdirmə yarışı edərək səy göstərən

kimsələr; bax onlar, cəhənnəmin dostudur. (103/22, Həcc / 42-51)

## Nəcm: 633

**52-54** Və Biz, səndən öncə heç bir elçi və heç bir peyğəmbər göndərmədik ki, o, bir şey arzuladığı zaman, şeytan onun arzusuna bir şeylər atmış (qatmış) olmasın. Bundan sonra Allah, şeytanın / İblisin atdığı [qatdığı] şeyləri aradan qaldırar. Sonra da Allah,
şeytanın buraxdığını (vəsvəsəni), qəlblərində xəstəlik olan; xarab düşüncəli və qəlbləri qatılaşan kimsələri dindən çıxarmaq üçün *–şübhəsiz şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləyənlər də, həqiqətən uzaq bir ayrılıq (nifaq) içindədirlər–*
özlərinə bilik verilən kimsələr, Quranın şübhəsiz Rəbbindən gələn bir gerçək olduğunu bilsinlər və ona iman etsinlər, sonra da qəlblərinin ona ehtiram duyması üçün ayələrini gücləndirər, qoruyar. Və Allah, çox yaxşı biləndir, ən yaxşı qanunlar qoyan, gücləndirəndir. Və şübhəsiz Allah, iman edən kimsələri ən doğru yola yönəldəndir.
(103/22, Həcc / 52-54)

## Nəcm: 634

**55** Küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] bu kəslər də, özlərinə qəflətən qiyamətin qopma anı və ya qısır [yararsız, səmərəsiz] bir günün əzabı (onlara) gələnə qədər, Qurandan şübhə duymağa davam edəcəklər.
**56** O gün hökmranlıq Allahındır. Aralarında O, hökm verər. Artıq iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələr, nemət cənnətlərindədir.
**57** Və küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] və ayələrimizi yalanlayan kimsələr (ki var); alçaldıcı əzab bax bunlar üçündür.
**58,59** Və Allah yolunda hicrət edən, sonra öldürülmüş və ya ölmüş olanlar (ki var); həqiqətən Allah, onları gözəl bir ruzi ilə ruziləndirəcək. Və şübhəsiz Allah, həqiqətən ruzi verənlərin ən xeyirlisinin məhz Özüdür. Həqiqətən onları razı qalacaqları bir yerə daxil edəcəkdir. Və şübhəsiz Allah, həqiqətən çox yaxşı biləndir, çox həlimdir.
**60** Bax belə! Və kim özünə verilən cəzaya eyni (cəza) ilə qarşılıq verərsə, sonra yenə ona haqsızlıq edilərsə, həqiqətən Allah ona yardım edər. Şübhəsiz Allah, həqiqətən çox əfv edəndir, çox bağışlayandır.
**61** Bax bu, şübhəsiz Allahın, gecəni gündüzün içinə salması, gündüzü də gecənin içinə salması səbəbiylədir. Şübhəsiz Allah, çox yaxşı eşidəndir, çox yaxşı görəndir.

**62** Bax bu, şübhəsiz Allahın, haqqın məhz özü olması və ortaq qoşanların Onun altından yalvardıqları şeylərin batilin məhz özü olması və şübhəsiz Allahın ucalardan uca olması, ən böyüyün Özü olması səbəbiylədir. (103/22, Həcc / 55-62)

## Nəcm: 635

**63** Həqiqətən Allahın, göydən su endirib və (onunla) yer üzünün yamyaşıl olduğunu görmədinmi / heç düşünmədinmi? Şübhəsiz Allah, çox ərməğan verəndir, ən yaxşı xəbəri olandır.
**64** Göylərdə və yer üzündə olan şeylər, yalnızca Onundur. Və şübhəsiz Allah, möhtac olmayandır, təriflənməyə ən çox layiq olandır.
**65** Sən, Allahın yer üzündəkiləri sizə boyun əydirdiyini [daim sizin faydalanacağınız ölçülərdə yaratdığını] və Onun əmri ilə dənizlərdə axıb gedən gəmiləri görmədinmi / heç düşünmədinmi? Göyü də Öz izni / biliyi [məlumatı] olmadan yerə düşməkdən O tutub saxlayır. Şübhəsiz Allah, insanlara çox şəfqətlidir, çox mərhəmətlidir.
**66** Və O, sizə həyat verən, sonra öldürəcək olan, sonra da dirildəcək olandır. Şübhəsiz insan, həqiqətən çox nankordur. (103/22, Həcc / 63-66)

## Nəcm: 636

**67** Biz, hər öndərli camaat üçün bir qulluq yolu təyin etdik. Onlar, ona görə qulluq etsinlər. O halda, bu işdə səninlə heç bir zaman mübahisə etməsinlər (höcətləşməsinlər). Sən də Rəbbinə (tərəf) çağır. Şübhəsiz sən, ən doğru bir yön (yol) üzərindəsən.
**68,69** Və əgər səninlə mübahisə edərlərsə, dərhal de ki: “Allah, etdiyiniz şeyləri, ən yaxşı bilәndir. Allah, ayrılığa (ixtilafa) düşdüyünüz şeylər ilə əlaqəli qiyamət günü aranızda hökm verəcəkdir.”
**70** Göydə və yer üzündə olan şeyləri, Allahın həqiqətən bildiyini bilmirsənmi? Şübhəsiz, bu, bir kitabdadır. Şübhəsiz bu, Allaha çox asandır.
**71** Və onlar, Allahın, haqlarında heç bir dəlil nazil etmədiyi və özlərində də onlara dair məlumatlar olmayan Allahın altındakılardan bir şeylərə ibadət edirlər. Və şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyənlər üçün heç bir yardımçı yoxdur.
**72** Və onlara ayələrimiz açıq-aşkar olaraq oxunduğu zaman, küfr edən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] o kimsələrin üzlərində, vəhy və ortaq (ümumi, hər kəs tərəfindən) pisliyi, çirkinliyi qəbul edilən şeyləri (görüb) tanıyarsan. Az qala, onlara ayələrimizi oxuyan kimsələrə hücum edəcəklər. De ki: “Yaxşı, sizə ondan daha pis olanını xəbər verimmi? Atəş! Allah Atəşi kafirlərə [Özünün ilah və

rəbb olduğunu bilərək rədd edən kimsələrə] vəd etdi. O, necə də pis bir dönüş yeridir!” (103/22, Həcc / 67-72)

**Nəcm: 637**

**73** Ey insanlar! Bir örnək verilməkdədir, indi ona qulaq asın: Sizin Allahın altındakılardan bu yalvardıqlarınız bir araya gəlsələr belə, bir milçəyi əsla yarada bilməzlər. Və milçək onlardan bir şey qapsa, onu (milçəkdən) geri ala bilməzlər. İstəyən və istənilən gücsüzdür.
**74** Allahı gərəyi kimi dəyərləndirib tanımadılar. Şübhəsiz ki, Allah çox qüvvətlidir, hər şeydən üstündür.
**75,76** Allah, xəbərçi ayələrdən elçilər seçər, insanlardan da elçilər seçər. Şübhəsiz Allah, ən yaxşı eşidən, ən yaxşı görəndir, əllərinin arasında olanı və arxalarında olanı bilir. Və işlər, yalnızca Allaha döndərilir. (103/22, Həcc / 73-76)

**Nəcm: 638**

**77,78** Ey iman etmiş kimsələr! Zəfər qazanmaq, öz vəziyyətinizi qorumaq üçün, Allahın birliyini təsdiq edib söyləyin, boyun əyib təslimiyyət göstərin, Rəbbinizə qulluq edin, yaxşılıq edin və Allah uğrunda gərəyi kimi səy göstərin. O, sizi seçdi və dində; atanız İbrahimin dinində / həyat tərzində sizin üçün bir çətinlik yaratmadı. O, daha öncə və bu Quranda, Elçinin sizə şahid olması, sizin də insanlara şahid olmağınız üçün, sizi “Müsəlmanlar” olaraq isimləndirdi. Elə isə, səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradın, ayaqda tutun], zəkatı / verginizi verin və Allaha sarılın O, sizin mövlanız; yol göstərən, yardım edən, qoruyan (himayə edən) yaxınınızdır. O, nə gözəl mövla və nə gözəl yardımçıdır! (103/22, Həcc / 77-78)

## MUNAFİQUN (104 – 63) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 639**

**1** Münafiqlər sənin yanına gəldikləri zaman: “Biz, gerçəkdən şahidlik edirik ki, şübhəsiz sən, Allahın elçisisən” dedilər. Allah da bilir ki, şübhəsiz sən Onun elçisisən. Və Allah şahidlik edir ki, şübhəsiz münafiqlər, həqiqətən yalançıdırlar.
**2** Onlar, andlarını bir qalxan (sipər) edib (insanları) Allahın yolundan döndərdilər. Şübhəsiz onlar, etdikləri şeylər pis olan kimsələrdir.
**3** Bu, onların iman etmələri, sonra iman etməmələri səbəbiylədir. Beləcə qəlblərinin üzərinə damğa vurulmuşdur, artıq onlar yaxşıca qavraya bilməzlər.

**4** Onları gördüyün zaman da, cüssəli quruluşları *–sanki onlar, söykədilmiş (dayaq verilmiş) / qismən geydirilmiş taxta kötüklər kimidirlər–* xoşuna gəlməkdədir. Danışdıqları zaman da qulaq asırsan. Hər fəryadı özləri əleyhində sanırlar. Onlar düşməndirlər, buna görə də onlardan çəkinib ehtiyat edin. *–Allah onları qəhr etdi; necə də çevrilirlər!–*
**5,6** Və onlara: "Gəlin, Allahın Elçisi sizin üçün bağışlanma diləsin" deyildiyi zaman, başlarını yana çevirdilər. Sən, onların, özlərini böyük tutaraq üz çevirdiklərini də görürsən. Sənin onlar üçün bağışlanma diləməyin ilə diləməməyin, onlar üçün eynidir. Allah, onları qətiyyən əfv etməyəcək; onları bağışlamayacaqdır. Şübhəsiz Allah, haqq yolundan çıxmış bir camaata doğru yolu göstərməz.
**7** Onlar: "Allahın Elçisinin yanında olanlara heç bir xərclərmədə, maliyyə dəstəyində olmayın, nəticədə dağılıb getsinlər!" deyərlər. Halbuki göylərin və yer üzünün xəzinələri Allahındır. Ancaq münafiqlər yaxşıca qavramayırlar.
**8** Deyirlər ki: "And olsun, Mədinəyə dönəsi olsaq, gücü və şərəfi çox olan, düşkün və zəif olanı, əlbəttə, oradan qovub çıxaracaq." Halbuki güc, şərəf və üstünlük Allahın, Onun Elçisinin və möminlərindir. Ancaq münafiqlər bilmirlər. (104/63, Munafiqun / 1-8)

**Nəcm: 640**

**9** Ey iman etmiş kimsələr! Mallarınız və övladlarınız sizi Allahı xatırlamaqdan yayındırmasın. Belə bir şeyi kim edərsə, artıq bax onlar, zərərə, itkiyə məruz qalıb acı çəkənlərin məhz özüdür.
**10** Və sizdən birinizə ölüm gəlib və: "Rəbbim! Məni yaxın bir müddətin sonuna qədər gecikdirsən, mən də beləcə sədəqə versəm və salehlərdən olsam" deməzdən öncə, sizə ruzi olaraq verdiklərimizdən Allah yolunda xərcləyin.
**11** Allah, vaxtının (ömrünün) sonu gəlib çatan heç bir kimsəni əsla təxirə salmaz (möhlət verməz). Və Allah, etdiklərinizdən xəbərdardır.
(104/63, Munafiqun / 9-11)

## MUCADƏLƏ (105 – 58) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 641**

**1** Əri haqqında səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah həqiqətən eşitmişdir. Allah, ikinizin danışığını da eşidir. Şübhəsiz Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**2** Sizdən, qadınlarınıza Zihar[397] edən kimsələr [ki var]; zihar edilən qadınlar, onların anaları deyil. Onların anaları, ancaq onları doğan

qadınlardır. Və şübhəsiz onlar, sözdən çirkin olanı və yalan (olanı) söyləyirlər. Və şübhəsiz Allah, çox əfv edən, çox bağışlayandır.
3 Və qadınlarına zihar edib sonra da söylədiklərindən dönənlərin, bir-birləri ilə təmasdan / əlaqədən öncə bir köləni azadlığa qovuşdurmaları lazımdır. Bax siz, bununla öyüdlənirsiniz. Allah, etdiklərinizdən çox yaxşı xəbəri olandır.
4 Artıq, kim ki, bu imkanı tapa bilməsə, cinsi əlaqəyə girmələrindən öncə, dərhal fasiləsiz olaraq iki ay oruc tutmalıdır. Artıq kim ki, (buna da) güc çatdıra bilmədi, altmış yoxsulu-işsizi yeyəcəklə təmin etməlidir. Bu, Allaha və Elçisinə iman etməyiniz üçündür. Və bunlar, Allahın hədləridir. Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün də çox ağrılı-acılı bir əzab var. (105/58, Mucadələ / 1-4)

## Nəcm: 642
5 Şübhəsiz, Allaha və Elçisinə (qarşı) həddi aşmağa qalxan kimsələr, özlərindən öncəkilərin alçaldıldığı kimi alçaldılmışdırlar. Halbuki, həqiqətən Biz, açıq-aşkar ayələr nazil etmişik. Və kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün alçaldıcı bir əzab var.
6 Artıq Allah, onların hamısını dirildəcəyi gün, etdikləri şeyləri onlara xəbər verəcəkdir. Allah onların etdikləri şeyləri bir-bir saymışdır, onlar isə unutmuşlar. Və Allah, hər şeyə ən yaxşı şahiddir.
(105/58, Mucadələ / 5-6)

## Nəcm: 643
7 Göylərdə olan şeyləri və yer üzündə olan şeyləri Allahın bildiyini görmədinmi / heç düşünmədinmi? Üç adamın gizli danışdığı yerdə O, həqiqətən dördüncüləridir. Beşdə də O, həqiqətən altıncılarıdır. Bunlardan az və ya çox olsunlar və harada olurlarsa olsunlar O, həqiqətən onlarla bərabərdir. Sonra qiyamət günü onlara etdikləri şeyləri xəbər verəcəkdir. Şübhəsiz Allah, hər şeyi ən yaxşı biləndir.
8 Pıçıldaşmaq qadağan edildikdən sonra yenə o qadağan ediləni etməyə çalışanları, günah, düşmənçilik və Elçiyə qarşı gəlmək xüsusunda pıçıldaşanları görmədinmi? Onlar sənin yanına gəldikləri zaman səni, Allahın salamlamadığı ilə salamlayırlar. Öz içlərində də: “Bu söylədiklərimizə görə Allah bizə əzab etməli deyildimi?” deyərlər. Cəhənnəm onlara yetər. Oraya yaslanacaqlar. Necə də pis dönüş yeridir!
9 Ey iman etmiş kimsələr! Pıçıldaşdığınız (xəlvət danışdığınız) zaman günahı, düşmənçiliyi və Elçiyə qarşı gəlməyi pıçıldaşmayın. Yaxşı adam olmağı və Allahın mühafizəsi altına daxil olmağı pıçıldaşın

(danışın). Hüzuruna toplanacağınız Allahın mühafizəsi altına daxil olun.
**10** Şübhəsiz bu pıçıldaşmalar, iman edən kimsələri üzmək üçün şeytandandır (şeytan əməlidir). Halbuki Şeytan, Allahın izni / məlumatı olmadıqca, möminlərə heç bir zərər verə bilməz. Və elə isə möminlər, işin nəticəsini yalnızca Allaha həvalə etsinlər.
**11** Ey iman etmiş kimsələr! Sizə: "Məclislərdə yer açın / başqalarına da iştirak haqqı verin" deyilincə, dərhal yer açın ki, Allah da (sizə) yer açsın / sizə genişlik versin. Və sizə: "Özünüzü olduğunuzdan daha böyük göstərin" deyilincə də özünüzü olduğunuzdan daha böyük göstərin.[398] Beləcə Allah, sizdən iman edən kimsələri və özlərinə bilik verilənləri dərəcələrlə yüksəltsin. Və Allah, etdiklərinizdən yaxşıca xəbəri olandır.
**12** Ey iman etmiş kəslər! Elçi ilə pıçıldaşacağınız [təkbətək danışacağınız, xüsusi xidmət alacağınız] zaman, bu pıçıldaşmağınızdan öncə dərhal bir sədəqə verin. Bu, sizin üçün daha xeyirli və daha təmizdir. Belə olmasına rəğmən, əgər bir şey tapa bilməsəniz, artıq şübhəsiz Allah, çox bağışlayan və çox mərhəmət edəndir.
**13** Təkbətək danışmağınızdan öncə sədəqələr verməkdən qorxdunuzmu? Bunu etmədiniz. Və Allah, sizin şüurlu şəkildə xətadan dönməyinizi qəbul etdi. Artıq səlatı iqamə edin [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını yaradın, ayaqda tutun], zəkatı / verginizi verin, Allaha və Elçisinə itaət edin. Və Allah, etdiklərinizdən ən çox xəbəri olandır. (105/58, Mucadələ / 7-13)

## Nəcm: 644
**14** Allahın qəzəbləndiyi bir topluluğu (özlərinə) yardımçı, qoruyucu (himayə edən); yönətici edənləri görmədinmi / heç düşünmədinmi? Onlar nə sizdəndir, nə də onlardan. Və onlar bilərək yalan yerə and içirlər.
**15** Allah, onlara çox çətin (şiddətli) bir əzab hazırlamışdır. Şübhəsiz onlar, etdikləri çox pis olanlardır.
**16** Andlarını (özlərinə) qalxan etdilər və Allahın yolundan çevirdilər. Artıq onlar üçün alçaldıcı bir əzab var.
**17** Onların mallarının və övladlarının, Allaha qarşı özlərinə heç bir şəkildə əsla faydası olmaz. Onlar, Atəşin əhalisidirlər. Onlar, orada daimi qalanlardır.
**18** Artıq Allah, onların hamısını təkrar diriltdiyi gün, sizə and içdikləri kimi, Ona da and içəcəklər və özlərinin bir şey üzərində olduqlarını sanacaqlar. Gözünüzü açın! Şübhəsiz onlar, yalançıların məhz özüdür.

**19** Şeytan, onları istila etmişdi (ələ keçirmişdi) və onlara Allahı xatırlamağı tərk etdirmişdi. Onlar, şeytanın qrupudur. Gözünüzü açın! Şeytanın qrupu həqiqətən itkiyə məruz qalanların məhz özüdür.

(105/58, Mucadələ / 14-19)

**Nəcm: 645**

**20** Allaha və Elçisinə (qarşı) həddi aşmağa çalışanlar (ki var); onlar, ən alçaq adamların arasındadırlar.
**21** Allah: "Əlbəttə, Mən və elçilərim qalib gələcəyik" deyə yazmışdır. Şübhəsiz Allah hər şeyə gücü çatandır, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır.

(105/58, Mucadələ / 20-21)

**Nəcm: 646**

**22** Allaha və axirət gününə iman edən bir topluluğu, Allaha və Elçisinə (qarşı) həddi aşmağa çalışanlarla qarşılıqlı sevgi bağı qurduğunu görə bilməzsən. Bunlar, onların istər ataları olsun, istər övladları olsun, istər qardaşları olsun, istər əqrəbaları olsun. Onlar, Allahın, qəlblərinə imanı yazdığı və onları Özündən olan vəhy ilə dəstəklədiyi kimsələrdir. Və Allah onları, daimi qalanlar olaraq, altlarından çaylar axan cənnətlərə qoyacaqdır. Allah, onlardan razı olmuşdur, onlar da Ondan razı olmuşdur. Bax bunlar, Allahın tərəfdarlarıdır. Gözünüzü açın! Allahın tərəfdarları, müvəffəqiyyətə çatanların məhz özüdür. (105/58, Mucadələ / 22)

## HUCURAT (106 – 49) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 647**

**1** Ey iman etmiş kimsələr! Allahın və Elçisinin iki əli arasında önə keçməyin / dində öz fikirlərinizi önə çıxarmayın. Və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**2** Ey iman etmiş kimsələr! Səsinizi Peyğəmbərin səsinin üstünə yüksəltməyin. Bir-birinizə yüksək səslə bağırdığınız kimi, Peyğəmbərə yüksək səslə bağırmayın; yoxsa siz şüurunda olmadan, hörmətsizlikdə irəli gedərsiniz və əməlləriniz boşa gedər.
**3** Şübhəsiz Allah Elçisinin hüzurunda səslərini aşağı salan kimsələr (ki var); bax onlar, Allahın, qəlblərini Özünün mühafizəsi altına daxil etməsi üçün imtahan etdiyi kimsələrdir. Onlara bağışlanmaq, qorunmaq (himayə edilmək) və böyük bir mükafat var.
**4** Şübhəsiz sənə otaqların arxa tərəfindən səslənən kimsələr (ki var); onların çoxu ağıllı davranmırlar.

5 Və əgər onlar, sən (onların) yanlarına çıxana qədər səbr etsəydilər, əlbəttə, onlar üçün daha yaxşı olardı. Və Allah, qullarının günahlarını çox bilərək rədd edən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.
6 Ey iman etmiş kimsələr! Əgər haqq yoldan çıxmışın biri sizə bir xəbər gətirərsə dərhal araşdırın / təsbit edin. Yoxsa bilmədən bir topluluğa sataşarsınız / zərər gətirərsiniz və etdiyinizə peşman olan kimsələr olarsınız.
7,8 Və şübhəsiz aranızda Allahın Elçisinin olduğunu bilin. Əgər o, bir çox işlərdə sizə uysaydı, həqiqətən sıxıntıya düşərdiniz. Fəqət Allah, Özünün bir lütf və neməti olaraq, sizə imanı sevdirdi və onu qəlblərinizə zinət etdi. Küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyi], haqq yoldan çıxmağı və üsyanı da sizə çirkin göstərdi. Bax bunlar, rüşdə (yetkinliyə) / əqli yetkinliyə sahib kimsələrin məhz özüdür. Və Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır, ən çox sağlam edəndir.
9 Və əgər möminlərdən iki qrup bir-biri ilə savaşdırılarsa, dərhal onların arasını düzəldin. Əgər biri o birinin üzərinə hücum edərsə, Allahın əmrinə dönənə qədər hücum edən tərəflə savaşın. Sonra da (hücum edən) əgər dönərsə, aralarında ədalətlə sülhü bərqərar edin və həqqaniyyətlə (haqqa uyğun) davranın. Şübhəsiz ki, Allah, həqqaniyyətlə (haqqa uyğun) davrananları sevər.
10 Möminlər ancaq qardaşdırlar. Elə isə rəhmətə yetişməyiniz üçün qardaşlarınızın arasını düzəldin və Allahın mühafizəsi altına daxil olun.
11 Ey iman etmiş kimsələr! Bir topluluq başqa bir topluluğu lağa qoymasın. Ola bilər ki, lağ etdikləri topluluq özlərindən xeyirlidir. Qadınlar da başqa qadınları lağa qoymasın. Bəlkə də lağ etdikləri qadınlar, özlərində xeyirlidir. Özünüzü (bir-birinizi) də fırladıb atmayın; rişxənd etməyin, alçaltmayın; bir-birinizi ləqəblər ilə fırladıb atmayın, alçaltmayın, xor görməyin. İmandan sonra haqq yoldan çıxan adını almaq necə də pis şeydir! Və kim xətadan dönməzsə, bax onlar səhv; öz zərərinə olan əməli işləyənlərin məhz özüdür.
12 Ey iman etmiş kimsələr! Zənnin bir çoxundan ehtiyat edin. Şübhəsiz zənnin bir qismi günahdır. Bir-birinizin qüsurunu araşdırmayın. Bir bölümünüz bir bölümünüzün qeybətini etməsin / onun olmadığı vaxt irəli-geri danışmasın. Sizdən biriniz ölmüş qardaşının ətini yeməyi sevərmi? Bax, bunu çirkin gördünüz. Və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verəndir, çox mərhəmət sahibidir.

(106/49, Hucurat / 1-12)

**Nəcm: 648**

**13** Ey insanlar! Biz sizi bir erkək ilə bir dişidən yaratdıq, bir-birinizlə tanışasınız deyə, sizi xalqlar və qəbilələr etdik. Şübhəsiz ki, Allah qatında ən dəyərliniz, Allahın mühafizəsi altına ən çox daxil olanınızdır. Gerçəkdən Allah, ən yaxşı biləndir, ən çox xəbər alandır.

(106/49, Hucurat / 13)

**Nəcm: 649**

**14** Bədəvi ərəblər: "İman etdik!" dedilər. De ki: "Siz iman etmədiniz, amma 'Əsləmna [sağlamlaşdırdıq / özümüzü sağlama aldıq]!' deyin; iman hələ qəlblərinizə girmədi. Və əgər Allaha və Elçisinə itaət edərsəniz, O, etdiklərinizdən heç bir şeyi sizə əskiltməz." Gerçəkdən Allah, çox bağışlayandır, çox mərhəmətlidir!

**15** Möminlər ancaq, Allaha və Onun Elçisinə iman edən, sonra da şübhəyə düşməyən və malları və canları ilə Allah yolunda səy göstərən kimsələrdir. Bax bunlar sadiqlərin məhz özüdür.

**16** De ki: "Siz, dininizi Allahamı öyrədirsiniz? Halbuki Allah, göylərdə olanları da, yerdə olanları da bilir." Və Allah, hər şeyi çox yaxşı bilir.

**17** Onlar, İslama girdikləri üçün sənin minnətdar olmağını gözləyirlər. De ki: "İslama girdiyinizə görə, məndən minnətdarlıq gözləməyin. Tam əksinə, əgər doğru kimsələrsinizsə, sizi imana yetişdirdiyi üçün, siz Allaha minnətdarlıq duyğusu bəsləyin."

**18** Şübhəsiz Allah, göylərin və yer üzünün görünməyənini, eşidilməyənini, hiss edilməyənini bilir. Və Allah, etdiyiniz şeyləri çox yaxşı görəndir.

(106/49, Hucurat / 14-18)

## TƏHRİM (107 – 66) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 650**

**1** Ey Peyğəmbər! Zövcələrinin razılığını qazanmaq üçün Allahın halal etdiyi şeyi nə üçün sən özünə haramlaşdırırsan? Və Allah çox bağışlayan, çox mərhəmət edəndir.

**2** Allah, kəffarəsini ödəyərək andlarınızı pozmağı (geri götürməyi) həqiqətən sizə məşru (şəriətə uyğun) etmişdir. Və Allah sizin mövlanız; yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınınızdır. Və O, ən yaxşı bilən, ən yaxşı qanun qoyandır.

**3** Bir də, bir vaxt Peyğəmbər, zövcələrindən bəzilərinə bir sözü / hadisəni sirr etmişdi. Sonra zövcələrindən biri bunu xəbər edincə və Allah, Peyğəmbərə bunu aşkar (əyan) edincə, Peyğəmbər hadisənin bir qismini təsbit etmiş, bir qismindən kənar durmuşdu / imtina etmişdi.

Nəhayət, o zövcəyə bunu özü xəbər verincə, o zövcə: "Bunu sənə kim xəbər verdi?" dedi. Peyğəmbər: "Mənə yaxşı bilən, yaxşı xəbər alan xəbər verdi" demişdi.
**4** Ey Peyğəmbərin iki zövcəsi, xətalarınızdan Allaha dönərsəniz sizin üçün yaxşı olar. *–Çünki həqiqətən ikinizin qəlbləri azdı; inanclarınız pozuldu, azğınlığa düşdünüz.–* Yox, əgər Peyğəmbərə qarşı həmrəy olarsanız, heç şübhəsiz Allah Özü, ona mövladır; yardımçıdır, dəstəkçidir, qoruyandır (himayə edəndir), yol göstərəndir. Cibril / Quran və iman edənlərin salehləri də. Və bunlardan sonra nazil olacaq ayələr də ona arxa çıxarlar.
**5** Əgər o sizi boşayarsa, Rəbbinin, ona sizdən daha xeyirli, müslümə, mömінə, daima hörmət göstərən, tövbə edən, oruc tutan / səyahət edən dul və bakirə zövcələr verməsi ümid edilir. (107/66, Təhrim / 1-5)

## Nəcm: 651

**6,7** Ey iman etmiş kimsələr! Özünüzü və yaxınlarınızı, yanacağı insanlar və daşlar olan bir Atəşdən qoruyun. Atəşin üzərində, Allaha qarşı gəlməyən, onlara əmr edilən şeyləri edən çətin (sərt) və kobud görəvli qüvvələr var. Ey kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş kimsələr]! Bu gün heç bir üzrxahlıq etməyin (bağışlanma diləməyin). Siz ancaq işlədiklərinizin cəzasını çəkəcəksiniz!
**8** Ey iman etmiş kimsələr! Xalis, qarışığı olmayan / səmimi bir dönüş ilə xətadan Allaha dönün. Ola bilsin ki, Rəbbiniz; Peyğəmbəri və onunla birlikdə iman edənləri utandırmayacağı, işıqlarının önlərində və sağ tərəflərində (axıb) gedəcəyi, "Rəbbimiz! İşığımızı tamamla, bizi bağışla, çünki Sən hər şeyə qadirsən" deyəcəkləri gündə sizin pisliklərinizi örtər və sizi, içlərindən çaylar axan cənnətlərə salar.
(107/66, Təhrim / 6-8)

## Nəcm: 652

**9** Ey Peyğəmbər! Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] və münafiqlərə qarşı çalışqan ol, onlara qarşı sərt davran. Onların gedəcəkləri yer də cəhənnəmdir. Və o, necə də pis (bir) dönüş yeridir. (107/66, Təhrim / 9)

## Nəcm: 653

**10** Allah kafirlərə [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə], Nuhun arvadı ilə Lutun arvadını örnək verdi. Bu ikisi, qullarımızdan iki saleh qulun alçaq arvadları idilər. Sonra onlara xainlik etdilər. İkisinin əri də, peyğəmbər olmalarına rəğmən,

Allahdan (gələn) heç bir şeyi onlardan dəf edə bilmədi. Və, "Daxil olanlarla birlikdə siz ikiniz də atəşə daxil olun!" deyildi.
11 Allah, iman edən kimsələrə də Fironun arvadını örnək göstərdi. Bir vaxt o, "Rəbbim! Mənə (Öz) yanında cənnətin içində bir ev düzəlt, məni Firondan və onun işindən qurtar. Və məni bu şirk qoşaraq səhv; öz zərərinə olan əməli işləyən camaatdan qurtar!" demişdi.
12 Və Allah, ismətini bir qala kimi qoruyan İmran qızı Məryəmi də örnək verdi. Bax Biz onu vəhyimizlə az da olsa biliklәndirdik (məlumatlandırdıq).[399] O da Rəbbinin kəlmələrini və kitablarını təsdiqləyib tətbiq etdi və daima ehtiram göstərənlərdən oldu.
(107/66, Təhrim / 10-12)

## TƏĞABUN (108 – 64) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

### Nəcm: 654

1 Göylərdə və yer üzündə olan şeylər, Allahı hər cür nöqsanlıqdan pak tutur. Mülk yalnızca Onundur, bütün təriflər də sadəcə Onadır; başqasını tərifləmək olmaz. Və O, hər şeyə ən yaxşı qadir olandır.
2 O, sizi yaradandır. Artıq, kiminiz kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biridir, kiminiz (də) mömindir. Və Allah etdiklərinizi ən yaxşı görəndir.
3 Allah göyləri və yeri haqq ilə yaratdı və sizə surət verdi. –*Surətlərinizi də nə gözəl etdi!*– Və dönüş yalnızca Onadır.
4 O, göylərdə və yer üzündəki şeyləri bilir, gizlədiyiniz və aşkar etdiyiniz şeyləri də bilir. Allah, sinələrin özünü də ən yaxşı biləndir.
(108/64, Təğabun / 1-4)

### Nəcm: 655

5 Öncədən kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] xəbəri sizə gəlib çatmadımı? Bax onlar, işlərinin vəbalını (cəzasını) daddılar. Onlar üçün ağrılı-acılı bir əzab da var.
6 Bu cəzalandırma, onlara elçiləri açıq-aydın dəlillər ilə gəldiyində: "Bir bəşərmi bizə yol göstərəcək?" deyib, küfr etmələri [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyə çalışmaları] və arxa çevirmələri səbəbiylədir. Allah, möhtac olmadığını göstərdi. Allah zəngindir, təriflənməyə ən yaxşı layiq olandır. (108/64, Təğabun / 5-6)

### Nəcm: 656

7 Bu Kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr] həqiqətən dirildilməyəcəklərinə yanlışca iman etdilər. De ki: "Əksinə, Rəbbimə and olsun ki, həqiqətən dirildiləcəksiniz, sonra

həqiqətən etdiyiniz şeylər sizə xəbər veriləcəkdir. Və bu, Allaha görə çox asandır.”
**8** Elə isə, Allaha, Elçisinə və Bizim nazil etdiyimiz işığa (nura) / Qurana iman edin. Və Allah, etdiyiniz şeylərdən xəbərdardır.
**9** Toplanma günü üçün sizi toplayacağı gün; *–bax o gün, qarşılıqlı aldatma / aldanma günüdür; kimin kimi aldatdığının ortaya çıxdığı gündür–* kim Allaha iman edər və saleh əməl işləyərsə, Allah, onun pisliklərini örtər və onu, içində sonsuzadək qalanlar olaraq altlarından çaylar axan cənnətlərə salar. Bax bu, böyük qurtuluşdur.
**10** İnkar edən və ayələrimizi yalanlayan kimsələr (ki var); bax onlar, içində daimi qalanlar olaraq atəşin əhlidirlər. O, necə də pis dönüş yeridir!
**11** Başa gələn hər müsibət, sadəcə Allahın biliyi çərçivəsində baş verər. Kim Allaha iman edərsə, Allah onun qəlbini yönəldər. Və Allah hər şeyi ən yaxşı biləndir.
**12** Və Allaha itaət edin, Elçiyə də itaət edin. Artıq üz çevirərsəniz, bilin ki, Elçimizin öhdəsinə düşən açıq-aşkar bir təbliğdir.
**13** Allah, Özündən başqa ilah deyə bir şey olmayandır. Artıq möminlər, işin nəticəsini sadəcə Allaha həvalə etsinlər.

(108/64, Təğabun / 7-13)

**Nəcm: 657**

**14** Ey iman etmiş kimsələr! Şübhəsiz zövcələrinizdən və övladlarınızdan sizə düşmən olanlar da var. O səbəblə, onlardan ehtiyat edin. Və əgər əfv edər, qüsurlarını üzlərinə vurmasanız, xoş görər və bağışlayarsanız, bilin ki, şübhəsiz Allah, çox bağışlayan, çox mərhəmət edəndir.
**15** Həqiqətən, mallarınız və övladlarınız sizi atəşə ata biləcək imtahan vasitəsidir. Allah isə, böyük mükafat Öz yanında olandır.
**16** O səbəblə, gücünüz yetdiyi qədər Allahın mühafizəsi altına daxil olun, eşidin və itaət edin. Və mallarınızdan, özünüzün yaxşılığına olaraq Allah yolunda xərcləyin / başda yaxınlarınız olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin edin. Kim də mənliyinin (nəfsinin) acgözlüyündən qorunarsa, bax onlar, müvəffəqiyyətə yetişənlərin məhz özləridir.
**17,18** Əgər Allaha gözəl bir ödünc verərsəniz, O, onu sizin üçün qat-qat artırar və sizi bağışlayar. Və Allah, ən yaxşı qarşılıq ödəyən, çox həlim, görünəni və görünməyəni biləndir, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

(108/64, Təğabun / 14-18)

# SƏFF (109 - 61) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

## Nəcm: 658

1 Göylərdə və yer üzündə olan şeylər, Allahı nöqsan sifətlərdən pak tutdular. Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
2,3 Ey iman etmiş kimsələr! Etməyəcəyiniz şeyləri nə üçün söyləyirsiniz? Etməyəcəyiniz şeyləri söyləməyiniz, Allah qatında cəzalandırılmağa səbəb olan böyük bir cinayət / günah olaraq təyin edildi.
4 Şübhəsiz Allah, Öz yolunda (bir-birinə möhkəm) rəbt edilmiş bir divar kimi səf çəkib savaşan kimsələri sevər. (109/61, Səff / 1-4)

## Nəcm: 659

5 Və bir vaxt Musa, qövmünə: "Ey qövmüm! Şübhəsiz mənim, sizin üçün Allahdan göndərilmiş bir elçi olduğumu bildiyiniz halda, nə üçün mənə əziyyət edirsiniz?" demişdi. Nə zaman ki, onlar əyrilib azdılar, Allah da onların qəlblərini əyrildib azdırdı. Və Allah, haqq yoldan çıxmış bir camaatı (doğru yola) yönəltməz.
6 Və bir vaxt Məryəm oğlu İsa: "Ey İsrail oğulları! Şübhəsiz mən, Tövratdan iki əlimin arasındakıları təsdiqləyən və məndən sonra gələcək, adı, Əhməd / tərifə başqalarından daha layiq (olan) bir elçini müjdələyən, Allahın bir elçisiyəm" demişdi. Sonra İsa onlara açıq-aşkar dəlillərlə gəlincə "Bu, açıq-aşkar bir sehrdir" dedilər.
(109/61, Səff / 5-6)

## Nəcm: 660

7 Və İslama dəvət olunduğu halda Allah üzərinə yalan uydurandan daha səhv; öz zərərinə olan əməli işləyən kimdir? Və Allah, şirk qoşaraq, küfr edərək səhv; öz zərərlərinə olan əməli işləyən camaatı (doğru yola) yönəltməz.
8 Onlar, ağızları ilə Allahın nurunu / göndərdiyi dini söndürmək üçün iradədən (güclərindən) istifadə edirlər. Halbuki kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] xoşlamasalar da Allah, nurunu / dinini tamamlayandır.
9 Allah, ortaq qoşanlar xoşlamasa da, Elçisini, haqq dini bütün dinlərin üzərinə çıxarması üçün doğru yol göstərənlə və haqq dinlə göndərəndir. (109/61, Səff / 7-9)

**Nəcm: 661**

**10-13** Ey iman etmiş kimsələr! Sizə, sizi ağrılı-acılı bir cəzadan qurtaracaq, qazanclı bir ticarət göstərimmi? Allaha və Onun Elçisinə iman edəcəksiniz; Allah yolunda canlarınızla, mallarınızla səy göstərəcəksiniz. Bax bu, əgər bilsəniz, sizin üçün daha yaxşıdır: Sizin günahlarınızı bağışlayar və sizi altlarından çaylar axan cənnətlərə və Ədn cənnətlərindəki xoş məskənlərə daxil edər. Bax bu, böyük qurtuluşdur. Və sizin sevəcəyiniz başqa bir şey də (əlavə olaraq): Allahdan yardım və yaxın bir fəth… Və iman edənlərə müjdə ver.
**14** Ey iman etmiş kəslər! Allahın yardımçıları olun; Necə ki, Məryəm oğlu İsa, həvarilərə: "Allah üçün mənim yardımçılarım kimdir?" demişdi. Həvarilər: "Allahın yardımçıları bizik" dedilər. Sonra İsrail oğullarından bir zümrə iman etdi, bir zümrə iman etmədi. Sonra da Biz, iman etmiş kimsələri, düşmənlərinə qarşı gücləndirdik və onlar üstün gəldilər. (109/61, Səff / 10-14)

## CUMUƏ (110 – 62) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 662**

**1** Göylərdə və yer üzündə olan şeylər, bütün kainatın hökmdarı, tərtəmiz, hər cür pislik və əskiklikdən uzaq olan, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olan, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edən Allahı nöqsan sifətlərdən pak tuturlar.
**2,3** O (Allah), Böyük şəhərlilərin / Məkkəlilərin arasında, özlərindən olan və Böyük şəhərlilərə və hələ onlara qatılmamış olan onlardan başqalarına Allahın ayələrini oxuyan, onları təmizləyən, onlara kitabı (öyrədən) və haqsızlığı, fəsadı, qarışıqlığı əngəlləmək üçün qoyulmuş qayda-qanun və prinsipləri öyrədən bir elçi göndərəndir. *–Onlar, öncələr açıq-aşkar bir azğınlıq içində olsalar da.–* Və O, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**4** Elçi göndərmək, Allahın istədiyi kəslərə verdiyi ərməğanıdır. Və Allah, böyük ərməğan sahibidir. (110/62, Cumuə / 1-4)

**Nəcm: 663**

**5** Özlərinə Tövrat yüklədilib, sonra onu daşımayan kimsələrin vəziyyəti, kitablar daşıyan eşşəyin vəziyyəti kimidir. Allahın ayələrini yalanlayan camaatın örnəyi necə də pisdir! Və Allah, şirk qoşaraq səhv; öz zərərlərinə olan əməli işləyən camaata doğru yolu göstərməz.

**6** De ki: "Ey Yəhudiləşmiş kimsələr! Əgər insanlar arasında yalnız özünüzün, Allahın yaxınları / yardımçıları olduğuna iman edirsinizsə, əgər doğru kimsələrsinizsə, dərhal ölümü istəyin."
**7** Halbuki onlar, əllərinin öndən göndərdiyi şeylər / işlədikləri günahlar üzündən, ölümü əsla istəməzlər. Və Allah, səhv; öz zərərinə olan əməli işləyənləri çox yaxşı biləndir.
**8** De ki: "Şübhəsiz sizin (gerçəkləşməsindən) qaçdığınız ölüm, mütləq sizə yetişəcək. Sonra görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi və hiss edilən hər şeyi bilənə döndəriləcəksiniz. O, sizə etdiyiniz şeyləri xəbər verəcək." (110/62, Cumuə / 5-8)

## Nəcm: 664

**9** Ey iman etmiş kəslər! Toplantı (cəm olma) günü səlat üçün [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmək üçün] səslənildiyi zaman, Allahın xatırlanmasına dərhal tələsin, alış-verişi buraxın. Əgər bilsəniz, bax bu, sizin üçün daha xeyirlidir.
**10** Sonra da səlat [maddi və zehni baxımdan dəstək olmaq; cəmiyyəti maarifləndirmək] gerçəkləşdirildiyində, dərhal yer üzündə dağılın və Allahın ərməğanlarından axtarın. Və zəfər qazanmağınız, (öz) vəziyyətinizi qorumağınız üçün Allahı çox xatırlayın.
(110/62, Cumuə / 9-10)

## Nəcm: 665

**11** Və onlar, bir ticarət və əyləncə gördükləri zaman ona getdilər və səni ayaq üstə qoydular. De ki: "Allahın yanında olan şeylər, əyləncədən və ticarətdən xeyirlidir. Və Allah, ruzi verənlərin ən xeyirlisidir." (110/62, Cumuə / 11)

# FƏTH (111 – 48) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

## Nəcm: 666

**1-3** Şübhəsiz Biz, Allah sənin günahlarından keçmiş və gələcək olanları bağışlasın, sənə olan nemətini tamamlasın, səni ən doğru yola yönəltsin və Allah, sənə çox güclü bir zəfərlə yardım etsin deyə, sənə açıq-aşkar fəth bəxş etdik.[400]
**4** O, öz imanları ilə birlikdə, iman baxımından artsınlar deyə möminlərin qəlblərinə qəlbi təskin edən güvən və sakitlik hissini / mənəvi güc (əhval-ruhiyyə) endirəndir. Göylərin və yerin orduları da yalnızca Allahındır. Və Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır. (111/48, Fəth / 1-4)

**Nəcm: 667**

7 Göylərin və yer üzünün orduları da Allahındır. Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.

8,5,6 Şübhəsiz Biz, mömin kişiləri və mömin qadınları, içində daimi qalanlar olaraq, altlarından çaylar axan cənnətlərə daxil etməsi və onların pisliklərini örtməsi üçün *–bax bu, Allah qatında böyük bir qurtuluşdur–;*

və Allah haqqında pis gümanda olan o münafiq kişilərə və münafiq qadınlara, Allaha ortaq qoşan kişilərə və ortaq qoşan qadınlara əzab verməsi üçün *–pislik onların üzərinə olmuşdur. Allah onlara qəzəb etmiş, onları uzaqlaşdırmış; rəhmətindən məhrum etmiş və onlar üçün cəhənnəmi hazırlamışdır. Ora necə də pis bir yerdir!–;* səni şahid, müjdə verən və xəbərdarlıq etmək üzrə elçi etdik.[401]

(111/48, Fəth / 7, 5-6)

**Nəcm: 668**

10 Şübhəsiz sənə bağlılıq (sədaqət) andı içən bu kimsələr, əslində Allaha bağlılıq (sədaqət) andı içməkdədirlər. Allahın gücü; nemətləri, yardımları onların güclərinin; yardımlarının, xidmətlərinin üzərindədir. O səbəblə kim sözündən dönərsə, artıq sadəcə özünün əleyhinə olaraq dönmüşdür. Kim də Allaha verdiyi sözə vəfa göstərərsə, Allah ona dərhal böyük bir mükafat verəcək.

11 Bədəvi ərəblərdən geridə qalmış; sizinlə gəlməyənlər, yaxında sənə deyəcəklər: "Mallarımız və ailələrimiz bizi məşğul etdi / saxladı. Haydı, Allahdan bizim bağışlanmağımızı dilə." Onlar, qəlblərində olmayanı dilləri ilə söyləyirlər. De ki: "Allah, sizə bir zərər dilədisə və ya bir xeyir dilədisə, Ona (Allaha) qarşı kimin bir şeyə gücü çata bilər? Əksinə, Allah etdiklərinizdən xəbərdardır."

12 Əslində siz Elçi və möminlərin, ailələrinin yanına / yaxınlarının yanına sonsuzadək geri dönməyəcəklərini sanmışdınız. Bu, sizin könlünüzə də xoş gəlmişdi. Və siz, pis gümanda oldunuz və dəyişikliyə / məhvə məruz qalan bir camaat oldunuz.

13 Və kim Allaha və Elçisinə iman etməzsə, bilsin ki, şübhəsiz Biz, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr] üçün çılğın bir atəşi hazırlamışıq.

14 Və göylərin və yer üzünün hökmranlığı Allahındır. O, istədiyini bağışlayar, istədiyinə əzab verər. Və Allah, çox bağışlayandır, çox mərhəmət edəndir.

15 Siz qənimətləri almaq üçün getdiyiniz vaxt, o geri qalanlar: "Qoyun

biz də sizin arxanızca gələk" deyəcəklər. Onlar, Allahın sözünü dəyişdirmək istəyərlər. De ki: "Siz, əsla bizimlə gələ bilməyəcəksiniz. Allah, daha öncə belə buyurmuşdur." Sonra onlar deyəcəklər: "Əksinə, siz, bizi qısqanırsınız" deyəcəklər. Əksinə onlar, çox az şey xaricində anlamazlar.
**16** Bədəvi ərəblərdən, geridə qoyulanlara de ki: "Siz, yaxında çox qüvvətli bir camaata qarşı çağırılacaqsınız, onlarla savaşarsınız və ya onlar Müsəlman olarlar. Artıq, əgər itaət edərsəniz, Allah sizə gözəl bir mükafat verər. Amma öncədən yan keçdiyiniz (əhəmiyyət vermədiyiniz) kimi yenə də yan keçərsəniz, sizə ağrılı-acılı bir əzab ilə əzab verər."
**17** Kor üçün bir vəbal yoxdur, topal üçün də bir vəbal yoxdur, xəstə üçün də bir vəbal yoxdur. Bununla bərabər, kim Allaha və Elçisinə itaət edərsə, Allah onu, altından çaylar axan cənnətlərə daxil edər. Kim də yan keçərsə, ona ağrılı-acılı bir əzab ilə əzab verər. (111/48, Fəth / 10-17)

## Nəcm: 669

**18,19** And olsun o ağacın altında sənə bağlılıq (sədaqət) andı içdikləri zaman Allah, möminlərdən razı olmuşdur. Bax qəlblərində olanı bilmiş, onlara qəlbi təskin edən güvən və sakitlik hissi / mənəvi güc (əhval-ruhiyyə) vermiş və onları çox yaxın bir fəth və alacaqları bir çox qənimətlər ilə mükafatlandırmışdır. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**20,21** Və Allah sizə, alacağınız bir çox qənimətləri və sizin gücünüz çatmayan, amma Allahın sizin üçün əhatə etdiyi başqa şeyləri, siz faydalanasınız və möminlərə bir əlamət olsun, Allah sizi ən doğru yola yönəltsin deyə vəd etmişdir. Allah, bax bunu sizə dərhal vermiş və insanların əllərini sizdən çəkmişdir. Və Allah, hər şeyə ən yaxşı qadir olandır.
**22,23** Və əgər kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmiş kimsələr] sizinlə savaşsaydılar, həqiqətən Allahın keçmişdən bu günə gələn qayda-qanunu / adətə uyğun olaraq, arxalarını çevirib qaçardılar. –*Allahın qanununda əsla bir dəyişiklik tapa bilməzsən.*– Sonra bir yol göstərən, qoruyan (himayə edən) yaxın və yardımçı da tapa bilməzdilər.
**24,25** Və Allah, sizi onlara qarşı müzəffər etdikdən sonra, Məkkənin vadisində; Hüdeybiyyədə, Allahın istədiyi kimsəni (Öz) rəhmətinə daxil etməsi üçün, onların əllərini sizdən, sizin əllərinizi də onlardan çəkəndir. Və Allah, etdiklərinizi ən yaxşı görəndir. Onlar, Allahın ilah

və rəbb olduğunu qəbul etməyən və sizi Məscidülhəramdan və hazırlanmış hədylərin / həcc edənlərə göndərilən azuqələrin yerinə çatmasını əngəlləyən kimsələrdir. Əgər özlərini hələ tanımadığınız, bilməyərək əzmək surətiylə məsuliyyətlərini boynunuza götürəcəyiniz mömin kişilər, mömin qadınlar olmasaydı, əgər onlar bir-birindən (seçilib) ayrılmış olsaydılar, həqiqətən onlardan Allahın ilah və rəbb olduğuna iman etməyən kimsələrə ağrılı-acılı bir əzab ilə əzab verərdik.

**26** Bir vaxt kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələr], cahiliyyə qalığı (olan) qüruru, soy təəssübkeşliyini və mühafizəkarlığı öz qəlblərində alovlandırıb coşdurduqları zaman, Allah dərhal, Elçisinin və möminlərin üzərinə qəlbi təskin edən güvən və sakitlik hissini / mənəvi güc (əhval-ruhiyyə) vermiş və o möminlərin "təqva / Allahın mühafizəsi altına daxil olmaq" sözünə bağlamışdı / sadiq qalmalarını təmin etmişdi. Onsuz da onlar, buna layiq idilər və buna haqları var idi. Allah, hər şeyi ən yaxşı biləndir.
(111/48, Fəth / 18-26)

## Nəcm: 670

**27** And olsun ki Allah, Elçisinə o görünüşü (qabaqcadan olacağını göstərib bildirdiyi); "Siz, Allah istəyərsə, mütləq güvən içində başlarınızı qırxdırmış və qısaltmış kəslər olaraq, qorxmadan Məscidülhərama daxil olacaqsınız" görünüşünü (qabaqcadan olacağını göstərib bildirdiyini) haqq ilə doğru çıxartdı. Elə isə Allah, sizin bilmədiyinizi bilir. Sonra da sizə bundan aşağı / yaxın bir fəth bəxş etdi.

**28,9** Allah, haqq dini bütün dinlərdən üstün etmək üçün, **9** Allaha və Elçisinə iman etməyiniz, Ona yardım etməyiniz, Ona ehtiram göstərməyiniz və hər zaman Onu hər cür nöqsanlıqdan pak tutmağınız üçün; Elçisini doğru yol göstərən Quran və haqq din ilə göndərəndir. Şahid olaraq da Allah yetər. (111/48, Fəth / 27-28, 9)

## Nəcm: 671

**29** Muhəmməd, Allahın elçisidir / Allahın elçisi Muhəmməd və onunla bərabər olan kimsələr də *–Allahın, onlarla düşmənləri qəzəbləndirməsi üçün– kafirlərə* [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] qarşı sərt, öz aralarında mərhəmətlidirlər. Sən onları, Allahın lütfünü və bir razılığını istəyərək Allahın birliyini öyrədənlər, boyun əyib təslimiyyət göstərənlər olaraq görərsən. Onların Allaha təslimiyyətlərindən nişanları, bütün varlıqlarında / hər tərəflərində bəlli olar. Bu, onların Tövratdakı örnəkləridir. Onların İncildəki

örnəkləri də cücərtisini yarıb çıxarmış, sonra onu qüvvətləndirərək qalınlaşmış, sonra da gövdəsi üzərinə dik qalxmış bir əkin kimidir. Bu, əkinçilərin də xoşuna gələr. Allah, onlardan iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə bağışlanma və böyük bir mükafat söz vermişdir. (111/48, Fəth / 29)

## MAİDƏ (112 – 5) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 672**

1 Ey iman etmiş kimsələr! Sözləşmələri yerinə yetirin. Siz, toxunulmaz ikən [həcci / ali ilahiyyat təhsilini davam etdirərkən] ov etməyi halal görməmək şərti ilə, sizə oxunacaqlar xaric, dördayaqlı, cütdırnaqlı, gövşəyən və ot yeyən heyvanların qüsursuzları / gərdənliyi olmayanları sizə halal edildi. Şübhəsiz Allah, istədiyini hökm edər; istədiyi qanunu qoyar.
2 Ey iman etmiş kimsələr! Allahın əlamətlərinə, haram aya, hədyə / həcc edənlərə azuqə yollamağa, hədiyyə etməyə, gərdənliklərinə [həcc edənlərin / orada ali ilahiyyat təhsili üçün olanların yeməsi üçün göndərilən heyvanlara qoyulan işarətlərinə] və Rəblərindən lütf və razılıq gözləyərək Beytülhərama (daxil olmaq istəyənlərə) / həcc görəvini etmək istəyənlərə hörmətsizlik etməyin. Toxunulmazlığınız (aradan) qalxdığında / həcc görəviniz bitdiyində də ov edin. Sizi Məscidülhəramdan çevirdiklərinə görə bir camaata qarşı olan kininiz, sizi təcavüzə sövq etməsin. Və "yaxşı adam" olmaq və Allahın mühafizəsi altına daxil olmaq üzərində yardımlaşın, günah və düşmənçilik etməkdə köməkləşməyin. Və Allahın mühafizəsi altına daxil olun. Heç şübhəsiz Allah, əzabı / sorğu-sual etməsi çox çətin (şiddətli) olandır.
3 Sizə leş, qan, donuzun əti, Allahdan başqasının adı xatırlanaraq kəsilən, boğulmuş, vurulmuş, yuxarıdan düşmüş, buynuzla vurulmuş, yırtıcı heyvanların yeyib və canlı ikən kəsmədikləriniz, *[bunlardan [donuzun əti də daxil] təmizləyə bildikləriniz, zərərini önləyə bildikləriniz xaric]*, dikinə qoyulmuş daşların üzərində kəsilənlər və fal oxları ilə qismət axtarmağınız haram edildi. Bunların hamısı doğru yoldan çıxmaqdır. Bu gün bu kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr], sizin dininizdən ümidsizliyə düşmüşlər. Elə isə onların qarşısında hörmətlə, sevgiylə, biliklə ürpərməyin. Mənim qarşımda hörmətlə, sevgiylə, biliklə ürpərin. Bu gün dininizi sizin üçün kamala yetişdirdim, sizə (olan) nemətimi tamamladım. Sizə din olaraq da İslama razı oldum. Artıq kim son dərəcə aclıq içində, günaha istəklə yönəlmədən məcbur qalarsa, bilsin

ki, şübhəsiz Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.
(112/5, Maidə / 1-3)

## Nəcm: 673

**4** Səndən, onlara nəyin halal edildiyini soruşurlar. De ki: "Sizə yaxşı və təmiz şeylər və Allahın sizə öyrətdiyindən öyrədərək yetişdirdiyiniz (əhliləşdirdiyiniz) ovçu heyvanların ovları halal edildi." Artıq onların sizin üçün tutduqlarından yeyin və üzərində Allahın adını xatırlayın və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, haqq-hesabı çox tez görəndir.
**5** Bu gün sizə yaxşı və təmiz şeylər halal edildi. Kitab verilənlərin yeməyi sizə halal, sizin də yeməyiniz onlara halaldır. Möminlərdən azad qadınları və sizdən öncə özlərinə Kitab verilənlərdən azad qadınları da, nikahlayaraq qoruma (himayə) altına alınmış biri etmək, –*zina etməmək və gizlicə dostluq (aşna) etməmək şərti ilə*– onlara mehrlərini[402] ödədiyiniz durumlarda sizə halal edildi. Kim imanı tanımayıb küfr edərsə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsə], Artıq həqiqətən onun etdiyi boşa getmişdir və o, axirətdə itkiyə / zərərə uğrayıb acı çəkən kimsələrdəndir. (112/5, Maidə / 4,5)

## Nəcm: 674

**6** Ey iman etmiş kəslər! Səlata [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarına] doğru qalxdığınız / camaat içinə çıxdığınız zaman, dərhal üzlərinizi və dirsəklərə qədər əllərinizi yuyun. Başlarınızı və iki topuğa qədər ayaqlarınızı əl ilə silin. Və əgər cünub / həddindən artıq şəhvət səbəbiylə ağlınız başınızda olmayacaq vəziyyətdəsinizsə təmizlik üstünə təmizlik edin [cinsi əlaqəyə girin, orqazm olun və yuyunun]. Və əgər xəstəsinizsə, yaxud (yolda) səfərdəsinizsə, yaxud sizdən biri ayaq yolundan gəlmişsə, yaxud qadınlarla təmaslaşdınızsa / cinsi əlaqəyə girdinizsə, sonra da su tapa bilməmişsinizsə, dərhal təmiz bir torpağa yönəlin. Sonra da təmiz torpaqla üzlərinizi və əllərinizi əl ilə silin. Allah, sizə hər hansısa bir çətinlik çıxarmaq istəməz, fəqət sizi təmizləmək və özünüzə verilən nemətlərin qarşılığını ödəməyiniz üçün üzərinizdəki nemətini tamamlamaq istəyər.
**7** Və Allahın, üzərinizdəki nemətini və: "Eşitdik, itaət etdik" dediyinizdə sizdən aldığı, Onunla (Allahla) sözləşdiyiniz "qəti sözləşmə"sini xatırlayın. Və Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, sinələrin içindəkini çox yaxşı biləndir.
**8** Ey iman etmiş kəslər! Allah üçün, həqqaniyyəti ayaqda tutan

şahidlər olun. Və bir camaata (qarşı) olan kininiz, sizi ədalətsizlik etməyə sürükləməsin. Ədalətli olun, ədalətli olmaq, Allahın mühafizəsi altına daxil olmağa daha yaxındır. Allahın mühafizəsi altına daxil olun. Şübhəsiz Allah, etdiklərinizdən xəbərdardır.
**9** Allah, iman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə vəd etmişdir: Bağışlanma və böyük mükafat yalnızca onlaradır.
**10** İnkar edən və ayələrimizi yalanlayan kimsələr də; bax onlar, cəhənnəm əhlidir.
**11** Ey iman etmiş kimsələr! Allahın sizin üzərinizdə olan nemətini xatırlayın. Bir vaxt bir topluluq sizə əl qaldırmaq niyyətinə düşmüşdü, ancaq Allah onların əllərini sizdən çəkmişdi. Və Allahın mühafizəsi altına daxil olun. Artıq möminlər də işin nəticəsini yalnızca Allaha həvalə etsinlər. (112/5, Maidə / 6-11)

**Nəcm: 675**

**12** Və and olsun ki, Allah, İsrail oğullarının sağlam sözünü almışdı. Və Biz, onlardan on iki müfəttiş / başçı (rəhbər) göndərmişdik. Və Allah demişdi ki: “Mən, həqiqətən sizinlə bərabərəm. Səlatı iqamə edər [maddi və zehni baxımdan dəstək olar; cəmiyyəti maarifləndirmə qurumlarını qurar, ayaqda tutar], zəkatı / verginizi verər, elçilərimə iman edər, onları dəstəkləyər və Allaha gözəl şəkildə ödünc verərsəniz, and olsun ki, sizdən pisliklərinizi örtəcəyəm və sizi altından çaylar axan cənnətlərə daxil edəcəyəm. Bax sizdən hər kim ki, bundan sonra küfr edərsə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edərsə], artıq həqiqətən yolun doğrusunu itirmiş olar.”
**13** Sonra da sözlərini pozmaları səbəbiylə onları uzaqlaşdırdıq və qəlblərini qatılaşdırdıq. Onlar kəlmənin / sözü yerlərindən / öz mənalarından dəyişdirirlər. Öyüd aldıqlarının önəmli bir bölümünü də tərk etdilər. Aralarından az bir qismi istisna olmaqla, (sən) onlardan daima xainlik görərsən. Yenə də sən, onları əfv et və (onlara) əhəmiyyət vermə. Şübhəsiz Allah, gözəl-yaxşı əməl işləyənləri sevər.
**14** “Biz, Nəsarayıq / Xristianıq” deyənlərdən də sağlam sözlərini almışdıq. Onlar da özlərinə xatırladılan şeylərin çoxunu tərk etdilər. Biz də onların arasına, qiyamətə qədər davam edəcək kin və düşmənçilik yerləşdirdik. Allah, yaxında etdiklərini onlara xəbər verəcəkdir. (112/5, Maidə / 12-14)

**Nəcm: 676**

**15,16** Ey Kitab əhli! Həqiqətən, Kitabdan gizlətdiyiniz şeylərin çoxunu meydana çıxaran, çoxundan da imtina edən Bizim elçimiz sizə

gəldi. Həqiqətən sizə, Allahdan bir nur və açıq-aşkar bir Kitab gəldi. Allah, o Kitabla Öz rizasına uyanları salamatlıq yollarına yönəldər. Onları Öz biliyi ilə qaranlıqlardan aydınlığa çıxarar və onları ən doğru yola yönəldər.
**17** And olsun ki, "Şübhəsiz Allah, Məryəm oğlu Məsihin elə özüdür" deyən kimsələr kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] olmuşdur. De ki: "Yaxşı, Allah Məryəm oğlu Məsihi, anasını və bütün yer üzündəki kimsələri dəyişikliyə / məhvə məruz qoymaq istəsə, Ona qarşı kim bir şey edə bilər? Göylərin, yer üzünün və ikisinin arasındakilərin mülkiyyəti də sadəcə Allaha aiddir. O, istədiyini yaradandır. Və Allah, hər şeyə ən yaxşı qadir olandır."
**18** Yəhudilər və Xristianlar, "Biz, Allahın oğullarıyıq və Onun sevimliləriyik" dedilər. De ki: "Madam ki, elədir, nə üçün günahlarınız səbəbiylə Allah sizə əzab verir?" Əksinə, siz, Onun yaratdıqlarından bir bəşərsiniz. O, istədiyi adamı bağışlayar, istədiyinə də əzab verər. Göylərin, yerin və ikisinin arasında olan hər şeyin sahibliyi, idarə edilməsi də Allaha məxsusdur. Dönüş də yalnızca Onadır.
**19** Ey Kitab əhli! Elçilərin ardı-arasının kəsildiyi bir vaxtda, "Bizə müjdə verən və xəbərdarlıq edən gəlmədi" deməyəsiniz deyə, sizə təbyin edən / açıq-aşkar ortaya qoyan Elçimiz gəldi. Bax həqiqətən müjdə verən və xəbərdarlıq edən sizə gəldi. Allah, hər şeyə ən çox qadir olandır.
**20,21** Və bir vaxt Musa, qövmünə: "Ey qövmüm! Allahın üzərinizdəki nemətini xatırlayın. Bir vaxt Allah, sizin aranızdan peyğəmbərlər göndərdi. Sizi də hökmdarlar etdi. Və aləmlərdən heç bir kimsəyə vermədiyini sizə verdi. Ey qövmüm! Allahın sizin üçün yazdığı təmizlənmiş torpağa daxil olun, geriyə dönməyin, yoxsa itkiyə uğrayanlar olaraq dönərsiniz" dedi.
**22** Onlar: "Ey Musa! Şübhəsiz orada zorakılıq edən bir camaat var. Onlar oradan çıxmadıqca, biz oraya əsla girməyəcəyik. Əgər onlar oradan çıxarlarsa, şübhəsiz biz də daxil olarıq" dedilər.
**23** Qorxanlardan və Allahın özlərinə nemət verdiyi iki nəfər dedi ki: "Onların üzərlərinə qapıdan daxil olun. Bax oradan daxil olarsanız, şübhəsiz siz, qalib olarsınız. Əgər iman edirsinizsə, artıq işin nəticəsini yalnızca Allaha həvalə edin."
**24** Musanın qövmü: "Ey Musa! Şübhəsiz biz, onlar orada olduğu müddətcə, biz oraya əsla daxil olmayacağıq. Artıq sən və Rəbbin gedin (onlarla) savaşın. Şübhəsiz biz, burada oturacağıq" dedilər.
**25** Musa: "Ey Rəbbim! Mən, özümlə qardaşımdan başqasına söz keçirə bilmirəm. Artıq bizimlə bu haqq yoldan çıxmış camaatın arasını ayır" dedi.

**26** Allah dedi ki: “Artıq təmizlənmiş torpaqlar onlara qırx il haram edilmişdir. Yer üzündə sərgərdan gəzəcəklər. O səbəblə sən, haqq yoldan çıxmış o camaat üçün narahat olma!” (112/5, Maidə / 15-26)

**Nəcm: 677**

**27-29** Onlara iki Adəm oğlunun xəbərini də olduğu kimi oxu. O vaxt hərəsi bir qurban təqdim etmişdilər, lakin birindən (qurbanı) qəbul edilmiş, digərindən isə qəbul edilməmişdi. O: “Səni mütləq öldürəcəyəm” dedi. Digəri: “Allah, yalnız Özünün mühafizəsi altına daxil olan şəxslərdən (qurbanı) qəbul edər. Sən, məni öldürmək üçün əlini mənə uzatsan da, mən əlimi, səni öldürmək üçün uzadan deyiləm [mən əlimi, səni zərərsizləşdirmək üçün uzadaram]. Şübhəsiz mən, aləmlərin Rəbbi Allahdan qorxuram. Şübhəsiz mən, istəyirəm ki, sən məni öldürməyin səbəbiylə olacaq günahı və öz günahını da yüklənib Atəşin əhlindən olasan! Şirk qoşaraq, küfr edərək səhv [öz zərərinə olan əməli işləyənlərin də] cəzası budur!” dedi.
**30** Belə olduqda, qurbanı qəbul edilməyənin eqosu, qardaşını öldürməyi ona asan göstərdi, sonra da onu öldürdü. Özü də zərərə uğrayanlardan oldu.
**31** Sonra Allah, dərhal ona qardaşının cəsədini necə basdırmalı olduğunu göstərmək üçün torpağı eşən bir qarğa göndərdi. O, “Vay mənim halıma, mən, bu qarğa kimi olmaqla aciz oldummu ki, qardaşımın cəsədini basdırıram.” dedi. Sonra da peşman olanlardan oldu.
**32** Bax Bunun üçün Biz, [bunların cərəyan edilməsinə görə] İsrail oğullarına “Şübhəsiz hər kim bir şəxs və ya yer üzündə fəsadın qarşılığı olmadan bir şəxsi öldürərsə, artıq bütün insanları öldürmüş kimi olar. Kim də bir şəxsin yaşamasına səbəb olarsa, bütün insanları yaşatmış kimi olar” şəklində vacib etdik. Və həqiqətən onlara elçilərimiz açıq-aydın dəlillər ilə gəldilər. Sonra da, şübhəsiz onların bir çoxu, həqiqətən yer üzündə davranışında həddini aşan kimsələrdir.
(112/5, Maidə / 27-32)

**Nəcm: 678**

**33,34 Allaha və Elçisinə qarşı savaşan; pozmağa təşəbbüs edən və yer üzündə fəsad çıxarmağa çalışanların *–siz onların üzərində güclü (hakim) olmamışdan / onları ələ keçirib göz altına almamışdan öncə xətalarından dönənlər xaric–* qarşılığı ancaq öldürülmələri [təhsilə təlimə tabe tutub dönmələrinin təmin edilməsi] və ya <u>şəhər həyatından uzaqlaşdırılıb kənd təsərrüfatı işlərində işlədilməsi, daş karxanalarında işlədilmələri,</u> yaxud**

**müqavilələrdən; öhdəliklərdən əlaqələrinin kəsilməsi, ya da olduqları yerdən sürgün edilmələridir. Bu, onlar üçün dünyada bir alçalmadır (rüsvayçılıqdır). Axirətdə də onlar üçün böyük bir əzab vardır. Artıq yaxşı bilin ki, Allah çox bağışlayan və çox mərhəmət edəndir.** (112/5, Maidə / 33-34)

## Nəcm: 679

35 Ey iman etmiş kəslər! Qurtulmağınız, zəfər qazanmağınız üçün Allahın mühafizəsi altına daxil olun, Ona yaxınlaşdıracaq / çatdıracaq şeyləri axtarın və Onun yolunda səy göstərin.
36 Şübhəsiz, kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr], bütün yer üzündəkilər və onunla birlikdə bir o qədəri yenə (əlavə edilsə), özlərinin olsa və (bunun hamısını) qiyamət gününün əzabından qurtulmaq üçün (fidyə) versələr, onlardan qəbul edilməz. Və onlar üçün ağrılı-acılı bir əzab var.
37 Onlar, Atəşdən çıxmaq istəyərlər. Amma oradan çıxan deyillər. Və onlar üçün davamlı bir əzab var. (112/5, Maidə / 35-37)

## Nəcm: 680

38 Oğru kişi və oğru qadın; bunların etdiklərinə qarşılıq, Allah (tərəfindən) bir əngəlləyici tətbiq olaraq dərhal ikisinin də gücünü / güclərini kəsin. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
39 Sonra kim etdiyi haqsızlıqdan sonra tövbə edər və düzəldərsə, bilsin ki, şübhəsiz Allah, onun tövbəsini qəbul edər. Şübhəsiz Allah,
çox bağışlayandır, çox mərhəmət edəndir. 40 Göylərin və yerin
sahibliyinin, idarəçiliyinin Allaha aid olduğunu bilmədinmi? O, istədiyinə əzab verər, istədiyini də bağışlayar. Və Allah, hər şeyə ən yaxşı qadir olandır. (112/5, Maidə / 38-40)

## Nəcm: 681

41 Ey Elçi! Qəlbləri iman etmədiyi halda ağızları ilə "İman etdik" deyən kimsələr və Yəhudiləşmişlərdən, dayanmadan yalana qulaq asan və sənin yanına gəlməyən kimsələr üçün dinləyən / casusluq edən, küfr [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmək] içində qaçışan bu kimsələr səni üzməsin. Onlar, kəlməni yerlərindən dəbərdib (oynadıb) dəyişdirirlər. "Əgər sizə bu verilərsə dərhal alın, o verilməzsə ehtiyat edin!" deyərlər. Allah, bir kimsəni dindən çıxarmaq, atəşinə salmaq istəyərsə, sən Allaha qarşı, onun (o kimsənin) lehinə heç bir şey edə bilməzsən. Onlar, Allahın, qəlblərini təmizləmək istəmədiyi

kimsələrdir. Onlar üçün dünyada rüsvayçılıq var və axirətdə onlara çox böyük bir əzab var.
42 Yalana çox qulaq asanlar, haramı çox yeyənlər; artıq onlar, əgər sənin yanına gələrlərsə, aralarında hökm et və ya onlardan kənar dur. Və əgər onlardan kənar durarsan, artıq sənə heç bir zaman zərər verə bilməzlər. Və əgər hökm edəcəksənsə, o zaman aralarında həqqaniyyətlə (haqqa uyğun) hökm et. Şübhəsiz Allah, həqqaniyyətlə (haqqa uyğun) davrananları sevər.
43 İçərisində Allahın hökmü olan Tövrat yanlarında ikən, səni necə həkəm (münsif təyin) edirlər, ondan sonra da geri addım atırlar? Onlar, iman edən kimsələr deyillər.
44 İçərisində doğru yol rəhbəri və nur olan Tövratı, şübhəsiz Biz nazil etdik. Müsəlmanlaşmış şəxslər olan peyğəmbərlər onunla Yəhudilərə hökm edərlər, özlərini Allaha həsr etmiş şəxslər və xaxamlar da, Allahın kitabından, qorumaları özlərindən tələb olunan və özlərinin də üzərinə şahidlik etdikləri şeylərlə hökm edərlər. İnsanlara ehtiram göstərib ürpərməyin, Mənə ehtiram göstərib ürpərin. Mənim ayələrimi də az bir pula satmayın. Və kim, Allahın nazil etdiyi ilə hökm etməzsə, bax onlar kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] məhz özüdür.
45 Və Biz, Tövratda onlara, cana can, gözə göz, buruna burun, qulağa qulaq, dişə diş yazdıq. Yaralara qisas var. Bununla bərabər, kim qisas haqqını bağışlayarsa, bu özü üçün kəffarə olar. Və kim Allahın nazil etdiyi ilə hökm etməzsə, bax onlar səhv; öz zərərinə olan əməli işləyənlərin məhz özüdür.
46 Və Biz o peyğəmbərlərin izləri üzərinə (onların ardınca), yanlarındakı Tövratın içində bəhs edilənləri təsdiqləyici olaraq Məryəm oğlu İsanın gəlməsini təmin etdik. Və ona, Tövratın içində bəhs edilənləri təsdiqləmək, Allahın mühafizəsi altına daxil olmuş kəslərə yol göstərmək və öyüd olmaq üzrə, içində yol göstərmə (hiayət) olan İncili verdik.
47 İncil əhli də Allahın onda (İncildə) nazil etdikləri ilə hökm etsinlər. Kim, Allahın nazil etdiyi ilə hökm etməzsə, artıq bax onlar, haqq yoldan çıxanların məhz özüdür.
48 Sənə də Tövratın bir hissəsinin içərisində bəhs edilənləri təsdiqləyən və onları qoruyub qollayaraq haqq ilə Kitabı / Quranı nazil etdik. Elə isə, onların aralarında Allahın nazil etdiyi ilə hökm et. Sənə gələn haqdan azaraq onların arzu və həvəslərinə uyma. Və Biz, sizin hamınız üçün bir yol xəritəsi / cəmiyyət halında yaşamağın prinsiplərini və geniş, işıqlı bir yol təyin etdik. Və əgər Allah istəsəydi, sizi tək bir öndərli cəmiyyət edərdi, fəqət sizə verdikləri ilə izi

çətinliyə salmaq / sınamaq üçün belə etmədi. Elə isə yaxşılıqlar üçün yarışın. Hamınızın dönüşü yalnızca Allahadır. Sonra O, haqqında anlaşılmazlığa (ixtilafa) düşdüyünüz şeyləri sizə xəbər verəcəkdir.
**49** Sən, yenə aralarında Allahın nazil etdiyi ilə hökm et, onların arzu-istəklərinə uyma. Səni; Allahın sənə nazil etdiyinin bir qismindən; mübarizəndən yayındıraraq atəşə atmalarından ehtiyat et. Artıq arxa çevirərlərsə, artıq bil ki, şübhəsiz Allah, bir qisim günahları səbəbiylə / günahlarının acısıyla onları müsibətə uğratmaq istəyir. Və şübhəsiz insanların lap çoxu həqiqətən haqq yoldan çıxan kimsələrdir.
**50** Yoxsa cahiliyyət (dövrünün) hökmünümü axtarırlar? Həqiqətən bilən bir camaat üçün, hökm (vermək) baxımından Allahdan daha gözəl kim ola bilər? (112/5, Maidə / 41-50)

## Nəcm: 682

**51** Ey iman etmiş kimsələr! Yəhudiləri və Nəsaranı / Xristianları yardımçı, yol göstərici, qoruyucu (himayə edən) yaxınlar qəbul etməyin. Onlar bir-birlərinin qoruyucu (himayə edən), yol göstərici yaxınıdır. Sizdən kim onları mutəvəlli [qoruyucu (himayə edən), nəzarətçi, yönətici] edərsə, artıq o, şübhəsiz onlardandır. Şübhəsiz Allah, şirk qoşaraq, küfr edərək səhv; öz zərərlərinə olan əməli işləyən topluluğa yol göstərməz. (112/5, Maidə / 51)

## Nəcm: 683

**52** Bundan sonra qəlblərində xəstəlik olan [xarab düşüncəli] kimsələrin: “Bizə bir fəlakət gəlməsindən ürpəririk” deyərək, onların içində vurnuxduqlarını görəcəksən. Artıq ümid edilir ki, Allah, bir fəth (zəfər) və ya (Öz) qatından bir əmr gətirər ki, içlərində gizlədikləri şeylərə (görə) peşman olan kimsələr olarlar.
**53** Və iman etmiş kəslər deyərlər: “Həqiqətən sizinlə bərabər olduqlarına dair, Allaha bütün gücləriylə and içənlər bunlardırmı?” Onların əməlləri boşa getmişdir və onlar itkiyə məruz qalanlar olmuşdur. (112/5, Maidə / 52-53)

## Nəcm: 684

**54** Ey iman etmiş kimsələr! Sizdən kim dinindən dönərsə, bilsin ki, Allah yaxında möminlərə qarşı mülayim, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəslərə] qarşı da qürurlu və şiddətli bir camaat gətirər ki, Allah onları sevər, onlar da Onu sevərlər; onlar, Allah yolunda səy göstərərlər və heç bir qınayıcının qınamasından qorxmazlar. Bu, Allahın istədiyinə verdiyi bir ərməğandır. Allah, biliyi və rəhməti geniş və hədsiz olandır, çox yaxşı biləndir.

55 Sizin yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınınız, sadəcə Allahdır, Onun Elçisidir, bir də Allahın bir olduğunu təsdiq edərək səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını quran, ayaqda tutan], zəkatı / vergini verən iman etmiş kimsələrdir.
56 Allahı, Onun Elçisini və iman edənləri özünə yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxın (olaraq) qəbul edənlər bilsinlər ki, həqiqətən Allahın tərəfdarları, qalib olanların məhz özüdür. (112/5, Maidə / 54-56)

**Nəcm: 685**

57 Ey iman etmiş kimsələr! Sizdən öncə özlərinə kitab verilənlərdən və kafirlərdən [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlərdən] dininizi məsxərə və əyləncə sayanları (özünüzə) yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar qəbul etməyin. Əgər möminsinizsə, Allahın mühafizəsi altına daxil olun.
58 Və siz, onları səlata [maddi və zehni baxımdan dəstək olmağa; cəmiyyəti maarifləndirməyə] çağırdığınız zaman, onlar onu məsxərə və əyləncə sayırlar. Bu, onların, ağıllarını işlətməyən bir camaat olmalarındandır.
59 De ki: "Ey Kitab əhli! Bizim, sadəcə Allaha, bizə nazil edilənə və daha öncə nazil edilənə iman etməmiz və şübhəsiz sizin çoxunuzun haqq yoldan çıxmış kimsə olması üzündənmi bizdən xoşlanmırsınız?"
60 De ki: "Allah qatında cəzalandırılma baxımından bunlardan daha pisini sizə xəbər verimmi? Allah kimləri uzaqlaşdırmış və qəzəbinə uğratmışsa; kimləri meymunlara, donuzlara və şeytana [tağuta] ibadət edənlər etmişsə, bax bunların məkanı pisdir və yolun doğrusundan daha çox azanlardır."
61 Onlar, sizin yanınıza gəldikləri zaman: "İman etdik" dedilər. Halbuki küfr [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmə] ilə daxil oldular və onlar həqiqətən küfrlə çıxanlardır. Və Allah, onların gizlədiklərini ən yaxşı biləndir.
62 Onlardan bir çoxunun, günah işləməkdə, düşmənçilik etməkdə və haram yeməkdə (bir-birləri ilə) yarışdıqlarını görərsən. Bu etdikləri şeylər nə qədər də pisdir!
63 Özlərini Allaha həsr etmiş şəxslər və din bilənləri (din xadimləri), onları günahı söyləməkdən və haramı yeməkdən çəkindirməli deyildilərmi? Törətdikləri şeylər necə də pisdir!
64 Və Yəhudilər, "Allahın əli bağlıdır (Allah xəsisdir)" dedilər. *–Söylədikləri şeylər səbəbiylə öz əlləri bağlandı və onlar uzaqlaşdırıldı.–* Əksinə, Allahın iki əli açıqdır; istədiyi kimi xərcləyər.

Və and olsun ki, Rəbbindən sənə nazil edilən (şey), onların çoxunda azğınlıq və küfr etmələrini [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmələrini] artırar. Və Biz, o Yəhudilərin arasına qiyamətə qədər düşmənçilik və kin saldıq. Nə zaman savaş / fəsad törətmək üçün bir atəş yandırsalar, Allah onu söndürmüşdür. Və onlar, yer üzündə fəsad törətməyə tələsərlər. Halbuki Allah fəsad törədənləri sevməz.
**65** Və əgər Kitab Əhli iman etmiş və Allahın mühafizəsi altına daxil olmuş olsaydılar, həqiqətən onların pisliklərini örtər və həqiqətən neməti bol olan cənnətlərə qoyardıq.
**66** Və heç şübhəsiz, əgər onlar Tövratı, İncili və özlərinə Rəblərindən nazil edilən Quranı ayaqda tutsaydılar (yaşatsaydılar), əlbəttə üstlərindən və ayaqlarının altından [hər bir tərəfdən] ruzilənəcəkdilər. Onlardan bir qismi orta yol tutan; bəzisinə iman edib bəzisinə iman etməyən, iman etmədiyi halda özünü iman etmiş kimi göstərən öndərli (başçısı olan) bir camaatdır. Və onlardan çoxunun etməkdə olduqları necə də pisdir! (112/5, Maidə / 57-66)

## Nəcm: 686

**67** Ey Rəsul! Rəbbindən sənə nazil edilәni təbliğ et. Və əgər bunu etməsən, o zaman Onun verdiyi elçilik görəvini yerinə yetirməmiş olarsan. Allah da səni insanlardan qoruyacaq. Şübhəsiz Allah, kafirlər [Özünün ilah və rəbb olduğunu bilərək rədd edənlər] cəmiyyətinə yol göstərməz.
**68** De ki: "Ey Kitab Əhli! Tövratı, İncili və Rəbbinizdən sizə nazil edilən qayda-qanunları həyata keçirmədikcə, heç bir şey üzərində deyilsiniz." Şübhəsiz ki, Rəbbindən sənə nazil edilənlər, onların çoxunda azğınlığı və küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyi] artırır. Elə isə kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənlər] cəmiyyəti üçün üzülmə! (112/5, Maidə / 67-68)

## Nəcm: 687

**69** Şübhəsiz bu iman etmiş kəslər, Yəhudiləşmiş kəslər, Sabiilər / Yəhya peyğəmbərin dinindən olanlar və Nəsranilər; kim Allaha və axirət gününə iman edər və saleh əməl işləyrsə, artıq onlar üçün bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər də. (112/5, Maidə / 69)

## Nəcm: 688

**70,71** And olsun ki, Biz, İsrail oğullarının sözləşməsini aldıq və onlara elçilər göndərdik; nə zaman ki, elçi onlara, nəfslərinin xoşlamadığı bir şeyi gətirdi, bir qismini yalanladılar, bir qismini də öldürürlər.
Və onlar, sosial bir yanğın (bəla) olmayacağını sandılar, korlaşdılar və

karlaşdılar. Sonra Allah, onların tövbəsini qəbul etdi. Sonra yenə onlardan çoxu korlaşdı, karlaşdı. Və Allah, onların etdikləri şeyləri ən yaxşı görəndir. (112/5, Maidə / 70-71)

## Nəcm: 689

**72** And olsun "Allah, Məryəm oğlu Məsihin özüdür" deyən kimsələr həqiqətən kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] olmuşdur. Halbuki Məsih demişdi: "Ey İsrail oğulları! Mənim Rəbbim və sizin Rəbbiniz olan Allaha qulluq edin. Şübhəsiz kim Allaha ortaq qoşarsa, həqiqətən Allah ona cənnəti haram edər, onun sığınacağı da atəşdir. Və şirk qoşaraq, küfr edərək səhv; öz zərərinə olan əməli işləyənlər üçün yardımçılardan kimsə yoxdur."
**73** And olsun, "Allah üçün üçüncüsüdür" deyən kimsələr həqiqətən kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] olmuşdur. Halbuki tək ilahdan başqa ilah yoxdur. Əgər söylədiklərindən əl çəkməzlərsə, həqiqətən onlardan kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] ağrılı-acılı bir əzab toxunacaqdır.
**74** Hələ də onlar, xətalardan Allaha dönməz və Ondan əfv diləməzlərmi? Allah çox bağışlayandır, çox mərhəmət edəndir.
**75** Məryəmin oğlu Məsih, sadəcə bir elçidir. Ondan öncə də elçilər gəlib keçmişdir. Anası da ən doğru bir qadındır. Hər ikisi də yemək yeyirdilər. Bax (gör), onlara ayələri necə açıqlayırıq. Sonra yenə bax, onlar necə döndərilirlər!
**76** De ki: "Allahın altındakılardan sizin üçün zərər və fayda verməyə gücü çatmayan şeyləreмi qulluq edirsiniz? Halbuki Allah, çox yaxşı eşidəndir, çox yaxşı biləndir."
**77** De ki: "Ey Kitab Əhli! Dininizdə haqqın xaricində həddi aşmayın. Daha əvvəl azmış, bir çoxlarını azdırmış və haqq yolun ortasından azmış bir camaatın istəklərinə də uymayın."
**78** İsrail oğullarından bu kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu kimsələr], Davudun dili ilə və Məryəmin oğlu İsanın dili ilə uzaqlaşdırılmışdır. Bu, onların üsyan etmələri və həddi aşmaları səbəbiylədir.
**79** Onlar, etdikləri pisliklərdə bir-birlərinə əngəl olmurdular. Əlbəttə, etdikləri şey necə də pis idi!
**80** Onlardan bir çoxunu; kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kəsləri] (özlərinə) müdafiəçi, himayə edən, yönətici qəbul etdiklərini görərsən. Mənliklərinin onların önünə gətirdiyi şey; Allahın onlara qəzəb etməsi nə qədər də pisdir! Onlar, əzab içində də daimi qalanlardır.

**81** Və əgər onlar Allaha, Peyğəmbərə və ona nazil edilənə iman etsəydilər, onları (özlərinə) qoruyucu (himayə edən), yol göstərən yaxınlar qəbul etməzdilər. Lakin onlardan bir çoxu yoldan çıxmış kimsələrdir.
**82** Sən, həqiqətən iman edən şəxslərə qarşı düşmənçilik baxımından insanların ən şiddətlisi (acımasızı) olaraq, o Yəhudiləri və o ortaq qoşan kimsələri görərsən. Və həqiqətən iman edən kimsələrə sevgi baxımından ən yaxın olaraq da, "Şübhəsiz biz, Nəsraniyik / Xristiyanlarıq" deyən kimsələri görərsən. Bu, öz içələrində keşişlərin və rahiblərin [yontulmuşların / adam olmuşların] olduğuna və onlar özlərini yuxarı tutmamalarına görədir.
**83,84** Və onlar, Elçiyə nazil edilən Quranı dinlədikləri zaman, onun haqq olduğunu öyrəndiklərinə görə gözlərinin yaşla dolduğunu görərsən. Onlar: "Rəbbimiz! Biz iman etdik, bizi şahidlər ilə birlikdə yaz!" Və "Biz, Rəbbimizin bizi salehlər dəstəsi ilə birlikdə daxil etməsini umduğumuz halda, Allaha və haqdan bizə gələn şeylərə nə üçün iman etməyək!" deyərlər.
**85,86** Allah da, onların belə demələri səbəbiylə, onları, içində daimi qalanlar olaraq, altından çaylar axan cənnətlər ilə mükafatlandırmışdır. Və bax bu, gözəl-yaxşı əməl işləyənlərin qarşılığıdır. İnkar edən və ayələrimizi yalanlayan kimsələr (ki var); bax onlar, cəhənnəmin əhlidir. (112/5, Maidə / 72-86)

## Nəcm: 690

**87** Ey iman edən kimsələr! Allahın sizə halal etdiyi təmiz-ləzzətli-gözəl şeyləri haram saymayın. Və həddi aşmayın. Şübhəsiz Allah, həddi aşanları sevməz.
**88** Və Allahın sizə verdiyi ruzidən halal və təmiz olaraq yeyin və siz, iman etdiyiniz Allahın mühafizəsi altına daxil olun.
**89** Allah, sizi qəsdən olmayan / vərdiş etdiyiniz andlara görə məsuliyyətli tutmaz. Fəqət qəsdən etdiyiniz / sözləşmələr bağladığınız andlara görə sizi məsuliyyətli tutar; onun kəffarəsi əhlinizə (ailənizə) yedizdirdiyinizin ən xeyirlisi / ən yaxşısı ilə on miskini (yoxsulu) yedizdirmək və ya geyindirməkdir. Və yaxud da bir köləni azad etməkdir. Verəcək bir şey tapa bilməyən kimsə üçün də üç gün oruc tutmaqdır. Bu, pozduğunuz zaman andlarınızın kəffarəsidir. Və andlarınızı qoruyun. Bax Allah, qarşılığını ödəyərsiniz deyə ayələrini sizin üçün belə açıqlayar.
**90** Ey iman etmiş kəslər! Xəmr [içki / hər hansı bir yolla ağlı örtmək], qumar; hər cürə asan qazanc məqsədli şans oyunu, qulluq edilən nəsnələri (əşyaları), şəxsləri təmsil edən işarələr; simvollar və fal

oxları; bütün kəhanət vasitələri və vəsaitləri ancaq şeytan işindən zərər verən şeylərdir. Elə isə (öz) vəziyyətinizi qorumağınız, qurtulmağınız üçün bu şeytan işindən çəkinin.
**91** Həqiqətən şeytan, xəmr və qumarda sizin aranıza düşmənçilik və kin salmaq və sizi, Allahın xatırlanmasından, (Allahın) öyüdündən və səlatdan [maddi və zehni baxımdan dəstək olmaqdan; cəmiyyəti maarifləndirməkdən] uzaqlaşdırmaq istəyər. Elə isə son qoyan kəslər / əl çəkən kəslərsinizmi?
**92** Və Allaha itaət edin, Elçiyə itaət edin və çəkinib tədbirli olun. Artıq əgər uzaq durarsanız, bilin ki, Elçimizə düşən sadəcə açıq-aşkar təbliğdir.
**93** İman edən və yaxşılaşdırmaq qayəsi ilə əməl işləyən kimsələrə, Allahın mühafizəsi altına daxil olduqları, iman etdikləri, yaxşılaşdırmaq qayəsi ilə əməl işlədikləri, sonra Allahın mühafizəsi altına daxil olduqları, iman etdikləri və sonra Allahın mühafizəsi altına daxil olduqları və gözəl-yaxşı əməl işlədikləri zaman, daddıqları şeylərdən ötrü bir məsuliyyət yoxdur. Və Allah, gözəl-yaxşı əməl işləyənləri sevər.
**94** Ey iman etmiş kimsələr! Həqiqətən Allah, kimsəsiz yerlərdə kimin Özündən (Allahdan) qorxduğunu bildirmək üçün sizi bir şeylə; əllərinizin və nizələrinizin çata biləcəyi bir ovla sınayar. Elə isə, kim bundan sonra həddi aşarsa, artıq acıqlı (şiddətli) əzab onunu üçündür.
**95** Ey iman etmiş kimsələr! Siz, toxunulmaz ikən / həcc görəvini yerinə yetirərkən ov heyvanı öldürməyin. İçinizdən kim qəsdən onu öldürərsə, etdiyi işin vəbalını (günahını) dadması üçün, Kəbəyə çatacaq bir hədy / yemək üçün hədiyyə edilən heyvan olmaq üzrə öldürdüyü heyvanın bənzəri ona cəza olacaq. *–Buna içinizdən iki ədalətli şəxs hökm edər.–* Yaxud kəffarə olaraq miskinləri (yoxsulları) doyurma, yaxud onun dəngi (ona bərabər) oruc tutmaq olacaq. Allah keçmişdə olanları əfv etmişdir. Fəqət kim ki, təkrarlayarsa, Allah tutub cəzalandıraraq ədaləti təmin edər. Və Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, günahkarı tutub cəzalandıraraq ədaləti təmin etmək prinsipinə sahibdir.
**96** Su ovu və onun yeyilməsi, sizə və yolda olanlara (səfərdə olanlara) fayda vermək üzrə sizə halal edildi. Quru ovu isə, siz həcc görəvini davam etdirdiyiniz müddətcə sizə haram edilmişdir. Və Öz hüzuruna toplanacağınız Allahın mühafizəsi altına daxil olun.
**97** Allah, Kəbəni; o Beytülhəramı, haram ayı, həcc edənlərə yemək üçün heyvan hədiyyə etməyi və gərdənlikləri / həcc edənlərin yeməsi üçün göndərilən heyvanlara qoyulan işarətləri insanların ayağa

qalxması; silkələnməsi, özlərini qurtarması üçün (bir vasitə) etdi. Bu, Allahın göylərdə və yerdə olan hər şeyi bildiyini və Allahın hər şeyi haqqı ilə bilən olduğunu, sizin də bilməyiniz üçündür.
**98** Şübhəsiz Allahın cəzasının çox şiddətli olduğunu və şübhəsiz Allahın çox bağışlayan, çox mərhəmətli olduğunu bilin.
**99** Elçiyə düşən sadəcə təbliğdir. Və Allah, aşkar etdiyiniz şeyləri və gizlədiyiniz şeyləri bilir.
**100** De ki: "Hər nə qədər pisliyin [pisin, pis şeylərin, murdarlığın,] çoxluğu xoşunuza gəlsə də, pis olan şeylə təmiz olan şey eyni olmaz." Elə isə, ey anlama qabiliyyətləri olanlar! Qurtulmağınız üçün Allahın mühafizəsi altına daxil olun.
**101** Ey iman etmiş kimsələr! Açıqlandığı zaman xoşunuza gəlməyən şeylərdən soruşmayın / istəməyin. Əgər onlar (barədə) Quran nazil edilərkən soruşarsanız / istəyərsəniz, sizə açıqlanar. Allah, onlardan keçmişdir, onları bağışlamışdır. Və Allah, çox bağışlayan və çox həlimdir.
**102** Şübhəsiz sizdən öncə gələn bir camaat bunları soruşmuşdu / istəmişdi, sonra da onlar Allahın ilah və rəbb olduğunu qəbul etməyən kimsələr oldular. (112/5, Maidə / 87-102)

## Nəcm: 691

**103** Allah; bəhirə, saibə, vəsilə və ham[403] (adlı) heç bir şey nəzərdə tutmamışdır (buyurmamışdır). Ancaq kafirlər [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələr], Allaha qarşı yalan düzüb-qoşub uydururlar. Və onların bir çoxu dərk etməz.
**104** Və onlara: "Allahın nazil etdiyinə və Elçiyə tərəf gəlin!" deyildiyi zaman: "Atalarımızı üzərində gördüyümüz şey bizə yetər" dedilər. Bəs Ataları bir şey bilməyən və göstərilən doğru yolu tapa bilməyən kimsələr olsa necə? (112/5, Maidə / 103-104)

## Nəcm: 692

**105** Ey iman edən kimsələr! Hər kəs özünə görə məsuliyyət daşıyır. Siz, yönəldildiyiniz doğru yola girdiyiniz zaman, (yolunu) azan kimsələr sizə zərər verə bilməzlər. Hamınızın dönüşü Allahadır. Sonra da O, etdiyiniz şeyləri sizə xəbər verəcək. (112/5, Maidə / 105)

## Nəcm: 693

**106** Ey iman etmiş kəslər! İçinizdən birinə ölüm hazır olduğu zaman vəsiyyət vaxtı aranızda şahidlik (etməli olanlar), öz içinizdən ədalət sahibi iki nəfərdir. Yaxud yer üzündə yolçuluğa (səfərə) çıxmışsınızsa, sonra da ölümün müsibəti sizə gəlib çatmışsa, sizdən olmayan iki

adamdır. Əgər şübhəyə düşərsəniz, səlatdan [maddi və zehni baxımdan dəstək olmaqdan; cəmiyyəti maarifləndirmək işindən] sonra onları gözlədərsiniz. Sonra da onları, "Əqrəba belə olsa, andı bir mənfəət qarşılığı satmayacağıq, Allahın şahidliyini gizləməyəcəyik. Əks təqdirdə, günahkarlardan olarıq" deyə Allaha and içdirərsiniz.
**107** Sonra da əgər o iki şahidin bir günah işlədikləri məlum olarsa, ölən şəxsə daha yaxın olan haqq sahiblərindən digər iki adam onların yerinə keçərlər və: "Bizim şahidliyimiz, o öncəki iki adamın şahidliyindən daha doğrudur və biz kimsənin haqqına təcavüz etmədik. Əks təqdirdə, biz, səhv davrananlardan; öz zərərlərinə olan əməli işləyənlərdən olardıq" deyə Allaha and içərlər.
**108** Belə bir and, şahidliklərini üsuluna görə yerinə yetirmələri, yaxud andlarından sonra andlarının qəbul edilməməsindən qorxmaları üçün ən yaxın / ən yaxşı yoldur. Allahın mühafizəsi altına daxil olun və qulaq asın. Və Allah, haqq yoldan çıxan topluluqlara yol göstərməz.

(112/5, Maidə / 106-108)

## Nəcm: 694

**109** Allah, elçiləri toplayacağı gün belə deyəcək: "Sizə verilən cavab nədir?" Onlar: "Bizim heç bir biliyimiz yoxdur; şübhəsiz ki, Sən, görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi ən yaxşı bilənin məhz Özüsən" dedilər.
**110** O zaman Allah demişdi ki: "Ey Məryəm oğlu İsa! Sənin üzərində və ananın üzərində olan nemətimi xatırla! O vaxt Mən, səni Allahın vəhyi ilə gücləndirmişdim. Yüksək mövqedə olan biri olaraq və yetkin biri olaraq insanlarla danışırdın. O vaxt sənə Kitabı, haqsızlığın, fəsadın və qarışıqlığın qarşısını almaq üçün qoyulmuş qayda-qanunu və prinsipləri, Tövratı və İncili öyrətmişdim.

O vaxt Mənim iznimlə / biliyimlə (məlumatım daxilində) palçıqdan; gildən (keramikadan) quş şəkli kimi bir şey (buxurdan) düzəldirdin. Sonra da onun içinə üfürürdün; aerozol əmələ gətirirdin, onlar da (xəstəlik yayan; aşılayan həşəratlar) Mənim iznimlə quş olurdu / dərhal gedirdilər. Anadangəlmə kor olanı, ala xəstəliyinə tutulmuş kimsəni iznimlə / biliyimlə sağaldırdın. Yenə Mənim iznimlə / biliyimlə sosial ölüləri çıxarırdın / canlandırırdın. Və o vaxt İsrail oğullarına açıq-aşkar dəlillərlə gəlib, onlardan Allahın ilah və rəbb olduğuna iman etməyənlərin: "Bu ancaq açıq-aşkad bir sehrdir!" dedikləri zaman səni onlardan qorumuşdum.
**111** Və o vaxt həvarilərə: "Mənə və Elçimə iman edin" deyə vəhy etmişdim. Onlar: "İman etdik!" Və "Bizim gerçəkdən müsəlmanlar olduğumuza şahid ol!" demişdilər.

**112** O vaxt həvarilər: "Ey Məryəm oğlu İsa! Rəbbin bizə göydən bir süfrə nazil edə bilərmi?" demişdilər. İsa: "Əgər iman edənlərsinizsə, Allahın mühafizəsi altına daxil olun" demişdi.
**113** Həvarilər: "Biz istəyirik ki, ondan yeyək, qəlblərimiz əməlli-başlı sakit olsun, sənin bizə doğru söylədiyini bilək və biz də buna şahidlərdən olaq" dedilər.
**114** Məryəm oğlu İsa: "Allahım, Rəbbimiz! Bizim üzərimizə, bizim üçün, öncəkilərimiz və sonrakılarımız üçün bir bayram və Sənin (tərəfindən) bir əlamət / işarət olaraq göydən bir süfrə endir. Və bizi ruziləndir. Və Sən ruzi verənlərin ən xeyirlisisən!" dedi.
**115** Allah dedi ki: "Şübhəsiz Mən, onun (süfrənin), sizin üçün endirəniyəm. Artıq bundan sonra sizdən kim iman etməzsə, Mən ona aləmlərdən heç kimsəyə etməyəcəyim bir əzabla əzab verəcəyəm."
**116-118** Və o vaxt Allah demişdi ki: "Ey Məryəm oğlu İsa! İnsanlara sənmi 'Məni və anamı, Allahın altındakılardan iki tanrı qəbul edin' dedin?" İsa: "Sən paksan, mənim üçün gerçək olmayan bir şeyi söyləməyim mənə yaraşmaz. Əgər mən onu demiş olsam, Sən, bunu mütləq bilərdin. Sən, mənim içimdə / özümdə olanı bilirsən, mən isə Sənin zatında olanı bilmərəm. Şübhəsiz Sən; görünməyəni, eşidilməyəni, hiss edilməyəni, keçmişi, gələcəyi ən yaxşı bilənin məhz Özüsən! Mən, onlara sadəcə, Sənin mənə əmr etdiklərini; 'Mənim və sizin Rəbbiniz olan Allaha qulluq edin!' dedim. Və mən, içlərində olduğum müddətcə onların üzərində şahid idim. Nə zaman ki, Sən məni vəfat etdirdin; keçmişdə etdiklərimi və etməli olduğum halda etmədiklərimi bir-bir xatırlatdırdın / məni öldürdün, Sən, onlara nəzarət edənin, məhz Özü oldun. Və şübhəsiz Sən, hər şeyə ən yaxşı şahid olansan. Əgər onlara əzab edərsən, şübhəsiz onlar, Sənin qullarındır və əgər onları bağışlayarsansa, şübhəsiz Sən, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olanın, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edənin məhz Özüsən." dedi
**119** Allah dedi ki: "Bu, doğru kimsələrə doğruluqlarının fayda verdiyi gündür. Onlar üçün, içində sonsuzadək qalacaqları, altından çaylar axan cənnətlər var." Allah, onlardan razı olmuşdur, onlar da Ondan razı olmuşlar. Bax bu, ən böyük qurtuluşdur.
**120** Göylərin, yer üzünün və bunların içində olan şeylərin sahibliyi, idarə edilməsi yalnızca Allaha məxsusdur. Və O, hər şeyə ən yaxşı qadir olandır. (112/5, Maidə / 109-120)

# TÖVBƏ (113 – 9) SURƏSİ
## MƏDİNƏ DÖVRÜ

**Nəcm: 695**

**1,2** Allahdan və Elçisindən əhdləşdiyiniz ortaq qoşanlara bir ultimatum, qəti xəbərdarlıq:
"Artıq yer üzündə dörd ay daha rahat gəzib-dolanın. Və bilin ki, həqiqətən siz Allahı aciz qoya bilməyəcək və həqiqətən Allah kafirləri [Özünün ilah və rəbb olduğunu bilərək edən kimsələri] rəzil-rüsvay edəcəkdir."

**3,4** Və "ən böyük həcc" günü,[404] həqiqətən Allahın və Onun Elçisinin ortaq qoşan kimsələrlə *–ortaq qoşanlardan əhd bağladığınız, sizə heç bir naqislik etməmiş və sizin əleyhinizə heç bir kimsəylə yardımlaşmamış kimsələr istisna olmaqla–* (heç bir) əlaqəsinin olmadığına dair Allahdan və Elçisindən insanlara bir bildiriş: "Artıq əgər xətadan dönərsəniz, bu sizin üçün xeyirlidir. Və əgər arxa çevirərsəniz, o zaman bilin ki, şübhəsiz Allahı aciz qoya bilməzsiniz." Kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən bu şəxsləri] də ağrılı-acılı bir əzabla müjdələ! Artıq siz də müddətləri (bitənə) qədər onlara verdiyiniz sözlərinizi yerinə yetirin. Şübhəsiz Allah, Özünün mühafizəsi altına daxil olan şəxsləri sevər.

**5** Bu Toxunulmaz edilmiş (haram) aylar / həcc ayları çıxdığı zaman da o ortaq qoşanları harada taparsanız öldürün, onları tutun, həbs edin [ətraflarını mühasirəyə alın] və bütün müşahidə yerlərində onlar üçün (onların pusqusunda) oturun. Artıq əgər tövbə edərlərsə, səlatı iqamə edərlərsə [maddi və zehni baxımdan dəstək olarlarsa; cəmiyyəti maarifləndirmə qurumlarını qurarlarsa, ayaqda tutarlarsa] və zəkatı / vergilərini verərlərsə, artıq onların yollarını (açıb) sərbəst buraxın. Şübhəsiz Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.

**6** Əgər ortaq qoşanlardan hər hansısa biri aman diləyərsə, Allahın kəlamını dinləməsi üçün ona aman ver. Sonra onu güvənli yerinə çatdır. Bu, şübhəsiz onların bilməyən bir camaat olmaları səbəbiylədir.

**7** Məscidülhəramın yanında əhd bağladıqlarınız istisna olmaqla, ortaq qoşan kimsələr üçün Allah qatında və (Onun) Elçisi qatında hər hansısa bir əhdləşmə necə ola bilər? Artıq onlar sizə qarşı doğru-düzgün olduqları müddətcə, siz də onlara qarşı doğru olun. Şübhəsiz Allah, Özünün mühafizəsi altına daxil olan kəsləri sevər.

**8-10** Necə ola bilər ki? Və əgər onlar, sizdən üstün olarlarsa, sizin haqqınızda bir anda və əhdləşməyə riayət etməzlər. Ağızları ilə sizi razı salmağa çalışarlar, qəlbləri isə (öz planlarını davam etməkdə) israr edər. Və onların çoxu haqq yoldan çıxmış kimsələrdir: Onlar Allahın

ayələrini çox az bir bədəllə satdılar və Allahın yolundan (uzaqlaşdırıb) saxladılar. Şübhəsiz onlar, etdikləri pis olanlardır. Onlar, hər hansısa bir mömin haqqında anda və əhdləşməyə riayət etməzlər. Və bax bunlar, həddi aşanların məhz özüdür.
**11** Bundan sonra əgər tövbə edərlərsə, səlatı iqamə edərlərsə [maddi və zehni baxımdan dəstək olarlarsa; cəmiyyəti maarifləndirmə qurumlarını qurarlarsa, ayaqda tutarlarsa] və zəkatı / vergilərini verərlərsə, artıq onlar dində qardaşlarınızdır. Və Biz ayələri, bilən bir camaat üçün hərtərəfli açıqlayırıq.
**12** Və əgər verdikləri sözdən sonra andlarını pozar və dininizə dil uzadarlarsa, (bundan) əl çəkmələri üçün o, küfrün [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmənin] öncüləriylə dərhal savaşın. Şübhəsiz onlar üçün sözləşmə (müqavilə) deyə bir şey yoxdur.
**13** Andlarını pozan, Elçini yurdundan çıxarmaq qərarına gələn və üstəlik də sizə qarşı savaşmağa ilk öncə özləri başlayan bir camaatla savaşmayacaqsınızmı? Yoxsa onların qarşısında hörmətlə, sevgiylə və biliklə ürpərirsinizmi? Artıq, əgər möminsinizsə, qarşısında hörmətlə, sevgiylə və biliklə ürpərməyiniz üçün Allah daha layiqdir.
**14,15** Onlarla savaşın ki, Allah, sizin əllərinizlə onları cəzalandırsın və onları rəzil-rüsvay etsin. Sizi də, onlara qarşı müzəffər etsin və mömin bir camaatın sinələrinə şəfa versin, sinələrinin kinini aradan qaldırsın. Allah, istədiyinin tövbəsini də qəbul edər. Və Allah, çox yaxşı biləndir, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
**16** Sizdən səy göstərənləri, Allahın Elçisindən və iman edənlərin altındakılardan (özünə) sirdaş / can dostu qəbul etməyənləri Allah (aydınlaşdırıb) bildirmədən / işarələyib göstərmədən (sərbsət) buraxılacağınızımı sandınız? Və Allah, etdiklərinizdən çox yaxşı xəbəri olandır.
**17** Ortaq qoşanlar, özlərinin küfrünə [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmələrinə] özləri şahid olduqları halda, Allahın məscidlərini abadlaşdırmalarından söhbət gedə bilməz. Bax onlar, işləri boşa getmiş kimsələrdir. Və onlar, Atəş içində daimi qalacaqlar.
**18** Allahın məscidlərini yalnız Allaha və axirət gününə iman edən, səlatı iqamə edən [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını quran, ayaqda tutan], zəkatı / vergisini verən və sadəcə Allahın qarşısında hörmətlə, sevgiylə, biliklə ürpərən kimsələr açar və yaşadar. Artıq bax onların, yönəldildikləri doğru yol üzərində olan kimsələrdən olmaları gözlənilir.
**19** Siz, həcc edənin sularının tədarük edilməsini və Məscidülhəramın abad edilməsini, Allaha və axirət gününə iman edən və Allah yolunda

səy göstərən kimsə ilə eyni tutursunuz? Bunlar, Allah qatında eyni ola bilməzlər. Və Allah, şirk qoşaraq, küfr edərək səhv; öz zərərlərinə olan əməli işləyən camaata yol göstərməz. (113/9, Tövbə / 1-19)

## Nəcm: 696

**28** Ey iman edən kimsələr! Ortaq qoşan bu kimsələr sadəcə bir murdardırlar. Artıq bu illərindən sonra Məscidülhərama yaxınlaşmasınlar. Əgər yoxsulluqdan / onların uzaqlaşmasıyla qazancınızı itirməkdən qorxursunuzsa, Allah sizi istədiyində ərməğanlar ilə yaxında zənginləşdirəcək. Şübhəsiz Allah ən yaxşı bilən, ən yaxşı qanun qoyandır.
**29** Özlərinə Kitab verilənlərdən, Allaha və axirət gününə iman etməyən, Allahın və Elçisinin haram etdiyini haram bilməyən və haqq dini (özünə) din qəbul etməyən kimsələrlə, (onlar) alçalmış olduqları halda cizyə verənə qədər savaşın.
**31** Onlar, Allahın altındakılardan alimlərini (din xadimlərini), rahiblərini və Məryəm oğlu İsanı özlərinə rəblər qəbul etdilər. Halbuki onlara sadəcə bir tək olan ilaha qulluq etmək əmr olunmuşdu. Allahdan başqa ilah deyə bir şey yoxdur. O, ortaq qoşanların ortaq qoşduqları şeylərdən də pakdır.
**32** Onlar, Allahın nurunu ağızlarıyla söndürmək istəyirlər. Halbuki Allah, sadəcə, kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə] xoş gəlməsə də Öz nurunu tamamlamaqda qərarlıdır.
**20** İman edən, hicrət edən və mallarıyla, canlarıyla Allah yolunda səy göstərənlər, Allahın qatında dərəcə baxımından daha böyükdür. Bax bunlar, qurtulanların məhz özüdür.
**21,22** Onların Rəbbi, onları Öz qatından bir rəhmət, bir razılıq və içində sonsuza (qədər) olmaq üzrə, içində tükənməz nemətlər olan, [onların] özlərinə aid cənnətlərlə müjdələyir. Şübhəsiz Allah, qatında çox böyük mükafat olandır.[405] (113/9, Tövbə / 28-29, 31, 32, 20-22)

## Nəcm: 697

**23** Ey iman etmiş kimsələr! Əgər atalarınız və qardaşlarınız iman etməyə qarşılıq küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etməyi] sevirlərsə, onları (özünüzə) yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar qəbul etməyin. Sizdən hər kim onları (özünə) yardımçı, yol göstərən, qoruyucu (himayə edən) yaxınlar qəbul edərsə, artıq bax onlar, yanlış davrananların; öz zərərlərinə olan əməli işləyənlərin məhz özüdür.
**25** And olsun ki, Allah, bir çox yerdə və Hüneyn Günü[406] sizə yardım etdi. O vaxt çoxluğunuz sizə güvən vermişdi, lakin onun sizə bir

faydası olmamış və yer üzü bütün genişliyinə rəğmən sizə dar gəlmişdi. Sonra da arxa çevirib qaçmışdınız.
**26** Sonra Allah, Elçisinin üzərinə və möminlərin üzərinə, qəlbi təskin edən güvən və xatircəmlik hislərini / içlərində mənəvi güclərini (əhval-ruhiyyələrini) yaratdı və sizin görmədiyiniz ordular endirdi. Kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələri] də əzaba uğratdı. Və bax bu, kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən o kimsələrin] cəzasıdır.
**27** Sonra, bütün bu olub bitənlərin arxasından, Allah, istədiyi kimsəyə dönüş nəsib edər. Və Allah, çox bağışlayandır, çox mərhəmət edəndir.
(113/9, Tövbə / 23, 25-27)

## Nəcm: 698

**30** Və yəhudilər: "Üzeyr Allahın oğludur" dedilər. Xristianlar da: "Məsih Allahın oğludur" dedilər. Bu, onların ağızlarıyla gəvələdikləri sözlər olub, guya bununla, daha öncə yaşayan kafirlərin [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrin] sözlərini təqlid edirlər. Allah, onlarla savaşmışdır. Necə də döndərilirlər!
**33** Allah, ortaq qoşanların xoşuna gəlməsə də, onu [haqq dini], Dinin [batil dinlərin] hamısının üzərinə çıxarması üçün Elçisini, doğru yol göstərən və haqq din ilə göndərəndir. (113/9, Tövbə / 30, 33)

## Nəcm: 699

**34** Ey iman etmiş kəslər! Şübhəsiz, xaxamlardan / alimlərdən (din xadimlərindən), rahiblərdən bir çoxu həqiqətən insanların mallarını haqsız yerə yeyərlər və Allah yolundan azdırarlar. Və qızıl və gümüşü yığıb və onları Allah yolunda xərcləməyən / başda öz yaxınları olmaq üzrə başqalarının nəfəqələrini (ehtiyaclarını) təmin etməyən kimsələr, dərhal onlara ağrılı-acılı bir əzabla müjdə ver!
**35** O gün, topladıqları qızıl və gümüşlərin üstü cəhənnəm atəşində qızdırılacaq və bunlarla alınları, yanları və kürəkləri dağlanacaq: "Bax bu öz canınız üçün saxlayıb yığdığınız şeydir. Haydı, indi dadın bu yığdığınız şeyləri!" (113/9, Tövbə / 34-35)

## Nəcm: 700

**24** De ki: Əgər atalarınız, oğullarınız, qardaşlarınız, həyat yoldaşlarınız, əqrəbalarınız, qəbiləniz, əldə etdiyiniz mallar, kasadlığa məruz qalmasından ürpərdiyiniz ticarət, xoşladığınız məskənlər sizə Allahdan, Onun Elçisindən və Onun yolunda səy göstərməkdən daha sevimlidirsə, artıq Allah, əmrini gətirənə qədər gözləyin. Və Allah, haqq yoldan çıxmış camaata yol göstərməz. (113/9, Tövbə / 24)

## Nəcm: 701

36 Şübhəsiz, Allah qatında; Allahın göyləri və yeri yaratdığı günki
yazısında ayların sayı, ay olaraq on ikidir. Bunlardan dördü
toxunulmaz (haram) edilmişdir. Bax bu, qoruyan dindir. Bu səbəblə
toxunulmaz aylarda özünüzə haqsızlıq etməyin. Və sizinlə toplu halda
savaşan ortaq qoşanlarla siz də toplu halda savaşın. Və şübhəsiz
Allahın, Özünün mühafizəsi altına daxil olan şəxslər ilə bərabər
olduğunu bilin.
37 O "Nəsi"[407] (haram ayları gecikdirmək) ancaq küfrü [Allahın ilah
və rəbb olduğunu bilərək rədd etməyi] artırmaqdır ki, kafirlər [Allahın
ilah və rəbb olduğunu bilərək rədd etmiş kimsələr] onunla çaşdırılar
(azdırılar); Allahın haram etdiyi (ayların) sayına uydursunlar və
(bununla) Allahın haram etdiyini halal etsinlər deyə, onu bir il halal,
bir il haram sayarlar. Onlara əməllərin pisliyi süslənib gözəl göstərildi.
Və Allah, kafir [Özünün ilah və rəbb olduğunu bilərək rədd edən]
camaata yol göstərməz. (113/9, Tövbə / 36-37)

## Nəcm: 702[408]

38 Ey iman etmiş kəslər! Nə oldu ki, sizə, Allah yolunda savaşa çıxın
deyildiyi zaman yerdə ağırlaşıb qaldınız / yerə mıxlanıb qaldınız.
Axirətdən əl çəkib bəsit dünya həyatınamı razı oldunuz? Amma
axirətdəkinə görə, bu bəsit dünya həyatının qazancı çox azdır.
39 Əgər savaşa çıxmasanız, Allah sizə ağrılı-acılı bir əzab ilə əzab
verər və yerinizə başqa bir camaatı gətirər və siz Ona zərər deyə bir
şey verə bilməzsiniz. Və Allah, hər şeyə ən yaxşı qadir olandır.
40 Əgər siz, Elçiyə yardım etməsəniz, bilin ki, Allah Ona həqiqətən
yardım etmişdir. Bir vaxt o kafirlər [Allahın ilah və rəbb olduğunu
bilərək rədd edən kəslər] onu ikinin (iki nəfərin) ikincisi olaraq
çıxarmışdılar. O vaxt ikisi mağarada idilər. O vaxt o, yoldaşına:
"Üzülmə, şübhəsiz Allah bizimlə bərabərdir." Bunun üzərinə Allah,
Onun üzərinə qəlbi təskin edən güvən və xatircəmlik hislərini
endirmiş / içlərinə mənəvi güclərini (əhval-ruhiyyələrini] qoymuş, onu
sizin görmədiyiniz əsgərlərlə gücləndirmiş və kafirlərin [Allahın ilah
və rəbb olduğunu bilərək rədd edən kəslərin] sözünü ən alçaq (söz)
etmişdi. Allahın kəlməsi də ən ucanın məhz özüdür. Və Allah, ən
üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq
qalib olandır, ən yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan /
sağlam edəndir.
41 Yüngül təchizatla və ağırlıqla savaşa çıxın və mallarınızla,
canlarınızla Allah yolunda səy göstərin. Əgər bilsəniz, bu sizin üçün
daha xeyirlidir. (113/9, Tövbə / 38-41)

**Nəcm: 703**

**42** Əgər səfər, yaxın bir qazanc və adi bir səfər olsaydı, onlar mütləq sənin ardınca gedərdilər. Fəqət o edilməsi çətin olan iş onlara uzaq gəldi. Bununla belə, "Bizim də gücümüz çatsaydı, həqiqətən sizinlə bərabər əlbəttə çıxardıq" deyə Allaha and içəcəklər *–(onlar) özlərini məhvə məruz qoyurlar–* və Allah bilir ki, onlar həqiqətən yalançı kimsələrdir.
**43** Allah, səni əfv etdi. Doğru kimsələr sənə yaxşıca bəlli olana və sən yalançıları bilənə qədər (bəlli olmamış və bilməmiş), nə üçün onlara izin verdin?
**44** Allaha və axirət gününə iman edən kimsələr, mallarıyla və canlarıyla səy göstərməyə səndən izin istəməzlər. Və Allah, Öz mühafizəsi altına daxil olan o kimsələri ən yaxşı biləndir.
**45** Səndən izin istəyənlər, sadəcə Allaha və axirət gününə iman etməyən və qəlbləri şübhəyə düşüb, şübhələrinin içində sərgərdan qalan kəslərdir.
**46** Və əgər çıxmaq istəsəydilər, mütləq çıxış üçün müəyyən hazırlıq görərdilər. Fəqət Allah, onların göndərilmələrini xoşlamadı və (buna görə) onları yoldan saxladı. *–Və "Oturun oturanlarla bərabər!" deyildi.–*
**47** Əgər sizin içinizdə çıxsaydılar, sadəcə fəsadı artıracaqdılar və həqiqətən aranıza sosial yanğın (bəla) salmaq üçün tələsəcəkdilər. İçinizdə onlara qulaq asanlar da vardı. Və Allah, o yanlış davrananları; öz zərərlərinə olan əməli işləyənləri çox yaxşı biləndir.
**48** And olsun ki, onlar, bundan öncə də insanları dindən çıxarmaq istədilər və sənə qarşı müxtəlif işlər düzüb-qoşmuşdular. Nəhayət, haqq gəldi və onlar istəmədikləri halda Allahın əmri zahir oldu.
**49** Onlardan bəzi kimsələr: "Mənə izin ver, məni sosial yanğına (bəlaya) salma / başımı bəlaya salma!" deyərlər. Gözünüzü açın! Onlar sosial yanğının (bəlanın) içinə düşdülər. Cəhənnəm də kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələri] hər tərəfdən əhatə edəcəkdir.
**50** Əgər sənə bir yaxşılıq toxunarsa, pis olarlar. Əgər sənə bir müsibət toxunarsa, "Biz həqiqətən tədbirimizi öncədən almışdıq!" deyərlər. Və onlar, sevinənlər olaraq yan keçib gedərlər.
**51** De ki: "Heç bir zaman bizə, Allahın bizim üçün yazdığından başqası toxunmaz. O, bizim mövlamızdır. Onun üçün möminlər işin nəticəsini yalnızca Allaha həvalə etsinlər."
**52** De ki: "Siz, bizə iki gözəlliyin birindən başqa (bir şeyin üz verməsinimi) gözləyirsiniz? Biz isə sizə, Allahın Öz qatından və ya bizim əlimizlə bir əzab endirməsini gözləyirik. Haydı, siz gözləyin,

şübhəsiz, biz də sizinlə bərabər gözləyənlərik.”
53 De ki: “İstəyərək və ya istəməyərək Allah yolunda xərcləyin; sizdən heç bir zaman qəbul edilməyəcəkdir. Şübhəsiz siz, haqq yoldan çıxanların camaatı oldunuz.”
54 Və onların xərclədiklərinin onlardan qəbul olunmasına, sadəcə, onların küfr etməsi [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmələri], Allahın Elçisinin həqiqi elçi olduğunu bilə-bilə inkar etmələri və səlata [maddi və zehni baxımdan dəstək olmağa; cəmiyyəti maarifləndirməyə] sadəcə tənbəl-tənbəl getmələri, Allah yolunda xərcləmələrini də ancaq istəməyərək etmələri əngəl oldu.
55 Elə isə, onların malları və övladları sənin qibtənə səbəb olmasın. Ancaq Allah, bunlarla, onları bəsit dünya həyatında cəzalandırmaq, onlar kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri ikən canlarını çıxarmaq istəyir.
56 Sizdən olmadıqları halda, şübhəsiz, özlərinin həqiqətən sizdən olduğuna dair Allaha and da içərlər. Lakin onlar, daim qorxan bir camaatdır.
57 Əgər onlar, sığınacaq bir yer və ya (içində) yaşamağa mağaralar və yaxud giriləcək bir deşik tapsaydılar, mütləq başlarını qaldırıb o tərəfə doğru yönələrdilər.
58 Onlardan bəziləri də, sədəqələr haqqında sənə dil uzadan kimsələrdir. (Belə) ki, o sədəqələrdən onlara verilmişsə razı olarlar, verilməmişsə dərhal qəzəblənərlər.
59 Və kaş ki onlar, Allah və Elçisinin onlara verdiyinə razı olsaydılar. Və “Bizə Allah yetər. Allah, yaxında bizə ərməğanlar verəcək, Elçisi də. Şübhəsiz biz, sadəcə Allaha rəğbət bəsləyirik” desəydilər.
60 Həqiqətən, Allah tərəfindən bir bölüşdürmə / ən vacib görəv olaraq sədəqələr / dövlətin gəlirləri ancaq fəqirlər, miskinlər / yoxsullar, işsizlər, o iş üzərində çalışan görəvlilər / dövlət görəvliləri, qəlbləri İslama isinişdiriləsi kimsələr, azadlığı olmayan kölələr, ağır borc altında olanlar, Allah yolunda olanlar [əsgərlər, tələbə və müəllimlər], yolda qalanlar üçündür. Allah, hər şeyi ən yaxşı biləndir və ən yaxşı qanun qoyandır.
61 Yenə onlardan bəziləri, Peyğəmbəri incidən və “O, özünə söylənən hər şeyi dinləyib təsdiq edən biridir!” deyən kimsələrdir. De ki: “Sizin üçün bir xeyir qulağıdır; Allaha iman edir, möminlərə inanır və sizdən iman edənlərə də bir rəhmətdir.” Və Allahın Elçisini incidən kimsələr, ağrılı-acılı bir əzab onlar üçündür.
62 Sizi razı etmək üçün, sizin üçün Allaha and içərlər. Bunlar əgər mömindirlərsə, Allahı və Elçisini razı etmələri daha doğrudur.
63 Şübhəsiz kim Allah və Elçisiylə yarışarsa (bəhsə girməyə

çalışarsa), şübhəsiz, onun üçün, içində sonsuzadək qalanlar olaraq cəhənnəm atəşi olduğunu bilmədilərmi? Bax bu, ən böyük rüsvayçılıqdır. (113/9, Tövbə / 42-63)

## Nəcm: 704

64 Münafiqlər, qəlblərindəki şeyləri özlərinə xəbər verəcək bir surənin (onların) üzərlərinə nazil edilməsindən çəkinirlər. De ki: "Siz istehza edin! Şübhəsiz Allah, sizin çəkindiyiniz şeyi ortaya çıxarandır."
65 Və əgər onlardan soruşsaydın, mütləq: "Sadəcə olaraq bizim başımız qarışmışdı, oyun oynayırdıq" deyəcəklər. De ki: "Allah, ayələri və Elçisi ilə istehzamı edirdiniz?"
66 Üzr istəməyin, siz "İman etdik" dedikdən sonra həqiqətən küfr etdiniz [Allahın ilah və rəbb olduğunu bilərək rədd etdiniz]. Sizdən bir qismini əfv etsək belə, şübhəsiz özləri günah işləyən kimsələr olduqları üçün [digər tayfanı] əzaba düçar edəcəyik. (113/9, Tövbə / 64-66)

## Nəcm: 705

67 Münafiq kişilər və münafiq qadınlar bir-birindəndir; pisliyi əmr edər, yaxşılıqdan çəkindirərlər və əllərini bərk saxlayarlar / xəsislik edərlər. Allahı tərk edərlər, Allah da onları tərk edər. Gerçəkdən də münafiqlər, haqq yoldan çıxmış kimsələrin məhz özüdür.
68 Allah, münafiq kişilərə, münafiq qadınlara və kafirlərə [Özünün ilah və rəbb olduğunu bilərək rədd edənlərə / iman etməyənlərə], içində təməlli qalanlar olaraq cəhənnəm atəşini vəd etmişdir. O, onlara yetər. Və Allah, onları uzaqlaşdırıb rəhmətindən məhrum etmişdir! Və onlar üçün qalıcı bir əzab var.
69 Siz də eynilə özünüzdən öncəki, sizdən daha güclü-qüvvətli, mal və övlad baxımından sizdən daha varlı və (dünyanın nemətlərindən öz) paylarına düşən qədər faydalanan kimsələr kimisiniz. Bax Siz də, sizdən öncəkilər paylarına düşən qədəriylə necə faydalanmaq istədilərsə, siz də onlar kimi payınıza düşən qədəriylə faydalanmaq istədiniz. Siz də (o) batanlar kimi batdınız. Bax bunların, dünyada və axirətdə əməlləri boşa getdi və bax bunlar itkiyə / zərərə uğrayıb acı çəkən kimsələrin məhz özüdür.
70 Onlara, özlərindən öncəki kəslərin; Nuh qövmünün, Adın, Səmudun, İbrahimin qövmünün, Mədyən əhlinin və alt-üst olmuş şəhərlərin xəbəri gəlmədimi? Onlara elçiləri açıq-aşkar dəlillərlə gəlmişdilər. Və sonra, Allah, onlara haqsızlıq edən biri deyildi. Lakin onlar, şirk qoşmaq surətiylə öz-özlərinə haqsızlıq edirdilər.
(113/9, Tövbə / 67-70)

## Nəcm: 706

71 İman edən kişilər və iman edən qadınlar; bunların bəzisi bəzilərinin qoruyucu (himayə edən), yol göstərən yaxınlarıdır. Bunlar hər kəs tərəfindən qəbul edilən yaxşı şeyləri əmr edərlər, bütün pis şeylərdən çəkindirərlər, səlatı iqamə edərlər [maddi və zehni baxımdan dəstək olma; cəmiyyəti maarifləndirmə qurumlarını qurarlar, ayaqda tutarlar], zəkatı / vergini verərlər, Allaha və Onun Elçisinə itaət edərlər. Bax bunlar (ki var), Allah onlara rəhmət edəcəkdir. Şübhəsiz Allah, ən üstün, ən güclü, ən şərəfli, məğlub edilməsi mümkün olmayan / mütləq qalib olandır, yaxşı qanun qoyan, pozulmağın qarşısını yaxşı alan / sağlam edəndir.
72 Allah, mömin kişilərə və mömin qadınlara, içində daimi qalanlar olaraq, altlarından çaylar axan cənnətlər və Ədn cənnətlərində xoş məskənlər vəd etdi. Allahın razılığı isə daha böyükdür. Bax bu, çox böyük qurtuluşun məhz özüdür. (113/9, Tövbə / 71-72)

## Nəcm: 707

73 Ey Peyğəmbər! İnkar edənlər və münafiqlər ilə cihad et; onlara qarşı səy göstər. Və onlara qarşı sərt ol. Onların sığınacaq yerləri də cəhənnəmdir. Və o, necə də pis bir olma yeridir; (necə də pis bir) son dayanacaqdır!
74 Onlar, söyləmədiklərinə dair Allaha and içərlər. Halbuki onlar, küfrü [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmək sözünü] həqiqətən söylədilər. İslamlaşmalarından sonra da kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri oldular. Və çata bilmədikləri, sahib ola bilmədikləri şeyləri çox istədilər. Onlar sadəcə, Allahın və Elçisinin möminləri Allahın ərməğanlarından zənginləşdirməsinə kin bəslədilər. Artıq əgər xətalarından dönərlərsə, özləri üçün xeyirli olar. Əgər geri durarlarsa da, Allah onlara dünyada və axirətdə çox ağrılı-acılı bir əzab ilə əzab verəcək. Yer üzündə onlar üçün bir qoruyucu (himayə edən), yol göstərən yaxın və yaxşı bir yardımçı da yoxdur.
75 Və onlardan bəziləri: "Əgər Allah ərməğanlarından bizə verərsə, həqiqətən bəxşişlər edəcəyik və həqiqətən yaxşılardan olacağıq" deyə Allaha söz verən kimsələrdir.
76 Sonra, nə zaman ki, Allah onlara Öz ərməğanlarından verir, onda xəsislik edərlər və üz çevirərək geri durarlar.
77 Nəhayət, Allaha vəd etdikləri şeylərdə sözlərini tutmadıqları və yalan söylədikləri üçün, O da Özüylə qarşılaşacaqları günə qədər (onların) qəlblərində davam edəcək bir münafiqlik yerləşdirərək, onları cəzalandırdı.

**78,79** Şübhəsiz Onlar; möminlərdən, sədəqələrdən öz könülləriylə bəxşiş edənlərə və güclərinin çatdığından artığını tapa bilməyənlərə dil uzadan, sonra da onları məsxərəyə qoyan kimsələr, Allahın onların sirlərini və pıçıltılarını (gizli danışıqlarını) bildiyini və şübhəsiz Allahın bütün bilinməyənlərin çox yaxşı bilicisi olduğunu bilmədilərmi? Allah, onları masqaraya çevirmişdir. Və onlar üçün çox ağrılı-acılı bir əzab var.
**80** Onlar üçün istər bağışlanma dilə, istər diləmə. Onlar üçün yetmiş dəfə bağışlanma diləsən də, yenə Allah, onları bağışlamayacaqdır. Bu, onların Allahı və Rəsulunu qəbul etməmələri səbəbiylədir. Allah, haqq yoldan çıxmış camaata yol göstərməz. (113/9, Tövbə / 73-80)

**Nəcm: 708**
**81** O geri qoyulanlar / savaşa qatılmayanlar, Allahın Elçisinə zidd olaraq oturub qalmalarıyla fərəhləndilər və mallarıyla, canlarıyla Allah yolunda səy göstərməkdən xoşlanmadılar, bir də "Bu istidə savaşa çıxmayın!" dedilər. De ki: "Cəhənnəm atəşi daha istidir." Kaş ki, yaxşıca qavrayıb anlaya bilsəydilər.
**82** Artıq qazandıqları günahın cəzası olaraq, çox az gülsünlər, çox-çox ağlasınlar. (113/9, Tövbə / 81-82)

**Nəcm: 709**
**83** Əgər Allah səni onlardan bir tayfanın yanına döndərər və onlar çıxmaq üçün səndən izin istəyərlərsə, de ki: "Artıq siz, heç bir zaman mənimlə bərabər əsla çıxmayacaqsınız. Və heç bir zaman mənimlə birlikdə düşmənlə savaşmayacaqsınız. Şübhəsiz siz, ilk öncə oturub qalmaqdan xoşlanırdınız. Artıq geridə qalanlarla bərabər oturub qalın!"
**84** Və onlardan ölən biri üçün dəstək olma, onun qəbirinin üzərində durma. Şübhəsiz onlar, kafirlərdir; Allahın ilah və rəbb olduğunu bilərək rədd edən, Onun Elçisinin gerçək elçi olduğunu bilərək rədd edənlərdir. Və onlar, haqq yoldan çıxmış olaraq ölənlərdir.
**85** Onların malları və övladları da səndə qibtə oyandırmasın. Allah, ancaq onları dünyada bunlarla cəzalandırmağı və onlar kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri ikən canlarının çətinliklə çıxmasını istəyir. (113/9, Tövbə / 83-85)

**Nəcm: 710**
**86,87** Və "Allaha iman edin və Elçisi ilə birlikdə səy göstərin [cihad edin]!" deyə bir surə nazil edildiyi zaman onlardan güc [mal, mülk, övlad] sahibi olanlar səndən izin istədilər və "Qoy biz də oturub

qalanlarla bərabər olaq!” dedilər. Geridə qalanlarla birlikdə olmağı seçdilər. Onların qəlbləri də damğalandı / möhürləndi. Artıq onlar yaxşıca qavrayıb anlamazlar.

**88** Fəqət Elçi və Onunla bərabər olan iman etmiş kimsələr mallarıyla, canlarıyla səy göstərdilər. Və bax onlar (ki var), bütün xeyirlər onlar üçündür. Və bax onlar, (öz) vəziyyəti pozulmayan, qazanclı çıxanların məhz özüdür.

**89** Allah, onlar üçün, içində daimi qalanlar olaraq, altından çaylar axan cənnətlər hazırladı. Bax bu, o çox böyük qurtuluşdur. (113/9, Tövbə / 86-89)

## Nəcm: 711

**90** Bədəvi Ərəblərdən üzr bəyan edənlər, özlərinə izin verilməsi üçün gəldilər. Allaha və Elçisinə yalan söyləyənlər də oturub qaldılar. Bunlardan Kafirlərə [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən kimsələrə], yaxında çox ağrılı-acılı bir əzab toxunacaqdır.

**91,92** Allah və Elçisi üçün səmimi olduqları təqdirdə, zəiflərə, xəstələrə və xərcləmək üçün bir şey tapa bilməyən kimsələrə, bir də onları mindirəsən deyə sənin yanına gəldiklərində: “Sizi üzərinə mindirəcək bir şey tapa bilmirəm” dediyin zaman, Allah yolunda sərf etməyə bir şey tapa bilmədiklərinə görə üzülüb gözlərindən yaş axa-axa geri dönüb gedən kimsələrə bir günah [vəbal], [sıxıntı] yoxdur. Gözəl-yaxşı əməl işləyənlərin əleyhinə bir yol yoxdur. Allah çox bağışlayandır, çox mərhəmət edəndir.

**93** Yol, ancaq zəngin olduqları halda səndən izin istəyən o kimsələrin əleyhinədir. Bunlar, geridə qalanlarla birlikdə qalmağa razı oldular. Allah da onların qəlbləri üzərinə damğa / möhür basdı. Buna görə (də) onlar bilməzlər.

**94** Onlara döndüyünüz zaman sizə üzr bəyan edəcəklər. De ki: “Üzr bəyan etməyin. Sizə qətiyyən inanmayırıq. Allah bizə, sizin xəbərlərinizdən önəmli xəbərlər verdi.” Bundan sonra da Allah və Elçisi işinizi görəcəkdir. Daha sonra da görünməyəni və görünəni bilən Allaha döndəriləcəksiniz. Sonra da O, etdiklərinizi sizə xəbər verəcəkdir.

**95** Onlara döndüyünüz zaman, onlardan kənar dayanmağınız üçün, sizə (görə) Allaha and içəcəklər. Siz də onlardan dərhal kənar dayanın. Şübhəsiz onlar kirlidir, murdarlanmışdır. Qazandıqlarının cəzası olaraq gedəcəkləri yer də cəhənnəmdir.

**96** Onlardan razı olasınız deyə sizin üçün and içərlər. Artıq əgər siz, onlardan razı olsanız da, bilin ki, Allah şübhəsiz haqq yoldan çıxmış o kimsələrin camaatından razı olmaz.

**97** Bədəvi Ərəblər, Allahın ilah və rəbb olduğuna iman etməmək və

münafiqlik baxımından daha çətin; Allahın, Elçisinə nazil etdiklərinin hüdudlarını bilməməyə / öyrənməməyə daha meyillidirlər. Allah da ən yaxşı bilən, ən yaxşı prinsip qoyandır.
**98** Bədəvi Ərəblərdən bəziləri də var ki, cəmiyyətin faydası üçün xərclədiyini zorla ödənmiş borc sayar və sizə bəlalar gəlməsini gözləyər. *–O çirkin bəla öz üzərlərinə (olsun)!–* Və Allah, ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**99** Yenə bədəvi Ərəblərdən elələri də var ki, onlar Allaha və axirət gününə iman edir və xərclədiyini Allah qatında yaxınlıq və Elçinin dəstəkləri sayar. Gözünüzü açın! Şübhəsiz bu, onlar üçün bir yaxınlıqdır. Allah, onları yaxında (Öz) rəhmətinə daxil edəcəkdir. Şübhəsiz Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.
(113/9, Tövbə / 90-99)

## Nəcm: 712

**100** Mühacir və ənsardan ilk öncə önə keçənlər və yaxşılaşdırma-gözəlləşdirmə ilə onları izləyən kimsələr (ki var); Allah onlardan razı oldu, onlar da Ondan razı oldular. Və Allah onlara, içlərində təməlli qalıcılar olaraq, altlarından çaylar axan cənnətlər hazırladı. Bax bu, böyük bir qurtuluşdur.
**101** Və yanınızda bədəvi Ərəblərdən münafiqlər var. Mədinə xalqından da münafiqliyə yaxşıca öyrəşmiş olanlar var. Onları sən bilməzsən. Biz bilirik onları. İki dəfə əzab verəcəyik onlara, sonra da çox böyük bir əzaba (tərəf) döndəriləcəklər.
**102** Digərləri də günahlarını etiraf etdilər. Saleh bir əməllə digər pisi qarışdırdılar. Ola bilər ki, Allah onların tövbələrini qəbul edər. Şübhəsiz Allah, qullarının günahlarını çox örtən, onları cəzalandırmayan və bəxşişi bol olandır, geniş mərhəmət sahibidir.
**103** Onların mallarından sədəqə al ki, sədəqə ilə onları təmizləmiş və paklamış olarsan. Bir də onlara dəstək ol. Şübhəsiz sənin dəstəyin onlar üçün bir rahatlıqdır. Allah ən yaxşı eşidəndir, ən yaxşı biləndir.
**104** Onlar Allahın, qullarından tövbəni qəbul etdiyini, sədəqələri aldığını və Allah tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verənin, çox mərhəmət edənin məhz Özü olduğunu bilmədilərmi?
**105** Və de ki: "Əlinizdən gələni edin! Artıq Allah, Elçisi və möminlər işlərinizi görəcəkdir. Və siz, görünməyəni və görünəni bilən Allaha döndəriləcəksiniz. Sonra O, işlədiklərinizi sizə xəbər verəcəkdir."
**106** Və digərləri, Allahın əmrinə qalanlardır. O (Allah), ya onlara əzab verər, ya da tövbələrini qəbul edər. Və Allah ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır. (113/9, Tövbə / 100-106)

## Nəcm: 713

**107** Və zərər verməy, küfr [Allahın ilah və rəbb olduğunu bilərək rədd etmək], möminlərin arasına ayrılıq salmaq və daha öncə Allah və Elçisinə qarşı savaş açmış; fəsad törətməyə təşəbbüs edənlərə gözətçilik etmək üçün məscid düzəldən bu kimsələr: "Biz, ən gözəldən başqa bir şey istəmədik" deyə and da içərlər. Allah da şahidlik edər ki, şübhəsiz bunlar, həqiqətən yalançılardır.

**108** Sən, o məscidin içində sonsuzadək dayanma / görəv etmə! İlk günündə Allahın mühafizəsi altına daxil olmaq üzərində qurulan məscid, əlbəttə görəvini icra etməyə daha layiqdir. Onun içində təmizlənməyi sevən ər (cəsur) kişilər var. Allah da təmizlənən kimsələri sevər.

**109** Yaxşı, təməlini Allahın mühafizəsi altına daxil olmaq və razılıq üzərində quran kimsə daha xeyirlidir, yoxsa təməlini yıxılmaq üzrə olan bir uçurumun kənarında qurub və onunla birlikdə cəhənnəmin atəşinə yuvarlanan (kimsəmi)? Və Allah, şirk qoşaraq, küfr edərək yanlış davranan; öz zərərlərinə olan əməli işləyən camaata yol göstərməz.

**110** Onların qəlbləri parça-parça olmadıqca, o qurduqları təməlləri, qəlblərində bir şübhə olaraq qalıb itməyəcəkdir. Və Allah, ən yaxşı biləndir, ən yaxşı qanun qoyandır. (113/9, Tövbə / 107-110)

## Nəcm: 714

**111,112** Şübhəsiz Allah, tövbə edən, qulluq edən, təriflər edən, səyahət edən, Allahın birliyini deyən, boyun əyib təslimiyyət göstərən, hər kəs tərəfindən qəbul edilən yaxşı şeyləri əmr edən, pis olan hər şeydən çəkindirən, Allahın hədlərini qoruyan iman edənlərdən, (onların) canlarını və mallarını şübhəsiz cənnəti onlara vermə qarşılığında satın almışdır: Onlar, Allah yolunda savaşırlar; sonra öldürürlər və öldürülürlər. Bu, Allahın Tövrat, İncil və Qurandakı gerçək bir vədidir. Və sözünü, Allahdan daha çox tutan kim var? Elə isə, etdiyiniz alış-verişlə sevinin. Və bax bu, böyük qurtuluşun məhz özüdür. Və möminlərə müjdə ver! (113/9, Tövbə / 111-112)

## Nəcm: 715

**113,114** Özlərinə, cəhənnəm əhli olduqları yaxşıca bəlli olduqdan sonra Peyğəmbərə və iman edən kəslərə, əqrəba belə olsalar, ortaq qoşanlar üçün bağışlanma diləmək yoxdur (yaraşmaz). İbrahimin atası üçün bağışlanma diləməsi də yalnızca ona vermiş olduğu bir sözə görə idi. Sonra onun, Allah üçün bir düşmən olduğu özünə açıq-aşkar bəlli olunca, ondan uzaqlaşdı. Şübhəsiz İbrahim, çox həssas, çox həlim

(xasiyyətli) biri idi.
**115** Allah, bir camaata doğru yolu göstərdikdən sonra, Özünün mühafizəsi altına daxil olmalarına səbəb olacaq şeyləri onlar üçün ortaya qoymadıqca, onları azdırmaz. Şübhəsiz Allah, hər şeyi ən yaxşı biləndir.
**116** Heç şübhəsiz Allah, göylərin və yer üzünün mülkü yalnızca Özünün olandır. O, dirildir və öldürür. Sizin üçün Onun altındakılardan bir yol göstərən, qoruyucu (himayə edən) yaxın və bir yardımçı yoxdur. (113/9, Tövbə / 113-116)

## Nəcm: 716

**117** And olsun ki, Allah, Peyğəmbərə və ən çətin saatında Ona tabe olan Mühacirlərə və Ənsara, onlardan bir qisminin qəlbləri az qalsın dönmək üzrə olduğu halda, tövbə nəsib etdi. Sonra da onların tövbələrini qəbul etdi. Şübhəsiz O, onlara (qarşı) çox şəfqətlidir, çox mərhəmətlidir.
**118** Geri qoyulanlardan o üç nəfərin də tövbələrini qəbul etdi. Elə ki, yer üzü bütün genişliyinə rəğmən onlara dar gəlməyə başlamışdı, mənlikləri (nəfsləri) də onları sıxıntıya salmışdı. Allahdan qurtuluşun, ancaq Allaha sığınmaqda olduğuna da yaxşıca iman etmişdilər. Sonra Allah, dönmələri üçün onlara tövbə nəsib etdi və tövbələrini qəbul etdi. Şübhəsiz ki, Allah tövbələri daha çox qəbul edən, çox tövbə fürsəti verənin, çox mərhəmətli olanın məhz Özüdür.
**119** Ey iman etmiş kimsələr! Allahın mühafizəsi altına daxil olun və doğru kimsələrlə birlikdə olun. (113/9, Tövbə / 117-119)

## Nəcm: 717

**120,121** Mədinə xalqı və ətrafdakı bədəvi Ərəblər üçün, Allahın Elçisindən geri qalmaları və Onun canından əvvəl öz canlarını düşünmələri olacaq şey deyil (yaraşmaz). Bax bu, ona görədir ki, Allah yolunda (onlara) isabət edən hər susuzluq, hər yorğunluq və hər aclıq kafirləri [Allahın ilah və rəbb olduğunu bilərək rədd edənləri] qəzəbləndirəcəkdir,
ayaq basdıqları hər yer və düşmənə qarşı əldə etdikləri hər müvəffəqiyyət qarşılığında onlara həqiqətən saleh bir əməl yazılmışdır,
Allah yolunda kiçik və böyük etdikləri hər xərcləmə və keçdikləri hər vadi qarşılığında həqiqətən onlar üçün, etdikləri işin daha gözəliylə Allahın onları mükafatlandırması yazılmışdır. Şübhəsiz Allah, gözəl-yaxşı əməl işləyənlərin mükafatını itirməz.
**122** Möminlərin, tədbirli olmaları üçün, hamısının birdən toplu halda

(savaşa) getməyi / səfərbər olmaları da (düzgün) olmaz. O halda, dində dərin bilik əldə etmələri, qövmləri onlara tərəf qayıtdıqları zaman onları xəbərdar etmək üçün onların hər təbəqəsindən bir qrupun qalması lazım gəlməzmi? (113/9, Tövbə / 120-122)

## Nəcm: 718

123 Ey iman etmiş kimsələr! İnkar edənlərdən təhlükə yaradan şəxslər ilə savaşın və sizdə bir sərtlik görsünlər. Və şübhəsiz Allahın, Özünün mühafizəsi altına daxil olan kimsələr ilə birlikdə olduğunu bilin.
(113/9, Tövbə / 123)

## Nəcm: 719

124 Və bir surə nazil edildiyi zaman, içlərindən bir kimsə: "Nazil edilən o surə hansınızı iman baxımından gücləndirdi?" deyər. Fəqət iman etmiş kimsələrə gəlincə, nazil edilən o surə, onları iman baxımından artırmışdır; gücləndirmişdir və onlar daimi olaraq müjdələnirlər.
125 Qəlblərində bir xəstəlik olanlara [xarab düşüncəli] olanlara gəlincə də; onların da murdarlıqlarının içinə murdarlıq əlavə etmişdir. Və onlar, kafir [Allahın ilah və rəbb olduğunu bilərək rədd edən] biri olaraq ölmüşlər.
126 Onlar, hər il bir və ya iki dəfə şübhəsiz özlərinin acı hadisələr ilə sınandıqlarını görmürlərmi? Sonra da tövbə etmir və öyüd almırlar.
127 Bir surə nazil edildiyində, bəzisi bəzisinə baxar: "Sizi bir kimsə görürmü?" (deyər). Sonra arxa çevirib gedərlər. Gerçəkdən onlar, yaxşıca anlayıb qavramayan bir topluluq olmalarına görə, Allah onların qəlblərini çevirmişdir. (113/9, Tövbə / 124-127)

## Nəcm: 720

128 And olsun, (öz) içinizdən sizə, sıxıntıya məruz qalmağınız ona ağır gələn, sizi çox sevən, sadəcə iman edənlərə çox şəfqətli (olan), asanlıq təmin edən, çox mərhəmətli bir elçi gəlmişdir. (113/9, Tövbə / 128)

## Nəcm: 721

129 Buna rəğmən, əgər uzaqlaşarlarsa, dərhal de ki: "Mənə Allah yetər. Ondan başqa ilah deyə bir şey yoxdur. Mən, işin nəticəsini sadəcə Ona həvalə etdim. O, çox böyük taxtın Rəbbidir."
(113/9, Tövbə / 129)

# NƏSR (114 – 110) SURƏSİ
# MƏDİNƏ DÖVRÜ

**Nəcm: 722**

**1,2** Allahın yardımı və fəth gəldiyi (zaman) və sən, insanların dəstə-dəstə Allahın dininə girdiklərini gördüyün zaman, **3** Dərhal Rəbbinin tərifiylə birlikdə hər cür nöqsanlıqdan Onu pak tut və Ondan bağışlanma dilə. Şübhəsiz O, əzəldən bəri tövbələri daha çox qəbul edən, çox tövbə (etmə) fürsəti verəndir. (114/110, Nəsr / 1-3)

Allah, doğrusunu və Öz muradını ən yaxşı biləndir.
Qüsursuzluq da sadəcə Allaha məxsusdur.

## DİPNOTLAR:

[1] Dünyada azadlıqlar aradan qaldırılaraq insanlıq şərəfi tapdalanıb bir çox məbudlar, rəbblər əmələ gətirildiyi, şirk, haqsızlıq, yanlış işlər və fitnə-fəsad yayıldığı, təbiətdəki ahəng pozulduğu dövrlərdə, Allah, Öz mərhəməti səbəbiylə müdaxilə edərək, o qövmlərə elçi göndərib kitab nazil edər. Allah, rəhməti Öz üstünə borc qəbul etmişdir. Məkkədə də bu şərtlər altında Muhəmməd elçi olaraq seçilərək, ona vəhy edilmişdir.

[2] *Rəbb* “tərbiyə edib yetişdirən, yaratdıqlarını müəyyən bir proqrama uyğun olaraq, müəyyən hədəflərə çatdıran, inkişafı planlayaraq idarə edən” mənasına gəlir. Bu söz mütləq mənada ancaq Allah üçün işlədilir. İnsanlar üçün “evin rəbbi”, “iş yerinin rəbbi” şəklində istifadə edilir. Bu ifadəyə ən yaxın söz türk dilinə fransız dilindən daxil olan “patron” sözüdür. Bu söz, yaxın mənanı versə də, sadəcə ticarət sahəsinə aid olan bir ifadə olduğundan, “rəbb” sözünün mənasını eynilə vermir. Ona görə də, “rəbb” sözünü bir-iki sözlə ifadə etmək imkanı olmadığından, məalımızda bu sözü ərəbcədəki kimi saxlamaq məcburiyyətində qaldıq. Buna görə də, oxucularımız, yuxarıdakı tərifi yaxşı yadda saxlamalıdır.

[3] Bu əmr şəxsən Peyğəmbərə verilmişdir, başqalarına aidiyyəti yoxdur. Bizim “öyrən-öyrət” şəklində tərcümə etdiyimiz “iqra” sözü məal və təfsirlərdə çox halda “oxu” şəklində tərcümə edilir. Burada tələb olunan şey, bir kitab və yaxud bir yazının oxunması deyil. Belə bir oxuma işini insan öz-özlüyündə də yerinə yetirə bilər. Sözün əsl mənası, “yığ, yığdıqlarını da payla” deməkdir. Beləliklər, bununla nəzərdə tutulan şey “öyrənib-öyrətmək”dir. Bu, peyğəmbərlik vəzifəsinin əsl mahiyyətidir. Elçinin nəyi öyrənib-öyrətməli olduğu daha sonra (8/87, Əla / 1-13; Nəcm: 20) ona bildiriləcək. Buna görə biz bu sözü “öyrən-öyrət” şəklində tərcümə etdik.

[4] Ayədəki *qələmlə öyrədən* ifadəsi ilə Allahın Elçisinə, özünə gələn vəhyləri yazması, yazdırması; beləliklə də mühafizə altına almasının gərəkliliyi işarəylə bildirilmişdir.

[5] İnsan varlandığına inandıqda, özünü Allahla müqayisə edir, əməllərinə görə hesaba çəkilməyəcəyinə inanaraq tağutlaşır, özünü Allahın yerinə qoyur, məsuliyyət hissini itirir.

[6] “Səlat” sözü əsrlərdən bəri əsl mənası xaricində “namaz” olaraq dərk edilmiş və o cür tərcümə edilmişdir. “Səlat” sözünün həqiqi mənası “dəstək olmaq, kömək etmək, problemlərin altına öz çiynini vermək, problemlərin həllini öz üzərinə götürmək, arxa olmaq”dır.

Quranda “əs-səlat” sözü “problemlərə maddi və zehni baxımdan dəstək olmaq, problemlərin həlli üçün öz çiynini yükün altına vermək” mənasında xüsusi isim olmuşdur. Buradakı problemlər sadəcə fərdi problemlər deyil, eyni zamanda iqtisadi və siyasi problemlər, təhsil və təlim-tərbiyə problemləri kimi ictimai problemləri də əhatə etməkdədir. Qısacası, səlat sosial dövlətin əsası və simvoludur. Bizim məalımızda, xüsusi isim olan “əs-səlat” sözünün həm əsli, həm də tərcüməsi verilmişdir. Səlatın tərcüməsi haqqında daha ətraflı məlumat “Təbyinül-Quran”dadır.

[7] “İnsanın, özünü Allahın mühafizəsi altına daxil edərək yaxşı əməl işləməsi, günahlardan uzaqlaşması, bununla da axirətdə ona ziyan və əzab verəcək şeylərdən özünü qoruması” mənasına gələn “təqva” Quranda əvvəlcə “şirkdən qaçmaq” və “axirətə inanmaq” mənasında işlədilmiş, daha sonra da imanı özündə əks etdirən bütün əməlləri ehtiva edəcək şəkildə genişləndirilmiş bir qavramdır. Buna görə də biz “təqva”nı “Allahın mühafizəsi altına daxil olmaq”, “müttəqi”ni isə “Allahın mühafizəsi altına daxil olan şəxs” kimi tərcümə etdik.

[8] Quranda bir çox surənin “qopuq, rabitəsiz hərflər” ilə başladığını görürük. Müxtəlif şəxslər bu hərflərin mütəşabeh, şifr, bir sözün qısaldılmış forması, bəzi sözlərin ilk və yaxud son hərfi olduğu haqqında fikirlər önə sürülmüşdür. Bizə görə bu hərflər “əla” [diqqət, gözünüzü açın] sözü kimi bir xəbərdarlıq işarəsidir və telefon danışıqlarındakı “alo” nidası kimi, oxunacaq ayələrə diqqət çəkmək üçündür. Ayrıca, Quranın riyazi quruluşundakı vacib ünsürlərdən biridir. Digər tərəfdən, bu hərflərin ədədi dəyərləri ifadə etməsi də mümkündür. Çünkü Quranın nazil olduğu dövrdə Ərəblər arasında rəqəmlər icad olunmamışdı, rəqəm yerinə hərflərdən istifadə olunurdu. Rəqəm yerinə hərflərin işlədilməsinə “əbcəd” hesabı deyilir. Biz rabitəsiz hərflərin yanında, onların ədədi dəyərlərini də göstərdik. Bu ədədi dəyərlərin nəyi göstərdiyi barədə hələlik bir qənaətə gəlməmişik. “Əbcəd” hesabı, Quranın nazil olduğu dövrdə rəqəm yerinə işlədilmək xaricində, hər hansı bir keyfiyyətə və xüsusiyyətə malik deyil.

Bu rabitəsiz hərflərlə bağlı qane edici bir tədqiqat hələ ki, meydana qoyulmamışdır və mövcud əsərlərdə, keçmişdəki yozumların nəqlindən başqa bir məlumat yoxdur. Bu məsələnin aydınlaşdırılması da, digər bir çox məsələ kimi, dürüst, səmimi və könüllü Quran tədqiqatçılarını gözləyir.

[9] Bir iddianı konkret dəlillərlə qüvvətləndirmək üçün ərəb dilində “qəsəm cümləsi” adlı bir cümlə növü işlədilir. Yəni “qəsəm cümləsi” bir iddianın dəlillərlə qüvvətləndirilmiş olaraq meydana qoyulması

məqsədi ilə qurulan cümlədir. Qəsəm cümləsi iki hissədən ibarət olur. Birincisi and içilən [dəlil, şahid göstərilən] “qəsəm hissəsi”, ikincisi isə ifadə edilmək istənilən əsas iddianın meydana qoyulduğu “qəsəmə cavab hissəsi”dir. And hissəsində, ikinci hissədə meydana qoyulacaq iddianı dəstəkləmək məqsədi ilə şəxslər, hadisələr yaxud əşyalar dəlil göstərilir. Qəsəmə cavab hissəsində isə nəzərdə tutulan əsl hökm ifadə edilir. Bu cümlələrin quruluşu da digər cümlələrin quruluşundan fərqlidir. Bunlar “Təbyinül-Quran”da detallı bir şəkildə göstərilmişdir.

Bu cümlə növü Quranda yüz dəfələrlə işlədilmişdir. Rəbbimiz bir çox hadisəyə, sistemə yaxud da “şey”ə qəsəm etmiş və bunları, ifadə etdiyi hökmə dəlil göstərmişdir.

[10] Buradan açıq bir şəkildə başa düşülməkdədir ki, Muhəmməd cəmiyyət içində hörmət qazanmış, əxlaqlı, ağıl və zəka baxımından sağlam, təmiz bir sərvətə sahib olduğu üçün peyğəmbər seçilmişdir.

[11] Ayənin hərfi mənası “Xortumunun üstünə damğa vuracağıq” şəklindədir. Bu, ərəblər arasında, hər hansı bir şəxsin camaatın gözü qabağında təhqir edilməsi mənasını daşıyır.

[12] Rəbbimiz, məsələnin doğru başa düşülməsi, ibrət alınması və gələcək üçün yol göstərmək məqsədi ilə yorulmadan misallar çəkir, qissələr nəql edir. Bu qissə və misallar, Quranın nazil olduğu dövrdə yaşayan insanların yaxından bildikləri Nuh, Ad, Səmud, Lut, Musa qövmü / İsrail oğulları, Firon və onların qalıqlarına aiddir. Təlim-tərbiyə baxımından böyük əhəmiyyət daşıyan qissələr, xəbərdalıqedici təsirə də malik olduğundan, Quranda çox sayda qissəyə və misala yer verilmiş, bu qissə və misallar bir çox dəfə təkrar edilmişdir. Qurandakı qissə və misalların üslubundan da başa düşülür ki, bunlar tarixi bilikləri yaymaq məqsədi ilə deyil, öyüd-nəsihət məqsədi ilə nəql edilmişdir. Müəyyən etdiyimizə görə, Qurandakı qissə və misalların öyüd almaq istəyən insanlara aşağıdakı faydaları var:

- Keçmişdə də peyğəmbərlərin gəlib-getdiyinə dair məlumat verməklə, peyğəmbərlərin əsassız olmadığını göstərir.
- Gəlib-gedən bütün peyğəmbərlərin vəzifəsinin təbliğ və nəsihət vermək olduğunu göstərir.
- Hər toplumun liderlərinin, özlərinə göndərilən peyğəmbərə qarşı həmişə mübarizə apardıqlarını göstərir.

Peyğəmbərimizin təbliğinə qarşı mübarizə apararaq ona mane olmaq istəyənlərə, bu davranışlarının əvəzində nə ilə qarşılaşacaqlarına dair keçmişdən –bəzilərini özlərinin də bildiyi– misallar verərək, keçmiş qövmlərin çökmələrinin, məhv olmalarının səbəblərini

açıqlayaraq xəbərdarlıq edir, gələcəyə işıq salır.

Peyğəmbərimizə və onun tərəfdarlarına, qarşılaşdıqları vəziyyətin keçmişdəki peyğəmbərlərlə onların qövmləri arasında meydana gələn hadisələrə oxşadığını, hətta əksəriyyət etibarı ilə eyni olduğunu bildirir. Beləliklə, Allahın elçilərinin daim qalib gəldiyini göstərək, onlara etimad verir, əzmli olmağı təlqin edir və onları mənəvi cəhətdən qüvvətləndirir.

Müasir dövrdə insanlar isə Yaxın Şərqin xaricində, Quranın nazil olduğu dövrdən sonra yox olan mədəniyyətləri və qövmləri, misal üçün Kiçik Asiya, Kraiya, Lidiya, Likiya, Frikiya, Xett, Urartu, İoniya, Ellin, Şumer, Assuriya, Babil, Roma, Makedoniyalı İskəndər, Bizans barəsində tədqiqatlarla tanış olaraq, onların düşdükləri səhvləri təkrar etmədən öz gələcəklərini inşa etməlidirlər.

[13] *Təsbeh* sözü "Allahı, Ona yaraşmayan şeylərdən pak tutmaq, uzaq tutmaq, yəni Allahı ucaltmaq, Onun bütün kamil sifətlərə sahib olduğunu dərk etmək və yeri gəldikcə bunu yüksək səslə söyləmək" mənasına gəlir.

[14] Əsas mənası "həbs etmək, içəridə saxlamaq" olan *səbr* sözü "ağlın və dinin göstərdiyi yolda davamlı olmaq, qərarlı olmaq, zəiflik göstərməmək", yəni "insanın öz əlində olmadan başına gələn, ona böyük qüssə bəxş edən müsibətlərə qarşı dözümlü olmaq, onlara qalib gəlmək üçün mübarizə aparmaq" mənasını verir. Səbrin nə olduğuna baxdığımız zaman, nə olmadığını da bilməliyik. Bilməliyik ki, haqsız yerə məhkumiyyətə boyun əymək, miskinliyə, tənbəlliyə və həqarətlərə razı olmaq, zillətə, haqsız təcavüzlərə, insanın şərəfini ləkələyən hücumlara dözmək, belə şeylərə qarşı səssiz və passiv qalmaq, dözərək qatlaşmaq – səbr etmək deyil. Çünkü qanunsuzluqla qarşılaşdıqda səsini çıxarmamaq, o davranışa ortaq olmaq deməkdir. Əksinə, *səbr* "bu növ pisliklərə qarşı mübarizə aparmaq, onlara etiraz etmək, bir haqqı qorumağa və müdafiə etməyə çalışmaq və bu işdə qərarlı olmaq" deməkdir. Rəbbimiz *səbri* Ali-İmran surəsinin 146-cı ayəsində belə bəyan etmişdir: "Neçə-neçə peyğəmbərlər də vardı ki, onlarla birlikdə bir çox Allah adamı döyüşmüşdü; Allah yolunda onlara üz verənlərdən süstləşmədilər, zəiflik göstərmədilər və boyun əymədilər. Və Allah səbr edənləri sevər." Bir insanın, öz gücü və iradəsiylə qalib gəlmək imkanı olan pisliklərə dözməsi və yaxud öz ehtiyaclarını ödəmək gücü olduğu halda, bu barədə süstlük göstərməsi səbr deyil, acizlik, təmbəllik və qorxaqlıqdır. Bütün peyğəmbərlərin ortaq xüsusiyyəti olan səbrin İslamdakı yeri çox mühümdür. Bunu bir və yaxud bir neçə sözlə ifadə etməyə çalışmaq, *səbr* sözünün mənasını

tam olaraq əks etdirmir. Buna görə də *səbr* sözünü ərəbcədən dilimizə daxil olduğu kimi saxlayırıq. Ancaq oxuyucularımız *səbr* sözünün mənasını yaxşı bilməlidirlər. Səbr mövzusu "Təbynül-Quran"da təfsilatı ilə ələ alınmışdır.

Bizim "darlığa düşmək" kimi tərcümə etdiyimiz *hut* sözünün mənası "doymaq bilməmək, tətmin olmamaq səbəbindən meydana gələn darlıq" deməkdir. Balıqlarda doyma hissi olmadığından, balığa *hut* deyirlər. Burada *Hut sahibi* ifadəsi Yunus və Musa peyğəmbərlər üçün işlədilmişdir. Hər iki peyğəmbər də vəzifələrinin çətinliyindən ötrü darlığa düşmüş və vəzifədən boyun qaçırmağa çalışmışdı. Quranda *hut* sözü (Rəsmi Müshəf: Saffat / 139-149 və Kəhf / 61) hər ikisinə aid edilmişdir. Yenə Quranda (Rəsmi Müshəf: Saffat / 139-148, Nəml / 10 və Qəsəs / 31) bildirildiyinə görə, hər ikisi də onlara tapşırılan vəzifədən boyun qaçırmışdır.

[15] Ayənin orjinalındakı *müzzəmmil* sözünün mənası "libasa yaxud hər hansı bir şeyə bürünən" deməkdir. Məcazi mənası isə "yatmağa hazırlaşmaq, yataq paltarını geyərək yatağa uzanmaq, yorğanı üstünə örtmək; heç kimə qaynayıb-qarışmadan özü öz başına yaşamaq" deməkdir. Biz burada ikinci məcazi mənasını tərcih etdik.

[16] Bu tapşırıq, coğrafi və mədəni şərtlər səbəbindən sosial və mədəni xidmətlərin gecə yerinə yetirildiyi xalqlar üçün nəzərdə tutulmuşdur. Ərəbistan coğrafiyasından kənarda yaşayan möminlər dini vəzifələrini gecə-gündüz demədən, yaşadıqları coğrafi şərtlərə görə ən münasib zamanda yerinə yetirməlidirlər.

[17] *Vəkil* söz "canlı-cansız bütün varlıqları müəyyən bir proqrama görə nizamlayan və bu proqramı qoruyaraq, dəstəkləyərək tətbiq edən" mənasına gəlir.

[18] Bax: 121 nömrəli qeyd.

[19] Bax: 116 nömrəli qeyd.

[20] Bu ayə, Mədinə dövrü ayələrindəndir. Nazil olduğu vaxt dəqiq bilinmir. Müshəfi tərtib edənlər bu ayəni ilk ayələrin arasına yerləşdirmişdirlər. Bizim qənaətimizcə, bir nəcm halındakı bu ayənin (nəcmin) yeri Tövbə surəsinin 106-cı ayəsindən sonra, yəni 712 və 713 nömrəli nəcmlərin arasındadır. Bu ayədə, möminlərin vəzifəsiylə Allah Elçisinin vəzifəsinin bir olmadığı, möminlərin vəzifələrinin daha yüngül olduğu, ilahi prinsiplərin bəndələrə yük olmadığı ifadə edilmişdir.

[21] Daha əvvəl, 10-cu nəcmdə *müzzəmmil* sözüylə xitab edildiyi halda, burada *ya eyyühəl-müddəssir* [ey üst paltarına bürünən] ifadəsi

işlədilmişdir. Bir çox əsərdə *müzzəmmil* və *müddəssir* sözlərinə eyni məna verilmişdir. Halbuki iki sözün arasında mənaca incə bir fərq var. Bu fərq gözdən qaçırılsa, ayənin məzmunu lazımi şəkildə başa düşülə bilməz. *Müzzəmmil* sözü "paltar, yataq örtüyü, qaba örtük kimi şeylərlə ümumi mənada örtünmək" mənasına gəlir. *Müddəssir* sözü isə "ancaq camaatın arasına çıxarkən geyilən bir üst paltarıyla örtünmək" mənasına gəlir. *Müddəssir* sözünün əsli *mütədəssir* şəklindədir. *Dəsar* "cübbə, palto, plaş, qaftan kimi köynəyin üstündən geyilən patlar yaxud bürünülən libas" deməkdir.

Bu ayədə, Qurandakı bədii sənətlərdən biri olan məcaz sənətindən istifadə edilmişdir. Üst paltarının geyilməsi, məcazi mənada camaatın arasına çıxmaq, işə-gücə getmək üçün hazırlaşmaq mənasına gəlir. Bu məcaz vasitəsilə artıq Muhəmmədə peyğəmbərlik libasının verilməsi, onun təbliğə başlamaq üçün hazır olması bildirilmişdir.

Ayənin açıq-aşkar xitabı belə başa düşülməlidir: "Ey peyğəmbərlik libasını geyən! Ey peyğəmbərlik əlbəsəsini geyərək peyğəmbərlik təchizatını qurşanan Muhəmməd!"

[22] *Aləmlər* sözü ilə "Allahın yaratdığı, Allahın imzasını daşıyan və Allahı tanıtmaq üçün bir işarə olan hər şey" nəzərdə tutulur.

[23] Bax: 2 nömrəli qeyd.

[24] *İbadət* sözü dilimizə ərəb dilindəki orjinal formada daxil olmaqla birlikdə, əsl mənasını, yəni insanın "qulluq, köləlik etmək" məqsədli davranışlarıyla bağlı mənasını əsasən itirmiş, sadəcə müəyyən ritualları, ayinləri ifadə etmək məqsədi ilə işlədilmişdir. *Abədə* kök feilinin məsdər forması olan *ibadət* sözü "bəndəlik etmək, köləlik etmək" mənasına gəlir. Bu məna isə insanın qeydsiz-şərtsiz təslim olmasını, itaət etməsini, boyun əyməsini ifadə edir. Dini termin olaraq *ibadət* sözü "bəndənin öz sahibi / yaradanı qarşısında, öz sahibi / yaradanı tərəfindən verilən vəzifələri qeydsiz-şərtsiz qəbul edərək yerinə yetirməsi" mənasını daşıyır. Hər şeyi yaradan Allah, bəndələri üçün müəyyən etdiyi davranış qaydalarını və həyat tərzini onlara müxtəlif şəkillərdə bildirmiş, ən nəhayətində bütün bu qaydaları Quranda cəm etmişdir. Bu həqiqətin işığında *ibadət*, Allah tərəfindən bir təlimatnamə [Quran] vasitəsilə bəndələrə bildirilən vəzifələrə bəndələrin qeydsiz-şərtsiz itaət etməsi və tabe olması, bu vəzifələri yerinə yetirməsi deməkdir. Elə isə, *ibadət* xalq arasında qəbul edildiyi kimi, sadəcə olaraq bir neçə əməli yerinə yetirməkdən ibarət deyil. *İbadət* – Allahın göndərdiyi "qulluq təlimatnaməsində" bildirilən bütün vəzifələri icra etmək, bütün tapşırıqları yerinə yetirmək deməkdir.

[25] *İnzar* sözü “qorxudaraq, məlumatlandıraraq və dərk etdirərək saqındırmaq” mənasına gəlir. Biz, bu sözün əmr formasını “xəbərdarlıq et” şəklində tərcümə etdik. Əziz oxuyucularımız “xəbərdarlıq et” ifadəsinin “qorxudaraq, məlumatlandıraraq və dərk etdirərək saqındır” mənasına gəldiyini yadda saxlamalıdırlar.

[26] Bura qədər oxuduğumuz ayələrdə görürük ki, Rəbbimiz, Muhəmməd ibn Abdullaha xitab edir, ona peyğəmbərlik verir, ona öz Rəbbinin adına öyrənməyi və öyrətməyi əmr edir, onu yetişdirir və vəzifəsini icra etmək üçün hazırlaşdırır, ona peyğəmbərlik libasını və təchizatını verir. Burada isə: “Qalx! Dərhal: *‘Bütün təriflər, aləmlərin Rəbbi, yaratdığı bütün canlılara nemət verən, yaratdıqlarına çox rəhm edən, hər kəsin yaxşı ya da pis bütün fellərin və işlərin əvəzini görəcəyi axirət gününün sahibi, hökmdarı Allahındır. Yalnız Sənə bəndəlik edirik və yalnız Səndən kömək istəyirik. Bizə, üstünə qəzəb yağdırılanların və azıb qalanların yolundan başqa olan yolu, nemət verdiyin kəslərin yolu olan doğru yolu göstər, bildir!’* deyərək xəbərdarlıq et və Rəbbinin ən böyük olduğunu elan et!” deyərək onu vəzifəsini icra etməyə səsləyir. Xüsusilə nəzərə almaq lazımdır ki, bundan əvvəlki nəcmlərdə Rəbbimiz ancaq Peyğəmbərimizə səslənmiş və Peyğəmbərimiz, özünə verilən təlimatları təbliğ məqsədi ilə başqalarına nəql etməyə başlamamışdır. Tarixi məlumatlara görə, “Qalx! Dərhal: *‘Bütün təriflər, aləmlərin Rəbbi, yaratdığı bütün canlılara nemət verən, yaratdıqlarına çox rəhm edən, hər kəsin yaxşı ya da pis bütün fellərin və işlərin əvəzini görəcəyi axirət gününün sahibi, hökmdarı Allahındır. Yalnız Sənə bəndəlik edirik və yalnız Səndən kömək istəyirik. Bizə, üstünə qəzəb yağdırılanların və azıb qal-anların yolundan başqa olan yolu, nemət verdiyin kəslərin yolu olan doğru yolu göstər, bildir!’* deyərək xəbərdarlıq et və Rəbbinin ən böyük olduğunu elan et!” əmrindən sonra Peyğəmbərimiz Səfa təpəsinin üstünə çıxmış, camaatı öz ətrafında toplamış və “Yaratdığı bütün canlılara nemət verən, yaratdıqlarına çox rəhm edən Allah adına (öyrədirəm, xəbərdarlıq edirəm)…” deyə təbliğ işində ilk addımı atmışdır.

Görüldüyü kimi, Fatihə surəsi kimi bilinən 7-ci ayə əslində Müddəssir surəsinin 2-ci ayəsinin bir hissəsi olub, müstəqil bir surə deyil. Bu ayənin müstəqil bir surəyə çevrilərək Müshəfin başına yerləşdirilməsi və “Fatihə” [açılış, giriş, ön söz] adını alması, Quranın Peyğəmbər tərəfindən tərtib edildiyi və yaxud “Fatihə” surəsini təşkil edən ayələrin vəhy olmayıb, Peyğəmbər tərəfindən elan edilən bir bəyanat olduğu, bu bəyanatın da ön söz kimi Quranın əvvəlinə əlavə edildiyi

qənaətini meydana gətirməkdədir.

[27] "Üfürərək boru çalmaq" keçmiş dövrlərdə, bir yerə yığışmaq lazım gəldiyini yaxud bir təhlükə gözlənildiyini xəbər vermək məqsədi ilə baş vurulan bir üsuldur. Belə borular əsasən iribuynuzlu heyvanların buynuzundan düzəldilirdi. Sura (boruya) üfürülməsi bir toplanış borusunun çalınmasını yaxud fitinin çalınmasını, məktəblərdə dərsin başladığını və ya başa çatdığını bildirən zəngin çalınmasını xatırladır. Biz bunu "həyəcan siqnalının çalınması" şəklində də başa düşə bilərik.

[28] Bu ayələrin mütəşabeh ayələr olduğu qəbul edilmiş və təbii olaraq, müxtəlif təfsir və məallarda müxtəlif şəkildə izah edilmişdir. Yenə bu səbəbdən, gələcəkdə də müxtəlif izahların olması ehtimal daxilindədir. Ayədə işlədilən *bəşər, səqər* və *levvaha* sözləri vasitəsi ilə müxtəlif bədii sənətlərə baş vurulmuşdur. *Səqər* sözünün kök mənası "hərarətin beyni ağrıtması" şəklində başa düşülür. Bu mənasından ötrü *səqər* sözü cəhənnəmin xüsusi adlarından birinə çevrilmişdir. Eyni abzasda Rəbbimiz, "Bilirsənmi ki, Səqər nədir?" deyə buyuraraq, hamının bildiyi mənanın nəzərdə tutulmadığını, fərqli bir mənaya işarə edildiyini göstərmişdir. Buna bənzər misallar çoxdur. Deməli, burada (15-ci nəcmdə) Rəbbimiz *səqər* sözünə fərqli bir məna vermişdir: "Səqər – üzərinə 'on doqquz' qoyulan, insan üçün görünməmiş lövhələr hazırlayan, nə meydanda saxlayan, nə də yox eləyən bir şeydir." Və Quranın bəşər sözü olduğunu iddia edən həyasızlar səqərlə qarşılaşacaq, səqər sayəsində, Quranın bəşər sözü olmadığını qəbul edəcəklər. *Bəşər* sözü "xalq, insan" mənasına gəldiyi kimi, insanın, üstündə tüklər bitən üz, baş və bədəninin üst dərisi" mənasına da gəlir. *Levvahatün* sözünün kökü olan *levh* sözü isə "taxta" mənasıyla birgə, "şimşəyin çaxması, parıldamaq, uzaqdan görünmək, yandırıb yaxmaq, dərini qaraltmaq, susamaq" kimi mənalara da gəlir. Oxuyucular, sözlərin bu fərqli mənalarından yola çıxaraq, öz anlayış səviyyələrinə görə hər hansı bir mənanı qəbul edə bilərlər.

Rəsmi Müshəfə görə buradakı 31-ci ayənin əslində məna və quruluş baxımından bura aidiyyətinin olmadığı açıq-aşkar görünür. Müshəfi tərtib edən heyətin etinasızlığı ucbatından bura əlavə edildiyi qənaətindəyik. Rəsmi Müshəfdəki Ali-İmran surəsinin 7-ci, Bəqərə surəsinin 26-27-ci ayələri ilə eyni mövzunu işləyən bu ayənin yerini dəqiqləşdirmək hələlik mümkün olmamışdır. Buna görə də bu ayəni burada saxlayaraq, müstəqil bir nəcm (15-ci nəcm) olaraq təqdim etdik. Bu ayənin özündən əvvəlki və sonrakı ayələrlə əlaqəsi yoxdur.

[29] Bu ayədə, Quranın bəşər sözü olmadığına başqa bir sübut göstərilir və səqərin dəyərindən bəhs edilir. Ayədəki sözlərin "həqiqi" mənası

nəzərə alınsa, ayə bu şəkildə başa düşülməlidir: “Xeyr! Xeyr! And olsun Aya, arxasını çevirdiyində gecəyə, ağarıb işıldadığında səhərə, qəsəm olsun ki, o [səqər] bəşər üçün, sizdən irəli keçmək / irəliləmək yaxud geriyə qalmaq / geridə qalmaq istəyənlər üçün həqiqətən ən böyük xəbərdarlıqlardan biridir.” Daha sonra görəcəyimiz kimi *qəmər* [ay] sözü məcazi olaraq “Elçi”ni, *gecə* sözü “cəhalət”i, *səhər* sözü “cəmiyyətin maariflənməsi”ni ifadə etməkdədir. Buna görə də biz məalda birbaşa məcazi mənaları verdik. Bu abzasda açıq-aşkar Elçi Muhəmmədin bilik və bacarıqlarının çərçivəsi, Quranın cəmiyyətə təsiri, cəhaləti aradan qaldırması, cəmiyyəti maarifləndirməsi nəzərə alındıqda, Quranın bəşər sözü olmadığı qəti bir şəkildə başa düşülür. Səqər də bunu başqa bir cəhətdən isbat etməkdədir.

[30] Bu surədə Əbu Ləhəb adıyla bəhs edilən şəxsin Qüreyş tayfasının tanınmış şəxslərindən Əbdulüzza ibn Əbdülmüttəlib ibn Haşim olduğu, arvadının isə Ümmücəmil [Əvra] olduğu hamılıqla mübahisəsiz qəbul edilmişdir. Tarixi qeydlərə görə Əbu Ləhəb son dərəcə varlı, iri cüssəli, qırmızısifət, tez hiddətlənən biri idi. Ömrünün axırına qədər İslamiyyətə qarşı mübarizə aparmış, həmişə müşriklərin başında yaxud yanında yer almışdır. Bədr döyüşündə şəxsən iştirak etməsə də, öz yerinə muzdlu əsgər göndərmişdir. Peyğəmbərimiz Allahdan gələn vəhyi insanlara təbliğ etməyə başladıqda, buna mane olmağa çalışan ilk şəxs Əbu Ləhəb olmuşdur. “Fatihə”nin camaata oxunması əsnasında “Həlak olasan, bizi bura bunun üçünmü yığmısan?” deyərək Peyğəmbəri daşa tutmuş və ayağından yaralamışdır. Daha sonra da Peyğəmbərimiz özünə verilən vəzifəni icra etmək məqsədi ilə bazar və meydanlarda gəzərək haqqı təbliğ edərkən, Əbu Ləhəb də onu kölgə kimi izləmiş, ona mane olmaq üçün hər cür üsula əl atmışdır. Peyğəmbərin yığıncaqlarına təxribat salır, “Bu mənim qardaşım oğludur, məcnundur, ona qulaq asmayın” deyərək camaatı yoldan çıxarmağa çalışırdı. Sözlü təcavüzlərini bəzən feli hücumlara çevirirdi. Elədikləri bununla da qalmırdı. Bəzi yerlərdə “Əgər qardaşım oğlunun dedikləri düz olsa, oğul-uşağımı və malımı fidyə verərək özümü əzabdan xilas edərək” deyə, Peyğəmbərimizə lağ edirdi.

Əbu Ləhəb sözlü və feli təcavüzlərlə Peyğəmbərimizə olan düşmənçiliyinə hər müstəvidə davam edərkən, arvadı da boş dayanmır, Peyğəmbərimizin yaşadığı küçəyə və evinin ətrafına tikanlar səpərək və onun əleyhində dedi-qodu yayaraq öz ərinə kömək edirdi. Öz ərinə o qədər cidd-cəhdlə kömək edirdi ki, çox sevdiyi və həmişə üstündə gəzdirdiyi boyunbağını da Peyğəmbərimizə qarşı işlənən pisliklərin

mükafatı olaraq xərcləmişdi. Müfəssirlərdən çoxu, bu surədəki “boynunda lifdən kəndir” ifadəsinin o məşhur boyunbağını təmsil etdiyi qənaətindədir.

Ən yaxın qohumlarının Peyğəmbərimizə maneçilik törətməsi, onu çox məyus edirdi. Çünki onların maneçilikləri və mənfi təbliğatları ucbatından, istədiyi müvəffəqiyyəti əldə edə bilmirdi. Əmisinin ona vurduğu ziyan, başqalarının vurduğu ziyandan dəfələrcə artıq idi. Bəzi adamlar, “Öz əmisi belə ona inanmadığı halda, biz niyə inanaq?” deyirdilər.

“Ləhəb surəsi” adıyla bilinən bu ayələr, belə bir şəraitdə Peyğəmbərimizə təsəlli vermək, ona dəstək olmaq, ona mənəvi güc vermək məqsədi ilə nazil edilmişdir.

Daha əvvəl nazil olan ayələrdə, hər hansı bir ad çəkilməyərək, mal-mülk, nüfuz və güc sahibi olduqları üçün təkəbbürlənərək yoldan çıxan şəxslərdən bəhs edilmiş, axirət gününü də təkzib edən bu şəxsləri Allaha tapşırmaq lazım gəldiyi, onların cəzasının Allah tərəfindən veriləcəyi bildirilmişdir. Əvvəlki surələrdə sifətləri və xarakterləri sadalanaraq yad edilən şəxslər, bu surədə Əbu Ləhəbin şəxsində konkretləşdirilmişdir.

Quran; zamanın və məkanın fövqündə cahanşümul bir mesaj olduğundan, onun sadəcə müəyyən bir dövrə və müəyyən bir coğrafiyaya məxsus olduğunu düşünmək doğru deyil. Allah Quranda hər hansı bir mövzuda misal çəkərkən tarix, yer və ad göstərməz. Şəxsləri öz hərəkətləri, davranışları, sifətləri və xarakterləri ilə tanıdır. Beləliklər də, çəkdiyi misalın hər zaman və hər yerdə mötəbər olmasını təmin edər.

Bu surənin bir qayəsi də, Peyğəmbərimizin doğma əmisinin belə hər hansı bir imtiyaza sahib olmadığını göstərməklə, krallıq yaxud köləlik, zənginlik yaxud yoxsulluq kimi sosial vəziyyətlərin, yaxud da seyidlik və şəriflik kimi nəsil xüsusiyyətlərinin insanlara axirətdə heç bir imtiyaz verməyəcəyini başa salmaqdır.

Bu ayələr, gələcəkdən xəbər verməklə, başqa bir möcüzə də göstərmişdir. Surədə Əbu Ləhəb və onun arvadının iman etməyəcəyi və cəhənnəmlik olduqları bildirilmişdir. Bu surə nazil olduqdan sonra 15 il yaşayan Əbu Ləhəb həqiqətən də ölənə kimi iman etməmişdir. Quranın nazil olduğu illərdə hamının şahid olduğu bu möcüzə, Muhəmmədin peyğəmbərliyinin də açıq-aşkar sübutlarından biridir.

[31] *Təbbət* sözünün həqiqi mənası “qurudu, yox oldu, həlak oldu” şəklindədir. Ayədəki *iki əl* ifadəsini “bir parçanı qeyd etməklə bütövü

nəzərdə tutmaq" məqsədiylə işlədilən məcaz olaraq qəbul etmək lazımdır, yəni iki əl qeyd edilərkən, arxa planda, o əllərin sahibi nəzərdə tutulur.

*İki əl* ifadəsi Əbu Ləhəbin iki günü təmsil edir. Nəcmin 3-cü cümləsində bu güclər "malı və qazandıqları" kimi izah edilmişdir. Əbu Ləhəbin varlı bir adam olduğu nəzərə alınsa, "qazandığı şeylər" deyərkən ətrafına topladığı adamlar, qurduğu təşkilat, oğulları, nökərləri və yığdığı dəstədən bəhs edildiyi nəticəsinə məntiqi yolla varmaq mümkündür. Biz məalda məcazi mənasına üstünlük verdik.

[32] Ayənin orjinalındakı sözlərin həqiqi mənası belədir: "on aylıq boylu dəvələr qiymətsiz olanda". "On aylıq boylu dəvə" bugünkü ferma, mədən, iş mərkəzi və sair şeylər kimi, o dövrdə insanlara mənfəət verən, onların sahib olduqları ən yaxşı gəlir mənbələrini ifadə edir.

[33] Ayənin orjinalındakı sözlərin həqiqi mənası belədir: "vəhşi heyvanlar bir yerə yığışanda". Qiyamətin dəhşəti qarşısında vəhşi heyvanların belə qoyun-quzu kimi bir yerə yığışacaqları, yəni öz xilqətlərini itirəcəkləri bu ifadə ilə izah edilmişdir.

[34] Ayənin orjinalındakı sözlərin həqiqi mənası belədir: "nəfslər qoşalaşdırılanda". Vəqiə surəsinin 7-ci ayəsinə (Nəcm 127) görə, buradakı qoşalaşdırma, insanların öz aralarında "sağın əhli, solun əhli və önə keçənlər" olaraq toplanıb qruplaşdırılmasıdır.

[35] Ayədəki *izal-mev'udəti suilət* ifadəsi çox vaxt belə tərcümə edilir: "diri-diri torpağa basdırılan qızdan soruşulanda". Halbuki bu tərcümə, ayənin mənasını daraltmaq deməkdir. İfadənin əsl mənasında isə "təzyiq və əziyyət nəticəsində imkanları məhdudlaşdırılan, təhsil və təlimdən, iş imkanından məhrum edilən, bu səbəbdən ötrü çətin, səviyyəsiz bir ömür yaşamaq məcburiyyətində qalan, ömrü ah-vay ilə, inildəməklə keçən qızlar, oğlanlar və bütün yetişkinlər" nəzərdə tutulmuşdur.

[36] Ayənin orjinalındakı ifadələrin həqiqi mənası belədir: "İndi o gizlənənlərə, yuvasına axıb gedənlərə, yönələndə gecəyə, nəfəsini dərəndə səhərə and içirəm ki". Biz, məcazi mənalarına üstünlük verdik.

[37] *Ərş* "ən böyük, ən uca məqam / taxt" deməkdir. Quranda 26 dəfə işlədilmişdir. Bunlardan dördü Nəml surəsində Səba mələkəsinin taxtı, biri Yusuf surəsində Yusuf peyğəmbərin taxtı olmaqla, bəndələr üçün istifadə edilmişdir. 21 yerdə isə məcazi olaraq Allahın taxtından bəhs edilmişdir.

Burada ərşin məcazi olaraq Allaha məxsus olduğunun göstərilməsi, Allahın ən uca məqam sahibi olduğunu, Ondan üstün bir idarəçi olmadığını bildirmək məqsədini güdür.

[38] *Elçinin sözü* "Elçi tərəfindən, əskildilib-artırılmadan, özündən bir şey əlavə edilmədən təbliğ edilən, onu elçi kimi göndərənin sözü" kimi başa düşülməlidir.

[39] Ayənin orjinalındakı ifadə belədir: "bu, qovulmuş şeytanın sözü deyil". *Şeytan* sözünün lüğət mənası "haqdan uzaq olan" deməkdir. Qavram olaraq "haqqa və ağla zidd hərəkət edən bütün şəxslərin, güclərin və qurumların ümumi və xarakteristik adı" kimi qəbul edilməlidir.

Şeytanın kim yaxud nə ola biləcəyi, xüsusiyyətləri Quranda təfsilatı ilə mövcuddur. Qurana görə şeytan: a) haram yeməyi, haqsız qazanc əldə etməyi təklif / əmr edən; b) pislik, həyasızlıq etməyi, Allaha qarşı bilmədiyimiz şeyləri söyləməyi bizə təlqin edən; c) bizi yoxsulluqla qorxudan; d) bizim vəhmə qapılmağımıza səbəb olan; e) Allahın yaratdıqlarını dəyişdirməyi bizə əmr edən; f) yoldan çıxarmaq məqsədi ilə bizə bər-bəzəkli sözlər pıçıldayan; g) bizə vəsvəsə verən, zehnimizi qarışdıran; h) işlədiyimiz əməllərlə bizi şıltaqlaşdıran; i) bizi yoldan azdıran; j) içki / narkotik vasitə və qumar vasitəsiylə insanların arasına düşmənçilik və kin salmaq istəyən; k) bizi Allahı yada salmaq və Ona bəndəlik etməkdən geri qoymaq istəyən şəxslər və güclərdir.

"Qovulmuş şeytan", "inadkar şeytan" ifadələri də Quranda "İblis" barəsində işlədilmişdir. "İblis" isə "insanın düşüncə qabiliyyəti"dir. Quranda İblis – gözə görünməyən, insanın zehninə vəsvəsə verən; xam fikirlər meydana gətirən, insanlara onların ətraflarından yaxınlaşan, təsir nəticəsində fəaliyyətə keçən, təsirsiz sahələrdə fəaliyyət göstərməyən, canlılardan sadəcə insanda olan, insana tabe olmayan, enerjidən yaradılmış bir güc, qabiliyyət şəklində tərif edilmişdir. Quranda bu qabiliyyət müşəxxəs formada işlədilmişdir. Daha ətraflı məlumat üçün "Təbyinül-Quran"a baxa bilərsiniz.

[40] *Adın təsbeh edilməsi / adın pak tutulması:* Bir adı "təsbeh" etmək [nöqsanlarda uzaq tutub ucaltmaq], əslində o adın sahibini "təsbeh" etmək deməkdir. Çünkü adın sahibinin ucalığı və müqəddəsliyi, adın ucalığı və paklığı ilə ifadə edilir. Yəni adın təsbeh edilməsinin məqsədi, Rəbbimizə yaraşmayan ad və sifətləri Ondan uzaq tutmaq, Onun adına atılan iftiraları təmizləməkdir. Quranın nazil olduğu dövrdə ərəblər arasında müəyyən səhv və axmaq inanışlar mövcud idi. Məsələn: a) mələklərin Allahın qızları olduğu; b) Üzeyir və İsanın Allahın oğlu olduğu; c) bəzi mələklərin və bütlərin insanları Allaha

yaxınlaşdırdığı; d) cinlərlə Allah arasında nəsəb əlaqəsi [soy bağı] olduğu inanışları. Ona görə də, “adı təsbeh etmək” əmrini yerinə yetirmək üçün bu cür inanışları əks etdirən ad və sifətləri Rəbbimizin ad və sifətləri arasından dərhal çıxarmaq lazım gəlir.

[41] Ayədəki sözlərin “həqiqi” mənası belədir: “Bürüyüb örtəndə gecəyə, parıldayanda gündüzə və kişini, qadını yaradana and olsun ki, sizin zəhmət və səyləriniz həqiqətən müxtəlif və hissə-hissədir.” Biz məcazi mənalarını təklif edirik.

[42] Ayələrin lüğət mənası belədir: “Şəfəqi, on gecəni, cütü və təki, keçib gedən bu gecəni sübut göstərirəm ki, şübhəsiz, Rəbbin nəzarət edir.” Biz məcazi mənalarına üstünlük verdik. Rəsmi Müshəfdə 14-cü sırada olan və “Şübhəsiz ki, Rəbbin nəzarət edir” mənasını verən ayə, qəsəm cümləsinin cavab hissəsidir. Texniki baxımdan və mənası etibarıyla qəsəm cümləsində yer almalı olduğu halda, Müshəfi tərtib edən heyət tərəfindən, əlaqəsiz bir yerə yerləşdirilmişdir.

[43] Ayənin orjinal halda mənası belədir: “Bunlarda, ağıl sahibləri üçün qüvvətli, qane edici bir izah varmı?” Bu cür suallara bəlağət elmində “istefhamı-inkari” deyilir. Belə suallar cümləyə “Əlbəttə var, əksini demək mümkün deyil.” mənasını verir. Bu səbəbdən, məalda bədii mənasını göstərdik.

[44] “Pazların sahibi” ifadəsi klassik ərəb dilində işlədilən, bədəvilərə məxsus qədim bir termindir. Bu termin “böyük bir nüfuz sahibi” yaxud “sarsılmaz, yıxılmaz bir güc” mənasında işlədilirdi. Bədəvi çadırını saxlayan pazların sayı, o çadırın böyüklüyünə görə müxtəlif olurdu. Çadırın böyüklüyü isə sahibinin statusuna və gücünə görə müxtəlif olurdu. Buna görə, güclü bir qəbilə rəisi çox vaxt “saysız-hesabsız dirəklərin üstündə dayanan çadırın sahibi” kimi təqdim edilirdi.

[45] Ayənin orjınalındakı sözlər bu mənanı verir: “səhər vaxtı və zülməti tamamən bürüyən gecə”. Biz burada məcazi mənalarına üstünlük verdik.

[46] Bax: 24 nömrəli qeyd.

[47] *Fil Əshabı*, Qurana görə, şər planları ucbatından Allah tərəfindən həlak edilmiş bir cəmiyyətdir. Ərəb və İslam mənbələrinə görə “Əshabı-fil” Həbəşistanın Yəmən valisi Əbrəhənin sərkərdəliyi altındakı bir ordunun adıdır. Heybətini artırmaq məqsədi ilə bu ordunun önündə Həbəşistandan gətirilən bir fil gedirdi.

Tarixi mənbələrə görə, VI əsrin ortalarında Həbəşistanın Yəmən valisi olan Əbrəhə, ərəblərin Kəbəyə necə ehtiram göstərdiklərini görmüş, dini, siyasi və iqtisadi qayələrlə Sana şəhərində əl-Qulleys adında

möhtəşəm bir kilsə tikdirmiş və ərəbləri bu kilsəni ziyarət etməyə səsləmişdi. Ərəblər bu dəvəti qəbul etməmişdilər, onlardan biri isə Əbrəhənin kilsəsini təhqir məqsədi ilə kirlətmişdi. Bundan çox qəzəblənən Əbrəhə, Kəbəni dağıtmaq məqsədi ilə ordusuyla birgə Məkkəyə hücuma keçmişdir. Ordunun önündə bir fil getdiyi üçün bu hadisəyə "Fil hadisəsi", bu hadisənin meydana gəldiyi ilə isə "Fil ili" deyilmişdir. "Əshabı-fil" sözünün lüğət mənası "axmaqlar, ağılsızlar dəstəsi" deməkdir. Burada bu ifadə ikibaşlı işlədilmişdir.

[48] Bax: 2 nömrəli qeyd.

[49] *Cin* və *ins* sözləri Quranda ilk dəfə burada işlədildiyinə görə, bu sözlər haqqında qısa məlumat vermək istəyirik. *Cin* – xalqın inanışında "insan kimi yeyib-içən, çoxalan, inanan, bəzən bu işin əhli olan insanlar tərəfindən işlədilən, fövqəladə gücə və biliklərə sahib olan, insanları vuran, istədiyi insana ziyan verən, böyük mənəvi duyğulara ilham verən gizli dəstək gücü, görünməyən məxluq" kimi bilinir. Bu səbəbdən Quran da səhv başa düşülməkdədir. *Cin* sözü əslində "örtülü məxluq; insanın beş duyğu orqanı ilə hiss edə bilmədiyi, dərk edilə bilməyən, varlığı şübhə götürməyən varlıq yaxud güc" deməkdir. Bu sözün zidd mənalısı olan *ins* [*insan*] isə "beş duyğu orqanı ilə hiss edilə bilən, bilinən, görünən, tanınan, rabitə qurulan, yox olmayan, həmişə meydanda olan" deməkdir. Bildiyimiz bu sözlər də *cin* sözündən əmələ gəlmişdir: *cənnət* [torpağı ağac yarpaqlarıyla gizlənmiş yer], *cinnət* [ağlın, düşüncənin gizlənməsi, dəli olmaq], *cənin* [ana bətnində gizləndiyi üçün belə adlanır], *cünnət* [döyüşdə istifadə olunan qalxan, döyüşçünü ox və mizraq zərbələrindən qoruyub gizlətdiyi üçün belə adlanır].

Quranda *cin* sözünün "mikroorqanizmlər, elektrik, maqnit, şüa, radiasiya, casus, kim olduğu bilinməyən, yad şəxs" kimi mənalarda işlədildiyini görəcəyik. Bir də, Quranda *ins* və *cin* sözlərinin birgə işlədildiyini görürük. Zidd mənalı bu iki söz birgə işlədildiyində, sözlər başqa mənalar kəsb edir, mənaca zənginləşir.

Zidd mənalı iki sözdən daha geniş mənalar əldə etmək üsuluna bütün dillərdə rast gəlmək mümkündür. Məsələn: gecə-gündüz, yaş-quru, canlı-cansız, it-pişik, səhər-axşam, yer-göy, yaxşı-pis, acı-şirin, sağ-sol, irəli-geri, aşağı-yuxarı, en-boy, ağ-qara, irili-xırdalı, dünya-axirət kimi zidd mənalı sözlər birgə işlədildiyində, sözlərin ayrı -ayrılıqda mənasından daha fərqli və geniş mənalar qazanır.

Bir-birinə zidd mənalar daşıdığını gördüyümüz *ins* və *cin* sözləri, birgə işlədildiyində "gördüyümüz-görmədiyimiz, bildiyimiz-bilmədiyimiz, tanıdığımız-tanımadığımız, hər kəs və hər şey" mənasını verir.

Quranda buna çox sayda misal var.

[50] Lüğət mənası “örtünmək, gizlənmək, alışmaq və bəndəlik” demək olan *ilah* sözü, ümumiyyətlə “ibadət edilən, tapınılan, ucaldılan” şeylərin ortaq adına çevrilmişdir. *İlah* sözünə “ehtiyacları aradan qaldıran, işlənən əməlin əvəzini verən, sükunət və arxayınlıq bəxş edən, ucalıq, öz hökmü altına alaraq qoruyan, müsibət zamanı qoruyan” mənalarının verilməsini, bu sözün “ibadət edilən varlıq” mənasında işlədilməsinin səbəbi olaraq göstərmək mümkündür.

Quranda *ilah* sözü həm “haqq və yaxud batil ayırmadan, insanların tapındığı varlıq” mənasında, həm də “həqiqətən ibadətə layiq olan haqq məbud” mənasında işlədilmişdir.

[51] Bir çox mənası olan *səməd* sözünün tərcüməsini bir sözlə vermək mümkün deyil. *Səməd* sözünün aşağıdakı mənaları var: bütün ehtiyaclar üçün müraciət edilən ağa, böyük; içində boşluq olmayan, içinə bir şey qoymaq mümkün olmayan, heç bir şeyə ehtiyacı olmayan; hər şeyi bilən; həlim; şan və şərəfi zirvədə olan; hər şeyi yaradan; arzu edilən işlərdə müraciət edilən, yalvarılan, sıxıntılı anlarda kömək istənilən; istədiyini edən, istədiyi hökmü verən, verdiyi hökmlər barəsində heç kim tərəfində sorğu-sual edilə bilməyən, hökmü heç kim tərəfindən ləğv edilə bilməyən; yeganə şərəfli zat; qəni / varlı; qullarının üstündə qahir olan, özündən yuxarıda heç kim olmayan, özündən aşağıdakılara ehtiram göstərməsinə ehtiyac olmayan; bütün ehtiyaclarda özünə müraciət edilən; yeməyən, içməyən, doyuzduran, ancaq doyuzdurulmayan; yaratdıqları yox olduqdan sonra da baqi qalan; əbədi və əzəli olan; ölməyən, varisi olmayan; yuxlamayan və oyandırılmayan; heç kimin sifətləri ilə tərif edilməsi mümkün olmayan; eybi, əskiyi, nöqsanı olmayan; başına bəla gəlməyi mümkün olmayan; sifətlərində və işlərində ən mükəmməl olan; daim qalib gələn, əsla məğlub olmayan; xüsusiyyətləri barədə məxluqların hər hansı bir məlumata sahib ola bilmədiyi, gözlərin qavraya bilmədiyi; əskiyi-artığı olmayan.

Bu ifadələri riyazi terminlərlə xülasə etmək istəsək, varlığına dair heç bir ədəd sistemində (natural ədədlərdən xəyali ədədlərə qədər) hər hansı bir əməliyyat aparmaq mümkün olmayan mükəmməl, kamil varlıq.

Bu qədər zəngin mənası olan bir sözün Quranda Allah barəsində işlədilmədən əvvəl, tarixdə hər hansı başqa bir məbud barədə işlədilməməsi də diqqəti cəlb edən bir məsələdir.

[52] Ayədəki *fövqəladə qüvvələri olan, üstün ağıl sahibi və ərşdə hökmranlığını qurmuş olan* ifadələriylə “Allah” nəzərdə tutulmuşdur.

Əlbəttə bu sözlər həqiqi mənasında yox, məcazi mənada başa düşülməli və burada, Allahın zatından yox, Onun təcəllasından, Onun qüdrətinin əks olunmasından söhbət getdiyi bilinməlidir. Musa peyğəmbərə ilk vəhy gəldikdə Allahın "dağda, ağacda bir alov" kimi təcəlla etdiyi də Quranda yer almışdır.

Ayənin orjinalındakı *isteva* sözünün məcazi mənası belədir: "hakimiyyət qurdu, nəzarət altına aldı". Ayələrdə görüldüyü kimi, "ərşə isteva etdi" sözü "ən böyük, ən uca məqamda hakimiyyət qurdu, nəzarəti öz əlinə aldı" mənasına gəlir. Bu mütəşabeh qavram, ayədə məcazi mənasıyla işlədilmişdir. *İsteva* sözü "Rəsmi Müshəf"də bu ayələrdə işlədilir: Yunus / 3, Rə'd / 2, Furqan / 59, Səcdə / 4, Taha / 5, Əraf / 54, Bəqərə / 29. Ayədə *isteva edən* ifadəsiylə nəzərdə tutulan da Allahdır. Çünkü *isteva* Allahın sifətlərindən biri olub, mələklərin yax-ud bəndələrin sifəti deyil.

[53] Ayədə işlədilən *yay uzunluğu* o dövrdə istifadə edilən və o dövrün adamlarının bildiyi bir uzunluq ölçüsüdür. "Metr" kimi beynəlxalq səviyyədə qəbul edilən ölçülər olmadığından, regional ölçülərdə istifadə edilirdi. "Yay boyu" da o dövrdə işlədilən rumh [nizə], sövt [dəyənək], arşın, qulac, boy, isbi [barmaq], xətvə [addım], şibr [qarış], zira [qol], ox atımı kimi ölçü vahidi idi. Belə ölçü vahidləri o dövrdə Qərb ölkələrində də var idi. Məsələn insan ayağının ölçüsünü əsas götürən "feet", insan əlinin baş barmağının dırnaq dibinin genişliyini əsas götürən "inch" kimi ölçülər Qərbdə işlədilən ölçü vahidləri idi. Yəni Uca Allah öz mesajında, xitab etdiyi camaatın bildiyi bir ölçü vahidini işlətmişdir.

[54] Ayədə keçən *vəhy* sözünün ilk mənası "gizli bir şəkildə məlumat vermək"dir. Daha sonra zaman keçdikcə, bu mənanın ətrafında "gizli danışıq, işarət etmək, əmr vermək, ilham vermək, ima etmək, pıçıldamaq, məktub yazmaq, elçi göndərmək" mənalarında da işlədilmişdir.

*Vəhy* sözünün bir termin kimi mənası isə belədir: "Allahın Öz əmrlərini, hökmlərini bir vasitə və vasitəçi olmadan, gizli və sürətli bir şəkildə peyğəmbərlərinə bildirməsi". *Vəhy* sözü *ilqa* sözü ilə eyni mənada işlədilir.

Vəhyin necə meydana gəldiyini bilmirik, bilməyimiz mümkün də deyil. Çünki Allah, yoxdan var etmək kimi, bu işi də "Öz işlərindən biri; başqa heç kimin eləyə bilmədiyi, eləməsi mümkün olmayan bir iş" kimi tərif etmişdir.

[55] Lat, Uzza, Mənat adlarının quruluşu və mənası haqqında geniş izahat vermək mümkündür. Ancaq biz, hər üçü müənnəs [qadın

cinsində] olan bu adlar barədə ensiklopedik səviyyədə məlumat verməklə təfərrüata varmayacağıq. Bu adların müənnəs olmasının səbəbi, ərəblərin bunlar mələklər olaraq, mələkləri isə Allahın qızları olaraq qəbul etməsidir.
Lat Taif şəhərində, qapısında gözətçilər və xidmətçilər olan bir binanın içindəki ağ, işlənmiş, üstü örtülü bir qaya idi. Taif əhalisi [Saqif qəbiləsi] Kəbədən sonra ən mötəbər məbədin Lat olduğuna inanırdı və Qureyşdən başqa digər qəbilələr qarşısında bununla öyünürdü. Uzza Məkkə ilə Taif arasında Naxlə deyilən yerdə, bir binanın içindəki ağac idi. Bunun daş olduğu da rəvayət edilir. Qureyş qəbiləsinin ehtiram bəslədiyi bu şeyin üstü örtülü idi. Bu gün belə Kəbənin üstünün örtülməsi, cahiliyyə dövrünə məxsus bu adətin davam etdiyini fikirləşməyimiz üçün bir əsas ola bilər. Mənat Məkkə ilə Mədinə arasında Müşəlləl deyilən yerdə bir qaya [heykəl] idi. Huzaa, Övs və Xəzrəc qəbilələri bu heykəl-qayaya ehtiram bəsləyir, həccə buradan başlayır və bu qayanın önünde yağmur duasına çıxırdılar.
Müşriklər, müqəddəs saydıqları bu bütlərə and içir, uşaqlarına Abdullat [Latın qulu], Abduluzza [Uzzanın qulu] və Abdulmənat [Mənatın qulu] kimi adlar verirdilər.
Bunların xaricində də müxtəlif qəbilələrə məxsus, öz gözətçiləri və xidmətçiləri olan bir çox büt və məbəd var idi. Kəbə üçün qurban kəsdikləri kimi, onlara da qurban kəsirdilər. Ayədə məxsusi olaraq bu üç bütün adının çəkilməsinin səbəbi, Hicaz tərəflərində çox sayda insanın ortaq tapındıqları bütlər olmasıdır.
[56] *Məlaikə* və tək halı olan *mələk* sözü həm "elçi göndərmək" mənasına gələn *uluk* sözündən, həm də "qüvvət, idarə gücü" mənasına gələn *məlk* sözündən əmələ gəlmiş ola bilər. "Elçi göndərmək" mənasına gələn *uluk* sözündən əmələ gələn *mələk* və *məlaikə* sözləri "peyğəmbərləri, vəhy ayələrini" ifadə edir. *Məlk* kökündən əmələ gələn *mələk* və *məlaikə* sözləri isə "təbiətdəki bütün maddi gücləri və enerji güclərini" ifadə edir. Quranda işlədilən bu sözlərin hər iki kökdən əmələ gəldiyini və əmələ gəldiyi kökün mənasına görə müxtəlif mənalarda işlədildiyini müəyyənləşdirdik. Yəni *məlaikə* sözü Quranda bəzən birinci, bəzən də ikinci mənada işlənmişdir. Hansı mənaya gəldiyini, işlədildiyi cümlənin və abzasın ümumi mənasına baxaraq müəyyən etmək mümkündür.
"Təbyinül-Quran"da *mələk* sözü ətraflı izah edilmişdir.
[57] Ayədə bu sözün əvəzində yer alan *şəfaət* sözünün lüğət mənası belədir: "Bir şeyi, onun oxşarı olan başqa bir şeyə əlavə etmək, onu dəstəkləmək, bir şeyi cütləmək və əsirgəmək". Bu söz zaman içində "yüksək mövqedə olan birinin düşkün birinə kömək etməsi, onu

qoruması, onun qoruması üçün vasitəçilik etməsi, onu tək qoymayaraq dəstək olması" mənasında işlədilməyə başlanmışdır.
Bu sözün termin olaraq mənası isə belədir: "hər hansı bir şəxsin bağışlanmasını istəmək, bir şəxsdən başqa bir şəxsə yaxşılıq etməsini, onun zərərinə olan işlərdən əl çəkməsini xahiş etmək, başqasının yerinə yalvarmaq, xahiş etmək, bir şəxsin qabağına düşərək onun işinin görülməsi üçün dua və minnət etmək".
Xülasə, *şəfaət* sözü "vasitəçi olmaq, yardım etmək və rəhbərlik edib yol göstərmək" mənalarını verir. Şəfaət həm bu dünyada, həm də axirətdə ola bilər. Bu dünyada həm Allahın, həm mələklərin, həm peyğəmbərlərin şəfaəti, həm də insanların bir-birlərinə şəfaəti ola bilər. Axirətdə isə şəfaət yalnız Allaha məxsusdur.
"Peyğəmbərimizin öz ümmətindən günahkarların günahlarının bağışlanması üçün Allahın hüzurunda vasitəçilik edəcəyi, günahkarlara dəstək olaraq onları cəzadan xilas edəcəyi" kimi, xalqın arasında geniş yayılmış olan inanış isə Qurana ziddir.

[58] Bax: 24 nömrəli qeyd.

[59] Bax: 56 nömrəli qeyd.

[60] Ayədəki *ruh* sözünün əsl mənası "can"dır. Bu söz həm həqiqi, həm də məcazi olaraq bir neçə mənada işlədilir. Ensiklopedik mənada *ruh*, adətən "varlığın maddi olmayan ölçüsü yaxud mahiyyəti" kimi tərif edilir. *Ruh* sözü həm lüğət mənasına, həm də ensiklopedik mənasına uyğun olaraq "mənəvi mənlik" və "can" məfhumları ilə eyni mənada qəbul edilmişdir. Geniş mənada "canlılıq, duyğu" demək olan və bundan əlavə "xarakter" mənasına da gələn *ruh* sözü məcazi mənada "bir şeyin mahiyyətini, ən vacib və ən əsas nöqtəsini" ifadə edən bir məna daşımaqdadır. Məsələn, passiv insanlar üçün işlədilən "ruhsuz" sifəti sözün geniş mənasına, "məsələnin bütün ruhu buradadı" ifadəsindəki *ruh* sözü isə məcazi mənasına bir misaldır. Nəticə etibarıyla, yuxarıdakı mənalar ətrafında *ruh* sözüylə bağlı yüzlərlə ibarə əmələ gəlmişdir.
*Ruh* sözünün ənənəvi dini termin olaraq mənası, ümumiyyətlə belə tərif edilə bilər: "bədəni yaradıldıqdan sonra, Allah tərəfindən üfürülərək insana verilən canlılıq".
*Ruh* sözü Quranda "ilahi meh, vəhy / bilik" mənasında işlədilmişdir. Ənənvi olaraq başa düşülən *ruh* ilə bunun bir əlaqəsi yoxdur. Quranda söz edilən *ruh* [ilahi meh, vəhy] ancaq belə izah edilə bilər: "bilərək və istəyərək bu ruha sahib olan və onu öz həyatında tətbiq edən fərdlərə və cəmiyyətlərə mənalı bir canlılıq verən, onları çürüməkdən qoruyan şey".

[61] Buradakı *salam* sözü, cümlənin quruluşuna görə, “yaşasın, səadət, xilas olmaq, gümrahlıq” deməkdir.
[62] Ayədəki sözlərin “həqiqi” mənası belədir: “Günəşə və onun parlaqlığına, onu izlərkən Aya, ona parlaqlıq verdikdə gündüzə, onu büküb örtdükdə gecəyə, göyə və onu düzəldənə, yer üzünə və onu yumru döşəyənə, nəfsə və onu tənzimləyənə –ki O, ona fücurunu və təqvasını ilham etdi…” Biz burada məcazi mənalara üstünlük verdik.
[63] Burada “sosial yardımlaşma və dəstək qurumları” *Allahın dəvəsi*; bu qurumları yaşatmaq üçün çalışmaq isə *dəvəni sulamaq* kimi göstərilmişdir. *Dəvənin baldırının kəsilməsi* isə bu qurumların yaşaması üçün lazım olan zəkat, vergi və digər gəlir mənbələrinin aradan qaldırılmasıdır. Quran keçmiş ümmətlər barəsində hökmləri simvolik ifadələrlə nəql edərkən, xitab etdiyi cəmiyyətdə bu mövzunu “səlat, səlatın yerləşməsi və zəkat vermək” ifadələriylə prinsip halına gətirmişdir.
[64] Ayədəki sözlərin “həqiqi” mənalarına görə buradakı ayə qrupunun mənası belədir: “Burclara malik olan göy üzünə, vəd olunmuş o günə, şahidlik edənə və şahidlik edilənə and olsun ki, Rəbbinin möhkəm yaxalaması həqiqətən çox şiddətlidir.” Biz məalda məcazi mənalarına üstünlük verdik.
[65] Bax: 37 nömrəli qeyd.
[66] “Rəsmi Müshəf”də bu surənin ayələrinin düzülüşü texniki baxımdan və məna baxımından qüsurludur. Biz qrammatik və semantik qaydalara görə yeni bir düzülüşdə təqdim etdik.
[67] Ayədəki sözlərin “həqiqi” mənaları belədir: “Əncirə, zeytuna, Bərəkətli dağa və bu Xətərsiz şəhərə and olsun ki…” Biz burada məcazi mənalarına üstünlük verdik. Surədə adı çəkilən yerlər, Quranın nazil olduğu dövrdə ərəblərin tanıdığı yerlərdir, halbuki əslində dünyanın hər yerindəki insanlar nəzərdə tutulmuşdur.
[68] Burada *Ev* sözü ilə “Beytullah” [Allahın evi], yəni Kəbə nəzərdə tutulmuşdur. Allah Quranda Kəbə barəsində “evim” sözünü işlətmişdir. *Allahın evi* demək, “Allahdan başqa heç kimə məxsus olmayan ev” deməkdir, yəni o yerin xalqa məxsus olduğu mənasına gəlməkdədir. Sosial problemlərin müzakirə edildiyi, ictimai ehtiyacların ödənməsi üçün yolların axtarıldığı, cəmiyyəti maraqlandıran məsələlərdə, təhsil, təlim-tərbiyə, qanunvericilik, icra kimi mövzularda qərarların alındığı yer deməkdir.
2 nömrəli qeyddə də izah edildiyimi kimi *rəbb* sözü “tərbiyə edib yetişdirən, yaratdıqlarını müəyyən bir proqrama uyğun olaraq, müəyyən hədəflərə çatdıran, planlayaraq idarə edən” mənasını verir. *Bu Evin Rəbbi* sözündə *Rəbbin* “ev”lə əlaqələndirilməsi, Kəbənin

tikilişinin və istifadəsinin Allah tərəfindən proqramlandığını və həyata keçirildiyini göstərməkdədir. Həqiqətən də o ev, yer üzündə Allah adına tikilən ilk evdir, bərəkətli yerdir, orada bolluq var.
Kəbəyə həcc və ümrə məqsədi ilə gələn minlərlə insana göstərilən xidməti Qureyşlilər öz aralarında paylaşmışdılar. Hər ailənin müəyyən bir vəzifəsi var idi. Kəbənin qorunması, orada xidmət etmək, hacılara su vermək, yardım etmək, onlar üçün pul yığmaq, onları yedirmək, hacılar arasında meydana gələn ixtilafları həll etmək kimi bir çox iş Qureyş qəbiləsi tərəfindən yerinə yetirilirdi. Bu müqəddəs ziyarət, Qureyşlilərə böyük bir üstünlük və ehtiramla birgə, bol qazanc da gətirirdi. Fəqət Qureyşlilərin Məkkədə belə səfa sürməsi onların öz zəhmətlərinin deyil, Allahın Kəbə barəsindəki planlarının bir nəticəsi idi. Allahın Kəbə barəsindəki bu planı müasir dövrdə də qüvvədə olub, Səudiyyə Ərəbistan dövlətinə böyük qazanc gətirməkdədir.
[69] Bax: 24 nömrəli qeyd.
[70] *Qariə* sözü "böyük şiddətlə zərbə endirən, böyük şiddətlə hücuma keçən şeylər, insanları şoka salan böyük fəlakətlər" mənasına gəlməkdədir. Göyün çatlaması, günəşin və ayın söndürülməsi, ulduzların bulandırılması, dağların hərəkət etdirilməsi, dənizlərin qaynadılması, xülasə hər tərəfdə hərc-mərclik olması nəticəsində insanlar şoka düşəcək, nə elədiklərini özləri də bilmədən, avara olub gəzəcəklər. Kainatdakı bütün varlıqlar xaotik bir şəkildə bir-biriylə toqquşacaq və bir-birləri üçün fəlakətə çevriləcək. O gün heç kim üçün dönüş yaxud qaçış imkanı olmayacaq.
Ona görə də qiyamətə, "ən böyük fəlakətin qapını döyməsi" mənasında *əl-Qariə* adı verilmişdir.
[71] Burada "vəfat" anı təsvir edilmişdir. *Vəfat* sözünün mənası "əskiksiz vermək, azaltmadan yerinə yetirmək" deməkdir. *Vəfat*, Allahın insanlara ölüm anından dərhal əvvəl yaşadacağı, hərkəsə elədiklərini və etməli olduğu halda etmədiklərini əskiksiz-artıqsız göstərəcəyi, xəbər verəcəyi bir andır. Başqa bir sözlə *vəfat*, ölüm anından qisa bir müddət əvvəl insanın həyatında olan-keçən hər şeyin ən incə təfərrüatına qədər, heç bir əskiltmə və artırma olmadan, Rəbbimiz tərəfindən göstərilməsidir. Bu isə insanın xilqətinə yaradılış anından etibarən yerləşdirilən "mühafizəçilər, yaddaşlar, elçilər, yaddaş hüceyrələri" vasitəsi ilə mümkün olmaqdadır. Rəbbimiz, bu mövzunun əhəmiyyətini nəzərə alaraq "ölüm, öldürmək" sözlərini işlətmir, ölümü ölümdən əvvəlki o əsrarəngiz hadisələrin adıyla izah edir. "Təbyinül-Quran"da *vəfat* barəsində ətraflı məlumat verilmişdir.
[72] Ayədəki sözlərin həqiqi mənaları belədir: "Urf halında [yığın-yığın, dəstə-dəstə, qrup-qrup] göndərilənlərə –yəni büküb yıxanlara–

canlandırdıqca-canlandıranlara –yəni ayırdıqca ayıranlara– və istər üzr, istərsə də xəbərdarlıq olsun deyə öyüdləri çatdıranlara and olsun ki, sizi qorxutmaq üçün xəbərdarlıq edilən şey mütləq meydana gələcək.” Biz burada məcazi mənalarına üstünlük verdik.
[73] Bax: 8 nömrəli qeyd.
[74] “Rəsmi Müshəf”dəki 22 nömrəli ayə qəsəm cümləsi olduğu halda, Quranın tərtilinə və ərəbcənin xüsusiyyətlərinə zidd bir şəkildə, olması lazım gələn yerdən fərqli bir yerdədir. Biz burada, bu ayəni öz yerinə qoyduq.
[75] Bax: 87 nömrəli qeyd.
[76] Bax: 43 nömrəli qeyd.
[77] Burada nəzərdə tutulan *Söz* Sad surəsinin 84-85-ci və Səcdə surəsinin 5-ci ayələrində deyilən, “cəhənnəmin ins və cinlərlə [hər kəslə] doldurulması” barədə Rəbbimizin aldığı qərardır. Rəbbimizin bu qərarı Quranda bəzən *əl-qövl*, bəzən isə *kəlimətü-Rəbbik* şəklində qeyd edilmişdir.
[78] Ayədəki sözlərin həqiqi mənası nəzərə alındıqda, qəsəm cümləsinin mənası belədir: “Xeyr! Bu şəhərə and olsun ki, –sən də bu şəhərə daxil olmaqdasan– və ataya və doğulana (and olsun) ki, Biz həqiqətən insanı məşəqqət içində yaratdıq.” Biz bu məalda sözlərin məcazi mənalarına üstünlük verdik.
[79] Ayədəki sözlərin həqiqi mənaları belədir: “Göyə və Tariqə and olsun ki, –Tariqin nə olduğunu sən nə bilirsən? (O,) dəlib keçən nəcmdir.– Elə bir nəfs yoxdur ki, onun üstündə müəyyən mühafizəçilər olmasın [hər bir insanın üstündə mütləq müəyyən mühafizəçilər var].” Biz burada məcazi mənalarına üstünlük verdik.
Ayədə nəzərdə tutulan *mühafizəçilər* isə “insan orqanizmindəki immunitet, endokrin sistemi və beyindəki diqqət funksiyası kimi zehni funksiyalardır”.
[80] Ayədəki sözlərin həqiqi mənaları belədir: “Dönüşün sahibi səmaya, yarılıb çatlayan yerə and olsun ki, şübhəsiz, o, ayırd edən bir qərardır. Və o, əyləncə deyildir.” Biz məalda məcazi mənalarını təqdim etdik.
[81] Allah heç kimə hiylə qurmaz. Bəlağət elmində *müşakilə* adı verilən bu ifadə şəkli, digər dillərdə də mövcuddur. Müşakilə sənəti “bir-birinə zidd iki şeydən birinin, digərinin adıyla adlandırılması”, yaxud “birinin dediyi sözün, başqa biri tərəfindən, birinci şəxsin işlətdiyinin ziddi olan bir mənada işlədilməsi” kimi tərif edilir. Məsələn, ərəbcədə belə bir təhdid ibarəsi mövcuddur: “Bizə qarşı bir cahillik etməkdən saqının, yoxsa biz də sizə cahillik edərik.” Burada ikinci *cahillik* sözü, əslində “sizə cəza verərik, sizə bir pislik edərik” mənasına gəlməkdədir. Dilimizdə də buna oxşar ibarələr var. Məsələn:

"Sən məni məyus etsən, mən də səni məyus edərəm." Buradakı ikinci *məyus etmək* sözü də əslində "cəzalandırmaq" mənasına gəlir. Misallardan da görüldüyü kimi, işlənən əməl [günah] ilə bu əməlin əvəzi [cəza] eyni sözlə ifadə edilir. Quranda buna bir çox misal var: Şura / 40; Həşr / 19; Ali-İmran / 54; Səcdə / 14; Nisa / 142; Nəml / 50; İbrahim / 46; Ənfal / 30.
Ona görə də, Allahın hiylə qurduğu deyilən ayədə, əslində hiylə quranların Allah tərəfindən cəzalandırılacağı, bu ayədəki xəbərdarlıq nəticəsində onların hiyləsinə qarşı möminlərin tədbir görəcəyi və Allahın köməyi ilə görülən bu tədbir nəticəsində müşriklərin bütün hiylələrinin puç olacağı ifadə edilmişdir. Həqiqətdə də belə olmuş və müşriklərin mane olmağa çalışdığı aydınlıq get-gedə yayılmışdır.
[82] Ayədəki sözlərin "həqiqi" mənaları belədir: "Ay yarıldı / ay yarılacaq". Biz məcazi mənasını təqdim etdik.
[83] Ayənin orjinalındakı *naqa* sözünün həqiqi mənası "ən məhsuldar dövründə olan dişi dəvə"dir. Burada bu sözlər "sosial yardımlaşma qurumları" nəzərdə tutulmuşdur. Qurandakı *səlat* qavramı ilə eyni mənaya gəlir. *Onun bölüşdürülən suyu* isə "sosial yardımlaşma qurumlarını yaşadan zəkat və hədiyyələr" mənasında işlədilmişdir. Ayədəki *baldırlarını kəsərək öldürdü* ibarəsi isə "verməli olduqları zəkatı, vergini verməyərək və dəstək göstərməyərək, sosial yardımlaşma qurumlarını məhv etdilər" mənasına gəlməkdədir. Biz məalda məcazi mənalarını təqdim etdik.
[84] Bax: 8 nömrəli qeyd.
[85] Texniki xüsusiyyətləri baxımından ayələrin düzülüşü məalda 1, 3, 2 şəklində verilmişdir.
[86] Bax: 44 nömrəli qeyd.
[87] Əykə əhli "Qırmızı dəniz sahilindəki Midyan şəhərində yaşayan xalqdır". *Əykə* sözü "ağaclıq, ağacları bir-birinə dolaşan meşəlik" deməkdir. Bu xalq çox gözəl iqlimə sahib olan bərəkətli bir torpaqda yaşayırdı.
[88] "Rəsmi Müshəf"də 27-29 nömrəli ayələrdən ibarət olan hissə, məna ardıcıllığı baxımından 48 və 49 nömrəli ayələrin arasına yerləşdirilmişdir.
[89] Ayədəki *mələ* sözünün əsas mənası "dolu olan" [anbar] deməkdir. Zaman keçdikcə, məcazi olaraq "rəislər / başçılar, bir icmanın böyükləri, xalqın ağsaqqalları" kimi mənalarda da işlənmişdir. Bu şəxslərə *mələ* deyilməsinin səbəbi, bilik, təcrübə və anlayışla dolu olmaları idi. Keçmiş dövrlərdəki təfsirçilər *mələ* sözünün məcazi olaraq "rəislər, böyüklər" [şura] mənasına gəlməsindən istifadə edərək və ayədəki *əl-mələil-əla* tamamlamasındakı *əla* [uca] sifətini nəzərə

alaraq, bunu "ali şura" kimi izah etmişdirlər. Ancaq bu "ali şura"nın nə olduğuna dair etibarlı bir dəlil olmadığına görə, "göylərdəki mələklər", "kərribiyyun / müqarrəbun" [Allaha ən yaxın mələklər] olduğu kimi əsassız görüşlər meydana atılmışdır. İş bununla da qalmamış, Allaha yaxın mələklərin [ali şuranın] nə danışdığına qulaq asmaq üçün şeytanların da göyə çıxdığı və orada ulduzlarla bombardmana tutulduğu deyilmişdir.
Bizim fikrimizcə, lüğəvi mənası "ali dolu, ali anbar" olan *mələi-əla* tamlamasıyla "vəhy, Quran ayələri" nəzərdə tutulmuşdur. Çünki Quran, hər kəsin ehtiyacını ödəmək üçün lazım gələn hər şeylə doludur; hər kəsin ehtiyac duyduğu / duyacağı biliklər əskiksiz olaraq Qurana doldurulmuşdur. Quranın içindəki şeylər xırda-xuruş şeylər olmayıb, ən qiymətli, ən ali şeylərdir. 69 nömrəli ayədən əvvəlki və sonrakı hissələr yaxşı başa düşüldükdə, *mələi-əla* ifadəsiylə Quranın nəzərdə tutulduğu daha açıq görünür. Çünki 70-ci ayədə "vəhy edildiyi" deyilən, 68-ci ayədə də "kafirlərin üz döndərdiyi" deyilən şey də Qurandır. Buraya qədər təhlil etdiyimiz surələrdə gördüyümüz və bundan sonrakı ayələrdə də görəcəyimiz kimi, müşriklər həmişə Quranı müzakirə obyektinə çevirmişdilər. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
*Mələi-əla* ibarəsi Saffat surəsinin 8 nömrəli ayəsində də "ali anbar" mənasında, Quranın bir xassəsi kimi işlədilmişdir.
[90] Bax: 56 nömrəli qeyd.
[91] *Ruh üfürmək* ibarəsi "Allahın insanı məlumatlandırması, ona vəhy göndərməsi, azca bilik verməsi" mənasına gəlir. Burada, Hicr / 29 və Səcdə / 9 nömrəli ayələrdə, yaradılmış insana bilik verilməsi, ilk vəhyin gəlməsi; ilk elçinin göndərilməsi mərhələsindən danışılmaqdadır. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[92] Bax: 39 nömrəli qeyd.
[93] Torpaq maddəni, od isə enerjini təmsil edir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[94] Bax: 8 nömrəli qeyd.
[95] Bax: 56 nömrəli qeyd.
[96] Ayənin orjinalında işlədilən Adəm sözü, "Rəsmi Müshəf"ə görə Sad / 72, Hicr / 29, Səcdə / 9 və Bəqərə / 31 nömrəli ayələrdə də açıq-aşkar görüldüyü kimi, "məlumatlandırılan, ilk vəhyi alan insanı, ilk elçini" təmsil etməkdədir. Adəmə gələn vəhylər bu nəcmdə və Bəqərə surəsinin 37-39-cu ayələrində (403 nömrəli nəcmdə) açıqca qeyd olunmuşdur.
[97] Bax: 39 nömrəli qeyd.

[98] Burada işlədilən şəcər [mürəkkəb, çəkişmə mənbəyi] və vərəqül-cənnət [cənnət yarpaqları] ibarələri "mal və pul" mənasına gəlir. Daha ətraflı məlumat üçün "Təbyinül-Quran"a baxınız.
Qissənin nəql edildiyi ayələrdəki sözlərin və ibarələrin həqiqi mənaları onu göstərir ki, Allah insanın mal ehtirasından uzaq olmasını istədiyi üçün, Adəmə və onun zövcəsinə mal düşkünü olmağı qadağan edir, İblis də Adəmi və onun zövcəsini mal ilə aldadır.
Göründüyü kimi, ayədəki sözlər tam mənasıyla həyatın gerçəkliklərini əks etdirməkdədir. Adəm və onun zövcəsinin nemətlərin dadına baxdıqdan sonra onlara əsir olmasına və mübtəlası olduqları bu nemətlərdən ayrılmaq istəməmələrinə bu gün də rast gəlirik. Müvəqqəti dünya həyatının bər-bəzəklərinin hamısına sahib olan yaxud olmaq istəyən, istifadə etdikləri bu bər-bəzəkləri öz üstünə yapışdıran, bər-bəzək yığan insanlar da az deyil. Elə isə, Rəbbimizin sözləri qətiyyən bir nağıl kimi başa düşülməməli və bilinməlidir ki, "bir insanın, ona ilham edilən günahı İblisin təsiri altında büruzə verməsi" şəklində meydana çıxan mənfi davranışların kökü Adəmə və onun zövcəsinə qədər gedib çıxmaqdadır.
[99] Burada təmsili bir hekayə var və Rəbbimiz, insanın maddə və mənəvi varlığını, zəif nöqtələrini bir teatr səhnəsi kimi canlandıraraq nəql etməkdədir. Bu hadisə qətiyyən keçmişdə olub-keçən bir hadisə deyil, hər insanın şəxsində cərəyan etməkdə olan hadisədir.
[100] Məscid; "səcədə, yəscudu" felinin mimli məsdəri [yer adı] olub, "səcdə edilən / etdirilən yer" mənasına gəlir. Bunun, bu gün qılınan namazlardakı səcdə yeri ilə bir əlaqəsi yoxdur. Bu söz, "başqa cür düşünən və hərəkət edən kəslərin inandırıldıqları, həqiqətə boyun əydirildikləri yer, bu kəslərin təslim olaraq həqiqətə boyun əydikləri yer", xülasə "təlim-tərbiyə yeri, başa salma" yeri mənasına gəlir.
[101] Əshabı-əraf "bu dünyada Quran haqqında az da olsa məlumat sahibi olan, Quran nəcmlərini bilən kəslərə" deyilir.

Bu şəxslər, Quran barəsində malik olduqları biliklər sayəsində kimin cənnətlik, kimin cəhənnəmlik olduğunu bilə bilərlər. Fikrimizcə, Qurandan ən az 10 nəcm öyrənən şəxslər, ictimai elmlərdən başqa birinə və təhsilə ehtiyac duymadan, insanların həyat tərzlərinə baxaraq cənnətliklərlə cəhənnəmlikləri bir-birindən ayıra bilərlər.
[102] Texniki və semantik baxımdan 46-49 nömrəli ayələr "Rəsmi Müshəf"dəki 50-51 nömrəli ayələrdən sonra verilmişdir.

[103] Bax: 37 və 52 nömrəli qeydlər.

[104] Bax: 22 nömrəli qeyd.

[105] Namaz sözü hind dilindən fars dilinə, fars dilindən də Səlcuqlular

dövründə türk dilinə keçmişdir. Fars dilindəki ilk mənası “odun qarşısında ehtiramla əyilmək” deməkdir. Sanskrit dilində “ehtiram göstərmək” mənasına gələn namaste sözünün fars dilinə keçən şəkli olduğu ehtimal edilir. Namaste sözü isə ehtimal ki, “salam vermək” mənasına gələn nam sözündən əmələ gəlmişdir. Həm nam [salamlamaq], həm də namaste [ehtiram göstərmək], müasir hind mədəniyyətində də gördüyümüz kimi, əyilərək icra edilir. Namaz sözünün fars dilindəki “əyilərək ehtiramla dua etmək” mənası ərəb dilində və Quranda əd-duau bit-təzərru [alçala-alçala, davamlı surətdə alçalaraq yalvarmaq] şəklində ifadə edilir.

Ayənin orjinalındaki təzərruan ifadəsinin kök mənası “zillət və təvazö göstərmək”dir. Qəlibi və cümlədəki yeri etibarıyla “zillət üstündən zillət” [alçala-alçala] mənasına gəlir. Ayədən də açıqca başa düşülür ki, bu ibadətin şəkil etibarıyla dəqiqləşmiş bir qaydası yoxdur. Mömin şəxs, öz Rəbbi qarşısında alçalmağı öz könlündən keçən şəkildə göstərir. Namazda rükət, üzünü qibləyə çevirmək, dəstəmaz almaq, örtünmək, müəyyən ayələri və duaları oxumaq kimi şərtlər də yoxdur. Bunlar sonradan tətbiq edilmişdir. Xülasə, namaz “qəlbin və bədənin Allaha niyazı” kimi başa düşülməlidir.

Ayənin orjinalında, vav bağlayıcı ilə cümlədə ikinci hal mövqeyində olan xufyətən sözü xfv kökündən əmələ gəlmişdir. Bu söz iki zidd mənanı özündə birləşdirir, yəni “açıqca göstərərək, par-par parladaraq” və “gizləyərək” mənalarını verir. Elə isə, ayədən iki məna çıxarmaq və bu ibadət hər iki halda yerinə yetirilməlidir.

[106] Bax: 63 və 83 nömrəli qeydlər.

[107] Klassik mənbələrə görə, əsa sözünün əsl mənası “yığılıb saxlanan, möhkəm tutulan” deməkdir. Bu mənası ilə tam şəkildə “Quran” sözünü də əvəz edir. Əl ağacına əsa deyilməsinin səbəbi, ancaq əl və barmaqların əl ağacının üstündə toplanması deyil, həm də “söykənmək, yarpaq silkələmək, silah kimi, bir yeri qazmaq, eşələmək məqsədilə işlətmək kimi bir çox faydanı da özündə toplaması”dır.

Bu sözü Musaya aid etdikdə, “Musanın yığdığı, Musanın möhkəm tutduğu” mənasını verir. Bu məna isə, ayələrdən də başa düşüldüyü kimi, “Musaya göndərilən vəhyləri və Musanın öz təcrübələrini, biliklərini” ifadə edir. Musanın əsasının nə olduğu açıqca ifadə edilmişdir. Bəqərə / 63, 93; Əraf / 145, 171; Məryəm / 12 nömrəli ayələrdən də başa düşülür ki, “möhkəm tutulan şey” əslində “kitab / ilahi vəhylərdir”. Bundan əlavə, 181 nömrəli nəcmdə də görürük ki, Yunus surəsində Rəbbimiz belə buyurur:

Nəhayət, təsirli söz söyləyən alimlər gəldikdə, Musa onlara “Nə

atacaqsınız, atın!” dedi. Onlar meydana atdıqda, Musa dedi: “Sizin gətirdiyiniz şey göz boyamaqdır / yalandır. Şübəsiz ki, Allah onun boş və əsassız olduğunu meydana çıxaracaq. Şübhə yoxdur ki, Allah fitnə-fəsadçıların işini düzəltməz. Və Allah, günahkarların xoşuna gəlməsə də, haqqı, Öz kəlmələri ilə meydana çıxarıb bərqərar edəcəkdir.” dedi.

Buradan da açıqca görünür ki, sehrbazlar əl ağacıyla yox, “Allahın kəlmələri ilə” məğlub edilmişdir.

Əsa sözü Quranda 6 dəfə işlədilmişdir. Bunlardan Taha surəsinin 18-ci ayəsindəki əsa “çoban əsası”, yəni dəyənəkdir. Rəbbimiz ilk vəhy anında Musanın əlindən bu əsanı salmışdır. Digər yerlərdə isə əsa sözünün mənası “Musanın vəhylərdən və təcrübələrdən öyrəndiyi biliklər” deməkdir. Musanın Firona qarşı işlətdiyi, sudan keçmək, daşürəkli İsrail oğullarını adam etmək məqsədiylə istifadə etdiyi əsa “Musanın bilikləri və təcrübəsi”dir, yəni ona vəhy edilən və o vaxta qədər öyrəndiyi şeylər, qazandığı təcrübələrdir.

[108] Sü’ban sözü “su və qan axmaq” mənasına gələn səab sözündən əmələ gəlmişdir. Vadidə sel yatağının qıvrım-qıvrım olması, yarın uzun saçlarının qıvrım-qıvrım olması şairlər tərəfindən bu sözlə ifadə edilmişdir. Sü’ban bu sözün cəm halıdır. Sü’ban sözü tək halda “uzun, güclü, siçovul ovlayan ilan” mənasında da işlədilir.

Deməli, sü’ban sözünün əsl mənası “selin, qabağına çıxan hər şeyi sürüyüb götürməsi” deməkdir. Siçovulları ovlayaraq udan ilana bu adın verilməsinin səbəbi də, ilanın şəkli, uzunluğu və qıvrılması ilə selə oxşaması və qarşısına çıxan siçovulu udmasıdır. Musanın bilik və təcrübələrinin buna oxşadılması isə, ilahi vəhyin, bütün bəşəri planları və hilələri / batil şeyləri yox edərək udması səbəbindəndir.

[109] Yədi-bəyza tamlamasında, əsasən “əl” kimi tərcümə edilən yəd sözü məcazi olaraq “qüvvət, var-dövlət, iqtidar, səltənət, nemət, yay, əllə görülən bütün işlər” kimi mənalarda da işlədilir.

Burada deyilən güc, digər ayələrdə, “Rəsmi Müshəf”ə görə Nəml / 12, Qəsəs / 32 nömrəli ayələrdə “cibindəki / qoynundakı güc” kimi tərif edilmişdir və bu güc də Harundur.

Bəyza sözü bəyaz [ağ] sözüylə eyni kökdən əmələ gəlmişdir. Başlıca lüğət kitablarında bu söz barəsində aşağıdakı məlumatlar yer alır:

“Bu sözün əsli yumurta deməkdir. Bəyaz sözü də “yumurta rəngindən” mənasına gəlir. Bu sözün bəyza forması, “həddən artıq bəyaz, parlaq” mənasını verir. Günəşə, ağ üzündə ləkəsi olmayan qadına, üstündə heç bitki olmayan torpağa, qəməri ayların 14-15-ci gecələrdəki halına

bəyza deyilir. Yədi-bəyza tamlaması "isbatlanmış, dəlil" deməkdir."

Bu izahlara görə, söz "ağappaq" mənasına gəlir ki, bu da mükəmməlliyin və qüsursuzluğun məcazi ifadəsidir.

Ayədə adı çəkilən "gücün", onu görənlərə ağappaq [qüsursuz, mükəmməl] görünməsi isə Harunun ifadə və xitabət qabilliyətinin mükəmməl olması səbəbindəndir. Ayələrdən də başa düşülür ki, ivrit dilini yaxşı bilmədiyinə, yaxud dilində bir problem olduğuna görə Musa peyğəmbərin xitabət qabiliyyəti zəif olmuşdur. Musanın bu qüsuru, qardaşı Harunun ona vəzir, katib, sözçü olaraq verilməsiylə aradan qaldırılmışdır. Bu məsələ Taha surəsində açıq-aşkar nəql edilmişdir.

[110] Sehr "hər hansı bir şeyi, göz aldatmacası, əl hərəkətləri yaxud başqa üsullarla olduğundan fərqli göstərmək" mənasına gəlir, ancaq o demək deyil ki, həmişə "göz aldatmacası" mənasında işlədilir. Məsələn, bir konfransda maraqlı bir çıxış barəsində "dinləyiciləri sehrlədi, heyran etdi" demək mümkündür. Bu səbəbdən, sehrbaz sözünü burada "heyranedici, nüfuzlu alim" kimi verdik.

[111] Ayənin orjinalında işlədilən yemm sözü "bəhr / bol su" deməkdir. Leys bu sözü belə izah etmişdir: "Dərinliyi və sahili bilinməyən dəniz". Ancaq Quranda Taha surəsinin 39 nömrəli ayəsində, Musanın anasına uşağı "yemm"ə atması vəhy edildiyi və Musanın içində olduğu sandığın "yemm"dən sahilə atıldığının açıqca ifadə edildiyi nəzərə alındıqda, yemm sözünün yuxarıdakı izahı doğru qəbul edilə bilməz. Çünkü Musa Nil çayına atılmış və onun sandığı çayın kənarına yaxınlaşmışdır.

Bu sözün ərəb dilinə Suriya dilindən keçdiyi də deyilir.

Bibliyadakı bu sözün ivrit dilindən ingilis dilinə bəzən "red sea" [qırmızı dəniz], bəzən isə "reed sea" [qamış dənizi, qarğı dənizi] kimi tərcümə edilməsi də diqqəti cəlb etməkdədir.

Eyni söz Əraf / 136; Taha / 39 (iki dəfə), 78, 97; Qəsəs / 7, 40 və Zariyat / 40 nömrəli ayələrdə də işlənmişdir.

Musanın ailəsinin və Fironun yaşadığı yerlər nəzərə alındıqda, Musayla bağlı hissələrdə işlədilən bəhr və yemm sözlərini "bol su / çay" kimi tərcümə etmək lazım gəlir. Bu ayələrə baxdıqda, Fironun da dənizdə / Qırmızı dənizdə deyil, Musanın çağa olarkən atıldığı suda boğulduğu qəti surətdə başa düşülməkdədir.

[112] Ayədəki gözəl söz "Rəsmi Müshəf"ə görə Qəsəs / 5-6, Maidə / 21 və Duxan / 25-28 nömrəli ayələrdə verilmişdir.

[113] Bəhr sözünün mənası belədir: "Çox miqdarda şirin yaxud duzlu

su”. Bu söz, “quru” sözünün əks mənalısıdır. Bu sözün əsli “yarmaq”dır. Qurunu yardığı üçün suya bu ad verilmişdir. Qədim ərəb şeirlərində də Fərat çayından bəhs edərkən bəhr sözü işlədilmişdir. Böyük duzlu sulara [dənizlərə] bəhr deyildiyinə daha çox rastlanır.

Yenə Musanın ailəsinin və Fironun yaşadığı şəhər nəzərə alındıqda, buradakı bəhr sözüylə Nil çayının ifadə edildiyini başa düşmək olar.

Bəhr sözü Musayla əlaqədar ayələrdə (“Rəsmi Müshəf”ə görə: Bəqərə / 50, Əraf / 138, Yunus / 90, Taha / 77, Şuəra / 63 və Duxan / 24) işlənmişdir.

[114] Bu hissədə Musanın əsasının nə olduğu açıqca izah edilmişdir. 107 nömrəli qeyddə də izah edildiyi kimi, əl ağacına əsa deyilməsinin səbəbi “barmaqların əl ağacını möhkəm tutması, onun üstündə toplaşmasıdır”. Burada möhkəm tutulan şeylərin nələrdən ibarət olduğu uzun-uzadı izah edilmişdir. “Rəsmi Müshəf”ə görə Bəqərə / 63, 93; Əraf / 145, 171; Məryəm / 12 nömrəli ayələrdən də açıqca aydın olur ki, “möhkəm tutulan” şey kitab / ilahi vəhydir.

[115] Ayənin orjinalındakı sözlərin “həqiqi” mənası belədir: “Bir buzov; böyürtüsü [cazibədar, aldadıcı səsi] olan bir cəsəd hazırlamışdılar.” Biz məalda məcazi mənalarını təqdim etdik. Burada izah edilən məsələ, İsrail oğullarının qızılın cazibəsinə qapılaraq, qızılı özlərinə məbud etməsidir. Bunu Taha və Bəqərə surələrində də görəcəyik. “Təbyinül-Quran”da bu barədə ətraflı məlumat verilmişdir.

[116] Müzzəmmil surəsinin 20-ci ayəsində (Nəcm 13) rast gəlsə də, nazil olma ardıcıllığına görə Quranda zəkat sözü ilk dəfə burada işlənmişdir. Bu səbəbdən, zəkat barəsində qısa məlumat verməyi məqsədəuyğun gördük. Zəkat sözü “təmizlik, artıb çoxalmaq, bolluq və tərif” mənalarına gəlir. Quranda bu sözün fel forması bu mənaların hamısında işlədilmişdir. Əz-zəkat forması malın təmizlənməsinə, malın içindən yoxsullara, kimsəsizlərə və digər haqq sahiblərinə məxsus olan haqların çıxarılıb özlərinə verilməsinə deyilir. Yəni: “Möminlərin dövlətində, dövlətin var olması, varlığını davam etdirməsi, səlatın yerinə yetirilməsi (maddi və mənəvi dəstəyin, əmin-amanlığın təmin edilməsi) məqsədiylə möminlərin iman borcu, bəndəlik vəzifəsi olaraq verdiyi vergiyə” deyilir. Biz bu gün buna qısaca “vergi” deyirik. Ancaq bu vergi, sədəqə kimi adi bir vergi deyil, islami çərçivədə müəyyən edilən, verilən və xərclənən bir vergidir. Qurana görə, vergi verməyin vaxtı, qazancın əldə edildiyi andır.

[117] Daha əvvəlki ayələrdə gördük ki, əsa əslində “Musanın bilik və təcrübələridir”. Burada isə Musanın öz bilik və təcrübəsini işlətdiyi “daş” ifadəsinə nəzər yetirək. Bildiyimiz kimi “daş” sərtliyin, qatılığın

simvoludur. Rəbbimiz, İsrail oğullarının qəlblərinin daş kimi, hətta daha da qatı olduğunu bildirmişdir. Yəni burada daş sözüylə əslində “daşürəkli İsrail oğulları” nəzərdə tutulmuşdur. Bu məsələni “Rəsmi Müshəf”ə görə Bəqərə surəsinin 74 nömrəli ayəsində görürük.

[118] Zərb sözünün “həqiqi” mənası “bir şeyin üstündə bir şey əmələ gətirmək” deməkdir. Bu məna əsas qəbul edilərək, zərb sözü “vurmaq, çırpmaq, yarmaq, sıxışdırmaq, yola çıxmaq, qəlbin atması, nəbzin vurması, misal çəkmək” və sair kimi yüzlərlə mənada işlədilmişdir. “Təbyinül-Quran”da Sad surəsində Əyyub peyğəmbərdən danışılan hissədə bu barədə ətraflı məlumat verilmişdir. Bu söz burada həqiqi mənasında, yəni “bir şeyin üstündə bir şey əmələ gətirmək” mənasında işlədilmişdir.

[119] Bu ayədəki eyn sözünə qədim lüğətlərdə “görmək, göz, günəş, çeşmə, yağış, mal, qızıl, insan, həyat, camaat, ölkə xalqı” kimi yüzdən çox məna verilmişdir. Ancaq bu söz nədənsə həmişə “çeşmə” kimi tərcümə edilmişdir. Halbuki, Musa peyğəmbərdən bəhs edilən hissədə eyn sözünün “camaat, ölkə xalqı” mənasına üstünlük vermək lazım idi. Bu sözü belə başa düşmək lazım gəldiyini Rəbbimiz, ayənin əvvəlində “Və Biz onları, hər birinə on iki nəvədən birinin başçılıq etdiyi qəbilələrə böldük” ifadəsiylə bizə göstərmişdir.

Eyni şeyi Maidə surəsinin 12 nömrəli ayəsində də görürük.

İsrail oğullarının on iki grupa / qəbiləyə bölünməsi və hər birinə bir nəfərin başçılıq etməsini Bibliya da (Saylar Kitabı, 1-ci bab, 1-16-cı cümlələr) təsdiqləməkdədir.

Bu ayədəki “Biliklərini o daş qəlbli qövmünə tətbiq et” cümləsinin də üstündə dayanmaq lazımdır. Müxtəlif ayələrdəki “və qövmü Musadan su istərkən”, “xalqlardan hər biri haradan su götürəcəyini yaxşıca öyrəndi”, “və bir zamanlar Musa, öz qövmü üçün su istədikdə” ifadələrindən də açıq-aşkar başa düşüldüyü kimi, Musanın qövmü sudan əziyyət çəkmiş, su üzündən onların arasında problemlər olmuşdu. O zaman Rəbbimiz Musaya biliklərindən / təcrübəsindən istifadə etməyi vəhy etmişdir.

Su qıtlığının nələrə səbəb ola biləcəyini Musa ondan əvvəl Misirdən qaçaraq Mədyənə gedərkən, Mədyən suyunun başında təcrübədən keçirmişdi. Bu mövzu “Rəsmi Müshaf”a görə Qəsəs surəsinin 23-25 nömrəli ayələrində (Nəcm 150) ətraflı izah edilmişdir.

Buradan başa düşülür ki, Musa, bu qədər xalqın birgə yaşamasının problemlərə səbəb olacağını düşünərək, İsrail oğullarını on iki yerə bölmüş, on iki cəmiyyət halına gətirmişdir. Susuzluq problemini də bu

şəkildə həll etmişdir. Bilindiyi kimi, yaşayış məntəqələri həmişə su başında, çay kənarında salınır.

[120] Ayənin orjinalındakı hut, hitan sözü klassik mənada "balıq" kimi başa düşülür. Doymaq hissinə malik olmadığına və həddən artıq yeyərək çatladığına görə, balığa hut deyilmişdir. Burada hut sözüylə nəzərdə tutulan məna, "doymaq bilməmək, tətmin olmamaq səbəbindən meydana gələn darlıq" deməkdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[121] Quranda səlat saxlamaqla [iqamə etməklə] bağlı əmr və xəbər cümlələri, ümumiyyətlə belə tərcümə edilmişdir: "namazı düzgün qılın, namazı lazımınca qılın". Sözlərin mənalarına görə apardığımız təhlil isə göstərir ki, bu tərcümələr əslində cümlənin mənasını tam əks etdirmir, hətta yanlış əks etdirir.

İqam sözü "oturmaq" felinin əks mənalısı olan qıyam sözünün ef'al babında məsdər formasıdır. Lüğətlərdə sözün bu formasının mənası belə göstərilmişdir: "ayağa qaldırmaq, ayaq üstünə qoymaq, ayaq üstündə saxlamaq".

Bu mənalar nəzərə alındıqda, iqamis-səlat tamamlamasının mənası belə olmalıdır: "zehni və maddi yardım və dəstəklə problemlərin həll edilməsi işlərini yerinə yetirmək və bu işləri davam etdirmək, yəni bu işləri ayaq üstündə saxlamaq, bu işləri yerinə yetirmək məqsədiylə təşkilatlanmaq". Daha da konkretləşdirmək lazım gələrsə, səlatı saxlamaq bu mənaları verir: a) zehni baxımdan fəaliyyət göstərmək üçün təlim-tərbiyə məkanları olan məktəblərin, müxtəlif kursların, təhsil mərkəzlərinin açılması və onlara dəstək verilməsi; b) maliyyə baxımından, iş yerlərinin açılması, sosial təminat sistemlərinin qurulması, yoxsullara və yetimlərə yardım etmək, subay və dulları evləndirmək kimi işlərin görülməsi məqsədiylə müvafiq qurumların təşkil edilməsi və onlara dəstək verilməsi. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[122] Bax: 333 nömrəli qeyd.

[123] Allahın Elçisi, ona verilən vəhyləri Məkkədə təbliğ edərkən, bundan xəbər tutan Yəsriblilər [Mədinəlilər] bir heyət göndərərək Məkkədə Allahın Elçisi ilə gizlicə görüşdülər və onun oxuduğu Qurana qulaq asdılar. Surənin əvvəlində bu görüş və bunun nəticələri nəql edilmişdir. Bu hadisə, İslam tarixində böyük əhəmiyyətə malik olan Aqabə görüşüdür. Ayədə deyilən "bir dəstə cin" xalq mədəniyyətində yer alan folklor ünsürü olan cin qavramı ilə bir əlaqəsi yoxdur. *Cin* sözü haqqında ətraflı məlumat 49 nömrəli qeyddə verilmişdir.

[124] Bu ayədən belə başa düşülür ki, gəldikləri yerdə insanlara təlim verdiyini, onları yetişdirdiyini iddia edən gizli bir təşkilat var. Qurana qulaq asdıqdan sonra həqiqəti görən və iman edən yadlar, özünütənqidlə məşğul olaraq, Quranla tanış olmadan əvvəlki hallarını, gizli təşkilatın boş və mənasız təlqinlərini, əslində boş işlərlə başlarını qatdıqlarını deməkdədirlər. Çünkü burada söz alan cin, ondan əvvəl münəccimlik etdiklərini, ümidlərini ulduzlardan almağa çalışdıqları biliklərə bağladıqlarını, bu məqsədlə daim rəsədxanalarda oturub gözlədiklərini, ancaq səmanın ulduz və meteorlarla dolu olduğunu, onlara baxmaqla istədikləri məlumatları əldə edəmədiklərini, nəticə etibarıyla sabah kimin halının necə olacağını öyrənə bilmədiklərini deyir. Bu parçada verilən məlumat, kökü Davud və Süleyman peyğəmbərlərə qədər uzandığı deyilən gizli təşkilat və bu təşkilatın “yetişdirmə” mərasimi haqqındadır.

[125] Bax: 10 nömrəli qeyd.

[126] Bax: 8 nömrəli qeyd.

[127] Bax: 77 nömrəli qeyd.

[128] Bax: 27 nömrəli qeyd.

[129] Bax: 77 nömrəli qeyd.

[130] Bu ayədə Quranın *furqan* olmaq xassəsi qabardılmışdır. Mürsəlat surəsində də izah etdiyimiz kimi, Quranın adlarından biri olan *furqan* sözünün mənası “iki şey bir-birindən ayırmaq”dır. Bu söz *fərq* kökündən əmələ gəlmişdir və *təfriqə* sözü ilə eyni mənanı verir. *Fərq* sözündən meydana gələn *təfriq, firaq, firqət, firqə, təfriqə, fəriq* sözlərinin əsasən müşəxxəs, *fariqat, faruq, furqan* sözlərinin isə əsasən mücərrəd şeylər barəsində işlədildiyini görürük.

“Rəsmi Müshəf”ə görə Bəqərə / 53 və Ənbiya / 48 nömrəli ayələrdə Musa peyğəmbərə verildiyi deyilən *furqan,* mücərrəd şeylər olan haqq ilə batili, iman ilə küfrü, gözəl ilə çirkini, yaxşı ilə pisi bir-birindən ayırdığı üçün Quranın adı kimi də işlədilmişdir.

[131] Bax: 37 və 52 nömrəli qeydlər.

[132] Yuxarıda da deyildiyi kimi, *mələk* sözü, əmələ gəldiyi kökə görə müxtəlif mənalar verməkdədir. *Məlaikə* və bu sözün tək halı olan *mələk* sözü *uluk* yaxud *məlk* köklərindən əmələ gəlmişdir. Ona görə də *məlaikə* sözü bəzən “elçi”, bəzən də “idarə etmək gücü” mənalarını verir. Sözün hansı mənada işləndiyi, onun yer aldığı mətnin məzmununa görə anlaşılmaqdadır.

İki-iki, üç-üç, dörd-dörd qanadlı: Cahiliyyət dövründə yaşayan ərəblərin inanışına görə Allahın qızları və köməkçiləri olan mələklər,

qanadlı məxluqlardır. Külək, yağış, zəlzələ kimi təbiət hadisələri də mələklərin əsəridir. Cahiliyyət dövrünə məxsus olan bu inanışlar qismən rəvayətlərə də daxil olmuşdur və Cəbrailin 600 qanadı olduğunun Peyğəmbərimiz tərəfindən rəvayət etdiyi iddia olunmuşdur. İsrafilin isə hər biri şərqdən qərbə qədər uzanan 12 min ədəd qanadının olduğu, Allah ərşini bu qanadların üstündə saxladığı da rəvayətlərə əlavə edilmişdir. Bəzi rəvayətlərdə isə mələklərin qanadlarının sayı milyonları keçməkdədir.

Qənaətimizcə, *qanad* sözü burada "güc"ü ifadə etmək məqsədi ilə işlədilmişdir. Belə ki, bu qanadlar bir növ fizikadakı gücün ölçü vahidi olan "at gücü" ifadəsinin yerini tutmaqdadır. Mələklərin qanadlarının çoxluğu, onların güclərinin də artıq olduğunu ifadə etməkdədir. O halda, əgər *mələk* sözü "idarə gücü" mənasında işlədilibsə, *mələklərin qanadları* da "yağış, külək, sel kimi təbiət hadisələrinin gücünü"; *mələk* sözü "elçi" mənasında işlədilibsə, *mələklərin qanadları* "Quran ayələrinin mütəşabeh mənalarının insanlarda yaratdığı təsir" kimi başa düşülməlidir. Bu izahdan sonra, mövzumuz olan ayələr, sözlərin fərqli mənalarına baxılaraq iki cür dəyərləndirilə bilər:

1. A) *"Bütün təriflər, göyləri və yeri yoxdan yaradan, xəbərçi ayələri iki-iki, üç-üç, dörd-dörd mənalar daşıyan elçilər olaraq göndərən Allaha məxsusdur. O, əmələ gətirməkdə, istədiyini artırar. Şübhəsiz ki, Allah hər şeyə qadirdir."*

B) *"Bütün təriflər, göyləri və yeri yarıb parçalayacaq olan, təbiət qüvvələrini müxtəlif şiddət vahidinə sahib elçilər olaraq göndərən Allaha məxsusdur. O, əmələ gətirməkdə, istədiyini artırar. Şübhəsiz ki, Allah hər şeyə qadirdir."*

Bu ayədə mələklərin *iki-iki, üç-üç, dörd-dörd qanadlı elçilər* olduğunun deyilməsi haqqındakı izahımız isə belədir ki, bu sözlərlə, mütəşabeh ayələrin birdən çox məna ifadə etdikləri bildirilmişdir. İkinci ayədəki *rəhmət* və *həkim* sözləri, belə bir məna çıxarmağın mümkün olduğuna işarədir.

Ayənin axırındakı *Allah... artırar* ibarəsi "Allahın gücünün sərhədsiz olduğunu, istədiyi hər şeyi yarada bildiyini və yaratmaqda davam etdiyini" ifadə etməkdədir.

[133] Bax: 8 nömrəli qeyd.

[134] Bax: 60 nömrəli qeyd.

[135] "Rəsmi Müshəf"də İsa haqqında ayələr, qəflət yaxud xəyanət səbəbindən, texniki və semantik baxımdan səhv düzülmüşdür. Bunun nəticəsində İsa insan / bəşər olmaqdan çıxmış, hələ beşikdə olarkan

danışdırılmış, göyə çəkildiyi söylənmiş və daha sonra da göydən yerə enəcəyi inanışı əmələ gəlmişdir.

Bütün bunlar, cümlələrin yerlərinin dəyişdirilməsi və qiraət fərqləri səbəbindən əmələ gəlmişdir.

Ayənin orjinalında Məryəmin işarə etdiyi kəs, "ona" əvəzliyi ilə göstərilmişdir və "o" əvəzliyi ilə ümumiyyətlə "Məryəmin qucağındakı çağa"nın nəzərdə tutulduğu qəbul edilir. Halbuki bizim qənaətimizə görə, "o" əvəzliyi ilə yığıncaqda iştirak edən, Məryəmin başına gələn əhvalatlardan tamamən xəbərdar olan, Məryəm doğarkən ona yol göstərən, 24-26 nömrəli ayələrdə də adı çəkilən Zəkəriyya peyğəmbər nəzərdə tutulmuşdur. Ali-İmran surəsinin 37 nömrəli ayəsində "və Zəkəriyyanı ona (Məryəmə) zamin etdi" sözləriylə ifadə edilən şey də elə budur.

*Məhd* sözünün *muhd*; *nukəllimu* sözünün *yukəllimu* şəklində qiraət edilməsi və 30 nömrəli ayənin əvvəlində "fayi-təqibiyyə" (təqib bildirən fa hərfi) olmaması nəzərdə tutularaq, İsanın sözlərini ehtiva edən ayələr 34 nömrəli ayədəki "Məryəm oğlu İsa" ifadəsinin sifəti olaraq qəbul edilmiş və burada təqdim etdiyimiz məal meydana çıxmışdır. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[136] Bax: 204 nömrəli qeyd.

[137] "Rəsmi Müshəf"dəki 98-ci ayə, məna baxımından 95-ci ayənin ardına gətirilmişdir.

[138] Bax: 8 nömrəli qeyd.

[139] Ayədəki sözlərin "həqiqi" mənaları belədir: "Rəhman, Ərşin üzərində isteva etmişdir [hökmranlıq qurmuşdur]." Biz məalda məcazi mənalara üstünlük verdik. Daha ətraflı məlumat üçün 37 və 52 nömrəli qeydlərə bax.

[140] Digər surələrdə ətraflı izah edilən Musa hadisəsi, Taha / 9-99-da (Nəcm 120) xülasə şəklində verilmişdir. Bu surədəki təhkiyənin bir səfərdə meydana gəldiyini zənn etmək doğru deyil. Burada nəql edilən hadisələrdə də xronoloji ardıcıllıq yoxdur.

[141] Ayənin orjinalındakı sözlərin lüğəvi mənası belədir: "Nəleynini çıxar". Ancaq burada nəzərdə tutulan əsl məqsəd budur: "yaxınlarını və mallarını burada qoy". Ona görə də biz məalda bu mənanı təqdim etdik.

[142] Bu parçada, peyğəmbərliyi dövründə Musaya verilən tapşırıqlar xülasə edilmişdir. Ayədəki "vəhy ediləcək şey" ibarəsinin izahı bu parçada verilmişdir:

*"Və Mən səni seçdim; O halda, vəhy ediləcək şeyə qulaq ver. Heç*

*şübhəsiz ki, Mən, Allahın elə Özüyəm. Məbud deyə bir şey yoxdur Məndən başqa. O halda Mənə bəndəlik et və Məni yad etmək üçün səlatı yerinə yetir. Şübhəsiz ki, o saat [qiyamət] gələcəkdir. Onu Mən, hərkəs əməyinin əvəzini alsın deyə az qala gizlədirəm."*

[143] "Rəsmi Müshəf"də Musa peyğəmbərlə əlaqədar parçanın girişində ayələrin düzülüşü səhvdir. Ona görə, 24-cü ayəni 19-cu ayənin arxasına gətirdik. Sonrakı hissədə də ayələri "20, 25-36, 21-23" şəklində düzdük.

[144] *Hayyə* sözü, Musa peyğəmbər haqqında hissənin doğru anlaşılması baxımından vacib sözlərdən biridir. Ona görə də bu sözü bir az ətraflı izah etmək istədik: *Həyat* sözündən əmələ gələn *hayyə* sözünü ərəblər bir çox misalda işlədirlər. Uzunömürlü olması baxımından ilana *hayyə* deyirlər. İtigözlü kəslər barəsində "O, hayyədən daha iti görür" deyirlər. Xain, zalım biri barəsində "O, hayyədən daha zalımdır" deyirlər. Ətrafındakı insanlara, cəmiyyətə faydalı olan, onları qoruyan şəxslərə "O, bölgənin hayyəsidir" deyirlər. *Hayyə* sözü təşbeh olaraq Böyük Ayı bürcünün Əkizləri ilə Əlqaid arasındakı ulduzlara da deyilir.

*Tahiyyə* / salamlama [Allah sənə ömür versin] sözü də eyni kökdən əmələ gəlmişdir.

Xülasə, bu sözün mənası "həyat və dirilik"dir. Əslində *hayyə* sözü ilanı yox, ilanın uzunömürlü olmasını ifadə edir. Burada *hayyətün təs'a* [hərəkət edən təs'a] deyilmişdir. Bunun qarşılığı "yeddi canlı" ibarəsi olub, "dəfələrcə ölüm təhlükəsiylə üzləşməsinə baxmayaraq, hər dəfə sağ qalmaq" mənasına gəlir. Bu ifadə bir çox xəstəliklərdən, bəla və fəlakətlərdən xilas olan adamlar barəsində, digər tərəfdən pişik və ilan barəsində də işlədilir.

Bu ayədəki *hayyə* sözünü başa düşmək üçün, Musanın sağ əlində nə olduğunun Allah tərəfindən başqa bir şəkildə ifadə edildiyinə də diqqət yetirmək lazımdır. Musanın sağ əlindəki şey Nəml / 10 və Qəsəs / 31 nömrəli ayələrdə "sanki görünməyən bir varlıq kimi, hərəkət etdirir" kimi ifadə edilmişdir. Yəni Musanın sağ əlindəki şey, "hərəkət etdirən görünməz bir varlığa" bənzəməkdədir. Bəs bu hərəkət etdirən görünməz varlıq nədir? Bu, insanların və heyvanların canıdır / ruhudur.

Bu ifadə də, vəhyin ruh xassəsini özündə daşıyır. Quranın bir adı da "ruh" olduğu kimi, Musanın sağ əlindəki şeyin [Kitabın] adı da "ruh"dur. Belə ki, Şuəra surəsinin 193-cü ayəsində, keçmiş kitabların da ruh / can xassəsinə malik olduğu ifadə edilmişdir:

*"O açıq-aşkar kitabla, xəbərdarlıq edəsən deyə açıq-aşkar ərəb dili ilə sənin qəlbinə Mötəbər Can [ilahi xəbər, mötəbər məlumat] daxil oldu. Və şübhəsiz Mötəbər Can [mötəbər məlumat] həqiqətən keçmişdəkilərin kitablarında da var idi."*

[145] Burada, 27 nömrəli ayədəki *hayyə* sözü "ilan" kimi başa düşüldüyündən, 21 nömrəli ayədəki *qorxma* sözü də təbii olaraq "ilandan qorxma" kimi başa düşülür. Halbuki əslində bu surənin 45-46 -cı ayələrində, Şuəra surəsinin 10-15-ci, Nəml surəsinin 10-cu və Qəsəs surəsinin 30-cu ayələrində ifadə edilən qorxu, Musanın ona tapşırılan vəzifədən qorxub qaçmasıdır. 22 nömrəli ayədəki *təhrücü* [çıxacaq] xəbərinin mübtədası da "əl" deyil, "sən"dir. Burada, Musaya köməkçi əlavə güc kimi göndərilən Harun vasitəsiylə, təbliğat işini qüsursuz, mükəmməl bir şəkildə yerinə gətirəcəyi ifadə edilmişdir.

20-23 nömrəli ayələrdə, Musaya verilən iki ayədən danışılır. Bunlardan birincisi çoban əsasının yerinə verilən vəhy [kitab / Tövrat], ikincisi isə ehtiyac anında ona kömək edəcək əlavə qüvvə / Harundur. Daha sonrakı ayələrdə, Musanın ifadə qabiliyyətinin kafi olmadığını, məqsədini daha yaxşı izah edə bilmək üçün qardaşı Harunu özünə köməkçi götürmək istədiyini və onun bu istəyinin yerinə yetirildiyini görəcəyik.

*Əsa* [kitab] və *yədi-bəyza* [qüsursuz güc] barəsində Əraf surəsinin Musa haqqındakı hissəsində ətraflı məlumat verilmişdir.

20-23 nömrəli ayələrdə Musaya verildiyi deyilən iki işarət / əlamət, Furqan surəsində də xülasə olaraq belə ifadə edilmişdir:

*"Və and olsun ki, Musaya Kitabı verdik və qardaşı Harunu da onunla birgə köməkçi, dəstəkçi verdik. Sonra da, 'Haydı, ayələrimizi təkzib edən o qövmə gedin!' dedik. Sonunda da ayələrimizi təkzib edən o qövmü parçalayıb yox etdik."* (Furqan / 35-36)

[146] Bu hissədə ayələr, "Rəsmi Müshəf"dən fərqli olaraq "20, 25-36, 21-23" ardıcılığı ilə düzülmüşdür.

[147] Bax: 111 nömrəli qeyd.

[148] Bax: 110 nömrəli qeyd.

[149] Ayənin orjinalındakı sözlərin "həqiqi" mənaları belədir: *"Onların ipləri və dəyənəkləri"*. Yuxarıda, *assıyıhim* sözünün tək şəkli olan *əsa* sözünün "bilik, təcrübə" mənasına gəldiyini izah etmişdik. Ayənin orjinalındakı *hibal* sözü də *həbl* sözünün cəmidir. *Həbl* sözünün əsas mənası isə sadəcə "ip" deyil, "bağlanılan (yapışılan) ip"dir. Əlavə olaraq bu söz "verilən vəd, bir-birinə söz vermək" mənasına da gəlir. Eləcə də Quranda ("Rəsmi Müshəf"ə görə Ali-İmran surəsinin 103-cü

ayəsi) *həblullah* [Allahın ipi] ifadəsi ilə insanları Allaha bağlayan Quran nəzərdə tutulmuşdur. Burada, insanların keçmiş biliklərinin, köhnə inanışlarının və yapışdıqları şeylərin dəyərsiz olduğu izah edilir.

[150] Bu ayələrdə, Musanın öz qövmünü gecələr işlədərək, tutulma qorxusu olmadan Nil çayında quru yollar açılmasının vəhy edilməsi, sonra da onu təqib edən Fironun öz ordusuyla birgə çayda boğulmasının mərhələləri nəql edilmişdir.

Ayədə diqqət etmək gərəkən nöqtə, bol suda açılacaq olan yolun, gecə yürüşü sayəsində açılmasıdır. Bu ibarə, "adamları gecələr işlətməklə, başqalarının diqqətini cəlb etmədən, işin yavaş-yavaş yoluna qoymaq" mənasına gəlməkdədir.

Qurandakı ifadələrə görə bu hadisələr bir neçə dəqiqə yaxud saatda deyil, uzun bir müddətdə baş tutmuşdur. Musa peyğəmbər Misirə qayıtdıqda Fironun mülkündəki qövmünün arasında illərlə qorxusuz-hürküsüz bir şəkildə fəaliyyət göstərmişdir.

Ayədəki *xaşyət* sözü də, elədiklərinin Firona xəyanət olduğunu fikirləşməməsi üçün bir xəbərdarlıqdır. Belə ki, Şuəra surəsinin 18-19-cu ayələrində görürük ki, Firon Musanı nankorluq və xəyanətdə günahlandırmışdır:

*"O [Firon]: 'Biz səni uşaqkən öz yanımızda böyütmədikmi? Ömrünün bir çox ilini bizim aramızda keçirmədinmi? Axırda elədiyini də elədin. Sən nankorun birisən…' dedi."*

[151] Bax: 115 nömrəli qeyd.

[152] Bu hissədə də bəzi ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dən fərqli düzülmüşdür. Ayələrin hansı ardıcıllıqla düzüldüyü nəcmin altında göstərilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[153] Bax: 56 nömrəli qeyd.

[154] Bax: 39 nömrəli qeyd.

[155] Bax: 98 nömrəli qeyd.

[156] Bax: 200 nömrəli qeyd.

[157] Bax: 8 nömrəli qeyd.

[158] Buradakı "and içənlər" 6 nömrəli nəcmdə (2 / 68 Qələm / 17-33) and içənlərdir. "Rəsmi Müshəf"ə görə Hicr / 90-93 nömrəli ayələr, texniki və semantik baxımdan, olduqları yerə aid deyil. Bu ayələrin əslində Şuəra surəsinin giriş abzasında olması gərəkdiyini uzun tədqiqatlar nəticəsində acizanə surətdə müəyyənləşdirdik. Ona görə də bu ayələri Şuəra surəsinin ilk abzasına yerləşdirdik.

[159] Bax: 107 nömrəli qeyd.

[160] Bax: 108 nömrəli qeyd.

[161] Bax: 109 nömrəli qeyd.
[162] Bax: 149 nömrəli qeyd.
[163] Burada, Musaya, Nil çayı üstündə, daha sonra sökülərək Firon və əsgərlərinin boğulmasına səbəb olan sədlər tikməsinin vəhy edildiyi açıqlanır. Bu ayələrdə bildirilir ki, Musaya, bilik və təcrübəsindən istifadə edərək Nil çayının üstündə sədlər tikmək vəhy edilmişdir, sonra da su dağ kimi yarılmışdır, yəni hündür sədlər tikilmişdir. Elmə məlum olan ən qədim səd b. e. ə. 2900-2750-ci illər arasında Nil çayının üstündə qurulan, 15 metr hündürlüyündə Səddül-Kəfara səddidir. Quranın açıqca ifadə etdiyinə görə, barajların sayı birdən çoxdur.
Səddin dağılması və Fironun boğulma səhnələri "Rəsmi Müshəf"ə görə bu ayələrdə yer almışdır: Duxan / 23-24; Qəsəs / 40; Zariyat / 40.
[164] "Rəsmi Müshəf"dəki 52-67 nömrəli ayələrin yer aldığı parçada problem var. Biz buradakı ayələri "63, 52-56, 60-66, 57-59, 67" ardıcıllığıyla tərtib etdik.
[165] Bax: 24 nömrəli qeyd.
[166] Burada 155-157 nömrəli ayələrin lüğəvi mənası belədir:
*"O [Saleh]: 'Bax bu, dişi dəvədir; onun su içmək hüququ var, müəyyən bir gündə də su içmək hüququ sizindir, ona bir pislik etməyin, yoxsa böyük bir günün əzabı sizi yaxalayar' dedi. Buna baxmayaraq onlar dəvənin baldırlarını kəsərək onu öldürdülər və peşman bir halda səhəri açdılar."*
Burada *səlat* və *zəkat* qavramları simvolik ifadələrlə izah edilmişdir. 63 nömrəli qeydə baxın.
[167] Bax: 87 nömrəli qeyd.
[168] "Rəsmi Müshəf"də Nəml surəsinin 6-cı ayəsi burada 223-224-cü ayələrin arasına yerləşdirilmişdir.
[169] Buradakı 6-cı ayə Şuəra surəsinin 223-224-cü ayələri arasında verilmişdir.
[170] Buradakı "doqquz" rəqəmi iki şəkildə başa düşülə bilər. A) Bu rəqəm cəm halını ifadə edir. Çünkü İsrail oğullarına doqquzdan çox ayə / nişan göstərilmişdi. B) Tövratdakı "on əmr"in doqquz ayədə yazılı olması nəzərdə tutulmuşdur. Yəhudilərin Tövratında iki ayrı əmr cümləsi olan "Qarşımda başqa məbudların olmayacaq" və "Özünə bütlər oyub düzəltməyəcəksən" əmrləri, Samirilərin Tövratında bir cümlədə ifadə edilmişdir. Beləliklər, "Qonşunun evinə tamah etməyəcəksən" əmri də daxil olmaqla Yəhudi nüsxəsində on əmr, Samiri nüsxəsində isə doqquz əmr yer almışdır.
[171] Ayədən başa düşülür ki, Süleymanın ordusu "ins, cin və quşlardan" ibarət idi. A) İns qrupu, Süleymanın öz millətindən olan və

ordunun döyüşən əsgərlərindən meydana gələn qrupdur. B) Əlavə işlərə baxan cin qrupu xaricilərdən meydana gəlirdi. Ordunun təchizat və ləvazımat işlərini görən əsgərlər bu qrupda yer alırdı. Səba surəsinin 13-cü ayəsində də izah edildiyi kimi, bu qrupdakı əsgərlər qalalar, hündür və möhkəm binalar tikməkdə, ağac, dəmir və mis işlərini görməkdə idi. Onlar qonşu ölkələrdən gətirilən sənətkarlar idi və Davud dövründən etibarən o ölkədə mövcud idilər. Süleymanın fəth etdiyi ölkələrə möhkəm bir infrastruktur, sənət və mədəniyyət aparmasında böyük payı olan bu şəxslər, öz işlərində mahir sənətkarlar olsalar da, Süleyman barəsində bədniyyətli planlar qurduqları üçün Quranın bəzi ayələrində onlardan "şeytanlar" deyə bəhs edilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir. C) Quşlar qrupu isə rabitə və yolda əsgərlərin su ehtiyacının təmin edilməsi məqsədi ilə istifadə edilən quşlardan və onlara baxan şəxslərdən əmələ gəlmişdi. Süleymanın quşlardan ibarət olan ordusu elə budur. Yoxsa, Süleyman dağdakı quşları yığaraq onlardan əsgər kimi istifadə etməmişdi.
Quranda Süleymanın da bir peyğəmbər olduğu, ona da vəhy gəldiyi deyilir, ancaq nəkimi vəhylər gəldiyi haqqında məlumat verilmir. Müsəlmanlar, Əhdi-Ətiqdəki "Süleymanın məsəlləri" adlı hissənin Süleymana vəhy edildiyini qəbul etmirlər.
Süleyman haqqında məlumatlar bu surədən başqa Rəsmi Müshəf"də Sad, Ənbiya, Səba və Bəqərə surələrində də yer almışdır.
Buradakı "Qarışqa vadisi" qarışqaların çox olduğu yeri ifadə etmir, sadəcə olaraq xüsusi addır. İmam Zəbidiyə görə "Qarışqa vadisi" Cirbən ilə Əsqalan arasında bir yerin adıdır. Bu vadidə yaşayan xalq, öz həyat şəraiti ilə qarışqaya oxşadılmış, ona görə vadiyə də bu ad verilmişdir. Müasir dövrdə də dünyanın müxtəlif yerlərində, həm "Qarışqa vadisi" xalqı kimi, həyat şəraitlərindəki hər hansı bir xassəni özlərinə ad olaraq götürən xalqlar, həm də quş, həşərat, ağac, qaya adlarıyla adlandırılan qövmlər mövcuddur.
Burada "hüdhüd" deyildikdə, hüdhüd quşu yox, o quşa baxan şəxs nəzərdə tutulmuşdur. Eləcə də şahin, qartal və s. quş adları müasir dövrdə də şəxs adı kimi işlədilir, bəzi quş cinslərinin adları isə simvolikləşmişdir. Hər xalqda rast gəlinən belə adlar məcazi və mütəşabeh ifadələrdir. Deməli, burada "hüdhüd" deyərkən, ordunun su ehtiyacını təmin edən, ordunun keçəcəyi yollarda su mənbələrini axtarıb tapan şəxs nəzərdə tutulmuş ola bilər. Mümkündür ki, bu şəxs öz vəzifəsini yerinə yetirərkən hüdhüd quşundan istifadə etdiyinə görə bu adı alsın. Eləcə də, insanlara gördükləri işə uyğun ad qoymaq, ləqəb vermək adəti müasir dövrdə də davam etməkdədir. Məsələn,

ordunun su ehtiyacını təmin edən şəxslərə “saqa” (saqqa: su gətirən, su işlərinə baxan şəxs) deyilir. Bu ad əslində bir quş cinsinin də adıdır və saqa quşuna bu adın verilməsinin səbəbi, dimdiyi ilə ətrafa su sıçratmasıdır.
Digər tərəfdən, 22-26 nömrəli ayələrdən başa düşülür ki, hüdhüd əslində iradəli, ağıllı, hətta dərin dini biliklərə malik olan biridir. Süleymanın hüdhüdü cəzalandırmaq istəməsi də nəzərə alınsa, hüdhüdün bir quş deyil, insan olduğu qənaəti qətiləşir.
[172] Səba Cənubi Ərəbistanda, xalqı ticarətlə məşğul olan bir ölkə idi. Paytaxtı indiki Şimalı Yəmənin mərkəzi Sana şəhərinin şimal-şərqində, təqribən 55 mil məsafədə yerləşən Mə’rib şəhəri idi. Məin padşahlığının çöküşündən sonra, təxminən b. e. ə. 1100-cü ildə gücləndi və 1000 il Ərəbistanda hökm sürdü. Daha sonra, b. e. ə. 115-ci ildə onların yerini Himyar dövləti tutdu. Bu xalq isə Ərəbistanda Yəmən və Hədramautu, Afrikada Həbəşistanı idarə edən, Cənubi Ərəbistanın başqa bir məşhur xalqı idi. Səba xalqı bir tərəfdən Afrika sahilləri, Hindistan, Uzaqşərq və Ərəbistanın daxili regionlarında cərəyan edən bütün ticarəti, digər tərəfdən isə Misir, Suriya, Yunanıstan və Roma ilə ticarəti öz əllərində tuturdular. Qədim dövrdə öz sərvətləri və rifah səviyyələri ilə məşhur idilər. Sahib olduqları yüksək rifah səviyyəsini, ticarətdən əlavə, öz ölkələrinin bir çox yerində sədlər inşa etməklərinə və yığdıqları yağış sularını sulama məqsədi ilə işlətməklərinə borclu idilər. Bu sədlərin sayəsində öz ölkələrini həqiqi mənada yaşıllıqlar diyarına çevirmişdilər. Yunan tarixçilərinin Səba ölkəsinin möhtəşəm yaşıllıqlarına dair verdikləri məlumatlar günümüzə qədər gəlib çatmışdır.
[173] Burada cinlərdən bir ifritin *“Sən taxtından qalxmamış”* sözü “sən hökmdarlıq məqamından qalxmadan”, yəni “sən hakimiyyətdə olduğun dövrdə” mənasına gəlir. *İfrit* sözünün mənası “öz yaşıdlarını əzib-keçən, onları zəlil edən pis adam” mənasına gəlir. İsrail ölkəsindəki yadlardan biri olan bu şəxsin (“Təbyinül-Quran”da bu barədə ətraflı məlumat verilmişdir: II cild, s. 392-397) ayədə keçən sözü (*“Və heç şübhə yoxdur ki, mən bunun üçün güclü və etibarlıyam”*) isə belə mənaya gəlməkdədir: “Onu daşıya bilərəm, heç bir şeyə xəsarət vermədən, olduğu kimi gətirə bilərəm, onu alıb qaçmaram, xəyanət etmərəm.”
[174] “Kitabdan özündə məlumat olan kəsin” ayədə keçən sözü (*“qablə ən-yərtəddə iləykə təfrukə”*) məal və təfsirlərdə yer aldığı kimi, “göz açıb-yummamış” mənasına yox, “sənin nəzərin özünə qayıtmamışdan əvvəl” mənasına gəlməkdədir. Yəni “sən bu işi başından atmamışdan əvvəl; sən indi Səba məlikəsini və onun ölkəsini fikirləşirsən, ondan

başqa heç bir şey fikirləşə bilmirsən, gözün ondan başqa bir şey görmür, başqa bir işlə maraqlana bilmirsən, mən də sənin nəzərin özünə qayıtmamışdan əvvəl, yəni bu işi öz başından çıxarmamışdan əvvəl onu sənə gətirəcəyəm" mənasını verməkdədir.

[175] Bax: 77 nömrəli qeyd.

[176] Dabbətün min-əl-ərz: *Dəbb* kökündən əmələ gələn *dabbəh* "yavaş-yavaş yeriyən, hərəkət edən, tərpənən, gözlə görülməyəcək qədər yavaş hərəkət edən yaxud hərəkəti gözlə təqib edilə bilməyən şey" deməkdir. *Dabbəh* sözü Quranda irili-xırdalı bütün canlılar üçün işlədilmişdir. Bu ayədəki *dabbəh* sözü digər yerlərdən fərqli olaraq *dabbətün min-əl-ərz* formasında tamamlama olaraq işlədilmişdir. Mənası "yer canlısı" deməkdir. Deməli, *dabbəh* sözünün başqa bir tamamlama içində işləndiyi Nəml surəsinin 82-ci ayəsi kimi, bu ayəni də digərlərindən fərqli bir şəkildə ələ almaq lazımdır. *Dabbəh*, məhşərdə meydana çıxarılacaq, yer üzündəki maddələrdən istehsal edilmiş bir növ yayım vasitəsi olacaq və ona yüklənən "insanların Allahın ayələrinə layiqli bir şəkildə inanmadıqları" elanını yayacaqdır. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[177] Bax: 77 nömrəli qeyd.

[178] Bax: 27 nömrəli qeyd.

[179] Bax: 68 nömrəli qeyd.

[180] Bax: 8 nömrəli qeyd.

[181] Bax: 109 nömrəli qeyd.

[182] Bax: 68 nömrəli qeyd.

[183] Bax: 50 nömrəli qeyd.

[184] Burada ilk vəhyin gəlişindən, Muhəmmədə peyğəmbərlik verilməsindən və ilk vəhyin nazil olduğu yerdən bəhs edilməkdədir. Şəkil və yer etibarıyla daha əvvəl Nəcm surəsinin giriş hissəsində də məlumat verilmişdi. İlk İslam tarixçilərindən Vaqidinin "Kitabul-Məğazi" və Əl-Əzrakinin "Əxbarül-Məkkə" adlı kitablarında yer alan məlumatlara görə, Məkkədə Məscidülhəramdan başqa müxtəlif yerlərdə məscidlər var idi. Hətta məkkəlilər bəzi evlərdən məscid kimi istifadə edirdilər. Belə məscidlərdən biri də Məkkəyə 9 mil məsafədə Ciranə vadisinin yuxarısında yer aldığı üçün Məscidüləqsa [ən uzaqdakı məscid] deyilən məscid idi. Bu məscidi Qüreyş qəbiləsinə məxsus olan bir nəfər tikdirmişdi. Bu məlumatlara görə, Məscidüləqsanın haram / mübarək yerin xaricində, kənarında olduğu başa düşülür. Elə isə, Məscidüləqsa Qüdsdə deyil, Məkkədəki haram / mübarək yerin kənarında yerləşir və Qurana nəzərən müəyyən edilən bu məlumat, ilk İslam tarixçilərindən Vaqidinin kitabındakı məlumatla eynidir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat

verilmişdir.
[185] Bax: 77 nömrəli qeyd.
[186] Bax: 50 nömrəli qeyd.
[187] Məna baxımından 45-48 nömrəli ayələr 41 nömrəli ayənin ardınca, 40 nömrəli ayə isə 42 nömrəli ayənin ardınca düzülmüşdür.
[188] Bax: 37 nömrəli qeyd.
[189] Bax: 121 nömrəli qeyd.
[190] Peyğəmbərimizə göstərilən bu mənzərə: 1) "Rəsmi Müshəf"ə görə İsra surəsinin 1-ci ayəsində bəhs edilən gecədə, Peyğəmbərimizin ilk vəhyi aldığı anda son sidrə ağacında gördüyü və Nəcm surəsində ətraflı bir şəkildə bəhs edilən mənzərədir. 2) Peyğəmbərimizin Məkkəyə girişini gördüyü mənzərədir. Fəth surəsinin 27-ci ayəsində bəhs edilmişdir. Onu da yaddan çıxarmamaq lazımdır ki, burada deyilən mənzərələr "yuxuda görülən" mənzərə deyil, oyaq vaxtı görülmüşdür.
*Lənətli ağac*, "yaxınlaşmamaq, tərk etmək lazım gələn ağac" mənasına gəlir ki, bu ibarə ilə "qızıl, mal" nəzərdə tutulmuşdur. Sad surəsində də dediyimiz kimi, ("Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir: II cild, s. 444) *lənət* sözü "qovmaq; yaxşılıq və faydadan məhrum etmək, ailə və nəslin bir fərdinin rədd edilməsi" mənalarına gəlir. Adəmə, yaxınlaşmaması deyilən (Əraf / 19, Nəcm 69) *şəcər* [ağac] "qızıl, mal, mülk" mənasına gəlir. ("Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir: II cild, s. 534.)
Eləcə də Quranda ("Rəsmi Müshəf"ə görə: Ənfal / 28; Təğabun / 15; Zumər / 49) onun insanlar üçün bir fitnə olduğu ifadə edilmiş və ona yaxınlaşmamaq, mübtəla olmamaq əmr edilmişdir.
[191] Bax: 56 nömrəli qeyd.
[192] Bax: 39 nömrəli qeyd.
[193] İblisin mallar və övladlar barədə insanlara şərik olması üçün xüsusi bir zəhmət çəkməsinə ehtiyac yoxdur. Adamlar İblisə xidmət edərək, mallarını İblisin məqsədinə müvafiq bir şəkildə xərcləyərək, övladlarına kamal verməyib onları cahil saxlayaraq, İblisi özlərinə, mallarına və övladlarına şərik edirlər. Düzgün təlim-tərbiyə almayan bir uşağın atası yarı-yarıya İblisdir və o uşağın da İblisin məqsədinə müvafiq bir şəkildə bir zalım, fasiq və müşrik olması labüddür.
Bu mövzu "Rəsmi Müshəf"ə görə Nisa / 118-119; Maidə / 103; Sad / 82-83; Ənam / 136; Bəqərə / 268; İsra / 31 nömrəli ayələrdə işlənmişdir.
[194] Bu ayələr səlat [zehni və maddi dəstək] vaxtlarını müəyyən edən ilk ayələrdir. Məkkədə nazil olan bir surənin içində yer alsa da, bu ayələr Mədinə dövrünə məxsusdur. Yuxarıda da vurğuladığımız kimi,

səlatın [zehni və maddi dəstəyin] qayəsi, hər hansı bir şəxsi zehni və maddi baxımdan dəstəkləyərək özünə və cəmiyyətə faydalı bir insana çevirməkdir. Xüsusən səlatın zehni tərəfi insanı kamala çatdırdığı üçün, Rəbbimiz bu çox vacib məqsədə çatmağın yolu olan təlim-tərbiyəyə nə qədər diqqət yetirdiyini, düşmənin hücumuna məruz qaldıqda belə zehni səlatdan əl çəkməmək barədə təlimatı ilə bizlərə nümayiş etdirmişdir. Yuxarıdakı ayələrdə də səlatın zehni tərəfi nəzərdə tutulmuşdur. Bu səbədən, səlatın müəyyən vaxtlarda yerinə yetirilməsi əmr edilmiş, insanların mənəvi qidalanmasının fasiləsiz bir şəkildə davam etməsi təmin edilmişdir. Səlatın möminlər tərəfindən günün müəyyən saatlarında yerinə yetirilən bir vəzifə olmasının qayəsi, əvvəla, insan şüurunda Allah inanışının daimiliyini təmin etmək məqsədi güdür. Bu səbədən, səlatı yerinə yetirmək [zehni və maddi dəstək qurumları əmlə gətirmək və bunların davamlılığını təmin etmək] insan üçün çox vacib bir vəzifədir. Vacibliyi nəzərə alınaraq, günün müəyyən saatlarında [səhər, axşam və gecə] bu vəzifənin yerinə yetirilməsi tapşırılmışdır. Səlatı yerinə yetirməyi əmr edən Allah, bu işin hansı saatlarda görülməsini İsra / 78-79 və Hud / 114 nömrəli ayələrdə açıq-aşkar ifadə etmişdir. Diqqət yetirsək görərik ki, Hud / 114 və İsra / 78-79 nömrəli ayərlərdəki ibarələr eynidir və bu ayələr səlatın vaxtlarını göstərməkdədir. Ancaq bu vaxtlar Quranın ümumi üslubuna uyğun bir şəkildə fərqli bir üslubla və müxtəlif sözlərlə ifadə edilmişdir. Bu müxtəlif sözlərin hamısının eyni məna daşıdığına fikir vermək lazımdır. Yəni burada göstərilən vaxtlar o günki Ərəbistanın coğrafi və ictimai şəraiti daxilində müəyyənləşdirilmişdir. Bizim qənaətimizcə, müxtəlif coğrafi və ictimai şərtlərdə səlat üçün ən uyğun vaxtları seçmək mümkündür.

[195] Bax: 54 nömrəli qeyd.

[196] Bax: 170 nömrəli qeyd.

[197] Bax: 8 nömrəli qeyd.

[198] *Qədəm* [ayaq] və *sidq* [doğruluq] sözlərindən ibarət olan *qədəmə sidq* tamamlaması "doğruluq ayağı" mənasına gəlir və "insanların işlədikləri əməllərin əvəzinin xeyirli, uğurlu olması" deməkdir. Bu tamamlamayla ayədə, "inananların işlədikləri əməllərin əvəzini əskiksiz, hətta artıqlaması ilə alacaqları" ifadə edilmişdir.

[199] Bax: 37 və 52 nömrəli qeydlər.

[200] Rəbbimiz tərəfindən bir Söz: Ayədə bəhs edilən *Söz* Rəbbimizin cəzaları "müəyyən bir vaxta qədər təxirə salmaq" prinsipidir. Uca Allah bu prinsipi və onu pozmayacağını "Rəsmi Müshəf"ə görə Şura / 14, Hud / 110, Fatir / 45, Fussilət / 45 və Taha / 129 nömrəli ayələrdə ifadə etmişdir.

[201] Bax: 77 nömrəli qeyd.
[202] Bax: 77 nömrəli qeyd.
[203] Bax: 8 nömrəli qeyd.
[204] Burada diqqət yetirilməsi lazım gələn əsas məsələlərdən biri budur ki, 2-4 nömrəli ayələrdəki bu sözlər Quran tərəfindən deyilməkdədir: *"Şübhəsiz ki, mən sizin üçün Onun tərəfindən, xəbərdarlıq etmək və müjdə vermək üçün göndərilən biriyəm. Və Rəbbinizdən əfv diləyin, sonra da Ona tövbə edin ki, sizi müəyyən bir müddətin sonuna qədər yaxşıca bəhrələndirsin. Və hər fəzilət sahibinə nemətlərini versin. Və əgər üz döndərsəniz, mən sizin əleyhinizə olan böyük bir günün əzabından qorxuram. Dönüşünüz sadəcə Allahadır. Və O hər şeyə qadirdir."*

Ədəbiyyatda "intaq" [nitq qabiliyyəti olmayan bir şeyi danışdırmaq, dilə gətirmək] adı verilən bir sənətdən burada istifadə edilmiş və bu sözlər Quranda söylətdirilmişdir. Bu məqama diqqət yetirməzsək, yuxarıdakı sözlərin Peyğəmbərimizə məxsus olduğunu sanmaq kimi bir xətaya düşə bilərik. Ədəbiyyatda tez-tez müraciət edilən bir bədii sənət olan intaq Quranın başqa ayələrində ("Rəsmi Müshəf"ə görə Məryəm / 64; Zariyat / 50-51; Saffat / 164-166) də işlədilmişdir.
[205] Ayədəki *əl-müstəqərr* "daimi qalınan yer", *əl-müstəvda* isə "müvəqqəti yer" mənasını verir. Allahın, hər canlının daimi yaşayış yerini də, müvəqqəti yerini də bilməsi, canlıların əmanət edildikləri və sonradan məskən tutduqları yerlərin Allah tərəfindən bilinməsi deməkdir. Bu yerlər nə qədər dəyişsə də, Allahın bilməsi baxımından bir dəyişiklik olmaz. Məsələn, bir şəxs müəyyən bir evdə yaşadığı halda, müəyyən səbəblərlə başqa şəhərlərə, başqa ölkələrə gedə bilər. Hara gedirsə getsin, Allah o insanın harada olduğunu bilər. Bir insanın hər gün yatdığı yer ilə öləcəyi yer eyni olmaya bilər, ancaq Allah onların ikisini də bilər. Bir sperma hüceyrəsi atanın orqanizmində yaradılır, sonra yerini dəyişərək ananın orqanizminə keçər. Allah bu hüceyrənin də nə vaxt harada olduğunu tam mənasıyla bilər. Bir bakteriya hər hansı bir yerdə əmələ gələr, sonra müxtəlif yollarla başqa canlıların orqanizminə daxil olaraq orada fəaliyyət göstərər. Allah o bakteriyanın da harada olduğunu və necə fəaliyyət göstərdiyini bilər.
Bu ayə, yuxarıda sadalananlardan əlavə, başqa bir mənanı da özündə ehtiva etməkdədir. Bu da, "insanın özünə məxsus məlumatlarla birgə diriliş gününə qədər əmanət olaraq, yox olmadan qaldığı yerin Allah tərəfindən bilinməsi"dir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[206] Bax: 37 nömrəli qeyd.

[207] Ayədəki sözlərin lüğəvi mənası belədir: “Ərşi də su üstündə idi.” *Ərş* və *isteva* sözləri barəsində 37 və 52 nömrəli qeydlərdə məlumat verilmişdir.

[208] “Rəsmi Müshəf”dəki 35 nömrəli ayə texniki və semantik baxımdan buraya gətirildi.

[209] Bu ayədəki “ocaq / təndir qaynadığında” ibarəsi əzabın yaxınlaşdığını bildirir və ərəblərin müharibənin qızışdığı anı ifadə edərkən işlətdikləri “ocaq / təndir isindi / qızdı” ibarəsi ilə oxşarlıq göstərir.

[210] Buradakı sözlərin lüğəvi mənası belədir: “saflaşdırılmış buzovu gətirməkdə”. İbrahim peyğəmbərin öz qonaqları üçün gətirdiyi buzov bu ayədə *həniz* sözü ilə, Zariyat surəsinin 26 nömrəli ayəsində isə *səmin* sözü ilə ifadə edilmişdir. Ənənəvi tərcüməçilər bu iki sözü “qızardılmış” və “kök” kimi tərcümə etmiş və beləliklə də bütöv bir buzovun qızardılmasının mümkün olmadığını və eyni buzovu tərif edərkən işlədilən “qızardılmış” sözü ilə ancaq canlı bir heyvan barəsində işlədilən “kök” sözü arasındakı ziddiyyəti də nəzərə almayaraq açıq-aşkar xəta etmişlər.
Buzovun sifəti kimi işlədilən bu sözlərin, yuxarıda göstərdiyimiz mənaları birləşdirildikdə, buradakı buzovun “saf halda olan” və “güc verən” bir buzov olduğu mənası meydana çıxmaqdadır. Ona görə də biz, bu buzovun Əraf surəsində “cazibədar səsi olan cəsəd buzov” kimi “qızıl” olduğu qənaətindəyik. Elə isə, İbrahim, muştuluq üçün gələn elçilərə muştuluq olaraq “qızıl” vermişdir. Burada hadisə bütövlükdə nəql edilməmişdir. Hadisə Hicr / 51-58 nömrəli ayələrdə bir az da ətraflı nəql edilmişdir. Belə görünür ki, İbrahim xoş xəbəri aldıqdan sonra muştuluq vermişdir.

[211] Burada 78-ci ayədəki *qızlarım* və 79-cu ayədəki *sənin qızların* sözləri ilə Lut peyğəmbərin öz qızları yox, “o qövmün qızları” başa düşülməlidir. Çünkü Lutun öz qızlarının say baxımından o qövmün bütün kişilərinə bərabər olması mümkün deyil. *Qızlarım* sözü ilə o qövmün bütün qadınları nəzərdə tutulduğu təqdirdə, belə bir bərabərlikdən danışmaq mümkündür. Ayədə bu şəkildə ifadə edilməsindən də başa düşülür ki, Lut, öz qövmünün bütün qadınlarını öz qızları kimi görürdü. Qövmün kişilərinin Luta verdiyi cavabı da (*“Sən bilirsən ki, bizim sənin qızlarında hər hansı bir haqqımız yoxdur”*) belə başa düşmək lazımdır: “Sənin qızlarına, yəni qadınlara ehtiyacımız yoxdur, onlara qarşı şəhvət hiss etmirik, onlara meylimiz yoxdur, onları istəmirik, sevmirik, onlarda gözümüz yoxdur.”

[212] Ayələrdə rastlanan *göylər və yer durduqca* ibarəsi, cənnətdəki nemətlərin və cəhənnəmdəki əzabların daimiliyini ifadə etməkdədir.

Çünki klassik ərəb dilində *göylər və yer durduqca* və *gecə-gündüz bir-birini təqib etdikcə* ibarələri "sonsuz müddət, əbədiyyət" mənasında işlədilir. Yoxsa axirətdə nə göylər, nə də yer var, dağlar dümdüz olacaq, göy də başqa bir şəklə salınacaqdır. Aşağıdakı ayələrdən də bunu başa düşmək olar: "Rəsmi Müshəf"ə görə Kəhf / 47; Nəbə / 18-20; Taha / 105-107; Nəml / 88; Tur / 9; Məaric 8-9; Qariə / 5; Vaqiə / 1-6; İbrahim / 48.

Ayələrdə rastladığımız *"Ancaq Rəbbinin diləyi istisna olmaqla"* sözü ilə kimlərinsə bu qanunların xaricində qalmasını yox, hər şeyin Allahın iradəsi ilə olmasını, bütün hakimiyyətin Allahın əlində olduğunu bildirir.

[213] Bax: 200 nömrəli qeyd.

[214] Bax: 8 nömrəli qeyd.

[215] Digər qissələr qısa və uzun formada birdən çox surədə yer alsa da, Yusuf qissəsi ancaq bu surədə yer almaqdadır. Üslub və möhtəva baxımından bu qissə bənzərsiz bir gözəlliyə və özünəməxsusluğa sahibdir. Bu həqiqət 3-cü ayədə *"Biz sənə qissələrin ən gözəlini nəql edirik"* sözləriylə ifadə edilmişdir. Tövhid, səbr, ədalət, tolerantlıq, bağışlamaq, yaxın ətrafla əlaqələr, iqtisadiyyat, siyasət, qalanı içəridən fəth etmək kimi mövzularda insanlığa köhnəlməyən prinsiplər diqtə edən və peyğəmbər də olsa hər insanın xəta işləyə biləcəyini göstərən bu qissə ilə Peyğəmbərimizə, Yusuf peyğəmbər kimi səbrli olması, qorxmadan və usanmadan vəzifəsini yerinə yetirməsi, işin nəticəsinin Yusufin aqibəti kimi xeyirli olacağı bildirilmişdir. Eyni zamanda, Qureyşlilərə də xatırladılmışdır ki, Peyğəmbərimizə qarşı girişdikləri mübarizədə mütləq məğlub olacaqlar, bu mübarizələri tamamilə mənasızdır.

[216] Yusuf qissəsi, Yusufun gördüyü bir mənzərəni atasına nəql etdiyi bu ayə ilə başlayır. On bir ulduzun, günəşin və ayın ona səcdə etdiyi [təslim olaraq onun əmrinə ram olduğu] "mənzərə" yuxuda görülməmiş, Yusufun oyaq halda gördüyü bir mənzərədir. Bu həqiqət, *rəeytü* [gördüm] felinin ayədə iki dəfə təkrarlanmasıyla vurğulanmışdır. Yəni Yusuf, görüdklərini yuxuda yox, oyaq halda gördüyünü təsdiqləyərək atasına nəql edir:

*"Atacan! Şübhəsiz ki, mən on bir ulduz, günəş və ay gördüm; onların mənə boyun əyib tabe olduqlarını gördüm."*

Yuxuda görülən və "röya" dediyimiz mənzələrdən bəhs edərkən Quranda *fil-mənami* [yuxuda] ibarəsi işlədilir. Quranda, yuxuda görüldüyü vurğulanan röyalardan biri İbrahim peyğəmbərə, digəri isə Peyğəmbərimizə məxsusdur (bax Saffat / 102, Nəcm 210; Ənfal / 43-44, Nəcm 471).

Yusufun oyaq halda gördüyü mənzərələrə oxşar mənzərələr, Yusufun zindan yoldaşları və ölkənin kralı tərəfindən də görüləcək. Yəni qissənin davamında yer alan *şərab sıxmaq, baş üstündə çörək aparmaq və quşların o çörəkdən yeməsi, yeddi cılız inəyin yeddi kök inəyi yeməsi və yeddi yaşıl sünbüllə yeddi quru sünbül* mənzərələri də röya deyil, gerçək mənzərələrdir. Əslində onlar, "gələcəklə" bağlı mənzərələrdir. Gələcəyə dair belə bir mənzərəni Peyğəmbərimiz də görmüşdü (bax Fəth / 27, Nəcm 670).

[217] Burada, 76-cı ayədəki *"Hökmdarın dininə / ölkənin qanunlarına görə, qardaşını tutub saxlaması mümkün deyildi"* cümləsi bəzi mənbələrdə "hökmdarın oğurluqla bağlı qanunu, oğurluq edən şəxsin döyülməsi və oğurladığının iki mislini ödəmək məcburiyyətində qoyulması" kimi, bəzi mənbələrdə isə "onlar o dövrdə hər oğrunu, oğurluq etdiyi üçün qul sayırdılar" kimi izah edilmişdir.

[218] Bax: 8 nömrəli qeyd.

[219] "Rəsmi Müshəf"dəki 12 nömrəli ayə bura gətirildi.

[220] Ayədən də açıq-aşkar başa düşülür ki, Quranın qorunmasını Rəbbimiz öz üstünə götürmüşdür, Quranı qoruyacaq, təhrif edilməsinə izn verməyəcəkdir. Fəqət Rəbbimiz, Qurana müdaxilə etmək istəyənlərin əllərini, ayaqlarını qıraraq, gözlərini kor edərək, yaxud Quranı bağlı seyflərdə saxlayaraq qorumaz. Rəbbimizin Quranı qoruması belədir:

Ləfzi, nəzmi və möhtəvası baxımından bir möcüzə olan Quran, ərəbcənin ən mükəmməl ifadə və qrammatika qaydalarına uyğun bir şəkildə nazil olmuşdur. Bu səbəbdən, Quranda hər hansı bir artırma, əskiltmə, yaxud yer dəyişdirmə meydana gəldikdə, o dəqiqə özünü büruzə verməkdədir: A) Müsəlmanlar erkən dövrdə Quranı kitab halına salmışlar, belə ki, ən qədim yazılı nüsxələrlə müasir nüsxələr bir-birinin eynidir. B) İlk gündən etibarən bir çox insan ahənkli sözləri səbəbindən Quranı asanlıqla əzbərləmişdir, beləliklə, tarixin hər dövründə minlərlə hafiz mövcud olmuşdur, bu səbəbdən də Quranın təhrif edilməsi, yaxud nüsxələrinin itməsi kimi təhlükələr meydana gəlməmişdir. C) Nazil olmağa başladığı dövrdən etibarən Quran təlimi də başlamışdır. Digər dinlərin əksinə din xadimləri sinifinin olmadığı İslamiyyətdə bu təlim-tərbiyə işi kəndli yaxud da şəhərli olmasından asılı olmayaraq hər kəsi ehtiva etmiş, çox sayda nüsxəsi çıxarılan Quran bütün müsəlmanların evlərinə girmiş, hər kəs tərəfindən oxunub öyrənilmişdir. Beləliklə, Quran təlimi geniş yayılmış və bədniyyət insanların Quranı təhrif etmək üçün göstərdikləri səylər nəticəsiz qalmışdır. D) Quranın nazil olmağa başladığı miladi təqvimin 610-cu ili, digər dinlərin meydana çıxdığı dövrlərlə müqayisədə tarixin daha

aydınlıq bir dövrüdür və bu dövrdə cərəyan edən hadisələr yazılmağa başlanmışdır. Belə ki, bəzi tarixçilər Musa və İsanın gerçək həyatda mövcud olduğunu qəbul etmir, lakin Peyğəmbərimiz haqqında belə bir tərəddüd mövcud deyil. Deməli, Peyğəmbərimizin yeganə möcüzəsi olan Quran da şübhəyə yer qoymayan tarixi qeydlərlə müasir dövrümüzə qədər gəlib çatmışdır. E) İslamiyyət Musa və İsa dövründəki kimi əzilən, məzlum, qərib azlıqların arasında yox, zəngin, hakim, müstəqil şəhərlərdə doğulmuş və güclü, hakim cəmiyyətlərin dini olmuşdur.

[221] Ayədəki sözlərin lüğəvi mənası belədir: *"Və göyü, daşlanan bütün şeytanlardan hifz etdik. Ancaq qulaq oğurluğu edən şeytan istisna olmaqla ki, onu aydın bir alov sütunu təqib edir."* Biz məalda ayələrin təvil edilmiş mənasını göstərdik. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[222] Bax: 49 nömrəli qeyd.

[223] Bax: 91 nömrəli qeyd.

[224] Eyni mövzu Sad surəsinin / 71-85 nömrəli ayələrində (Nəcm 66) də işlənmişdir.

[225] Eyni mövzu Hud surəsinin / 69-83 nömrəli ayələrində (Nəcm 191) də işlənmişdir.

[226] Bax: 211 nömrəli qeyd.

[227] Bax: 87 nömrəli qeyd.

[228] "Rəsmi Müshəf"ə görə Hicr / 90-93 nömrəli ayələri biz Şuəra / 3-6 nömrəli ayələrlə birgə verdiyimzdən, burada onlara yer verilməmişdir.

[229] Bax: 24 nömrəli qeyd.

[230] Ənam surəsi (165 ayədən ibarətdir) o günə qədər nazil olan prinsiplərin xülasəsi kimidir. Bu ayələrin bir səfərdə cəm halında nazil olduğu nəql edildiyinə görə, onları bir nəcm halında təqdim etdik. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[231] Bax: 71 nömrəli qeyd.

[232] "Rəsmi Müshəf"dəki 114-cü ayəni 64-cü ayənin davamı, 104-cü ayəni isə 67-ci ayənin davamı kimi qəbul etdik.

[233] Bax: 205 nömrəli qeyd.

[234] Bu hissədəki ayələr də texniki və semantik səbəblərlə "Rəsmi Müshəf"dəkindən fərqli ardıcıllıqla düzülmüşdür.

[235] Ayələrin lüğəvi mənası belədir: *"Həqiqətən Biz ən altdakı səmanı bəzəklərlə / ulduzlarla bəzədik. Və mələil-əladan bir qırıntı qoparan və şəhabi-saqib tərəfindən təqib edilənlər istisna olmaqla, daimi əzab içində olan, hər yerdən daşlanaraq qovulan və mələil-əlaya heç qulaq asmayan şeytani-maridlərin hamısından hifz etdik. Və asi, inadkar*

*şeytanların hamısından hifz etdik.”*

Buna oxşar bir bölüm də Hicr surəsinin 16-18 nömrəli ayələrində (Nəcm 197) yer almışdır. Ayədəki mələil-əla ibarəsinin “Quran” olduğunu 89 nömrəli qeyddə izah etmişdik.

[236] Bax: 77 nömrəli qeyd.

[237] Buradakı 88-89 nömrəli ayələr texniki və semantik səbəblərlə “Rəsmi Müshəf”dəkindən fərqli ardıcıllıqla düzülmüşdür.

[238] Burada bəhs edilə hadisələr İbrahim və İsmailin həyatının müxtəlif dövrlərini əhatə edir və hamısı bir-birinin dərhal ardından yaşanan hadisələr deyil. Buradakı islamlaşmaq, Bəqərə / 124-132-ci ayələrdə (Nəcm 420) bəhs edilən hadisələrlə əlaqədardır. “Təbyinül-Quran”da bu barədə ətraflı məlumat verilmişdir.

[239] Bax: 204 nömrəli qeyd.

[240] Bax: 8 nömrəli qeyd.

[241] Bu hissədəki ayələr də texniki və semantik səbəblərlə “Rəsmi Müshəf”dəkindən fərqli ardıcıllıqla düzülmüşdür.

[242] Bu ayələrdə, *şükr edən* bəndələrə misal göstərilən Süleymandan və ona verilən nemətlərdən bəhs edilməkdədir. Ayələrdən başa düşülür ki, Süleymana verilən nemətlər arasında yelkənli gəmilərdə və yel dəyirmanlarında küləkdən istifadə etmək, misi əridərək alətlər hazırlamaq, uzaq yerlərə sürətlə gedib-gəlmək, əcnəbi-hünərli işçilərdən sənətkarlıq, ustalıq, istehkam və memarlıq sahələrində yararlanmaq kimi şeylər var.

Bundan əvvəlki hissədə atası Davudun dəmirdən, burada isə oğlu Süleymanın misdən istifadə etdiyi deyililr. Bu iki peyğəmbər-hökmdara dəmiri və mis kimi metaları işləmək qabiliyyətinin verilməsi, onlara verilən iqtidar nemətinin böyüklüyünü göstərir.

Mümkündür ki, ayədəki *“Biz ərimiş mis mədənini ona sel kimi axıtdıq”* cümləsi, Süleymanın yaşadığı coğrafiyada mis mədəni olmadığını, misin gəmilərlə uzaqdan, xüsusən də Kiprdən gətirildiyini ifadə etsin. Belə ki, *Kipr* sözü də *mis* mənasını verən sözdən əmələ gəlmişdir.

Burada, 14-cü ayənin son hissəsindən də başa düşülür ki, 12-ci ayənin axırındakı *“Və onlardan kim Bizim əmrimizdən çıxıb yoldan azsa, ona şiddətli atəşin əzabından daddırdıq”* sözləri, Süleymanın onların üstündə mütləq hökmran olduğunu, əcnəbilərin Süleyman üçün məcburi qaydada işlədiyini ifadə etməkdədir. 171 nömrəli qeyddə Süleymanın cinləri haqqında qısa məlumat verilmişdir.

Süleyman haqqında yalan və iftira kampaniyaları təşkil edən, onu devirərək canlarını qurtarmaq üçün əllərindən gələni edən şeytan

xassəli cinlər, hünərli, ancaq məcburi qaydada işlədilən sənətkarlardır. Bunu bilən Süleyman, axıra kimi onlardan yararlanmağa davam etmişdir.

[243] Bu ayələrdə, İblisin heç bir məcburedici gücü olmadığı halda, Səba xalqının İblisə uyaraq yoldan çıxdığı, həddini aşdığı və nəticədə cəzalandırıldığı ifadə edilmişdir. Daha əvvəl təmsili formada ifadə edilən bəzi xəbərdarlıqlar da ("Rəsmi Müshəf"ə görə: Əraf / 16-17, Nəcm 69; İsra / 62, Nəcm 165; Hicr / 39-40, Nəcm 199) bu ayədə xatırladılmışdır.

Bu ayədə nəql edilməkdədir ki, İblis, insanların az bir hissəsi istisna olmaqla, hamını yoldan çıxaracaq və onları naşükür bəndələr halına gətirəcək. Səba xalqının aqibəti, şeytanın bu funksiyasına çox gözəl bir nümunədir. Çünki onlar da şükr etməyərək nankorluq etmiş və şeytanı təsdiqləyən bir hala düşmüşdülər.

[244] Bax: 57 nömrəli qeyd.

[245] Zumər surəsinin 10-cu və 53-cü ayələrinin yazılış və oxunuşunda köçürmədə səhvə yol verilmişdir. Bizim "qullar" şəklində tərcümə etdiyimiz söz, Müshəfdə "qullarım" kimi yazılmışdır. Müshəfdəki bu katib səhvi əsrlərdən bəri görməməzliyə vurulmuşdur. İnsanları Muhəmmədə qul edən, İslam inanışıyla ziddiyyət təşkil edən bu qüsuru mütləq aradan qaldırmaq lazımdır. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[246] *Tağut* sözü "azğın, yoldan çıxmış, pislik və şər işlərdə lider, zorba, şeytan, büt, bütxana, kahin, sehrbaz, Allahın hökmlərinə arxasını çevirən şəxs və qurum" mənalarına gəlir.

[247] *Məsani* sözü "iki-iki, qat-qat" deməkdir. Quranın *məsani* [iki-iki, qat-qat] olma xassəsi qısaca belə izah edilə bilər: A) Qarşılaşdırma metodu: Zumər surəsinin 22-23-cü ayələrində də görüldüyü kimi, pozitiv və negativ hadisələr hər zaman qarşılaşdırma metoduyla təqdim edilir. Əbrar-füccar, yaxşılar-pislər, yer-göy, ins-cin, haqq-batil, cənnət-cəhənnəm, xəbərdarlıq-müjdə kimi. B) Verilən bir mesajın mütləq surətdə ikinci dəfə də vurğulanması.

[248] Ayədəki "dəriləri biz-biz olar" ibarəsi əslində "tükləri biz-biz olar" mənasına gəlir.

[249] Ayəni təşkil edən cümlənin xəbəri (cümlə üzvü) yox idi. Fussilət surəsinin 40 nömrəli ayəsi rəhbər tutularaq, məalda cümlənin xəbəri öz yerinə qoyulmuşdur.

[250] Bax: 45 nömrəli qeyd.

[251] Bax: 27 nömrəli qeyd.

[252] Bax: 56 nömrəli qeyd.

[253] Bax: 37 nömrəli qeyd.

[254] Bu ayədə, cənnət əhlinə Allahın təcəllisi olaraq Allahın əzəmət və böyüklüyünün göstəriləcəyi bildirilmişdir. Göstəriləcəyi deyilən bu ilahi təcəlli olduqca bədii bir təşbehlə ifadə edilmişdir: Allah hökmranlıq taxtında oturmuşdur, bütün güclər Onu pak tutaraq və tərifləyərək ətrafında dolanmaqdadır. Burada deyilən *mələklər* Bəqərə / 30-34-cü ayələrdə bəhs edilən mələkləri xatırlatmaqdadır. Allahın yaratdığı bütün güclər, bütün sistemlər cənnətdə də Allahı pak tutmaqda və Onun şanına təriflər deməkdədir.

[255] Bax: 8 nömrəli qeyd.

[256] Bax: 37 nömrəli qeyd.

[257] *Ərşi daşıyanlar* ibarəsinin əsl mənası "Allah barəsində məlumatları daşıyanlar" deməkdir. Onlar Allahın varlığına, birliyinə, məbud və rəbb olduğuna dəlalət edən bütün varlıqlar və Ərşin sahibi tərəfindən onlara verilən tapşırıqlar daxilində Allah haqqında elmi, tövhidi bir yerdən başqa bir yerə daşıyan, Allahı tanıtdıran peyğəmbərlərdir.

[258] Bax: 71 nömrəli qeyd.

[259] Bax: 8 nömrəli qeyd.

[260] Bax: 52 nömrəli qeyd.

[261] Bax: 77 nömrəli qeyd.

[262] Burada Məkkə müşriklərinin nail olmağa çalışdıqları şey, insanların diqqətini Qurandan başqa sahələrə çəkmək, dinləyənlərin diqqətini dağıtmaq, qulaq asdıqları şeyin möhtəvasını başa düşməklərinə mane olmaqdır.

Bu plan; Quranın Müshəfdəki ardıcıllığının pozulması, rəvayətlərlə həqiqi mənaların pozulması, mötərizə daxilində şəxsi qənaətlərin Qurana daxil edilməsi, mənasını dərk etmədən oxuyaraq bunun savab olduğuna inanmaq, Quranın hamı tərəfindən başa düşülməsinin mümkün olmadığını iddia etmək, dəstəmaz almadan Quran oxumağın qadağan edilməsinə dair fitva vermək, Quranın ictimai-siyasi möhtəvasının gizlədilməsi, Quranın dinin yeganə mənbəyi olduğunu qəbul etməmək kimi anlayışlarla davam etməkədir.

[263] Bax: 200 nömrəli qeyd.

[264] Müasir dövrümüz üçün Quranda meydana qoyulan ənfüsi və afaqi möcüzələrdən bəziləri bunlardan ibarətdir: Ənfüsi möcüzələr: Hər insanda qoruyucu hüceyrələrin olması, cütlər halında yaradılmış olmaq, spermanın qarışıq bir maye olması, cinsiyyətin müəyyən edilməsi, uşaqlıq divarında asılı olması, loğma ət parçası olmaq, sümüklərin əmələ gəlməsi və üstünün ətlə örtülməsi, üç zülmətdə yaradılmaq… Afaqi möcüzələr: Kainatın daim genişlənməsi, yoxluqdan yaradılmaq, kainatın yaradılışında qaz mərhələsi,

kainatdakı mükəmməl orbitlər, günəşin axıb getməsi, günəş və ayın fərqi, ayın orbiti, göyün və yerin təbəqələri, göyün mühafizə edilməsi, göyün geri qaytardıqları, göyün dirəksiz ucalması, dünyanın geoid formasında [tam kürə olmayan, dəvəquşu yumurtasına oxşayan, qütblərdən içəri basıq] olması, dünyanın və kosmosun ölçüləri, dünya fırlandıqca qütblərin basıq hala gəlməsi, dünyanın fırlanması, aşılayan küləklər, yağışın ölçüsü, suyun dövr etməsi, okeanın dibində şirin sulu çayların olması, paz şəkilli dağlar, neftin əmələ gəlməsi, tənəffüz və fotosintez, göyə ucalmağın çətinliyi, bitkilərdəki erkəklik və dişilik… Sadaladığımız bu bioloji, fiziki və astronomik hadisələr barədə, Quranın nazil olduğu dövrdə məlumat yox idi. Elə isə, emlin yeni kəşflərinin Quranda yer alması, Quranın Allahdan gəldiyinin açıq və qəti sübutudur.

[265] Bax: 8 nömrəli qeyd.

[266] "Rəsmi Müshəf"dəki 10-cu ayə texniki və semantik baxımdan 15-ci ayədən sonra verilmişdir.

[267] Bax: 200 nömrəli qeyd.

[268] Bax: 54 nömrəli qeyd.

[269] Bax: 8 nömrəli qeyd.

[270] "Rəsmi Müshəf"dəki 60-cı ayə burada verilmişdir.

[271] "Rəsmi Müshəf"dəki 61-62-ci ayələr burada verilmişdir.

[272] Bax: 37 nömrəli qeyd.

[273] Bax: 8 nömrəli qeyd.

[274] Siyər və məğazi kitablarına görə (Peyğəmbərin həyatından və müharibələrindən bəhs edən kitablar), peyğəmbərliyin ilk illərində Məkkədə böyük bir qıtlıq yaşanmışdır. Qıtlığın kritik həddə çatdığı günlərdə Əbu Süfyan, Rəsulallahın yanına getmiş və aradakı qohumluqlarının xətrinə, qıtlıq bəlasını dəf etməsi üçün Allaha dua etməsini xahiş etmiş, əgər Allah bu bəlanı dəf edərsə, Peyğəmbərimizə iman gətirəcəklərini demişdir. Allah qıtlıq bəlasını dəf etmiş, ancaq müşriklər öz vədlərinə əməl etməyərək şirk qoşmaqda davam etmişdilər.

[275] Bax: 8 nömrəli qeyd.

[276] Bax: 8 nömrəli qeyd.

[277] Bax: 49 nömrəli qeyd.

[278] Bax: 77 nömrəli qeyd.

[279] Surə bir qəsəm cümləsi ilə başlayır. 6 ayədən meydana gələn hissədə bir-birinin arxasınca müəyyən şeylərə qəsəm edilir, beləliklə, bu şeylərə and içilməklə, verilən vədlərin [*yenidən yaradılma, dirilmə, həşr və sorğu-sual edilmək barədə xəbərdarlığın*] doğruluğu sübut edilmişdir. Burada deyilənə görə, qiyamət mütləq qopacaq, hər kəs

əməllərinin əvəzini alacaqdır. Bu hissədə bir-birinin ardınca gələn ibarələrin Allahın kainatdakı ayələrinimi, yoxsa Quran ayələrinimi ifadə etdiyi barəsindəki qənaətimiz belədir ki, onların ikisi də nəzərdə tutula bilər. Ona görə də, bu ayələrin iki baxımdan qiymətləndirilməsi lazım gəlir. 1) Kainatdakı hadisələrlə əlaqəsi baxımından: Rəbbimiz burada suyun təbiətdəki dövrünə diqqət yetirilməsini buyurur. Dəniz, göl, çay və ən böyüyündən tutmuş ən kiçiyinə qədər bütün gölməçələrdən istilik sayəsində qalxan buxarlar və qurudaki torpaq hissəcikləri küləklərlə sürüklənərək milyonlarla ton yükə [yağış buluduna] çevrilir, sonra da müxtəlif yerlərə paylanaraq yer üzünə endirilir. Yağış olaraq yer üzünə enən bu su vasitəsilə ölü torpaq təzədən canlandırılır. Bu dövrün ölü təbiəti "təzədən canlandırması" ölən insanların da yenidən dirilməsinin mümkün olduğunu göstərən ən böyük dəlillərdən biridir. (Rum / 46-50; Fussilət / 39; Fatir / 9; Bəqərə / 164; Əraf / 57; Hicr /22-23.)

2) Quran ayələri ilə əlaqəsi baxımından: Burada Quran ayələri də nəzərdə tutula bilər. Elə isə, buradakı *sovurub dağıdanlar* və ondan sonra dəlil kimi göstərilən ifadələrlə Quran ayələri nəzərdə tutulmuşdur. Çünki Quran ayələri, qarşısına çıxan hər şeyi sovurub dağıtmaqda, heç bir batil düşüncə və əməl Quran ayələrinin qarşısında duruş gətirə bilməməkdədir. Quran ayələri möhtəvası baxımından çox ağırdır, əldən-ələ, dildən-dilə, könüldən-könülə yayılaraq hər kəsə fayda verməkdə, hər kəsin problemini həll etməkdədir. Quranın bir adı da "*ruh*"dur və o, ölünü xatırladan kafirlərə və cəmiyyətlərə həyat bəxş etməkdədir.

Bu surədə də olduğu kimi, bir çox surənin əvvəlində Quran, məcazi ifadələrlə təqdim edilmişdir: Mursəlat /1-7, Nəcm 55; Saffat / 1-5, Nəcm 205; Naziat / 1-3, 26, Nəcm 369.

[280] *Səma* sözü məcazi olaraq "alimləri" ifadə edir.

[281] Ayədəki *səmin* sözünün lüğəvi mənası "güc verən buzov" deməkdir. Bu da, 210-cu qeyddə də deyildiyi kimi, "qızılı" ifadə edir.

[282] Bax: 204 nömrəli qeyd.

[283] "Rəsmi Müshəf"də 18-ci sırada yer alan Kəhf surəsinin bu ayələrini biz fərqli bir şəkildə tərtib etdik.

[284] Kəhf və Rəqim əhli qissələri axirət həyatının qəti şəkildə sübut edilməsi məqsədi daşıyan elmi bir təcrübədir. Bu qissəni oxumağa başlamamışdan əvvəl ona da diqqət yetirmək lazımdır ki, qissədə ancaq Kəhf əhlindən yox, Rəqim əhlindən də bəhs edilmişdir. Ona görə də, bu hissədəki əvəzliklərin bəziləri Kəhf əhlini, bəziləri isə Rəqim əhlini bildirir. Ayələrin mətnindən də açıqa-aşkar başa düşüldüyü kimi, surənin bu hissəsində, Quranın nazil olduğu dövrdə

meydana gəlməmiş olan, ondan əsrlər sonra meydana çıxacaq bir haldan, insanların yox olmadığı və ora-bura səpələnmiş haldakı hüceyrələrin vaxtı gəldikdə toplanaraq birləşdiriləcəyi həqiqətindən, axirətin mütləq varlığını elmi şəkildə isbat edən şəxslərdən və hadisələrdən bəhs edilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[285] Ayədəki *hut* sözü haqqında 14-cü qeyddə məlumat verilmiş, bu sözün "darlığa düşmək / sıxıntı" mənasına gəldiyi izah edilmişdir. Musanın darlığa düşməsi, ona Fironu öldürərək İsrail oğullarını Misirdən çıxarmaq vəzifəsi tapşırıldıqda, bu vəzifənin öhdəsindən necə gələcəyinə dair narahatçılığıdır. Bu qissədə Musa, bu vəzifənin öhdəsindən necə gəlməli olduğunu, Allaha qarşı müharibə edənlərin öldürülməli olduğunu, yəni Fironu niyə öldürməli olduğunu öyrənəcəkdir.
[286] Bu hissədə mükəmməl bədii təsvir vasitələrindən istifadə edilərək, Muhəmməd peyğəmbər fərqli bir dillə tanıdılmışdır. Bu ayələr nazil olduqda, onlarda bəhs edilən hadisələr hələ meydana gəlməmişdi. Zehinlərdəki mitoloji Zülqərneyn barədə sual verənlərə, tarixi Zülqərneyn hekayəsi ilə cavab verilmişdir. Bu hissə, bu baxımdan da bir möcüzədir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir. Sözlərin lüğəvi mənaları nəzərə alındıqda, bu hissənin məalı belə olacaqdır:
*Və sənə Zülqərneyn haqqında sual verirlər. De ki: "Sizə ondan, bir xatırlatma / öyüd oxuyacağam: Şübhəsiz, Biz ona [Zülqərneynə] yer üzündə qüdrət verdik və ona hər şeydən bir səbəb verdik. Sonra o, bir səbəbə tabe oldu. Nəhayət o, günəşin batdığı yerə çatdığı zaman, onun [günəşin] qara bir palçıqda batmaqda olduğunu gördü. Bir də bunun yanında bir qövm gördü. Biz dedik ki: "Ey Zülqərneyn! Onları ya cəzalandıra bilərsən və ya onlarla yaxşı-gözəl rəftar edə bilərsən." O dedi ki: "Zalımlıq edərsə, həqiqətən ona əzab verəcəyik. Sonra Rəbbinə geri qaytarılacaq, sonra O da onu görülməmiş bir əzaba düçar edər. Amma hər kim iman edər və saleh əməl işlərsə, artıq buna da ən gözəl əvəz vardır. Və Biz ona əmrimizdən asan olanı söyləyəcəyik." Sonra o [Zülqərneym], bir səbəbə tabe oldu. Nəhayət, günəşin doğduğu yerə vardı. Vəhyin bir qövmün üzərinə doğduğunu gördü. Belə ki, Biz onlar üçün, ondan [günəşdən] daha aşağı mərtəbəli şeylərdən bir sipər hazırlamışdıq. Bax belə! Və Biz onun yanında olan şeyləri elm baxımından əhatə etmişdik. Sonra o [Zülqərneyn] bir səbəbə tabe oldu. Nəhayət, iki səddin arasına gəlib çatdıqda, iki tayfanın altındakılardan, demək olar ki, heç söz anlamayan bir tayfa gördü. Onlar [söz anlamaz tayfa] dedilər ki: "Ey*

*Zülqərneyn! Şübhəsiz ki, Yəcuc və Məcuc bu torpaqları xarab edir. Buna görə, sənin bizimlə onlar arasında bir səd tərtib etməyin şərti ilə, sənə bir vergi versək olarmı?" O [Zülqərneyn] dedi ki: "Rəbbimin mənə verdiyi imkanlar daha xeyirlidir. Haydı, siz mənə öz qüvvənizlə kömək edin, sizinlə onların arasında çox möhkəm bir səd düzəldim. Mənə, dəmir kütlələri gətirin / iti zəkanızla hazırladığınız təklif mətnlərini gətirin." Nəhayət, iki təpə / hədəf bərabər olduğu zaman: "Üfürün!" dedi. Nəhayət, onu [dəmiri] bir od halına gətirdikdə, 'Gətirin mən də üstünə su töküm' dedi. Artıq, onların [söz anlamaz qövmün], onu aşmağa gücü çatmadı, onu deşməyə də gücü çatmadı. O [Zülqərneyn] dedi ki: "Bu, Rəbbimin bir mərhəmətidir. Artıq, Rəbbimin verdiyi vədin vaxtı gəldikdə, onu düppədüz edəcək. Rəbbimin vədi də haqdır."*

Biz məalda, iki mənanı da təqdim etdik.

[287] Muhəmməd peyğəmbərin iki çağın sahibi olması, iki şəkildə izah edilə bilər:

A) Onun Məkkədən Mədinəyə köçməsi ilə yeni bir təqvim başlamışdır. Bu səbəbdən, həyatının bir hissəsi "hicrətdən əvvələ", bir hissəsi isə "hicrətdən sonraya" düşür. Eynən, "miladdan əvvəl, miladdan sonra" deyildiyi kimi.

B) Günəşin [vəhyin] doğduğu yer olan Məkkə ilə –surədəki ifadəyə görə– günəşin batdığı yer olan Mədinənin sahibi.

[288] Burada, Muhəmmədin Mədinədə dövlət başçısı olmasından və yerli xalqla ilk müqaviləsindən [Mədinə vəsiqəsi] danışılır.

[289] Burada, Muhəmmədin, ona vəhy edilən yerə [Məkkəyə–Xudeybiyyəyə] getməsindən və orada bağladığı müqavilədən danışılır.

[290] *Yəcuc* və *məcuc* sözlərinin ərəbcə olmadığı deyilir. Qurandakı ərəbcə olmayan sözlərlə əlaqədar tədqiqatlardan, bu sözləri də –*harut* və *marut* sözləri kimi– əcnəbi bir dilə [yunan dilinə] məxsus olduğu, daha sonra ərəbləşdiyini başa düşürük. Diqqəti cəlb edən bir məsələ də budur ki, bu sözlər "yandırıb dağıtmaq, atıb saçmq" sözlərini xatırladan sözlərlə ərəbləşdirilmişdir.

Müqəddəs Kitabda və əldəki İncillərdə, həm də Quranda, yəcuc və məcucun ortaq xüsusiyyəti yürüyüşləri və istilaları kimi göstərilmişdir. Deməli, bu sözlərin ifadə etdiyi güc, bir ləşkərin gücüdür. Elə isə, *yəcuc* bu "ləşkərin sərkərdəsi", *məcuc* isə "onun əsgərlədirir".

Bu izahı əsas alaraq, Xeybəri istila edən sərkərdənin [Muhəmmədin] və onun əsgərlərinin [səhabələrin] də Xeybərlilər üçün yəcuc və məcuc olduqlarını demək mümkündür.

94 nömrəli ayədəki sözlərin "həqiqi" mənalarına görə, Zülqərneynə müraciətlə, sanki *söz başa düşməyən, qanun-qayda bilməyən bir*

*camaatdan*, üçüncü şəxslərdən danışılmaqdadır:
*Ey Zülqərneyn! Şübhəsiz ki, Yəcuc və Məcuc bu torpaqları xarab edir.*
Ətraflı düşünülmədiyi üçün, bu söz səhv başa düşülmüşdür. Halbuki, burada deyilən *söz başa düşməyən, qanun-qayda bilməyən camaat* Zülqərneynə birbaşa *"Sən və sənin ordun bu torpaqları xarab edir"* deməyərək, yumuşaq və diplomatik bir üslubla *"Ey Zülqərneyn! Şübhəsiz ki, Yəcuc və Məcuc bu torpaqları xarab edir"* deyərək kinayəli bir dillə müraciət etməkdədir.
[291] Burada Xeybər müqaviləsinin hazırlanmasından və möhtəvasından danışılmaqdadır. Daha ətraflı məlumat üçün tarix kitablarına və "Təbyinül-Quran"a müraciət etmək mümkündür.
[292] Bax: 246 nömrəli qeyd
[293] Bax: 71 nömrəli qeyd.
[294] Allah bəzi şəxsləri mal, övlad, ömür və ağıl baxımından digərlərindən üstün yaratmışdır. Mal baxımından üstün olanlar, sahib olduqları mallardan öz əllərinin altında işləyən adamlara bərabər miqdarda vermir, müəyyən səbəblərdən, müxtəlif miqdarlarda verirlər. Bu adamlardan heç birini özləriylə eyni səviyyədə görmür, mallarını onlarla bölüşmürlər. Rəbbimiz burada belə demək istəyir: Siz belə əlinizin altında işləyən şəxsləri özünüzə ortaq [şərik] kimi qəbul etmirsiniz, ağa ilə qul, işçi ilə sahibkar arasındakı fərqi qəbul edirsiniz. Elə isə, Allah ilə Allahın yaratdığı qullar arasında fərq olmasını niyə qəbul etmirsiniz? Allah, heç qullarını özünə ortaq [şərik] qəbul edərmi?
Allahın Öz nemətlərini qullarına müxtəlif miqdarlarda verməsi və bu səbəbdən bəzi şəxslərin digərlərindən üstün olması, ictimai nizamın qorunub saxlanması üçündür: Həyatda yuxarı-aşağı təbəqələr arasındakı əlaqələr, ictimai həyatın içinə yerləşdirilən, insanların bir-birləriylə müxtəlif ictimai əlaqələr qurmasına imkân verən və bu əlaqələri yaratma tərzinə görə insanların imtahan edildikləri ilahi bir qaydadır. Buradakı *dərəcə-dərəcə ucaltmaq* isə hörmət, ehtiram, kəramət baxımından yox, ekonomik güc, ağıl, zəka, dərrakə, bilik baxımından fərqlilikləri ifadə edir. Ekonomik güc, zəka və dərrakə baxmından hamı eyni olsaydı, o cəmiyyətdə insanların bir-birinə iş gördürməsi, yəni məşğulluq və iş istehsalı mümkün olmazdı, onların mümkün olmadığı bir cəmiyyətdə isə həyat dayanardı. Bu barədə bax: "Rəsmi Müshəf"ə görə: Zuxruf / 32, Nəcm 258; Rum / 28, Nəcm 379.
[295] Bu ayədə, müqaviləni pozan şəxslər *ipliyini möhkəm əyirdikdən sonra onu söküb pozan qadına* oxşadılmışdır. Bir qadının, əyirib bükdüyü yunu təzədən pozmağa çalışması, əhdlərini pozan şəxsləri xarakterizə etmək məqsədi ilə işlədilən təsvirdir. Ərəb məişətinə görə

meydana gələn bu təşbehdə konkret olaraq müəyyən bir qadının nəzərdə tutulduğuna dair müxtəlif qeydlər olsa da, aydındır ki, bu təşbeh, əhdini pozan bütün kişi və qadınları ehtiva etməkdədir.
[296] Burada deyilən şəhər, çox güman ki, Səba surəsinin 5-21-ci ayələrində (Nəcm 223) bəhs edilən Səba şəhəridir.
[297] Xalq arasında "şənbə" günü olaraq bilinən *səbt* günü, insanların gündəlik həyatlarıyla bağlı işləri [dünya işlərini] bir yana qoyaraq, onları heç firikləşmədən, ancaq Tanrının sözlərinə qulaq asdıqları və onları dərin-dərin firikləşməyə zaman ayrıdıqları, yəni həm bədənlərinə, həm də ruhlarına istirahət verdikləri gündür.
[298] Burada adları çəkilən bütlər, Nuh qövmünün məbud qəbul etdiyi bütlər idi. Allahın Rəsulu Muhəmməd dövründə Ərəbistan coğrafiyasında da bu adları daşıyan bütlər var idi.
[299] Texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəki 25-ci ayəni 28-ci ayənin arxasına gətirdik.
[300] Bax: 8 nömrəli qeyd.
[301] Bax: 37 nömrəli qeyd.
[302] Bax: 290 nömrəli qeyd.
[303] Ayələrdə işlədilən *ma mələkət əymanuhum* [müqavilələrinin sahib olduqları] ibarəsi əsasən "cariyələr" kimi başa düşülmüşdür. Cariyələrin sayı barəsində bir məhdudiyyət olmadığı kimi, onlarla nikah bağlamaq məcburiyyəti də olmadığı anlayışı hakim olmuşdur. O halda, *ma mələkət əymanuhum* [müqavilələrinin sahib olduqları] ibarəsiylə kimlərin nəzərdə tutulduğunu təhlil etmək lazım gəlir. İslamiyyətin gəldiyi dövrdə dünyanın hər yerində olduğu kimi, Ərəbistan coğrafiyasında da köləlik var idi və qulların satılıb-alınması, miras qoyulması, qaçırılması, hərb əsirlərinin qula çevrilməsi kimi üsullarla davam edirdi. İslamiyyət, müharibə xaricində əsir almağı və hərb əsirlərinin də qula çevrilməsini qadağan etdi (Ənfal / 62 və Muhəmməd / 4). Beləliklə, köləliyi tədricən bütünlüklə aradan qaldırdı. XIX əsrdə İngiltərə başda olmaqla digər dövlətlər də köləliyi qadağan etdilər və aradan qaldırdılar. Ancaq təəssüf ki, guya bir İslam ölkəsi olan Osmanlı Dövləti zənci qulların alınıb-satılmasını 1857-ci ildə, ağdərili qulların alınıb-satılmasını isə ancaq 1909-cu ildə qadağan etmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
Köləliyin davam etdiyi müddətdə, yerli və beynəlxalq adətlərə uyğun olaraq qadın və kişi qullar müəyyən şərtlər daxilində, müqavilələr çərçivəsində himayəçi ailələrə tapşırılır, bu ailələr qulların əməyindən istifadə edir və onları himayə edirdilər. Qullar din və vicdan azadlığına malik idi, ancaq iqtisadi və siyasi azadlıqları yox idi. Miras və qəsb etmək üsuluyla qul əldə etmək aradan qaldırıldıqdan sonra, hərb

əsirlərindən mübadilə edilməyən, fidyə verilməyən və ailəsindən bir himayəçiləri də olmayan qadınlar yenə müəyyən şərtlər daxilində müəyyən adamların himayəsinə verilirdi. Bəzən də köləliyin ləğv edilmədiyi qonşu ölkələrdən birindən hədiyyə olaraq qullar göndərilirdi.
Buradakı *ma mələkət əymanuhum* [müqavilələrinin sahib olduqları] ibarəsi ilə "bu şərtlər daxilində himayə altında olan qadınlar" nəzərdə tutulmuşdur. Belə qadınlarla cinsi əlaqədə olmaq üçün mütləq onların yaxınlarından icazə almaq və adətə uyğun olaraq mehrlərini verərək onları nikaha almaq şərti var (Nisa / 24). İslamiyyət, nikahsız cinsi əlaqəni qəbul etmir, nikahsız könüllü əlaqəni zina, nikahsız zorla əlaqəni isə zorlama kimi qəbul edir.
Ayədə bu qadınların "və ya" sözüylə ikinci bir qrup olaraq sayılmasının səbəbi, onların keçmişindəki naməlum məqamlar və o günkü mehr adəti baxımından digər həmyerliləriylə bərabər sayılmamasıdır. Nikahın təməli bir olsa da, təfərrüatda bir fərq var. Belə qadınlara konkret misal vermək lazım gələrsə, Peyğəmbərimizin zövcələrindən Safiyə bir hərb əsiridir, Mariyə isə ona hədiyyə edilmişdir. Peyğəmbərimiz onların ikisiylə də nikah bağlamışdır. Digər tərəfdən, bu iki qadın da Quranda (Təhrim və Əhzab surələrində) Rəsulallahın zövcələri kimi keçmişdir.
Müasir dövrdə köləlik ləğv edilmiş, adətlərin yerini milli və beynəlxalq hüquqi aktlar tutmuşdur. Müasir dövrdə bu qavram əsir kamplarında, sığınacaqlarda və himayə qurumlarındakı qadınlar olaraq ələ alınmalıdır.
[304] Bax: 77 nömrəli qeyd.
[305] Bax: 37 nömrəli qeyd.
[306] Bax: 27 nömrəli qeyd.
[307] Bax: 37 nömrəli qeyd.
[308] Bax: 8 nömrəli qeyd.
[309] Bax: 37 və 52 nömrəli qeydlər.
[310] Bax: 91 nömrəli qeyd.
[311] Bax: 71 nömrəli qeyd.
[312] Bax: 49 nömrəli qeyd.
[313] Ayədəki sözlərin lüğəvi mənası belədir: *"Tur, yayılmış incə dəri [perqament] üzərinə sətir-sətir yazılan kitab, abad ev, yüksək tavan, doldurulan [alovlandırılan] dəniz sübutdur ki, şübhəsiz, Rəbbinin əzabı həqiqətən vaqe olacaqdır, ona mane olacaq [heç bir güc] yoxdur."*
[314] Buradakı *səma* sözü ilə kainatdan / bütün varlıq aləmindən daha irəli bir nöqtə, "ən üst nöqtə" nəzərdə tutulmuşdur ("Təbyinül-

Quran"da *səma* sözü barəsində ətraflı məlumat verilmişdir: I cild, s. 526-527). İnsanın təbiəti elədir ki, Allah haqqında fikirləşdikdə, səmaya baxır. Dua edərkən də əllərini göyə qaldırır. İnsan bir çətinliklə üzləşdikdə üzünü göyə tutaraq Allaha yalvarır. Eləcə də, fövqəladə hadisələr barəsində "göydəndüşmə" sözü işlədilir. Allahdan gələn kitablara "səmavi kitablar" deyilir. Deməli, insan nə vaxt Allah barəsində fikirləşsə, öz təbiətindəki bir instinktlə yerə yox, göyə baxır.

[315] Bax: 27 nömrəli qeyd.

[316] Bax: 37 nömrəli qeyd.

[317] "O hadisə"nin nə olduğu daha yaxşı başa düşülsün deyə, 4-12-ci ayələrdən ibarət olan hissəni, əsas hissənin sonuna gətirdik.

[318] Bax: 303 nömrəli qeyd.

[319] Bax: 27 nömrəli qeyd.

[320] Ayədəki sözlərin lüğəvi mənası belədir: *"Suya batıran kimi / batıraraq zorla çəkənlər; çətinlik vermədən asanlıqla çəkənlər və o üzdükcə-üzüb gedənlər; sonra önə keçdikcə-keçib bir işə əncam çəkənlər dəlildir ki."* Biz burada məcazi mənalarına üstünlük verdik.

[321] Naziat surəsinin ayələrini, texniki və semantik səbəblərlə "Rəsmi Müshəf"dəkindən daha fərqli bir ardıcıllıqla düzdük.

[322] Bax: 8 nömrəli qeyd.

[323] "Rəsmi Müshəf"də 46-cı yerdə olan bu ayənin əslində buraya aid olduğu qənaətindəyik.

[324] Bax: 303 nömrəli qeyd.

[325] "Rəsmi Müshəf"də 47-ci yerdə olan bu ayənin əslində buraya aid olduğu qənaətindəyik.

[326] Bax: 8 nömrəli qeyd.

[327] "Rəsmi Müshəf"dəki 14-17-ci ayələri 23-24-cü ayələrin arasına yerləşdirdik.

[328] Buradakı 33 nömrəli ayə məal və təfsir yazanlar tərəfindən belə başa düşülmüşdür: *"Halbuki onlar, möminlərə nəzarətçi olaraq göndərilməmişdi."* Belə məna, ayənin texniki quruluşuna uyğun gəlmir. Digər tərəfdən, "Rəsmi Müshəf"ə görə Nisa / 80; İsra / 54; Şura / 48; Ənam / 104, 107; Hud / 86; Əraf / 60-61; Yasin / 47; Mülk 9, 29; və Zuxruf / 47 nömrəli ayələrin rəhbərliyi ilə başa düşülür ki, "nəzarətçi / elçi olaraq göndərilməyən, azğınlıqda ittiham edilən və işlərinə gülünən" şəxslər, elə "möminlərdən bəziləri" yəni Allahın elçiləridir.

[329] Quranın bundan sonrakı ayələrinin Mədinədə nazil olduğu qəbul edilir. Allahın Elçisi Məkkədən Mədinəyə hicrət etmiş və Mədinəlilər onu dövlət başçısı etmişdilər. Rəsulallahın burada xitab etdiyi kütlə, əvvəla münafiqlər və Mədinədə, Mədinə ətrafında yaşayan

yəhudilərdir. Bundan sonrakı ayələrdə əsasən bu münafiqləri və yəhudiləri hədəfə götürən təbliğatla İslam dövlətinin təməl prinsipləri yer alacaq.

[330] Bax: 8 nömrəli qeyd.

[331] Bax: 52 nömrəli qeyd.

[332] Bax: 96 nömrəli qeyd.

[333] Buradakı hadisələr Əraf / 138-155 və Taha / 80-98 nömrəli (Nəcm 120) ayələrdə danışılan hadisələrdir. Ayənin orjinalında yer alan fövq sözü həm "alt" sözünün ziddi olaraq "üst" mənasına gəlir, həm də şərəf və fazilət baxımından başqa birindən üstün olan fakə felinin məsdər formasıdır. Digər tərəfdən, fövq sözü əsasən mənəvi üstünlüyü ifadə etmək üçün işlədilir. Bax: "Rəsmi Müshəf"ə görə: Zuxruf / 32; Bəqərə / 212; Ali-İmran / 55; Ənam / 18; Əraf / 127. Burada İsrail oğulları "alt", Musa isə "üst"dür.

[334] Bu hissədə, mütəşabeh ibarələrin necə təvil edildiyi birbaşa Allah tərəfindən göstərilmişdir. Ayələrdə işlədilən inək sözü ilə "qızıl"ın nəzərdə tutulduğu başa düşülür. Yəni burada inəyin məcburi qaydada kəsilməsi, İsrail oğullarının istəməyə-istəməyə qızıla tapınmaqdan əl çəkməyini ifadə edir.

[335] Başçının işləri həmişə cəmiyyətin adına yazılır. Çünkü başçı, elədiyi şeyləri cəmiyyət adına edir. Səmud qövmündə də dəvənin baldırlarını kəsən (səlat vəzifəsini ortadan qaldıran) bir nəfər olsa da, bu iş bəzi ayələrdə cəm halında cəmiyyətin ayağına yazılmışdır.

[336] "Rəsmi Müshəf"də müstəqil bir nəcm olan 62 nömrəli ayəni, semantiki baxımdan İsrail oğullarından danışan hissədən sonra verdik.

[337] Bax: 333 nömrəli qeyd.

[338] "Allahın təmir etməsi, düzəltməsi" mənasına gələn Cibril [Cəbrayıl], Quran ayələrinin bir xassəsidir. Xalqın düşüncəsindəki kimi, Allahdan elçilərə vəhy gətirən bir mələk mövcud deyil. Allah, vəhyi vasitəçisiz olaraq Öz elçilərinin beyninə yerləşdirər. Cibril / Cəbrayıl isə nazil edən deyil, nazil olandır. Bunun ziddini iddia edən tərcümə və şərhlər səhvdir və Qurana uyğun düşmür. İvrit dilindən ərəb dilinə keçən və "qoruyan, himayə edən böyük başçı" mənasına gələn Mikayıl da Rəsulallahın (Tövbə surəsinin 128-ci ayəsində deyilən) xüsusiyyətləridir. Qısaca demək lazım gələrsə, Quranda bəhs edilən Mikal / Mikayıl əslində Muhəmməd Peyğəmbərdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[339] Bu hissədəki ayələri, semantiki baxımdan "Rəsmi Müshəf"dən fərqli bir ardıcıllıqla düzdük.

[340] Həcc haqqındakı bölümlərin daha yaxşı başa düşülməsi üçün müəyyən şeyləri bilmək lazımdır.

***Məlum Aylar***

Ənənəvi şərhlərdə, ayədəki "məlum aylar" ifadəsi haqqında "şəvval, zildəqə və zilhiccə ayları", "şəvval, zilqədə ayları və zilhiccənin ilk on günü" kimi müxtəlif fikirlər meydana atılmışdır. Bu fikirlər, bir baxımdan Quran nazil olmamışdan əvvəlki anlayışın davamıdır. Təəssüf ki, həcc mərasimi də uzun illərdən bəridir zilhəccə ayında həyata keçirilməkdədir.

Bəqərə / 197-ci ayədən (422-ci nəcm) də açıq bir şəkildə başa düşülür ki, Rəbbimiz həcc üçün bir neçə ayı (ən az üç ay) əhatə edən bir müddəti nəzərdə tutmuşdur. Bu o deməkdir ki, müsəlmanlar həcc üçün "Həcc Təşkilat Komitəsi" yaxud "Həcc Əmiri" meydana gətirməlidirlər, bu qurum da həcc vaxtını müəyyənləşdirərək elan etməlidir və elan edilən müddətdə hamı bu quruma gedərək onun əmrinə tabe olmalıdır.

***Hədy***

Hədy, "həcc edənlərin yemək ehtiyacını təmin etmək məqsədi ilə Kəbəyə göndərilən (hədiyyə olaraq göndərilən) canlı heyvan" deməkdir. Quranın nazil olduğu dövrdə Ərəbistan coğrafiyasında bu iş üçün ən münasib olan şey canlı heyvandır.

***Ehram***

Həm Bəqərə / 196 nömrəli ayədən (Nəcm 422), həm də Maidə surəsinin 1, 2, 95, 96 nömrəli ayələrindən (Nəcm 672 və 690) başa düşülür ki, həcc edən şəxs başını qırxdırmamalı, rəfəsdən (pis söz danışmaq, cinsi əlaqə), kiçik-böyük günahları işləməkdən, dava-dalaş və düşmənçilik kimi davranışlardan uzaq olmalı və ov etməməlidir.

Bu hökmlər ədəbiyyata "ehram" (qadağa) adıyla daxil olmuşdur. Ancaq "ehram" sözü eyni zamanda şəkil baxımından da bir məna qazanmışdır. Belə ki, tikişsiz, kəfənə bənzəyən bir geyimə ehram deyilir. Bunun səbəbi, həccə niyyət edən, gəlib həcc əmirinə tabe olan, İbrahimi təlim görən şəxslərin iş, mövqe, ictimai sinif, irq, cinsiyyət, mal, mülk, övlad kimi varlıqlarını, xülasə bundan əvvəlki həyatlarını, mallarını və övladlarını geridə qoyaraq, İbrahim peyğəmbər kimi, "Mən Rəbbimə, Rəbbimə xidmət etməyə gedirəm" deməyini göstərməsidir.

***Ərəfat və Məşərülhəram (müzdəlifə)***

Bəqərə / 198 nömrəli ayədə (Nəcm 422) Rəbbimiz, həcc vəzifəsini yerinə yetirən möminlərə belə buyurur: "Ərəfatdan çıxıb axın-axın gedərkən, Məşərülhəramda dərhal Allahı yad edin."

Bu əmri yerinə yetirmək üçün "Ərəfat" və "Məşərülhəram" ifadələrini yaxşı başa düşmək lazımdır.

***Ərəfat***

Ərəfat sözü "bilik, ürfan" mənasını verən "ərf" sözündən əmələ gəlmişdir. Məlum olduğu kimi, Ərəfat, Məkkə yaxınlığında bir bölgənin adı olaraq məşhurluq qazanmışdır. Əslində Quranda Ərəfat, "müəllim və tələbələrin olduqları yerlər; təlim-tərbiyə mərkəzləri" mənasında işlədilmişdir. Həcc dövründə Məkkə yaxınlığında sabit yaxud səyyar şəkildə qurulan və qurulası bütün təlim-tərbiyə mərkəzlərini ehtiva etməkdədir.

***Məşərülhəram***

Ayədəki Məşərülhəram ifadəsi "əl-Məşarülhərami" formasında, müəyyən halda gəlmişdir, xüsusi isim kimidir. Mənası "toxunulmaz, bilik-şüur qazanılan yer" deməkdir. Məşərülhəram Ərəfat və Mina bölgələri arasında qalan bölgənin adıdır (bəzilərinə görə, bu bölgənin bir hissəsinin adı da olabilər).

Rəbbimizin "Ərəfatdan çıxıb axın-axın gedərkən, Məşərülhəramda dərhal Allahı yad edin." əmrini yerinə yetirmək üçün, Məkkə ətrafında qurulan bütün təlim-tərbiyə müəssisələrindəki möminlər, müəyyən günlərdə axın-axın Məşərülhərama gəlməli və orada hamılıqla "Allahı yad etmək" mərasimini icra etməlidirlər.

***Allahı zikr (yad) etmək***

"Zikrullah, yəni Allahı yad etmək", xalqın arasında yayıldığı kimi, əlində təsbehlər dildə "Allah, Allah…" demək deyil. "Zikrullah, yəni Allahı yad etmək" Allahın biz bəndələri üzərindəki haqqını və bizə verdiyi nemətləri düşünmək, Allaha qarşı öz vəzifəmizi yerinə yetirib yetirmədiyimizi tez-tez yoxlamaq, Allahın bizə verdiyi vəzifələri tam olaraq yerinə yetirmək, Allahın nemətlərinə şükr edərək (onların əvəzini verərək) nankorluq etməmək və daim bu şüura sahib olmaqdır.

***Sayı bəlli olan günlər***

Bəqərə / 203-cü ayədə (Nəcm 422) Rəbbimiz "Və Allahı sayı bəlli olan günlərdə yada salın" buyurmaqdadır. Rəbbimizin burada buyurduğu "sayı bəlli olan günlər" həm cəm halda, həm də qeyri-müəyyəndir. Deməli, bu günlərin hansı günlər olacağı yenə də Həcc Təşkilat Komitəsi tərəfindən, Həcc Əmiri tərəfindən müəyyən edilməlidir.

***Bəraə (ultimatom), yekun qərar***

Məlum olduğu kimi, Rəsulallah, hicrətin 10-cu ilində həcc təşkil etmiş və şəxsən iştirak etmişdir. Peyğəmbərin də iştirak etməsi səbəbiylə, bu həccə "həcci-əkbər" (ən böyük həcc) deyilmişdir. Bu həcc mərasimində təxminən 114 min müsəlmanın iştirak etdiyi deyilir. Bu həccin yekun qərarını isə Rəbbimiz, Tövbə surəsinin ilk 19 ayəsini (Nəcm 695) nazil edərək, bildirmişdir.

"Təbyinül-Quran"da həcc barəsində ətraflı məlumat verilmişdir.
[341] Bu hissədəki ayələri, semantiki baxımdan "Rəsmi Müshəf"dən fərqli bir ardıcıllıqla düzdük.
[342] Oruc "yeməkdən, içməkdən, danışmaqdan və cinsi əlaqədən əl çəkmək" mənasına gəlir. "Danışmamaq" maddəsi nəzərə alınmadan tutulan oruc, İslam dinində insanı təqvaya / Allahın mühafizəsi altına daxil olmaq hədəfinə çatdırmaq məqsədi ilə tutulan oruc deyil. Vacib işi olanlar və xəstələr oruc tutmaq məcburiyyətində deyil, ancaq oruc tutanlar da onu düzgün tutmalıdır.
[343] Bu hissədəki ayələri, semantiki baxımdan "Rəsmi Müshəf"dən fərqli bir ardıcıllıqla düzdük.
[344] "Kişinin and, nəzir və yaxud hər hansı bir başqa şərt qoşaraq, müəyyən bir müddət üçün yaxud müddəti məlum olmadan zövcəsiylə cinsi əlaqəyə girməyi öz-özünə qadağan etməsi" mənasında işlədilən bir termin olan ila, nikahın sonlandırılmasına səbəb ola bilən bir andır. Zövcələrinə qəzəblənən kişilər, bu yolla qadına əziyyət verirdilər.
İslamiyyətdən əvvəl Hicaz ətrafında yaşayan ərəblər tərəfindən bir boşama üsulu olaraq istifadə edilən ila, əsasən uzun müddətli yaxud müddətsiz olduğu üçün, qadına təzyiq göstərmək, ona əziyyət vermək və ziyan vurmaq məqsədiylə istifadə edilirdi. Çünki ila edən kişi öz ərlik vəzifəsini yerinə yetirmirdi və nikahları ila müddətinin axırına qədər davam etdiyi üçün, qadın boşanmış sayılmır, günlərini böhran içində keçirirdi. Quran bu zülmə son qoyaraq, ila müddətini dörd ay olaraq məhdudlaşdırdı. Kişi bu müddət içində kəffarə verərək zövcəsinə qayıtmasa, dörd ay bitən kimi nikah pozulacaqdı. İslamiyyət ailə hüququ sahəsində bu və bunun kimi bir çox məsələdə yeni prinsiplər və köklü həll yolları gətirmiş, kişilərin ailə içində mütləq hakimiyyətini ləğv etmişdir.
[345] Qurana görə mehr, qadın üçün "dolanışıq qarantiyasıdır". Bu qayda, qadının zəifliyindən yox, ictimai və mədəni önəmi baxımından qadının qorunması ehtiyacından meydana gəlmişdir. Dul qalarsa iddə müddəti qurtarana kimi dolanışığını təmin edə biləcəyi bir malın yaxud pulun qadına verilməsi, qadını öz dolanışığını təmin etmək üçün zəhmət çəkmədən, yuvasından uzaqlaşaraq əziyyətlərə düçar olmaqdan xilas edəcəkdir. Beləliklə qadın müxtəlif hücumlardan, təhdidlərdən və pisliklərdən də uzaq olacaqdır. Qısaca demək lazım gələrsə, Allah qadını şərəfləndirmək, qorumaq və onun çətinliyə düşməsinə mane olmaq üçün qadına mehr verilməsini əmr etmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[346] Bu ayədə əs-səlatül-vüsta olaraq adı çəkilən səlat "cümə / yığıncaq gününün səlatı"dır. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat

verilmişdir.
[347] Bax: 246 nömrəli qeyd.
[348] Riba sözü "artmaq, çoxalmaq, şişmək" deməkdir. Dilimizdə "faiz" mənasına gəldiyi kimi, hüquqi bir termin olaraq, mübadilə əsnasında "əvəzsiz artıq" deməkdir. Yəni riba sözü ancaq maliyyə əməliyyatlarındakı artığı yox, mal mübadiləsindəki artığı da ehtiva edir. Allahın qadağan etdiyi ər-riba hərhansı bir xərcin yaxud xidmətin əvəzi olmadan alınan, yəni ödəyənin qazancına risksiz ortaq olmaq mənasına gələn ribadir. Başqa bir sözlə, Allah "əvəzsiz" və "risksiz" olan "artığı" qadağan etmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[349] Burada nəql edilən döyüş və döyüş əsnasında meydana gələn hadisələr Bədr döyüşüylə bağlıdır. Mədinənin cənub-qərbində, Mədinədən 120, Qırmızı dənizdən 20 km məsafədə yer alan Bədr, ədviyyat yolunun üstündəki dayanacaqlardan biridir.
Məkkə müşrikləri Mədinəyə köçən Rəsulallahın və onun ətrafında toplaşan adamların geri qayıdacağından qorxduqları üçün mütəmadi olaraq müəyyən dəstələr göndərir və onlara ziyan vururdular. Bundan əlavə, Mədinədə, Peyğəmbərin və mömünlərin Mədinyə gəlməsindən narazı olan adamlar var idi. Onların ən birincisi isə o günlərdə tac geyərək kral olmağa hazırlaşan, Peyğəmbərin gəlişindən sonra yaddan çıxan Abdulla bin Ubey bin Səlul idi. Çünki Mədinə əhalisi, onun yerinə Peyğəmbəri dövlət başçısı seçmişdi.
Xalqın bu seçimi və qohumlarından çoxunun müsəlman olması səbəbiylə Abdulla bin Ubey bin Səlül müsəlmanların tərəfinə keçməyin özü və tərəfdarları üçün daha yaxşı olacağı qərarına gəldi və zahirən müsəlman oldular. Beləliklə, Mədinədə münafiqlik hərəkatı başladı.
Məkkənin idarəçiləri arasındakı kindar müşriklər, Mədinədəki dostları Abdulla bin Ubey bin Səlül ilə əlbir olaraq Peyğəmbəri və onun tərəfdarlarını Mədinədən qovmağı, hətta onları məhv etməyi planlaşdırırdılar. Abdulla bin Ubey bin Səlülə belə bir məktub yazdılar: "Siz bizimkilərə sığınacaq verdiniz. Siz ya Muhəmmədi öldürün yaxud yurdundan qovun, ya da biz hamılıqla sizə hücum edərək kişilərinizi öldürəcək, qadınlarınızı da əsir alacağıq."
Bu məktubdan sonra Məkkə müşrikləri ilə Mədinə münafiqləri əlbir oldular. Peyğəmbəri və möminləri öldürmək yaxud Mədinədən qovmaq üçün hazırlaşmağa başladılar.
Peyğəmbər və möminlər bu plandan xəbər tutdular və tədbir görməyə başladılar. Elə bu dövrdə Allah, möminlər üçün yeni bir strategiya müəyyənləşdirdi; fitnə, haqsızlıq və xaosun aradan qaldırılması üçün

lazım gələrsə döyüşməli [ölməli və öldürməli] olduqlarını bildirirdi. Artıq möminlər öz dinlərini, canlarını və yurdlarını müdafiə etmək üçün döyüşmək məcburiyyətində idilər.
O əsnada Məkkəli müşriklər müsəlmanları təhdid edirdilər, onların Mədinə yaxınlarına qədər göndərdikləri soyğunçu dəstələr müsəlmanlara ziyan vururdu. Nəhayət, Məkkə müşriklərinin ortaq hazırladıqları və Əbu Süfyan tərəfindən idarə olunan bir ticarət karvanını Suriyaya göndərdilər, məqsədləri bu karvandan əldə edilən gəlirlə müharibəyə hazırlaşmaq və müsəlmanlara son zərbəni vurmaq idi.
Bundan xəbərdar olan Peyğəmbər, vəziyyəti öz əshabı ilə müzakirə etdi. Bu karvanın Məkkəyə gedib çatmasına icazə verməməyi qərarlaşdırdılar. 83 nəfəri mühacirlərdən, 61 nəfəri Övsdən, qalanı da Xəzrəcdən olmaqla cəmi 305 nəfərlik bir ordu hazırladılar. Bu ordunun 3 atı və 70 dəvəsi var idi.
[350] Quranın nazil olduğu dövrdə ən mükəmməl müharibə vasitəsi olan “atların” yerini müasir dövrümüzdə “hərbi təyyarələr, təyyarə gəmiləri, qitələrarası raketlər, nüvə silahı” və sair kimi başa düşmək lazımdır.
[351] Bax: 8 nömrəli qeyd.
[352] Xristianlığın səhv inanışlarını açıb göstərən bu hissə Nəcrandan Mədinəyə gələrək Peyğəmbərlə mübahisə edən bir heyət barəsində nazil olmuşdur.
[353] Bu hissədəki ayələri, texniki və semantik baxımdan “Rəsmi Müshəf”dəkindən fərqli bir ardıcıllıqla düzdük.
Burada İsa peyğəmbərin İsrail oğullarına göndərilməsindən və bunun səbəblərindən danışılır. Musa və Harun peyğəmbərlər həm İsrail oğullarına vəhyi, tövhidi öyrətmək, həm də onları Misirdəki əsarətdən xilas etmək məqsədi ilə göndərilmişdi. Bu hissədə İsa peyğəmbərin vəhyi təbliğ etməklə birgə, İsrail oğullarını epidemiya şəklində yayılan xəstəliklərdən xilas etmək, xəstəliklərə qarşı qabaqcadan tədbir almaq və İsrail oğulları üçün rahat bir məişət təmin etmək məqsədiylə, profilaktiki həkimlik, göz həkimliyi, dəri həkimliyi kimi vəzifələrlə, sağlam qidalardan istifadə etməyi, konserva, turşu, bəkməz, duza qoyulmuş qidalar hazırlamaq, arpa, buğda, dənli bitkilər yığıb saxlamaq, onları rütubətdən və həşəratlardan necə qoruyacaqlarını öyrətmək kimi məqsədlərlə göndərildiyi xülasə şəklində izah edilməkdədir.
Bizim *“Şübhəsiz mən sizin üçün palçıqdan; gildən; keramikadan quş şəkli kimi bir şey; buxurdan düzəldərəm”* deyə tərcümə etdiyimiz ayədəki *“düzəldərəm”* felinin tamamlığı ayənin orjinalında yer

almamış və oxuyucunun öz anlayışına buraxılmışdır. Ayədə “quş fiquru, quş maketi düzəldərəm” deyilmir, “quş şəkli, quş fiquru, quş maketi kimi bir şey düzəldərəm” deyilir. Burada, İsanın gildən quş şəklində buxurdan düzəldərək və içinə qoyduğu ədviyyatlara üfürərək, hasil olan tüstü və qoxuyla göz xəstəliklərinə və digər xəstəliklərə səbəb olan ağcaqanad, milçək kimi həşəratları qovduğu başa düşülür. Günümüzdə də mövcud olan keramikadan hazırlanan buxurdanların əksəriyyətinin quş şəklində olduğunu bilirik.
Ayədə *fəyəkunu* (dərhal olar) felinin ismi də yer almamış və ümumi mənanın axışı içində anlaşılmalıdır.
[354] Burada (121-122, 140-144, 155-157, 165-168 nömrəli ayələr) Uhud döyüşünün səbəb və nəticələri barədə qısa məlumat verilmişdir. Bu mövzuda ensiklopedik səviyyədə məlumat almaq faydalı olar.
[355] Bu ayə, cahiliyyə dövründə ərəb məişətində mövcud olan bir adəti [zihar adətini] ləğv etmişdir. Ərəb adət-ənənələrində görə, bir kişi öz zövcəsinin bir hərəkətinə qəzəbləndikdə, ona belə deyirdi: “Sən mənim üçün anamın kürəyi kimisən.” Belə olduqda, aralarındakı ailə bağları qopmasa da, bir-birləri üçün halal qəbul edilmirdilər. Fəqət tam mənada boşanmış da olmurdular. Bu halda qadının başqa bir çarəsi qalmır və o, əziyyətə qatlaşmaq məcburiyyətində olurdu. Mucadələ surəsinin 1-4-cü ayələrində (Nəcm 641) bundan danışılır.
[356] Bu ayədə hicrətin 5-ci ilində meydana gələn Xəndək döyüşündən danışılır. Bədr döyüşündə olduğu kimi, burada da Allah açıq-aşkar möcüzələr yaratmışdır. Bu hissədə Xəndək və Bənu Qurayza döyüşlərinin bəzi səhnələrindən danışılır. Həm bu hissəni düzgün başa düşmək, həm də tarixi hadisə barəsində ətraflı məlumat almaq üçün Xəndək döyüşü haqqında ensiklopedik səviyyədə məlumata sahib olmaq yaxşı olardı.
*Əhzab* “hizblər” [zidd qruplar, partiyalar] deməkdir. Bu sözlə müsəlmanlarla döyüşmək məqsədi ilə birləşən Məkkə, Qətəfan, Bənu Qurayza və digər ərəb qəbilələri (müşriklərin birləşmiş gücü) nəzərdə tutulmuşdur.
[357] Zeyd, Kelb qəbiləsindən idi. Kiçik yaşda qəbilə savaşında əsir alınaraq Uqaz bazarında qul olaraq satıldı. Xədicənin qardaşı uşaqlarından Hakim ibn Hizam, Zeydi alaraq Məkkəyə gətirdi və bibisinə hədiyyə etdi. Peyğəmbərimiz, Xədicə ilə evlənirkən, Zeyd onun zövcəsinə xidmət edirdi. Zeydin xasiyyəti və hərəkətləri xoşuna gəldiyi üçün, onu zövcəsindən istədi. Beləliklə, bəxti gətirən uşaq, bir neçə il sonra peyğəmbərlik bəxş ediləcək olan o kamil insanın xidmətinə keçdi. Zeydin o vaxt 15 yaşı var idi. Daha sonra atası və əmisi Zeydin Məkkədə olduğunu öyrəndilər və Muhəmmədin yanına

gələrək, fidyə verib Zeydi almaq istədilər. Muhəmməd belə dedi: "Uşaqdan soruşacağam, sizinlə getmək istəyirmi, yoxsa mənimlə qalmaq istəyir? Qoy, buna özü qərar versin. Əgər mənim yanımda qalmaq istəsə, mən, yanımda qalmaq istəyən bir nəfəri geri qaytara bilmərəm." Onlar da buna razı oldular. Zeyd, Peyğəmbərin yanında qalmağa üstünlük verdi. Muhəmməd dərhal Zeydi azad etdi və Kəbədə bir dəstə Qureyşlinin qarşısında Zeydi övladlığa götürdüyünü elan edərək belə dedi: "Şahid olun, bu andan etibarən Zeyd mənim oğlumdur. Mən onun varisiyəm, o da mənim varisimdir." Bu hadisədən sonra Zeydi, Zeyd ibn Muhəmməd deyə çağırmağa başladılar. Bütün bu hadisələr, Muhəmmədə peyğəmbərlik bəxş olunmamışdan əvvəl olmuşdu. Daha sonra Muhəmmədə peyğəmbərlik verildikdə, Zeyd ona inanan ilk dörd nəfərdən biri oldu. Zeyd o vaxt 30 yaşında idi və 15 il Peyğəmbərə xidmət etmişdi. Hicrətin 4-cü ilində Peyğəmbər, Zeydi bibisinin qızı Zeynəblə evləndirdi.

[358] Allah Quranı qoruyaraq, qorunmasını təmin edərək, ondan sonra yeni bir kitab nazil etməyəcək. Yeni bir kitab nazil etməyəcəksə, deməli yeni bir elçi də göndərməyəcək.
Allah Muhəmmədi axırıncı peyğəmbər olaraq göndərmiş və beləliklə, elçi göndərmək işinə son qoymuşdur. Ancaq elçinin vəzifəsi olan xəbərdarlıq etmək, müjdə vermək, öyüd vermək, yaxşılığı buyurmaq və pislikdən çəkindirmək vəzifələrini –Bəqərə / 143 (Nəcm 421); Ali İmran / 104, 110 (Nəcm 494) və Həcc / 78 (Nəcm 638) nömrəli ayələrdən də açıq-aşkar başa düşüldüyü kimi– bu ümmətə vermişdir.

[359] Bax: 345 nömrəli qeyd.

[360] Bax: 303 nömrəli qeyd.

[361] Bax: 303 nömrəli qeyd.

[362] "Rəsmi Müshəf"dəki 73-cü ayə, texniki və semantiki baxımdan 63 -cü ayə ilə birləşdirilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[363] Bax: 345 nömrəli qeyd.

[364] Bax: 303 nömrəli qeyd.

[365] Bax: 345 nömrəli qeyd.

[366] Bu hissədə, texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıq tətbiq edilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[367] Bax: 303 nömrəli qeyd.

[368] Bax: 345 nömrəli qeyd.

[369] Bu hissədə, texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıq tətbiq edilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[370] Bax: 303 nömrəli qeyd.

[371] *Cunub* [cənabətli] sözü "uzaq olan / qopan" mənasına gəlir. Nisa / 43 və Maidə / 6 nömrəli ayələri əsas aldıqda, bu sözün "şəhvət hissinin qabarması, nəfsin oyanması səbəbiylə həyatdan qopan, müvazinətini itirən, məntiqli hərəkət edə bilməyən" mənasına gəldiyi başa düşülür. Çünki bu halda olan insan həyatdan və dünyadan qopur, məntiqli düşünə bilmir. Buradan da başa düşülür ki, cənabətli olmaq, spermanın xaric edilməsi ilə yuyunmaq arasındakı vəziyyət deyil, şəhvətin qabarması ilə spermanın xaric edilməsi arasındakı gərgin vəziyyətə deyilir.

[372] Düşüncə günü səbəbindən yəhudilərdən imtahana çəkilən camaat barəsində Əraf surəsində danışılmışdır.

[373] Bax: 246 nömrəli qeyd.

[374] Bax: 246 nömrəli qeyd.

[375] Bu sözlər əsasən "heyvanları axtalamaq, insanları xədim etmək" kimi başa düşülmüşdür. Ancaq burada deyilən *dəyişdirmək* "varlıqların genlərini dəyişdirmək, insanların faydalanması üçün yaradılan ay, günəş, daş, torpaq kimi varlıqları müqəddəsləşdirərək onları məbud qəbul etmək, belinə minilmək və əti yeyilmək üçün yaradılan heyvanları haramlaşdırmaq, bəhirə, saibə, vəsilə, ham kimi heyvanları müqəddəsləşdirmək, qanuni cinsi hədlərin xaricinə çıxaraq homoseksuallıq etmək, səbəbsiz hitan / sünnət etmək, xülasə, təbiəti, təbiətin tarazlığını pozmaq" kimi geniş başa düşülsə daha uyğun olar.

[376] Bax: 303 nömrəli qeyd.

[377] Bu hissədə, texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıq tətbiq edilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[378] Bu hissədə, texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıq tətbiq edilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.

[379] Bu hissədəki ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür. Bundan əlavə, "Rəsmi Müshəf"dəki Zilzal surəsi də 172-ci ayənin hal zərfi kimi verilmişdir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat yer almaqdadır.

[380] Bax: 353 nömrəli qeyd.

[381] Bax: 8 nömrəli qeyd.

[382] Bax: 37 və 52 nömrəli qeydlər.

[383] Bu hissədəki ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür.

[384] Bax: 353 nömrəli qeyd.

[385] Bax: 353 nömrəli qeyd.
[386] Bax: 49 nömrəli qeyd.
[387] Bu hissədəki ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür.
[388] Bax: 450, 452, 514 və 601 nömrəli nəcmlər.
[389] Bu hissədə, möminlərlə bağladıqları müqavilələrə xəyanət edən, Məkkəli müşriklər və yerli münafiqlərlə əlbir olan yəhudi qəbilələrinin Mədinədən sürgün edilməsindən danışılır. Bu hissəni oxuyarkən, bu tarixi hadisələri nəzərə almaq və bu hadisələr barəsində ensiklopedik səviyyədə də olsa məlumat əldə etmək lazımdır.
[390] Bu hissədəki ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür.
[391] "İfk" hadisəsi, münafiqlərin, Peyğəmbəri və möminləri gözdən salmaq, İslam cəmiyyətini parçalamaq, başda Əbubəkr olmaqla, Peyğəmbərlə yaxın dostlarının arasını vurmaq, mühacirlərlə ənsar arasında ixtilaf yaratmaq məqsədi ilə Peyğəmbərin məhrəm ailə sirlərini hədəfə götürərək, region və qəbilə təəssübündən istifadə etmək surətiylə müraciət etdikləri bir mənfi propaqanda və iftira kampaniyasıdır. Bu propaqanda müvəffəqiyyətə nail olmuş və iki müsəlman camaatının bir-birlərinin üstünə qılınc çəkəcək səviyyəyə gətirmişdir. Peyğəmbərin müdaxiləsi sayəsində onları sakitləşdirmək mümkün olmuşdur. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[392] Bax: 353 nömrəli qeyd.
[393] Bax: 303 nömrəli qeyd.
[394] Bax: 303 nömrəli qeyd.
[395] Ayədəki sözlərin lüğəvi mənası nəzərə alındıqda, ayənin tərcüməsi belə olmalıdır: *"Hər kim Allahın dünyada və axirətdə ona kömək edəyəcəyini zənn edirsə, dərhal səmaya bir səbəb uzatsın, sonra… kəssin. Sonra da baxıb görsün bu planı, onu qəzəbləndirən şeyi [zehninə yerləşən fikri] aradan qaldıracaqmı?"* Quran ayələri nəzərə alındıqda görürük ki, *səmaya yönəlmək* "Allahın rəhmətini gözləmək və Allahın səmadan rəhmət yağdırması" mənasına gəlir. "Təbyinül-Quran"da bu barədə ətraflı məlumat verilmişdir.
[396] Bu hissədəki ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür.
[397] Bax: 355 nömrəli qeyd.
[398] Burada, "özlərini olduqlarından daha böyük göstərmək" müharibədə və digər fövqəladə hallarda düşmənə qorxu vermək məqsədi daşıyır. Olduqları yerdən qalxıb getmək mənasına gəlmir.
[399] Bax: 91 nömrəli qeyd.

[400] Burada Xudeybiyyə Sülh Müqaviləsindən və Rizvan Biətindən danışılmaqdadır. Hicrətdən 6 il ötmüş və bu müddətdə heç kim öz yurdu və qohumlarıyla əlaqə saxlamamışdı. Mühacirlərin həsrət və qürbət hissi böyümüş, ənsarda da Kəbə həsrəti əmələ gəlmişdi. Bu səbəbdən Rəsulallah, Kəbəyə getmək istəyənlərin hazır olmasını buyurdu. Zülqədə ayının birinci bazar ertəsi günü [13 mart 628] 1400 nəfər Məkkəyə doğru yola çıxdı. Sülh məqsədi ilə gəldiklərini göstərmək üçün, səfər qılıncı deyilən bir qılıncdan başqa silah götürməmişdilər. Bundan xəbərdar olan Məkkəli müşriklər, nə bahasına olursa olsun Rəsulallahın Məkkəyə girməsinə icazə verməmək barədə qərar qəbul etdilər. Peyğəmbərin Məkkəyə daha artıq yaxınlaşmasına mane olmaq üçün Xalib bin Vəlidin komandası altında 200 süvaridən ibarət bir dəstə göndərdilər. O vaxta qədər Peyğəmbər və möminlər Məkkə yaxınlığındakı Xudeybiyyəyə gəlib çatmışdılar. Peyğəmbər, öz məqsədlərini çatdırmaq və Məkkə müşriklərinin fikrini öyrənmək üçün bir elçi göndərdi və Məkkəyə döyüşmək məqsədiylə gəlmədiklərini, Kəbəni ziyarət etdikdən sonra geri qayıdacaqlarını bu elçi vasitəsiylə bildirdi. Ancaq müşriklər, elçinin dəvəsinə zərbə vuraraq elçini yerə saldılar və öldürmək istədilər. Məkkəli olmayan bəzi şəxslər araya girərək elçini xilas etdilər. Elçi geri qayıdaraq vəziyyəti Peyğəmbərə nəql etdi. Məkkəli müşriklər, müsəlmanların Məkkəyə girməsini özlərinə böyük bir təhqir olaraq görürdülər və ərəblərin gözündən düşəcəklərini zənn edirdilər. Məkkədə hələ də hörməti və bir çox nüfuzlu qohumu olan Osmanın elçi kimi göndərilməsi təklif edildi. Rəsulallah, Osmanı Qüreyşə göndərdi. Osman, Peyğəmbərin sözünü çatdırdı və “Biz müharibə üçün gəlmədik, sadəcə olaraq ümrə ziyarəti üçün gəldik” dedi. Qüreyşlilər Osmana belə dedilər: “Sən istəyirsənsə Kəbəni təvaf edə bilərsən, ancaq hamınızın Məkkəyə daxil olmasına və Kəbəni təvaf etməsinə icazə verməyəcəyik.” Osman bunu qəbul etmədikdə, onu Məkkədə göz həbsində saxladılar. Müsəlmanlar arasında, Osmanın öldürüldüyü şayiəsi yayıldıqda, Rəsulallah möminləri biətə dəvət etdi. Bütün möminlər, canları bahasına da olsa döyüşdən qaçmamaq barədə ona biət etdilər. Bu mövzu, surənin 10, 18 və 19-cu ayələrində nəql edilmişdir. Bu ayələr əsas alınaraq, bu biətə “Biətür-rizvan” [razılıq biəti] və biət əsnasında altında dayandıqları ağaca “Şəcərətül-rizvan” [razılıq ağacı] adı verilmişdir. Daha sonra, Osmanın ölüm xəbərinin yanlış olduğu meydana çıxdı. O əsnada iki tərəfdən də elçilər gəlib-gedirdi, tərəflər bir razılıq əldə etməyə çalışırdılar. Müşriklər müsəlmanların Məkkəyə daxil olmasına icazə verməməkdə qərarlı idilər. Rəsulallah isə bu sözlərlə sülh bağlamağı

təklif edirdi: “Biz döyüşmək məqsədilə gəlmədik, məqsədimiz Kəbəni ziyarət etməkdir. Qüreyşlilər müharibədən zəif çıxdılar. İstəyirlərsə, onlarla bir müqavilə bağlamağa hazıram. Qəbul etsələr yaxşı olar, qəbul etməsələr, ölənə qədər onlarla döyüşərəm.” Məkkəli müşriklər, Peyğəmbərin öz mövqeyindən əl çəkmədiyini gördükdə, döyüşməyə cəsarət etməyərək, Osmanı və Məkkədəki bəzi müsəlmanları azad etdilər. Daha sonra razılığa gəlmək üçün Süheyl bin Əmrin rəhbərliyi altında bir heyəti Rəsulallahın yanına göndərdilər. Orada Xudeybiyyə Müqaviləsi bağlandı. Bu müqaviləyə görə: 1) Müsəlmanlarla müşriklər 10 il müharibə etməyəcəklər. 2) Müsəlmanlar o il Kəbəni ziyarət etmək fikrindən əl çəkərək geri qayıdacaqlar, ancaq gələn il ümrə ziyarətini həyata keçirəcəklər, müşriklər Məkkədən çıxacaq, müsəlmanlar orada üç gün qalacaqlar və yanlarında səfər qılıncından başqa silah olmayacaq. 3) Məkkədən biri müsəlman olaraq Mədinəyə sığınsa, geri qaytarılacaq, ancaq Mədinədən Məkkəyə sığınanlar geri qaytarılmayacaq. 4) Ərəb qəbilələri, istədikləri tərəflə razılığa gəlmək hüququna malik olacaqlar.
Bu şərtlərin ilk baxışda müsəlmanların əleyhinə olması səbəbindən, müsəlmanlar böyük bir məyusluq yaşadılar və Peyğəmbərə belə dedilər: “Sən Allahın rəsulu deyilsənmi? Bizim mübarizəmiz haqlı mübarizə deyimli? Bu zilləti niyə qəbul edirik?” Müsəlmanlar Xudeybiyyədə 19 gün qaldıqdan sonra Mədinəyə qayıtmaq üçün yola çıxdılar. Yolda bu surə nazil oldu.

[401] Bu hissədəki ayələr texniki və semantik baxımdan “Rəsmi Müshəf”dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür.

[402] Bax: 345 nömrəli qeyd.

[403] Burada 103 nömrəli ayədə *“Allah; bəhirə, saibə və ham [adlı] heç bir şey nəzərdə tutmamışdır [buyurmamışdır]. Ancaq inkar edən şəxslər, Allaha qarşı yalan düzüb-qoşub uydururlar. Və onların bir çoxu dərk etməz.”* sözləri ilə cahiliyyət dövründə ərəblərin sahib olduqları bəzi dini inanışlar rədd edilməkdədir. Cahiliyyət dövründə ərəblərin heyvanlarla bağlı bir çox batil inanışı var idi. Belə ki: Bahirə: Dişi dəvə beş dəfə doğduqdan sonra, ərəblər ona minməyi və belinə yük vurmağı haram sayır, yununu da qırxmırdılar. Beşinci balası erkək olsa, balasını qurban edirdilər, dişi olsa qulaqlarını yarırdılar. Bu da onun nəzir olduğunu göstərirdi. Saibə: Bir nəfər xəstələndikdə, yaxud bir şey itdikdə və ya bir müsibət üz verdikdə, bir dəvəni sərbəst buraxmağı nəzir deyirdilər. Xəstə sağaldıqda, yaxud itən əşya tapıldıqda, yaxud müsibət sovuşduqda dəvəni azad edir, ona yük vurmur, belinə minmir və onu kəsmirdilər. O heyvanı sərbəst buraxırdılar. Vəsilə: Qoyun bir erkək, bir dişi olmaqla əkiz

balaladıqda, erkəyi kəsmir, "Bacısı ona çatdı" deyirdilər. Belə qoyunlara da əsilə adı verirdilər. Ham: Bir erkək dəvənin nəslindən on dəvə dünyaya gəldikdə, yaxud da bu dəvə öz balasının balasını gördükdə, ona yük vurmur, belinə minmir, "O özünü qorudu" deyirdilər.
[404] "Ən böyük həcc" Peyğəmbərin də iştirak etdiyi və şəxsən rəhbərlik etdiyi həcdir.
[405] Bu hissədəki ayələr texniki və semantik baxımdan "Rəsmi Müshəf"dəkindən fərqli bir ardıcıllıqla düzülmüşdür.
[406] Hüneyn; Məkkə ilə Taif arasında, Tihamə bölgəsində geniş bir vadidir. Məkkənin fəthindən sonra müsəlmanlarla Həvazin müşrikləri arasında bu vadidə döyüş olmuşdu.
[407] "Təxirə salmaq, gecikdirmək" mənasına gələn *nəsi*; ərəblərin haram aylara riayət etməkdən boyun qaçırmaq istəmələrini, işin ciddiyyətinə xələl gətirmək səylərini ifadə edir.
[408] Bu ayələrdə möminlərə sitəm edilir, münafiqlərin və öz kefinə düşkün şəxslərin davranışları pislənir və Müsəlmanlara əmr edilir ki, heç bir bəhanə gətirmədən, ağır ya da yüngül olmasına baxmayaraq hər şəraitdə Allah yolunda malları və canlarıyla çalışsınlar.
Burada deyilən Təbük səfəri (Təbük; Mədinə ilə Şam arasında, suyu və xurma bağları bol olan bir yerin adıdır) hicrətin 9-cu ilində Şamda toplaşan 40 min nəfərlik Bizans ordusuyla çarpışmaq üzrə Mədinədən Şama doğru təşkil edilən hərbi səfərdir. Bu mövzunu daha yaxşı başa düşmək üçün Təbük səfəri barədə ensiklopedik səviyyədə məlumata malik olmaq lazımdır.

# İÇİNDƏKİLƏR:

## İÇİNDƏKİLƏR:

# İÇİNDƏKİLƏR:

